Az-2

**Redaktorlar:** *Həkim Qəni (Qəni Hüseynqulu oğlu Hüseynov)*

*Hacı Rafiq Şirvani (Rafiq Əliqulu oğlu Əliyev)*

Şahin Fazil. **İKİNCİ DİVAN.**
"Elnur-P". Bakı-2005. səh. 1268

**Şahin Fazil** 40 ildən çoxdur ki, Azərbaycan şerinin klassik janrlarının müasir dövrdə inkişafı naminə ədəbi yaradıcılıqla məşğuldur. Bu müddət ərzində onun bir neçə qəzəllər kitabı (1978, 1990, 1994) çapdan çıxmış, birinci "Divan" əsəri oxuculara təqdim olunmuşdur (1996). "İkinci Divan"a isə minacat, nət, qəsidə, qəzəl, qitə və başqa nəzm nümunələri ilə yanaşı, vətən və qürbət, vüsal və hicran, həzz və iztirab səciyyəli şerlər, habelə ictimai məzmunlu nəzm əsərləri də daxil edilmişdir. Bu, Şahin Fazilin 20-ci kitabıdır.

ŞF $\frac{4600300001-37}{Q23530}$ - 2005 **qrifli nəşr**

**Az-2**


*Yazmışam mən elə bir "Divan"ı*
*Ki, tutur bir çoxuna divanı.*

*Elə nöqsanlı adam mən görürəm,*
*Mənə ürcah eləyir nöqsanı.*

*Asiyəm, amma xəbis kimsələrə-*
*Daima eyləmişəm üsyanı.*

*Dəyəcək öz başına toppuz tək,*
*Mənə böhtan atanın böhtanı.*

*Əlim altında mənim Quran var,*
*Başım üstündə isə cananı.*

*Sevmirəm qürbəti ki, qürbətdir,*
*Sevirəm doğma Azərbaycanı.*

*Mən vüsal aşiqiyəm aləmdə,*
*Yaxına qoymayıram hicranı.*

*Dilimi vəsf edənin mən quluyam,*
*Dilimə xor baxanın sultanı.*

*Alağa verməyəcəkdir imkan,*
*Bağımın tər süsəni, reyhanı.*

*Ədəbiyyat elimin nemətidir,*
*Şair isə sözümün bağbanı.*

*Xəstədir indi qəzəl, ey Şahin,*
*Çarə et, ey qəzəlin loğmanı!*

*8.07.1996*

## DİBAÇƏ

Bismillahir-rəhmanir-rəhim!

Pərvərdigara! Sənin qüdrət və əzəmətinə şükr olsun ki, Sənin aciz bəndən Kərbəlayi Şahin Fazil ikinci dəfə böyük cürətə gəlib ikinci "Divan" kitabını yazdı və onu eləcə "İkinci Divan" adlandırdı. Bahar əyyamı suları aşıb-daşan Qudyal çayı kimi təlatümlü ilhamım məni daim yazmağa sövq etdiyindən tez-tez öz-özümə deyirdim:

*Şahin, yeni "Divan"ını təqdim elə xəlqə,*
*Bir güllə bahar olmayacaqdır, bilirəm mən.*

Pərvərdigara! Birinci "Divan"ımın nəşr olunmasından artıq səkkiz il ötmüşdür və mən özümdə "Divan"larımın sayını artırmaq üçün inadkar qüvvət görürəm ki, həmin qüvvəni Sən özün mənə vermisən. Ey böyük Yaradan, tez-tez ya röyada, ya da elə oyaq vaxtı Səninlə söhbət edirəm, Sənə Sənin cavabını gözləmədən sual verirəm, düşünürəm, düşünürəm... Bir də görürəm ki, sualdan maraq, maraqdan şer yarandı:

*Durmaqda zaman məkan üzündə,*
*Yainki məkan zaman üzündə?*

*Gördük, yer üzündə asiman var,*
*Rəbbim, nə var asiman üzündə?*

*Ulduz bəzək oldu kəhkəşanə,*
*Var özgə nə kəhkəşan üzündə?*

*Var isə yamanlığımda yaxşı,*
*Yaxşı görünür yaman üzündə.*

*Şair deyəni düşərsə başə,*
*Olmazmı ziya çoban üzündə?*

*Söz yox ki, dumanda gün görən yox,*
*Mən gün görürəm duman üzündə.*

*Zülmətdə - işıq, işıqda - zülmət,*
*Şahin, işıq ol cahan üzündə.*



Pərvərdigara! Əlli ilə yaxındır ki, şer yazmaqdayam. Bu müddət ərzində Sənin yardımınla on doqquz elmi, bədii və tərcümə kitabım çap olunmuş, iki yüzədək elmi, yüzdən bir qədər az publisis- tik məqaləm müxtəlif qəzet və jurnallarda dərc edilmişdir. Şer yazmağın nə demək olduğunu, şübhəsiz ki, Özün yaxşı bilirsən. Nəzərimcə, söz zər, şair zərgərdir və şairdə zərgər diqqəti, zərgər dəqiqliyi olmalıdır ki, sözün qədrini zər kimi bilsin, kəlmələri misra və beytlərə zərgər səliqəsi ilə, sapa mirvari düzülən sayaq düzsün. Və ən əsası isə şair xalis, saf, tər-təmiz xəlqi sözlərdən bəhrələnməli, elə yazmalıdır ki, oxucu savadından, ya savadsızlığından asılı olmayaraq şerin mənasını başa düşsün, lüğət giriftarı olmasın.

*Söz zərgəri oldum deyə zər var qəzəlimdə,*
*Zər var deyə şer içrə zəfər var qəzəlimdə.*

*Gül-bülbülü seyr etmədəyəm tazə nəzərlə,*
*Köhnə nəzərə tazə nəzər var qəzəlimdə.*

*Bəzən mənə yar oldu sevinc hissi təbii,*
*Bəzən də ələm, qüssə, kədər var qəzəlimdə.*

*Üstünlüyümü tazə əsrdə biləcəklər,*
*Bir mən bilirəm indi nələr var qəzəlimdə.*

*Bağçamda çəpər görməyəcəklər mənim, amma*
*Yad kəlmələrə qarşı çəpər var qəzəlimdə.*

*Şahin qəzəli tər axıdıb "Divan" edibdir,*
*Vəznim qədəri bəlkə də tər var qəzəlimdə.*

Pərvərdigara! Milad tarixinin min doqquz yüz qırxıncı əjdaha ilində, qoç bürcü altında, hicri tarixinsə şəmsi tarixlə 1319-cu, qəməri tarixləsə 1360-cı ilində, Quba şəhərində dünyaya göz açan Şahin Fazilin həyatı çox da rahat keçməmişdir. Başımın erkən yaşımdan ağarması narahat güzəranıma dəlalət etmirmi?

*Demədimmi ona gənclikdə ki, az fikr etsin,*
*Qoca görsənmədədir indi yaşından Şahin.*
*Başı qürbətdə çəkibdir o qədər zillət ki,*
*Şama bənzər, yanacaq yansa, başından Şahin.*

Pərvərdigara! Qürbət ellərdə çox gün keçirmişəm. Əfqanıstan, İran, Türkiyə, İraq, Rusiya, Gürcüstan, Tacikistan, Özbəkistan, Türkmənistan, Qırğızıstan, Dağıstan torpaqlarında çox izlərim, çox sözlərim qalmışdır. Təbii ki, iztirabım da olub, həzzim də. Dərdlənməyi babalarım Əfzələddindən (Xaqani), İmadəddindən (Nəsimi), Füzulidən və atam Fazildən əxz etmişəm:

*Bəşərin dərdi canımda, gecə-gündüz yanıram,*
*Elə bil yanmaq üçün Şahini Fazil yaradıb.*

Pərvərdigara! Otuz ildən çoxdur ki, tarix elmi ilə məşğulam. Qaraqoyunlu, Ağqoyunlu, Şirvanşahlar və Səfəvilər dövrünü qüvvəm çatan qədər tədqiq etmişəm. Bu sahədə az-çox nəyəsə nail olmuşam. Elmlər doktoruyam, iki universitetdə dərs deyirəm:

*Elə elm aləminə mail olubdur Şahin,*
*Birbəbir məqsədinə nail olubdur Şahin.*

*Gəncliyimdən tanıyırlar məni çox imzadə,*
*Bir dəyişkən cərəyan, naqil olubdur Şahin.*

*Gah olub Fərzəli, gah Fərzəlibəyli, hərdən*
*Şahini ləğv eləyib Fazil olubdur Şahin.*

Pərvərdigara! Ömrümün əlli ili dinlərin üzərinə qadağa qoyulan bir ölkədə keçmişdirsə də, dinsiz olmamışam, Sənə həmişə etiqadım olub, adını dilimdə vird etmişəm. Dörd yol Məşhədə, iki dəfə Kərbəlaya getmiş, müqəddəs imamlarımızın ziyarətində dualar oxumuşam. Bir neçə minacat, nət, qəsidə və məsnəvi qələmə almışam ki, başdan-ayağadək cənabınıza, peyğəmbərimizə və imamlarımıza həsr edilmişdir:

*Çox niyyətə, çox məqsədə yetdim bu həyatda,*
*Allahsevənəm, Şahinə Allah yar oldu.*

Pərvərdigara! Yerdə pis ömür sürmədim. Uğurlarım da olub, uğursuzluqlarım da. Artıq yerimi başqasına verib yeri tərk etmək vaxtım yaxınlaşır. Vaxtını dəqiqliklə Sən bilirsən. Qurani-Kərimdə yazılıb: "Huvə bikulli şəyin əlim" ("O, hər şeyi biləndir"). Ya İlahi, indiyəcən yerdə yerim oldu, bəs göydə necə, olacaqmı?



*Taqətim əriyib gedib,*
*Qalxım, heyim varmı görən?*
*Çomağım çürüyüb gedib,*
*Çoban, neyim varmı görən?*

*Az getməyə, çox getməyə,*
*Ac getməyə, tox getməyə,*
*Yerdə yerim yox, getməyə*
*Göydə göyüm varmı görən?*

Pərvərdigara! Bu günlərdə şerlərini yalnız heca və sərbəst vəznlərində yazan və əruza (xüsusilə qəzələ) üstdən aşağı baxan bir şairlə mübahisəm oldu. Onun fikrincə, qəzəl köhnə əyyamın qalığıdır və qəzəldə yar-əğyar, gül-bülbül, şam-pərvanə kimi illərlə "çeynənən" ifadələr üstün yer tutur. Mən ona qəzəllərimdən bir neçə beytimi misal gətirdim və dedim ki, qəzələ ictimai məzmun vermək mümkündür:

*O qeyrətsiz vətəndaşlar neçin satmış vətən mülkün,*
*Məgər mümkünmü görsünlər Samur satdım, Araz aldım*

*Yaman çoxdur mənim dərdim, sayı yaddan çıxır, bir gün*
*Görərlər saymaq üçün dərdi sayğac tək cihaz aldım.*

*Nə lazımdır qılınc almaq ələ, əldə qələm varkən?*
*Əlimdən xəncəri atdım yerə hiddətlə, saz aldım.*

*Daha rindanəlik divanəlikdir, bəsdir, ey Şahin,*
*Kifayətdir şərab ilə, mey ilə dəstəmaz aldım.*

***

*Qarabağ öylə fələkətdə, Fələstin də belə...*
*Bu nə dövr oldu əzazil, bu nə dövrandı belə?*

*Əgər əcdadımız Adəm baba olmuşsa bizim,*
*Bu nə kafər, nə yəhudi, nə müsəlmandı belə?*

***

*Neçə ildir ki, əlindən Qarabağ getmişdir,*
*Niyə rahət oturubsan a vətəndaş, niyə?*

*Beş əsr öncə qızılbaş ki savaş eylərdi,*
*Şah Xətai, niyə susmuş o qızılbaş, niyə?*

*Məmləkət elmi ilən, alimi ilən tanınır,*
*Alimin paltarı gündən-günə nimdaş niyə?*

*Qara rəng qarə günün rəmzi sayılmışsa əgər,*
*Sən qəragünlüdə, Şahin, ağarıb baş niyə?*
***
*Saçlarım qar kimi hər ləhzə ağarmaqda mənim,*
*Qarabağ məskəni qarə bağ olandan sonra.*

Pərvərdigara! Əlimə qələm aldığım gündən etibarən mənim əsas qayəm öyrənmək olmuşdur. Ana dilimi öyrənməklə Ana Vətənimdə doğulub boya-başa çatan, bütün ömrü boyu Vətənimdə yaşayıb-yaradan, yaxud durna quşları kimi qərib ellərə pərvazlanan şair və alimlərimizi öyrəndim, fars dilini mənimsəməklə yüzlərlə İran, Türkiyə və Azərbaycan ədibinin yaradıcılığı ilə dərindən tanış oldum, çoxmənalı ərəb kəlmə və istilahlarına bələd olmaqla bu zəngin dilin söz ehtiyatına heyranlığım artdı. Təkrar-təkrar anadilli ədəbiyyatımızı mütaliə etdim, hər mütaliədən sonra bu ədəbiyyatın müxtəlif janrlarında qələmə alınmış bədii nümunələrə vurğunluğum artdı, ədəbi istiqamətə yönəlməkdə olan peşəm müəyyənləşdi və söz gülüstanımızın bağbanlarından biri olmaq qərarına gəldim. Həm heca, həm sərbəst, həm də əruz vəznində şerlər yazmağa başladım və yaza-yaza müəyyən etdim ki, müasir Azərbaycan ədəbi dilinin imkanları hər üç vəznli poeziyamızı layiqincə zənginləşdirməyə qadirdir. Əmin oldum ki, şer gülzarımızı əcnəbi söz və izafətlərdən təmizləmək imkan daxilində olan bir məsələdir, bu şərtlə ki, zəhmətsevər olasan və ana dilimizi ürəkdən sevən vətəndaşa çevriləsən. Onsuz da qəzəl karvanımız neçə-neçə əsrlərdir ki, yol gəlməkdədir. Bu karvanın sarbanları çox böyük ehtirama layiq şəxsiyyətlər olmuşlar, dilimizi, şerimizi, mənəviyyatımızı zənginləşdirmişlər, lakin ötən əsrlərin ədəbi dili ilə müasir ədəbi dilimiz arasındakı mövcud fərqi də unutmaq lazım deyildir. On üçüncü yüzillikdən iyirminci yüzilliyin düz iyirmi-otuzuncu illərinədək ərəb-fars sözləri və izafət tərkiblərinin tüğyan etdiyi ədəbi dilimiz müəyyən dəyişikliyə uğramışsada, yad kəlmələrin nüfuz və təsirindən kənar ola bilməmişdir. Mən bu cümlələri yaza-yaza qüdrətli söz sahibləri Nəsimi, Füzuli, Xətai, Qövsi Təbrizi, Seyid Əzim Şirvani və nəhayət Vahidi xatırladım, ədəbi dilimizin sadəlikdən-qəlizliyə (mürəkkəbliyə), qəlizlikdən-sadəliyə keçmə prosesi gözlərim önündə canlandı. Nisbətən sadə dilli Nəsimini Füzuli, qəliz dilli Füzulini sadə dilli Xətai və Qövsi Təbrizi, bu iki sadə dilli nəhəng simanı qüdrətli qələm sahibi, lakin qəlizdil Seyid Əzim Şirvani əvəz etdi və nəhayət ədəbi dilimizi xalq dilinə (xəlqi dilə) çox yaxınlaşdıran Vahid meydana çıxdı. Mən illər boyu düşündüm və Vahidin yolunu özümə örnək seçdim. Çünki elə bu günün özündə də şerləri qəlizlik baxımından ötən əsrlərin şerlərini kölgədə qoya biləcək şairlər "müasir ədəbi incilər" yaratmaqdadırlar.

*Təqlidə qurşanmaq məndən qaçaqdır,*
*Mənəm müəllifi neçə bəyanın.*
*Həyatda öz izi qalmayacaqdır*
*Başqa iz üstündə addımlayanın.*

*Şairin özünü əks edir kitab,*
*Zərin özündədir zərin dəyəri.*
*Böyük olmayacaq qocalsa da lap*
*Böyük şairlərin təqlidçiləri.*

*Sevərək həmişə fəxr eləmişəm*
*Elimin Seyidi, Sabiri ilə.*
*Xalqı alimiylə tanıyır aləm,*
*Xalqı tanıyırlar şairi ilə.*

Mən tam məsuliyyətlə deyə bilərəm ki, ana dilimizə, bu dilin doğma söz və istilahlarına ögey nəzərlərlə baxanlarda dil təəssübkeşliyi yoxdur və onlar təqlid yolunu tutmaqla (olduqca asan yoldur) nəhəng Füzuli və Seyid Əzimlərin zəif (çox zəif!) yamsılayıcıları rolunu öhdələrinə götürmüşlər:

*"Arı"nı "zənbur" edibsən, səni "zənbur" sancsın,*
*Gül kimi "bal" sözünü sən niyə "şəhd" eylərsən?*

*Sən yazan sözləri Seyyid neçə il öncə deyib,*
*Yoxsa Seyyid Əzimə yetməyi əhd eylərsən?*

*Var ikən şer səmasında Füzuli günəşi,*
*Niyə öz şəmini yandırmağa cəhd eylərsən?*

Məlum olduğu kimi, yenilikçilərin köhnəpərəstlərə qarşı mübarizəsi hər dövrdə olmuşdur və həmin mübarizə bu gün də davam edir. Yenilikçi şairlər köhnə, tapdanmış yolla getməkdə məna görmür, köhnəpərəstlər isə "köhnə hamam, köhnə tas" deyə-deyə köhnə ifadə, ibarə, istilah və izafətlərdən imtina etmək istəmirlər.

*Köhnə qəzəlxanlara: -Sadə yazın, -söylədim,*
*Sözlərimə etiraz eylədilər bir daha.*
*-Tazə qəzəllər gərək, tazə fikirlər, - dedim,*
*-Köhnə hamam, köhnə tas, -söylədilər bir daha*

Əgər mən özüm yenilikçi şair-qəzəlxan olmasaydım, bəlkə də, müasir qəzəlxanların illər boyu getdikləri köhnə şer yolu ilə hərəkət edər, özümü heç bir əziyyətə salmadan bir dilin deyil, üç dilin qafiyələri ilə rahatca qəzəl yazar, "gül-bülbül", "vüsal-hicran", "aşiq-məşuq" mövzularını naftalin iyi verən əcnəbi sözlərlə bəzəyər, qeyri-xəlqi qəzəllərə meydan verərdim. Bu, olduqca asan bir yoldur və mən qırx ildir ki, həmin asanlıqdan imtina etmişəm:

*Əcnəbi sözlə nə vardır ki, şerlər deməyə?*
*Ağı qarə, qaranı ağ yazırlar yenə də.*
*Yazılan kəlmələri dil utanır söyləməyə,*
*"Aşiq"in cəmini "üşşaq" yazırlar yenə də.*

Qəribə burasıdır ki, bizimlə eyni dövrdə yaşayan köhnəpərəst qəzəlxanlar özlərinin guya haqlı olduqlarını hər yerdə isbat etməyə çalışır, qəzəl dilinin "qəliz olma zərurətini" təbliğ edir, ana dilimizin sözləri ilə *(heç şübhəsiz ki, dilimizdə vətəndaşlıq hüququ qazanmış ərəb-fars sözləri də çoxdan bəri doğmalaşan sözlərimizdir və Azərbaycan dilinin lüğət fondunda layiqincə yer tutmuşlar - məsələn, vətən, qələm, kitab, eşq, vüsal və s.)* qəzəl yazmağın qeyri-mümkünlüyünü iddia edirlər. Onlar bu kimi iddialarla özlərinin beş-üç uğurlu şerləri olmadığı halda Nəsimini, Xətaini, Qövsi Təbrizini, Vahidi və bu gün xəlqi qəzəllər yaradan zəhmətsevər şairlərimizi inkar etmiş olurlar. Onların ərəb və fars dillərini əməlli bilməyərəkdən bu dillərin sözlərini yerli-yersiz işlədərək *(əsasən lüğətlərdən istifadə yolu ilə)* qəzəl yazmaları olduqca qəribə bir əməldir:

*O qəzəllər ki, yazırsan, yazaram, dil bilirəm,*
*O qəzəl ki, yazıram mən, yaza bilməzsən sən!*

Belə müəlliflər bilmək istəmirlər ki, müasir dövrdəki çlxmilyonlu azərbaycanlı oxucular qəzəllərin qəliz söz və izafət tərkiblərinin mənasını bilmək üçün ciblərində lüğət gəzdirməlidirlər:

*Məni bir dəstə qəzəlxan gətiribdir təngə,*
*"Dərman"ı "daru" yazırlar, nə bilim "daru" nədir?*



*Hər "məcaz əhlinə zənciri-eşqdir geysu,**
*Yarımın saçları "saç"dırsa əgər, "geysu" nədir?*

*"Əndəlib", ya "solovey" söyləmirəm bülbülə mən,*
*"Aycamallım" demişəm dilbərimə, "məhru" nədir?*

*"Bərgi-güldür meyi-ləb ləli və ya atəşi-ab"?***
*Afərinlər, suya "ab" söylə həmişə, su nədir?*

*Bu ərəb şeri deyildir, nə də fars şeri deyil,*
*Nə də türk şeri deyildir, əcəba, bəs bu nədir?*

Lakin o qəzəlxanlar anlasınlar ki, məhz xəlqi qəzəllər yazdığım üçün, təvazökarlıqdan uzaq olsa da, deməliyəm:

*Şahinəm, sultanı oldum saf qəzəllər mülkünün,*
*Hər gəda fikr etməsin ki, mən təki sultan olur.*

Mübarizə davam edir və davam edəcəkdir. Mən birinci "Divan" kitabımda açıq-aşkar nəzərə çatdırdığım əqidəmdən əl çəkən deyiləm və Pərvərdigara, Sənin izninlə son nəfəsimədək köhnəpərəstlikdən əl çəkmək istəməyən qəlizdil qəzəlxanlarla döyüşəcəyəm.

*Təqlidanə qəzəlinlə özünü baş sandın,*
*Çox nahaq düşmüsən, ey dost, bu ucuz sevdayə*

*Məğrur olma bu qədər, Seyyid Əzimlər vardır,*
*Sən bir arpayə dəyirsən, mən iki buğdayə.*

Məndən sonra isə, təbii ki, xəlqi qəzəlin zirvəsini yeni-yeni şahinlər fəth edəcəklər:

*Razıyam mən qələmimdən, girərək meydanə,*
*Çox "mənəm" söyləyənə kəllə atıbdır qəzəlim.*

*Qələmim əl kimi tutmuş əlimi, əğyarə*
*Ən səlis sözlər ilə şillə atıbdır qəzəlim.*

*Bu qələmdirmi, deyildir, elə bil top lüləsi,*
*Nə qədər nanəcibə güllə atıbdır qəzəlim.*

* Misra Mirzə Məhəmmədəli Binəvanındır.

** Misra Sadıq Rahilindir.

Pərvərdigara! İndi Səninlə şer və onun məzmunu ilə bağlı bir qədər də söhbət etmək istəyirəm. Böyük şairlərin böyük-böyük "Divan"larını mütaliə etdim, irfanı və təsəvvüfü öyrənmək meylinə düşdüm və imkanım meylimə yardımçı oldu. Bildim ki, Allahı tanımaq mərifətdir, təsəvvüf isə irfanın mənbəyindən bəhrələnən bir təriqətdir. Qavradım ki, irfanla təsəvvüf sufiyyət, dərvişiyyət, arifiyyət və haqq yola düşməkdir. Lakin irfanla təsəvvüf arasında çəpər dikəltmək istəyənlər var, onlar dərk etmirlər ki, irfan təsəvvüfü və başqa təriqətləri özündə əks etdirən ümumi bir anlayış, təsəvvüf isə irfanın bir şöbəsi və təzahürüdür.

*Neçə arif kəsin irfanını öyrəndim mən,*
*Gəzib əfqan elini, Türkiyəni, İranı.*

Bu gün təsəvvüfü yabançı bir cərəyan kimi qəbul edənlər var. Bu məgər Füzulini, Nəsimini, Xətaini inkar deyilmi?

*İrfanla təsəvvüf qoşa qanaddı,*
*Surət yoxa çıxsa məna var olmaz.*
*Biri digərinə doğru can atdı,*
*O parça olmasa bu paltar olmaz.*

Təsəvvüfü öz parlaq yaradıcılıqları ilə inkişaf etdirən farsdilli şairlər Həkim Sənai, Mövlana Rumi, Şeyx Əttar, türkdilli ədəbiyyatın nümayəndələri Gülşəhri, Şahidi, Behişti, Həmdi, Rizvani, Sevdayi və başqalarının şərq ədəbiyyatının ən məşhur mövzusu olan "Leyli və Məcnun"a həsr etdikləri əsərlər məhz "vəhdəti-vücud" nəzəriyyəsinə əsaslanmış, bəşəri gözəllikdən İlahiyə yüksələn insan eşqini ifadə etmişlər. O ki qaldı Füzulinin "Leyli və Məcnun" poemasına, bu əsər əsasən türkdilli təsəvvüf ədəbiyyatının ədəbi zəmini üzərində qələmə alınmış poetik bir incidir:

*"Gər mən mən isəm nəsən sən, ey yar,*
*Vər sən sən isən nəyəm məni-zar?"* -

deyən Füzuli məgər bu və bunun kimi yüzlərlə beyti ilə vəhdəti-vücuddan bəhs etmirmi? Təsəvvüf ədəbiyyatından alaraq, öz əsərlərində bol-bol işlətdiyi istilahlar, məsələn, xərabat (mənalar aləmi, vəhdət məkanı, arif adamların məskəni), mey (haqqı anmaqla sufinin qəlbində yaranan və onu sərməst edən zövq), şərab (məhəbbətin ifrat dərəcəyə varması), zülf (küfr və ya örtük, hicab), üz (iman) məgər bu böyük şairin məhz "vəhdəti-vücud" fəlsəfi nəzəriyyəsinə əsaslandığından xəbər vermirmi? Mən bir daha yuxarıdakı



fikrin üzərinə qayıdıram: Təsəvvüfü inkar etmək klassik şairlərin əksəriyyətinin adları üzərindən qələm çəkmək deməkdir. Şəxsən mənə gəldikdə isə, mən irfan və təsəvvüfü Şərq fəlsəfəsinin iki möhtəşəm sütunu sayır, onların birini digərindən ayırmıram:

*Nəzərim dəymədə hər ləhzə İmadəddinimə,*
*Və "Ənəlhəq"dəki mənasını görməkdə gözüm.*

*Baxaraq diqqət ilə hər tərəfə, ey Şahin,*
*Tanrının nurü təcəllasını görməkdə gözüm.*

Yaxud,

*Qeysin xəbəri vardı, Leylanı bilirdim,*
*Mən məktəbə getməzdən sevdanı bilirdim.*

*Dünya hələ bilmirdi varəmmi, yoxammı,*
*Amma, mən isə, Şahin, dünyanı bilirdim.*

Yaxud,

*Mənsur "Ənəlhəq" deməsəydi yaşayardı,*
*Şahin, yaşamaqdan ötəri söylə "Ənəlhəq".*

Pərvərdigara! Ruhun mahiyyətini Səndən başqa bilən yoxdur, lakin bilirik ki, ruh ölməzdir və irfanla təsəvvüf bunu təsdiq edir:

*Ruhun ölməzliyi haqqında hədislər çoxdur,*
*Qayıdıb ruh deyirlər təzədən canə gəlir.*

*Bu əgər böyləsə Vahid yenə peyda olacaq,*
*Görərik Mirzə Ələkbər yenə dövranə gəlir.*

*Yuxu gördüm ki, dirilmiş təzədən Seyyid Əzim,*
*Bu həmin Seyyid Əzimdirmi ki, Şirvanə gəlir?*

*Məncə irfan ilə, mənadə təsəvvüf birdir,*
*Neçə məna ki təsəvvüfdədi irfanə gəlir.*

İrfan və təsəvvüf arasında kəskin fərq və dərin ziddiyyət olduğunu sübut etməyə çalışanlara üzümü tutub deyirəm:

*Bir halda ki, irfanı bilir dərs kimi əzbər,*
*Təlqin eləmə arifə irfanı mücərrəd.*

*Şeri bəzəyib əcnəbi sözlərlə lüğətdən*
*Şair deməsin bizlərə mənanı mücərrəd.*

*Kim getməsə hərgah fənafillaha* doğru,*
*Əlbət ki, sanır hər iki dünyanı mücərrəd.*

*Kim bilməsə hərgah bəqabillahı** mütləq,*
*Mütləq edəcək zənn təcəllanı*** mücərrəd.*

Pərvərdigara! İrfani istilahlardan olan "surət" və "məna" da məni hey düşündürməkdədir. Nədir surətin mənası və mənanın mənası? Nədir bu iki istilahı bir-birinə yaxınlaşdıran və birini digərindən ayıran cəhət? Surət təkcə zahiri görünüşdürmü? "Məna" yalnız batini yol, yaxud həqiqət yoludurmu? "Keyfiyyət" məfhumu hər iki istilaha aid edilirmi? Bilmirəm. Amma bilirəm ki, hər ikisi zərurətdir. Necə ki, demişəm:

*Şahin, sənə örnək surətdəki məna,*
*Məna da zərurət, surət də zərurət.*

Yaxud:

*Məni məna da düşündürmədədir, surət də,*
*Verirəm qiyməti həm surətə, həm mənayə.*

Lakin, nəzərimcə, məna daha üstün keyfiyyətə malikdir:

*Ürəyim öylə böyük ki, demə əsla balaca,*
*Edirəm zənn ürəyimdən hələ dünya balaca.*

*Şahinin şer bağında neçə məna gülü var,*
*Kaş onun olmaya şerindəki məna balaca.*

***

*Surətə baxmır bu Şahin, indi məna axtarır,*
*Könlünü cəlb etməyir surət daha məna kimi.*

***

*Sən qəzəldə həmişə izləmisən mənanı,*
*Şahina, üzmə əlindən yenə məna ətəyin.*

* Fəna üç mərhələdən ibarətdir: məhv, təms (yox olmaq, itmək), məhəq (aradan getmək). Fənafillah - təsəvvüfdə insanın öz sifatını Allahın zatı və xüsusiyyətləri ilə dəyişməsi, nəticə etibarilə insanın dünya bağlarından azad olaraq o Tama, Bütövə - Allaha qovuşmaq dərəcəsidir.

** Bəqa diri qalmaq, əbədi yaşamaq, ölməzlikdir. Bəqa Allah-təalaya xas sifətdir. Bəqabillah - Allahın insanın daxilində təcəllası və insanın öz vücudunu Allahın varlığında yox etməsidir.

*** Təcəlla - İnsanın Allahın varlığını öz içində hiss etməsidir. Təcəllanın üç növü vardır: Təcəllayi-cəmal, təcəllayi-cəlal, təcəllayi-kəmal.



Pərvərdigara! "Dibaçə"ni bitirmək üzrəyəm, lakin Səninlə söhbətim bitmək bilmir, çünki Sənə çox sualım var, çünki Sənin məni doğru-düzgün yol və əmələ hidayət etməyinə bərk ehtiyac duyuram, çünki bilmədiklərim bildiklərimdən sonsuz dərəcədə çoxdur.

*Görən haqlıyammı, əməlim haqmı?*
*Mən tutan yolmudur qəzəlin yolu?*
*Aparıb cənnətə çatdıracaqmı*
*Əməlisalehi əməlin yolu?*

*Didib-parçalayır, könül, qəm səni,*
*Niyə sevindirmir bu aləm səni?*
*Gözüm qoy görməsin Keçəl Həmzəni,*
*Mənim yolum deyil keçəlin yolu.*

*Bir məzar verirəm bu cahana mən,*
*Qovrula-qovrula, yana-yana mən.*
*Şahin, göz dikmişəm asimana mən,*
*Yanıma ordandır əcəlin yolu.*

Pərvərdigara! Mənim Səndən müqəddəs bir təmənnam var: Vətənim Azərbaycanı tapdayan yağı düşmənlərin ayağını yurdumdan kənar et, öz müsəlman ümmətini bəlada qoyma. Elə et ki, yarağımız əlimizdə, papağımız başımızda olsun. Elə et ki, tezliklə düşmən caynağında qalan torpaqlarımız azad olsun və biz üzümüzə dəymiş şapalaq izini silə bilək:

*Zəfərimdən nə xəbər var, nə soraq qalmışdır.*
*Hələ yurdumda mənim amma qoçaq qalmışdır.*

*Söyləyirlər ki, papaq qeyrətidir millətimin,*
*Ölkəmizdə görəsən çoxmu papaq qalmışdır?*

*Papaq altında oğullar ki var idi öldü.*
*Ləçək altında qadınlar sinədağ qalmışdır.*

*Xeyli vaxtdır üzü gülmür nə qədər insanın,*
*Yağılardan üzümüzdə şapalaq qalmışdır.*

*Hər silah əllərimizdən yığılıb, məlumdur,*
*Gər, silahlar yığılıbdırsa, çomaq qalmışdır.*

*Hey deyib biz "Qarabağ" inləyirik, tək qaramı?*
*Düşmənin tapdağı altda neçə bağ qalmışdır.*

*Dedilər dağ dağılardı bu qədər dərd altda,*
*Bu qədər dərd ilə Şahin neçə sağ qalmışdır?*

Pərvərdigara! Fani dünyanı tərk edib əbədi üqba aləminə köçməyə tam hazıram. Ölümdən sonra dirilmək var. Bilirəm ki, "Allah haqdır, ölüləri dirildər və hər işə qadirdir. Və eləcə də qiyamət günü çatacaq: buna heç şübhə yoxdur. Və Allah qəbirlərdə olan ölülərin hamısını diriildəcək". *(Quran, Həcc surəsi, 6-7-ci ayələr)*. "Zalikə biənnəllahə huvəl-həqqu və ənnəhu yühyil-mövta və ənnəhu-əla külli şəyin qədir. Və ənnəs-saətə atiyətun la rəybə fiha və ənnəllahə yəb-əsu mənfil qübur". Ümidim cənnətə düşməkdir, çünki mən bilən cəhənnəmlik bir əməldə bulunmamışam. Özün hər əməlimdən halisən, ya İlahi.

*Gərək əzm ilə, inam ilə ölüm, ey Şahin,*
*Deyələr göydəkilər: - Cənnətə sən xoş gəldin!*

Pərvərdigara! Acizanə bir xahişim də var: "İkinci divan" adlı bu 20-ci kitabımın çapında çox böyük xidməti olan Babək Təhmasibi adlı xeyrxah bir insanın faydalı işlərinə fərəc ver, Babəkin arzusunu bəbəyində, diləyini ürəyində qoyma, təqva sahibi olduğu üçün bütün xeyrli əməllərində ona yardımçı ol. Babək Təhmasibi sovet dövründə baş verən hadisələr burulğanından bəhs edən "Burulğan" adlı bir roman da yazdı. Qoy onun ilham quşunun uçuşu daha da sürətli olsun, ya İlahi!

*Naşirim vardır ki, bu divanımı çap eylədi,*
*Bənzəri yox çap işində, nəşrdə tək qardaşım.*

*Şerə aşiq, əhdə sadiq, vəsfə layiq bir adam,*
*Söhbəti düzgün, sözü saf, qəlbi kövrək qardaşım.*

*Yazdı şimşək sürətiylə bir "Burulğan" tək kitab,*
*Çox burulğandan çıxıb əzm ilə şimşək qardaşım.*

*Etdiyi xidmət ki, vardır dağdən əskik deyil,*
*Xidmət etmiş Şahinə dağ boyda Babək qardaşım.*



Pərvərdigara! Ölümdən qabaq ürəyimdə bir arzu da baş qaldırmışdır: Mənə qüvvət və möhlət ver üçüncü "Divan" kitabımı da yaradım. Əlbəttə, yaradan Sənsən, biz şairlər isə Sənin hökmlərinin adi icraçılarıyıq. İstə məni, ey Tanrı. Son arzumun da çin olmasını istə, ey Tanrı. Üçüncü "Divan"ımın yazılmasını istə, ey Tanrı.

*Dərd əhlinə dərman eləyər istəsə Tanrı,*
*Hər xəstəni loğman eləyər istəsə Tanrı.*

*Cananəni ifritəsifət etməyə qadir,*
*İfritəni canan eləyər istəsə Tanrı.*

*Quran oxudar kafərə islah eləməkçin,*
*Şeytanı müsəlman eləyər istəsə Tanrı.*

*Fironları dünya evinin indi də vardır,*
*Fironlara fərman eləyər istəsə Tanrı.*

*Hər məscidi abad eləyər Kəbə misalı,*
*Meyxanəni viran eləyər istəsə Tanrı.*

*İstərsə biyabanı edər qərq gülə, ya*
*Gülzarı biyaban eləyər istəsə Tanrı.*

*Mərcanı dəyirmandakı dən tək üyüdüb də,*
*Adi daşı mərcan eləyər istəsə Tanrı.*

*Şahin ki, qəzəl mülkünə bir bəndədi aciz,*
*Ol bəndəni sultan eləyər istəsə Tanrı.*

*13.07.2002*

## MİNACAT
*(Məsnəvi)*

*Qüss ibn Saidə son peyğəmbərin gələcəyi vaxtın yaxınlaşdığını xəbər verənlərdən idi. Ərəblərin məşhur bazarı Suki-Ukazda bir qızıl dəvə üzə- rində söylənən xütbəni həzrət Məhəmməd əleyhüssəlam gəncliyində dinləmişdi"*

**Osman Kəskioğlu. Siyəri-Nəbi, Ankara 1993, səh.21.**

Ey varlığa şan olan İlahi,
Hər yanda əyan olan İlahi.
İzz eyləməsən yarı yar anmaz,
Lütf eyləməsən şer yaranmaz.
Əlbəttə ki, təbimə səbəb var,
İlhamə Sən olmusan səbəbkar.
Lütf eylə yenə şer deyim mən,
Peyğəmbəri vəsf eyləyim mən.
Amma yenə öz sözümdə Sənsən,
Könlümdə özün, gözümdə Sənsən.
Nətim də, minacatım da çox var,
Amma yenə vəsfiniz davamdar.
Peyğəmbərə söz deməkdən əvvəl
Ya həqq, sözümü Sənə deyim gəl.
Ey xəlq eləyən cahanı yoxdan,
Sənsən yaradan məkanı yoxdan.
Sən "Kon" ki dedin məkan yarandı,
Sən "Kon" ki dedin cahan yarandı.
"Kon" söylədiyin kəramət oldu,
Hər olmuşa istiqamət oldu.
"Kon" söylədiyin dilimdə "Ol"dur,
"Kon" söylədiyin əyanə yoldur.
"Ol" adlı gözəl şüar var oldu,
Yoxdan yaranışda var var oldu.



Qəlbin "yox"a etimadı vardır,
Vardır, "yox"a etiqadı vardır.
Sən "Kon" ki dedin yarandı aləm,
Səndən yaranıbdı kafü nun həm![1]
Dünyayə Məhəmmədi verən Sən,
Kəbədəki əsvədi[2] verən Sən,
Əsvəddəki hikməti verən Sən.
Hikmətdəki qüdrəti verən Sən.
Qüdrətdəki xisləti verən Sən.
Xislətdəki qüdrəti verən Sən.
Qüdrət ki dedim, Məhəmməd oldu,
Hikmət ki dedim, Məhəmməd oldu.
Quranı ki nazil eylədin Sən,
Çox cahili fazil eylədin Sən.
Çox zalimi adil eylədin Sən,
Çox nadanı aqil eylədin Sən.
Çox naqisi kamil eylədin Sən,
Çox bilməzi qabil eylədin Sən.

Bir gün ələ bir kitab aldım.
Bir çox suala cavab aldım.
Sirr gülşəninin gülabı idi,
Cövdət paşanın kitabı idi. [3]
Sanki mənə oldu bir işarət.
Bir xütbəni eylədim qiraət.
Şad idi könül, ürək şən idi.
Ol xütbə Sənin dilindən idi.
Səndən bizə sadir idi xütbə.
Başdan-başa təfsir idi xütbə.
Bir xütbə ki, nadir idi xütbə.
Sirr açmağa qadir idi xütbə.

[1] Gər kaf ilə nunan oldu aləm,
Aya, nədən oldu kafü nun həm".
*M.Füzuli*

[2] Kəbədəki qara daşın adı.
[3] Cövdət paşa. Qisəsi-ənbiya.

Ləl idi, cəvahir idi xütbə,
Peyğəmbərə dair idi xütbə.
Ol xütbəni nəzm edə bilərdim,
Nəzm etməyə əzm edə bilərdim.
Hərçənd ki, bu asan iş idi,
Nəsr ilə gözəl deyilmiş idi.
Nəzm eyləmədim o nəsri əfv et,
Kəsrimsə bu iş, bu kəsri əfv et.

Varlıqların ey ümidi, şanı,
Tez-tez oxuyub həmin bəyanı.
Tez-tez eləyib o xütbəni yad,
Xütbəylə müdam edib Səni yad,
Əhvalını şad edir bu Şahin,
Peyğəmbəri yad edir bu Şahin.
Nəzm eyləmədim o nəsri, əfv et,
Kəsrimsə bu iş bu kəsri əfv et.

## XÜTBƏ

"Ey insanlar, gəlin, dinləyin, unutmayın, ibrət alın. Yaşayanlar ölür, ölən yox olur. Olacaq olur. Yağış yağar, otlar bitər. Cocuqlar doğular, analarının, atalarının yerini tutar. Sonra hamısı məhv olub gedər. Hadisələrin, həyatın ardı-arası kəsilməz, zaman-zaman bir-birini qovarlar. Qulaq asın. Diqqət edin. Göydə xəbər var. Yerdə ibrət alacaq şeylər var. Yer üzü bir geniş eyvandır. Göy üzü bir yüksək tavandır. Ulduzlar sayrışır. Dənizlər durur. Gələn qalmaz. Gedən gəlməz. Yoxsa, çatdıqları yerdən xoşnud olubmu qalırlar? Yoxsa, orada buraxılıb da yuxuyamı dalırlar? Əmin edirəm: Allahın hüzurunda bir din vardır ki, indi inandığımız dindən daha əzizdir. Və Allahın bir gələcək Peyğəmbəri vardır ki, gəlməsi çox yaxındadır. Kölgəsi başınızın üstündədir. Nə xoşbəxtdir o şəxs ki, ona iman gətirə, o da ona hidayət eləyə. Vay o bədbəxtə ki, ona qarşı üsyan və müxalifətdə ola. Yazıqlar olsun ömürləri qəflətdə keçən ümmətlərə.

Ey camaat! Hanı əbu və əcdad? Hanı bər-bəzəkli saraylar və daşdan tikililər tikən Ad və Səmud? Hanı dünya varlığına məğrur olub da, millətinə "Mən sizin ən böyük Rəbbinizəm" deyən Firon ilə Nəmrud? Onlar sizə nisbətdə daha zəngin və qüvvətli, qüdrətcə sizdən daha üstün deyildilərmi? Bu yer onları dəyirmanında üyütdü, toz etdi, dağıtdı. Sümükləri belə çürüyüb dağıldı. Evləri dağılıb izsiz qaldı. Yerlərində, yurdlarında indi it ulayır. Ehtiyatlı olun, onlar kimi qəflətdə qalmayın. Onların yoluyla getməyin. Hər şey fanidir. Əbədi olan ancaq cənabi-Həqdir ki, birdir, şəriki və oxşarı yoxdur. Tapınacaq ancaq Odur. Doğmamış, doğulmamışdır. Əvvəl gəlib-keçənlərdə bizə ibrət olacaq şey çoxdur. Ölüm irmağının girəcək yerləri var, amma çıxacaq yerləri yoxdur. Böyük-kiçik hamı köçüb gedir. Gedən geri gəlmir. Qəti olaraq dedim ki, hamıya olan mənə də olacaqdır".

*3.08.1996*

## MİNACAT
*(Məsnəvi)*

"Huvəlləzi xələqə ləkumma fi-l ərzi cəmiən sum məstəva iləs-səmai fə səvva hunnə səbə səmavatin və hüvə bikulli şəyin əlim".

(Tərcüməsi: "Yer üzündə nə varsa hamısını sizin üçün yaradan, sonra səmaya üz tutaraq onu yeddi qat göy halında düzəldib nizama salan Odur. O, hər şeyi biləndir").

***Quran, Əl-Bəqərə surəsi, 29-cu ayə***

"Və ləhul-kibriyau fis-səmavati vəl-ərzi və Huvəl-əzizul-həkim"

(Tərcüməsi: "Göylərdə və yerlərdə böyüklük yalnız Ona məxsusdur. O, yenilməz qüvvət və hikmət sahibidir").

***Quran, Əl-Casiyə surəsi, 37-ci ayə***

Ey təbimə qüvvə bəxş edən zat,
Ey qüvvəmə təbi nəqş edən zat,
Ver güc bu minacatım yazılsın,
Məqsudə yenə çatım, yazılsın.
Ver güc Səni bir də vəsf edim mən,
Məqsudimə doğru yol gedim mən.
Gül mövsümü bitdi, qışə az var,
Yarəb, yaşım altmışə az var,
Ver qüvvə şerdə halım olsun,
Söz söyləməyə macalım olsun.
Ver qüvvə ibadət eyləyim çox,
Quranı qiraət eyləyim çox,
Qal əhlinə heyrət eyləyim çox,
Hal əhlinə rəğbət eyləyim çox.
Aqil ilə söhbət eyləyim çox,
Cahillərə nifrət eyləyim çox.
Şəkk yox, əzəli kəramətin var,
Vahidliyini olarmı inkar?
Həqsən əməlü sözündə, ey həqq,
Hər şey ötəri, Sən isə mütləq!
Hər şeydə fəna, sən isə baqi,



Sənsən bu yerin, göyün dayağı.
Sənsən bizə Adəmi edən xəlq,
Sənsən bütün aləmi edən xəlq.
Sənsən yerə göndərən Kitabı,
Sənsən edən elçi bir cənabı.
Ol zatı özün rəsul edibsən,
Son elçi kimi qəbul edibsən.
Meracə çıxarmısan rəsuli,
Bu haqda gözəl deyib Füzuli:
"Fərz oldu bir əzmə cəzm qılmaq,
Meraci-kəmalə əzm qılmaq".
Ən ülvi bəşər deyib o zatə,
Girdin bəşər ilə ixtilatə.
Merac-kəmal meracıydı,
Merac-vüsal meracıydı...
Sənsən bəşəriyyətin qüruri,
Sənsən əbədiyyətin zühuri.
Sənsən əbədi varı həyatın,
Sənsən ulu memarı həyatın.
Sənsən qara qəlbi zar edən də,
Sənsən yarı yarə yar edən də.
Olmazsa əgər icazən, ey Rəbb,
Məlum ki, mən olmaram mən, ey Rəbb.
Sənsən mənə "alim ol" deyən də,
Sənsən məni şair eyləyən də.
Amma məni hey çəkir müəmma,
Yarəb, mənə çox fikir müəmma.
Düzgünmü Füzulinin xitabı,
Vardırmı sualının cavabı:
"Hər xilqətə gərçi bir səbəb var,
Aya, səbəbi kim etdi izhar?
Gər kaf ilə nundan oldu aləm,
Aya, nədən oldu kafü nun həm?"
Ay göy dolanır, nədir buna sirr?
Gün göydə yanır, neçin tükənmir?
Məhrumdu neçin səma həvadən?
Ulduz niyə göz vurur səmadən?
Hicran olacaqmı yox cahandan?
Nöqsan olacaqmı yox cahandan?
Tüğyan olacaqmı yox cahandan?

Tufan olacaqmı yox cahandan?
Üsyan olacaqmı yox cahandan?
Şeytan olacaqmı yox cahandan?
Düzgünmü bu Şahinin xitabı?
Vardırmı sualının cavabı?

"Hər riştə ki, həqq əyan edibdir,
Sərriştəsini nihan edibdir".
Hərçənd gözəl deyib Füzuli,
İzahını eyləyib Füzuli.
Amma məni hey çəkir müəmma,
Yarəb, mənə çox fikir müəmma:

Hər gerçəyin üstündə var pərdə, müəmmadır,
Yerlər də müəmmadır, göylər də müəmmadır.

Yoxdan var olan aləm, gildən yaranan Adəm,
Bir zatə yəqindirsə, çox fərdə müəmmadır.

Barmağı edib xəncər "Şəqqül-qəmər" ecazı,
Barmaq da müəmmadır, xəncər də müəmmadır.

Mülcəm neçin öldürdü Heydər kimi bir mərdi?
Mülcəm də müəmmadır, Heydər də müəmmadır.

Loğmanların sehri hər dərdə dəvadırmı?
Bir dərdə dəvadırsa, çox dərdə müəmmadır.

Zəmzəm suyu Kövsərmi, Kövsər suyu Zəmzəmmi?
Zəmzəm hələ sirr isə, Kövsər də müəmmadır.

Hər şeydə müəmma var, Allah - müəmmasız!
Şahin sözü üstündə yox pərdə, müəmmadır.

*9-10.07.1998*

**MİNACAT**
*(Qəzəl)*

Mənə ver qüvvə ki, imkan eləyim, ya Allah,
Canı cananıma qurban eləyim, ya Allah.

Bizi həm zar eləyib, həm də pərişan eləyib,
Kafəri zarü pərişan eləyim, ya Allah.



Mənə tibb elmini öyrət ki, təbib olmaqla,
Dərdlinin dərdinə dərman eləyim, ya Allah.

Mənə güc ver ki, deyib sözlərimi mərdanə,
Neçə haqsızlığa üsyan eləyim, ya Allah.

Ciyərin qan eləmişdim, təzədən ol razı,
Neçə əğyarı ciyərqan eləyim, ya Allah.

Oxumaq da qəzəli asan ola, yazmaq da,
Qəzəli istərəm asan eləyim, ya Allah.

Nə qəzəl vaxtıdı, cəng eylə ki, düşmən basıla!
İstərəm Şahinə fərman eləyim, ya Allah.

*8.09.1998*

**MİNACAT**
*(Qəsidə)*

Hər dəmim naləvü əfğandı mənə, ya Rəbbim,
Udduran qan yenə hicrandı mənə, ya Rəbbim.

Fələyin cövrünə dözmək bu fəna aləmdə,
Gər çətindirsə də, asandı mənə, ya Rəbbim.

Görübən hər dəlini Məcnunu anmaqda gözüm,
Hər şəhər sanki biyabandı mənə, ya Rəbbim.

Qurusun göz yaşı gözlərdə, tükənsin qəmlər,
Bir gilə göz yaşı ümmandı mənə, ya Rəbbim.

Mənim ardımca xəbislər deyinirlər hərdən,
Sözləri hərzəvü hədyandı mənə, ya Rəbbim.

Qoy desinlər gecə-gündüz, canım öyrəncəlidir,
Boş deyimlər quru tüğyandı mənə, ya Rəbbim.

Cahilin söhbəti başdan-başa nöqsan isə,
Dinməmək cahilə nöqsandı mənə, ya Rəbbim.

Bulaşıq hər qəzəlin ziddinə getmək - qayəm!
Saf qəzəl həşrə qədər şandı mənə, ya Rəbbim.

Desə hər kim mənə var məndə riya, yanlışdır,
Sən bilirsən ki, bu böhtandı mənə, ya Rəbbim.

Vətənin hər daşını ləl ilə mərcan sanıram,
Tikanı sünbülü reyhandı mənə, ya Rəbbim.

Daşına qurban olum, torpağına qurban olum,
Quru səhrası gülüstandı mənə, ya Rəbbim.

Kim deyir ki, cahan içrə daha sultan yoxdur,
Sevgilim var isə - sultandı mənə, Ya Rəbbim.

Yanıma Əzrayılı bir neçə il gec göndər,
Məşğulam, söz demək imkandı mənə, ya Rəbbim.

"Gəl" desən Şahinə, sidq ilə məgər gəlməzmi?
Mütiyəm hökmünə, fərmandı mənə, ya Rəbbim.

*4.03.1999*

## MİNACAT
*(Qəsidə)*

Geridə qalır cavanlıq, oluram qoca. İlahi,
Edirəm Sənə, bilirsən, nə qədər dua, İlahi.

Neçə hicr ilən görüşdüm, nə qədər bəlayə düşdüm,
Eləmə bəlayə bir də məni mübtəla, İlahi.

Ələmi əlimdən alsan, qələmi əlimdən alma,
Sözümə kəsər gərəkdir, gözümə ziya, İlahi.

Əməlimdə hər nə varsa Sən özün gözəl bilirsən,
Əməlin müqabilində olacaq cəza. İlahi.

Nə namaz qılmışam mən, nə də təsbehim olubdur,
Nə oruc tutmuşam çox eləyib xəta. İlahi.

Ələ almışam şərabı, yelə vermişəm savabı,
Demirəm hər haqq-hesabı, edirəm həya, İlahi.

Mənə kim vəfa edibsə ona mən vəfalı oldum,
Görünüb əməllərimdə həmişə vəfa, İlahi.

Olunur əlacı hasil çoxunun təbabət ilə,
Mən isə qəzəllərimlə edirəm şəfa, İlahi.

Neçə il şer yolunda döyüşüb mübariz oldum,
Dayanıb müqabilimdə neçə əjdaha, İlahi.



Dağa "dağdı" söylədim mən, bağa "bağdı" söylədim mən,
Ağa "ağdı" söylədim mən, qaraya qara, İlahi.

Bilirəm, inayətinlə sözümə verildi qiymət,
Yazıram dəyərli sözlər, satıram baha, İlahi.

Sənə çox minacatım var, busa "Ərznamə" oldu,
Sənədir səda dilimdən, Sənədir nida, İlahi.

Nə qədər bəla görübdür bu qoca, zavallı Şahin,
Mənə verdiyin bəlanı yara vermə, ya İlahi!

*6.01.1999*

## MİNACAT
*(Rücu)*

Dərvişəm, deyəndə "hu",
Nidamı eşidirsən.
Təkcə Sənsən arizu,
Sədamı eşidirsən,
Sədamı qəbul elə,
Allahım.

Sənə məhəbbətim var.
Sən - ən ülvi kəlamım.
Hər dəm itaətim var,
Hər dəqiqə salamım,
Salamı qəbul elə,
Allahım.

Gəlirəm, gedənlərə
Yetir salamı məndən.
Bir gündə neçə kərə
Dua eləyirəm mən,
Duamı qəbul elə,
Allahım.

*27.06.1999*

## MİNACAT
*(Qəsidə)*

Kimsə deyil, aləmə meyar Odur,
Hər şeyi yoxdan eləyən var Odur.

Gərçi səbəb var isə hər illətə.
Hər səbəbə ümdə səbəbkar Odur.

Zahirə çıxmış nə qədər ixtira,
Zahiri amma edən izhar Odur.

Hər cürə gerçəkliyi təsdiq edən,
Cümlə təsadüfləri inkar Odur.

Yollayıban Ərzə müqəddəs kitab,
Quranı dünyayə edən car Odur.

Hər şeyi görməkdədi, gizlətməyək,
Hər şeyi bilməkdədi, hüşyar Odur.

Od, Su, Hava, Torpağı mövcud edib!
Harda bəşər var ona sərdar Odur.

Ustaların ustasının ustası,
Ustasının ustası - pərgar Odur.

Kim kimə eylərsə mədədkarlıq,
Kimsə deyil, təkcə mədədkar Odur.

Zülm eləyən əvvəl-axır zar olur,
Zalımı bir gün eləyən zar Odur.

Tanrı, Xudavənd, Xuda, Laməkan,
Xaliqü Sübhan və Qəffar Odur.

Səbr eləyən zatdı, sabirdir O,
Dərdliyə yar, qəmliyə qəmxar Odur.

Kimdə qələm varsa - qələm sahibi,
Kimdə ələm varsa - ələmdar Odur.

Göydəki yerlər bizə məlum deyil,
Yerdəki göylərdə isə var Odur.

Şirinə Fərhad dedi memar olub,
Bilmədi amma bunu: Memar Odur.

Leyliyə eşq elmini tədris edən,
Qeysi edən eşqə giriftar Odur.

Kimsə hələ etməyib idrak Onu,
Dərki müyəssər deyil, əsrar Odur.



Qoy deməsinlər daha çox yar var,
Yar Odur, yar Odur, yar Odur.

Sevgisi yox, bəlli ki, dildar çox,
Şahinəsə sevgili dildar Odur!!!

## NƏT

*23.11.2001*

*"Hu!" ("O, yəni Allah!)*

Onu da xatırla ki, bir vaxt Məryəm oğlu İsa belə demişdi: "Ey İsrail oğulları! Mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir Peyğəmbərlə sizə müjdə verən Allahın elçisiyəm".

*Quran, Əs-Səff surəsi, 6-cı ayə*

"Və bilirəm, bildirirəm ki, Məhəmməd Onun (Allahın - Ş.F.) bəndəsidir, rəsuludur. O, Məhəmmədi tanınmış bir din ilə göndərdi. Atəşlər içərisində yollarını azanlara onu dağ kimi nişan verdi. Şübhələri dağıtmaq üçün hökmlü bir kitab nazil elədi. İnsanlar imtahan içində idilər. Din ipi qırılmaq üzrə idi. Doğru inanc dirəkləri yıxılırdı. Dinin əslinə qarışıqlıq düşmüşdü, nicat yolu daraldıqca daralırdı. Vahimələrdən xilas olmaq üçün gözlər kor olmuşdu. Doğru yolun adı-sanı qalmamışdı. Allaha qarşı üsyan edirdilər. İman dayaqları çürümüşdü. Dünya məhv olmuş, nişanələri tanınmaz hala düşmüşdü. İnsanlar şeytana itaət edir və onun yolunu tuturdular. Hər yerdə şeytanın bayrağı dalğalanırdı. İnsanlar elə bir vəziyyətdə idilər ki, fitnə-fəsad onları dabanları ilə əzirdi. Allah onu (Məhəmmədi) ən xeyirli yerdə, ən şər qonşular arasından göndərdi. İnsanlar bir halda idilər ki, onların yuxuları yuxusuzluq, sürmələri göz yaşları, elmləri cəhalət idi".

*Həzrət əmirəl-möminin Əli ibn-Əbu Talib. Nəhcül-bəlağə. Tehran, 1995. səh.32-33.*

"Hu!" oldu birinci söz bu Nətə.
Bu "hu" bəzək oldu, yahu, Nətə.
Ya "Hu" deyilir sənə, ya "Yahu",
"Yahu" deyirəm özüm də, ya "Hu!"
Hər bir sözə bu yazıldı başda,
"Hu!" başdı ki, "Hu!" yazıldı başda.
Ey Nəti qiraət eyləyən kəs,
Ey mən kimi "Yahu!" söyləyən kəs,
Təzim elə, sən də, mən də təzim,
Dərvişlərə "hu!" deyəndə təzim.

Şairlərə "hu!" deyəndə təzim,
Nasirlərə "hu!" deyəndə təzim,
Hakimlərə "hu!" deyəndə təzim,
Alimlərə "hu!" deyəndə təzim,
Fazillərə "hu!" deyəndə təzim,
Aqillərə "hu!" deyəndə təzim.
Nadan nə bilir nədir "hu", Yahu,
Baş sözdü bu Nətimə bu, Yahu!
Mən Nətimə min xəyalat ilə
İqdam elədim minacat ilə.
Çünki, Sənə bağlıdır xəlayiq,
Biz - xəlq olunan, Sən isə - Xaliq.
Çünki, Sənə mütidir bu aləm,
Bir "Ol!" deməyinlə oldu aləm.
Çünki hər işin başı özünsən,
Çünki, üzüyün qaşı özünsən.
Çünki, əzələ əzəl özünsən,
Hər bir təmələ təməl özünsən.
Hər bir şəhə şəh ki var, özünsən,
Hər bəndəyə şəhriyar özünsən.
İcad eləyən üsuli, ya Rəbb,
İrsal eləyən rəsuli, ya Rəbb.
Hər bir nəbi ki, rəsul deyildir,
Hər bir rəsul isə bir nəbidir.*
Çünki, rəsulu nəbi edən - Sən,
Əhməddi, rəsulluq aldı Səndən.
Ən türfə kitabı göndərən - Sən,
Dünyayə Məhəmmədi verən - Sən.
Əhməddi, dönüb Məhəmməd oldu,
Cəhlin qabağında sərhəd oldu.
Sən təlim edibsən ol cənabı,
Sən alim edibsən ol cənabı,
Sən fazil edibsən ol cənabı,
Sən adil edibsən ol cənabı,
Sən sərvər edibsən ol cənabı,
Peyğəmbər edibsən ol cənabı.
Sən qət elədin o - rəhbər olsun,

* "Hər nəbi rəsul, yəni şəriət sahibi deyildir, ancaq hər rəsul nəbidir". Baxın: Nəhcül-bəlağə, Tehran, 1995, səh.30.



İdrakinə afərinlər olsun!
Əfv eylə ki, cürətə gəlib mən,
İnşa elədim qəzəl dilindən:

Nə qədər varsa - məkanı bilirəm, bildirirəm
Və məkan içrə zamanı bilirəm, bildirirəm.

Bu cahan aləmi zənn eyləməyin vahiddir,
Neçə min böylə cahanı bilirəm, bildirirəm.

Elə sirr var ki, bir insan onu idrak etməz,
Hər şeyi mənsə əyani bilirəm, bildirirəm.

Hər nihanın mənə, əlbəttə, nihanı məlum,
Hər nihan içrə nihanı bilirəm, bildirirəm.

Neçə isbatı güman eyləyən adəm çoxdur,
Cümlə isbatı, gümanı bilirəm, bildirirəm.

Yaxşı iş hər nə qədər çoxsa, yaman iş həm var,
Nə qədər yaxşı-yamanı bilirəm, bildirirəm.

Aləmin aliminin hər biri məlumdu mənə,
Nəyə layiqdi çobanı bilirəm, bildirirəm.

Kafəri yaxmağa atəşdə cəhənnəm gözlər,
Doludur qırla tiyanı bilirəm, bildirirəm.

Əlinin oğlu Hüseynin qanı islamə şərəf,
Tələf etmiş niyə canı bilirəm, bildirirəm.

Elə kəs var ucalır həzzi göyə, kəs həm var,
Ucalır ərşə fəğanı bilirəm, bildirirəm.

Cavan insanı qoca eyləyən illət nədədir?
Qoca eylər nə cavanı bilirəm, bildirirəm.

Deməsin kimsə olur boş yerə tənbeh, fələyin
Kimə tuşlandı kamanı bilirəm, bildirirəm.

Laməkan olduğuma şəkk eləyənlər bilsin:
Laməkanəm və məkanı bilirəm, bildirirəm.

Vaxtlı-vaxtında tapındım Sənə mən, Allahım,
Şahinəm, xeyrü zıyanı bilirəm, bildirirəm.

Ey müslimə şan olan Məhəmməd,
Ey hökmü rəvan olan Məhəmməd,
Ey əqli əyan olan Məhəmməd,
Ey fəzli bəyan olan Məhəmməd,
Ey qəlbə şəfa olan Məhəmməd,
Ey dərdə dəva olan Məhəmməd,
Quran ki, bir kitabdı nadir,
Quran ilə Allah oldu zahir.*
Quranı qiraət eyləyən çox,
Quranə "səmavidir" deyən çox.
Hər rəmzə cəvabdır bu Quran,
Ən ülvi kitabdır bu Quran.
İdrakını bildirir cahanə,
Fazilliyinə odur nişanə,
Kamilliyinə odur nişanə,
Aqilliyinə odur nişanə,
Qabilliyinə odur nişanə,
Adilliyinə odur nişanə.
Hər bir dəmini edir tərənnüm,
Ürf aləmini edir tərənnüm.
Şəxsiyyətini edir tərənnüm,
Qüdsiyyətini edir tərənnüm,
Heysiyyətini edir tərənnüm,
Saf niyyətini edir tərənnüm.
Ey müslimə iftixarü hami,
Barəndə gözəl demiş Nizami:
"Sultani-səriri-kainatsan,
Şahənşəhi-kişvəri-həyatsan".
Ey yer üzünün axır rəsuli,
Vəsfində nə xoş demiş Füzuli:
"Ey padşəhi-səriri-lövlak,
Məqsudi-vücudi-xakü əflak!..
... Ey raqimi-nüsxeyi-məani,
Məmureyi-elmi-dinə banı.
Şahənşəhi-məsnədi-risalət,
Rəssami-qəvaidi-ədalət".

* Nöqsan sifətlərdən münəzzəh olan Allah öz hökmləri ilə "Quranda təcəlla etdi". Baxın: "Nəhcül-bəlağə", səh.117.



Ey eşqə dayaq olan Məhəmməd,
Ey elmə çıraq olan Məhəmməd.
Ey zülmə hasar olan Məhəmməd,
Ey ədli şüar olan Məhəmməd.
Ey həqqə nəsim olan Məhəmməd,
Ey "Dürri-yetim" olan Məhəmməd.
Ey müslim üçün yanan rəsulim,
"Xeyrül-bəşər" adlanan rəsulim.
Ey dinimi bərqərar edən kəs,
İslamı cahanda var edən kəs.
Ey Kəbəni təmir eyləyən kəs,
Xaliq sözünü bizə deyən kəs.
Bütxanəni ey uçurdan adəm,
Ey aləm içində tazə aləm.
Bir vədə "Əmin" adına layiq,
Görmüş səni əksərən xəlayiq.
"Xeyrül-ənam" adlanan da Sənsən,
Xeyr işlə qanadlanan da Sənsən.
Ey ərşə qədəm basan rəsulim,
Allahə qulaq asan rəsulim,
Mümkünmü yenə qədəm qoyulsun?
Meracına afərinlər olsun!
Həzzin çoxalıb birə min oldu,
Merac sənin nəsibin oldu.
Allahı görən rəsul Sənsən,
Allahə ilahi qul Sənsən.
Ey ər rəsulum, ərən rəsulim,
Ey yeddi göyü görən rəsulim.
Var idi birinci göydə Adəm,
Görcək Səni olmuş idi xürrəm.
Var idi ikinci göydə Yəhya,
İdrislə idi, deyildi tənha.
Var idi üçüncü göydə Yusif,
Yusif gözünə göründü arif.
Dördüncü göyə yetişdiyin dəm.
İsa Sənə olmuş idi həmdəm.
Var idi beşinci göydə Harun,
Yar idi beşinci göydə Harun.
Altıncı göyə bəzəkdi Musa,
Altıncı göyə gərəkdi Musa.

Yeddinci göyə yetişdiyin an
İbrahimi görmüsən yaxından.
Cismin qəbul idi yeddi göydə,
Səkkiz rəsul idi yeddi göydə.
Sonra daha yüksəyə yönəldin,
Sən "Sidrətül-intəha"yə gəldin.
Sən "Sidrətül-intəha"da oldun,
Saf elçi idin, səfadə oldun.
Pak elçi idin daha pak oldun,
Allahə yetib fərəhnak oldun.
Ey layiq olan ilahi lütfə,
Ey sadiq olan ilahi lütfə,
Meracına afərinlər olsun,
Zər tacına afərinlər olsun.
Meracdə yox zaman həddi,
Meracdə yox məkan həddi.
Meracını dərk edən tapılmaz,
Meracə daha gedən tapılmaz.
Meracı yığılsa aləm əqli,

Dərk eyləyə bilməz adəm əqli.
Ey şerimə şan olan Məhəmməd,
Ey cismimə can olan Məhəmməd,
Ey qəlbimə nur olan Məhəmməd,
İslamə qürur olan Məhəmməd.
İslamın olan ey iftixarı,
Əfv eylə bu Şahini, bu zarı,
Zarəm ki, mən acizəm, sözüm az,
Az sözlə Nizami olmaq olmaz!
Çox sözlə Nəsimi qabil oldu,
Çox sözlə Füzuli fazil oldu.
Çox sözlə Seyid sərəfraz oldu,
Çox söz dilədimsə də az oldu.
Ver güc ki, olum şerdə qadir,
Çox sözlə Ələkbər oldu Sabir.
Ver güc ki, xəyalatım çox olsun,
Nətim və Minacatım çox olsun.
Çox Nət yazanlar oldu zahir,
Qismət mənə həm neçə cəvahir.
Yəni ki, cəvahirimdi hər Nət,
İmanımı təsdiq eyləyər Nət.



Nət ilə gözüm tox olsa yaxşı,
Nətim nə qədər çox olsa yaxşı!
Ver güc ki, qəzəl bağım gül açsın,
Ver güc ki, bu dilsizin dil açsın.
Ver güc ki, desin bu şeri güclü,
Təqdim eləsin bu şeri güclü:

Dil vəsf edərsə ismin - dildarımız Məhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.
Tutsaq həmişə rəsmin - qəmxarımız Məhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.

Bütxanədən yan olduq, müştaqü heyran olduq,
Sadiq müsəlman olduq, sərdarımız Məhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.

Allahımız bir oldu, dilxahımız bir oldu,
On dörd əsrdir oldu meyarımız Məhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.

Biz bəndəyik, o - sultan, biz aşiqik, o - canan,
Eşq mülkü olsa viran memarımız Məhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.

Cahil sözü əzabdır, Şahin sözü gülabdır,
Peymanımız kitabdır, ilqarımız Məhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.
Səlləllahu əleyhi və alihi və səlləm!!!

*13-15.06.1997*

## QƏZƏL

*İmam Mehdi əleyhüssəlamın mövludu münasibətilə*

Görməmişik çöhrəni, höccət əleyhüssəlam,
Gözləyirik biz səni, höccət əleyhüssəlam.

Hey səni yad eyləyib, gör necə dad eyləyib,
Qaldırırıq şivəni, höccət əleyhüssəlam.

Gör neçə ildir ki, biz "cümə gələrsən" deyib
Gözləyirik cüməni, höccət əleyhüssəlam.

Bəzi avam adəmin şübhə dolub qəlbinə,
Gəl uzaq et şübhəni, höccət əleyhüssəlam.

Ey dirilərdən biri, ey dirilərdən diri,
Ey dirilik mədəni, höccət əleyhüssəlam.

Müntəzirik, ağlarıq vəslin üçün, seyr elə,
Gözdən axan çeşməni, höccət əleyhüssəlam.

Gəl ki, yaman gündəyik, daima şövqündəyik,
Mən, Hacı Mail, Qəni, höccət əleyhüssəlam.

Şahinə imdad elə, müztəribəm, şad elə
Mən kimi hər bəndəni, höccət əleyhüssəlam.

*28.12.1996*

## QƏSİDƏ

*Seyyidüş-şühəda İmam Hüseynin pak ruhuna ithaf*

Gör bir neçə vaxtdır tökülüb qanı Hüseynin,
Yandırmadadır bizləri hicranı Hüseynin.

Əsli, nəsəbi, mərtəbəsi alidən ali,
Əlbəttə, ürəklərdədi ünvanı Hüseynin.

Elmi, hünəri, mərifəti ümmana sığmaz,
Olmuşmu görən bir gilə nöqsanı Hüseynin.

Heyran edəcək aləmi illər boyu şəksiz,
Fəzli, ədəbi, hikməti, irfanı Hüseynin.

Həqq aşiqi olmuşlara dərman niyə lazım?
Əlbəttə, şəhadətdədi dərmanı Hüseynin.

Təkcə Ərəbistanı deyil, qətli sərasər
Zar etmədimi Azəribaycanı Hüseynin.

Üsyan elədi şövq ilə yetmiş iki aşiq,
Xar eylədi kafərləri üsyanı Hüseynin.

Həmrahləri yaxşı bilirdi bunu, hətta
Sağ qalmağa yox zərrəcə imkanı Hüseynin.



Amma ki, çəkilmək geri gəlmirdi xəyalə,
Hazırdı hamı olmağa qurbanı Hüseynin.

Müslim* deyilən azəribaycanlı da vardı,
Çəkmişdi onu meydana tüğyanı Hüseynin.

Həzrət Əlinin ruhi uçub etsə də pərvaz,
Həzrət Əlinin canı imiş canı Hüseynin.

Hər mömünə kaş qismət ola öylə şəhadət,
İslamə şərəfdir şərəfi, şanı Hüseynin.

İslampərəstik, yenə kafərlərə qarşı
"Gəl-gəl" deyə səslər bizi meydanı Hüseynin.

Ol zatın olubdur necə heyranı bu Şahin!
Olmuş, olacaq daima heyranı Hüseynin.

*2.12.1997*

## QƏZƏL

*Əbülfəzl Abbasın şərəfinə*

Cəngə eləsə pərvaz tərlanı Əbülfəzlin,
Adəm nə sayaq olmaz heyranı Əbülfəzlin.

Bir əzmü səbat etdi müslimə nicat etdi,
Küfr əhlini mat etdi meydanı Əbülfəzlin.

Yol var idi, yol yoxdur, sağ var idi, sol yoxdur,
Qol var idi, qol yoxdur, var canı Əbülfəzlin.

Qol yoxsa, ayaq varsa, diş varsa, dodaq varsa,
Var, dişdə bıçaq varsa tüğyanı Əbülfəzlin.

Şöhrət də Hüseyn idi, şövkət də Hüseyn idi!
Əlbəttə, Hüseyn idi sultanı Əbülfəzlin.

Tab itdi, əcəl çatdı... Sirdaşları ağlatdı,
Munisləri dağlatdı hicranı Əbülfəzlin.

Heyfa, nər idi, getdi! Əfsus, ər idi, getdi!
Mum tək əridi getdi imkanı Əbülfəzlin.

---

* Müslim Azərbaycani - İmam Hüseynlə birgə şəhid olan yetmiş iki nəfərdən biri. Onun oğlu da həmin cəng zamanı həlak olmuşdur.

Qoy ar ola nahəqqə! İnkar ola nahəqqə,
Ruhi qovuşub həqqə ruhani Əbülfəzlin.

Bax göylərə, ey Şahin, var izləri ol cəngin,
Etmiş şəfəqi rəngin al qanı Əbülfəzlin.

*3.12.1997*

## QƏZƏL

*Sahibəz-zaman İmam Mehdinin mövludu münasibətilə*

Hərçənd ki, üz tutdu hicranə İmam Mehdi,
Bir gün girəcək hökmən meydanə İmam Mehdi.

Çıxmışsa əgər ərşə biçarələrin ahı,
Çıxmazmı çəkib nərə üsyanə İmam Mehdi?

Qəm dərd ilə çulğaşsa, haqsızlıq aşıb-daşsa,
Gəlməzmi ədalətçin tüğyanə İmam Mehdi?

Sultanlərin qəsri zülm ilə ucalmışsa,
Etməzmi həmən qəsri viranə İmam Mehdi?

Dindarə bu məlumdur, dinsiz isə bilsin ki,
Gerçəkdi, deyil əsla əfsanə İmam Mehdi.

Qərq eyləyəcək bir gün Allah rizasıyla
Kafərləri hər yanda al qanə İmam Mehdi.

Qəhrin bıçağı ilə namərdə tutub divan,
Rəftar edəcək mərdlə mərdanə İmam Mehdi.

Bərpa edəcək ədli insaf ilə aləmdə,
Meyar olacaq hər bir insanə İmam Mehdi.

Gün tək saçacaq şölə hökmən Ərəbistanə,
İranə İmam Mehdi, Turanə İmam Mehdi.

Hər zülm eləyən şahə zülm eyləyəcək haqlı,
Şahin, olacaq bir şah şahanə - İmam Mehdi.

*25.12.1998*



## QƏSİDƏ

*Altıncı imam Cəfəri-Sadiq səlamullahi-əleyhə ithaf*

Eşq ilə qiyam etdi İmam Cəfəri-Sadiq,
Gül cismini şam etdi imam Cəfəri-Sadiq.

Ömründə otuz dörd il imamət ili oldu,
Çox elmi təmam etdi İmam Cəfəri-Sadiq.

Alçalmağı lənətlədi insanlar içində,
Yüksəkdə məqam etdi İmam Cəfəri-Sadiq.

İmzasını illər boyu artırdı elmdə,
İrfanını tam etdi İmam Cəfəri-Sadiq.

Kafərlərə baş əyməməyi eylədi təlqin,
Müslümə salam etdi İmam Cəfəri-Sadiq.

Hər dəm Bəni-Abbasü Üməyyə çəkişirkən,
Bir gör nə nizam etdi İmam Cəfəri-Sadiq.

Təbliğ eləyib dinimizi aləmə yaydı,
Ən ülvi məram etdi İmam Cəfəri-Sadiq.

Hər elmi bir ahuyə əgər bənzədən olsa,
Ahuləri ram etdi İmam Cəfəri-Sadiq.

Şahin, elə eşq ilə qiyam hər əməlində,
Eşq ilə qiyam etdi İmam Cəfəri-Sadiq.

*23.02.1999*

## QƏZƏL

*Səkkizinci imam Əbülhəsən Əli ibn Musa əl-Rzanın şərəfinə*

Yoxdu imam olmağa səndə məram, ey imam.
Amma imamət sənə oldu məqam, ey imam.

Əfv elə ki, şerimi "ey" deyə ərz eylədim,
Mən sənə aciz qulam, sənsə imam, ey imam.

Bir neçə il yad edib, uyquda gördüm səni,
Sən "xudahafiz" dedin, mənsə "salam", ey imam.

Üç bacını xatirə sən gətirib ağladın,
Çünki o məsumələr almadı kam, ey imam.

Sevgili övladısan sən ki İmam Musanın,
Ömr uzunu bəslədin dinə inam, ey imam.

Doğma elindən səni sürgünə göndərdilər,
Oldu pərişan necə gör o nizam, ey imam.

Ötmədi asan gün heç də Xorasandə,
Etdi xilafət sənə qarşı qiyam, ey imam.

Fikri işıq, əqli nur, zehni ziya, qəlbi gen,
Elmi dərin, helmi çox, qayəsi tam, ey imam.

Bir neçə il mədhini gərçi xəyal eylədi,
Etdi bu Şahin bu gün şeri tamam, ey imam.

*4.06.2000*

## QƏZƏL

*12-ci imam Əbülqasim Məhəmməd ibn Həsən Əsgəri Sahibəz-zamana - İmam Mehdiyə ithaf*

Olmalı gün tək əyan Mehdi imaməz-zaman,
Körpə çağı qeyb olan Mehdi imaməz-zaman.

Şəkk eləyən yox sənə, ey əvəzi biəvəz,
Ey nişanı binişan Mehdi imaməz-zaman.

Hökmü vara hökmü var! Hökmdara hökmdar,
Hökmrana hökmran Mehdi imaməz-zaman.

Bircə Xudavənd bilir hansı məkan içrəsən,
Bəh, nə gözəl bir məkan, Mehdi imaməz-zaman.

Gəl ki zühurun ola, biz sənə bir dəm belə
Olmamışıq nagüman Mehdi imaməz-zaman.



Gəl daha, şagirdinik, et bizə ustadlıq,
Verməliyik imtahan Mehdi imaməz-zaman.

Şahin əmindir buna: Var zamanın sahibi!
Sahib olar bir zaman Mehdi imaməz-zaman.

*5.06.2000*

## QƏZƏL

*Fatimeyi-Zəhra səlamullahi-əleyhanın mövludu münasibəti ilə*

Hər surətə baxdıqca gördüm neçə mənanı,
Məna mənə öyrətdi çox rəmzü müəmmanı.

Leylalərə baş oldu, əlbət bu səbəbdən də
Tərif eləyən çoxdur eşq əhlinə Leylanı.

Ruhani məhəbbətdir sevdirdi sədaqətlə
Fərhadlara Şirini, Vamiqlərə Əzranı.

Gündüz-gecə andıqca eşq elmini, beynimdə
Nəqş oldu vəfa hökmü, qovdum neçə xülyanı.

İffətdə, məlahətdə, hörmətdə, ləyaqətdə
Fatimeyi-Zəhradır fəth eylədi dünyanı.

Peyğəmbərin övladı peyğəmbərə layiqdir,
Həzrət Əli bəxş etdi Fatiməyə sevdanı.

Zəhra elə ulduz ki, parlar işığı daim,
Dan ulduzuna döndü, mat etdi Sürəyyanı.

Tərifinədir zərrə, təbliğinədir qətrə -
Qoşsam nə qədər beyti, yazsam neçə misranı.

Ömrün boyu vəsf eylə ilham ilə, ey Şahin,
Fatimeyi-Zəhranı, Fatimeyi-Zəhranı!

*19.09.2000*

## QƏSİDƏ

*Ətağanın məzarı önündə*

Güllənməlidir hökmən gülzar, Ətağa cəddi!
Qışdırsa da, şadəm ki, gül var, Ətağa cəddi.

Dilbər Qarabağ yurdum, heyfa, qara bağ oldu,
Yurdumda edir cövlan əğyar, Ətağa cəddi.

Zülm artdı... Zühur eylər tezliklə İmam Mehdi,
Hicran daha çox çəkməz, az var, Ətağa cəddi.

Söz mülkü də virandır viranə Mədain tək,
Təmir eləyər mülkü memar, Ətağa cəddi.

İlhamı bu müştağın ilham pərisindəndir,
Qəlbimdə ona vardır ilqar, Ətağa cəddi.

Ayəmdi xeyrxahlıq, qayəmdi xeyrxahlıq,
Şerimdə mənim qayəm izhar, Ətağa cəddi.

Məyus olacaq hökmən hər vədə əgər qəsdən
Kim şerimi eylərsə inkar, Ətağa cəddi.

Var, ədlə inamım var, naəhlə qiyamım var,
Bir gün qusacaqdır qan qəddar, Ətağa cəddi.

İllər boyu boylandım qürbətdə vətən səmtə,
Yollarda gözüm qaldı, ey yar, Ətağa cəddi.

Vallah, həyatımda çox maneələr gördüm,
Billah, olacaq yollar həmvar, Ətağa cəddi.

İmansız olanlar var, daim mənəsə amma
Qəlbimdəki imandır meyar, Ətağa cəddi.

Görmürsən orucluqdur? Şair, sözü yığcam et,
Sürətlə yaxınlaşdı iftar, Ətağa cəddi.

Matəm çəkilər bir gün, hər qəm çəkilər bir gün,
Vardır qəmə, ey Şahin, qəmxar, Ətağa cəddi.

*21.02.1999*



## QƏSİDƏ

Sevdim yarı, yar dərdimə yardır, bilirəm mən,
Aşiqdə bəsirət gözü vardır, bilirəm mən.

Tərif nə gərək, ləzzəti məlumdu nübarın,
İlk busə də, aldınsa, nübardır, bilirəm mən.

Sevdasız ürəklərdə bahar fəsli də qışdır,
Sevdalı könüllərdə bahardır, bilirəm mən.

Var həzzi, sevinci, kədəri, dərdi, fərağı,
Eşq aləmi bir sirli qumardır, bilirəm mən.

Gər yurda sədaqətli adam qürbətə düşsə,
Qəlbindəki xiffətdi, qübardır, bilirəm mən.

Kəs var ki, əsən hansı küləkdir deyə bilmir,
Amma ki, səmumdur, giləvardır - bilirəm mən.

Vardır özün ustad sananlar qəzəl içrə,
Hər kim ki, bu yolda peşəkardır, bilirəm mən.

Təqlidçilərin yolları nahəmvar olursa,
Sənətdə yolum xeyli hamardır, bilirəm mən.

Meyl eyləmirəm bir də alağlarla edim cəng,
Barmaqlarım onsuz da qabardır, bilirəm mən.

Üqba deyilən aləmə getmək diləyim var,
Bu çərxi-fələk başıma dardır, bilirəm mən.

Comərd adamın azca da namərdliyi olmaz,
Namərdlik edən mərdimazardır, bilirəm mən.

Dinlə, yenə gəlməkdə külüngün səsi dağdan,
Dinlə, yenə zəncir səsi vardır, bilirəm mən.

Yarım məni Sənan kimi dindən çıxarıbdır,
Zənn eyləməyin məstü xumardır, bilirəm mən.

Bənzər dedilər almaya alma ki qələtdir,
Dinməkdə olan tar, ya setardır, bilirəm mən.

Yerdə mənə xoşdur ki, "Segah"ü "Qatar"ım var,
Durna səfisə göydə qatardır, bilirəm mən.

Yarın saçı tək gör nə uzun oldu bu şerim,
İlham pərisi gəldi, çapardır, bilirəm mən.

Şahin deyilir ismimə, amma ki pələngəm,
Caynağə keçən hansı şikardır, bilirəm mən.

*23.01.1997*

## QƏSİDƏ

*Hu! (O - yəni Allah! - Ş.F.)*

Xəlq eyləməyib aləmə insanı mücərrəd,
Bəxş eyləməyibdir ona imkanı mücərrəd.

Sən bir də mücərrəd demə öz fikrini, ey gül,
Bir gün, bunu bil, bezdirəcək canı mücərrəd.

Bir halda ki, irfanı bilir dərs kimi əzbər,
Təlqin eləmə arifə irfanı mücərrəd.

Xahiş ki edirsən, mənə üryan onu bildir,
Etmə, gözəlim, bir daha fərmanı mücərrəd.

Üstünlüyünü ərz elə şövq ilə vüsalın,
Tənqid eləmə bir dəxi hicranı mücərrəd.

Əlbəttə, mücərrədliyi var kürreyi-ərzin,
Amma, elə zənn eyləmə hər yanı mücərrəd.

Qəlbində tutan yer mənim eşqimdi həqiqi,
Mən sevməmişəm sevgili cananı mücərrəd.

Mənada olan məfhumu dərk eyləyə bilməz
Gər varsa, sanan əhd ilə peymanı mücərrəd.

Hədyan ki, deyirlər mənə, qoy müstəqim olsun,
Qoy söyləməsinlər mənə hədyanı mücərrəd.

Şeri bəzəyib əcnəbi sözlərlə lüğətdən
Şair deməsin bizlərə mənanı mücərrəd.



Kim getməsə hərgah fənafillaha* doğru,
Əlbət ki, sanır hər iki dünyanı mücərrəd.

Kim bilməsə hərgah bəqabillahı** mütləq,
Mütləq edəcək zənn təcəllanı*** mücərrəd.

Dünya ki, verilmiş bizə, gerçəkliyi vardır,
Zənn eyləmə dünyadakı dövranı mücərrəd.

Qurban ki, kəsirlər səbəbi xəlqə əyandır,
Kim kəsdi axı Məkkədə qurbanı mücərrəd.

Daş ki atılır şeytana, məlumdu nə üçün...
Daş atmayırıq vurmağa şeytanı mücərrəd.

Pünhan edilən sözləri aşkar olacaqdır,
Zənnı eyləməsinlər Baba Pünhanı**** mücərrəd.

Mail***** dedi ki, "Mailin ünvanı vətəndir",
Şahin, deyəsən Mailin ünvanı mücərrəd.

*26-27.01.1997*

## QƏSİDƏ

Şadlıqla gedib yanına əfğan ilə döndüm,
Etdikcə vüsal arizu hicran ilə döndüm.

- Əl çək, - dedi, - xahişdən, əzizim, məni tərk et,
Baş tutmadı xahiş, neçə fərman ilə döndüm.

Buz baltası söylərdi mənə cümlə görənlər,
Bir xəstəliyim yoxsa da, dərman ilə döndüm.

Hərdən səfər etdim neçə sərhədlərə doğru,
Döndüm geriyə, əhd ilə peyman ilə döndüm.

---

* Təsəvvüf elmində fənafillah - insanın dünya bağlarından azad olaraq, o Tama, o Bütövə - Allaha qovuşmaq dərəcəsidir.

** Bəqabillah - Allahın insanın daxilində təcəllası və insanın öz vücudunu Allahın varlığında yox etməsidir.

*** Təcəlla - insanın Allahın varlığını öz içində hiss etməsidir.

**** Şair Baba Pünhan

***** Şair Hacı Mail

Hər ölkəni, döndükdə, gətirdim mən özümlə.
Mən yurduma Türkiyyəvü İran ilə döndüm.

Öz yurduma qəlbimdə gətirdim neçə yurdu,
Hərdən də Dağıstan, Çeçenistan ilə döndüm.

Qəlbimdə Bədəxşan eli, əfqan eli vardır,
Zənn eyləməyin ləli-Bədəxşan ilə döndüm.

Dərvişlər ilə bir neçə ünsiyyətim oldu,
İmansız idim bəlkə də, iman ilə döndüm.

Gördüm nə qədər məşğələ alimlər içində,
Hər məşğələdən mən geri irfan ilə döndüm.

Şer aləminə baş vura bildimsə bir azca,
"Bustan" ilə, ey Sədi, "Gülüstan" ilə döndüm.

Meyxanəyə getdim mən ayıq, döndüm ayıq həm,
Nə huriyə baxdım, nə də qılman ilə döndüm.

Məclislərə getdim neçə nadan dəxi gördüm,
Getdikdə mən aram idim. üsyan ilə döndüm.

Uçdum göyə şahin kimi - ov niyyəti ilə,
Girdim suya dalğıc kimi - mərcan ilə döndüm.

Bir gün də görərlər ki, öləndən sora, Şahin,
Ruhım təzələndi, təzə bir can ilə döndüm.

*3-4.02.1997*

## QƏSİDƏ

Cananın vəslinə olmazsa əgər imkanı,
Neyləyir canını aşiq daha, çıxsın canı!

Şad edir könlümü, əlbəttə, vüsalı yarın,
Sızladır qəlbimi şairlərimin hicranı.

Məhsəti Gəncəvi tək Gəncədə yoxdur şair,
Hanı xaqanlara xaqan sayılan Xaqani?

Hanı fazil o Füzuli neçə "Divan" yazsın?
Hanı Şeyxim, o Nizamim, o nəzm sultanı?



Hanı şerin üzünü ağ eləyən Qətranım?
Görəsən biz görərikmi yenidən Qətranı?

Gələcəkmi cahana bir də Cahanşah* hökmü?
Hanı Şah İsmayılın - şah babamın fərmanı?

O Nəsimi ki, nəsimiydi şer gülşənimin,
Hanı, yoxdur o təsəvvüf bağının bağbanı.

Eşq döndərmədə düz qaməti bəzən qövsə,
Hanı Qövsi Əlican, şerimizə Qövsi hanı?

Neçə şair kimi Sayib dəxi Təbrizdəndir,
Şerdə qüdrəti məşhur eləyib İranı.

Hanı Seyyid, hanı Mirzə Ələkbər Sabir?
Hanı bəs Hadi ki, məşhur eləsin Şirvanı?

Natəvan idi qəzəl reyhanı, ey şairlər,
Nə zaman xəlq olacaq bir də qəzəl reyhanı?

Məndə yoxdur buna şəkk, bir daha peyda olmaz
Zülfüqar ilə, Məsih ilə, Bədr Şirvani.

Bənzədən var elə şairlərə bəzən özünü,
Həddini aşmadadır öyləsinin hədyanı.

Bəzi şairlərimiz onları təqlid eləyir,
Boş görünməkdədi amma ki, şer meydanı.

Yenə xəlqim qəzəlin anlaya bilmir dilini...
Yenə mən başlayıram mərəkəni, tüğyanı.

Təbi bir sısqa bulaqdan da zəifdir, amma
Zənn edən var ki, yaratmış kimidir ümmanı.

Söyləyən var ki, bu şair yeni Sabirdi bu gün,
Buna yox, Sabirə sən atma, canım, böhtanı!

Ya, deyirlər ki, Seyiddir bu! İmansızlıqdır!
Kim ki haqsız danışır, yanmalıdır imanı.

---

* Məşhur Qaraqoyunlu hökmdarı və şairi Cahanşah Həqiqi

Özün ol hər nə olursansa, budur düzgün yol,
Qurban olsan da, buyur, ol bu yolun qurbanı.

İzin üstüylə gedən kəs görə bilməz izini,
Adi hər daş əvəz eylərmi məgər mərcanı?

Söyləyən var mənə hərdən "Sənə nə, kim nə yazır,
Ey qəzəlxan, daha tərk et qiyamı, üsyanı".

Zar olub inləyirəm mən, a qəzəlxanlarımız,
Edirik biz axı təmsil Azərbaycanı.

Etmişəm mən nə isə dərdə giriftar özümü,
Yaxşısı, vəcdə gəlib vəsf eləyim cananı.

Dinlədikcə səni heyran oluram, dildarım,
Görmürəm səndə qəzəlxanda olan nöqsanı.

Sənə qibtəylə baxan Şahinə qibtəylə baxır,
Oluram mən sənə heyran olanın heyranı.

*14-20.03.1997*

## QƏZƏLLƏR

Məskənim daşdı, kəsəkdir mənə bundan sonra,
Yaşamaq çöldə - diləkdir mənə bundan sonra.

Qaçıram baş götürüb qəlbidaş insanlardan,
Sərt qaya sanki ipəkdir mənə bundan sonra.

Var isə quli-biyaban da biyabanda əgər,
Sanaram mən ki, mələkdir mənə bundan sonra.

Məni divanə edib çöllərə saldın, gözəlim,
Daha zəncir gərəkdir mənə bundan sonra.

Sinəm üstündə dumanlar daha yorğanımdır,
Quru torpaqsa döşəkdir mənə bundan sonra.

Əl qopubdur ətəyindən, daha yox fərqi, yerim
Zirvədir dağda, ətəkdir mənə bundan sonra.

Yarağım oldu qələm bir neçə vaxt, indi isə
Bir çomaqdır, dəyənəkdir mənə bundan sonra.



Oxudum bir neçə əfsanəsini Məcnunin,
Mənəvi vəsl bəzəkdir mənə bundan sonra.

Mən alağ sözləri atdım qəzəlimdən, Şahin,
Hər sözüm sanki çiçəkdir mənə bundan sonra.

*6.10.1995*

***

Məni, şadəm ki, çağırmış təzədən yar bura,
Daha bundan belə hər gün səfərim var bura.

Səsləyərmi görəsən bülbülü gül məqsədsiz?
Ya, səbəbsiz yerə səslərmi səbəbkar bura.

Keçən il hər yanı solmuşdu bu pakizə yerin.
Allahım, bir daha qoy dəyməyə azar bura.

Dəmbədəm göylərə qalxsın, havalansın nəğmə,
Etməsin zərrəcə aşiqlərini zar bura.

Bu bağın üstünə ruzi düşə zənbil-zənbil,
Bağiban, kaş yağa ulduz qədəri var bura.

Gəlmişik biz, ey ətirçi, bu gülüstanə yenə,
Səni gül şövqü gətirmiş, məni dildar bura.

Məskən olsun bura aşiqlərə, Şahin Fazil,
Qədəmi dəyməyə, layiq deyil əğyar bura!

*8.10.1995*

***

Ürəyim öylə böyük ki, demə əsla balaca,
Edirəm zənn ürəyimdən hələ dünya balaca.

Ortabab aşiqə dönmək ki deyil niyyətimiz.
Ya böyük olmalı aşiqliyimiz, ya balaca.

Düşmüşük bir neçə ildir böyük eşqin yoluna.
Böyük eşq əhlinə xas olmadı sevda balaca.

Gözəlim, eşqimizin tarixi var gör nə böyük...
Qeysi sevmişdi olarkən hələ Leyla balaca.

Sənə dağ boyda, gülüm, sevgi təmənna edirəm,
Ola bilməz sənə qəlbimdə təmənna balaca.

Boş təxəyyüldən uzaq dilbərim oldun gerçək,
Sən xəyal əhli deyilsən, sənə xülya balaca.

Eşq dəryasını kin dalğası hərdən döymüş,
Eşq dəryası böyük, amma ki, dalğa balaca.

Bəzi misramə qərəzlə qoyan "əmma" tapılır,
Şerimin siqlətinə amma ki, "əmma" balaca.

Gər müəmma duyulur saf qəzəlimdən arabir,
Belə aydınlıq önündə o müəmma balaca.

Şahinin şer bağında neçə məna gülü var,
Kaş onun olmaya şerindəki məna balaca.

*10.01.1996*

***

Olacaq yer üzü göyçək neçə ildən sonra,
Buna heç eyləməyin şəkk! Neçə ildən sonra.

Dediyim kəlmələrin heç biri əfsanə deyil,
Görərik biz bunu gerçək neçə ildən sonra.

Yerdəki əyriliyi yaxşıca göstərməkçin
Çaxacaqdır neçə şimşək neçə ildən sonra.

Bu rəzalət tozunu silmək üçün aləmdən,
Geyilər əllərə əlcək neçə ildən sonra.

Hələlik dolmayan hər qəlbə məhəbbət, sevgi,
Olacaq aləmə örnək neçə ildən sonra.

Demə, rəssam, bu gözəllikdə gözəl dilbər yox,
Sən onun surətini çək neçə ildən sonra.

Dağ uzaqdan görünür gözlərə yüksək, Şahin,
Görəcəklər məni yüksək neçə ildən sonra.

*15.02.1996*

***

Can ayrı ağlamaqdadı, canan ayrıca,
Əhd ayrı ağlamaqdadı, peyman ayrıca.

Çarə tapammayır deyə günlərlə loğmanım,
Dərd ayrı ağlamaqdadı, dərman ayrıca.



Sən ki, mənimlə tərk elədin badə içməyi,
Mey ayrı ağlamaqdadı, fincan ayrıca.

Aludə olmadın zərə, daş-qaşə uymadın,
Dürr ayrı ağlamaqdadı, mərcan ayrıca.

Getdin hara, qayıt geriyə, gör ki qüssədən
Bağ ayrı ağlamaqdadı, bağban ayrıca.

Kövrəldi əmr, bir neçə yol xahiş ağladı,
Hökm ayrı ağlamaqdadı, fərman ayrıca.

Yusif ki iftirayə düşüb düşdü zindana,
Misr ayrı ağlamaqdadı, Kənan ayrıca.

Düşdü iki ərəb iki dildardən kənar.
Qeys ayrı ağlamaqdadı, Sənan ayrıca.

Şahin, gələydi vəsl yenə, söyləyəydilər:
- Hicr ayrı ağlamaqdadı, hicran ayrıca.

*11.04.1996*

***

Əldə iki zər var, vəfa nərdi yanımda.
Bir kuzə şərab, bir də ki dilbərdi yanımda.

Daş-qaşə, zərə, zivərə meyl etmədim əsla,
Bir paslı dəmir zərlə bərabərdi yanımda.

Əyyaşlərin məclisi çəkmir məni bir dəm,
Əğyar müsəlmansa da, kafərdi yanımda.

Xosrovlara xas nəşə uzaqdırsa da məndən.
Fərhadlərin qəm-kədəri, dərdi yanımda.

Eşq ordusunun Qeys kimi üzvü çox olmuş,
Mən zabitəm, onlar isə əsgərdi yanımda.

Həmkarım olubdursa da mərdanə adamlar.
Hərdən görürəm bir neçə namərdi yanımda.

Kabulda silahım var idi, orda da qaldı.
Şamdır və qələmdir, neçə dəftərdi yanımda.

Var bircə təmənnam fəqət səndən, İlahi,
Lütf eylə, görüm mən həmişə mərdi yanımda.

Əzm eyləmərəm bir də sənin bağına, bağban,
Yarım təzədən lalə-sənubərdi yanımda.

Eşqində görüb yandığımı söylədi canan:
- Şahinmi bu, şahin nə, səməndərdi yanımda!

*26.04.1996*

***

*Şair Ənvər Nəzərliyə*

Eləsən sirrini agah sən əgər başqasına,
Başqası sən dediyin sirri deyər başqasına.

Mən "həqiqət" deyib hər yerdə qiyam eyləyirəm,
Məsləhət görməyirəm yağdıra şər - başqasına.

Söz bağımdan nə zərurətsə aparsınlar qoy,
Mane olsun nə gərəkdir ki çəpər başqasına.

Mənfəət arzulayıbdır ürəyim hər fərdə,
Narahat olmadayam dəysə zərər başqasına.

Dustlər, hali edin qüssə-kədər ləşkərini,
Yetməsin məndən ötüb qüssə-kədər başqasına.

Ey həsəd sahibi, dərvişliyimə etmə həsəd,
Sakin olmaq sənə qismətdi, səfər başqasına.

Olmasa yaxşı idi qarə qızıl ölkəmdə,
Uzun illər boyu zər verdi Xəzər başqasına.

Neçə gündür ki susub, şer oxumur məclisdə,
Şair üstünlüyü vermişmi məgər başqasına.

Dostunam xeyli səmimi, məni sən xar eləmə,
Ənvəra! Dostu qoyub etmə nəzər başqasına.

Əsl Aşiq özüməm, başqası göz çəksin qoy,
Şahina, car elə, yetsin bu xəbər başqasına.

*3.07.1996*

***

Sən dinlə məni, mən danışım, yar, danışma.
Dillənmə, sənə xeyli sözüm var, danışma.



Xoş bir görüşün təyini nə, təxiri nəydi?
Kimdir bu işə öylə səbəbkar, danışma.

Lap qopsa da tufan, məni xar etməməliydin,
Etdin məni birdən-birə sən xar, danışma.

Birdən-birə bir təsdiqi inkar elədin sən,
Bir gün də edərsən məni inkar, danışma.

Düz söz və həqiqət səni etmişdi vəfalı,
Oldun yalana indi vəfadar, danışma.

Gizlət dilini dişlərin altında, sükut et,
Ol çarə mənə, yoxsa ki naçar danışma.

Bir şübhə gəmirmişdi mənim qəlbimi qurd tək,
Yol vermə gəmirsin onu təkrar, danışma.

Səbrim ki daralmış gözü tək iynənin, indi
Etmə başıma gen cahanı dar, danışma.

Şahin belə söylər sənə: Qoy hər zaman olsun
Düzlük sənə meyar, mənə meyar, danışma.

*28.07.1996*

***

Elə kəs var ki, yaxır yarə qara,
Olmasın qismət o dildarə qara.

Qara xal düşmüş idi, indi isə
Düşəcəkdir ürəyə yarə qara.

Çox qalıbdırmı görən ağ günümə,
Qara gün gördü bu biçarə, qara.

Görmərəm, ey pəri, ağ gün sənsiz,
Yazılar dərdlərimə çarə qara.

Səni görcək qaralıb göydə günəş,
Olacaq indisə ayparə qara.

Elə ağsan ki, həsəddən bir gün
Olacaqdır gecə səyyarə qara.

Çəkmisən sürmə qara gözlərinə,
Yaraşır gözləri xummarə qara.

Qaralıb qövsi-qüzeh heyrətdən,
Ağ qara, mavi qara, qarə qara.

Gəlmədin, soldu çiçəklər, güllər,
Elə bil endi çəmənzarə qara.

Darə çəkdirdi fələk Mənsuri,
Bağlasınlar fələyə, darə qara.

Sevinən yox daha bayramlarda,
Girməyir ciblərə bir parə qara.

Bu nə bayram, bu nə rəngdir, nə şüar?
Yaxacaqlar yenə divarə qara.

Qəbrimə baş daşı hazırlasalar
Demişəm rəngini dildarə qara.

Cahilə getmə yaxın, ey Şahin,
Elə kəs var ki, deyir qarə qara.

*24.11.1996*

***

Can qoyubdur bu qəzəl sahibi yar uğrunda,
Canı yoxdur daha, tərk oldu nigar uğrunda.

Deməsinlər dəli sevdadə tək olmuş Məcnun,
Dəlilik eylədi Sənan da Xumar uğrunda.

Uduzan ömrü mənəm sevgi üçün, cahil var
Uduzur hər nəyi vardırsa qumar uğrunda.

Ömrümün getdi baharı, yetişib qış fəsli,
Yenə əlləşmədəyəm amma bahar uğrunda.

Oxudum bir daha Mənsuri, sübut oldu mənə
Can veribdir o hünər sahibi dar uğrunda.

Sevgi güllərdə, çiçəklərdə də var, otda da var,
Sarmaşıq ərşə qədər qalxdı çinar uğrunda.

Əllərimdə bu qabarlar nə suluğlanmışlar?
Mən qələm tutmadayam sanki qabar uğrunda.



Şahinəm, hifz edirəm eşqimi dürdanə kimi,
Var-yoxumdan keçərəm mən belə var uğrunda.

*29.11.1996*

***

*Abbasqulu ağa Bakıxanovdan ilhamlanaraq*

Gördüm səni, ey dilbər, dilbərlər arasında,
Sanki görünür gövhər gövhərlər arasında.

Eşq ordusunun çox var əsgərləri, mən - zabit,
Zabit dayanıb şəstlə əsgərlər arasında.

Dağ-daş mənə qalsın qoy, kol-kos mənim olsun qoy,
Yarım, yerisən yaxşı məxmərlər arasında.

Leylalərə rəhbər sən, Məcnunlara rəhbər mən,
Bilməm niyə sülh olmur rəhbərlər arasında?

Dəftər yazıram, dəftər dönmür kitaba, neynim,
Ötməkdə günüm hər gün dəftərlər arasında.

Saf şeri cilalanmış bir mərmərə bənzətdim,
Mərmər görə bilmirsən mərmərlər arasında.

Yazdıqlarını qəsdən tənqid eləyirlərsə,
Şair də müsəlmandır - kafərlər arasında.

Daş yağdı mənə küncdən, sərt oldu hücum, eyvah,
Yumşaq olanı yoxmu qənbərlər arasında?

Aqillərimiz çoxmu şairlərimiz içrə?
Adillərimiz yoxmu Səncərlər arasında?

Döndüm o yana - xəncər, çöndüm bu yana - xəncər,
Neynim ki, qalıb cismim xəncərlər arasında.

Hər bir qəzəlim balmı, şərbətmi? Deyil əfsus,
Əlbət zəhər həm vardır şəkkərlər arasında.

Təqlidçilərə rəğbət bir damcı da yox məndə.
Bərbər elə bərbərdir bərbərlər arasında.

Su! Təşnəliyim vardır, hey "su" deyibən yandım
Qudyallar arasında, Tərtərlər arasında.

Şerim gələcək dövrün şeri olacaq, Şahin,
Zərgər seçə bilmir zər zərgərlər arasında.

*18-19.02.1997*

***

Sünbül nədi zülfün kimi sünbül qabağında?
Gül düşdü nəzərdən, a gülüm, gül qabağında.

Səndən, a şirindillim, uzaqkən acıdildim,
Dil şəkkərə dönməkdə şirindil qabağında.

Qürbətdə vətən nisgilinə mən necə dözdüm?
Cismim dözə bilməz daha nisgil qabağında.

Təbim iti bir çay idi, qəm sahilə döndü,
Çay neyləyəcəkdir axı sahil qabağında?

Yaş əllini ötdü, ağarıb baş, əyilib bel,
Mən neyləyə billəm bu qədər il qabağında?

Əğyarı pəsənd etmədi fazil bu qəzəlxan,
Bir yol da xəcil olmadı cahil qabağında.

Şahinliyi çox kəs bacarar, şərt bu ki, Şahin
Bülbül kimi cəh-cəh vura bülbül qabağında.

*21.03.1997*

***

Hər dəmim dərd diləyir qüssəvü qəmdən başqa,
Olmasın dəm mənə qismət belə dəmdən başqa.

Ən böyük qəm əsl aşiqlər üçün - qəmsizlik!
Vermə heç nə mənə, ey Rəbb, sitəmdən başqa.

Nə böyükdür gözümün dərdi - gülüş qeyb oldu,
Gözümün munisi yoxdur daha nəmdən başqa.

Yanıram mən də, yazırlar Kərəm haqqında fəqət,
Başqa bir aşiqimiz yoxmu Kərəmdən başqa?

Yaşımın çoxluğu yoxdursa da, itkim çoxdur,
Mən itirdim neçə sirdaşı nənəmdən başqa.

Zahid, əmmamə qoyubsan başına yoxsa kələm?
De görüm, başda nə vardır o kələmdən başqa?



Mən nə təsbeh, nə də canan əlini istəyirəm,
Şahinəm, istəmirəm heç nə qələmdən başqa.

*18.04.1997*

***

Dəydi mizrab simə, eylədi hər pərdə səda...
Səslən, ey tar, əlac olmalıdır dərdə səda.

Nəğmə avazını istər ürəyim, söz səsini,
Nə gərək sikkədə cingilti mənə, zərdə - səda.

Dinləyirsənmi əzan vaxtı müəzzinləri sən,
Tut qulaq, vaiz edir şövq ilə minbərdə səda.

Tutmuşuq əldə zəri yar ilə nərd şövqüylə,
Yenə nərdtaxta açıldı, düşəcək nərdə səda.

Daha ox uçmaya, ey kaş, qılınc qında qala!
Xəncərə dəyməsə mümkündümü xəncərdə səda?

Doğrunun, doğruluğun hacəti yox isbatə,
Çox həqiqətdə sükut var isə, var şərdə - səda.

Dərvişin, rövzəxanın çox qulaq asdım səsinə,
Şahini neydə nəva çəkdi, qələndərdə səda.

*2.07.1997*

***

Qalmışam mən yenə yarın fərağı altında.
İnlərəm vəslimizin səs-sorağı altında.

Bağdən kim ki aparmış gülümü, xar olsun,
Qoy tikan bitsin o şəxsin ayağı altında.

Gözəlim, bir-birimizdən soyumaq mümkünmü?
Yenidən qalmışıq eşqin sınağı altında.

Darayırsan məni hər yerdə, bu işdən əl çək,
Kaş olaydım başının mən darağı altında.

Düşmüşəm mən yenidən təqibinə əğyarın,
Nə gözəl sillə yeri var qulağı altında.

Dikmişəm göz, gecədir, ay ilə ulduzlara mən,
Durmuşam asimanın çilçırağı altında.

Ey müsəlman, aramızda yenə yoxdur birlik,
Yığışaq bir yerə dinin çırağı altında.

Ocağı sönsə də təbin təzə "Divan" yazdı,
Şahinin köz görünübdür ocağı altında.

*15.09.1997*

***

Gül də var, qönçə də var, bülbülü yoxdur amma,
Elə bülbül dəxi var ki, gülü yoxdur amma.

Gəzirəm bağdə ki, meyvəsi zənbil-zənbil,
Bağiban var, onun zənbili yoxdur amma.

Hər çayın sahili vardır, bunu inkar etməm,
Eşq dəryaçəsinin sahili yoxdur amma.

Kəndiri yoxsa da ulduz asılıbdır göydən,
İşığı var qəmərin, naqili yoxdur amma.

Özünə bir neçə cahilsə fərasətli deyir,
O fərasətlilərin aqili yoxdur amma.

Elə iş var ki, ədalətdən əsər görsənmir,
Qətli vardır çoxunun, qatili yoxdur amma.

Deyəcək yar çəkib ah mən öləndən sonra:
- Var qəzəllər, qəzəlin Fazili yoxdur amma.

*17.09.1997*

***

Yarım, dayanıbdır yenə hicran aramızda,
Vəsl etməyə yoxdur daha imkan aramızda.

Ey Tanrı, mələk hardadı imdadə yetişsin,
İş gördü siyasət ilə şeytan aramızda.

Göz yaşları yox, sellər axır gözlərimizdən,
Mümkün ki, yaranmış ola ümman aramızda.

Bax halıma, kafər də mənim halıma yandı,
Kafərmi hamı, yoxmu müsəlman aramızda?

Sanki yeni Fərhad ilə Məcnun özüm oldum,
Dağ bitdi, əyan oldu biyaban aramızda.



"Məcməş-şüəra" katibi sultandı əzəllər,
Qan-yaş axıdır indi bu sultan aramızda.*

Qoy həsrətə həsrət qala hər sevgili, yoxdur
Şahin kimi həsrətli qəzəlxan aramızda.

*21.09.1997*

***

Asiman dərvişə yarpaq boyda,
Görürəm Şahdağı dırnaq boyda.

Mən bu boyda yerə yerləşməyirəm,
Mənə göyqurşağı qurşaq boyda.

Qolunu ver mənə, töhfəm vardır,
Qəmərin çevrəsi qolbağ boyda.

Qayıdandan bəri yarım yanıma
İlhamım, təbim olub dağ boyda.

Qələmim bağda ağaclar qədəri,
Mənə dəftər gətirin bağ boyda.

Kədərim iynə ucundan balaca,
Həsrətim qalmadı oymaq boyda.

Həzzimiz gülşənə sığmır, ey gül,
Dərdimiz bir dənə zanbaq boyda.

Saqi ol, eşq meyi içmək dilərəm,
Ver qədəh Şahinə bardağ boyda.

*29.09.1997*

***

Sevmirəm rəqs havası, istəyirəm "Cəngi" ola,
Qoy bu "Cəngi" deyənin düşmən ilə cəngi ola.

Bağiban, mən o səbəbdən yazıram bağda şer.
Sözlərin ətri ola, rayihəsi, rəngi ola.

Çalmaya heç kimi heç kim, gözəlim, gürzə kimi,
Çalınan qoy gecə-gündüz qapımın zəngi ola.

* Bu qəzəl yazılan vaxt mən "Məcməüş-şüəra" ədəbi məclisinin katibi idim - Ş.F.

Nə şərab istəyirəm mən, nə kəbab, ey saqi,
Yenə Qəçrəş bağının yemliyi, turşəngi ola.

İndi dünya dəyişibdir, təzəlik istəyirəm,
Tazə Şah İsmayıla tazə Ərəbzəngi ola.

Şahinin var yeni ahəngi qəzəl mülkündə,
Elə söz söylə ki, şerin yeni ahəngi ola.

*23.10.1997*

***

Aşiqin gör necə düşmüş yenə sevda başına,
Əl atıb ya dizinə döymədədir, ya başına.

O qədər yaş axıdıb göz ki, yaratmış dərya,
Üzübən çatmalıyam indisə dərya başına.

Keçmədən dərsini eşqin olan aşiq vardır,
Açacaqdır nə oyun gör ki, bu xülya - başına.

Əcnəbi kəlmələri hey döşəyən var vərəqə,
Çox əməllər gələcəkdir hələ misra başına.

Çox oyunbazlıq edirlər hədəri, üqbadə
Gələcəkdir çox oyunlar neçə molla başına.

Havalanmış düşərək şövq ilə eşqə Məcnun,
Gəlməyib bəs nə səbəbdən hava Leyla başına?

Səpmək üçün külünü Şahini yandırsınlar,
Kül töküm mən bu üsul ilə, a dünya, başına.

*24.12.1997*

***

Edərəm çox xeyir işlər o Xeyirxah qoysa,
Gülərəm mən dəxi bir gün, gözəlim, ah qoysa.

Ya da, timsah tökür göz yaşını, mən də o cür
Tökərəm ümmana göz yaşımı timsah qoysa.

Yaxşı öyrənməli - şahmat oyunu hikmətdir,
Bəlkə də adi piyadə şah olar şah qoysa.

Sirr çoxdur, onu faş etməyə şeytan qoymur,
Edərəm aləmi çox sirrdən agah, qoysa.



Hamının səhvi olur təkcə Xudadən qeyri,
Edərəm səbr ilə hər səhvimi islah, qoysa.

Dilə yad kəlmə gərəksiz elə ünsür kimi ki,
Baş həkim heç nə itirməz məni cərrah qoysa.

Şahin, "Allah" deyib yazmadayam hər şeri,
Yeni "Divan"ım olar çap əgər Allah qoysa.

*21.06.1998*

***

Matəm ki, yananlar var meyxanə sorağında,
Şadəm ki, canım yanmış cananə sorağında.

Biganələrə qarşı biganəliyim çoxdur,
Görmüş məni kim bir dəm biganə sorağında?

Çox yaxşı ki, çox yerdə sərraflığım məlum,
Çox dürrə yanan oldum dürdanə sorağında.

Mən Lənkərana getdim dostlar ilə üns üçün,
Hərdən də ayaq basdım İranə, sorağında.

Tapmaq diləyim vardır Məcnun uyuyan qəbri,
Mərdanə olar daim mərdanə sorağında.

Var olmasına şəkkim yoxdur ulu Fərhadın,
Mən olmamışam, billəh, əfsanə sorağında.

Pərvanəmi yandırdım bica yerə, ey Şahin,
Şam tək yanıram indi pərvanə sorağında.

*31.12.1998*

***

*Şair dostum Əlisəftər Nailə*

Yar, yar, yar çıxır qarşıma,
Var, var, var çıxır qarşıma.

Hal əcəb oldu xoş, ey tarzən,
Tar, tar, tar çıxır qarşıma.

Görmədəyəm amma ki, əğyarlər
Zar, zar, zar çıxır qarşıma.

Mənsuru gördüm yuxuda, söylədi:
"Dar, dar, dar çıxır qarşıma".

Qeys deyindi Ərəbistandə:
"Qar, qar, qar çıxır qarşıma".

Şahina, heç qorxmayıram, ley cumur,
Sar, sar, sar çıxır qarşıma.

*20.02.1999*

***

Ey şəm, əgər yansan pərvanəni yandırma,
Ey can, əgər odlansan canənəni yandırma.

Ey çərxi-fələk, cəhli cəng atəşinə qərq et,
Döndər külə namərdi, mərdanəni yandırma.

Bütxanəsə gər qəlbim, yarım isə bütdürsə,
Bir büt yaşayır məndə, bütxanəni yandırma.

Var nanədə, ey bağban, yarın telinin ətri,
Yandır alağı yansın, sən nanəni yandırma.

Dönsün ciyəri qanə! Mey verməyib, ey saqi,
Məstin atasın yandır, məstanəni yandırma.

Səhrayə yolum düşsə, ey gün, məni yaxsan da,
Məcnun kimi əql əhli divanəni yandırma.

Ey Şahin, əgər mürtəd zahidlərə qəsd ilə
Məscidə alov vursan meyxanəni yandırma.

*22.02.1999*

***

Səbr et ki, ötər şaxtalı rüzgar, darıxma,
Sevda çəmənində əriyər qar, darıxma.

Yox şübhə ki, mənsiz darıxıb qüssələnirsən,
Əlbəttə, mənim həm kədərim var, darıxma.

Aşiq çox olub, indi isə növbə bizimdir,
Dünyamıza eşqi edərik car, darıxma.

Dərd əhli deyən bizlərə bilsin bunu yaxşı:
Dərd əhli olar həzzə giriftar, darıxma.



Ey gül, başını qaldıracaqsan göyə doğru,
Bülbül də müdam olmayacaq zar, darıxma.

Vallah, fərağın başına daş atarıq biz,
Billah, edərik təkliyi inkar, darıxma.

Şahin, neçə müddətdi ki, viranədi könlüm,
Abad eləyər viranı memar, darıxma.

*Lənkəran, 4.04.1999*

***

Olmaz dəyəri vəslin hicranım əgər yoxsa,
Dərdim məni məhv eylər dərmanım əgər yoxsa.

İlham alıram sözdən, söz meydanı - meydanım,
Bir gün düşərəm gözdən meydanım əgər yoxsa.

Ox tək qələmim vardır, xəncər kimi barmağım -
Nizəm, əmudum, gürzüm, qalxanım əgər yoxsa.

Ölkəm ulu eşq mülkü, dildar isə sultanım,
Başsız qalacaq ölkəm sultanım əgər yoxsa.

Onsuz mənə dövran yox, amma sürərəm dövran
Dürrüm əgər olmazsa, mərcanım əgər yoxsa.

Məddah olan hər şəxsə üsyan eləmək - meylim,
Qul tək olaram müti üsyanım əgər yoxsa.

Varsa əgər imkanım sevda - mənə məqsəddir,
Şahin, ölərəm şəksiz imkanım əgər yoxsa.

*18.04.1999*

***

Hər kəs başını əysə canənə qabağında,
Sanki şam edir səcdə pərvanə qabağında.

Fərsizdi bu zərgər, ya dürdanə dəyərsizdir?
Laqeyd durub zərgər dürdanə qabağında.

Əfsanəyə aldanma, ey dil, nə qədər sağəm,
Gerçəkliyə müştağəm əfsanə qabağında.

Şahanəliyim artır miskinləri gördükdə,
Miskin necə xar olmaz şahanə qabağında?

Qiymət verə bilmirsə namərd mənə, şadəm,
Mərdanəliyim bəlli mərdanə qabağında.

Bülbüldə ağıl gördüm gülşəndə deyir nəğmə,
Bayquş oxuyur amma viranə qabağında.

Yoxdursa əgər qorxun dur gəl görüşək, əğyar,
Şahin səni gözlər məst meyxanə qabağında.

*Lənkəran, 4.06.1999*

***

Adəmə - heyrət evi, arifə - hikmət dünya,
Aşiqə - eşqi sübut etməyə fürsət dünya.

Səni qəsb etməyə minlərlə savaş baş vermiş,
Səni məhv eyləyəcək böylə siyasət, dünya.

Bilirik, qalmamısan Daraya, İsgəndərə də,
Torpaq üstündə nədir bəs bu cəhalət, dünya?

Nə qədər yurdu səyahət elədim illərlə,
Məni məyus eləyibdir o səyahət, dünya.

Əfqanıstan kimi bir ölkə fəlakətdə bu gün
Və Fələstində də artmaqda fəlakət, dünya.

Niyyətim heç də deyildir səni tənqid eləyim,
Niyyətimdir ki edim iblisə lənət, dünya.

Nə qədər cahilə bəxş eylədi minlərlə sevinc,
Nə qədər alimə verdi əziyyət dünya.

Mənə od vursa əgər yandıraram dünyanı,
Şahinəm, eyləməsin mənlə zərafət dünya.

*25.09.1999*

***

Yetməsəm vəslə, qətl xoşdu sağ olmaqdansa,
Gəl yaxın, cismimi öldür uzaq olmaqdansa.

Qələmin verdiyi həzz üstünüdür həzzlərin,
Qələm olmaqdı münasib, bıçaq olmaqdansa.

Elə şair görürəm təbi sönükdür, sözü az,
Şəm timsalı sönür çılçıraq olmaqdansa.



Hücum olsa mənə haqsız - yanaram, yandıraram,
Ocaq olmaq dilərəm mən bulaq olmaqdansa.

Zar olum haqlı olan şəxsi zar etməkdənsə,
Xar olum cahilə, cəhlə dayaq olmaqdansa.

Heç zaman olmamışam olmaram alət əldə,
Çoban olmaq daha üstün çomaq olmaqdansa.

Yuxuda hər gecə cənnət görürəm dünyanı,
Yuxlamaq yaxşıdı, Şahin, oyaq olmaqdansa.

*3.10.1999*

✦✦✦

Dərdini ver mənə dərmanı özünçün saxla,
Çarəsiz qoy məni, imkanı özünçün saxla.

Aşiqin hicranı hicranıdı sən tək mələyin,
Mənə gəl söyləmə "hicranı özünçün saxla".

Ismayıl kimdi axı, sahibisən meydanın,
Ey Ərəbzəngi, o meydanı özünçün saxla.

Saqini ver mənə, təklikdəyəm, ey meyxanaçı,
Qədəhi çək bəri, qəlyanı özünçün saxla.

Əzrayıl, eşqim əgər ölsə, gəl öldür məni sən,
Neynirəm canımı, al canı, özünçün saxla.

Mənə təklif eləsə seçməyi dünya, deyərəm:
- Ver qarışqanı, Süleymanı özünçün saxla.

Kimsəyə vermə kəsib Şahini qurbanlıqda,
Onu qurban elə, qurbanı özünçün saxla.

*Lənkəran,5.11.1999*

✦✦✦

Yenə sənsizləmişəm mən, gözəlim, gəl yanıma,
Şahinəm, göydü yerim, sən dəxi yüksəl yanıma.

Şənliyim olmayacaq heç də mükəmməl sənsiz,
Gəl yetiş, dərdü bəla gəldi mükəmməl yanıma.

Sənə səcdə eləməkçin əli hey qaldırıram,
Gəlməsən, bil ki, bu saət düşəcək əl yanıma.

Düşərək yanına yarın yanıma sən dəxi gəl,
Gətirən yoxdu nə vaxtdır, nənə, xəngəl yanıma.

Görüşə var eləsi getmədə tənbəl-tənbəl,
Gözəlim, gəlməyəcəksən elə tənbəl yanıma.

Bilirəm, dərsini eşqin çıxarıbsan yaddan,
Elə izah gəlib eşqi müfəssəl yanıma.

Yandıran yoxdu mənim təbimi, hər dəm sönürəm,
Şahinəm, yanmalıyam gəlsə o məşəl yanıma.

*Quba,11.11.1999*

✦✦✦

Əlim, ey yar, yetişməz sənə bundan sonra,
Bir də olmaz mənə ol təntənə bundan sonra.

Məni sıxmaqda həyatın əli, boğmaqda qolu,
Olacaqdır bu həyat məngənə bundan sonra.

Kiprik asudə olur göz yaşı düşdükcə yerə,
"Ağlama" söyləməsinlər mənə bundan sonra.

Məni gümrah aparsın yanına Allahım,
Düşəcək diş, əsəcəkdir çənə bundan sonra.

Yaşadım bir neçə müddət sənin hicrinlə, gülüm,
Boynuma xəncəri hicrin enə bundan sonra.

Nə gərək Şahinə sənsiz bu ömür, gəl və üfür,
Ömrümün şəmi yanır, qoy sönə bundan sonra.

*20.03.2000*

✦✦✦

Elə ki sevgili canənə gəlir qarşınıza,
Elə bil gül yüyürür, nanə gəlir qarşınıza.

Ey ağıldan danışanlar, gəlirəm, indi ələ
Götürün daş ki, divanə gəlir qarşınıza.

Mən qəliz dildə yazan şairə divan tuturam,
Bu qəzəl sahibi mərdanə gəlir qarşınıza.

Onu meyxanədə saqi gecə mehman eləmiş,
Mey içibdir yenə, məstanə gəlir qarşınıza.



Oxuyun, nəğmə dirildir məni, bu nəğməpərəst
Təzədən gəlmək üçün canə, gəlir qarşınıza.

Mən səmimiyyətə məftun adamam, yaxşı baxın,
Bu sevən kəs nə səmimanə gəlir qarşınıza.

Şahin istər yana, yandırmağa cəhd eyləməyir,
Yandırın tez şamı, pərvanə gəlir qarşınıza.

*Moskva, 26.04.2000*

✦✦✦

Güləcək gözlərimiz gün ağ olandan sonra,
Günümüz gün sayağı parlaq olandan sonra.

Saçlarım qar kimi hər ləhzə ağarmaqda mənim,
Qarabağ məskəni qarə bağ olandan sonra.

Eybi yoxdur, gələrəm mən özümə inşallah,
Dırnağım göz çıxarar caynağ olandan sonra.

Kim deyir insan ölür, yox, dəyişir dünyanı,
Cismə ölmüş deməyin ruh sağ olandan sonra.

Soyun, ey nazəninim, qönçə kimi paltarını,
Qönçəyə gül deyilir çılpağ olandan sonra.

Ayrıla bilməyəcək eşq odunun sehriylə
Qolların qollarıma qaynağ olandan sonra.

Bir daha badə-filan gəlməyəcək ortalığa,
Saqi dərdü qəmimə ortağ olandan sonra.

Tər qəzəl gülləri baş qaldıracaq qəbrimdən,
Şahina, mən bir ovuc torpağ olandan sonra.

*5.07.2000*

✦✦✦

Daşacaq çay kimi sevda mən öləndən sonra,
Aşacaq sahili dərya mən öləndən sonra.

Yanıram atəşinə, indi cəhənnəmdi mənə,
Dönəcək cənnətə dünya mən öləndən sonra.

Tapıram mən elə məna onu surət görmür,
Tapacaq surəti məna mən öləndən sonra.

"Şerimizdən dilə yad kəlmə atılsın", bu tələb
Olacaq şövq ilə icra mən öləndən sonra.

Arabir qibtə, həsəd, kin mənə etməkdə hücum,
Yatacaqdır bu qasırğa mən öləndən sonra.

Məni bir çoxları qovğalərə çəkmiş qəsdən,
Sönəcəkdir neçə qovğa mən öləndən sonra.

O qəzəlxan ki, mənim beytimi dərk eyləməyir,
Qoşacaqdır mənə misra mən öləndən sonra.

Şahinəm, canlıyam, əfsus, məni görmürlər,
Edəcəklər məni peyda mən öləndən sonra.

*21.07.2000*



Yenidən eylə səfər, gəl yanıma,
Qalmağa sübhə qədər gəl yanıma.

Saqiyə söyləmişəm get buradan,
Sənsə, ey ülvi bəşər, gəl yanıma.

Gün kimi aydın elə gündüzümü,
Gecəmi eylə səhər, gəl yanıma.

Açıban vəslə yaşıl yol, yollan,
Hörübən hicrə çəpər, gəl yanıma.

Acı dəmlər daha qoy tərk olsun,
Ömrümü eylə şəkər, gəl yanıma.

Fərəhindən daşacaqdır dəli Kür,
Coşacaq mavi Xəzər, gəl yanıma.

Şairəm, şerimə sən təb verdin,
Zərgərəm, ey mənə zər, gəl yanıma.

Məni şad eylə, ey ilham pərisi,
Şahinə vermə kədər, gəl yanıma.

*25.07.2000*



Qoçu kəsmişmi bıçaq özbaşına?
Sönə bilmişmi çıraq özbaşına?



"Ol" dedim mən və yaratdım ərzi",
Gəlməyibdir bu sorağ özbaşına.

Bizi Allah cəzalandırdı,
Getməyibdir Qarabağ özbaşına.

Qonşumuz düşmən olubdur, araya
Düşməyibdir bu nifaq özbaşına.

Ağ - qara oldu, səbəbsiz ki deyil,
Olmayıbdır qara ağ özbaşına.

Məni çəkməkdə görünməz bir əl,
Sanmayın getdi ayağ özbaşına.

Saçının hər teli cəlb etdi məni,
Başa dəyməz ki, darağ özbaşına.

Səni istərmi könül sevdasız,
Səni səslərmi dodaq özbaşına?

Bircə misra belə nəzm olmayacaq,
Qalacaqdırsa marağ özbaşına.

Şahinə yar ola İlham pərisi,
Dola bilməz ki varağ özbaşına.

*21.08.2000*



Ey şəm, özünü yax oda, pərvanəyə baxma,
Ey göz, qapanıb qal, daha cananəyə baxma.

Zər qədrini zərgər daha bilmir, zəri yoxdur,
Çoxdan aparıblar zəri, viranəyə baxma.

Xeyri biliyin olmadı, cahilliyə qurşan,
Dəftərləri yandır və kitabxanəyə baxma.

Yıx quş damını, danə üçün getmə dükanə,
Yoxdursa göyərçin daha sən danəyə baxma.

Mollanı tamah öldürəcək, məscidə getmə,
Yoxdur deyə saqi meyə, meyxanəyə baxma.

Canan, itirib əqlini, divanədi Şahin,
Əqlin var isə gəl daha divanəyə baxma.

*12.09.2000*

✦✦✦

Ey göz, nə görübsən qoca dünya yuvasında?
Tərk eylə onu, get yaşa üqba yuvasında.

Ox dəydi, pozuldu yenə bir durna qatarı,
Yarəb, qala bilmir niyə durna yuvasında?

Rəmzin hələ boldurmu sənin, söylə, Ilahi,
Sirrin hələ çoxdurmu müəmma yuvasında?

Mən tutiyə təklif elədim qəsrimi, amma
Tuti yaşamaq istədi xurma yuvasında.

- Çox yazma, - dedim Ənvərə*, - bəsdir, qocalıbsan,
- Misra hələ çoxdur, - dedi, - misra yuvasında.

Surət nədi, mənə nə, müəyyən elədim ki,
Var sevgilimin surəti mənə yuvasında.

Şahin qocalıbdır, daha ənginliyə uçmur,
Amma oturub şövq ilə sevda yuvasında.

*14.09.2000*

✦✦✦

Hicrinlə xoş oldu yar, ağla,
Bundan belə, ey nigar, ağla.

Eşqim sənə yadigardı, aldım,
Yoxdur daha yadigar, ağla.

Sən qəlbimi çox qübarə saldın,
Qəlbin eləsin qübar, ağla.

Başlar daha ömrümün xəzanı,
Güllənməyəcək bahar, ağla.

Göz yaşlarını axıt yağış tək,
Gizlin deyil, aşikar ağla.

Mən tək görübən fəraq, gülmə,
Çək mən kimi intizar, ağla.

* Ənvər Nəzərli



Baxmaz daha sən tərəf bu Şahin,
Çünki belədir qərar: Ağla!

*30.09.2000*

✦✦✦

Bir sirr dedim sevgili canané yavaşca,
Yaydı o isə sirrimi hər yanə yavaşca.

Eşq əhlinə hər yerdə vəfa eyləmişəm mən,
Keçmiş qabağımdan neçə biganə yavaşca.

Gəl çıx ki, ürək çatlayacaq ayrılığından,
Can tablaya bilmir axı hicranə yavaşca.

Meyxanəni birdən-birə gəl bağlama, saqi,
Hal əhlinə qoy bağlana meyxanə yavaşca.

Cəngavər igid həmləyə birdən-birə keçdi,
Cəng əhli olan girmədi meydanə yavaşca.

Yanmaqda tərəddüd edə bilmişmi bir aşiq?
Qorxaqlar isə atəşə qoy yanə yavaşca.

Pərvanədi Şahin, oda birdən yanacaqdır,
Şəmin oduna yanmadı pərvanə yavaşca.

*25.01.2001*

✦✦✦

Hər sevən güclü olurmuş seviləndən sonra,
Bilmişəm çox şeyi mən eşqi biləndən sonra.

Deyirəm qoy bütün eşq əhli sevinsin, Yarəb,
Durulur adəmin əhvalı güləndən sonra.

Kişi tək qəlbimi böldüm yarıya yarə görə,
Arxayınlaşdı canım qəlbi böləndən sonra.

Al günəş qovdu çəni, dağ yenə çənsizləşdi,
Dağı seyr eyləyirəm çən çəkiləndən sonra.

Gəlmişəm əqlə sevib yarı, nə işdir görəsən,
Olmuşam mən dəlisov əqlə gələndən sonra.

Tazə Məcnun eləyibdir məni eşqim yoxsa?
Mənə Məcnun deyəcəklərmi biləndən sonra?

Şairin şeri yaşar ölsə də şair, Şahin,
Dirilər tək yaşaram mən də öləndən sonra.

*11.03.2001*



Saqi mey, canan vəfa, şair varaq axtarmada,
Neyçi ney, sultan səfa, əsgər yarağ axtarmada.

Şahin ikən mənsə tənha qalmışam bayquş tək,
Yardən vurğun könül daim soraq axtarmada.

Zil qaranlıqdır otağım, gəl ki, dönsün gündüzə,
Aşiqəm mən, öylə aşiq ki, çıraq axtarmada.

Pərdə qopmuş, güldan aşmış, güzgü düşmüşdür yerə,
Gözlərim bica yerə hey təmtəraq axtarmada.

Orda ki, cananə yoxdur, bəlli ki, səhman yox,
Nimçə sınmış, çəngəl itmiş, göz bıçaq axtarmada.

Sən gələn gün bir də başlar, dilbəra, toy məclisi,
Gəl gəlin tək, aşiqin ağ bir duvağ axtarmada.

Gəlməyincə sərvqamətlim dikəlməz qamətim,
Mən sərilləm torpağa, qamət dayaq axtarmada.

Başqa yandansa, diyarın dərdi zar etmiş məni,
Düşmənim daim xəbis olmuş, nifaq axtarmada.

Yüz papaq həm örtə bilməz bircə qeyrətsizliyi,
Öylə qeyrətsiz adamlar var papaq axtarmada.

Bir zamanlar düz gözündən mən vurardım quşları,
İndi düşmən döyməyə Şahin çomaq axtarmada.

*31.03.2001*



Ruhim sevinir şeri qəzəlxan oxuyanda,
Can vəcdə gəlir nəğməni canan oxuyanda.

Bir başqa təravət görünür bağdə, ey gül,
Hərdən qoşulub bülbülə bağban oxuyanda.

Bağlandı dilim onda ki, zəngulə vurursan,
Qul dillənə bilsin necə sultan oxuyanda?



İrad tutursan mənə ki, qüssəliyəm mən,
Gülləm, gözəlim, Azəribaycan oxuyanda.

Fəryadını bir kimsə eşitmir bu diyarın,
Yetməz qulağa çay səsi ümman oxuyanda.

Əlbəttə, buludlar yenə göz yaşını tökmüş,
Bildim bunu mən təşnə biyaban oxuyanda.

Şad ol, - dedilər, mən nə təhər şad ola billəm?
Ağlarsa gözüm, Şahina, hicran oxuyanda.

*Lənkəran, 24.04.2001*



Allahım, rəhm eləyib canə bu gündən sonra,
Baxmaram bir də o cananə bu gündən sonra.

Belə peyman elədik ki, ikimiz bir nəfərik,
Ümidim qalmadı peymanə bu gündən sonra.

"Eşq yoxdur" deyə üsyan eləyən kəslər çox,
Başladım mən dəxi üsyanə bu gündən sonra.

Necə məhrəmdi ki, məhrəmliyimiz car oldu,
Deyirəm mən ona biganə bu gündən sonra.

Eşq məstanəsi olmuşdum, elm gendə idi,
Olaram elm ilə məstanə bu gündən sonra.

Ahü fəryadü qəmim bitdi, dünəndən bitdi,
Gəlmərəm mən daha əfğanə bu gündən sonra.

Nə olub Leyli, nə Məcnun, nə Şirin-Fərhad,
Mənə onlar hamı əfsanə bu gündən sonra.

Şahina, varmı məhəbbət? Daha əqlim kəsmir!
Qoy desinlər mənə divanə bu gündən sonra.

*20.05.2001*



Get, gözəl, get, yenə həsrətlə dönərsən yanıma,
Yenə hörmətlə və izzətlə dönərsən yanıma.

Sən görərsən ki, saçım ağdı, ağappaq olmuş,
Bol təəccüb dolu heyrətlə dönərsən yanıma.

Bilmirəm mən qalacaqdırmı məhəbbət məndə?
Amma sən mehrü məhəbbətlə dönərsən yanıma.

Bilmirəm sənlə yenə söhbətə başlarmı dilim?
Sənsə xoş nitq ilə, söhbətlə dönərsən yanıma.

Sıxacaqdırmı qolum belini əvvəlki təki?
Sənsə əvvəlki hərarətlə dönərsən yanıma.

Nazını çəkməyə razı olacaqdırmı könül?
Sənsə naz ilə, nəzakətlə dönərsən yanıma.

Etmə zənn eyləyirəm mən yenə peyğəmbərlik,
Bir qucaq dərd ilə, möhnətlə dönərsən yanıma.

Şahinin hicrinə heç kim dözə bilmir, qayıdır,
Getdiyin tək elə sürətlə dönərsən yanıma.

*10.06.2001*



Sahib ollam yenə Xankəndimə, Allah qoysa,
Salaram düşmənimi bəndimə, Allah qoysa.

Yazaram gündə qəzəl şəninə xoş günlərimin,
Başlaram qoşma, qıfılbəndimə, Allah qoysa.

Şirnisi sanki azalmış elə bil qəndin də,
O şirinlik gələcək qəndimə, Allah qoysa.

Pis günün ömrü çox olmaz, özüm ollam sahib,
Hər qarış torpağıma, kəndimə, Allah qoysa.

Azəri xalqını kafər ki, məəttəl qoydu,
Bir zaman mat olacaq fəndimə, Allah qoysa.

Qanlı caynaqlarını bənd eləmiş torpağıma,
Düşəcək caynağıma, bəndimə, Allah qoysa.

Lap Pənah xan kimi, Şahin, buraraq bığlarımı,
Gedərəm mən yenə Xankəndimə, Allah qoysa.

*17.06.2001*



Bədbin oldum eli dərd-qəmdə görəndən sonra,
Ağladım yurdumu matəmdə görəndən sonra.



Mən ki qürbətdə qalıb ömr eləyirdim rahət,
Diqqəti, hörməti dövrəmdə görəndən sonra.

Geri döndüm, başa düşdüm ki, silahlanmalıyam,
Qəzəbi, nifrəti naləmdə görəndən sonra.

Agah oldum: odu var, tüstüsü var qüssələrin,
Qapqara tüstünü qüssəmdə görəndən sonra.

Şuralar səltənəti aləmi aldatmışdı,
Başa düşdü bunu aləm də görəndən sonra.

Boş şüarlar bizi pis günlərə qoymuş, Yarəb,
Bilmişik pisliyi hər dəmdə görəndən sonra.

Hər şirin vədə inanmır daha Şahin Fazil
Acı gerçəkliyi ölkəmdə görəndən sonra.

*13.07.2001*



Qoy qarsalanıb can həmişə yanə yolunda,
Sərf eyləmişəm canımı canənə yolunda.

Diqqət yetirin bağbana, ey xanəxarablar,
Tər tökmədə gündüz-gecə gülxanə yolunda.

Mən başımı qurban demişəm millətim üçün,
Çox mərdin itibdir başı mərdanə yolunda.

"Şəm xislətini qoy yerə, sön, sön" deməsinlər,
Yox, yanmalıyam şövq ilə pərvanə yolunda.

Məstanəyəm eşqinlə, nə lazım mənə badə?
Məstanə durub sən kimi məstanə yolunda.

Nuş eyləmərəm mən meyi meyxanədə bir də,
Heç gözləmərəm saqini meyxanə yolunda.

Sən verdiyin üçün sevirəm dərdü bəlanı,
Gəlmiş nə qədər dərdü bəla canə - yolunda.

Canan dedi: - Şahin mənə Məcnun ola bilmiş,
Sərf eyləmişəm ömrümü divanə yolunda.

*22.10.2001*

✦✦✦

*Abbasqulu ağa Bakıxanov Qüdsinin Qubada 1835-ci ildə yaratdığı "Gülüstan" ədəbi məclisinin bugünkü "Gülüstan"çılarına!*

Bir mən olam, bir də o canan ola,
Saziş ola, əhd ola, peyman ola.

Qalmaya, bağban gedə bağdan, fəqət
Bülbül ola, bir də gülüstan ola.

Gün qədəh içrə görə öz əksini,
Qəm yanımızdan çəkilə, yan ola.

Məclisə hal əhli yığışsın, neçə
Şair ola, həm də qəzəlxan ola.

Şer oxuya tazə "Gülüstan"çılar,
Söz deməyə şövq ilə imkan ola.

Çoxlu yetişsin yeni Abbasqulu,
Qoy bu "Gülüstan" o "Gülüstan" ola.

Fazil olan Şahini dilləndirin,
Şahin olan Fazilə meydan ola.

*28.11.2001*

✦✦✦

Bir yar oturub çöhrəsi gülrəng yanımda,
Var saqi dəxi, tarü kaman, çəng yanımda.

Zövq almadayam xəlqimizin musiqisindən,
Səslənmədə sevda dolu ahəng yanımda.

Ud ilə rübabın səsi birdən havalandı,
Tar ilə setar oldu həmahəng yanımda.

Hal əhli olan kəsləri şad etdi muğamat,
Kim var edə bilsin bacarıb cəng yanımda.

Mey - rəngini qeyb eylədi gördükdə dodağı,
Al qönçə kimi aldı dodaq rəng yanımda.

Dilləndirir arifləri şövq ilə bu məclis,
Olmaqdadı nadan isə diltəng yanımda.



Rəqqası mənəm saf qəzəlin indi, a Şahin,
Rəqs eyləyə bilməz axı hər ləng yanımda.

*25.11.2001*

✦✦✦

Kəsmə ümmidini, hicran bitər, Allah qoysa,
İtər, ey yar, aramızdan çəpər, Allah qoysa.

Gərçi səy eyləmişik, amma olub bihudə,
Səyimiz bir daha olmaz hədər, Allah qoysa.

Azalar nisgilimiz mərhəmətindən Rəbbin,
Çoxalar qəlbdə taqət, təpər, Allah qoysa.

Yetişər xeyli vüsalın gəlişindən hökmən,
Bizə hicran əli verməz zərər, Allah qoysa.

Gün gələr eşq zərindən mənə həm pay düşər,
Zərgərə qismət olar onda zər, Allah qoysa.

Kəmərinlə məni çək bağla, gülüm, bəxş edərəm
Sənə göyqurşağı rəngli kəmər, Allah qoysa.

Cəhd edib Şahini sən ölməyə qoyma, bir gün
Şahini ölməyə, yarım, əgər, Allah qoysa.

*24.01.2002*

✦✦✦

Dönməyir mən tərəfə, ey pəri, iqbal gedib,
Daha candan deyəsən qüvvə itib, hal gedib.

Arı tək bal ki çəkərdim dodağından hanı bəs?
O dodaqdan necə olmuş ki həmin bal gedib?

Sən ki yoxsan fərəhimdən də əlamət yoxdur,
Yaranan dəm yenə çıxmış yoxa dərhal, gedib.

Kədərim, bil ki, çoxalmaqda mənim gün-gündən,
Neçə girvənkə gəlibdir, neçə misqal gedib.

Kəsmərəm kəlmə bir afətlə də səndən sonra,
Qoy desinlər ki, bu kəs lal doğulub, lal gedib.

Əfqanıstanda qalıbdır mənim həzzim, vətənə
Həzzimi nəql eləməkçün neçə hambal gedib.

Şahina, tökmədəyəm göz yaşımı Qudyalə,
Ərəbistanə çata kaş ki Qudyal gedib.

*3.05.1996*



Söz de ki, söz sözsüzə imdad olub.
Sözlə könüllər sevinib şad olub.

Söz qocadır lap elə dünya kimi,
Həm də tifldir, təzə növzad olub.

"Sevgi" isə, "eşq" isə ən möhtərəm
Söz ki, əzəldən bizə icad olub.

Var elə sözlər ki, yaranmaqdadır,
Var elə sözlər dilimə yad olub.

Şair edib kimsəni sehriylə söz,
Kimsə uyub bir sözə cəllad olub.

Bir acı söz bir şirin ömrün sonu -
Qəsd eləyən canına Fərhad olub.

Qüvvəni gör, sözdəki bir hökmə bax,
Bir söz ilən bir qala bərbad olub.

Söz deməyə sövq eləyən Şahini
Əliağa Vahid kimi ustad olub.

*7.12.1996*



Bilirəm, bilməyimin vaxtı çatıb,
Gəlirəm, gəlməyimin vaxtı çatıb.

Gəlirəm, baş ilə Çin səddini lap
Allahım, dəlməyimin vaxtı çatıb.

Bəsdir, ömrüm boyu mən zar oldum,
Sevinib-gülməyimin vaxtı çatıb.

Tökmərəm mən daha göz yaşlarımı,
Gözümü silməyimin vaxtı çatıb.

Bezmişəm yerdəki çılğınlıqdan,
Göyə yüksəlməyimin vaxtı çatıb.



Yaşamaq niyyətimi parçalamaq,
Nəfsimi bölməyimin vaxtı çatıb.

Görürəm Tanrını tez-tez yuxuda,
Şahina, ölməyimin vaxtı çatıb.

*1.01.1997*



Tazə ey sərv ağacı, tazə qalıbsan nə əcəb?
Bağ ara çoxlu alağ var, ucalıbsan nə əcəb?

Qismət olmuş sənə, fəxr eylə ki, şirin dəmlər,
Xosrovun yoxsa əlindən tac alıbsan, nə əcəb?

Qələmin yazdı dəmadəm səni əldən saldı,
Nə qədər könlü bu halətlə çalıbsan, nə əcəb?

Düşünürdük ki, daha fikrü xəyalın bitdi,
Sən xəyal aləminə böylə dalıbsan, nə əcəb?

Gözəlim, var idi məndə səni tapmaq dərdi,
Səni tapdım, məni min dərdə salıbsan, nə əcəb?

Aldım eynək ki, baxım yaxşı ona, söylədi yar:
- Şahina, bəs cavan idin, qocalıbsan nə əcəb?

*9.02.1997*



Adəmə olmasa idi əgər Həvva vacib,
Bəşər övladına olmaz idi sevda vacib.

Bir sınaqdır bu həyat aləmi insanlar üçün,
Bu səbəbdən yaranıb oldu bu dünya vacib.

Şair olmaz o adamdan ki, sönükdür təbi,
Qəzələ beyt gərək, beytəsə misra vacib.

Gərçi surət də zərurət, buna yox şəkk, amma,
Deyilən söz, yazılan şerdə məna vacib.

Haqlıyamsa mən əgər əmr edirəm cürətlə,
Mənə zənn eyləməsin kimsə təmənna vacib.

Kərəmə yanması, odlanması vacibdirsə,
Fərhada dağ görülüb, Məcnuna səhra vacib.

Simü zər, ləlü cəvahir də gərəkdir, amma
Sanmıram mən elə ziynətləri əsla vacib.

İstəyirdim axıdıb göz yaşı dərya yaradım,
Demirəm mən daha şairlərə dərya vacib.

Zahida, ağzını yum, ağzımı gəl açdırma,
Mənə - gerçəkliyi görmək, sənə - xülya vacib.

Söylədim: - Bəh, nə süzürsən, gözəlim, durna tək?
Dedi: - Sən şahinə bir mən kimi durna vacib!

*22.02.1997*



Yaradan Adəmi gildən nə qədər gil yaradıb!..
Neçə dərya yaradıbdır, neçə sahil yaradıb.

Bilməli gör nə qədər məsələ var bilməyirəm,
Amma, eşq məsələsində məni qabil yaradıb.

Gözəlim, vəslə yetişdim, acı dəmlər yox olub,
Deyirəm gör nə səadət bu şirindil yaradıb.

Tanrı qəlbimdə kənar afəti sakin eləməz,
Qəlbimi təkcə sənin eşqinə mənzil yaradıb.

Ayrıla bilməyirəm gör necə səndən, bu fələk
Boynuna qollarımı sanki həmayil yaradıb.

Elə adəm görürəm bir dili yox, min dili var,
Niyə bir dilli adamda bu qədər dil yaradıb?

Alnımızda yazı varkən suçu yoxdur fələyin,
Aqili aqil edib, cahili cahil yaradıb.

Həzzimiz bir ilədir, nisgilimiz bir dərya,
Tanrımız bəs nə üçün bir belə nisgil yaradıb?

Bəşərin dərdi canımda, gecə-gündüz yanıram,
Elə bil yanmaq üçün Şahini Fazil yaradıb.

*19.06.1998*



Yar tək boynun qucur... Həllacə kəndir yar olub,
Dərdinə məhrəm daha dildarı olmur, dar olub.



Dörd sözün müştağıyam mən - ən dəyərli, dadlı söz
Əhd olub, peyman olub, sevda olub, ilqar olub.

Dərk edəndən aləmi qal əhlini bəd görmüşəm,
Təsdiq eylər kim bunu hal əhli bədrəftar olub?

Çöldə gəzməkdən nə fayda, hər zaman iş görməli,
Qeys sərgərdan gəzib, Fərhad isə memar olub.

Varmıdır tənhalığa məftun olan kəs mən kimi?
Həzzimə hərdənsə dəmsaz saz olubdur, tar olub.

Səsləməkdən mən onu, "gəl-gəl" deməkdən bezmişəm,
Bağiban gülzar edincə bağımı dil zar olub.

Üzgünü oldum cahanda düzlüyün, düzgünlüyün,
Hər zaman düzlük vəfadar aşiqə meyar olub.

Kim deyərsə "lailahə" tezcə "illəllah" derəm,
Fikri Şahin Fazilin inkarə bax, inkar olub.

*6.09.1998*

***

Haraya getdi o canan, o gedəndir ki gedib
Və gəlibdir yenə hicran, o gedəndir ki gedib.

Quruyub gül, saralıbdır ağacın yarpağı,
Dönməyir bağə o bağban, o gedəndir ki gedib.

Nə gülüstanə meyl var, nə təmaşayə həvəs,
Nə seyr qaldı, nə seyran, o gedəndir ki gedib.

Gözəlindən, sanıram, xali olubdur yurdum,
Boşalıb Azəribaycan, o gedəndir ki gedib.

Şadiman olmuş idim xeyli zaman idi, məni
O pəri etdi pərişan, o gedəndir ki gedib.

Qeyri loğman ola bilməz bu kəsin loğmanı,
Xəstəyəm, çünki o loğman o gedəndir ki gedib.

Şahinin canı gedib yarı gedəndən sonra,
Yox gümanım ki, gələr can, o gedəndir ki gedib.

*13.08.1999*

***

Gözəlim, aşiqini gör necə avarə olub,
Vurulandan o qara xalə günü qarə olub.

Bütöv ikən ciyəri parələnibdir şüşə tək,
Heç sual eyləməyirsən ki, neçin parə olub?

Əl qələm tutmayır andıqca gözəl surətini,
Yüyürəndən bəri ardınca ayaq yarə olub.

Yusifin qiyməti qiymətsiz olub dövrə görə,
Görəsən indi o aşiq neçə dinarə olub?

Xosrovun oldu Şirin tərk eləyib Fərhadı,
Nə olubdursa, əzizim, yenə memarə olub.

Əqlimi başdan alan "Şur", "Çahargah", "Şüştər",
Məni heyran eləyən bir də "Zəminxarə" olub.

Şahinəm, eşqə düşəndən bəri çox gördüm ki,
Mənə biçarə deyən kəs özü biçarə olub.

*29.05.2000*

***

Hicr oxundan sinəm üstdə o qədər yarə qalıb,
İnana bilməyirəm mən ki, mənə çarə qalıb.

Yoxdu bir zərrə inamım ki, ürək tab etsin,
Dağ böyüklükdə ürəkdən kiçicik parə qalıb.

Qara bir qul kimi lal olmuşam, ey xanəxarab,
Dilimin söz deməyi sən kimi dildarə qalıb.

Dinlədikcə tarı hey şurə gələn qəlbim vay,
Nə "Arazbarı"ya yer var, nə "Zəminxarə" qalıb.

Deyirəm bəlkə məhəbbət yox imiş aləmdə?
Ümidim indi mənim eşqi də inkarə qalıb.

Gün qara, bəxt günümdən də qara, Allahım,
Hanı ağ rəng, məgər təkcə mənə qarə qalıb?

Sənin eşqinlə gəzir çölləri divanə kimi,
Gözəlim, Şahinə bax, gör necə avarə qalıb.

*27.03.2001*



***

Məst edincə çiçəyin rayihəsi canı əcəb,
Bülbülün cəh-cəhi doldurdu gülüstanı əcəb.

İki yandan bağa aşiqləri cəlb etdi bahar,
"Afərin"dir bu bağın bir yanı, bir yanı "əcəb".

Biri yarımdı gələn, digəri ilham pərisi,
Bəxş edibdir mənə tale iki cananı əcəb.

Biri tutdu əlimi, digəri açdı dilimi,
Mərhəba, verməyirəm mən yelə imkanı əcəb.

Yaşasın qoy ulu dünya, yaşasın saf sevgi,
Bəzəyir sevgi gülü daima dövranı əcəb.

Şəhidi olmayan ölkə itirər qiymətini,
Bəzəyibdir neçə meydanı şəhid qanı əcəb.

Üyüdən xəlqi nizam ilə dəyirmandı fələk,
İşlədir həzrəti-Allah bu dəyirmanı əcəb.

Həm elm sahəsi, həm şer, həm eşq meydanı,
Şahina, fəth eləyibsən neçə meydanı əcəb!

*3.07.2001*

***

Göylər papağım olmuş, çəkməmsə mənim - torpaq,
Eşqim, ümidim, həzzim, arzum, vətənim - torpaq.

Keçmişləri hörmətlə yad etməliyik daim,
Sanmam bu günüm gündür, amma dünənim torpaq.

Axmaqda su üstündən, keçməkdə su altından,
Paklıq sevənim torpaq, saflıq sevənim torpaq.

Fırlanmadadır dünya, dövr etmədədir dövran,
Torpaq çəmən olmuşdur, olmuş çəmənim torpaq.

Pərt olma ki, Şəddadı ağuşinə almışdır,
Bir vaxt Hüseyn oldu, oldu Həsənim torpaq.

Torpağə qılaq səcdə, hər vədə edək təzim,
Kim torpağa cövr etsə olmazmı qənim torpaq?

Ecazı ilən Rəbbin Adəm yaranıb gildən,
Torpaq olacaq bir gün, Şahin, bədənim torpaq.

*3.03.1997*

***

*Bu günlərdə qürbətə yeni səfərim var...*

Haradan gəldi, İlahi, yenə idbar fəraq?
Yenidən eyləyəcəkdir günümü zar fəraq...

Yenidən qüssə əlindən ürəyim qövr edəcək,
Yenidən eyləyəcək şənliyi inkar fəraq.

Getmək üçün bilirəm, fikri yenə olmayacaq,
Qalmaq üçün edəcəkdir yenə israr fəraq.

Əfqanıstanda, İran məmləkətində, eyvah,
Mənə zülm eylədi hər dəm o zülmkar fəraq.

Qəddimi qövs elədi qəm çəkiciylə döyərək,
Başıma dərd ələyindən ələdi qar fəraq.

Fərağa dözməyirəm mən, bu mənim eybimdir,
Təzədən eybimi, yarəb, edəcək car fəraq.

Başqa səyyarədə vardırsa da, Şahin, mənə nə?
Görəsən Yer kürəsində nə qədər var fəraq?

*5.02.1999*

***

Neyləsin mən təki məstanə yazıq?
Neçə eşq atəşinə yanə yazıq?

Canda yar eşqi, diyar eşqi yaşar,
Hələ aşiq neçə cananə, yazıq.

Biri ilham pərisi, başqası elm,
Girişibdir hələ irfanə yazıq.

Şamı yandırmayıram mən gecələr,
Yanacaq atəşə pərvanə yazıq.

Bağı basmaqda alağlar yenə də,
Gül yazıq, qönçə yazıq, nanə yazıq.



Leylisi Şahini Məcnun elədi,
Neyləsin indi bu divanə yazıq?

*8.03.1999*

***

Yarsınmı dağı mən kimi Fərhad yarımçıq?
Qalsınmı əlimdə işim, ey dad, yarımçıq?

Olmazsa o canan məni həm qətl eləsinlər,
Saxlarmı görən qətlimi cəllad yarımçıq?

Sən ki günün aşiqlərin, əğyar, acı etdin,
Qalsın sənin ağzında görüm dad yarımçıq.

Məscidləri abad eləmirsən niyə yaxşı?
Olsun görüm, ey şeyx, evin abad yarımçıq.

Kamilləşə bilmir niyə hər kəs cahan içrə?
İnsan, eləyiblər səni icad yarımçıq.

Olsun, - deyirəm, - hər bəşərin həzzi mükəmməl,
Qalsın, - deyirəm, - naləvü fəryad yarımçıq.

Şahin, - dedilər, - yaxşı bişibdir qəzəl içrə,
Dərsi ona öyrətmədi ustad yarımçıq.

*27.05.1999*

***

Deməyin saqisiz insanə "yazıq",
Saqisi öldüsə meyxanə yazıq.

Bağiban ölsə - demək bağ öldü,
Gül yazıq, qönçə yazıq, nanə yazıq.

Möhtərəmdir təmiz əllərdə qabar,
Natəmiz əldəki dürdanə - yazıq.

Nə üçün isminə "aşiq" dedilər.
Deyirəm mən isə Sənanə yazıq.

Ey Züleyxa, çək əlin Yusifdən.
Düşməsin bir daha zindanə yazıq.

Yazıq olsun həmişə namərdlər.
Olmasın amma ki, mərdanə yazıq.

Bir canım var idi öldüm - getdi,
Can yazıq olmadı, cananə yazıq.

Zəli bilmir ki, sorub qan, öləcək,
Susayıbdır həmişə qanə yazıq.

El neçin Şahinə Məcnun deməyir?
Neyləsin indi bu divanə yazıq?

*7.06.1999*

***

Gər şərabım belə tünd olsa camı yandıracaq,
Məşələ dönsə halalım haramı yandıracaq.

Qoca yer kürrəsi fərşimdi, səma damımdır,
Məndə ki var bu qədər isti, damı yandıracaq.

Rəhm elə, çıxmaya qoy bir də başımdan tüstü,
"Xudahafiz" dilə gəlsə "salam"ı yandıracaq.

Ey qəzəlxan, nə yanırsan belə hicran oduna,
Bu qədər yanma ki, yanğın adamı yandıracaq.

O pəri bir kərə saf eşqimi rədd etmişdi,
Yenə "yox" olsa cavabı atamı yandıracaq.

Onu mən şam kimi yandırmalıyam, yoxdur şəkk,
Saqqalı yansa da Şahin o şamı yandıracaq.

*3.07.2000*

***

Qismətim, bilsəm əgər mən ki, vüsal olmayacaq,
Həşrədək məndə o gündən bəri hal olmayacaq.

Sən özün yaxşı bilirsən ki, ömür fanidir,
O hüsn qalmayacaqdır, o camal olmayacaq.

Şairəm, ey pəri, yüzlərlə xəyalım vardır,
Daha beynimdə mənim özgə xəyal olmayacaq.

Eşqini sən dəxi elan eləsən, qəlbimdə
Nə kədər yer tutacaqdır, nə məlal olmayacaq.

"Mənə dildar olacaqsanmı?" - dilim dillənəcək,
Səni görcək daha bir qeyri sual olmayacaq.



Gəzmişəm çox yeri yar ilə diyar eşqiylə,
Mən təkin aşiqə heç yerdə zaval olmayacaq.

Qura bilsək bu məhəbbətlə "Məhəbbət qəsri",
Əminəm şahdə həm öylə cəlal olmayacaq.

Çox deyiblər ki, həyat, ey pəri, beşgünlükdür,
Qəflət etsək belə, sevdayə macal olmayacaq.

Şahinəm, fırlanıram başına pərvanə kimi,
Daha aşiqlərə pərvanə misal olmayacaq!

*6.04.2001*

***

Qurunun yanması bəlli, gözəlim, nəm yanacaq,
Çırağın piltəsi tək göz yaşı möhkəm yanacaq.

Sinəm altında var atəş, sinəm üstündə sənəm,
Sinəm atəşdə yanarsa, sənəmim həm yanacaq.

Elə adəm görürəm yansa fəğan eyləyəcək,
Elə adəm dəxi var, yansa da, xürrəm yanacaq.

Pisə, əlbəttə, cəhənnəmdədi yer, kəs var ki,
Olsa hərgah cəhənnəmdə cəhənnəm yanacaq.

Mən bilən, yox elə insan ki, günah eyləməsin,
Bircə dəm yansa biri, qeyrisi hər dəm yanacaq.

Eybi yoxdur, məni məşəl kimi yandırsınlar,
Mən ki şadəm bu işə - məndə olan qəm yanacaq.

Şahina, etmə şikayət ki, yanırsan tənha,
Yetəcək öylə dövr ki, bütün aləm yanacaq.

*27.09.2001*

***

Bəxtimin sönmədədir qəndili, ey dadi-bidad,
Viran olmaqda ömür mənzili, ey dadi-bidad.

Bisütundan da ağır çox dağı yardım, ey qəlb,
Ömrümün ötdü hədər çox ili, ey dadi-bidad.

Mən də divanəsiyəm dövrümüzün, zəncir ver,
Sarıyıb kim qoluma məftili, ey dadi-bidad?

On üç il mən nə sayaq tab elədim hicranə?
Yıxar idi o kədər-qəm fili, ey dadi-bidad.

Aramızdan yenə axmaqda o hicran dənizi,
Zülm edirsən mənə, ey sevgili, ey dadi-bidad.

Bir-birindən aralı biz iki sahil kimiyik,
Çəkəcək sahilə kim sahili, ey dadi-bidad?

Saqi verməzsə əgər mey, susacaqdır Şahin,
Neçə vaxtdır ki, açılmır dili, ey dadi-bidad.

*24.01.1996*

***

Eşqim mənə görsəndi cananə əlində,
Dürr danəsi dürdanə dürdanə əlində.

Bəxş eylə qəzəl təbin həmdəmlərə, yarəb,
Qoyma qala ilhamı biganə əlində.

Aşiq kəsi məstanə sevda eləsin qoy,
Görsənməyə mey bir də məstanə əlində.

Eşqim elə bariz ki, gerçəkliyi - məndə,
Gerçəkliyi gizlətmə əfsanə əlində.

Fürsət neçə namərdə olmuşsa da qismət,
Parlar təzədən xəncər mərdanə əlində.

Mən cismimi ləzzətlə, ey şam, oda yaxdım,
Yanmaq nə asan işmiş pərvanə əlində.

Şahin təzə divanə, zəncir isə köhnə,
Zəncir görünür təzə divanə əlində.

*21.10.1995*

***

Yeni dövrün yeni bir qeysəri lazımdı mənə,
Azərəm, azəri İsgəndəri lazımdı mənə.

Çox dedik "Babəkimiz vardı bizim bir vaxtlar..."
Vətənin indi igid əsgəri lazımdı mənə.



Rəhmət olsun o nər insanlara, min-min rəhmət,
İndinin İsmayılı*, Heydəri** lazımdı mənə.

Hər şeyin qiyməti qalxıb ölümün nırxı düşüb,
Bir ümid şəmi, güman ülkəri lazımdı mənə.

Düşmən ardınca deyindikcə deyindik, söydük,
Yox, söyüş bəsdi, döyüş səngəri lazımdı mənə.

Yağıdan torpağımı indi qoparmaq lazım,
Vətənin hər kəsəyi, qənbəri lazımdı mənə.

Şahina, istəmirəm şah babamın taxt-tacını,
Hanı, Şah İsmayılın xəncəri lazımdı mənə.

*23.10.1995*

***

Zülfünün sünbülünü açdı o canan yenə,
Zülfü tək eylədi hicranı pərişan yenə.

Söylədim: - Eyləmə gül çöhrəni məndən pünhan,
Qoy olum mən o gözəl hüsnünə heyran yenə.

- O səbəbdən, - dedi, - mən gizləyirəm surətimi,
Görünə gözlərinə bir dəxi hicran yenə.

Hicrin olmazsa əgər, ləzzəti olmaz vəslin,
Yanmısan bir neçə yol hicr oduna, yan yenə.

Söylədim dilbərimə: - Şair imişsən sən ki!
Dedi: - Şair yaradır Azəribaycan yenə.

Nə xülasə, o dedi, mən də cavabın verdim,
Mən dedim, verdi cavab bəndəyə sultan yenə.

Beləcə yetdi qaranlıq gecə, gün gizləndi,
Zülfütək dəydi qara gözlərə hər yan yenə.

Şahina, zülməti qovsun deyə evdən dərhal,
Zülfünün sünbülünü bağladı canan yenə.

*18.12.1995*

* Şah İsmayıl Səfəvi
** İgid qızılbaş mürşidi və sərkərdəsi Şeyx Heydər Səfəvi

***

Gümanım bir də aldatmaz, gələr canana zənnimcə,
Soyuqdan donmuşam, billəh, vurar od canə zənnimcə.

Varım yox, dövlətim yox, sərvətim yox, zənginəm amma,
Odur yaqut, odur mərcan, odur dürdanə zənnimcə.

Gül olmuş, bülbül olmuş, sünbül olmuşdur hədəf təbə,
Vətəndaşəm, qonar meylim qılınc-qalxanə zənnimcə.

Əql dəryası olmuşdur, bu gün Məcnunə divanə
Deyən divanədir, Məcnun deyil divanə zənnimcə.

Çoban olmuş deyə Şeyxi məzəmmət eyləmək - nöqsan,
Çobanlıq etməmək nöqsan olar Sənanə zənnimcə.

Əgər Fərhad ölüb-getmişsə də əfsanə qalmışdır,
Bu aşiq həm, gülüm, bir gün olar əfsanə zənnimcə.

Sanırdıq biz ki, Şahin Fazilin iqbalı dönmüşdür,
Sənin zənnin, mənim zənnim olar viranə zənnimcə.

*28.03.1996*

***

Sevdayə düşəndən bəri nəm yoxdu gözümdə,
Varsan deyə sən qeyri sənəm yoxdu gözümdə.

Çəksin gözünü başqa gözəllər qəzəlimdən,
Dəftər gözə dəymir və qələm yoxdu gözümdə.

Dilbər, sənə cəllad deyimmi, deməyimmi?
Edam eləyibsən qəmi, qəm yoxdu gözümdə.

Eşqin ələmindən dəxi həzz almadayam mən,
Qəm bir yana qalsın ki, ələm yoxdu gözümdə.

Sevdim sitəmi mən onu sən verdiyin üçün,
Qəm yoxdu, ələm yoxdu, sitəm yoxdu gözümdə.

Aşiqlərə, canan, mənəm aşiqbaşı indi,
Fərhad ilə, Qeys ilə Kərəm yoxdu gözümdə.

Qəlbimdə mənim dürr kimi eşqin kimi bol-bol
Var var deyə dinarü dirəm yoxdu gözümdə.



Ən çox nənəmin sevgisi var idi canımda,
Sevdim səni mən öylə, nənəm yoxdu gözümdə.

Şahindir adım, "şah" sözü var gərçi adımda
Billah, hərəmxanə, hərəm yoxdu gözümdə.

*20.03.1996*

***

Öylə bədhal olmuşam zülm eyləyəndən qəm mənə,
Bir müqəvva zənn edir, adəm demir adəm mənə.

Sən cəbrlə, həndəsəylə doldurubsan beynimi,
Ey müəllim, Leyli-Məcnundan danış hər dəm mənə.

Aşiqəm, aşiqliyimdən sən ki agah olmusan...
Tənə etmə, yaxşısı bir şillə çək möhkəm mənə.

Bircə-bircə göz yetirdim, sevgilim, çox dilbərə,
Məlum etdim bircə sənsən, təkcə sən məhrəm mənə.

İstəməzdim eşqdən zövq almasaydım mən, əgər
İsanı bəxş eyləyəydi bakirə Məryəm mənə.

İşdi-şayəd sən əgər sındırmış olsan qəlbimi,
Bir nəzər, bir xoş baxışdır, sevgilim, mərhəm mənə.

Tərk edərdim cənnətin minlərlə huri-qılmanın
Olsa idin sən cəhənnəmdə əgər həmdəm mənə.

İstədim Məcnun olum divanə sansınlar məni,
Amma, Şahin, el dedi divanə yox, sərsəm mənə.

*25.03.1996*

***

Bir kimsəni göz görməz canana görünməzsə,
Nadan gözü söz görməz əfsanə görünməzsə.

Qeyb eyləyibən nuri düşməzmi ziyasından
Zərgər gözünə hər gün dürdanə görünməzsə.

Mey süzmə, süzər saqi meyxanədə hər saqi,
Yarəb, nə edər saqi meyxanə görünməzsə?

Hər şah Qubad olmaz, hər busədə dad olmaz,
Aşiq necə şad olmaz biganə görünməzsə.

Hər çöhrədə nur olmaz, hər başda şüur olmaz,
Şəmin nuru gur olmaz pərvanə görünməzsə.

Ülviyyətim əl çalmaz, şahanəliyim qalmaz
Ülviyyə görünməzsə, Şahanə görünməzsə.

Çəkməzmi kədər aşiq Məcnun kimi hər aşiq?
Aşiqmi məgər aşiq mərdanə görünməzsə.

Aqildi bu dünyadə, öldükdəsə üqbadə,
Divanə olar Şahin Divanə görünməzsə.

*2.04.1996*

***

Qurbanam həzzinə mən, həzzi vətən verdi mənə,
O təhər həzzi nə lalə, nə süsən verdi mənə.

Həmi şair, həmi aşiq! Yaradan lütf eləyib,
Bu iki vergini Məcnun ilə tən verdi mənə.

Yenə dağlar şahı Şahdağı ziyarət elədim,
Bu gün ilhamı duman verdi və çən verdi mənə.

Dağdan encək yeni zövq ilə mükafatlandım,
Müjdə, ey qəlb, mükafatı çəmən verdi mənə.

Dedim insaf elə, ey yar, axan göz yaşıma,
Var imiş mərifəti, durdu ləyən verdi mənə.

Buğdanın nırxı çoxalmış, bunu bülbül nə bilir?
Çox sağ olsun o dəyirmançı ki, dən verdi mənə.

Verhaverdir qoca dünyadə, a Şahin, bir gün
Görəcəklər kı, əcəl gəldi kəfən verdi mənə.

*4.04.1996*

***

Ehtiram eyləsə kim həmdəminə bir zərrə,
Mübtəla olmasın aləm qəminə bir zərrə.

Günəşimdir, nə olar yar bu haqq aşiqinin
Səpə ümmid işığı hər dəminə bir zərrə.

İqtidarın var, İlahi, nə olar sən qatsan
Qudyalın qətrəsini Zəmzəminə bir zərrə.



Qəmimin mərhəmin eşq olduğunu yar bilir,
Məni möhtac eləmir mərhəminə bir zərrə.

Bilmirəm mən pərisən yerdə mələksən yoxsa?
Bənzəmirsən bu cahan adəminə bir zərrə.

Bələdik zülmünə artıq, yenə zülm eylə, gülüm,
Yada - ulduz qədəri, məhrəminə - bir zərrə.

Hey verib şerinə görkəm nə günə qalmışsan?
Şahina, diqqət elə görkəminə bir zərrə.

*5.04.1996*

***

Yetirə bilsə kim hərgah o cananı mənə,
Eləsin zənn yetirmiş yenə loğmanı mənə.

Fələyə neyləmişəm ki, alaraq aramım
Niyə vermiş təzədən bir belə hicranı mənə?

İstərəm qərq eləyim cismimi, qoymur dalğa,
Göstərin cismimi qərq etməyə ümmanı mənə.

Sözü şəkkər, dili şəkkər, dodağı şəkkərdi,
Qismət etmişdi İlahi şəkəristanı mənə.

Söz qoşa bilməməyim qeyriyə nöqsanımsa,
Qeyrilər əfv eləsinlər belə nöqsanı mənə.

Xaliqim, gəl məni Məcnun, onu Leyla eləmə,
Mən şəhər vurğunuyam, qıyma biyabanı mənə.

Fələyin gözləri kormu, quru bir canım var,
Görməyir yoxsa o layiq bu quru canı mənə?

Yazıraın şerimi hər gün tək onun şövqüylə,
Sanki ilham özü etmiş belə fərmanı mənə.

Edirəm əhd olum saf qəzəlin sultanı,
Verə Allah təki, Şahina, imkanı mənə.

*6.04.1996*

***

Sevdayə nə rəğbət daha sevda belədirsə?
Ömr etmədə mənə hanı mənə belədirsə?

Tez-tez dəyişir səmtini hərcayı xanım tək,
Yox etibarı bir gilə dərya belədirsə.

Qeysin hanı qəbri? Unudubdur onu səhra!
Yaddan çıxar, əlbəttə ki, səhra belədirsə.

Həvva izn olmazsa əgər buğda yeyərmi?
Adəm demirəm Adəmə Həvva belədirsə.

Günlərlə gətirmir gözümə hüsnünü yarın,
Rədd eyləyirəm röyanı röya belədirsə.

Məcnuni olandan bəri mən qaçdı yanımdan
Mən neyləyə billəm axı Leyla belədirsə.

Mən vəsf edirəm cövr edir amma mənə dünya,
Vəsf etmə daha, Şahina, dünya belədirsə.

*9.04.1996*

***

Hərçənd ki, qəlbimdə dözüm var fəraqə,
Mən bitərəfəm, kimdi tərəfdar fəraqə?

Aşiqlərimizdən mənim əlbət gileyim var,
Hər sirri neçin eylədilər car fəraqə?

Bizdən bu səbəbdən də əl üzmür dəli hicran,
Hicran ola bilməz axı inkar fəraqə.

Aciz məni görmüşmü qəzəlxanlar içində?
Bilməm nə düşübdür yenə, ey yar, fəraqə?

Eyvah, fəraqə necə öyrəncəliyəm mən...
Öyrətdi məni sevgili dildar fəraqə.

Ölkəmmi edib qürbətə vadar bu şəxsi?
Qürbətmi edibdir belə israr fəraqə?

Dilbər, yenə hicrində təlin tək əsirəm mən,
Şahin təzədən oldu giriftar fəraqə.

*20.04.1996*



***

Bağiban reyhana, reyhan mənə baxmaqda yenə,
Oluban şerimə heyran mənə baxmaqda yenə.

Baxmasın köhnə qəzəlxanları təqlid eləyən,
Tazəyəm, tazə qəzəlxan mənə baxmaqda yenə.

Neçə yad kəlməni dən tək mən üyütdüm, yoxdur,
Hanı dən? Varmı? Dəyirman mənə baxmaqda yenə.

Mən Bədəxşanda da heç baxmamışam lələ tərəf,
Burda da ləli-Bədəxşan mənə baxmaqda yenə.

Saqiya, bir neçə fincanını qırdım getdim,
Gələrəm, bir neçə fincan mənə baxmaqda yenə.

Neçə yol gəlmiş idi, qovmuş idim bir neçə yol,
Üzə bax ondakı, hicran mənə baxmaqda yenə.

Ölülər həm diridirlər, məni həmkar sanıb
"Gəl" deyə Qeys ilə Sənan mənə baxmaqda yenə.

Hazıram son səfərə mən, a mələklər, hələlik,
Əzrayıl yoxsa da, şeytan mənə baxmaqda hələ.

Etməyib əhdə vəfa, Şahina, canan getdi,
Gəlsə də qov, demə "canan mənə baxmaqda hələ".

*28.04.1996*

***

Şəməm, yanıram mən pərvanəlik eylə,
Yan, yan belə sən həm mərdanəlik eylə.

Dön mərdə, sürünmə, comərdə, sürünmə,
Yerlərdə sürünmə şahanəlik eylə.

Yoxdursa məhəbbət sən qaldığın evdə,
Kaşanə də olsa viranəlik eylə.

Söz qədrini bil sən, öz qədrini bil sən,
Dürdanə yanında dürdanəlik eylə.

Məscid yanından laqeyd ötüb keç,
Meyxanə yanında məstanəlik eylə.

Hifz eylə səbatı, yar ilə büsatı,
Sevdasız həyatı əfsanəlik eylə.

Əql ilə səlam et sən Şahini görcək,
Məcnuni görəndə divanəlik eylə.

*1.05.1996*

***

Bitir hicran, gəlir canan səmimanə-səmimanə,
Verir üzgün bu cismə can səmimanə-səmimanə.

Edir tənə ki, hicran eyləmiş şair səni, sənsə
Söyürsən hicri hər bir an səmimanə-səmimanə.

Mən hicrindən səmimanə-səmimanə nə gördüm ki,
Deyim gəlməkdədir hicran səmimanə-səmimanə.

Çox illər möhtac olmuşdum vüsalə, busə lütf etsən
Verərsən xəstəyə dərman səmimanə-səmimanə.

Bu gün yer kürrəsində eşqə sultanəm, budur zənnim,
Mənimçin dövr edir dövran səmimanə-səmimanə.

Gedək bağə, çıxaq bağdan, çıxaq dağə, düşək dağdan,
Müdam "gəl-gəl" deyir orman səmimanə-səmimanə.

Təbiət köksü cənnətdir, təbiət qoynu cananə,
Haçandır gözləyir canan səmimanə-səmimanə.

Adam var iltifat etmir nigarə, mənsə, ey Şahin,
Olardım yarıma qurban səmimanə-səmimanə.

*14.05.1996*

***

Sevdayə düşən aşiq xülya ilə söhbətdə,
Xülyalı bu şairsə sevda ilə söhbətdə.

Hər vədə axar səssiz, dərya belə ah etməz,
Göz yaşları olmazsa dərya ilə söhbətdə.

Bir dağçapanı gördüm dağ ilə edir söhbət,
Səhragəzəni gördüm səhra ilə söhbətdə.

Mən də qərib olmuşdum, durna da qərib idi,
Qürbətdə günüm keçdi durna ilə söhbətdə.



Qovğa ilə hərb eylə, qovğa danışıq bilməz,
Günlər hədər ötməkdə qovğa ilə söhbətdə.

"Köynək" sözü işlətmə Yusif görünən vaxtı,
"Divanə" sözündən qaç Leyla ilə söhbətdə.

Eşq ilə edib söhbət öylə şirin olmuş ki,
Yarım, dilimiz sanki xurma ilə söhbətdə.

Çox söz deyirəm hərdən, amma ki eşitmirsən,
Yəqin qulağın, dilbər, sırğa ilə söhbətdə.

Zərgər zərə aludə, zər zərgərə aludə,
Gündüz-gecə şairsə misra ilə söhbətdə.

Ömrüm boyu həzz aldım mən molla Füzulidən,
Kim söylədi həzz olmaz molla ilə söhbətdə?

Adəm iki-üç adəm bilmir tapa söhbətçin,
Sən Şahinə bir bax ki, dünya ilə söhbətdə.

*17.05.1996*

***

Yenə gözdən süzülür çeşmə kimi yaş niyə?
Bu qədər cövr eləyir sirdaşa sirdaş niyə?

Leyli ibni-Salamın səmtinə bir daş atdı,
Məcnuna dəydi gedib Leyli atan daş niyə?

Şirinin vəslinə Xosrov yetəcəkmiş, əcəba,
Şirinin şəklini nəqş eylədi nəqqaş niyə?

Neçə ildir ki, əlindən Qarabağ getmişdir,
Niyə rahət oturubsan, a vətəndaş, niyə?

Beş əsr öncə qızılbaş ki savaş eylərdi,
Şah Xətai, niyə susmuş o qızılbaş, niyə?

Məmləkət elmi ilən, alimi ilən tanınır,
Alimin paltarı gündən-günə nimdaş niyə?

Sirri biganə əgər bilsə, o sirr sirr deyil,
Eləyib yar bizim sirrimizi faş niyə?

O qələmqaşə nəsihət niyə təsir eləmir?
Bilmirəm doğru deyəndə çatılır qaş niyə?

Qarə rəng qarə günün rəmzi sayılmışsa əgər,
Sən qaragünlüdə, Şahin, ağarıb baş niyə?

*20.05.1996*

***

Sevincim yoxsa da var qəm, nigarımsan, əlac eylə,
Saralmış büsbütün çöhrəm, baharımsan, əlac eylə.

Gücüm yox, qüvvətim yox, iqtidarım yox mənim sənsiz,
Gücümsən, qüvvətimsən, iqtidarımsan, əlac eylə.

İnan ki, səndən özgə qeyri bir dildarə yer yoxdur -
Həzin könlüm qıfıllanmış, açarımsan, əlac eylə.

Nə müddətdir sənə pak eşqimi mən etibar etdim,
Buna şahiddi Allah, etibarımsan, əlac eylə.

Mənəm şən nəğmə şövqündə, mənimçin bir təvafüt yox,
Mənim nəğməmmisən, ya nəğməkarımsan, əlac eylə.

Əlim təsbehlidir, vardır çomağım çiynim üstündə,
Mənəm Sənan olan Şahin, Xumarımsan, əlac eylə.

*21.05.1996*

***

Qoy duvağsız görünə ay yenə,
Saçını gərdəninə yay yenə.

Lütfünü pay eləyərdin mənə sən,
Qismət olsun mənə bir pay yenə.

Dedi yarım mənə: - Pay vaxtımıdır?
Çulğayıb yan-yörəni vay yenə.

Yetmiş il oldu bəla əyyamı,
Hava qan ağlayır eyvay yenə.

Mən dedim: - Qış bitəcəkdir hökmən,
Gələcəkdir, gözəlim, yay yenə.

Zay olub çox günümüz qürbətdə,
Olmasın günlərimiz zay yenə.

Əl üzək gəl dəli bədbinlikdən,
Gözəl əyyamləri say yenə.

Dedilər: - Şahin əcəb nikbindir,
Varmıdır Şahinə həmtay yenə?

*17.06.1996*



***

Gəldi bahar, bitdi bitənlər yenə,
Gör necə gülləndi çəmənlər yenə.

Vəcdə gətirmiş yenə gül bülbülü,
Göz-gözə durmuş sevişənlər yenə.

Qəlbə həvəs, gözlərə gəlməkdə nur,
Üzlərə gülməkdə süsənlər yenə.

Coşdu könüllər, yenə qan qaynadı,
Sevgilərə daldı sevənlər yenə.

Tərk eləyib bir para inciklıyi,
Bəh, barışırlar küsüşənlər yenə.

İsmayılım düşdü yada, Babəkim...
Varmı görən öylə ərənlər yenə?

Arxayın idi dağ ötüb*, çay keçən**,
Arxayın olsaydı gələnlər yenə.

Əzm eləyərdik Bakıdan Təbrizə,
Təbrizə getsəydi gedənlər yenə!..

Yoxdu şimal, ya ki, cənub söhbəti,
Xatirə gəlməkdə ötənlər yenə.

Bir vətən olmuşdur iki, Şahina,
Birləşə bilsəydi vətənlər yenə!..

*5.07.1996*

***

Ağdır varağım, sındı qələm, et mənə çarə,
Keyfim, gözəlim, indi mürəkkəb kimi qarə.

Eyşim elə ki seyr elədi qüssəmi, bitdi,
Həzzim görübən qəmlərimi qaçdı kənarə.

Bədbinliyə bax məndəki, çoxdandı görünmür,
Məndən bir əməl, ey pəri, səndənsə işarə.

Ey doğma olan qəlbimə yar, özgəlik etmə,
Sən bənzəməyirsən axı bir özgə nigarə.

---

* Savalan dağı nəzərdə tutulur.

** Araz çayı

Bir dəfə kömək eyləmiş idin mənə yaxşı,
Ərz et köməyin sevdiyinə indi dübarə.

Hərçənd bu qəzəl sahibinin öz yolu vardır,
Tuş oldu bu yolda nə qədər mərdiməzarə.

Ömrün qışı gəldi, daha mən neyləyə billəm?
Şahin geri dönmək diləyir, amma bəharə!

*9.07.1996*

***

Qüssə könüldən qaçaq olmuş yenə,
Naləvü fəryad uzaq olmuş yenə.

Dərdü kədər baş götürüb qaçdılar,
Üzdəniraqlar iraq olmuş yenə.

Oldu sevincimlə fərəh qolboyun,
Gör nə təhər təmtəraq olmuş yenə.

Bir daha səhrayə çıxıb getmərəm,
Dörd tərəfim bağça-bağ olmuş yenə.

Qır darağı at yerə, barmaqlarım
Zülfünə, yarım, daraq olmuş yenə.

Sən məni seyr etmədəsən, mən səni,
Gözlərimiz çilçıraq olmuş yenə.

Hamilə təbim doğa bilmirdi şer,
Şer uşağımdır, uşaq - olmuş yenə.

Yatmış idi daş kimi bəxtim mənim,
Şahina, bəxtim oyaq olmuş yenə.

*30.07.1996*

***

Elə ki güzgüsünü tutdu o canan üzünə,
İki göz, gördü ki, baxmaqdadı heyran üzünə.

Üzü allandı qızılgül kimi - görcək üzünü,
Yığılıbdır bədənindən elə bil qan üzünə.

Sərv boylandı, mixək baxdı, qərənfil yandı...
Gördü heyrətdə qalıb bağü gülüstan üzünə.



Neçə saət üzü rəng aldı onun dan üzü tək,
Elə bil şöləsi düşmüşdü günün dan üzünə.

Olub aludə o huri üzünə, bilmir ki,
Dayanıb baxmadadır mən kimi qılman - üzünə.

Üzünün bir neçə müddət də olub heyranı,
Söylədim: - Tut üzünü mən sarı, qurban üzünə.

Nə nəzərlərdi mübarək, nə baxışlardı gözəl,
Ahunun gözləri zillənmədə ceyran üzünə.

Aşiqin hər günü, lütf et ki, vüsal ilə keçə,
Qalım həsrətdə mən amma neçə hicran üzünə.

Məni üzməkdə, İlahi, yenə vəhdətsizlik,
Bəsdi, qaldırma müsəlmanı müsəlman üzünə.

Neçə şeytançını bənzətmədəyəm əğyarə,
Tüff edib mən tüpürüm qeyz ilə şeytan üzünə.

Şirin olsun günü aşiqlərinin həlva tək,
Tutini qoyma tamarzı şəkəristan üzünə.

Şahini yollama, Allah, təzə qürbətlərə sən,
Qoyma həsrətli onu Azəribaycan üzünə.

*10.08.1996*

***

Əlbəttə, nə gövhərdi, nə zərdir mənə çarə,
Səndən, gözəlim, cüzi nəzərdir mənə çarə.

Gəlsəm sizə bəxtim kimi olsa qapı bağlı,
Aç, as kəmərindən ki, kəmərdir mənə çarə.

Xoş sözdü, bəyaz üzdü, xumar gözdü təmənnam,
Çox yaxşı bilirsən ki nələrdir mənə çarə.

Əlbəttə şirinsən mənə, yarım, şəkərimsən,
Bir gün şəkər olmazsa, zəhərdir mənə çarə.

Hərçənd ki, Kabul çayı var, Dəclə-Fərat var,
Amma Dəli Kür, Mavi Xəzərdir mənə çarə.

Əfsus ki, sinnim daha əsgərliyə düşmür,
Söz gözləyirəm, yaxşı xəbərdir mənə çarə.

Şahin, Qarabağ mülkü pərakəndə olubdur,
Çarəm yox olub, təkcə zəfərdir mənə çarə.

*16.08.1996*

***

Təbim almaqda bulaqdan busə,
Amma fikrimsə çıraqdan busə.

Vüsalım var idi Kabulla müdam,
Gəlməyir indi fəraqdan busə.

Qoca İranda nəsib oldu mənə
Savalan adlı o dağdan busə.

Hörmətim vardı mənim Türkiyədə,
Mənə gəlməkdə uzaqdan busə.

Xatirim xeyli əzizdir deməli,
Göndərirlərsə İraqdan busə.

Busələr məncə məhəbbətdəndir,
Almayır kimsə nahaqdan busə.

Boyalı çöhrə nə lazımdı mənə,
İstəməm çünki boyaqdan busə.

Əl-ayaq eylə, alım hər ləhzə
Həmi əldən, həm ayaqdan busə.

Bilmirəm mən ki, daraq almada, ya
Zülfün almaqda daraqdan busə?

Axacaq, bəlli ki, qıpqırmızı qan
Boyan eylərsə bıçaqdan busə.

Kim qəra daşı öpürsə öpsün,
Alıram mənsə dodaqdan busə.

Şahinəm, var varağım, var qələmim,
Qələm almaqda varaqdan busə.

*20.09.1996*

***

Kəssələr qoç kimi bir gün məni qurban yerinə,
Bədənimdən yerə eşq axmalıdır qan yerinə.

Ad qoyublar mənə "Şahin", bilirəm quş dili də,
Özümü zənn edirəm indi Süleyman yerinə.

Ayrılıq könlümü hərçənd pərişan eləmiş,
Görəcəkdir vüsalı göz yenə hicran yerinə.



Dərmanım yoxsa da, dərd etməyirəm, yar gəlsə
Mənə lütf eyləyəcək busəni dərman yerinə.

Bu fəna mülkdə candan dəxi qiymətli nə var?
Nə verim yarə ki, layiqli ola can yerinə?

Şahina, bircə də bəxş etməyə mərcanım yox,
Düzərəm göz yaşımı boynuna mərcan yerinə.

*23.09.1996*

***

Könlüm istər elə, ey yar, alım cam gecə,
Sənə mən badə verim, sən mənə ilham gecə.

Gündüzün dərdisəri qoy unudulsun mey ilə,
Çəkilir dərdimizə gör necə əncam gecə.

Üzü ey ay tək işıqlı, baha olmuş şam da,
Mənfəətdir mənə, yandırmayıram şam gecə.

Eşqin, əlbəttə, mənə ən gözəl ənamındır,
Gözəlim, eşqini ancaq elə ənam gecə.

Zehnimi zəbt eləyir elmi işim gündüzlər,
İstərəm mən ki, əzizim, olum aram gecə.

Mülkü abad ola hər qəlbigeniş insanın,
Qoy uçulsun başına bədnəzərin dam gecə.

O nə şairdi müdam ilhamı gözlər, mənəsə
Həm səhər gəlmədə ilham, həm axşam, gecə.

Görə bilmir məni gündüz, bu səbəbdəndir ki,
Dolanır başıma şəfqətlə güləndam gecə.

Mən ki, gündüz əlinə düşməyirəm əmr eləsin,
Eləsin indi o mehparə sərəncam gecə.

Var təmənnam: Canım çıxsa da gündüz çıxsın,
Şahina, çünki həyatdan alıram kam gecə.

*8.10.1996*

***

*Təzə səsli qəzəlxan-şair Ayaz Arabaçıya*

Ülvi eşq indi də var, öylə kəsəm aləmdə,
Tək səninlə, gözəlim, həmnəfəsəm aləmdə.

Məni sarmaqdadı sevgi təpədən dırnağacan,
Sevgilim, sevgiliyəm mən, həvəsəm aləmdə.

Sinəm içrə nə qədər sirri yatır dünyanın,
Qapısı bağlı olan bir qəfəsəm aləmdə.

Tazə söz naminə əzmimdə palıd tək bərkəm,
Deməsinlər mənə kövrək vələsəm aləmdə.

Var ümidim ki, davam etdirəcəklər yolumu,
Heç zaman söyləmərəm mən ki, bəsəm aləmdə.

Tazə səslər gələcəkdir qəzələ, ey Şahin,
Köhnə səslər batacaq, tazə səsəm aləmdə.

*2.12.1996*

***

Dərdə düşmək bu ahıl yaşda yaraşmaz mənə,
Gözəlim, yad eləyib gündə kağız yaz mənə.

Əmin oldum məni cəlb eyləyə bilmir heç nə,
Gül çıxıb, amma ki, qışdır elə bil yaz mənə.

Saz idi halım, əzizim, yox əsər şənlikdən,
Ağlayardım çalan olsaydı əgər saz mənə.

Niyə qopdum yenə səndən, mənə lap yaxşı olur,
Nə qədər gəlsə bəla sanki olur az mənə.

Yenə dərviş kimiyəm, ah, nə taledir bu?
Taleyim tazə gəlin tək eləyir naz mənə.

Qonmuşam zirvəsinə Hindukuşun hərdənbir,
Doğmadır amma o Şahdağ mənə, Qafqaz mənə.

Alağın kölgəsi altında qalan güllər var,
Gətirin tezcə alaq biçməyə dəryaz mənə.

Söyləyirlər "Şığı, şahin kimi pərvaz eylə",
Şahinəm, amma müyəssərmi o pərvaz mənə?

*3.12.1996*



***

Deyəsən zar edəcəkdir acı hicran məni də,
Ey Qeys, ağladacaq sən kimi dövran məni də.

Söyləyin qul Ayaza bircəmi Sultan Mahmud?
Neçə eşq əhli sanır eşqdə sultan məni də.

"Müstəqillik" deyibən meydana cumduq bir vaxt,
Hələ də "gəl" deyibən çəkmədə meydan məni də.

Dedilər qoç başı qovğadə gərəkdir, ey qoç,
Kəsəcəklər deyəsən sən kimi qurban məni də.

Bir şirin busə olar min acı dərmanə əvəz,
Bezdiribdir acı dərman ilə loğman məni də.

Cananımdan giley etdim qazıya, söylədi ki,
Elə divanə edib evdəki canan məni də.

Sağlığında nə qədər şairi incitmişlər,
Neçə qal əhli çıxıb etdi pərişan məni də.

Təzə əsrin təzə şer əhlinə ümmid edirəm,
Biləcək, Şahina, layiqli qəzəlxan məni də.

*5.12.1996*

***

Kədər gəlməkdə sel boyda, divarımsan, əlac eylə,
Qəmim var Çənlibel boyda, Nigarımsan, əlac eylə.

Bulud yan durdu, taqət yox, günəş yandırdı, taqət yox,
Varımsan, sərvə hacət yox, çinarımsan, əlac eylə.

Nə həzzim var mənim sənsiz, nə şəndir məskənim sənsiz
Saralmış gülşənim sənsiz, baharımsan, əlac eylə.

Yan oldum laləzarımdan, seçilmir nalə zarımdan,
Kənar oldum nübarımdan, nübarımsan, əlac eylə.

Sən eşqimdən yanırsansa, Böyük Şeyxi anırsansa,
Məni Sənan sanırsansa Xumarımsan, əlac eylə.

Qoy olsun şər kənar səndən, əlimdə hər nə var - səndən,
Əməl məndən, qərar səndən, qərarımsan, əlac eylə.

Vüsalı dəmbədəm andı, bu Şahin hicrdən yandı,
Açıq bəxtim qıfıllandı, açarımsan, əlac eylə.

*9.12.1996*

***

İçib eşqin meyini olmadayam məstanə,
Nə mənə saqi gərəkdir, nə də ki meyxanə.

Eşq bəhrində üzüb bir neçə yol batsam da,
Sanmasınlar ki, daha girməyirəm ümmanə.

Mərdə mərdanə yaraşmaqdadı, mərdanəyə mərd,
Mənə mərd söylədilər, dilbərimə mərdanə.

İbrətamiz yaşamaqçın o biri aləmdə
Bu həyat aləmi çoxdan bizə ibrətxanə.

Aşiqəm mən elə gerçək, nəçidir Qeys, mənə
Hər nağılçı baba qoy söyləməsin əfsanə.

Məni eşqinlə deyirsən bu qədər yandırma,
Alışıb yanmalıdır şəm oduna pərvanə.

Qəlbim içrə bu nə oddur, nə alovdur, Şahin,
Az qalır əldə qələm istiliyimdən yanə.

*10.12.1996*

***

Hər gecə hərçənd mən yatmaqdayam min ah ilə,
Hər səhər açmaqdayam göz amma "Bismillah" ilə.

Bəxtəvər günlər xəyalı vəslə çatdırmır bizi,
Durmuşuq biz üzbəüz hicran tək timsah ilə.

Müşkülat həddindən artıq, varmıdır islah edən?
Müşkülatın həlli mümkündür fəqət islah ilə.

Bir tərəfdən "Allah-Allah" söyləyirlər məkr ilən,
Başqa yandan cəng edirlər gündə "Hizbillah" ilə.

"Kərbəla hər yerdə var" ərz etsələr aldanmayın,
Etmişik çox-çox səyahət biz də çox səyyah ilə.

Dərdim həddindən ziyadə, dərdbilən, eyvah, yox,
Şahina, ötməkdədir hər gün günüm "eyvah" ilə.

*5.02.1997*



***

Aşiq, daha bağlanma o dildarə dübarə,
Bil ki, edəcək qəlbini yüz parə dübarə.

Tərk eyləyibən sən onu ağ günlərə çıxdın,
Qoyma ki, ola ruzigarın qarə dübarə.

Bica aradın sən onu, bədbəxt olacaqdın,
Xoşbəxtliyi xoş niyyət ilə arə dübarə.

Gəl mənəvi zənginliyi əldən daha vermə,
Göz dik təzədən sevgi təki varə dübarə.

Əğyarə çevirmişdi səni, düz yola düşdün,
Meylin salacaq qeyri bir əğyarə dübarə.

Hərçənd o dildar səni hey daramaqda,
Get öz yarının saçlarını darə dübarə.

Çalmaq yerinə öyləsinin könlünü, Şahin,
Çək mizrabı əvvəlki kimi tarə dübarə.

*24.02.1997*

***

Durmaqda zaman məkan üzündə,
Yainki məkan zaman üzündə?

Gördük, yer üzündə asiman var,
Rəbbim, nə var asiman üzündə?

Ulduz bəzək oldu kəhkəşanə,
Var özgə nə kəhkəşan üzündə?

Var isə yamanlığımda yaxşı,
Yaxşı görünür yaman üzündə.

Şair deyəni düşərsə başə,
Olmazmı ziya çoban üzündə?

Söz yox ki, dumanda gün görən yox,
Mən gün görürəm duman üzündə.

Zülmətdə - işıq, işıqda - zülmət,
Şahin, işıq ol cahan üzündə.

*29.03.1997*

***

Fırlanmadadır toz yenə meydan üzərində,
Nöqsan görürəm mən neçə nöqsan üzərində.

Var bəndə ki, gündüz-gecə fikr etmədədir ki,
Hökm eyləyə bilsin necə sultan üzərində.

Çox nakəsi təbim ilə sındırmışam artıq,
Sınmış gəmi qalmaz daha ümman üzərində.

Üstdən görürəm hər şeyi, altdan yanacaqdır
Hər kim ki, qərar eyləsə vulkan üzərində.

Gördüm neçə loğmanı ki, loğmanlığı bilmir,
Təcrübə apardım neçə loğman üzərində.

Əlbəttə, vüsal olmayacaq bir də müyəssər,
Kim zərbini göstərməsə hicran üzərində.

Mərcanı gətirdim ələ, şəksiz o mənimdir,
Amma vuruşurlar yenə mərcan üzərində.

Bir "Divan"ı, Şahin, bitirib kamə yetişdim,
Tər tökmədəyəm mən yeni "Divan" üzərində.

*2.04.1997*

***

Söz zərgəri oldum deyə zər var qəzəlimdə,
Zər var deyə şer içrə zəfər var qəzəlimdə.

Dəmdən-dəmə şirin sözümü eyləsə təkrar,
Tuti biləcəkdirmi şəkər var qəzəlimdə?

Gül - bülbülü seyr etmədəyəm tazə nəzərlə,
Köhnə nəzərə tazə nəzər var qəzəlimdə.

Bəzən mənə yar oldu sevinc hissi təbii,
Bəzən də ələm, qüssə, kədər var qəzəlimdə.

Vəsf eyləmirəm Leyli və Şirinləri təkcə,
Şöhrətli Nigar, şanlı Həcər var qəzəlimdə.

Üstünlüyümü tazə əsrdə biləcəklər,
Bir mən bilirəm indi nələr var qəzəlimdə.



Bağçamda çəpər görməyəcəklər mənim, amma
Yad kəlmələrə qarşı çəpər var qəzəlimdə.

Söz gülşənimi əcnəbi güllər bəzəmirlər,
Əsla deməm həftəbecər var qəzəlimdə.

Təbim məni yandırsa da dönməz külə cismim,
Qudyal çayı, Kür nəhri, Xəzər var qəzəlimdə.

Şahin qəzəli tər axıdıb "Divan" edibdir,
Vəznim qədəri bəlkə də tər var qəzəlimdə.

*4.04.1997*

***

*Şair və tarixçi alim Həyat Şəmiyə*

Yenə sürətlə gələn yanıma hicrandı belə,
Təzədən tərk eləyən aşiqi canandı belə.

Nəzərimdə yenə aləmdəki rənglər qarışır,
Nə sudur qırmızı bu? Ya ki, nə ağ qandı belə?

Ayıra bilməyirəm hətta qəzəlxanları da,
Bilmirəm bu Qənidir, ya Baba Pünhandı belə?

Ağqoyunlu qoşunu gəldi yenə röyamə:
Bu nə bayraqdı, nə ləşkərdi, nə meydandı belə?

Baş əyirlər Səfəvi şahına şahlar bir-bir...
Necə şahlardı ki, lərzandı, pərişandı belə?

Dağçapan bilməyirəm Qeys idi, ya Fərhaddı?
Çölgəzən Məcnun idi, yoxsa ki, Sənandı belə?

Aparırlar məni qoç tək başımı kəsməkçin,
Bu nə bayramdı, nə qoçdur bu, nə qurbandı belə?

Ölkəm içrə günü-gündən çoxalır meyxanə,
Kafəristandı bu, ya Azəribaycandı belə?

Qarabağ öylə fəlakətdə, Fələstin böylə...
Bu nə dövr oldu əzazil, bu nə dövrandı belə?

Əgər əcdadımız Adəm baba olmuşsa bizim,
Bu nə kafər, nə yəhudi, nə müsəlmandı belə?

Bizi var-yoxsuz edən göydəki varlıqdırmı?
Bu nə əmr oldu, nə hökm oldu, nə fərmandı belə?

Öyrənən quş dilini tazə Süleymanəm mən,
Bu nə dil, - söylədilər, - ya nə Süleymandı belə?

Bir qəzəldə neçə mövzu qarışıb bir-birinə...
- Bu nə Şahin, - dedilər, - ya nə qəzəlxandı belə?

*24.04.1997*

***

Fələyə öylə ucalmaqda fəğanım bu gecə,
Səhərə çıxmağıma yoxdu gümanım bu gecə.

O cahan içrə görən varmı qaranlıq gecələr?
Nə qaranlıqdı, İlahi, bu cahanım bu gecə.

Oldu ağ qarə saçım, çün dedi yar "eşq yoxdur",
Tərk edib mən qocanı getdi cavanım bu gecə.

Ürəyimdə nə qədər tabü təvanım vardı,
Aman Allah, tamam oldu təvanım bu gecə.

Aşiqin faidəsi eşq ilə əmr etməksə,
Faidəm bitdi, yenə gəldi ziyanım bu gecə.

Vəsl oxu hicri nişan aldı gümanımda müdam,
Gərilib mən tərəfə indi gümanım bu gecə.

Şahinəm, zənn eləyirdim ki, hayanım vardı,
Yar yoxdur, deməli yoxdu hayanım bu gecə.

*11.05.1997*

***

Məni məst eylədi təsnif yenə, rəng yenə,
Əqlimi aldı başımdan neçə ahəng yenə.

Elə şirin danışırsan acılıqdan yox əsər,
Şipşirin gəldi, əzizim, mənə turşəng yenə.

Söhbətə başladı aşiq yenə eşq haqqında,
Yorula bilməyəcək onda bu gün əng yenə.



Gəlib əğyar dedi eyləməyim mən onu həcv,
Məni, əğyarə deyin, eyləməsin dəng yenə.

Yenə iblis çoxalıb, xəlqi xəbərdar edirəm,
Döyürəm gündə nəqarə, çalıram zəng yenə.

Cəng atır köhnə qəzəllər nə qədər cüng içrə,
Atacaq, köhnə əgər olsa, sözüm cəng yenə.

Gözlərim göz yaşı yox, qan axıdır, ey Şahin,
Bağçamın güllərinə verməkdəyəm rəng yenə.

*8.09.1997*

***

Görməyibdir belə bir mötəbəri bir kimsə,
Ələ düşməz, gözəlim, sən təhəri bir kimsə.

Verəsən gər mənə ağu içərəm xoşluqla,
İçməyib öz xoşu ilən zəhəri bir kimsə.

Sən xəta əhli deyilsən ki, xəta eyləyəsən,
Görməyibdir hələ səndən xətəri bir kimsə.

Gəh qaşındır, gəh üzün - mən belə təşbih edirəm,
Belə təşbih edə bilməz qəməri bir kimsə.

Bir günəşdən savayı, bir də ki, səndən başqa
Etməyibdir hələ parlaq səhəri bir kimsə.

Günümü şirin edibdir bu nigar, ey tuti,
Mən kimi sevməyəcəkdir şəkəri bir kimsə.

Bağdayam, bağla bağı get evinə, arxayın ol,
Bağiban, aşmayacaqdır çəpəri bir kimsə.

Hər səfərdə üzüm ağ oldu mənim, zənn edirəm
Vurmayıbdır başa mən tək səfəri bir kimsə.

Söz - kəhərdir, sürürəm istədiyim səmtə onu,
Mən kimi sürməyəcəkdir kəhəri bir kimsə.

Hələ sevda səfərim var mənim Məcnun tək,
Çəkməyibdir bu səfərdən zərəri bir kimsə.

Sevginin sonsuz olan sahəsi var, sahili yox,
Çıxmayıb sahilinə müxtəsəri bir kimsə.

Əl-qol atmaqda bu ümmanə düşüb Şahin həm,
Üzmək ilən keçə bilməz Xəzəri bir kimsə!

*4.10.1997*

***

Ürəyimdən asılıb sanki ağır daş yenə,
Faş edib çünki mənim sirrimi sirdaş yenə.

İstəməzdim çoxunu mən gələcək əyyamın,
O xoş əyyam dönəydi geriyə kaş yenə.

Qələmim vəsf eləyəydi o qələm qaşlarını,
Çatmayaydı qaşını kaş o qələmqaş yenə.

Deməmişdimmi məgər vur daşa sınsın badə?
Gözlərindən axıdır yaş yerə əyyaş yenə.

Məstə mey şişəsini vermə, çəkin, ey saqi,
Ağlı çıxmış deyə başdan yaracaq baş yenə.

Yuxu gəlmir gözümə, qəlbi cahan dərdi sarıb,
Nənəm olsaydı verərdi mənə xaşxaş yenə.

Həmi Fazil yaradır, həm də ki, cahil yaradır,
Gərdişindən fələyin açmayıram baş yenə.

*21.10.1997*

***

Ey yolçu, xəta etmə, xətər fikrinə düşmə,
Fikrin bu isə, onda səfər fikrinə düşmə.

Olsun ki, gücün var, hünərin var, təpərin var,
Mərdanəliyin yoxsa zəfər fikrinə düşmə.

Hərdən məni səslər yenə meyxanəyə saqi,
Canan, xəbərin yoxsa xəbər fikrinə düşmə.

Ey bağiban, incitmə bizi, insafın olsun,
Yar ilə girək bağə, çəpər fikrinə düşmə.

Olsan belə yer kürrəsinin sultanı, Xosrov,
Şirinin əgər varsa, Şəkər fikrinə düşmə.



Ay seyrinə çıxdım yenidən, ey gecə, çox qal,
Qonmuş nəzərim ayə, səhər fikrinə düşmə.

Fikrimdə, xəyalımdadı, qəlbimdədi Kəbə,
Şahin, Ərəbistanə səfər fikrinə düşmə.

*7.12.1997*

***

Mənəm tabsız, mənəm üzgün, yar ol, Yarəb, yetiş dadə,
Pozanda pozmuşam düzgün, yazanda yazmışam sadə.

Ömür şamdır həyat içrə, yanan kim, yandıran kimdir?
Həyat ötmüş təmənnadə, ömür keçmiş müəmmadə.

Ümidsizlik keçib həddən, gümanə nagümanəm mən,
Gümanə nagüman insan nələr çəkmiş bu dünyadə?!.

Mənəm Məcnunü Fərhadı bu dövrün, tay sanarlarmı
O Məcnuni bu Məcnunə, o Fərhadı bu Fərhadə?

Hariflər əldə mey tutmuş, mən isə saqinin zülfün,
Uduzmuş kim bu məclisdə, kim udmuşdur bu sevdadə?

Biliblər eşq düsturin, görüblər Tanrının nurin,
Müsəlmanlar Məhəmməddə, məsihilər Məsihadə.

Şiə, sünni - iki dindaşıdır islamın aləmdə,
Nələr çəkdik təbərradən, nələr gördük təbərradə*?

Mənəm gücsüz, mənəm qadir, mənəm aciz, mənəm mahir...
Əqidəm gün kimi zahir o misradə, bu misradə.

Qəzəllər yazmışam min-min... əsərlər rəmzidir eşqin,
Min ildən sonra da, Şahin, məni xəlqim salar yadə.

*4.01.1998*

***

Qəlbimdə mənim yarə inam var həmişə,
Əğyarləri eylərəm inkar həmişə.

Minnət yükü altda nə qədər qədd əyilirkən,
Mən qəddimi şax tutmuşam, ey yar, həmişə.

* Təbərra - düşmənçilik deməkdir. Şiəlikdə ən mürtəce baxışdır.

Xahişlərini hökm ilə bildir mənə daim,
Əmr eylə, buna ixtiyarın var həmişə.

Memarların meyarı abad eləməksə,
Meyarə əməl etməli memar həmişə.

Tənə oxunu kim mənə yağdırdı nahaqdan,
Eyham oxuna oldu giriftar həmişə.

Şah İsmayılın şəxsən özü cəng eləyibdir,
Baş olmalıdır orduda sərdar həmişə.

Şair elə yazsın ki, gərək xəlq başa düşsün,
Mən xəlqiliyi eyləmişəm car həmişə.

Milli qəzəlin olmalıdır xəlqi libası,
Şahin eləyibdir bunu təkrar həmişə.

*13.01.1998*

***

Şirin gözəlim, sən məni Fərhad gəl eylə,
Viranə olan könlümü abad gəl eylə.

Zənn eyləmirəm eşqimizi yad eləmirsən,
Çıxmışsa yadından bu sevən, yad gəl eylə.

Qəddim əyilibdir, təzədən dərd çəkirəm mən,
Dərddən məni loğman kimi azad gəl eylə.

Şadlıqsevən idim, yenə zar olmuşam, ey yar,
Zar ilə ötən ovqatımı şad gəl eylə.

Hərçənd ki, ev yıxmağı bihudə sanırsan,
Hicrin evini vəsl ilə abad gəl eylə.

Şagird deyiləm mən daha eşq məktəbi içrə,
Ustadlərə sən məni ustad gəl eylə.

Vardır iki göz məndə, fəqət hüsnünə, dilbər,
Dörd gözlə baxan Şahinə imdad gəl eylə.

*15.01.1998*

***

Bu sayaq işləsə hərgah qələm qaş üstdə,
Araya qan düşəcəkdir o qələmqaş üstdə.

Sirrini sirdaşımın verməyirəm əğyarə,
Bir zaman öldürəcəklər məni sirdaş üstdə.



Daş atırsan neçə vaxtdır ki, mənim bostanıma,
Nə zaman daş qoyacaqsan axı sən daş üstə.

Ağlama, göz yaşına dözməyə halım yoxdur,
Gözlərimdən düşəcəkdir yenə yaş yaş üstə.

- Ağ üzündən qoparıb at o qara xalı, - dedim,
Dedi: - Kişmiş də axı olmalıdır aş üstə.

Gözəlim, müti olubdur sənə Şahin öylə,
Diləsən kəs başını, dil deyəcək "baş üstə!".

*27.02.1998*

***

Eləyirlər niyə heyrət bu üzülmüş canə?
Üzülüb can o zamandan ki, gedib cananə.

Sağlığında kimə əfsanə yaratmışlar ki?
Gözəlim, eşqimə bir gün yaranar əfsanə.

Neçə mərdanəliyim eylədi əfsanə səni,
Sənə məstanə deyirlər, mənəsə - mərdanə.

Ayaq üstündə gərək qarşılayım gəlsə əcəl,
Mən ləyaqətlə vida etməliyəm dövranə.

Məni bükdükdə, deyin bağlamasınlar kəfəni,
Ola bilsin ki, durub rəqs eləyim məstanə.

Nə qədər şerü elmdə uğurum var mənim,
Dost sevinməkdə, həsəd çəkmədədir biganə.

Başımı şax tuturam mən yaradıb xəlqi qəzəl,
Şahinəm, ömr uzunu olmalıyam şahanə.

*2.03.1998*

***

Eşq nərdi önümdə və məhəbbət zəri əldə,
Şad ol, gözəlim, sevgimizin zivəri əldə.

Yığdım yenə səndən ötəri, gülsevənimsən,
Güldəstə varımdır yenə də, ey pəri, əldə.

Cəng eyləmişəm daima haqsızlığa qarşı,
Hifz eylə, gülüm, mən kimi cəngavəri əldə.

Tənqid edirəm Xosrovu mən, çünki o aşiq
Həm Şirini tutmuş, həmi də Şəkkəri əldə.

Güc qalmasa qollarda və qüvvətsə ayaqda,
Gəzdirməliyik xəlqi sevən rəhbəri əldə.

Şəksiz ki, zəfər məşəli əldən gedəcəkdir,
El saxlaya bilməzsə əgər əsgəri əldə.

Var badə tutan, qələ tutan, ölkə tutanlar,
Gündüz-gecə Şahinsə tutub dəftəri əldə.

*24.03.1998*

***

Vəslini bir də nigarım mənə lütf eyləməsə,
Bitəcək səbrü qərarım mənə lütf eyləməsə.

Xislətimdən alıram həzz vüqar əhli kimi,
Sınaram həzzi vüqarım mənə lütf eyləməsə.

Mən nə Sənan olaram, otladaram mən nə sürü,
Qaçaram - eşqi Xumarım mənə lütf eyləməsə.

Gedirəm qürbətə tez-tez, ölərəm xiffətdən,
Ən həzin nəğməni tarım mənə lütf eyləməsə.

Nikbinəm, rəqs edərəm bəlkə məzarımda belə,
Çatlaram rəqsi məzarım mənə lütf eyləməsə.

Edərəm birkərəlik tövbə şərab içməkdən -
Badəni sevgili yarım mənə lütf eyləməsə.

Torpağın altı olar məskənim, əlbət, Şahin,
Gülümü gərçi baharım mənə lütf eyləməsə.

*15.05.1998*

***

Saf məhəbbət əyan olar böylə,
Yarə yar mehriban olar böylə.

Eşqini gül tək ərməğan etdi,
Aşiqə ərməğan olar böylə.

Yarıma gündə imtahanım var,
Sevgidən imtahan olar böylə.



Yıxmışam çox igidi meydanda,
Dedilər pəhlivan olar böylə.

Saçlarım ki, ağardı, yox dərdim,
Dağ başında duman olar böylə.

Sızlaram hicri bircə gün görcək,
Yaxşı günlər yaman olar böylə.

Nikbinəm mən, nədir bu bədbinlik?
Ey cavanlar, cavan olar böylə.

Şahinin sözləri olur "Divan",
Püxtəlikdən nişan olar böylə.

*2.06.1998*

***

Ey əcəl, gəlmə hələ, sevgili dilbər - Yerdə,
İnana bilməyirəm öyləsi var hər yerdə.

Göydə, məlum mənə ki, mənəvi aləm vardır,
Maddi aləm isə cümlə müyəssər - Yerdə.

Hələ mən nəqdi qoyub nisyəyə aldanmamışam,
Oxşayır gözlərimi lalə, sənubər Yerdə.

Buğda üstündə Yerə qovladılar Həvvanı,
Gördü göydən düşərək buğda sərasər - Yerdə.

Səpirəm mən gecə-gündüz yerə göz yaşlarımı,
Bəlli işdir ki, çiçəklər göyərər tər yerdə.

Yoxdu Kövsər suyu üçün göyə uçmaq meylim,
Çünki, Qudyal suyudur Şahinə Kövsər - Yerdə!

*12.06.1998*

***

Ehtiram olsa da çox sərvərə gündüz və gecə,
Eşq ola Mirzə Əli Əkbərə gündüz və gecə.

Şair olmaq diləsən dik varağa gözlərini,
Otur şerini yaz dəftərə gündüz və gecə.

Ey müsəlman, xəbərin varmı, yağışlar sayağı,
Lənətim yağmadadır kafərə gündüz və gecə.

Əlimizdən Qarabağ çıxdı, gərək cəng eləyə,
Girə əsgərlərimiz səngərə gündüz və gecə.

Nəyə lazımdı qıfıllar ki, qapansın qapılar,
Qoy açılsın üzə hər pəncərə gündüz və gecə.

O səbəbdən ki, nigarım gülün aludəsidir,
Bağiban, qoy bu sevən gül dərə gündüz və gecə.

"Görməmiş" söyləyəcəklər mənə, Şahin, bilirəm,
Dikmişəm gözlərimi dilbərə gündüz və gecə.

*14.07.1998*

***

Mənlə Kəbə arasında neçə dağ olsa belə,
Çox yaxındır mənə, hərçənd uzaq olsa belə.

Diridir yaxşı qəzəlxan ki, ölübdür çoxdan,
Ölüdür bəzi qəzəlxan hələ sağ olsa belə.

Dilimin sözlərinə xor baxanın düşməniyəm,
Deyirəm mən bunu min bir kərə, ağ olsa belə.

Əl açıb söz dilənən var, dilənmək yaramaz
Paltar üstdə neçə üst-üstə yamağ olsa belə.

Hərə öz bildiyi işdən çalışıb tutmalıdır,
Mən Ələddin deyiləm əldə çırağ olsa belə.

Çıxmışam bir neçə yol imtahanından eşqin,
Üzüağ çıxmalıyam gündə sınaq olsa belə.

Daha meyxanəyə dəyməz qədəmim heç vədə,
Getmərəm mən oraya məndə marağ olsa belə.

Saqidən əvvəl-axır üzməliyəm əl, Şahin,
Qollarım qollarına gərçi calağ olsa belə.

*5.08.1998*

***

*Ey Mir Cəlal Zəki!*

Biri molla, biri xidmətçi olur mollaya,
Eşq üçün göndərib Allah mənisə dünyayə.

Deyibən "Eşq" o saət açıram gözlərimi,
Arabir öylə ki, hərdən dalıram röyayə.

Mən şəhər Məcnunu tək tarixə düşdüm, çünki
Düşmədim "Leyli, aman Leyli" deyib səhrayə.



Yazıram şerimi hər gün çəkilib bir küncə,
Qoşuram baş nə, cəngə, nə də bir dovğayə.

Məni mənə da düşündürmədədir, surət də,
Verirəm qiyməti həm surətə, həm mənayə.

Canda yar eşqi, diyar eşqi coşub-daşmaqda,
Mən bu coşğunluğu nisbət qılıram dəryayə.

Şahinəm, qoymasın Allahımız, ey tuti quşu,
Məni canənəyə həsrət, sənisə - xurmayə!

*6.11.1998*

***

Bilməyirəm heç nə səbəbdir yenə,
Naz eləmək dilbərə dəbdir yenə.

Bitmədə qış mövsümü, şadəm buna,
Gəlmədə yaz fəsli, əcəbdir yenə.

Yazmalıyam mən yenə əvvəlki tək,
Tazələmək təbi tələbdir yenə.

Yarə qəzəl söyləmədim mən bu gün,
Kin təzədən gəldi, əsəbdir yenə.

Meyli əgər yoxsa, mehrsizləşib,
Rəhmi əgər yoxsa, qəzəbdir yenə.

İstəyir olsun yenə Məcnunə tay,
Şahinə bax, sanki ərəbdir yenə.

*6.12.1998*

***

Ya İlahi, o gedən cananı qaytar yerinə,
Üstəlik can da gedibdir, canı qaytar yerinə.

Neçə gündür ki, gəlib sakini olmuş evimin,
Çox rica eyləyirəm, hicranı qaytar yerinə.

Guya mehman olacaq bir neçə gün, istəmirəm,
O həyasız, o rəzil mehmanı qaytar yerinə.

Düşmürəm heç başa şeytanı neçin xəlq elədin?
Sənə mən yalvarıram: Şeytanı qaytar yerinə.

Mənə cənnətdə də təklif eləmə qılmanı,
Hurini ver bəriyə, qılmanı qaytar yerinə.

Düşübən çöllərə qansız nə qədər ovçu gəzir,
Ahunu çək qoruğa, ceyranı qaytar yerinə.

Sevginin xəstəsiyəm mən, niyə loğman gəldi?
Mən əlac istəmirəm, loğmanı qaytar yerinə.

Sevdiyim yar əgər qiymətimi bilməzsə,
Əhdi poz, sazişi qır, peymanı qaytar yerinə.

Nə gərək erməni Əsli? Kərəmi yandırma!
Nə gərək gürcü qızı? Sənanı qaytar yerinə!

Hamıya bəlli: Bəşər xilqəti heçdən yaranıb,
Şahini heçliyə göndər, canı qaytar yerinə.

*11.12.1998*

***

Yaşayırsa kim əgər mey dolu cam xatirinə,
Ömrünü sərf eləyir, məncə, haram xatirinə.

Çıxıram mən dama Allahə yaxın düşməkçin,
Mən dama çıxmayıram sadəcə dam xatirinə.

Eşq mülkündə nizam olmalıdır hər vədə,
Daima ömr eləyək biz də nizam xatirinə.

"Yaşasın Eşq!" deyib can verək, ey aşiqlər,
Badə getsin başımız böylə məram xatirinə.

Eşqin ülviyyətinə etiqadım var mənim,
Gözəlim, aşiqə rəhm eylə imam xatirinə.

Məni gördükdə bütün vaxtını sərf eylə mənə,
Mənə vermə salamı təkcə salam xatirinə.

Mənə qoy Qeys məqamı ola qismət, Rəbbim,
Mən məqam istəmirəm heç də məqam xatirinə.

Eşq şam isə mənəm eşqə yanan pərvanə,
Daima istəmişəm yanmağı şam xatirinə.

Bağiban, bülbülü qov, bağinə Şahin gəldi,
Gülü sən bəslə ləyaqətli adam xatirinə.

*29.12.1998*



***

*Qəzəlxan Hacı Ələmdar Mahirə*

Gəzirəm badəvü peymanə yanımda, sənə nə?
Mənə bənzər neçə məstanə yanımda, sənə nə?

Dostum, əlbəttə ki, Fərhad ilə Sənan olmuş,
Hələ Məcnun kimi divanə - yanımda, sənə nə?

Bəllidir, getməmişəm yol hələ biganə ilə,
Ya, olubdur neçə biganə yanımda, sənə nə?

Sənə nə simü zərə məndən meyl yox, yaxud
Etibar görmədi dürdanə yanımda, sənə nə?

Mən tikanlarla, alağlarla barışmaz düşmən,
Gül kənarımda, mixək, nanə yanımda, sənə nə?

Sənə nə məclisə namərdi yaxın qoymayıram,
Ya da vardır neçə mərdanə yanımda, sənə nə?

Sənə nə təsbehi fırlatmayıram molla kimi,
Saqi böyrümdədi, meyxanə yanımda, sənə nə?

Biri yarımdı mənim, digəri ilham pərisi,
Gəzirəm mən iki cananə yanımda, sənə nə?

Həmi şair, həmi alim kimi hər gün yazıram,
Şahinəm, şövqü həvəs var canımda, sənə nə?

*2.03.1999*

***

Razılaşma tökülə gözlərimin yaşı yerə,
Yola gəl, tök ətəyindən, gözəlim, daşı yerə.

Ey fələk, ağrın alım, hardadı sirdaşlərim,
Qaldırıb göylərə, vurdun neçə sirdaşı yerə.

Bu nə qışdır ki, qarından bir əsər görsənmir,
Yağacaqmı görəsən qar yenə quşbaşı yerə?

Yeri yaş etmədi ambarı göyün, hərçənd ki,
Tökülür çox fəqirin gözlərinin yaşı yerə.

Bilməyirlər ki, yerin taleyi göydən asılı,
Bağlanıb sidq ürəkdən nə qədər naşı yerə.

Qibləniz, bəlli ki, meyxanədi, məscid deyil,
Çırpmışam qaldırıban mən neçə əyyaşı yerə.

Göyə qaldırmayıram zurnaçı tək baş, Şahin,
Nə də hambal sayağı əyməyirəm başı yerə.

*20.03.1999*

***

Kim sevsə bu dünyadə cananı məhəbbətlə
Dəf eyləyəcək hicri, hicranı məhəbbətlə.

Qılmanınam, ey huri, sənsən gözümün nuri,
Huri də gərək sevsin qılmanı məhəbbətlə.

Bəhs eyləyəcək daim irfani məhəbbətdən,
Hər kim sevə bilmişsə irfani məhəbbətlə.

Üsyanə edən üsyan insan idim əvvəllər,
Alqışlayıram indi üsyanı məhəbbətlə.

Mən tək bəyənib cəngi zəng etdi Ərəbzəngi:
- Hazırlamışam cəngə meydanı məhəbbətlə.

Bilməm niyə dövranə sevgim tükənir hər gün?
Xəlq etmədimi Rəbbim dövranı məhəbbətlə?

Cismani məhəbbətdən, canan, üzülüb cismim,
Şahin səni sevməkdə ruhani məhəbbətlə.

*26.07.1999*

***

Vardır yenə dəftər o qələmqaş əlində,
Dəftər yerinə qəlbim ola kaş əlində.

Sən bir də məni gözləmə, saqi, xudahafiz,
Meyxanəni gördüm neçə əyyaş əlində.

Sirrim yenə quş timsalı uçmuş ürəyindən,
Ey kaş, tuta sirrimi sirdaş əlində.

Yarəb, niyə sınmır görəsən cəngin ayağı?
Çoxmu çıxacaq qarşımıza baş əlində?

Fərhadı neçin bir belə tərif eləyirlər?
Nəqqaş işi müşkildimi nəqqaş əlində?



Mən şeri təmiz yazdığım üçün daş atırlar,
Şahin, yenə qalmış yaxamız daş əlində.

*23.10.1999*

***

Addımlaya bilməz ayağım yad ilə birgə,
Rədd eyləyirəm yardımı imdad ilə birgə.

Çərxin diridir yaddaşı, tarix varağında
Nifrət yazılıb Firona Şəddad ilə birgə.

Aşiqlərə tüğyan eləyir məndə məhəbbət,
Yad eyləyirəm Məcnunu Fərhad ilə birgə.

Şerimdə mənim qəm də görünməkdə, fərəh də,
Var onda həlimlik dəxi fəryad ilə birgə.

Sevdim yarımı öylə ki, cənnətdə nə huri?
Qalmaq dilərəm mən o pərizad ilə birgə.

Daim anıram Kabulu, İstanbulu, Rəşti,
Şahin, sevirəm Təbirzi Bağdad ilə birgə.

*15.03.2000*

***

Baxa bilsəydi bu dəm sevgili canan özünə,
Məndən artıq olar idi özü heyran özünə.

Bağbanın görkəminə baxmayın üstdən aşağı,
Bağə baxdı həmişə, baxmadı bağban özünə.

Birləşə bilməyirik biz niyə kafərlər tək,
Özünə pislik edir hey bu müsəlman özünə.

Gündə fərman eləyən millətə rəhbər görürəm,
Barı etsin, kor olub eybinə, fərman özünə.

Ey ölümdən qaçan insan, ölümə yox çarə,
Çarə tapsaydı edərdi onu loğman özünə.

Bu fəna aləmə bənd olma, ömür fanidir,
Əbədi san o biri aləmi hər an özünə.

Dirilik çeşməsi axtarmadasan, ey Şahin,
Tapa bilsəydi tapardı onu sultan özünə.

*27.05.2000*

***

Buludun faidəsi varmı şüa istəyənə?
Bəxş elə şəfqəti, ey Tanrı, şəfa istəyənə.

Yarasa atmadı can vəslinə yetsin günəşin,
Günəşin vəsli nəsib oldu ziya istəyənə.

Məscidə qoyma şərab əhlini, ey molla, daha,
Bağla meyxanəni, ey saqi, dua istəyənə.

Ey qəzəlxan, sözünün qiymətini, qədrini bil,
Şeri heç vədə ucuz satma baha istəyənə.

Şer olsun təki, vəznin o qədər yox fərqi,
Əruzun mənfəəti azmı heca istəyənə?

Çoxalır get-gedə yaş, ey pəri, səndən savayı,
Hələ rast gəlmədim aləmdə qoca istəyənə.

Bivəfa kəsləri seyr eyləyibən, ey Şahin,
Bivəfa olma, vəfa eylə vəfa istəyənə.

*31.05.2000*

***

Hamıdan qaçdı və tez gəldi kədər mən tərəfə,
Gələcəkdir hələ, eyvah, nələr mən tərəfə.

İstərəm mən gecə də gün yaya öz şöləsini,
Səpə öz nurini gündüz də qəmər mən tərəfə.

Bəxtəvər qoy bilə aləm məni, ey sevdiciyim,
Qəhqəhə sən tərəfə gəldi, qəhər mən tərəfə.

Sənə göyqurşağı rəngində kəmər vermişdim,
Bir də gördüm açılıb düşdü kəmər mən tərəfə.

Başın üstündə günəş parlasın, ey sevdiciyim,
Günəş öz nurini bir gün də səpər mən tərəfə.

Sənin asudəliyindən o qədər şadəm ki,
Arxayınlıq sənə üz tutdu, xətər mən tərəfə.

Dəli sevda qumarım oldu uğursuz, şadəm,
Faidə sən tərəfə düşdü, zərər mən tərəfə.

Hər sınaqdan quru çıxdım həmişə, hərçənd ki,
Şahina, yağdı yağışlar kimi şər mən tərəfə.

*14.06.2000*



***

Allah yaratdı insanı həyatə,
İnsan isə çatdı cismani həyatə.

Üz tutdu dəmadəm gerçəkliyə doğru,
Hər fani həyatdan irfani həyatə.

Zülmü hədə bildi, həqqə gedə bildi,
Mənsur edə bildi üsyanı həyatə.

Bildim necə yol var: Gündüz-gecə yol var,
Nurani zəkadən nurani həyatə.

Çismani qovuşma, ruhani qovuşma...
Üstünlüyü verdim ruhani həyatə.

Daim ola meylin imkanə münasib,
Tətbiq elə, Şahin, imkanı həyatə.

*22.06.2000*

***

Yanıma yollanacaqdır yenə dildar gecə,
Gecədən sübhə kimi ülfətimiz var gecə.

Bizə gündüz gətirərsən meyi sən, ey saqi,
Olmasa yaxşıdı məncə o zəhrmar gecə.

Məcnunun naləsi gündüz də var idi, gecə də,
İndiki aşiq isə təkcə olur zar gecə.

Ey günəş, çıxma, çıxarma gecənin paltarını,
Gözlər ağ üzlü nigarı qarapaltar gecə.

Yaxşı ki, ay ilə ulduzda sənin şölən yox,
Yoxsa, gündüz kimi parlar idi par-par gecə.

Çox əməl görsə də, şadıq, dili yoxdur gecənin,
Gündüzə sirrimizi eyləməyir car gecə.

Şahinin həzzi qədərsiz ki, qəzəldən çəkib əl
Ona ilham pərisi nəğmə pıçıldar gecə.

*11.07.2000*

***

Başladım mən yenə fəryadıma gündüz və gecə,
Yetməyir bircə adam dadıma gündüz və gecə.

Təzə xislət yaranıb səndə, inan, heyranəm
Sən kimi nazlı pərizadıma gündüz və gecə.

Mən ki, hər ləhzə və hər dəm sənə xidmətçi idim,
Yetməyirsən niyə imdadıma gündüz və gecə?

Aramızda nələr olmuşsa ötən günlərdə
Birbəbir düşmədədir yadıma gündüz və gecə.

Vətənin qədri bilinsin həmişə, övladım!
Deyirəm mən bunu övladıma gündüz və gecə.

Mən savab iş tuturam indi o babətdən ki,
Oxuna sonra dua adıma gündüz və gecə.

Nər Nizamim gecə-gündüz qələm işlətmişdir,
Afərinlər ola əcdadıma gündüz və gecə.

Şahinəm, dahi Füzuli, elə şagirdəm ki,
Mütiyəm sən kimi ustadıma gündüz və gecə.

*27.07.2000*

***

Başımın eşq, əzizim, tacı olmuş yenə də,
Gözütox bir kişi eşqin acı olmuş yenə də.

Eşq odu qızdıra bilmirdi məni sac kimi,
Ürəyim od kimi eşqin sacı olmuş yenə də.

Saqi də, badə də, mey də buna heyrətlənmiş,
Neçə əğyar gözü qıyqacı olmuş yenə də.

Qəlbə olduqca yaxın sanmış idim hicranı,
Acı hicranı ki, şirindi, acı olmuş yenə də.

Eşqə yad gözlə daha baxmayacaqdır Şahin,
Ürəyim eşq ilə qardaş-bacı olmuş yenə də.

*1.09.2000*



***

*"İraq Respublikasının Azərbaycandakı Səfirliyi tarix elmləri doktoru, professor Şahin Fərzəlibəyliyə öz səmimi salamlarını yetirir və İraq Respublikası Ali Təhsil və Elmi Araşdırmalar Nazirliyi Daimi Koordinasiya Komitəsinin İraq sərkərdəsi Səlahəddin əl-Əyyubinin rəhbərliyi altında Qüdsün azad olunması ildönümü münasibətilə keçiriləcək illik Qüds konfransına dəvətini göndərməkdən şərəf duyur. Konfrans 2-6 oktyabr 2000-ci il tarixdə keçiriləcək. Səfirlik konfransda iştirak etməyə razı olduğunuz təqdirdə əvvəlcədən xəbər verməyinizi xahiş edir".*

**İraq səfirliyi**
**18.09.2000-ci il (imza)**

Üzməyə şirin canı gəlmiş yenə,
Ömrümüzün hicranı gəlmiş yenə.

Ayrılığa döz yenə, ey sevgilim,
Hicr anı, hicran anı gəlmiş yenə.

Bir daha yollanmalıyam qürbətə,
Hökmdarın fərmanı gəlmiş yenə.

Getmək üçün Bağdada, gündüz-gecə
Keçməliyəm İranı, gəlmiş yenə.

Çıx bu sınaqdan da mətin, ey könül,
Bir də sınaq imkanı gəlmiş yenə.

Şahina, şahin kimi döz qürbətə,
Haydı, fəraq aslanı gəlmiş yenə.*

*25.09.2000*

***

Etməsəydin məni gər dərdə giriftar belə,
Ey nigarım, başıma yağmaz idi qar belə.

Çalma, Habil**, gəl oxutma tarı, ey Ramiz***, sən,
Məni, eyvah, kaman öylə üzür, tar belə.

Dedilər "qəlb əgər sınsa, yapışmaz bir də",
Təzədən "gəl" deyibən eyləmə israr belə.

* İkinci Bağdad səfərim baş tutmadı. Özüm imtina etdim... Bakıda görüləsi işlərim çoxdur...
** Habil Kaman
*** Tarzən Ramiz Quliyev

Zar olublar ulu aşiqlərimiz həm, amma
İnana bilməyirəm kimsə olub zar belə.

Etmədim mən "tikan"ı "xar" qəzəldə heç vaxt,
Niyə etdin məni birdən-birə sən xar belə?

Sən özün yaxşı bilirsən ki, yaman incimişəm,
Təzədən "gəl" deyibən eyləmə israr belə.

Mənə şəkk eyləmə gəl, düzdanışandır Şahin,
Nə üçün əyri baxırsan mənə, ey yar, belə?

*10.12.2000*

***

Rövşən olmaq mənə mümkünmü Nigar eşqiylə?
Olarammı yenə Sənan Xumar eşqiylə?

Çox kilid açmağa cəhd eylədim illərlə, dilim
Yenə "sim-sim" deyəcəkdirmi açar eşqiylə?

Doludur qafiyələrlə şer uğrunda başım,
Sındırır baş neçə məmursa şüar eşqiylə.

Ömrümün arzulamışdım qışını gənclikdə,
Gözlərim indi tökür yaş bahar eşqiylə.

Saqi çəkmiş məni meyxanəyə mey yox, vaiz,
Heç qumarxanəyə getdimmi qumar eşqiylə?

Hər hüceyrəmdə varım var o yar eşqi kimi,
Çox varı eyləmişəm yox belə var eşqiylə.

Kəsələr gər qanadımdan birini, ey Şahin,
Uçaram bircə qanad ilə də yar eşqiylə.

*13.01.2001*

***

Gərçi əlin vəslinə gündə çəpər çəkmədə,
Ey şəkərim, tutinin könlü şəkər çəkmədə.

Dövrəsinə yer günün, aysa yerin fırlanır,
Sanma bu fırlanmadan kimsə xətər çəkmədə.

Fırlanıram mən dəxi dövrənə gündüz-gecə,
Fırlanıram, nazını mən kimi ər çəkmədə.

Gəl ki, sevincim gələ, yox olacaqdır kədər,
Çünki, dəyirman daşı indi kədər çəkmədə.

Şerini keçmiş günün şairi yazmış qəliz,
Əcnəbi sözdən bu gün şer zərər çəkmədə.

Poz o izafətləri*, mən - qəzəlin zərgəri,
Misgəri mis cəlb edir, zərgəri zər çəkmədə.



Ləzzətini çəkmişəm mən qoca dünyamızın,
İndi o dünya üçün qəlb qəhər çəkmədə.

Gər bu cahan içrə mən çox səfər etdim, fəqət
Şahini son mənzilə indi səfər çəkmədə.

*14.01.2001*

***

Adım comərd aşiq tək qala, ey kaş, sevdadə,
Qaralsın cümlə namərdlər, ağarsın baş sevdadə.

Məhəbbətli an üstündür məhəbbətsiz keçən gündən,
Canım pambıq kimi ataş tutaydı kaş sevdadə.

Nəsib əyyaşə gər olsa salar sevdanı qiymətdən,
Muradə yetməsin bir dəm görüm əyyaş sevdadə.

Təmənna eyləyir haqqdan neçin sevdanı zahid həm,
Nə sevda? Üstünə göydən yağaydı daş sevdadə.

Başın çəkmiş bəlalər bir neçə sirdaşdən, canan,
Qoru, hifz eylə sirri, olmasın sirdaş sevdadə.

Dəyişmək istərəm sənlə, kiçik səndən, böyük məndən
Ki, səndən bir tük olsun, məndən isə baş sevdadə.

Səni sevdadən əskik etməsin Allah, ey Şahin,
Özün hal əhlisən, vacib deyildir yaş sevdadə.

*20.01.2001*

***

Gözəlim, söyləmə nisgillərimiz var hələ,
Nikbin ol, öndə qəşəng illərimiz var hələ.

Mən də Məcnun kimiyəm, yoxsa da zəncirlərimiz,
Sarısınlar məni, məftillərimiz var hələ.

Acı olmazmı ömür mülkü şirindillərsiz?
Çox şükürlər ki, şirindillərimiz var hələ.

---

* "Pənbeyi-daği-cünun..." (Məhəmməd Füzuli), "Movti-cismani..." (Seyid Əzim Şirvani), "Əsiri-qeydi-zənciri-səri-zülfi-nigar..." (Məmo bəy Məmai), "Sağlığı-can..." (Əliağa Bakir), "Meydani-söz..." (Ələmdar Mahir) və s.

Bağiban, gəl bizi məhrum eləmə gülşəndən,
Bağlama darvazanı, güllərimiz var hələ.

Ya İlahi, niyə birləşməyir Azərbaycan?
Nə üçün susmalıyıq, dillərimiz var hələ.

Xan Araz axmadadır qəmli, pərişan, məhzun...
Qəsbkar pəncədə sahillərimiz var hələ.

Söylədim yarə: - Qəzəl mülkü qalıb Vahidsiz,
Dedi: - Şahin kimi fazillərimiz var hələ.

*16.03.2001*

***

Gül solur, amma dodağın qan olur gündən-günə,
Aşiqin rüxsarına heyran olur gündən-günə.

Bircə yol qurban olublar Qeyslər, Fərhadlar,
Dilbərim, yarın sənin qurban olur gündən-günə.

Padşahim "gəl, - dedi, - dərgahimə", padşahdən
Bəxtiyarəm, bəndəyə fərman olur gündən-günə.

Müstəqillikdən əlamət görmədik illər boyu,
Müstəqillik dərdinə dərman olur gündən-günə.

Yetmiş il bol-bol yalan təriflər etdik, indisə
Düzlüyə, düzgünlüyə meydan olur gündən-günə.

Bitdi qış, gülləndi gülşən, yar xoş, dildar xoş,
Mərhəba, aşiqlərə imkan olur gündən-günə.

Xoş ki, əğyarın məhəbbət qəsri abad olmadı,
Çox şükürlər Tanrıya, viran olur gündən-günə.

Arxada qalmışdır əyyamım ki, hicran var idi,
Söyləyərdim "qismətim hicran olur gündən-günə".

Yar əzəllər bilməz idi vəsldir dərmanımız,
Şahina, yarım mənim loğman olur gündən-günə.

*5.04.2001*

***

Əğyarı ki gördüm neçə Leyla həvəsində,
Heç bircəsi də olmadı amma həvəsində.



Xülya məni tərk eyləməyi tərk eləyibdir,
Xülyalı adam olmalı xülya həvəsində.

Səhra eləyir arizu dəryadə batanlar,
Səhradə yananlar isə dərya həvəsində.

Mənanı qoyub surətə diqqətlə baxan çox,
Şair isə surət, həmi məna həvəsində.

Yoxdursa da acgözlük edən mollaya rəğbət,
Könlüm o Füzuli kimi molla həvəsində.

Eşq atəşi var isə yaşın fərqi bilinməz,
Qoy söyləməsinlər qoca sevda həvəsində.

Ömrüm sona yetməkdədir eşqim sona yetmir,
Eşq tutisi, Şahin, hələ xurma həvəsində.

*13.06.2001*

***

Qeyb elədim taqəti, gəlmədi tab üstünə,
Taleyə bax, iztirab gəldi əzab üstünə.

Hər yeri bərbad idi qəlb evimin, bir daha
Cumdu bəla mən kimi xanəxarab üstünə.

Ağlayıban bir neçə dəftəri islatmışam,
İndi isə qətrələr düşdü kitab üstünə.

Göz yaşının hər biri bir dənə mirvaridir,
Doldurubаn yığmışam mən qabı qab üstünə.

Molla içib badəni tərk elədi məscidi,
Şeyxə dedi "atma şər bir də şərab üstünə".

Çox üləma axtarıb çox sual etdimsə də,
Heç birisi gəlmədi amma cavab üstünə.

Gülləri sıxdım yenə, saqi, gülabdanı tut,
Təzə gülab axmada köhnə gülab üstünə.

Qafil olub çox günah eyləmisən, Şahina,
Cəhd elə gəlsin savab indi savab üstünə.

*16.07.2001*

***

Durmuşam dağ kəli tək mən yenə dağ üstündə,
Sanki illərlə bu cür qallam ayaq üstündə.

Elə yüksəkdi bu saətdə məkanım, yoxdur
Asimandan savayı heç nə papaq üstündə.

Kaş hər şairə mən tək yetə ənginliklər,
Ömrü zay olmaya fərş üstdə, yataq üstündə.

Vətənin vəsfinə yüzlərlə şer həsr etdim,
Cananın ismi olub həkk dodaq üstündə.

Hansı pərvanə dözər atəşə mən tək, gözəlim,
Kim görübdür qala pərvanə çıraq üstündə?

Səsinə bənzədiyindən bulağın avazı,
Yazmışam şerimi günlərlə bulaq üstündə.

Diləyim "Xəmsə" yaratmaqdı sənin şövqünlə,
Nə qədər xatirəmiz var varaq üstündə.

Səni tərk eyləsə Şahin yaralansın cismi,
Qurusun qoy qanı, ey şux, bıçaq üstündə.

*7.08.2001*

***

Sanma ki, təkcə biyabanü çəmən var məndə,
Bağiban, qəlbimə gir, lalə-süsən var məndə.

Bircə yumruqluq ürək gör nə böyüklükdə imiş,
Xan Kəpəz var, qoca Şahdağ, Göyəzən var məndə.

Yurduma qəsd eləyib yağı... Dumanlandı başım,
Qarabağ məskəni yad əldədi, çən var məndə.

Mənliyimdən o rəzil yaxşı xəbərdar olsun,
Bir deyil, bir neçə min bəlkə də "mən" var məndə.

Gün gələr kimliyimi dərk eləyər kafərlər,
Əli vardır, Hüseyn var və Həsən var məndə.

Qələbəm gəldiyi dəm qüssə-qübarım gedəcək,
Qələbəm olmayacaqdırsa kəfən var məndə.

Tutmayıb məndə qərar tək bu Bakı, ey Şahin,
Elə azman adamam mən ki, vətən var məndə.

*18.08.2001*



***

Getmək diləyib eylədi canana bəhanə,
Atəşlənə pambıq kimi, qoy yanə bəhanə.

Görmürmü bəyəm şəmə fəda olmada cismi,
Amma eləmir bir kərə pərvanə bəhanə.

Ömrüm boyu qəlb söyləyəni söyləyəcək dil,
Lazımmı məgər mən kimi insanə bəhanə?

Əfsus ki, isbatü sübüt kölgədə bəzən,
Səyritmədədir köhləni çox yanə bəhanə.

Məqsudi nə güldür, nə çiçəkdir, nə ələfdir,
Eşq əhlinə, bağban, əvəlik, nanə - bəhanə.

Allah evinə - Kəbəyə çatdır məni, Allah,
Görmək dilərəm mən səni, bütxanə - bəhanə.

Meyxanəyə, billəh, mey üçün gəlmədi Şahin,
Ey saqi, səni görməyə meyxanə - bəhanə.

*3.09.2001*

***

Şeytanı fələk vurmasa insanın ipiylə,
İnsan boğular, bəlli ki, şeytanın ipiylə.

Gündüz-gecə tər gülləri tərk eyləmərəm mən,
Bağban məni bağlarsa gülüstanın ipiylə.

İrad eləmə yazmağıma gündə şer sən,
Şair, nə işin var yenə imkanın ipiylə?

Biz bilməliyik qədrini gündüz-gecə şerin,
Bağlanmalıyıq sənətə irfanın ipiylə.

Dünya, məni qorxutma daha dar ağacıyla,
Mən meydana girdim neçə üsyanın ipiylə.

Heyfa, məni qorxutdu fəraq illəri hərdən,
Bağlandı tabım, taqətim hicranın ipiylə.

Tale, məni biçarə qılan ipləri aç, aç,
Sən bağla daha Şahini cananın ipiylə.

*5.09.2001*

***

*Qəzəlxan Cəsur Narıyə*

Ürək qanım dönüb suyə axır gözdən nizam ilə,
Baxırlar qeyri aşiqlər bu şəxsə ehtiram ilə.

Gəhi meyxanə, gəh məscid ilən ülfət tutardım mən,
Bu gün yoxdur aram, billəh, nə saqiylə, nə cam ilə.

Mənə canane təklif eyləyənlər hali olsunlar:
Halal işlərlə məşğuləm, aram yoxdur haram ilə.

Qılıncım yox, sözüm vardır və kəlməm var, tüfəngim yox,
Silahım istilahımdır, silahlandım kəlam ilə.

Mənim, maşallah, hazırdır iki "Divan"ım, inşallah,
Qəzəl mülkündə şahlıq eylərəm mən ehtişam ilə.

Cəsarətlə, ləyaqətlə səyahətlərdə ömr ötdü,
Dəyanət qəsrinə çatdıqda əyləşdim inam ilə.

Mənə hər kim ki daş atdı daşın qaytardım, ey Şahin,
Əgər kim ki salam etdi cavab aldı salam ilə.

*5.10.2001*

***

Hər biri saf aşiqin Məcnuna təndir, mənə,
Atəşi eşqin müdam od mənə, təndir mənə.

Eşqimə vursam ləkə mən ki, məni mütləqa
Asmalıyam, dilbərim qoy verə kəndir mənə.

Rədd eləyin qürbəti, istəmirəm, gülşənin
Qanqalı da yurdumun lalə-süsəndir mənə.

Yad zərindən həzər! Öz elimin qənbəri
Ləli-Bədəxşandır, dürri-Yəməndir mənə.

Mən vətənə dönmüşəm, qoy bilə hər bilməyən
Qüssə yaxın düşməyir indi nədəndir mənə.



"Pənbeyi-daği-cünun içrə nihandır bədən"*,
"Pənbeyi-daği-cünun məhz kəfəndir mənə" **.

Çək gözünü Şahinin el-obasından, rəzil,
Azərbaycandı bu, bil ki, Vətəndir mənə!

*24.10.2001*

***

Diqqətlə baxıb gördüm var qarə ağ üstündə,
Sinnim qınaq altında, sevgim sınaq üstündə.

Axşam gələ bilmirsən, gəldin yanıma gündüz,
Bildim ki, həyadəndir, - tər var dodaq üstündə.

Cəlb eyləməyir heç nə, sənsən bu saat seyrim,
Allandı yanaq, ey gül, seyrim yanaq üstündə.

Hüsnündə çıraq nuri, nurindəsə "yan" hökmü,
Pərvanə yanır bildim neyçün çıraq üstündə.

Sevdayə düşən şahəm, qəsrim sənədir möhtac,
Möhkəm duracaq sevda qəsrim dayaq üstündə.

Getdin darayıb zülfü, amma darağın qaldı,
Öpdüm darağı, ey gül, zülfün daraq üstündə.

Getdin, quruyub qaldım min bir fikir altında,
Ölsün qoy ağaclar tək Şahin ayaq üstündə.

*20.01.2002*

***

Mən solub göydə göyərdim bəlkə,
Orda cənnət gülü dərdim bəlkə.

Soyuğam, qar kimiyəm, buz kimiyəm,
Elə yandır ki, közərdim bəlkə.

Təzədən hövsələmi artırdım,
Azala qüssəvü dərdim bəlkə.

Elə süst oldu gərilmir qanadım,
Qanadı bir daha gərdim bəlkə.

* İfadə Füzulinindir.
** Misra Qasım bəy Zakirindir.

İstinad nöqtəsi tapsam, əlimə
Yeri mən həm götürərdim bəlkə.

Göyü deşmək mənə olsaydı nəsib,
Şahina, Rəbbi görərdim bəlkə.

*26.01.2002*

***

Hanı gənclik, edirəm qibtə o xoş növrağə,
Göz təəccüblə baxır bağladığım qurşağə.

İndi bağ içrə belə gəzmirəm əvvəlki təki,
Gözəlim, töyşümədən onda çıxardım dağə.

Gəldi hər canlıya ömrüm boyu rəhmim, hətta,
Yazığım gəldi budaqdan üzülən yarpağə.

Vətən uğrunda qızıl qanə boyanmaq mənə xoş,
Köynəyim dönməlidir olsa lüzum bayrağə.

Sən üzüm suyini yığmaqdasan, ey meyxanaçı,
Yığıram mənsə məhəbbət meyini bardağə.

Ey qəzəlxan, aradın Məcnunu qumsallıqda,
Karıxıb qalma o səhradə, gəlib gir bağə.

Şahinəm, məndə gülə öylə məhəbbət var ki,
Cəsədim həm cücərib gül verəcək torpağə.

*11.02.2002*

***

Aləm ola hökmdarə tabe,
Ollam mən isə nigarə tabe.

Rəbbin də nigarə lütfü var ki,
Sənanı edib Xumarə tabe.

"Səbr eylə" deyib qərar verdi,
Olmaz necə qul qərarə tabe?

Mən sadiqə etibarı vardı,
Sadiqliyim etibarə tabe.

Gündüz-gecə gözlədim vüsalı,
Olmuş vəsl intizarə tabe.



Getmişdi hicr, dübarə gəldi,
Oldum ona mən dübarə tabe.

Söz şairi bəxtiyar edibdir,
Şair sözə aşikarə tabe.

Safdır qəzəli, düşündünüzmü
Şahin niyə Şəhriyarə tabe?

*24.06.1997*

***

Fikri səmimanə deyirsənsə, de,
Sən mənə biganə deyirsənsə, de.

Tab eləmək tənqidə müşkülsə də,
Tənqidi mərdanə deyirsənsə, de.

Saqqalımız rəngini almış qarın,
Körpəyə əfsanə deyirsənsə, de.

Faş eləmək sirri münasib deyil,
Sirrini cananə deyirsənsə, de.

Dərdə düşər, hər kəsə ərz eyləmə,
Dərdini loğmanə deyirsənsə, de.

Cismini yandırmada yar şəm tək,
Aşiqə pərvanə deyirsənsə, de.

Hər gözələ dürr demə, dürr inciyər,
Leyliyə dürdanə deyirsənsə, de.

Eşqdə aqil sanıram Məcnunu,
Şahinə divanə deyirsənsə, de.

*26.04.2001*

***

Bağibanəm, əməyim varsa - səmərsiz qalmaz,
Ağacı zəhmətimin heç də bəhərsiz qalmaz.

Məni bica yerə səhralara qovma, gözəlim,
Bilməyirsənmi bu aşiq bu şəhərsiz qalmaz?

Aşiqəm, mən daha dərvişliyi tərk eyləmişəm,
Elə dərviş görürəm amma, səfərsiz qalmaz.

Gəlir ilhamə şirin dəmləri seyr etdikcə,
Təbimin tutisi bir gün də şəkərsiz qalmaz.

Ver icazə, belinin qolların olsun kəməri,
Köynəyin öylə ipəkdir ki, kəmərsiz qalmaz.

Ürəyim öylə ki şad oldu bir az, qəm də gəlir,
Məndəki şənliyə bax sən ki, kədərsiz qalmaz.

Gülü kim qırsa mənim qəlbimi qırmış kimidir,
Dedilər: - Bağə çəpər çək ki, çəpərsiz qalmaz.

Desə kim "eşqə könül vermə, zərərdir", deyirəm
- Şahinəm mən, əsl aşiq o zərərsiz qalmaz!

*14.10.1995*

***

Dağlanmış ürəklərdə, bu məlum ki, yağ olmaz,
Amma ki, xəyalım yenə səndən irağ olmaz.

Onsuz da görünməz gözə, yandırma çırağı,
Ey yar, bu cür sən ki, yanırsan, çıraq olmaz.

Bir qəlbdə eşq olmasa, yoxdur daha heç nə,
Sənsiz yaşayar bəlkə də can, amma sağ olmaz.

Barmaqlarım on dişli darağ oldu təbii,
Qıvrım telə bir başqa darağdan darağ olmaz.

Bir yanda külüngün səsi, bir yandasa - zəncir,
Fəxr eylə ki, heç yanda bu cür təmtəraq olmaz.

Çox keçməliyik dağ ilə səhra sınağından,
Eşq əhlinə bundan da mübarək sınaq olmaz.

Zənn eyləmə dərgahına həqqin yol uzağdır,
Allahə yaxın kəslərə ol yol uzağ olmaz.

Təqlid eləyib bir neçə rəhmətliyi daim
Şair "qoçağam mən" demək ilə qoçaq olmaz.

Söz məşəli, söz tonqalı çör-çöplə alışmaz,
Yanmazsa odun, öylə ocaqdan ocaq olmaz.



Məna çölünü süni suvarma yaşıl etməz,
İrfan bağına sısqa bulaqdan bulaq olmaz.

Şahin kimi hər bağibanın zəhməti olsa,
Tənbəlliyi tərk eyləsə, bağda alağ olmaz!

*26.10.1995*

***

Bilməm nə olubdur, yenə yarım nəzər etməz,
Etməzsə nəzər, sevdiyini bəxtəvər etməz.

Allahıma bel bağlamışam, lütf eləsin qoy,
Olmazsa əgər lütfü, bir adəm hünər etməz.

Gəzməz suyun üstündə Məsiha kimi heç kəs,
Barmaqsa dönüb xəncərə şəqqül-qəmər etməz.

Hər dəm o xeyirxahı anıb dərk elədim ki,
Allahə itaət edən adəm zərər etməz.

Divanəyəm eşqinlə, demə "eşqdən əl çək",
Divanəyə, ey yar, nəsihət əsər etməz.

İstərsən əgər yarını, gəl qovma qapından,
Yar yarını istərsə əgər dərbədər etməz.

Səyyah olub eşq ölkəsinə çox səfər etdim,
Qorxarsa əgər kim bu səfərdən, səfər etməz.

Vardır elə aşiq, əməli eşqə xətərdir,
Şahinsə xəta eyləyər, amma xətər etməz!

*31.10.1995*

***

Şahin sənə məhrəmdir, biganə deyil şəksiz,
Hər Şahin olan adəm şahanə deyil şəksiz.

Beynimdə fikirlər var zərdən daha qiymətli,
Hər yer ki qızıl saxlar, viranə deyil şəksiz.

Xislətləri mərdanə aşiqlərə eşq olsun,
Cinsiyyəti mərd hər kəs mərdanə deyil şəksiz.

Yox faidəsi şəmin yanmazsa əgər mən tək,
Odlanmasa pərvanə pərvanə deyil şəksiz.

Eşqin xumarı, məsti, məstanəsi oldum mən,
Mey məsti olan qafil məstanə deyil şəksiz.

Gerçəkliyi əfsanə şəklində görənlər çox,
Eşqim ki, həqiqətdir, əfsanə deyil şəksiz.

Zəncir ilə zəncirdə fərq azdı, təfavüt çox,
Hər bir dəli, ey Şahin, divanə deyil şəksiz.

*11.11.1995*

***

Dərvazəmi döymüş yenə hicran xəbərsiz,
Hicranı görəndən üzülür can xəbərsiz.

Döyməkdə məni qamçısı qeyz ilə fərağın,
Dar oldu cahan başıma, canan, xəbərsiz.

Yoxsan deyə, vəslin daha imkanı görünmür,
İmkan uzaqlardadı, imkan xəbərsiz.

Kafər belə zülm eyləməz idi, a müsəlman,
Üzgün bu müsəlman ki, müsəlman xəbərsiz.

Yaddır mənə hər gizli əməl, amma ki hicran
Hökm eyləmədə gizlicə, pünhan, xəbərsiz.

Bir gün də əgər keçsə günüm böylə kədərli
Məndən qalacaq bağü gülüstan xəbərsiz.

Çünki, ürəyim hiss edirəm partlayacaqdır,
Bundan olacaq sən kimi loğman xəbərsiz.

Yoxdur xəbəri Azəribaycan diyarından,
Şahin nə çəkir Azəribaycan xəbərsiz.

*9.01.1996*

***

Canan güman etdim səni, canan belə olmaz,
Car eyləmisən sirrimi, pünhan belə olmaz.

Gündən-günə qeyb olmada imkanı vüsalın,
İmkan eləmirsən buna, imkan belə olmaz.

Yoxsa, mənə saf eşqimi nöqsanmı sanırsan,
Nöqsan isə bu, ey pəri, nöqsan belə olmaz.



Hicranı ki atdın araya, guya sınaqdır,
Hicranmı? Ölümdür bu ki!.. Hicran belə olmaz.

Susmaq ilə üsyan eləyirsən mənə guya,
Üsyanına qurban, axı üsyan belə olmaz.

Sülh əhdini pozdun, niyə hərb elanı yoxdur?
Elan elə elanını, elan belə olmaz.

Bir zərrə daha cövrünə tab eyləyə bilmir,
Yox taqəti, yox hövsələsi, can belə olmaz.

Danmaq ilə saf eşqimizi küfr eləyirsən,
Kafər belə gər olsa, müsəlman belə olmaz.

Şahin, bu açıq dərdimə dərman niyə gizli?
Dərd öylə olar, amma ki, dərman belə olmaz.

*30.03.1996*

***

Eşqim yönəlib mərdə, namərdə salam olmaz,
Hətta salam olsa həm, bir qeyri kəlam olmaz.

Əğyarə dedim namərd, aşiqlərə mərdanə,
Aşiqlər olan yerdə əğyarə məqam olmaz.

Yoxdur demə, ey saqi, ey saqi, gətir camı,
Meyxanədə kim görmüş saqi ola, cam olmaz?

Aşiqsə əgər şair, şairsə əgər aşiq,
Təbı tükənə bilməz, ilhamı tamam olmaz.

Yanmaqda görür ömrün mənasını pərvanə,
Yandır şamı, kim söylər pərvanəyə şam olmaz.

Aşiq yetə hər kamə, xəlq etməyə həngamə,
Olmazsa nizamnamə işlərdə nizam olmaz.

Şahin kimi dərvişlər sidq ilə deyərmişlər:
Hər kəs ki, halal işlər, ol kəsdə haram olmaz!

*31.10.1996*

***

Qovğa diləyən var isə lal olsa pis olmaz,
Sülh naminə hər başda xəyal olsa pis olmaz.

Bir damla qanından ötəri cəng eləyən var,
Aşiq qanı eşqində halal olsa pis olmaz.

Yox şübhə ki, əğyarlərin qalması pisdir,
Əğyar ilə gündüz-gecə qal olsa pis olmaz.

Elm ilə, biliklə dola hər kəllə cahanda,
Cahildə də bir zərrə kamal olsa pis olmaz.

Şövq ilə, şirin dillə yazılsın qəzəl ey kaş,
Bayquş kimilər tutimisal olsa pis olmaz.

Xal düşməyə bir qəlbə də xəlq içrə, amandır,
Amma, yanaq üstdə qara xal olsa pis olmaz.

Şahin, acı hicran da yar eşqində şirindir,
Söz yox ki, nəhayətdə vüsal olsa pis olmaz.

***

Mən bilməyirəm can nə təhər bağrıqan olmaz?
Vallahi və billahi bu bərklikdə can olmaz.

Min bir daşı dəydi fələyin cismimə, dözdüm,
Əğyarə o daşdan biri dəysə yaman olmaz.

Cahil görürəm cəhli əyandır əməlindən,
Bağ qeydinə qalmaz kişidən bağiban olmaz.

"Alim" görürəm "elm"inə aludədi, bilmir
Elmi yazısı olmasa, elmi əyan olmaz.

Şair görürəm razı özündən elə, guya
Söz mülkünə ondan savayı hökmran olmaz.

Gəlsin neçə ustad alım imtahan ondan,
Ustadə o kimdir ki, deyir imtahan olmaz.

Vardırsa gücün qolda, çeviklik də gərəkdir,
Hər güclü adamdan, bilirik, pəhlivan olmaz.



Gün çıxsa, bulud qaçsa, çən itsə gülər aləm,
Gün çıxsa, bulud qaçsa, çən itsə duman olmaz.

Bica yerə gər hifz eləsəm canı, ziyandır,
Can versəm əgər eşq yolunda ziyan olmaz.

Yarım, demə şövq ilə cavanlaşmada yarın,
Gündən-günə Şahin qocalırsa cavan olmaz.

*9.12.1996*

***

Yarım, mənə bir qeyri nigar yar ola bilməz,
Söz gəzsə əgər "qeyri yarı var", ola bilməz.

İllər boyu hifz etməliyik eşqə inamı,
"Eşq yoxdu" deyən eşqə giriftar ola bilməz.

Layiqmidir aşiqlərə şəhvani məhəbbət?
Əsla elə duyğu bizə meyar ola bilməz.

Daş yonmasa Şirini yolunda gecə-gündüz,
Fərhadə dönüb hər kişi memar ola bilməz.

Bir kimsə eşitmir niyə aşiq çəkən ahı?
Qışqırmasa qüvvətlə xəbərdar ola bilməz.

Hər kim ki vəzirdir, ola bilməz ola Vaqif,
Hər axtalanan xacəsə Qacar ola bilməz.

Dərd eyləmə yollansa əgər yoxluğa bir gün,
Yoxlaşmasa adəm, gözəlim, var ola bilməz.

Düşsün hamı Şahin kimi sevdasına eşqin,
Bir kimsə bu sevdadə günəhkar ola bilməz.

*1.01.1997*

***

Çox dağ ucadır, amma ki, Şahdağ ola bilməz,
Çox kəs qocadır, mən kimi qıvraq ola bilməz.

Gülməz üzü aşiq olanın yarı uzaqsa,
Qəlbində fərağə düşənin yağ ola bilməz.

Göy qurşağını, olsa lüzum, yarıma verrəm,
Kim söylədi göy qurşağı qurşaq ola bilməz?

Hər kim ki, qəzəl yazdı, qəzəlxan demək olmur,
Hər meyxanaçı, bəlli ki, Çildağ * ola bilməz.

Onlarca qəzəlxan görürəm söz dilənirlər,
Saf yazmada heç kim mənə ortağ ola bilməz.

Dönməz kitaba dəftəri hər şairin, hər yer
Süstdürsə əgər bağibanı bağ ola bilməz.

Mən çox deyirəm az eşidirlər məni, əfsus,
Fəzl əhli cığal kəs kimi şıltağ ola bilməz.

Öylə qaradır zənci ki, hətta onu, Şahin,
Sabun ilə daim yuyasan ağ ola bilməz.

*8.03.1997*

***

Halım xoş idi, vardı vüsalım gecə-gündüz,
Pisləşmədədir indisə halım gecə-gündüz.

Sağ olsa idi Qeys bilərdi bunu şəksiz
Artır niyə sürətlə məlalım gecə-gündüz.

Şerin zəmisindən yenə ey arpa biçənlər,
Buğda ilə dolmaqda çuvalım gecə-gündüz.

Şerimlə döyüşdüm nə qədər kafər ilən mən,
İnkar eləyir küfrü kamalım gecə-gündüz.

Allahıma vardır gileyim çərxi-fələkdən,
Cövr etmədədir cismə bu zalım gecə-gündüz.

Ey Rəbb, sənə yoxsa yaxın düşmək üçünmü
Yüksəlmədədir ərşə xəyalım gecə-gündüz?

Tədric ilə, şadəm ki, haram işləri atdım,
Şahin, çoxalır indi halalım gecə-gündüz.

*23.04.1997*

***

Göy qaralmazsa əgər göydə qəmər görsənməz,
Ya, ağarmazsa səma, bəlli, səhər görsənməz.

---

* Ağasəlim Çildağ



Sən mənim sirrimi car eyləməsəydin hərgah,
Arxayınlıqla deyərdim ki, zərər görsənməz.

Saxlasaydın dilini dişlərin ardında əgər,
Söyləyərdim ki, sevin, səndə kədər görsənməz.

Düşünürdüm ki, ömürlük səninəm, sən də mənim,
Arada, zənn eləyirdim ki, çəpər görsənməz.

Niyə məhrəmliyimiz bəllidi biganələrə?
Nə sayaq indi deyim mən ki, xətər görsənməz?

İndi mən qaçmalıyam hicrə tərəf vəslindən,
Daha mən söyləyə bilməm ki, səfər görsənməz.

Tökürəm göz yaşı timsah kimi, ey Şahin,
Bir zamanlarsa deyərdim ki, qəhər görsənməz.

*25.05.1997*

***

Bir şəxs müsəlman isə imanını atmaz,
İmanını gər atsa da, vicdanını atmaz.

Qılman mən isəm, huridən əl çəkmərəm əsla,
Huri o isə, mən kimi qılmanını atmaz.

Əsl aşiqə söz söyləməyin eşqdən özgə,
Lap canı fəda etsə də, cananını atmaz.

Göz yumsa, həlak olsa da, ölmüş deməsinlər,
Meydanda müzəffər o ki, meydanını atmaz.

Kafər də görünməkdədi müslim arasında,
Müslim o adamdır ki, müsəlmanını atmaz.

İnsan üyüdür gündə, dəyirmançı fələkdir,
Billəh bu dəyirmançı dəyirmanını atmaz.

Vəsl oldu müyəssər ona, Şahin nə adamdır?
Məqsudinə yetmişsə də əfğanını atmaz.

*1.07.1997*

***

Eşq olmasa gər, yar həvəsində olan olmaz,
Gül gülməsə, gülzar həvəsində olan olmaz.

Yoxdursa vüsal istəyi hərgah canında
Mənsur kimi dar həvəsində olan olmaz.

Gər bağlamasa belinə eşq qurşağı aşiq,
Sənan təki zünnar həvəsində olan olmaz.

Dərvişləri dərk eyləsə kim mən kimi, əsla
Dərvişliyi inkar həvəsində olan olmaz.

Şəxsiyyəti cəmiyyətə meyar demişlər,
Düz çıxmasa, meyar həvəsində olan olmaz.

Bir naşı əgər tarı oxutmursa ürəkdən,
Zənn eyləməyin tar həvəsində olan olmaz.

Bilməm nə səbəbdən o bütün könlünü qırdın,
Şahin, daha memar həvəsində olan olmaz.

*22.07.1997*

***

Qış görməyən adəm baharın xiffətin etməz,
Bilməzsə zərurətdi - qarın xiffətin etməz.

Fironları olmuş o qədər çox bu cahanın,
Millət daha bir tacıdarın xiffətin etməz.

Min bir şüar illərlə dedik, çaldı qabar dil,
Dil bir daha min bir şüarın xiffətin etməz.

İllərlə mənim qol-budağım sanki kəsildi,
Billahi, budaqlar mişarın xiffətin etməz.

Yoxdursa da var oldu könüllərdə məzarı,
Hadi kimi şair məzarın xiffətin etməz.

Elm öylə tərəqqi edib, imkanı olanlar
Təyyarəsi varsa, çaparın xiffətin etməz.

Var isə əgər gözdə ziya, görməliyəm gül,
Gözsüzlər isə laləzarın xiffətin etməz.

"Yaxşı" dedilər, amma ki, eşq dərdi yamanmış,
Eşq dərdi çəkən kəs azarın xiffətin etməz.

Bica yerə eyb eyləməyin Şahinə "məstdir",
Məst olmasa aşiq yarın xiffətin etməz.

*23.08.1997*



***

Vəslin məni tərk etməsə hicran yada gəlməz,
Ey yar, sevinc getməsə, əfğan yada gəlməz.

Olsun mənə lənət deməsəm "şeytana lənət",
Bir ləhzə olubdurmu ki, şeytan yada gəlməz?

Meydanə çıxar əvvəl-axır asi olanlar,
Gər rəhbər ədalətlisə, üsyan yada gəlməz.

Yarım ki, könül mülkünə sultan ola bilmiş,
Sındırsa könül mülkünü, sultan yada gəlməz.

Odlanma Kərəm, Əsli keşişdən törəyibdir,
Bir gün gələcəkdir ki, o canan yada gəlməz.

Əfsus Xuraman da Züleyxa kimi oldu,
Vaqif qalacaq yadda, Xuraman yada gəlməz.

Şahin ki, şəhər sakinidir, yox çölə meyli,
Yad eyləməsə Qeysi, biyaban yada gəlməz.

*26.09.1997*

***

Yaş ötsə, deyirlər ki, məhəbbət vecə gəlməz,
Billah yalandır, belə söhbət vecə gəlməz.

Həsrət dağı çəkməkdədi qürbətdə olan kəs,
Kim çəkməsə qürbət dağı həsrət vecə gəlməz.

Düzgünmü bəyəm Nofəli rədd eylədi Məcnun?
Kim söylədi "eşq içrə siyasət vecə gəlməz"?

Əğyarə dedim "gəl yola, hər yerdə xəcilsən",
Əğyar dedi "bil ki, xəcalət vecə gəlməz".

İflasə günün bir günü məruz qalacaqdır,
Müflis eləyən xəlqini dövlət vecə gəlməz.

Artıq belə dad etmədə sənətkar olanlar:
- Hörmət yox isə sənətə, sənət vecə gəlməz!

Şahin, verəcək qiymətimi aqil adamlar,
Cahil adamın verdiyi qiymət vecə gəlməz!

*1.10.1997*

***

Mey məsti olan adəmə məstanə deyilməz,
Qal əhlinə, mərd olsa da, mərdanə deyilməz.

Hər şer yazan cahilə şair demək olmur,
Hər ətri olan ot-ələfə nanə deyilməz.

Şəmin başına dövr eləyən bir kəpənək var,
Yanmazsa əgər atəşə, pərvanə deyilməz.

Cananə müdam aşiqə can bəxş eləyəndir,
Amma, can alan dilbərə cananə deyilməz.

Qəlbimdə qərəz yox deyə, biganəyə hətta
Biganəliyim yox, mənə biganə deyilməz.

Meyxanə deyənlər də gedir məscidə hərdən,
Əfsus, o qəmxanəyə meyxanə deyilməz.

Məcnunə ağılsız deyənin ağlı yox imiş,
Səhra şahına, Şahina, divanə deyilməz.

*10.10.1997*

***

Eşqi sən tək, düşünürdüm mənə bir yar eləməz,
O qədər zülm elədin ki, onu qəddar eləməz.

Elə zənn eyləmə əfv eyləyərəm bir də səni,
Sənə eşqində bu aşiq daha israr eləməz.

Çox günah eylədiyindən günün ah ilə keçir,
Belə saysız günəhi qeyri günəhkar eləməz.

Qələmim bir dəxi həcv etməyəcək əğyarı,
Mənə yar eyləyəni bəlkə də əğyar eləməz.

Necə rəftar elədin sən, a müsəlman balası?
Əminəm mən buna: kafər belə rəftar eləməz.

Sən ki, İsa nəfəsindən danışırsan bu qədər,
Gözünü yum, sənə İsa nəfəsi kar eləməz.

Şahinin bülbülə dönmüşdü, susub lal oldu,
Dil daha heç kimə sevdasını izhar eləməz.

*19.10.1997*



***

Bundan belə hicran mənə mehman ola bilməz,
Mehman mənə bir ləhzə də hicran ola bilməz.

Loğmanım o canan isə, yarəb, mənə dərd ver,
Dərd olmasa, canan mənə loğman ola bilməz.

Müti sanan öz xəlqini rəhbər yanılıbdır,
Zənn eyləməsin rəhbərə üsyan ola bilməz.

Quran oxuyursan, sənə Quran qənim olsun,
Kafərlik edən bəndə müsəlman ola bilməz.

Bir çox dəlinin məskəni olmuş dəlixanə,
Məskən dəli hər şəxsə biyaban ola bilməz.

Heç bilməyirəm səndə həlimlik nə səbəbdən?
Hökm etsə fərəh qəlbdə əfğan ola bilməz.

Gəldin və gülüstan elədin dövrəmi, ey gül,
Bir güllə, - deyən var ki, gülüstan ola bilməz.

Seyr eylədim illərlə qəzəlxanları, heç kim
Saf şerə bu Şahin kimi sultan ola bilməz.

*11.11.1997*

***

Gözəlim, yerdə də var huri və qılman - ikimiz,
Etmişik eşqdə aşiqləri heyran ikimiz.

Nə Ərəbzəngi qalıbdır, nə də Nofəl yoxdur,
Eləyək yerdəki haqsızlığa üsyan ikimiz.

Sən bilirsən ki, alağlar çoxalır gün-gündən,
Amma var Eşq bağında iki bağban - ikimiz.

Bilirik yaxşı ki, öndə nə qədər müşkil var,
Qoysa Allah edərik müşkili asan ikimiz.

Bir saray etmədəyik, ey gözəlim, biz inşa,
Bir sarayda olacaqdır iki sultan - ikimiz.

Dərdliyə rəhm eləyən yoxdur özümdən qeyri,
Olarıq dərdlilərə bəlkə də loğman ikimiz.

Mən bilən dilləri olmuşmu bilən, ey Şahin,
Bilmişik quş dilini mən və Süleyman ikimiz.

*4.05.1998*

***

Sevgini eyləmək inkar əlindən gəlməz,
Fikrimə çox dəlilim var, əlindən gəlməz.

Yerləşibdir elə möhkəmcə vəfa qəlbində
Bivəfalıq, sənin, ey yar, əlindən gəlməz.

Neçə ildir məni xoşhal eləyirsən, gözəlim,
Eyləmək aşiqini zar əlindən gəlməz.

Elə afət görürəm aləmə min fitnə salır,
Aləmə eyləyirəm car: Əlindən gəlməz!

O qədər rəhm eləyibsən mənim əhvalıma ki,
İstəsən olmağı qəddar əlindən gəlməz.

Hamıya yaxşılıq, ey şeyx, əlindən gəlsin,
Olmasan eşqə giriftar əlindən gəlməz.

İstədim mən yenə meyxanəyə dəysin ayağım,
Şahina, eyləmə israr, əlindən gəlməz.

*10.06.1998*

***

Hər yaşdə can içrə təvan olsa pis olmaz,
Şair qoca, aşiqsə cavan olsa pis olmaz.

Çox yaxşı xəbər gəlsə də, ən yaxşı budur ki,
Əğyar olanın halı yaman olsa pis olmaz.

Bir çox kitabım var ki, görünmür hələ nəşri,
Yazdıqlarımız xəlqə bəyan olsa pis olmaz.

Çox düşdü yolum Şahdağa, hərdən yerim amma
Heydərbaba ilə Savalan olsa pis olmaz.

Yormaqda bizi köhnə uğurlarla öyünmək,
Comərdliyimiz indi əyan olsa pis olmaz.

Gülsün üzü qoy dostlarımın gül yağışından,
Düşmənlər isə gülləbaran olsa pis olmaz.



Məcnun üzülüb, - söylədilər, - Leyli düzündə,
Şahin, sənə həm öylə məkan olsa pis olmaz.

*1.07.1998*

***

Gözəlim, getmə ki, həmdəm qalmaz,
Dərdimə sən təki məhrəm qalmaz.

Hacı olmaqdı məramım, canan,
Olmasam, can evi xürrəm qalmaz.

Həccə getsəm elə nuş eyləyərəm
Məkkədə bir gilə Zəmzəm qalmaz.

Gəlmisən, tərk eləyir qəm yerini,
Sən olan yerdə axı qəm qalmaz.

Qurudar göz yaşını güllər həm,
Güllər üstündəki şəbnəm qalmaz.

Bağlamış yaş yolunu indi ürək,
Gözlərimdən çəkilər nəm, qalmaz.

Amma vardır yenə hicran hissi,
Həm qalar canda bu hiss, həm qalmaz.

Şahina, aləmimiz aləmdir,
Yar əgər getsə, bu aləm qalmaz!

*Lənkəran,19.12.1998*

***

Elə qal əhli olan var məni fazil bilməz,
Fazilin fəzlini, əlbəttə ki, cahil bilməz.

Ad qoyublar neçə naqabilə Qabil adını,
Adı Qabilsə də qabil onu qabil bilməz.

Alimin elmini dərk eyləyə bilməz nadan,
Alimin elmi bir ümmandı ki, sahil bilməz.

Amu-Dərya nə bilir məndə olan ilhamı?
Təbimin çay kimi coşğunluğunu Nil bilməz.

Tək qəzəldirmi məgər şairi şair eləyən?
Elmsiz şairi söz sahibi kamil bilməz.

Əcnəbi sözləri bol-bol yamayan var qəzələ,
Öylə şəxsi bu qəzəl sahibi aqil bilməz.

Xəlqi sözlərlə yazıb şerimi fəxr eyləyirəm,
Şahinə söyləməsinlər yanılıb "dilbilməz".

*1.03.1999*

***

Pərvanə, uzaqlaş, çıraq olmaq mənə olmaz,
Yandırram, uzaq qaç, ocaq olmaq mənə olmaz.

Leylim, məni Məcnun eləyib çöllərə qovma,
Ey nazlı nigarım, qaçaq olmaq mənə olmaz.

İnsaf elə gəl, yarını ağlatma, amandır,
Yarım, kişiyəm mən, uşaq olmaq mənə olmaz.

Barmaqlarım on dişli daraq oldu saçında,
Hər zülfə münasib daraq olmaq mənə olmaz.

Ey sevgili dilbər, yaşa sən ki, yaşayım mən,
Səndən sora bir gün də sağ olmaq mənə olmaz.

Cahilləri etmək diləyim var günü qarə,
Aqillərə, əlbəttə, ağ olmaq mənə olmaz.

Bəsdir, yerə tök sən ətəyindən daşı, zahid,
Daş atma mənə, daşqalaq olmaq mənə olmaz.

Çox nemətə, Şahin, yumaram göz bu cahanda,
Canan ilə meydən uzaq olmaq mənə olmaz.

*8.04.1999*

***

Köksündə sənin ürək rəhmsiz,
Mümkünmü ola mələk rəhmsiz?

Dəryadə ümid gəmim yox oldu,
Qərq etdi onu fələk rəhmsiz.

Bəxtin şamı şövq ilən yanırkən
Söndürdü onu külək rəhmsiz.

İnsanı duyan yox idi bağda,
Qəddar idi - gül, çiçək - rəhmsiz.



Heç baxmadı mən sarı qızılgül,
Olmuş yara müştərək, rəhmsiz.

Şahin, o rəhmsizi nə tənqid?
Rəhm eyləməsin gərək rəhmsiz.

*28.04.1999*

***

Məstanəliyim deyil səbəbsiz,
Şahanəliyim deyil səbəbsiz.

Yaz gəldi və cuşə gəldi qanım,
Divanəliyim deyil səbəbsiz.

Uğrunda cəfakeşəm o yarın,
Mərdanəliyim deyil səbəbsiz.

Yanmaq dilərəm bu şəmə dərhal,
Pərvanəliyim deyil səbəbsiz.

Əfsanələşir bu kəs sağ ikən,
Əfsanəliyim deyil səbəbsiz.

Şahin, o nə şair dilənir söz?
Biganəliyim deyil səbəbsiz.

*12.03.2000*

***

O pəriçöhrə ki, bir dəm də yadımdan çıxmaz,
Sanıram hər iki aləmdə yadımdan çıxmaz.

Ömrümün hər dəmini nəqş elədim yaddaşə,
Fərəhim də, gözəlim, qəm də yadımdan çıxmaz.

Vurduğun yarə də yaddan çıxası yarə deyil,
Çəkdiyin yarəmə məlhəm də yadımdan çıxmaz.

Ana Yer kürrəmizi cənnətə bənzətmişlər,
Bəli, cənnətdə cəhənnəm də yadımdan çıxmaz.

Molla ağlatdı məni qəm dolu avazıyla,
Saqi rəqs eylədi dövrəmdə, yadımdan çıxmaz.

Görübən Çaldıranı səhvimizi yad elədim,
"Təxti-Cəmşid" də, hələ Cəm də yadımdan çıxmaz.

Nail oldum o qədər hörmətə mən, ey Şahin,
Ulu İran mənim ölsəm də yadımdan çıxmaz!

12.06.2000

***

Aşiqə rüsva desələr inciməz,
Arifə molla desələr inciməz.

Söndürə gər sözdəki atəş kini,
Atəşə dərya desələr inciməz.

Surətə məna donu geydirsələr,
Surətə məna desələr inciməz.

Mümkünü imkan ilə bir tutmuşuq,
Meylə təmənna desələr inciməz.

Olsa əgər söz iki - məzmun bir,
Aləmə dünya desələr inciməz.

Aşiqə "canan" desələr inciyər,
Məcnuna Leyla desələr inciməz.

Yerdə təkəm göydəki Allah tək,
Şahinə tənha desələr inciməz.

8.08.2000

***

Yox bağdə yer mən təki məstanəyə sənsiz,
Fikrim daha qonmur, gözəlim, nanəyə sənsiz.

Könlüm evi abad idi, çox yaxşı bilirsən,
Heyfa ki, dönüb indisə viranəyə sənsiz.

Meysiz də məni məst eləyən səndin əzəllər,
Neynim, gedirəm mən yenə meyxanəyə sənsiz.

Eşq içrə xəyalən neçə kaşanə yaratdım,
Könlüm quşu qonmur daha kaşanəyə sənsiz.

Biganə adamlar məni heyrətdə qoyardı,
Döndüm deyəsən mən dəxi biganəyə sənsiz.

Çoxdandı kitab almıram, ey canlı kitabım,
Çünki həvəsim yoxdu kitabxanəyə sənsiz.



Yanmaqdadı hicran oduna indi bu aşiq,
Şahindi, dönür get-gedə pərvanəyə sənsiz.

1.09.2000

***

Hər can ki yaşar, "bənzəri var canə" deyilməz,
Hər göyçək olan dilbərə cananə deyilməz.

İnsan ilə insanə gərək fərq qoyulsun,
Hər ətri olan ot-ələfə nanə deyilməz.

Hər bığlı kişi, varsa da bığ, mərd deyildir,
Məst olsa da, hər adəmə məstanə deyilməz.

Şəkkərdi sözü-söhbəti, indi acıdırsa,
Neyçün bibəristan şəkəristanə deyilməz.

Şairlər olub məscidə viranə deyiblər,
Allah evinə qeyz ilə viranə deyilməz.

Biganə deyil, amma nə olsun ki ərəbdir,
Məcnun kimi hər aşiqə biganə deyilməz.

- Divanəyəm eşqinlə, - dedim, söylədi: - Şahin,
"Divan"ı olan şairə divanə deyilməz.

15.10.2000

***

*Həsədkar bir qəzəlxana!*

Ədəbiyyat deyilən sənətə ol heyran, yaz,
Boyayıb al şəfəqin rənginə şeri, yan, yaz.

Qələmi sövq elə hər vəzninə şerin, qalma
Tək qəzəl həndəvərində belə sərgərdan, yaz.

Vəsli həm eylə təmənna arabir Allahdan,
Kim deyibdir sənə daim oturub hicran yaz.

Ürəyində yaşayan şeytanı öldür, öldür,
Söyləyiblər ki, "bu meydan, bu da şeytan", yaz.

Xəlqi sözlərlə bəyan et qəzəli hər vədə,
Əcnəbi sözlərə et sən də bu gün üsyan, yaz.

Mən əsər yazmağı məşq eyləmişəm illərlə,
Sən isə məşq eləyirsən hələ, "Məşqistan" yaz.

Çalışıb şerdə gəl möcüzə icad eləyək,
Nə gərəkdir sənə hikkə, mənəsə tügyan, yaz.

Şahinin "Divan"ı idrakə dəlalət eləyir,
Hünərin varsa əgər, sən də bacar "Divan" yaz.

*25.10.2000*

***

Yara kim vursa yara yarəsi yaddan çıxmaz,
Ya çara ərz edənin çarəsi yaddan çıxmaz.

Kabulun səksəkəsi çıxmayacaq canımdan,
Gülləsi, mərmisi, qumbarəsi yaddan çıxmaz.

Nalənin, çək-çevirin, qəm-kədərin, fəryadın
Ucalan göylərə fəvvarəsi yaddan çıxmaz.

Əfqanın musiqisi xoşsa da, od yurdumuzun
"Şahnaz"ı, "Rast"ı, "Zəminxarə"si yaddan çıxmaz.

Bakı ölkəmdə günəşdirsə, güman eyləyirəm
Qubadır yurdumun ayparəsı, yaddan çıxmaz.

Məni hicranə salıb sən qaragün etsən də,
O xumar gözlərinin qarəsi yaddan çıxmaz.

Gəzirəm çarəsini, çarə gərəkdir eşqə,
Dedi: - Şahin, bilirəm, çarəsi yaddan çıxmaz.

*7.09.2000*

***

Hicranı görən bəndə peşiman necə olmaz?
Gündən-günə biçarə könül qan necə olmaz?

Sən bağda gəzərkən, alağın yır-yığışıyçın
Şahin kimi aşiq bağa bağban necə olmaz?

Məcnunə təsəlli canı qurban eləməkmiş,
Qurbanın olum, can sənə qurban necə olmaz?

Tənqid elədim xislətini çox qəzəlimdə,
Görcək məni əğyar pərişan necə olmaz?



Zülm etməsin aşiqlərə heç vədə gözəllər,
Zülm eyləmək aşiqlərə nöqsan necə olmaz?

Düşmən qədəmi torpağımı tapdalayarsa,
Səngər mənə məskən, mənə meydan necə olmaz?

Vaqif nə gözəl söz dedi mərd övrətə, Şahin:
"Vaqif ər olan övrətə heyran necə olmaz".

*19.09.2000*

***

Neçə gündür ki, gülüm, hicr ilə söhbət düşməz,
Bu səbəbdən araya bir gilə həsrət düşməz.

Eşq - sərvətdi, fəqət çəkməlisən zəhmətini,
Zəhmətə xor baxan adəmlərə sərvət düşməz.

Əlini sevgiyə aç gör neçə fürsət düşəcək,
Qocalıq vaxtı, əzizim, ələ fürsət düşməz.

Qətilik olmalıdır səndə, ey aşiq, daim,
Hər tərəddüddə olan şəxsə qətiyyət düşməz.

Bacaya baxma, ət istərsən əgər ovlağa get,
Bacadan saxsı gələr, toz tökülər, ət düşməz.

"Heyrət, ey büt..." dedi şair, özü heyrətdə idi...
Heyrəti duymasa, əlbət, bütə heyrət düşməz.

Cənnəti eyləməyir arizu Şahin Fazil,
O ki eşq kafəridir, kafərə cənnət düşməz.

*24.06.2001*

***

Ocaqsan, tonqalam mənsə və tonqaldan ocaq olmaz,
Çıraqsan, çilçırağəm mən, çıraqdan çilçıraq olmaz.

Dayanmış xidmətimdə qüssəvü dərdü kədər daim,
Nə şah üçün, nə padişah üçün bu təmtəraq olmaz.

Mənə mən harda olsam da, daş atmışsan, utan, əğyar,
Qalaqlansın, o daşlardan bu aşiq daşqalaq olmaz.

Müdam ardımca sözlər ki, demişsən, büsbütün məlum,
Səs olmazsa, soraq getməzsə bir dəm səs-soraq olmaz.

Vətən mülkü vətəndaşdan dayaq istərsə var həqqi,
Bu xəlqə sən tək adəmdən ömür-billah dayaq olmaz.

Dilim əskik deyildir qeyri dildən, dilşünasəm mən,
"Dağ"a "kuh" söyləyirsən sən, neçin bəs "kuh" "dağ" olmaz?

Qəzəllər yazmışam saf ki, "xəzəllərdir" deyən yoxdur,
Mənim söz gülşənimdə, Şahinəm, əsla alağ olmaz!

*1.11.2001*

***

Allandı yanağın, ona mən al deməyimmi?
Qaymaq deyilibdir dodağa, bal deməyimmi?

Göz yaşlarımı sən yenə zülfünlə silirsən,
Qurbanın olum, zülfünə dəsmal deməyimmi?

Sən daxil edibsən nə təhər qəlbimə eşqi?
Mən bu əməliyyatına idxal deməyimmi?

Susmuş niyə bülbül yenə sən şərqi deyəndə?
Dilsiz deməyimmi, ona mən lal deməyimmi?

Tez-tez səni vəsf eyləyirəm xoşhal olursan,
Halın xoş olursa sənə xoşhal deməyimmi?

Əğyar əməlindən edirəm xəlqi xəbərdar,
Yarım, bu gözəl niyyətə amal deməyimmi?

Var öylə cavan ki, bizə ağsaqqal olubdur,
Hərdənbir ona mən qarasaqqal deməyimmi?

Şairlər olub qarə xala nöqtə deyiblər,
Bir nöqtəyə ki, qəlbə düşüb, xal deməyimmi?

Eşqin yükünü sən kimi kim çəkmədə hər dəm?
Aşıq, bu səbəbdən sənə hambal deməyimmi?

Fal açmadadır çoxları Hafiz kitabıyla,
"Divan"ıma, Şahin, görəsən fal deməyimmi?

*8.11.1995*



***

Eşqini hifz edirəm qəlbdə sərmayə kimi,
Sözünü dinləyirəm gündə sənin ayə kimi.

Oxşayıb zövqümü zövqün ki, olubdur məftun,
Şirinə, Şəkkərə, Leylayə, Züleyxayə kimi.

Tutmuşam mayə qəmindən də sənin, tacir tək
Əldə qəm sərvətimi saxlayıram mayə kimi.

Mənə amma, gözəlim, naz eləyirsən hərdən
Dözürəm nazına səbr ilə sənin dayə kimi.

Qayədir mən kimi aşiqlərə "eşq" məfhumi,
Eşqə "eşq" etməliyəm ömr uzunu qayə kimi.

Bu böyük yer kürəsində elə eşq əhli olub
Şöhrəti yüksələ bilmiş günəşə, ayə kimi.

Tək sənin vəslinə yetmək ki təmənnam olmuş,
Olmayıb qeyri təmənna bu təmənnayə kimi.

Bitəcəkdir qışı ömrün, gələcək yay yenə,
Şahina, sağ qalarammı görəsən yayə kimi?

*19.11.1995*

Nə gərək ahü fəğan fəlsəfəsi?
Kimə lazımdı bu qan fəlsəfəsi?

Ol xeyirxah, gülüm, hər yandan
Yan edir xeyri ziyan fəlsəfəsi.

Dağıdan eyləməsinlər onu zənn,
Yaradandır Yaradan fəlsəfəsi.

Olacaq yerdə nizam inşallah,
Zahir olmaqda güman fəlsəfəsi.

Gəhi yunan, gəhi Misr oldu yeri,
Məni cəlb etdi cahan fəlsəfəsi.

Çobanın fəlsəfəsi - ney çalmaq,
Canı çalmaqsa - ilan fəlsəfəsi.

Çobana şer oxu, zənn etmə fəqət
Sürü saymaqdı çoban fəlsəfəsi.

"Varmı Göygöl? Hanı Şahdağ?" Yaranıb
Ayrılıqdan Savalan fəlsəfəsi.

Şahinin fəlsəfəsi "Eşq" oldu,
Yetəcək yarə haçan fəlsəfəsi?

*27.12.1995*

***

Qəm gəldi yenə, vay, o yarım hara getdi?
Röya kimi qeyb oldu xumarım, hara getdi?

At çapdı, çapar oldu cavanlıq, yoxa çıxdı,
Düşdüm mən ayaqdan ki, çaparım hara getdi?

Kəsmişdi qübarın önünü yar, görünmür,
Artdıqca müdam artdı qübarım, hara getdi?

Udduqca udardıq hava gülzarə gələndə,
Çatmır hava indi, havadarım hara getdi?

Dil zümzümə eylərdi gəlib şurə çəməndə,
"Rast" ilə, "Segah" ilə, "Qatar"ım hara getdi?

Bədbəxtliyə bax məndəki, birdən-birə bəxtim
Bağlandı, qıfıllandı, açarım hara getdi?

Ömr içrə baharımdı cavanlıq ki, ötüşdü,
Gənclik - o bahar adlı nigarım hara getdi?

- Şahin, - dedilər, - getdi baharın! - Fəğan etdim:
- Mən həm bilirəm getdi baharım, hara getdi?

*13.03.1996*

***

Hicrin gecəsi getdi, vəslin səhəri gəldi,
Göz gün tək işıqlandı, çünki o pəri gəldi.

Göz yaşı töküb getdi Leyla quru səhrayə,
Məcnun səfəri bitdi, Leyla səfəri gəldi.

Şəkk eylər idim eşqə, eynimdə mənim az həm
Eşqin dəyəri yoxdu, eşqin dəyəri gəldi.



Görsənməsə qəm, qüssə dil bir də deməz böylə:
- Bundan betəri getdi, ondan betəri gəldi.

Bitmiş daha nisgillər, bilsin bunu qafillər:
Qovğa xəbəri getdi, sevda xəbəri gəldi.

Yox zərrə qədər şübhə: Üstün dəxi vəsl hicrə!
Hicran təzədən gəlsə, bilsin hədəri gəldi.

Şerim neçə müddətdi dünya üzü görmürdü,
İlham Araza döndü, təbin Xəzəri gəldi.

Şahdağdan ağır dərdim tərk etdi məni getdi,
Həzzimsə bu gün, Şahin, dünya qədəri gəldi.

*15.05.1996*

***

Ölkəm dağılır, el talanır, kim kimə indi?
Məzlum dönübdür görürəm zalimə indi.

Təxt üstdə oturmuş neçə sultan yıxıldı,
Hökm altda qalan hökm eləyir hakimə indi.

Girsin hələlik köynəyə tarım, kədərim var,
Tar inciməsin dəyməsə mizrab simə indi.

Göz yaşları çıxmırdı ürəkdən neçə vaxtdı,
Axmaqda, məəttəldi gözüm bir himə indi.

Bədbinliyə, aləm qopa, təslimmi olardım?
Çarəm kəsilib, qaldı ümid təslimə indi.

Məzlumların naləsi yetmır sənə yoxsa,
Ey Rəbb, şikayət eləyək biz kimə indi?

Tilsimli qapı bir sözə bənd idi, a Şahin,
"Sim-sim" sözü təsir eləmir tilsimə indi.

*4.07.1996*

***

Xəlq edəndən bəri adəmdə ləyaqət sevgi,
Ən qədim fəlsəfədir, ən ulu hikmət sevgi.

Əksəriyyət eləyir meyl ona məftunluqla,
Nə gözəl möcüzədir, bəh, nə kəramət sevgi.

Mənə bir kəs deməsin bir də "fəqirsən" sözünü,
Sərvətim sevgi mənim, məndəki dövlət sevgi.

Vurnuxur daima yar axtarışıyla əğyar,
Onu böylə görübən çəkdi xəcalət sevgi.

Deyiləm pəhləvan, amma canimın qüvvəti var,
Saf məhəbbət mənə gücdür, mənə qüvvət - sevgi.

Dilimiz "sevgi" deyir, sevgili yarım, bizdə
İxtilat sevgidi, söz sevgidi, söhbət sevgi.

Mən ki ömrüm boyu sevmiş və sevilmiş şəxsəm,
Can verərkən olacaq son sözüm əlbət "sevgi".

Sevgi Allahı deyən var adıma, ey Şahin,
Olmasam mən qalacaq Allaha həsrət sevgi.

*29.08.1996*

***

Olmazdısa meyli alışıb-yanə səmimi,
Yandırmaz idi cismini pərvanə səmimi.

Sərtəm arabir, başqası olsaydı bezərdi,
Baxmaqda mənə sevgili cananə səmimi.

Meyxanəyə hərdən gedişim təxirə düşcək,
Saqi evə göndərmədə peymanə səmimi.

Hər kim ki, səmimi deyil insanlığı olmaz,
Meyl etməli insan isə insanə səmimi.

Vallah, kitabxanəyə baş çəkməsəm ölləm,
Gözlər yolumu gündə kitabxanə səmimi.

İllər boyu Sina ilə Tusi oxudum mən,
Var ehtiramım bir neçə loğmanə səmimi.

Mən tapdamaram gülləri, bağban, məni qovma,
Əzm eyləmişəm mən bu gülüstanə səmimi.

Ovçu olanın süni səmimiyyəti məlum,
Ovçu baxa bilməz axı ceyranə səmimi.

Bir dəfə deyil, min kərə qoy lənətə gəlsin
Hər kəs atını sürməsə meydanə səmimi.

Təzim edirəm yarıma, əlbəttə ki, görcək
Baş əyməlidir bəndəsi sultanə səmimi.



Məcnun ilə röyadə bu gün xeyli danışdıq,
"Divanə" dedi Şahinə divanə səmimi.

*6.09.1996*

***

Ey qəzəl, qəlbimdə yer tutdun mənim sevda kimi,
Başqa hər şer isə görsənməkdədir xülya kimi.

Hər qəzəl bir güzgü tək əks eyləyibdir çöhrəni,
Canlanırsan gözlərimdə, sevgilim, röya kimi.

Dustaq oldum gəh fərağə, gəh vüsalə, hər gecəm
Saçların tək gəh uzundur, gəh qısa - misra kimi.

Olmuşam bir xeyli müddətdir ki, mən Quranə yar,
Sözləri yarın şirindir aşiqə həlva kimi.

Mən köçündən ayrı düşmüş durna gördüm, ağladım,
Başqa quşlar çəkməyirlər fikrimi durna kimi.

Leyli-Məcnun sevgisindən çox yazılmışdırsa da,
Tapmaq olmaz qeyri aşiq Adəmü Həvva kimi.

Valeh oldum bir neçə peyğəmbərin ecazına,
Gəzdirən varmı əsanı Həzrəti-Musa kimi?

Varmı kəs Həzrət Məhəmməd timsalı kəssin ayı,
Ya da su üstündə gəzsin, batmasın İsa kimi?

Surətə baxmır bu Şahin, indi məna axtarır,
Könlünü cəlb etməyir surət daha məna kimi.

*26.09.1996*

***

Elə ki getdi küsüb yar, yanımdan getdi,
O səliqəm o nizam xanimanımdan getdi.

Yazıban car eləmişdim "cahana Leyli gəlib",
Car çəkim indisə "Leylim cahanımdan getdi"?

Öyrədirdim ona eşq dərsini, ustadıydım,
Aldı öz qiymətini imtahanımdan, getdi.

Zənn edirdim neçə gün sonra güman ki qayıdar,
Kaş kəsəydim onu, zənnim gümanımdan getdi.

Vurulandan bəri canana bədən mülkümdə
İki can vardı, biri uçdu canımdan getdi.

Geri dön, getsəm əgər mən, deyəcəksən: - Əfsus!..
Şahinim şahin idi, asimanımdan getdi.

*2.10.1996*

***

Qalmadı tabü təvan, tabü təvanım getdi,
Bu gedən yar deyildir, de ki, canım getdi.

İnanırdım ki, nizam eşq iləcdir aləmdə,
Daha bundan belə eşqə nə inanım, getdi.

Eşq mülkü, düşünürdüm ki, məhəbbətlə dolu,
Mənəvi söylədiyim mülkə gümanım getdi.

Mən bu üç beyti ki yazdım, yenidən yar gəldi,
Təzədən faidə görsəndi, ziyanım getdi.

Titrəyir qeyz ilə canım həyəcan olduqda,
Sakitəm mən yenə əlbət, həyəcanım getdi.

Bəşəri vəsli bəşər naminə vəsf etməliyəm,
Elə ki gəldi vüsal, ahü fəğanım getdi.

Qıl dua, qoymasın Allah gələ ayrılığı,
Ayrılıq gəlsə yenə, Şahina, qanım getdi.

*6.10.1996*

***

Yenə qar gəldi, gülüstan əlimdən getdi,
Nə seyr qaldı, nə seyran, əlimdən getdi.

Yarımın zülfü kimi bəs nə uzun oldu bu qış?
Dözməyib möhnətə bağban əlimdən getdi.

Gizlədərdi bizi güllər dağılıb üstümüzə,
Görüşə gör neçə imkan əlimdən getdi.

Ormanın qoynuna girdikdə qalardıq yalqız,
Ürəyim, yan ki, orman əlimdən getdi.



Bulağın saf suyu mey ləzzəti verməkdəydi,
Məst olardı su ilə can, əlimdən getdi.

İri yarpaqları fincan idi cəngəllikdə,
Gör təbii neçə fincan əlimdən getdi.

Dərmanım indi qar altında qalan otlardır,
Ey təbib, gör neçə dərman əlimdən getdi.

Eybi yoxdur, gedəcək qış, gələcək yaz yenə,
Demərəm "yaz, a qəzəlxan, əlimdən getdi".

Şahina, hər nə gedirsə qoy əlindən getsin,
Söyləmə sən təki "canan əlimdən getdi".

*22.12.1996*

***

Çəkməz idim Mani olsaydım bu dünya rəsmini,
Mən çəkərdim hər zaman Leyla, Züleyxa rəsmini.

Məhrum eylə, saqiya, meyxanə rəsmindən məni,
Ver Məhəmməd rəsmini, göstər Məsiha rəsmini.

Ey Süleymanım, işin bir kimsəyə düşmüşmü heç?
"Hə" deyib göstərdi icz ilə qarışqa rəsmini.

Sordu dilbilməz "neçin zar olmusan?", - dilbilməzə
Güldü Məcnun, tez çəkib göstərdi səhra rəsmini.

Tutiyə mən xurma göstərdim çəkib, dilləndi ki,
Xurmanı lütf et mənə, göstərmə xurma rəsmini.

Qoy məhəbbət rəsmi olsun şakəri rəssamların,
Çəkməsinlər bir daha şövq ilə qovğa rəsmini.

Sünni-şiə ixtilafı rədd olaydı kaş ki,
Görməyəydik, Şahina, bir gün təbərra rəsmini*.

*31.12.1996*

---

* Təbərra rəsmi - şiələr tərəfindən yalnız Həzrət Əlinin təriflənib, digər üç xəlifənin
- Ömərin, Əbubəkrin, Osmanın (Məhəmməd peyğəmbərin əshabələrinin) şiddətlə lənət-
lənməsidir. Hələ XVI əsrdə Osmanlı Türkiyəsinin Səfəvilər dövlətinə etdiyi 6 böyük hü-
cum (1514, 1534, 1535, 1548, 1554, 1578-ci illər) məhz "təbərra rəsminin" aradan götü-
rülməməsi səbəbindən baş vermişdir. Bu haqda bax: Şahin Fazil Fərzəlibəyli. Azərbaycan
və Osmanlı imperiyası XV-XVI əsrlərdə, Bakı, 1995, səh.157-158.

***

Ülfətü ünsiyyət içrə baş olaydım kaş ki!
Hər zaman sirdaşə mən sirdaş olaydım kaş ki!

Yarlər, hüşyar olun, baş qaldırır əğyarlər,
Dəymək üçün onlara bir daş olaydım kaş ki!

Dilbəri biçarə görcək odlanır bağrım başı,
Hər köməksiz dilbərə qardaş olaydım kaş ki!

Girmərəm meyxanəyə, amma deyir meyxanəçi:
"Saqiya, eyşinlə mən əyyaş olaydım kaş ki!"

Nəqş edib nəqqaşlər bir çox gözəl surət daşa,
Çəkməyə gül hüsnünü nəqqaş olaydım kaş ki!

Görmək üçün hüsnünü hər ləhzə, hər dəm, anbaan,
Çöhrəni yelpikləyən sirdaş olaydım kaş ki!

Şah Xətai Şahinə röyadə "Baş şair" dedi,
Kaş olaydım bir zaman, eykaş, olaydım kaş ki!

*8.02.1997*

***

Yarımı, şahiddi aləm, sevmişəm mən can kimi,
Sevmədim ən nazənin, ən bəxtəvər canan kimi.

Eşq mülkündə pozulmaz bir nizam olsun gərək,
Mən qulaməm, ey nigarım, sənsə ol sultan kimi.

Asi oldum gözləməkdən vəslini illər boyu,
Hökmdarım, niyyətim görsənməsin üsyan kimi.

Dərdə bir bax, çox şeyi bilsəm də üzmək bilmirəm,
Eşq bəhrində neçin gizlənmisən mərcan kimi?

Mən təbib axtarmıram, yoxdur təbibdən faidə,
Varmı bir kəs dərdimə etsin dəva loğman kimi?

Bəlli ki, xoş davranışdan xoşlanar xoşxahlər,
Varmıdır bir qeyri bədxahim mənim hicran kimi?

Pis kəsi tapşırmışam mən Tanrının divanına,
Yazmışam mən bir kitab ki, yazmışam "Divan" kimi.



Mən ki, əsla bilmədim böhtan nədir, eyham nə,
Yağdıran var üstümə eyhamını böhtan kimi.

Neyləyim, əsdikcə üstümdən fərağın yelləri,
Sovrulur hər ləhzə ömrüm, Şahina, xırman kimi.

*15.02.1997*

***

Hicranı mən qovmuşam, ya qovlayıb hicran məni?
Mən canı tərk etmişəm, ya tərk edibdir can məni?

Naxələf bir qonşunu yurdumda mehman eylədim,
Ey Xudavəndim, zəlil etməkdədir mehman məni.

Bir mənəm, bir loğmanım, yarəb, sağaldır kim kimi -
Bilmirəm mən loğmanı, ya əksinə loğman məni.

Aşikarlıq şakərimdir, yox işim pünhan ilə,
Aşkar sevdim səni, amma ki sən pünhan məni.

Diş-dodağın ləlü mərcan tək məni cəlb eylədi,
Heç zaman cəlb etməmişdi ləl, ya mərcan məni.

Yaxşıdır zülfün kəsilməkdənsə kəssən boynumu,
Sinəmə yay zülfünü, qızdırmayır yorğan məni.

Əfzələddin, Seyyidü Sabir fəxarətdir bizə,
Hər üçü şirvanlıdır, mat eyləyib Şirvan məni.

Baxsa da lap zərrəbinlə, dağ görünməz zərrəyə,
Bir deyin, mümkünmü görsün hər cılız insan məni?

Son nəfəsdə Şahinin son sözlərindən bir sətir:
Əzrayıl öldürmədi, öldürdü bir canan məni!

*17.02.1997*

***

Hərə bir dərdə düşüb ah ilə əfğan elədi,
Mən pərişanısa cananı pərişan elədi.

Gecələr üstü yerin ah ilə əlvan olmaz,
Gün çıxıb hər tərəfi gör necə əlvan elədi.

Şerdə gün kimi çıxmaq diləyim var mənim,
Bir də gördün ki, bu aşiq buna imkan elədi.

Deməsinlər ki, Füzuli elə, Seyyid belə...
Bir də gördün ki, zaman ismimi dastan elədi.

Bir də gördün ki, qəzəl bir dəxi rövnəqləndi,
Təzə bir Hafizi dövran qəzəlxan elədi.

Bir də gördün ki, biri Sədini qoymuş gendə...
Bir də gördün ki, biri aləmi heyran elədi.

Bu üzündürmü yanır, yoxsa çıraqdır böylə?
Bir də gördün ki, üzün təbi çırağban elədi.

Oldu peyda yeni sultan qəzəl mülkündə,
Bir də gördün ki, fələk Şahini sultan elədi.

*20.02.1997*

***

O gündən ki, cünun könlüm o dildarı pəsənd etdi,
Məhəbbət şərbəti göz yaşımı dondurdu, qənd etdi.

İmamı gözləyən Mənsuri çəkdirdin neçin darə?
Fələk məşhur oyunbaz ki, kələk işlətdi, fənd etdi.

Dəmirdən mən çarıq geydim, ürək birdən-birə çünki
Təmənna Aşqabad etdi, Səmərqəndü Xocənd etdi.

Neçin şairlərim yazmır şirindil Şəhriyarım tək?
Neçin şairlərim etmir o sehri ki, Səhənd etdi?

Qüzeh qövsü izafətdən kənar olduqda göyçəkdir,
Mənim Rəbbim həmin qövsü yer üstündə kəmənd etdi.

Görüb hüsnündə ay nurin dəmadəm şad olardım mən,
O zülfü dilbərim neyçün camalında rübənd etdi?

Bu dünyanın əcaib işləri var imiş, ey Şahin,
Fələk Leyla kimi cananəni Məcnunə bənd etdi.

*25.02.1997*

***

Sanıram, ey gözəlim, çox gözələ baş səni,
Həmişə saxlaya Allah bu cür kaş səni.

Deməsinlər mənə "bir kimsəyə sirrin verme",
Yox, gülüm, etməliyəm sirrimə sirdaş səni.



Heç kimin şəninə söz yazmayacaqdım, amma
Qələmim vəsf edəcəkdir, a qələmqaş, səni.

Mən yazan "Eşq kitabı" sənə düstur olsun,
Etməsin başqa kitablar daha çaşbaş səni.

Vətənin yaxşı vətəndaşı olub hər vədə,
Ey vətəndaş, görək yaxşı vətəndaş səni!

Ey qəsbkar, dayan, tullama gəl daş mənə,
Yıxacaq əvvəl-axır tulladığın daş səni.

Əskərim, çox qələbən vardı qızılbaş vaxtı*,
Aparaydı döyüşə kaş qızılbaş səni.

Yaş ötüb əllini, ey yar, - dedim, yar dedi:
- Şahina, etməsin heç vədə xəcil yaş səni!

*10.03.1997*

***

Gözəlim, bas sinəm üstdə qədəm əvvəlki təki,
Ləzzət alsın qədəmindən sinəm əvvəlki təki.

Düşünürdüm ki, daha gəlməyəcək ilhamım,
Şükür Allahə, götürdüm qələm əvvəlki təki.

Elə eylərdi yürüş ki, duruş etməzdi fərəh,
Yürüş etmir daha mən səmtə qəm əvvəlki təki.

Qorxusundan əsirəm nanə kimi andıqca,
Məni qorxutmayacaqdır sitəm əvvəlki təki.

Gözüm içrə daha yer tutmayacaq bir kimsə,
Gözümə dolmayacaqdır ələm əvvəlki təki.

Rəhmət olsun, məni pişvaz eləmirlər çoxdan
Babam əvvəlki mehrlə, nənəm əvvəlki təki.

Əllərindən qopa bilmir əlim, ey yar, getsən
Fərəhim olmayacaq gözdə cəm əvvəlki təki.

Ehtiram eylədiyim çox kəsə yoxdur meylim,
Yenə ol Şahinə sən möhtərəm əvvəlki təki.

*11.03.1997*

---

* XVI əsr Azərbaycan Səfəvi dövlətinin hakimiyyət dövrünə işarədir.

***

Qürbətdə qalıb olmasa da şad Füzuli,
Şad oldu ki, söz söylədi azad Füzuli.

Olmazdısa azadəliyi, müti qalardı,
Etməzdi şikayət dolu fəryad Füzuli.

Sərrast deməkdə sözü mahir idi, sanki
Söz gülləsini eylədi icad Füzuli.

Türkün dilini göylərə qaldırdı fəxrlə,
Ustadların ustadı ustad Füzuli.

Məcnun ilə Fərhadı çəkib nəzmə yaşatdı,
Məcnun Füzuli ilə Fərhad Füzuli.

Pak ruhimidir bizlərə imdadə yetişdi?
Yoxkən, yetiribdir neçə övlad Füzuli.

İmdad umuruq biz yenə, söz sərrafımızdır,
Şahin kimi çox şairə imdad Füzuli.

*13.04.1997*

***

*Hu! (O! - yəni Allah!)*

Əks eləyir gör necə arzu səsi:
Təşnə kəsin arzusudur su səsi.

Bilmədi insafü mürüvvət nədir,
Ovçunu cəlb etmədə ahu səsi.

Nəğməsi var bircə - ölümdən qabaq!
Bir kərə çıxmaqda fəqət qu səsi.

Röyada Şah İsmayılı görmüşəm,
Sufilərin gəldi "həyahu" səsi.

Arif olan Quranı öpməkdədir,
Aşiqi çəkməkdə yarın busəsi.

Sən məni hər dəm duyacaqsan, gülüm,
Varsa əgər qəlbdə duyğu səsi.

Kim nə deyirsə, eşidə bilməyir,
Şahinə yetməkdə fəqət "hu!" səsi.

*14.04.1997*



***

Qal əhli zəfər çalsa, dəhşət bu deyildirmi?
Həzz itsə, kədər qalsa, xiffət bu deyildirmi?

Biz ki, ikiyik, amma bir eşqə giriftarıq,
Birləşsə canım canə, vəhdət bu deyildirmi?

Görcək səni lal oldum, bağlandı dilim sanki,
Gözlər danışırlarsa, söhbət bu deyildirmi?

Yüz yerdə qərar etdim "qürbət" demədim amma,
Yar yardan uzaqdırsa, qürbət bu deyildirmi?

"Badə" dediyim - surət, "mey" söylədiyim - məna,
Məna bu deyildirmi, surət bu deyildirmi?

Gəl söyləmə "Sokratəm", fəxr eyləmə "Fərhadəm",
Gildən düzəlib Adəm, qüdrət bu deyildirmi?

Bica yerə Məcnunluq, yad gözlərə məftunluq,
Yad sözlərə məftunluq - heyrət bu deyildirmi?

Tezliklə zühur etsin, ya Rəbb, İmam Mehdi,
Xiffət bu deyildirmi, həsrət bu deyildirmi?

Şahin, mənə "sərvətsiz" - hər kəs desə, haqsızdır,
Eşq varı varımdırsa, sərvət bu deyildirmi?

*15.04.1997*

***

Gün qürub etdi, yenə göydə qəmər görsəndi,
Elə ki, getdi gecə, gəldi səhər görsəndi.

Günlərim böylə keçir, gəh gecədir, gəh gündüz,
Ayda da, gündə də amma mənə zər görsəndi.

Gah zər rəngini göylərdə buludlar örtdü,
Gah ah gəldi, aləm cumdu, kədər görsəndi.

Amma əksilməsi nikbinliyimin mümkünmü?
Axı, bədbinliyə qəlbimdə çəpər görsəndi.

Bülbül oldum, gözə görsəndi qızılgüllərimiz,
Tuti oldum, mənə hər yerdə şəkər görsəndi.

Xətrimi, hörmətimi istəyən adəm çoxdur,
Bircə kəsdən mənə şər yağdı, zərər görsəndi.

Karivanım yenə ötməkdə nizam ilə mənim,
Rəml atıb söylədilər "öndə səfər görsəndi".

Dərvişəm, günlərim onsuz da səyahətdə keçib,
Nə bəla bəhrinə düşdüm, nə xətər görsəndi.

Keçəcəkdir hələ çox yolları Şahin Fazil,
Yolkəsən qoy bunu bilsin ki, hədər görsəndi.

*25.04.1997*

***

Çəkəcəkdir yenə dildar mənim həsrətimi,
Biləcək həsrətə meyar mənim həsrətimi.

Həsrətin şəklini çəkmişdi o, rəssam sayağı,
Çəkəcəkdir yenə təkrar mənim həsrətimi.

Həsrətin həzzini bəzən verə bilmir vüslət,
Sanacaq həzzə səbəbkar mənim həsrətimi.

Demirəm təkcə o yar ilə o ilham pərisi...
Çəkəcəkdir hələ çox yar mənim həsrətimi.

Lovğalanma o çəmənzardə sən, ey bülbül,
Çəkmədə bağü çəmənzar mənim həsrətimi.

Həsrətim bir yeni "Divan"ə yönəlmişdi mənim,
Qələmim etmədi inkar mənim həsrətimi.

Şahina, Mənsuru kəndirlə şərəfləndirdi,
Neçə ildir ki, çəkir dar mənim həsrətimi.

*3.05.1997*

***

Qəmginəm mən də bu saət qoca dünya təhəri,
Yanıram, qovruluram sanki qovurğa təhəri.

Vurmağa nanəcib insanı nə qüvvəm bəs edir,
Nə əsa sahibiyəm Həzrəti-Musa təhəri.

Lovğalanma belə daşmaqla, bulaq, mən də varam,
Gözlərimdən sel axır yerlərə dərya təhəri.

Surətin qədrini artırsa da mənə, bəzən
Birləşə bilməyirəm surətə mənə təhəri.



Təzə "Divan"ı bitirməkdə çətinlik çəkirəm,
Yovuşa bilməyirəm beytimə misra təhəri.

Girmirəm mən daha meyxanəyə, saqi, görürəm,
Sən də köynək cıracaqsan o Züleyxa təhəri.

Qədrimi, qiymətimi varmı bilən kəs? İndi
Şahinəm, meyl edirəm qürbətə durna təhəri.

*1.06.1997*

***

Yapışaydım üzünə kaş sənin xal kimi,
Səriləydim başına ya da ki, dəsmal kimi.

Gözəlim, keyf edirəm mən ki, bitib hicranım,
Yığmıram qəm yükünü çiynimə hambal kimi.

Deyər idim özümə: "Ayrılığı öldürsəm,
Gün gələr mən dəxi ollam yenə xoşhal kimi".

Sən ki gəldin yanıma, qüssəvü dərdim getdi,
Üzünə baxmayıram hər gələnin lal kimi.

Neçə vaxt idi ki, susmuşdu tamam ilhamım,
İndisə çağlayacaqdır yenə Qudyal kimi.

Hansı qafil bala meyl eyləyəcəkdir bilməm
Şirin olsa dodağı sevdiyinin bal kimi.

Saqqalın ağlığı qorxutdu yenə cananı,
Şahina, xar eləyən yox məni saqqal kimi.

*10.07.1997*

***

Sözlərimdə əks edir elmin, kamalın cilvəsi,
Gözlərimdə rəqs edir hər dəm xəyalın cilvəsi.

Çəkməyibdir heç məni cahü cəlal, hərçənd ki,
Çox kəsi çəkməkdədir cahü cəlalın cilvəsi.

Sən ki saf olmaqdasan gündən-günə mirvari tək,
Sevgilimsən, saflığında var zülalın cilvəsi.

Bilmirəm mən gözmüdür bu, ya ki, ulduz göz vurur?
Bilmirəm mən qaşmıdır bu, ya hilalın cilvəsi?

Gül camalından sənin, yarım, ziya əskik deyil,
Bərq vurur bülbül görən gül tək camalın cilvəsi.

Sən hara, Leyla hara, heç vədə Leyla gəzmədim,
Bilmirəm üstünmü hər Leylamisalın cilvəsi?

Gün gedir, ay həm gedir, il həm gedir, ömr həm gedir,
Xatirimdən getməyir, Şahin, vüsalın cilvəsi.

*15.07.1997*

***

Getməzsə günəş, qəmər gələrmi?
Bitməzsə gecə, səhər gələrmi?

Həzz itdi yenə, qəhərsə gəldi,
Dərd olmasa heç qəhər gələrmi?

Qalmazmı məgər, məgər qalarmı?
Getməzmi məgər, məgər gələrmi?

Getsin bu günüm ki, qarə gəldi,
Bundan da günüm betər gələrmi?

Yarım, mənə bixəbər deyirlər,
Səndən mənə bir xəbər gələrmi?

Qürbət səfərim xətərsiz oldu,
Allah qorusa, xətər gələrmi?

Heç bir də Əli kimi hünərvər,
Düldül kimi bir kəhər gələrmi?

"Divan"ı böyük hünərlə yazdım,
Bundan da böyük hünər gələrmi?

Şahin, elə cəhd, ol müzəffər,
Cəhd eyləməsən, zəfər gələrmi?

*19.09.1997*

***

*Qəzəlxan Namiq Şəfaiyə*

Şəm var, pərvanədir mindən biri,
Mən təki mərdanədir mindən biri.

Min nəfərdən bir nəfərsən, zahida,
Sevgiyə biganədir mindən biri.



Qəlb evi cəng əhlinin viranədir,
Sanmayın viranədir mindən biri.

Saqi yoxsa təsiri yoxdur meyin,
Saqisiz - məstanədir mindən biri.

Çox bina inşa olubdur, yaxşı ki,
Çox deyil, meyxanədir - mindən biri.

Xəlq edib dünya evi çox Leylini,
Leyli tək əfsanədir mindən biri.

Söyləmə hər dürrə gəl dürdanə sən,
Dürr çox, dürdanədir mindən biri.

Hər gözəl zənn etməsin cananədir,
Bəlkə də cananədir mindən biri.

Şahinə, çoxdur dəli, divanə az,
Sən kimi divanədir - mindən biri.

*30.10.1997*

***

Olmasam da mən cahanda, ey pəri, zər sahibi,
Bəxtiyar etsin İlahi mən kimi hər sahibi.

Ey müxalif, səngərə girdin mənə bir ox atıb,
Səngərindən çıxmağı bilməzmi səngər sahibi?

Niyyətin qapqarədir, qəlbin o niyyətdən qara,
Mən həqiqət söylərəm hər vədə, ey şər sahibi.

Ey paxıllar padişahı, çap olur dəftərlərim,
"Divan"ım vardır, özünsən indi dəftər sahibi.

Çox mətin zabit görübdür möhtəşəm söz ləşkəri,
Zabit olmaq istəyir oğlun, ey əsgər sahibi.

Bir gözü dan ulduzu yarın, biri qütb ulduzu,
Ülkərin vardırmı heç böylə, ey ülkər sahibi?

Mən kiməm, ya biz kimik, ya yer nədir, ya göy nədir?
İnsü cinsin, kainatın ey sərasər sahibi.

Şahinəm, mən hər zaman "Allahu əkbər" söylərəm,
Allahım, sənsən fəqət "Allahu əkbər" sahibi.

*5.11.1997*

***

Can düşür qüvvədən, ey gül, badamın yox xeyri,
Dindirirsən məni xoş-xoş, kəlamın yox xeyri.

Düz deyiblər ki, ürək ayinədir, sındırma,
İncidibsən məni, zalım, salamın yox xeyri.

Qəmginəm öylə bu saət yenə, ey meyxanaçı,
Badə nə, versə əgər saqi camın yox xeyri.

Mənə "şəm yaz" dedilər, "şəm" niyə, "şam" yazmalıyam,
Günəşin yandığı halətdə şamın yox xeyri.

Zəncinin çöhrəsini sabun ağartmaz heç vaxt,
Binədən üz qaradırsa, hamamın yox xeyri.

Cəbr ilən hifz eləmək səltənəti mümkünmü?
Dibə düşmüşsə əgər lərzə, damın yox xeyri.

Şahina, şerini hər nadana göstərmə daha,
Sürmənin gözlərinə kor adamın yox xeyri.

*14.11.1997*

***

Kimsədə görməyirəm sən kimi canan əsəri,
Etməsinlər mənə təklif daha cananələri.

Yığıram göz yaşımı ovcuma dürdanə kimi,
Dondurub düzməliyəm saplara dürdanələri.

Biri sənsən, biri Vamiq, biri Fərhad, ey Qeys,
Dövrəmə toplamışam siz kimi mərdanələri.

Məndə yoxdur sənə bir zərrə inam, ey zahid,
Minə də çatsa əgər təsbehinin danələri.

Şəmi yandırdığım üçün həmişə gündüzlər
Gecələr yandıra bilmir daha pərvanələri.

Mən həqiqət gəzirəm ömr uzunu dünyadə,
Arifəm, söyləməsinlər mənə əfsanələri.

Dedilər Şahinə "yox qüssəsi divanələrin",
Qüssəsiz görməmişəm mən hələ divanələri.

*19.11.1997*



***

Diləsən uçmağı - tərlandən öyrən dərsi,
Nazənin qaçmağı - ceyrandən öyrən dərsi.

Var ikən huriyəbənzər mələyi dünyanın,
Demərəm mən sənə şeytandən öyrən dərsi.

İmtahan dövrü gəlibdir - Qarabağ imtahanı!
Hərbə get, cəng elə, meydandən öyrən dərsi.

Bağa baxmazsan əgər dağ görərsən bağda,
Bağı bağ eylə və bağbandən öyrən dərsi.

Mərifət öylə məziyyətdi ki, var az kəsdə,
Ədəbə meyl elə, insandən öyrən dərsi.

Aləmin bir neçə ibrət deyilən dərsi də var,
İnqilab, vəlvələ, üsyandən öyrən dərsi.

Dərdimin çarəsi yoxmuş, yuxu gördüm yuxuda,
Dedi Loğman ki, Loğmandən öyrən dərsi.

Hiyləgər kəsdən uzağəm, sevirəm comərdi,
Tülküdən et həzər, aslandan öyrən dərsi.

Sənə eşq elmini öyrətməyə hazır Şahin,
Gözəlim, gəl bu qəzəlxandən öyrən dərsi.

*24.11.1997*

***

Gecə bitdi, səhərin yox xəbəri,
Təzə gündən qəmərin yox xəbəri.

Gözəlim, gözlərini dik gözümə,
Nəzərimdən nəzərin yox xəbəri.

Dil acı, amma şirindir dodağın,
Zəhərindən şəkərin yox xəbəri.

Kədəri aid edirlər Qeysə,
Kədərimdən bəşərin yox xəbəri.

Ümidim qaldı o dünyayə mənim,
Faidəmdən zərərin yox xəbəri.

Xəbərim var xəbərindən vəslin,
Nə qədər bixəbərin yox xəbəri.

Qış yetib, Şahin itib, bağban ölüb,
Gül solubdur, çəpərin yox xəbəri.

*8.12.1997*

***

Sən ki gəldin yanıma, zövqü səfalər gəldi,
Sən ki getdin, o saat cövrü cəfalər gəldi.

Məni döydükcə cəza dalğası naçar soruram:
- Nə xəta eyləmişəm mən ki, cəzalər gəldi.

Arabir sanki mələklər məni dindirməkdə,
Nə sədalərdi bu, göydən nə sədalər gəldi?

Başladım Quranı öyrənməyə, Allah, sənə
"Qülhüvallah" dediyim dəmdə dualər gəldi.

Sanki sözlər özünün siqlətini artırdı,
Elə bil gözlərə nur doldu, ziyalər gəldi.

Bihəyalər də sənin zatını inkar eləmir,
Üzlərə, ismini çəkdikdə həyalər gəldi.

Əfqanıstanda qalıbdır nə qədər dost-tanışım,
Görəsən onlara, Yarəb, nə bəlalər gəldi?

Kimə ay çatsa, mənə gəldi fəqət ay işığı,
Kimə gün çatsa, mənə təkcə şüalər gəldi.

Yoluxurlar məni Fərhad ilə Sənan hərdən,
Yanıma gör nə qədər bəxtiqəralər gəldi.

Görəsən, varsa bu gün, Məcnuna varis kimdir?
Şahin, əvvəlcə adım, sonra nidalər gəldi!!!

*30-31.12.1997*

***

Özümə, ey pəri, biganəliyin var səbəbi,
Yanıram eşqinə, pərvanəliyin var səbəbi.

Mən sevəndən səni əfsanələşibdir eşqim,
Aydın olsun gözüm, əfsanəliyin var səbəbi.

Əsl aşiqləri mərdanə görürlər daim,
Bəllidir hər kəsə: mərdanəliyin var səbəbi.

Neçə məstanəni saqi yenə qovmaq diləyir,
Söyləyin saqiyə: məstanəliyin var səbəbi.



Bu qəzəl sahibi misrayə qəliz söz düzməz,
Şeri saf yazmada, şahanəliyin var səbəbi.

Üns edəndən bəri rindlərlə - yazıb rindanə,
Bəli, Hafizlərə rindanəliyin var səbəbi.

Əqlimi aldı başımdan o gözəl, əqlim yox,
Şahina, sən demə divanəliyin var səbəbi.

*24.02.1998*

***

*İrana 7-ci səfərimdən vətənə dönəndən sonra*

Gəzmişəm Türkiyəni, Qafqazı İranə kimi,
Heç zaman olmamışam mən belə məstanə kimi.

Mənə hər şey burada doğma gəlir, qürbətdə
Hiss edirdim özümü hər şeyə biganə kimi.

Ayağım özgə diyarlarda olub, fikrimdə
Azəribaycan olub Azəribaycanə kimi.

Orda mən nanəni zülfün sayağı qoxlardım,
İndisə qoxlayıram zülfünü hey nanə kimi.

Bilərəm vəslimizin qədrini bundan sonra,
Bircə addımdır axı vəsldən hicranə kimi.

Daş atarkən dəliyə qaçmağa başlar qorxub,
Daş atırsan ki, qaçım mən dəxi divanə kimi?

Daha mən qürbətə şahin kimi uçmaq diləməm,
Vətənimdə gəzirəm, Şahina, şahanə kimi.

*10.05.1998*

***

Hanı badə, yenə cam yox, saqi,
Yenə məclisdə nizam yox, saqi.

Bircə məstanəsi var, məstdi hamı,
Sən ləyaqətdə adam yox, saqi.

Mənə sən badəni gizlin vermə,
Gizlin işlərlə aram yox, saqi.

Hanı hal əhli ki, mən halə gəlim?
Nə "əleyküm", nə "salam" yox, saqi.

Hanı tar, harda qaval, yoxmu təbil?
Nə üçün dambadaram yox, saqi?

Qoy yığılsın yenə pərvanə bura,
Niyə yanmır, yenə şam yox, saqi.

Məqsədim təbimə verməkdir güc,
Məndə bir qeyri məram yox, saqi.

Nə gözəl kəlmədi "Eşq", ey Şahin,
Bu gözəllikdə kəlam yox, saqi!

*7.07.1998*

***

Kimdir o gedən, Ya Rəbb, cananə deyildirmi?
Mən tək o da dünyayə biganə deyildirmi?

Dünya bizi dərk etmir, bizlər isə dünyanı,
Könlüm bu səbəbdən də qəmxanə deyildirmi?

Məhbus isə - sultan da bir adi vətəndaşdır,
Azad isə - dərviş də şahanə deyildirmi?

Çox söylədilər "Məcnun", hər dəm dedilər "Leyli"...
Gerçəkmi o aşiqlər, əfsanə deyildirmi?

Meyxanə olub viran, abad olacaq bir gün,
Abad görünən məscid viranə deyildirmi?

Qış gəldi, çiçək soldu, bülbül səsini kəsdi,
Amma oxuyur Şahin, divanə deyildirmi?

*31.10.1998*

***

Padşahlər cahanə şahanə gəldi-getdi,
Dərvişlər neçin bəs biganə gəldi-getdi?

Mərdanəlikdən olmaz! Namərdliyə qələm çək!
Mərdanəlik sevənlər mərdanə gəldi-getdi.

Sönməkmi yox yanmada, getməkmi yox gəlmədə?
Hey şəm yandı-söndü, pərvanə gəldi-getdi.

Hal əhli çox göründü, qal əhli çox göründü -
İranə gəldi-getdi, Turanə gəldi-getdi.



Aləm görüb çox arif, arif görüb çox aləm,
Sabir tək bir arif Şirvanə gəldi, getdi.

Çox yanı qəbr edənlər, şeytanə səbr edənlər,
Dövranə cəbr edənlər dövranə gəldi-getdi.

Tarixdə qalmaq üçün tərk eylə əqli, Şahin,
Məcnuni an, cahanə divanə gəldi, getdi.

*19.11.1998*

***

Bu gecə sübhə qədər qoy oyaq olsun, saqi,
Çatladı kuzə, qədəh sındı, sağ olsun saqi.

Ehtiyacım işığa yox bu gecə, söndürdüm,
Üzü yanmaqda çıraq tək, çıraq olsun saqi.

Qapasın qoy gözünü sübh açılandan sonra,
Sübhəcən - xidməti məndən, qonaq olsun saqi.

Soyuğun təsiri olmaz cana bir zərrə belə,
Canı yandırsın, od olsun, ocaq olsun saqi.

Bu gecə fikrini məşğul eləsin sübhə kimi,
Bu gecə qeyri fikirdən uzaq olsun saqi.

Daha meyxanədə mey süzməsin, işdən çıxsın,
Nəzərimdə uca dağ boyda dağ olsun saqi.

"Saqinamə"m necə bitməz bu gecə, ey Şahin,
Mən olum, bir qələm olsun, varaq olsun, saqi!

*28.03.1999*

***

Saqi, gətir badəni, et yenə xürrəm məni,
Həm səni tərk eyləsin ahü fəğan həm məni.

Getməyimin vaxtıdır yer küräsindən daha,
Ah, çürütməkdədir göz yaşı hər dəm məni.

Mən ki, bu viranədə zülmü sitəm görmüşəm,
Qovlayacaq cənnətə görsə cəhənnəm məni.

Qeys idi, Fərhad idi, Nofəl idi... birbəbir
Gör necə tərk eylədi bir neçə həmdəm məni.

Sabirü Seyyid idi, bir də Füzuli babam...
Aləmi tərk etdilər, təklədi aləm məni.

Dərd məni əldən salır, qalx ayağa, saqiya,
Hardadı mey kuzəsi, məst elə möhkəm məni.

Başlayıram, Şahina, şövq ilə qatilliyə,
Mən qəmi öldürməsəm, öldürəcək qəm məni.

*Gəncə, 13.05.1999*

***

Qəm yükündən əyilən hambala heyfim gəldi,
Başı torpağə dəyir az qala, heyfim gəldi.

Müstəqillik qazanıb çox yeri qurban verdik,
Naşı əllərdəki istiqlala heyfim gəldi.

Mavi çox nəğməsini dinləmişəm illərlə,
Qurudubdur suyunu, Qudyala heyfim gəldi.

Ey gözəl, şeyxə de ki, saqqalını qırxdırsın,
O dodaqlar ki dəyir saqqala, heyfim gəldi.

Verdilər dərmanı Söhrabə öləndən sonra,
Nə qədər Söhraba, Rüstəm-Zala heyfim gəldi.

Adi quşdur səsi yoxdursa, a Şahin, bülbül,
O qəzəlxan ki dönübdür lala, heyfim gəldi.

*13.06.1999*

***

Düşdü sevdayə könül sirr dolu xülya qədəri,
Heç nə cəlb eyləməyir fikrimi sevda qədəri.

İki "Divan"ı bitirdim, yenə fikrim var ki,
Söz qoşum mən iki "Divan"dakı misra qədəri.

O qədər rəmzü müəmma demişəm bəlkə olar
Qoca dünyadə olan rəmzü müəmma qədəri.

Eşqi yoxdursa ürək bir tikə ət parçasıdır,
Eşqi vardırsa əgər qiyməti dünya qədəri.

Gözəlim, hörmətimiz var, bizi eşq əhli sevir -
Məni Məcnun qədərincə, səni Leyla qədəri.



Düşdü qovğayə vətəndaşlarımız, zənn edirəm
Heç nə bezdirməyəcəkdir məni qovğa qədəri.

Qələbəm naminə mey nuş eləmək istəyirəm,
Mey verin Şahinə olsun neçə dərya qədəri.

*30.06.1999*

Aşiqin yandı sənin eşqinə, dilbər, bişdi,
Göz yaşı cismini etmişdisə də tər, bişdi.

Zəri bir zərrə əritmək diləyin vardı sənin,
O təhər vurdun alov sən zərə ki, zər bişdi.

Al qanın istiliyi isti imiş məşəldən,
İsti qanlar axıdıb yerlərə xəncər bişdi.

Neçə qənbər götürüb düşmənə atmaq dilədim,
Ovcum içrə o qədər qaldı ki, qənbər bişdi.

Bilməyib dil dili rüsvay eləyir şairlər,
Nəzəri dəydi o şairlərə Ənvər* bişdi.

Yarımın nəqşini yonmaq dilədim mərmərdən,
Elə ki, dəycək əlim mərmərə mərmər bişdi.

Mənə eşq əhli səməndər demiş idi səhvən,
Nə səməndərdi bu Şahin ki, səməndər bişdi.

*9.09.1999*

***

Bu nə hicrandı yenə qəlbimi al qan elədi?
Heç nə etməzdi, yamanlıq mənə hicran elədi.

Görmüşük loğman edər cəhd azalsın ağrı,
Xəstəyə cövrü cəfanı elə loğman elədi.

Sıyrılıbdır daha sidqim o gözəl dilbərdən,
Gözləri xahiş edərdi, dili fərman elədi.

İstədim ah çəkim sinədən əfğan çıxdı,
Sordular: Kimdi bu qaplan təki əfğan elədi?

Ey deyən şor su cücərtməz gülü, səhvin vardır,
Göz yaşım düşdüyü torpağı gülüstan elədi.

* Ənvər Nəzərli

Gözəlim, indi müsəlmanlığına şübhəm var,
Kafər etməzdi bu zülmü ki, müsəlman elədi.

Düyməla köynəyini, eşqi unut, ey Şahin,
Məcnunu eşq qovub çöllərə üryan elədi.

*Lənkəran, 6.12.1999*

***

Dönməsəm kafərə hərgah Xumardan ötəri,
Dönərəm aşiqə mən doğma diyardan ötəri.

Yadıma xəzrisi düşdü Xəzərin qürbətdə,
Gözdə yaşlar giləlendi giləvardan ötəri.

Durna gördüm, qatarından aralı düşmüşdü,
Hey baxırdı göyə durna o qatardan ötəri.

Sidq ürəkdən səni sevdim, gözəlim, gəl yanıma,
Mənə baxma elə işvəylə kənardan, ötəri...

Əlimizdə qoşa zər, öndəsə sevda nərdi,
Getmədəydi ürəyim böylə qumardan ötəri.

Qovğa ölsün və məhəbbət əbədi ömr etsin!
Çox şüardan keçirəm mən bu şüardan ötəri.

Görəsən ləğvinə hərbin çıxacaqdırmı qərar?
Can fəda eyləyərəm mən o qərardan ötəri.

Həddini aşmaz ana, Yer anamızdır, Şahin,
Yerin övladı aşır həddini vardan ötəri.

*5.01.2000*

***

Olmazsa alan, zərin nə xeyri?
Zər yoxdusa, zərgərin nə xeyri?

Məzlum isə, millətin nə rəhni?
Zalim isə, rəhbərin nə xeyri?

Ağ etmə, xəcil olarsan, ey şeyx,
Ağsaqqala dilbərin nə xeyri?

Hal əhli içər behiştdə Zəmzəm,
Qal əhlinə Kövsərin nə xeyri?

Tuti, şəkərə yox ehtiyacım,
Dil baldısa, şəkkərin nə xeyri?



Təb var isə, xeyri var qədərsiz,
Təb yoxdusa, dəftərin nə xeyri?

Olmazsa gücün Şah İsmayıl tək,
Şahin, sənə xəncərin nə xeyri?

*2.02.2000*

***

Ey eşqə düşən qəlb, məhəbbət dəmi gəldi,
Bağban, qapını bağlama, işrət dəmi gəldi.

Səslər gülü gül, bülbülü bülbül yenə bağda,
Susmaq nə gərəkdir, axı söhbət dəmi gəldi.

Dər meyvə, gətir gül, çayı dəmlə, hələ getmə,
Sonra deyərəm mən sənə xəlvət dəmi gəldi.

Tənhalığa ziddəm deyə tənhalığı atdım,
Qəflət dəmi çox qalmadı, fürsət dəmi gəldi.

Hicran məni zar eyləmiş idi, sayıq oldum,
Qovdum qapıdan hicranı, cürət dəmi gəldi.

Gəldim dözümüm, əzmim ilə həsrətə qalib,
Bir dəm demirəm mən daha həsrət dəmi gəldi.

Şahlıq quşu qonmuş başıma, şahəm, a Şahin,
Dövlət qururam yar ilə, dövlət dəmi gəldi.

*4.02.2000*

***

Bu fələk gör neçə vaxtdır gətirib canə məni,
Gəh qoyur yurduma həsrət, gəhi cananə məni.

Aləmin hər dəmi başdan-başa ziddiyyətdir,
Bu təzad əvvəl-axır salmalıdır qanə məni.

Nə hicrdir bu ki, ovqatımı şənləndirmiş?
Nə vəsldir bu ki, salmış belə əfğanə məni?

Necə şaməm, yanıram heç kəsi yandırmayıram,
Yandırır atəşinə, bax işə, pərvanə məni.

Qəm gəlir, qüssə gəlir, ley sayağı dərd gəlir,
Çəkəcəklər bilirəm hər biri bir yanə məni.

Bağiban həm qudurubdur, nə ədəbsizlik bu,
Bülbüləm, qoymayır amma ki, gülüstanə məni.

Çöhrə solğun, saç uzun, hal pərişan, çılğın...
Bəs neçin zənn eləyən yox hələ divanə məni?

Gər cibim boşsa da, Şahin, qədəhim dopdoludur,
Bəsləyir gör necə gündüz-gecə meyxanə məni.

*8.03.2000*

***

İsbat elə gəl dürr ilə dürdanədə fərqi,
Mərd ilə, müəyyən elə, mərdanədə fərqi.

"Məstsən" dedi zahid mənə, vallah, gözü görmür
Görmürsə əgər məst ilə məstanədə fərqi.

Sən Məcnuna divanə deyirsənsə sübut et,
Bildir mənə aqil ilə divanədə fərqi.

Həm şəm yanır, həm də ki pərvanə, görürsən,
Mən görməyirəm şəm ilə pərvanədə fərqi.

Şevgim elə sabit ki, ayırd etməyirəm mən,
Ülviyyə ilə sevgili Şahanədə fərqi.

Cananəni sevməkdə biri, qeyrisi canı,
Aşiq, de görək can ilə cananədə fərqi.

Saqi, ver izn Şahinə qoy məscidə getsin,
İstər görə məscid ilə meyxanədə fərqi.

*Dərbənd, 22.03.2000*

***

"Aç dəftərini, şerini get yaz" demədinmi?
"Olmaq daha aşiq sənə olmaz" demədinmi?

Mən yadə salan dəm o ötən illəri hərdən,
"Etdin məni illərlə sərəfraz" demədinmi?

Sən söyləmədinmi bu qoca şairə möcüz?
Diqqət yetirib şerimə ecaz demədinmi?

Əfqan elinə mehrimi gördükdə tükənmir,
"Şahin quşu tək et yenə pərvaz" demədinmi?

Ey yar, elədin qeyz ilə əğyarı məzəmmət,
Çox söz ona layiq idi, sən az demədinmi?



Şer içrə alağ sözləri biçdim gecə-gündüz,
Şahin, qələmə şövq ilə dəryaz demədinmi?

*20.06.2000*

***

Vətənə qulluq edək sevgili canan təhəri,
Eləyək qupquru səhranı gülüstan təhəri.

Dişimiz, dırnağımızla qoruyaq torpağı,
Gərək olsun vətənin hər yeri meydan təhəri.

Qara işlər görən adəm qara gün görməlidir,
Sifəti qırmızı olmur nə üçün qan təhəri?

Əfqanıstanı da sevdim vətənim tək güclü,
Əfqanıstan yaralı Azəribaycan təhəri.

Dərdimə kimsə əlac eyləyə bilməz sən tək,
Səni zənn eyləyirəm mən mənə loğman təhəri.

Ömrümü bal kimi sənsən belə şirin eləyən,
Şəkərimsən, şəkərim, ol şəkəristan təhəri.

Şahinin bilməyəcəkdir dilini heç vədə
Bilməsə quş dilini yarı Süleyman təhəri.

*15.07.2000*

***

Aşiqəm, ey nazənin, bir cana mehman iki,
Bir özümün, bir sənin, məndə daha can iki.

Qulluq edib daima sən kimi, ey bağiban,
Bəsləyirəm mən də gül, bir bağa bağban iki.

Amma, mənim gülşənim həm də qəzəl gülşəni,
Səndə gülüstan bir, məndə gülüstan iki.

Ölkəm əzəl bir idi, indi iki parədir,
Azəribaycan iki, həm də ki, şeytan iki.

Şiə nədir, sünni nə, məzhəbi rədd etmişəm,
Hər günəhi bizdə ki, oldu müsəlman iki.

Söyləsən "öl" ölməmək aşiqə mümkün deyil,
Bircəsi bəsdir mənə, eyləmə fərman iki.

Olma pərişan, olum təkcə pərişan özüm,
Mən necə tab eylərəm olsa pərişan iki?

Bir - pərisi ilhamın, bir də özün, ey pəri,
Hər kəsə bir olsa da, Şahinə canan iki.

23.07.2000

***

Verdim ona mən gül, o gülüstan tələb etdi,
Mən zər boyun oldum, o isə can tələb etdi.

"Yox" kəlməsini dinləməyə hövsələ yoxdur,
"Qoç yoxdu" dedim, yar isə qurban tələb etdi.

Loğmanə dedim "ver mənə dərmanını eşqin",
"Yoxdur" dedi, loğman özü dərman tələb etdi.

Cəhl əhli cəhalət dilədi əhlinə daim,
Fəzl əhli təsəvvüf dedi, irfan tələb etdi.

İrfandə "canan" ilə "Allah" adı birdir,
Həqq əhli "Ənəlhəqq" deyə canan tələb etdi.

İnsanın əgər mənliyi, heysiyyəti varsa,
Müti dayana bilmədi, üsyan tələb etdi.

Kafərlərə çox tab edə bilməz qoca dünya,
Bir gün görəcəklər ki, müsəlman tələb etdi.

Eşqin çox imiş zilləti həzzindən, a Şahin,
Bir vəslə yetişmək neçə hicran tələb etdi.

23.08.2000

***

Ömrüm boyu fikrim nə zərə, zivərə getdi,
Amma ki, qələmdanə, kitab-dəftərə getdi.

Tərtərlə əlaqəm yaranıbdır neçə gündür,
Göz yaşıma bax, cari olub Tərtərə getdi.

Yoxsan deyə sən ağzımızın ləzzəti yoxdur,
Yoxdur o qutabın, nənəcan, düşbərə getdi.

Bilməm niyə hərbin qapısı bağlana bilmir,
Sərmayə topa, topxanaya, xəncərə getdi.

Yonmaz idi bilsəydi əgər Şirinə heykəl,
Güc-qüvvəsi Fərhad kişinin mərmərə getdi.



Ülviyyəti eşqin nə pozulmuş belə, Şahin,
Leylanı soruşdum, dedilər ki, ərə getdi.

27.09.2000

***

Ey ayüzlüm, sən təkin yoxsa əgər ayparəsi,
Aşiqin, vallahi ki, biçarəlikdir çarəsi.

Görməmişdim hicri mən, qapqarə zülfüm var idi,
Zülfümün qürbət diyar içrə ağarmış qarəsi.

Yağı düşmən qeyz ilən çatlatmaq istər bağrımı,
Düşmənin qoy öz başında partlasın qumbarəsi.

Seyrə çıxdım şəhrimi, "Fəvvarələr bağı"ndayam,
Sanki hər fəvvarə büllur göz yaşı fəvvarəsi.

Ey nigarım, ağrıdırsan, kipriyin ahəstə sıx,
Var sənin hər kipriyində qəlbimin bir parəsi.

Dərdlərim ulduz qədərdir, qum qədərdir qəmlərim,
Sinəm içrə qövr edir minlərlə cövrün yarəsi.

Şahina, sinnin olubdur altmış, dincəl bir az,
Ey qəzəl səhrasının ahu gəzən avarəsi.

13.12.2000

***

Məni eşq daima sən səmtə çəkər, boş yerəmi?
Gözəlim, öylə şirindirsə şəkər boş yerəmi?

Asimanı, yeri tənzim eləyən qüdrət var,
Gecə bihudə düşür ya ki səhər boş yerəmi?

Baxəbər eylədi Quran bizi üqbadən,
Bixəbər bilməyir amma ki xəbər boş yerəmi?

Bağiban söylədi gül qədrini bilmək lazım,
Bu hasar boş yerədirmi, o çəpər boş yerəmi?

O zamandan ki gedibsən, evimin boşluğu var,
At çapır dördnala boşluqda kədər, boş yerəmi?

Sən ki yoxsan neçə istək də yoxalmış kimidir,
Qanə dönmüşsə əgər canda ciyər boş yerəmi?

Qəlbimin gör nə qədər boşluğu var, ey Şahin,
Qəlbimin boşluğu, ey yar, məgər boş yerəmi?

*12.01.2001*

***

*Günbəgün dözülməz olur həyatım...*

Səhv eyləmişəm mən necə!.. Yarım bu deyildi,
Aldanmışam eyvah, nigarım bu deyildi.

İlk eşqə yetən kəs görəsən varmı, İlahi,
Sınmaqda budağım ki, çinarım bu deyildi.

Ən varlı adamdım, varı sevdadə görürdüm,
Dürdanəli, mirvarili varım bu deyildi.

Cananıma can içrə olan köz kömür oldu,
Bilsin bunu aləm ki, qərarım bu deyildi.

Daş başıma düşsün ki, Şirin olmadı yarım,
Kül başıma olsun ki, Xumarım bu deyildi.

Gəlmiş qocalıq, var əbədi sevgiyə şəkkim,
Billah, cavanlıqda şüarım bu deyildi.

Söz yox ki, "keçən keçdi, olan oldu" deyiblər,
Ömrün gülü solmaqda, baharım bu deyildi.

Neynim ki, məhəbbət deyilən çalğını, Şahin,
Ömrüm boyu çaldımsa da, tarım bu deyildi.

*18.02.2001*

***

Deməsinlər ki nədir yar ilə yarın fərqi?!
Bəllidir tarzənə tar ilə tarın fərqi.

Doğrudur, hər biri canana olubdur, lakin,
Bilməyir kim nədi Xummarla Nigarın fərqi?

Əfqanıstan da diyar, Azəribaycan da diyar,
Bəllidir yaxşı vətəndaşə diyarın fərqi.

Vəsl hər vədə cavanlıqda nübarımdı mənim,
Qocalıq yetdi, bilinməkdə nübarın fərqi.

Hanı Göyçay çinarı verə ilham mənə?
Qəddimi əydi bu qürbətdə çinarın fərqi.



Çəkməyən eşq qübarın və vətən nisgilini,
Necə bilsin nədi nisgillə qübarın fərqi?

Gecələr yastığı mən çəkmədəyəm ağuşə,
Od vurur Şahinə yastıq ilə yarın fərqi.

*Lənkəran,21.03.2001*

***

Gözümə bir neçə qəm-qüssəli dəm görsəndi,
Anamın surəti canlandı, dədəm görsəndi.

Babamın saqqalı qardan da bəyaz, böyründə
Gülərüz bir qarı görsəndi - nənəm görsəndi.

Gözümə dəydi kəfənlərdə Züleyxa, Leyli,
Nə hərəmxanə göründü, nə hərəm görsəndi.

Gördüm öldürmədə cahilləri Şeyx Nəsrullah,
Kefli İsgəndərə baxdım yenə dəm görsəndi.

Nə bu gün gözlərimi oxşadı gülzar mənim,
Nə mənim gözlərimə indi sənəm görsəndi.

Üç cavan qardaş itirdim, mənə zülm etdi fələk,
Gözlərim yaş tökəcək sel kimi, nəm görsəndi.

Ulu aşiqləri gördüm ölü, Şahin, gözümə
Yenə Fərhad ilə Qeys dəydi, Kərəm görsəndi.

*21.04.2001*

***

Tək vəslmiş, sevgilim, aləmdə hicran çarəsi,
Təsir etmir dərdimə bir zərrə dərman çarəsi.

Çarə çox var, heç birindən dərdimə yetmir şəfa,
Qismət olsun aşiqə hər vədə canan çarəsi.

Olsa çarəm qoymaram qalsın qəfəslərdən nişan,
Bülbülə hər vədə lazımdır gülüstan çarəsi.

Mən ki pakəm, pak adamlar qoy yetirsin çarəmi,
Amma yetsin şeytana hər yanda şeytan çarəsi.

Yağının illərlə dözdük məkrinə, bəsdir daha,
Mərmidir, topdur, tüfəngdir indi meydan çarəsi.

Çoxdu sinnim, hərbə qoymurlar gedim, qanım ki var,
Qan çəkənlər, hazıram göstərməyə qan çarəsi.

Əlbir olmaq, dilbir olmaq çarədir hər bir qəmə,
Varmı kafər çarəsi, yoxmu müsəlman çarəsi?

Qismət eylə Şahinə cənnətdə həm öz yarını,
Allahım, vacibmi hökmən huri-qılman çarəsi?

*20.04.2001*

***

Çəkirəm qoynuma dərdi, kədəri yar kimi,
Yığıram qəm yükünü qəlb evimə var kimi.

Yox ikən az da günahın səni mən incitdim,
Baxıram sən tərəfə indi günahkar kimi.

Başımı tənə qılıncıyla yarır yoldaşlar,
Yeridirlər mənə eyhamı zəhrmar kimi.

Acı sözlər ki deyirlər məni tənqid eləyib,
Yeriyir beynimə düz hər biri mismar kimi.

Sadiqəm mən yenə, bilsin bunu qoy bilməzlər,
Sanmasınlar məni bir zərrə də əğyar kimi.

Fikrimi cəlb eləmir bağ da səndən sonra,
Dağ çəkmir məni gülzarü çəmənzar kimi.

Günlərim qapqara olmuşsa qara zülfün tək,
Saçlarım oldu ağappaq, gözəlim, qar kimi.

Olmuşam, Şahina, bədbin, hanı oynaq qəzəlim?
Elə dınqıldayıram indi sınıq tar kimi.

*Lənkəran, 25.04.2001*

***

Kim çəkirsə gər fəna aləmdə dünya dərdini,
Ya onu tərk eyləmiş olsun gərək, ya dərdini.

Mən bu dövrün oxşayan göz surətindən bezmişəm,
Dərd çəkir könlüm mənim, çəkməkdə məna dərdini.

Cəng odunda, qovğa cəngində bələnsin dərdinə,
Kim bizə peyvənd edibsə cəngü qovğa dərdini.



Can verirdi bir qərib durna köçündən gen düşüb,
Çəkmiş oldum mən Herat şəhrində durna dərdini.

Saqi də gördüm ki məstdir, molla da məst, bilmirəm
Saqinin dərdin çəkim mən yoxsa molla dərdini?

Mən də olmaq istərəm divanə aşiq, çünki Qeys
Verdi əldən əqlini çəkməklə Leyla dərdini.

"Məxzənül-əsrar"lər, "Şahnamə"lər vardır yazan,
Şahin isə eyləyib yük qəlbə misra dərdini.

*6.05.2001*

***

*Tarzən Vamiq Məmmədəliyevə*

Elə ki, tarzənim tarını dilləndirdi,
Sanki yar həsrət ilə yarını dilləndirdi.

Sirrini açmağa cəhd etdi muğamatımızın,
Avazın yüz cürə əsrarını dilləndirdi.

Tarı inkar eləyən kəsləri kəsdi sim ilə,
Təsdiqin şövq ilə inkarını dilləndirdi.

Tarçalanlar neçə əhsən dedilər yer-yerdən,
Seyr edin, gör neçə həmkarını dilləndirdi.

Dinləyin, gəlmədə səs bir neçə qəbristandan,
Qəbrdə Xanını, Cabbarını dilləndirdi.

Şahina, sadəcə tar çalmadı Vamiq xəlqə,
Xəlqimin mənəvi bir varını dilləndirdi.

*25.07.2001*

***

Əlindən öylə ki, tutdum, əlin çəkdi, nigar əsdi,
Elə zənn eylədim tərpəndi aləm, ruzigar əsdi.

Dəyərsiz bir adam gördüm çinarə balta çalmışdı,
Halım pəjmürdəhal oldu bu halətdən, çinar əsdi.

Herat içrə qərib bir durna gördüm qanə qərq idi,
Həmin durna qatarından kənar olcaq qatar əsdi.

Rəzil bir qonşu çoxdandır tutub torpağımı nahəqq,
Koroğlu öylə paslatdı qılıncın ki, Nigar əsdi.

Bu dünya xəlq olan gündən bəri çox-çox külək coşmuş,
Qəfildən bir külək tufan qopardı laləzar əsdi.

O Şura dövləti ki, baş qoparmış, qan axıtmışdı,
Cırıldı qırmızı bayraqları, min-min şüar əsdi.

Cavanlar, gül dərin, amma, amandır, sınmasın bağban,
O dəm ki, bağiban sındı, çəpər sındı, hasar əsdi.

Bu şair öylə narahət adamdır ki, dəfn vaxtı
Deyərlər: Şahini dəfn eylədik, amma məzar əsdi.

*8.08.2001*

***

Bir gül yaradıb bir neçə bağ saldı Nizami,
Bir "Xəmsə" yazıb, ölsə də, sağ qaldı Nizami.

Türkün dili fəxr olmamış ikən hələ şerə,
"Fars" adlı dilin həzzinə hey daldı Nizami.

Kam aldı fələkdən yazıban "Məxzənül-əsrar",
Sirr məxzənini açdı və kam aldı Nizami.

Fəxr eylədi Qafqaz ilə, Arran ilə daim,
Şirvan elinə şövq ilə əl çaldı Nizami.

Gizlin ki deyil, eylədi şirvanşaha xidmət,
Amma nə boyun bükdü, nə alçaldı Nizami.

İlham alıban canlar alan yeddi gözəldən,
Tunc olsa da, bir mum kimi yumşaldı Nizami.

Şahin oxuyub "Xəmsə"ni ilham ilə dindi:
Bir "Xəmsə" yazıb, ölsə də, sağ qaldı Nizami.

*22.08.2001*

***

Bir əlac eyləmədi, loğmanı qovdum getdi,
Geriyə dönməyəcəkdir, hanı, qovdum getdi.

Hər zərif xilqəti hifz eyləməyim məlumdur,
Ahuya zülm eləyən ceyranı qovdum getdi.



Bağibandır bağı bağ eyləyən aləmdə fəqət,
Bağı dağ eyləyən ol bağbanı qovdum getdi.

Nə olub kafərə aşiq, nə geyib zünnarı,
Qeysi təbliğ edibən, Sənanı qovdum getdi.

İki xilqət mənə röyadə qonaq gəlmişdi,
Hurini saxlayaraq qılmanı qovdum getdi.

Dedilər həcv eləmirsən daha hicranı, dedim
Elə mən birkərəlik hicranı qovdum getdi.

Qoymaram şerimə yad istilahı mən yaxına,
"Qəbqəb"i * rədd elədim, "müjkan"ı ** qovdum getdi.

Canı hər ləhzə cəfa üzdüsə, can üzdü məni,
Şahinəm, təngə gəlib mən canı qovdum getdi.

*26.08.2001*

***

Aşiqin eşqi coşubdur, yeni dövran gəldi,
Demirəm bir daha "gün gəldi, pərişan gəldi".

Leylican, gözlərin aydın ki, sənin Məcnunin
Gəzib illər boyu çox bərrü biyaban, gəldi.

Gəl ki, Şah İsmayılam mən, gücümü, qüvvətimi
Ey Ərəbzəngi, sübut etməyə meydan gəldi.

Canımın qalmasına zərrə gümanım yoxdu,
Mən ki cananımı gördüm canıma can gəldi.

Vəsli pişvaz eləyib boğmalayaq hicranı,
Deməyək bir də "vüsal öldü və hicran gəldi".

Dil şəkər, kəlmə şəkər, busə şəkərdir, Şahin,
Bu gələn yar deyildir, şəkəristan gəldi.

*30.08.2001*

***

Gəldi insan aləmə ovqatı çağ olmuş kimi,
Aləmi tərk eylədi beş gün qonaq olmuş kimi.

---

* Qəbqəb - buxaq (farsca)

** Müjkan - kipriklər (farsca)

Göz deyimmi mən gözə, ya göz demək mümkün deyil,
Ağlamaqdan gözlərim, Yarəb, bulaq olmuş kimi.

Çəkmişəm zillət düşüb hicranə, amma bir çoxu
Qürbəti yad eyləməkdə təmtəraq olmuş kimi.

Gün batıb, ay çıxmayıb, ulduz sönübdür şəm yox,
Yanmada gül surətin amma çıraq olmuş kimi.

Çöhrələr ənliksiz olsun, çöhrələr kirşansız,
Mən sifət görməkdəyəm hərdən suvağ olmuş kimi.

Dağçapan ahəstə vursun qoy külüngün dağdə,
Sızlayır şirin canım hər ləhzə dağ olmuş kimi.

Bir görünməz kəndir ilən yarıma bağlanmışam,
Bağlıdır yarım mənə hər dəm calağ olmuş kimi.

Çən qucubdur dörd tərəfdən dağların şah dağını,
Şahdağımdan sallanıbdır çən duvağ olmuş kimi.

Qoy şer gülzarı hifz olsun yabançı kəlmədən,
Əcnəbi hər söz o bağ içrə alağ olmuş kimi.

Olsa yox bir gün bu şair şeri var eylər onu,
Yad edərlər Şahini hər vədə sağ olmuş kimi.

*15.09.2001*

***

Göndərmədi loğman onu dərman özü gəldi,
Mən "gəl" demədim, mənzilə canan özü gəldi.

Açdı qapımı yoxsa o, sevda açarıyla?
Qalmışdı bayırda, içəri can özü gəldi.

Getmişdi, fərar etmiş idi öz vətənindən,
Qürbətdə idi, mülkə Süleyman özü gəldi.

Gülxanəmə yol yox evimin künc-bucağından,
Girdi bacadan yoxsa o bağban, özü gəldi.

Qəti əmin idim buna: gəlməz cana bir də,
Donmuşdu damar içrə, cana qan özü gəldi.



Var idi tərəddüd ki, qayıtmaz geri bir də,
İmkanə tamarzı kəsə imkan özü gəldi.

Şahin, qapı da bağlı idi, pəncərələr də,
Bilməm ki, hayandan içəri can özü gəldi.

*17.02.2002*

***

Eyvah, xumarım niyə Gürcüstana getdi?
Od vurdu təlatümdə olan bir cana, getdi.

Getdi, bu diyar içrə məgər yer qəhət idi?
Başdan-başa dönməkdə ciyər al-qana, getdi.

Bezmişdimi, Yarəb, o xumarım bu şəhərdən?
Tərk etdi şəhər mülkünü kəndistana getdi.

Bilmirmi günüm ahü fəğan olmada onsuz?
İnsan nə üçün zülm eləyir insana, getdi.

Hicran isə tuş eylədi ox səmtimə, amma
Heyfa, mənə sancılmadı oxlar, yana getdi.

Yarım dönəcək yanıma əlbət bu yaxında,
Xürrəm gələcəkdir necə ki, şadyana getdi.

Şahin soruşur tuti kimi hey öz-özündən:
Eyvah, xumarım niyə Gürcüstana getdi?

*25.02.2002*

***

Sənə dayə gəlimmi, gəlməyimmi?
Bu sevdayə gəlimmi, gəlməyimmi?

Mənə Xummar "Sənanım" deyəndə
Kəlisayə gəlimmi, gəlməyimmi?

Nədir mətləb, nədir niyyət, nədir qəsd?
Nədir qayə? Gəlimmi, gəlməyimmi?

Gülüm, min bir dilək vardır könüldə,
Təmənnayə gəlimmi, gəlməyimmi?

Xəyalım ki, var idi, yoxdur indi,
O xülyayə gəlimmi, gəlməyimmi?

Önümdən gər Araz tək çay axarsa
Həmin çayə gəlimmi, gəlməyimmi?

Dedim Şahin ölür, dilləndi dilbər:
- Təmaşayə gəlimmi, gəlməyimmi?

*2.05.2002*

***

Qəzəlim çox suala indi cavab olsun qoy,
Haqlıyam, yoxsa ki haqsızmı, hesab olsun qoy.

Niyə mən əcnəbi sözdən qaçıram hər vədə?
Kitabım doğma kəlam ilə kitab olsun qoy!

Nə üçün bir bu qədər həcv edirəm əğyarı?
Ev yıxan kəs, deyirəm, xanəxərab olsun qoy!

Niyə bəs dilbəri tənqid edirəm hərdənbir?
Sözlərində acılıq varsa, gülab olsun qoy!

Etmirəm bəs niyə qal əhlini biryolluq lal?
Deyirəm bəlkə düzəldi, mənə bab olsun qoy!

Cahilin cəhli hara, mən hara? Elm öyrənsin,
Eşidib tənəmi qəlbində əzab olsun qoy.

Niyə "həzrət" demirəm heç kəsə mən aləmdə?
Mənə həzrət bu cənab yox, o cənab olsun qoy!

Əməli saleh adam varmı günəhdən xali?
Əməlimdə yenə hər vədə savab olsun qoy!

Daş atıb qeyz ilə meyxanəyə Şahin dedi ki,
Daha meyxanəçinin mülkü xərab olsun qoy!

*1.09.1997*

***

*Həmişə diri Üzeyir bəy Hacıbəyliyə*

Tək, sanma, muğam mülkünə memar Üzeyir bəy,
Çox sənətə qabil idi hüşyar Üzeyir bəy.

Yazdıqları bol, yazmaya bilməzdi o dahi,
El dərdinə olmuşdu giriftar Üzeyir bəy.

Heyran idi arifliyə, aşiqliyə daim,
Ariflərə, aşiqlərə sərdar Üzeyir bəy.



Gəh tar ilə, gəh səhnə ilə, gah qələmlə
Qəlbindəkini eylədi izhar Üzeyir bəy.

"Arşın mal alan", "Əsli Kərəm" dərdinə qəmxar,
Leyla ilə Məcnun qəminə yar Üzeyir bəy.

Hal əhlini hali edə bilmişdi halından,
Zövq əhlinə hər sahədə meyar Üzeyir bəy.

"Hər sahədə olsun, - dedi, - ölkəmdə tərəqqi",
Fikrində müdam eylədi israr Üzeyir bəy.

Musiqimizi öylə ucaldıb yer üzündə,
Hər qəlbdə, Şahin, həmişə var Üzeyir bəy.

*27.12.1999*

***

Edibdir öylə məstanə bu üzgün canı göyçəklik,
Çəkir məntək gülüstanə bugün cananı göyçəklik.

Mənim aşiq xəyalım zövq alır daim gözəllikdən,
Dəmadəm artırır eşq əhlinə imkanı göyçəklik.

Mənimtək xəstəyə mərhəm deyildir, həb deyil çarə,
Bilir loğman əzəldən dərdimin dərmanı - göyçəklik.

Qovaq bağbanı bir günlük ki, heç kim olmasın mane,
Nigarım, bir sən ol, bir mən, budur xudmani göyçəklik.

Əgər qan tökməyə olsa həris qanlar tökər, amma,
Gözəl canan önündə süst edər sultanı göyçəklik.

Gözüm seyr eyləməkdən doymayır dünyanı bir ləhzə,
Bizə bəxş eyləmiş Allahımız məccani göyçəklik.

Dəruni saflığın, göyçəkliyin müştağı oldum mən,
Ürək göyçəksə adəmdə, nədir cismani göyçəklik.

Bu göyçəklik nə göyçək ruhimi oxşar bu gün, Şahin,
Mənəm ruhani gülşəndə gəzən irfani göyçəklik.

*5.11.1995*

***

Bizə əzab verənə biz əzab verməliyik,
Kim iztirab verə iztirab verməliyik.

Bəşər yorulmadımı inqilab görməkdən?
Neçin yenə bəşərə inqilab verməliyik?

Bizə kitab əvəzi top-tüfəng lazımmı?
Bizə silah əvəzi biz kitab verməliyik.

Edib nahaq əməli haqqı danmayaq, bir gün
Hesab istəyənə biz hesab verməliyik.

Acıqla gül qıranın əlləri qırılsın kaş,
Gülü gülab eləyib biz gülab verməliyik.

Yoruldu saqi bizə hey şərab verməkdən,
Biz indi saqiyə hərdən şərab verməliyik.

Çalış ki, etməyəsən bir günah aləmdə,
Qiyamətin günü, Şahin, cavab verməliyik.

*1.03.1996*

***

Məstə mey, bülbülə gül, aşiqə canənə gərək,
Bunların hər üçü birlikdə bu nalanə gərək.

Sənin hicrində səmimi neçə məktub yazdım,
Yazasan sən də səmimanə-səmimanə gərək.

Neçə biganə kəsin mən dəxi biganəsiyəm,
Sənə biganə olanlar mənə biganə gərək.

Canlı gülsən, gəzişirsən bu gülüstan içrə,
Baxmayım bir daha mən nərgizə, reyhanə gərək.

Nanə ətriylə nahaqdan bu qədər qürrələnir,
Zülfünün ətrinə aludə ola nanə gərək.

Nofəl öz mərdliyi ilə yaşayır qəlbimdə,
Dedilər sən kimi mərdanəyə mərdanə gərək.

Neçə aqil kəsi təqdim elədik Leylayə,
Dedi aqil sizin olsun, mənə divanə gərək.

Sözlər uçmaqdadı pərvanə kimi beynimdə,
Təbimin şəminə gündüz-gecə pərvanə gərək.



Görəsən mən nə üçün yanmamışam indiyəcən?
Şahinəm, mən kimi aşiq alışıb-yanə gərək.

*18.09.1996*

***

Gözəlim, fəxr edirəm mən yenə, sevda göyçək,
Səndə - göyçəksə meyl, məndə - təmənna göyçək.

Həmi surət, həmi məna məni cəlb eyləmədə,
Həmi surət ola göyçək, həmi məna göyçək.

Ey bəşər, qərq eləyirsən niyə çirkabə yeri?
Sən kəsif eyləməsən gər suyu, dərya göyçək.

Demə səhradə gözəllik görə bilmirsən sən,
Məcnunu yadə gətir, bil necə səhra göyçək.

Sən bilirsən, gözəlim, xoşlamıram xülyanı,
Oldu sən xatirə düşdün deyə xülya göyçək.

Buğda almaq diləyim var, onu sat, mən də alım,
Əkilibdir üzünə, ey pəri, buğda göyçək.

Dilimiz gül kimi göyçəkdi bu gün, ey Şahin,
Elə söz düz ki, ola şerdə misra göyçək.

*30.11.1997*

***

Hər ilin qədrini bil sən, hələ çox il gələcək,
Oturub gözləmə göydən yerə zənbil gələcək.

Ömrümüz çay kimi axmaqda təlatümlə yenə,
Hələ çox sellənəcək su, hələ çox gil gələcək.

Əvəz etdikcə nəsil karivanı bir-birini,
Neçə cahil gedəcəkdir, neçə aqil gələcək.

Müşkülün əvvəlidir, ey gözəlim, hicranın,
Kim bilir qarşıya hər gün neçə müşkül gələcək.

Bir gözündə məni qoy, başqa gözündə bir tel,
Tərəzi düzdüsə, vəznim yenə yüngül gələcək.

Mən şirin dillə yenə tutini dilləndirirəm,
Acı olsun nə təhər dil, o şirindil gələcək.

Qarğalar tərk edəcək gülşəni qar-qar eləyib,
Başlayıb cəhcəhinə şövq ilə bülbül gələcək.

Neçə gündür yenə bağdan çıxa bilmir Şahin,
Tapdayıb gülləri naz ilə bağa gül gələcək!

*1.01.1998*

***

Deməsinlər! Mənə Məcnun, sənə Leyla nə demək?
Şəhərin sakiniyəm mən, mənə səhra nə demək?

Görməyəndə səni gündüz yata bilməm gecə mən,
Səni görmürsə, əzizim, gözə röya nə demək?

Sən də sülh arzulayırsan gecə-gündüz mən də,
Sənə qovğa nə deməkdir, mənə dəva nə demək?

İstəyirsən yenə həlva çalasan, ey dilbər,
Elə şirin danışırsan daha həlva nə demək?

Elə şair görürəm təbi təəccüb doğurur,
Ayda - bir, həftədə - bir bir neçə misra nə demək?

Ey gözəllər, qocalardan soruşun eşq nədir?
Cavan aşiq nə bilir eşq nə, sevda nə demək.

Nə şərab istəyirəm mən, nə kabab, ey Şahin,
Yar olan yerdə mənə qeyri təmənna nə demək?

*24.11.1998*

***

Faş elə, kim sındırıbdır qəlbini qəddar tək?
Ver icazə eyləyim təmir onu memar tək.

Aşiqin imkanı yoxdur çox təəssüf şah kimi
Eyləyərdim yoxsa hər səhranı mən gülzar tək.

Eşqdə gər var isə cüzi təmənna, dön geri,
Baxmışam, billəh, o cür sevdayə istismar tək.

Ülvi eşqi mən də təsdiq etmişəm aşiq kimi,
Təsdiqim bəzən görünmüşdür mənim inkar tək.



Əvvəl-axır eylərəm təsir sənin həm kəllənə,
Yumruğum, cahil, çəkicdir, sözlərim mismar tək.

Başımı sevda xərab etmişmi, Şahin, istərəm
Fırlanım hər dəm nigarın başına pərgar tək.

*10.12.1999*

***

Paltar geyinibsən təzə, ey yar, mübarək,
Olsun geyiminlə neçə paltar mübarək.

Sönməkdə ikən şəm kimi eşqim, əzizim,
Etdin qocanı eşqə giriftar, mübarək.

Oldum mən əmin ki, mənə nazdan yan olubsan,
Yan olma vəfadən, a vəfadar, mübarək.

Susmuşdu dilim dilsiz adamlar kimi qəti,
Etdin dilimi sən yenə pərgar, mübarək.

Pak eşqi düşüb şübhəyə inkar eləyən var,
İsrar elədin eşqdə, israr mübarək.

İqbalımız, ey sevdiciyim, tazə alovla
Yanmış təzədən gün kimi par-par, mübarək.

Ey Tanrı, ağarmış günü Şahin qarabəxtin,
Qarə saçımı rənglədiyin qar mübarək.

*25.06.2000*

***

*Təqlidçi qəzəlxanlar mənim onlara iradıma qarşı deyirlər ki, klassik şairlərimiz ərəb-fars sözləri və izafət tərkiblərindən gen-bol istifadə etmişlər və biz də onların yolunu gedirik. Həmin qəzəlxanlara deyirəm: Məgər indiki rəssamlar qulağının birini kəsən Van Qoqa bənzəmək naminə öz qulaqlarını kəsməlidirlərmi?*

Daima təqlidə ağ olmaq gərək,
Yamsılamaqdan uzaq olmaq gərək.

Şəminə göz dikməməli kimsənin,
Cəhd eləyib çilçıraq olmaq gərək.

"Urma o zülfi-siyəhə şanəni" *,
Böylə deyimdən iraq olmaq gərək.

---

* Misra Mirzə Ələsgər Növrəsindir (XIX əsr).

Neyləyirəm çay ki, bulanlıqlaşıb,
Saf, suyu şəffaf bulaq olmaq gərək.

Ey qələmim, yad sözü hiddətlə döy,
Lazım olarsa çomaq olmaq gərək.

Azəribaycan dili büllur olur,
Düşməni çoxdur, oyaq olmaq gərək.

Xəlqi şer saxlayacaq sağ bizi,
Şahina, ölsək də, sağ olmaq gərək!

***

Bu qəzəlxan hələ çox şeri əyan eyləyəcək,
Qələmin sirrini illərlə bəyan eyləyəcək.

Sevginin faidəsindən çox ədiblər yazmış,
Sevgisizdirsə əgər qəlb ziyan eyləyəcək.

Yaşım artırsa da yaş çoxluğuna laqeydəm,
Saf məhəbbət məni hər yaşda cavan eyləyəcək.

Sınayıb sevgini illərlə inandım möhkəm
Nə qədər müşkili aləmdə asan eyləyəcək.

Əbədi həkk olunub yaddaşa əfqan yurdu,
O gözəl yer görəsən çoxmu fəğan eyləyəcək?

Qarabağ məsələsindən ürəyim dinc olmur,
Erməni çoxmu o torpaqda məkan eyləyəcək?

Var, güman etməliyəm, mən yenə qürbətdə məkan,
Halımı bir dəxi qürbət nigəran eyləyəcək.

Eybi yox, Şahina, düşsəm vətənimdən aralı,
Yenə təb ayrılığı güllələbaran eyləyəcək.

*17.03.2001*

***

Eyvah, acı "rüzgar" ilə qar oldu həmahəng,
Bəh-bəh ki, "nigar" ilə "xumar" oldu həmahəng.



Avazına, şəşlənməsinə, sehrinə rəğmən
Əlbəttə ki, "tar" ilə "setar" oldu həmahəng.

Xar ilə çinarın, bilirik fərqi böyükdür,
Əfsus ki, "xar" ilə "çinar" oldu həmahəng.

Barmaqda qabar var deyə qəlb içrə qübar var,
Ey qəlb, "qabar" ilə "qübar" oldu həmahəng.

Zar olma, yetər yoxsa azar ilə məzarın,
"Zar" ilə, "azar" ilə, "məzar" oldu həmahəng.

Bilməm ki, təsadüfmü, qəza təqdiridirmi
"Şonqar" ilə, "sar" ilə "şikar" oldu həmahəng.

Şahin, yenə "yar" ilə "bahar" qafiyələndi,
Şadəm, yenə "yar" ilə "bahar" oldu həmahəng.

*13.03.1997*

***

Bağiban, lalə, sənubər görünür rəngarəng,
Lütf elə, yarıma gül dər, görünür rəngarəng.

Yenə ağ köksünə düşmüş qara zülfün göyçək,
Gözəlim, bəh yenə mərmər görünür rəngarəng.

Dodağın rəngi keçibdir yenə şəkkər dişinə,
Təzədən gözlərə şəkkər görünür rəngarəng.

Yuxu gördüm, yenə röyaya şəhidlər girdi,
İraq olsun, yenə səngər görünür rəngarəng.

Yenə dillərdəki "Vur! Doğra! Şığı!" kəlmələri,
Yenə əllərdəki xəncər görünür rəngarəng.

Bizi haldan çıxarıbdır Qarabağ faciəsi,
Atılan üstümüzə şər görünür rəngarəng.

Neçə ildir ki, Fələstin gözə rəngin görünür,
Çeçenistandakı məhşər görünür rəngarəng.

Minbərə ləzgi, ərəb, türk, gilək, fars çıxır,
Dəyməsin göz, yenə minbər görünür rəngarəng.

Qəzəliyyat, sürud, nət, minacat yazdım,
Barəkallah ki, dəftər görünür rəngarəng.

Şeri mən qan-tər içində yazıram, ey Şahin,
Dəftərə damcılanan tər görünür rəngarəng.

17.05.1997

***

Aşiqi şair edər olsa əgər yar qəşəng,
Bülbül uçmaz qırağa olsa çəmənzar qəşəng.

İsti kəlməmlə əritdim necə donmuş qəlbi,
İsti gün çıxmasa hərgəh əriməz qar qəşəng.

Çəkirəm sözlərimə şövq ilə mənа çəkici,
Hədəfə çatmayacaq olmasa mismar qəşəng.

O təhər bəxş eləyirsən mənə ilham, ey gül,
Edirəm fikrimi gündən-günə izhar qəşəng.

Olar aşiq günü günlərlə qəşəng, əlbəttə,
Olsa hərgah onun sevdiyi dildar qəşəng.

Səni rəssam təki vəsf eyləyirəm, məlum ki,
Rəssamın yaxşısa şəklin sənə oxşar qəşəng.

Dedi: - Şahin, aradım səy ilə, səndən qeyri
Harda var indi qəzəl mülkünə memar qəşəng?

3.03.2001

***

Eşqimiz tək, gözəlim, gün belə parlaq deyil,
Çox təəssüf ki, günü hər sevənin ağ deyil.

Çox şeyi bilməməyin bəllisə də, ey ağyar,
Bunu sən bilməlisən: Sevgi oyuncaq deyil!

Tab edə bilməyəcəksən o məhəbbət dağına,
Çəkə bilməzsən onu, sən bacaran dağ deyil.

Danışırsan, gözəlim, sən necə şirin-şirin,
Bu şirinlikdə nə baldır, nə də qaymağ deyil..

Geymisən əyninə ismətlə sədaqətdən don,
Kim geyinmişsə sədaqət donu çılpaq deyil.

İstərəm bəxş eləyim mən sənə göyqurşağını,
Söyləyər kim mənə göy qurşağı qurşağ deyil.



Sönsə qəlbində məhəbbət alovu bir ləhzə,
Görəcəklər ki, bu Şahin ölüdür, sağ deyil.

29.11.1995

***

Canı hicr atəşi yandırmasa hicran deyil,
Ya, əgər dözməsə can hicr oduna, can deyil.

Saf məhəbbətdi dolub cismimə dövran eləyir,
Bədənim içrə mənim dövr eləyən qan deyil.

Aşiqin sən eləyən zülmə, gülüm, şad olmuş,
Görübən cövrünü, bir zərrə pərişan deyil.

Unudubsansa əgər yarını dəhşətdir bu,
Yardən ayrı düşübsənsə, bu hicran deyil.

Çəksələr cismini Mənsur kimi darə belə,
Etiqad əhli müsəlmansa, peşiman deyil.

Müslimin etiqadı olmalıdır Qurana,
Məncə, hər sünnət olan bəndə müsəlman deyil.

Gözəlim, səbr edirəm mən dəxi Eyyub kimi,
Yad olan hövsələyə, taqətə - insan deyil.

Gülməsin Şahini üryan görən sahildə,
Kim səbr köynəyi geymişsə, o üryan deyil.

25.12.1995

***

Aləmimdən mənim aləm ki xəbərdar deyil,
Nə bilir dərdimi, dərdim ona izhar deyil.

Gecə-gündüz içirəm mən meyi - irfan meyini,
Axı, irfan meyi şərbətdi, zəhrmar deyil.

"Eşq vardır" demişəm, eyləmə inkar, ey şeyx,
Eşqi təsdiq edənin təsdiqi inkar deyil.

Sağlam olsaydı başın aşiq olardın çoxdan,
Eşqə başdanxarab ancaq giriftar deyil.

Eşqdir, sevgi, məhəbbətdi bu gün meyarım,
Başqa meyar daha mən aşiqə meyar deyil.

Mənəvi var yoxundursa sənin, ey varlı,
Yığdığın var ki var, yox kimidir, var deyil.

Bir ərəb aşiq olub bir qıza məşhur olmuş,
Niyə bəs Şahinin eşqi cahana car deyil?

*10.03.1996*

***

Məni müştaq eləyibdir özünə tər bir gül,
Bəlkə cənnətdə də yoxdur sənə bənzər bir gül.

Çox gözəl var ki, gül olmaq diləyir, bilmir ki,
Yetə bilməz sənə, ey gülbənizim, hər bir gül.

Gülü Şirindi, yonubmuş onu Fərhad daşdan,
Mənsə yondum sənə layiq ola - mərmər bir gül.

Hər sözün zər kimi qiymətlidi, zər tək göyçək,
Zərgərəm mən ki, düşübdür əlimə zər bir gül.

Bülbül oldum sənə mən Eşq gülüstanında,
Hansı gülşəndəsə "Bülbül!.." deyə göynər bir gül.

Arabir sən məni eyhamın ilə sancırsan,
O zaman söyləyirəm mən sənə "neştər bir gül".

Gözəlim, Şahinə məlum ki, gülü qoxlarlar,
Mənsə daddım səni gördüm necə şəkkər bir gül.

*19.04.1997*

***

Səni hüşyar eləyən var, gülüm, hüşyar ol,
Əgər hüşyar ola bilsən, mənə minnətdar ol.

Göz yaşımdan xəbərin varmı sənin, ey dilbər,
Gözümün yaşları islatdı səni, bidar ol.

Xoşluğundan necə xoşlanmada idim, gözəlim,
Yenə xoşluq ilə rəftar elə, xoşrəftar ol.

Sənə eşq dərsini keçdim ki, quraq eşq qəsri,
İndisə həndəsə öyrən, çalışıb memar ol.

Yara qəm vermək olarmı, əcəb aşiqlər var...
Demərém mən sənə "yarım, mənə sən qəmxar ol".

Bığı neynir dodağım, Xan Qarabağ getmişdir,
Ürəyim, heç sənə şənlik yaraşırmı, zar ol.

Qəzəli pis günə qoymuş necə şair, ey dil,
Dilimə xor baxan adəmləri çal, şahmar ol.



Şahinin təbinə gər dəysə nəzər bir vədə,
Qələmim, bədnəzərin gir gözünə, mismar ol.

*18.12.1997*

***

Getdin təzədən, tut, mənə hicranı gətir gəl,
Hərgah açıq gəlməsə, pünhani gətir gəl.

Edam eləyək biz onu birdəfəlik, ey yar,
Fövt eyləmə əsla belə imkanı, gətir gəl.

Eşq aləminin, ey pəri, nöqsanıdı hicran,
İslah eləyək şövq ilə nöqsanı, gətir gəl.

Qurbanın olum, fərz elə hicran bizə qoçdur,
Qurbanlığımız var, mənə qurbanı gətir gəl.

Qəlbin yuxadır, mən bilirəm, hicrana amma
Qeyzi, qəzəbi, hikkəni, tüğyanı gətir gəl.

Mən xəstənin, əlbəttə ki, loğmanı özünsən,
Var dərdi bu şəxsin, ona dərmanı gətir gəl.

Amma gecikib-eyləmə, halım yenə pisdir,
Çatdır özünü Şahinə, loğmanı gətir gəl.

*21.09.1998*

***

Dərdimə dərman edəcəksənsə, gəl,
Müşkili asan edəcəksənsə, gəl.

Vəsli edirsənsə təmənna, buyur,
Hicrana fərman edəcəksənsə, gəl.

İstəmirəm sirrim ola aşikar,
Sirrimi pünhan edəcəksənsə, gəl.

Mən məni qurban edirəm sən yara,
Sən səni qurban edəcəksənsə, gəl.

Ömrü çürütdüm düşübən qürbətə,
Ömrü firavan edəcəksənsə, gəl.

Mən daha meyxanəyə getməm, məni
Sən meyə mehman edəcəksənsə, gəl.

Qəlbi pərişan edəcəksənsə, get,
Zülfü pərişan edəcəksənsə, gəl.

Aşiqi heyran eləmək çox çətin,
Aşiqi heyran edəcəksənsə, gəl.

Daima ilhamə gətir Şahini,
Sən buna imkan edəcəksənsə, gəl.

*27.09.1998*

***

Hərgah azalmışsa da, tabım mənim, ey gül,
Xoşdur sənin uğrunda əzabım mənim, ey gül.

Zənn etmə şərabı çəkib aldım mən üzümdən,
Ruhani şərab idi şərabım mənim, ey gül.

Tər gülləri əzməklə gülab etmədim hasil,
Bir başqa gülab idi gülabım mənim, ey gül.

Bazardə bal tapmayıban mən doşab aldım,
Baldan da şirin çıxdı doşabım mənim, ey gül.

Var öylə qəzəl sahibi heç dəftəri yoxdur,
Allahə şükür çoxdu kitabım mənim, ey gül.

Sorduqda "Sevirsənmi?", dedim: -"Sevməyirəmmi?!"
Gördünmü sualımdı cavabım mənim, ey gül.

Şahin də günah eylədi hərdən, əmin ol ki,
Azdır günəhim, çoxdu savabım mənim, ey gül.

*2.08.2000*



## BİR QƏZƏLDƏ İKİ QƏZƏL

### I

Ey yarı görən bülbül, iqrarı görən bülbül,
İqrarı görən bülbül, ey yarı görən bülbül.

Ey xarı görən bülbül, qıydınmı gülü xarə?
Qıydınmı gülü xarə, ey xarı görən bülbül?

Dildarı görən bülbül, uç bir də səlam eylə,
Uç bir də səlam eylə, dildarı görən bülbül.

Memarı görən bülbül viranəyə göz dikməz,
Viranəyə göz dikməz memarı görən bülbül.

Gülzarı görən bülbül susmaq nədi bilməzmiş,
Susmaq nədi bilməzmiş gülzarı görən bülbül.

Cabbarı* görən bülbül bülbüllüyü tərk etdi,
Bülbüllüyü tərk etdi Cabbarı görən bülbül.

İlqarı görən bülbül ilqarə xilaf olmaz,
İlqarə xilaf olmaz ilqarı görən bülbül.

İnkarı görən bülbül Şahin kimi qan ağlar,
Şahin kimi qan ağlar inkarı görən bülbül.

### II

İqrarı görən bülbül,
Ey yarı görən bülbül.

Qıydınmı gülü xarə,
Ey xarı görən bülbül?

Uç bir də səlam eylə
Dildarı görən bülbül.

* Cabbar Qaryağdıoğlu

Viranəyə göz dikməz
Memarı görən bülbül.

Susmaq nədi bilməzmiş
Gülzarı görən bülbül.

Bülbüllüyü tərk eylər
Cabbarı görən bülbül.

İlqarə xilaf olmaz
İlqarı görən bülbül.

Şahin kimi qan ağlar
İnkarı görən bülbül.

*1.03.2001*

***

Kim əgər hüsnünə gündən-günə heyran deyil,
Surəti insana bənzərsə də insan deyil.

Xaliqin gör nə qədər gül bitirib qoynunda,
Amma çox sevgili var qoynu gülüstan deyil.

Vəslinə kim ki yetir, rahət olur aşiq tək,
Heç deyən varmı vüsalın mənə dərman deyil?

Səni atəşli, hərarətli yaratmış Xaliq,
Hansı nöqtəndi vücudində çırağban deyil.

Dağların var döşün üstündə, gəlir can vəcdə,
Gəlməyən vəcdə əgər var isə can, can deyil.

Elə məşhur eləyibdir, gözəlim, sinə səni
Sinəsi hər gözəlin sən kimi əlvan deyil.

Gözlərindirmi sənin mavi Xəzər, göy Göygöl?
Gözünə baxsa o kimdir sənə heyran deyil?

Elə təsvir elədim mən ki, yaranmaz şübhə,
Kim deyər, Şahina, bu - Azəribaycan deyil?

*4.03.2001*

***

Ey dil, de ki, ey sevgili dildar, qayıt gəl,
Hicrində olubdur ürəyim zar, qayıt gəl.



Baş şişdi məhəbbət gileyindən, belə getsə
Dünya olacaqdır başıma dar, qayıt gəl.

Yoxsa yanıma bir də qayıtmaq diləyin yox?
Yoxsa, eləyirsən məni inkar, qayıt gəl.

Sevdamızı çox kəs hələ bilmir, bunu bil sən,
Vallah, edərəm hər tərəfə car, qayıt gəl.

Bihuş kimiyəm, tərk eləyir hey məni huşim,
Hüşyar gedibsən elə hüşyar qayıt gəl.

Dünyanı verərdim sənə bir muştuluq üçün,
Gəlsən qayıdıb, muştuluğun var, qayıt gəl.

Gəlsən sən əgər, başqa gözəl dilbərə baxsa
Çıxmazmı gözü Şahinin, ey yar, qayıt gəl.

*30.07.2001*

***

*O gün ki, atəşinlik arizi-canana yazmışlar,*
*Məni-sərgəştəni ol atəşə pərvanə yazmışlar".*
**Qasım bəy Zakir**

Üzülmüşdür canım qəmdən, bunu canane yazmışlar,
Günəhkar bəndəni əfv etməyi sultanə yazmışlar.

Sənin zülfündə vardır nanə ətri mənsə möhtacəm,
Dirilməkçin mənə, ey nazəninim, nanə yazmışlar.

Sədaqətdən kənar olmaq məhəbbətdən yan olmaqdır,
Bunu hər şəxsə bildirmiş, bunu hər yanə yazmışlar.

Yazan vardır ki, yoxdur sevgi aləmdə, qələtdir bu,
Yazan kəslər yalan yazmış bunu, əfsanə yazmışlar.

Kimin var isə idrakı gedib əyyaşə baş qoşmaz,
Mənə hər gün kitabxanə, ona meyxanə yazmışlar.

Gərək gülşən təmizlənsin, alağ basmış gülüstanı,
Məni laqeyd sanmışlar, məni biganə yazmışlar.

Qəzəlxanlıqda əl çəkdim keçilmiş yolla getməkdən
Və üsyan eylədim, Şahin, məni üsyanə yazmışlar.

*5.08.2001*

***

Deməyim mən nə sayaq indi o bağbanə gözəl?
O salıbdır bu bağı, bağçanı səhmanə gözəl.

Edəcəkdir məni divanə gözəllik bir gün,
Gül gözəl, qönçə gözəl, lalə gözəl, nanə gözəl.

Üstəlik sən də gözəllikləri artırmadasan,
Yaraşırsan, gözəlim, sən bu gülüstanə gözəl.

Oxlar idin məni kipriklərin ilə, ey şux,
Oxların qoy yenə batsın bu həzin canə gözəl.

Biri yandıqca ölür, qeyrisi öldükcə yanır,
Bilmirəm şəm gözəldir, ya o pərvanə gözəl?

Görürəm ki, yenə eşqim səni məstanə edib,
Deməyim mən sənə indi necə məstanə gözəl?

Dalaşırsan nə üçün Şahin ilə, ey molla,
Sənə məscid gözəldir, ona meyxanə gözəl.

*13.02.2002*

***

Dedim: -Ver su, -dedin: -Tərtər gətirrəm,
Dedim: -Mey bu, -dedin: -Kövsər gətirrəm.

Dedim: -Sənsiz günüm şirin deyildir,
Dedin: -Şirin deyil, şəkkər gətirrəm.

Dedin: -Qoy kipriyim keçsin sinəndən,
Dedim: -Oxmu? -dedin: -Xəncər gətirrəm.

Dedim: -Gəl daşlayaq əğyarı tez-tez,
Dedin: -Daş olmasa qənbər gətirrəm.

Dedim: -Hərdən şer məclislərində
Sözüm coddur, -dedin: - Məxmər gətirrəm.

Dedim: -Dolmuş varaqlar vəsfin ilə,
Dedin: -Yoxsa varaq, dəftər gətirrəm.



Dedim: -Söz yazmışam qiymətli zərdən,
Dedin: -Zər var isə, gövhər gətirrəm.

Dedim: -Yaz şerini Şahindən üstün,
Sözüm müşkdür, -dedin: -Ənbər gətirrəm.

*13.10.1995*

***

Sənsən hökmdar, Səncər nə lazım?
Kipriyin ki var, xəncər nə lazım?

Görüb halımı bil əhvalımı,
Şərhə halımı dəftər nə lazım?

Artır eşqini dəmbədəm mənə,
Olsa zər qəhət zərgər nə lazım?

Gör bu sirdaşı, sən də sirr daşı...
Axdı göz yaşı, Tərtər nə lazım?

Söz qatarımın yoxdur əyləci,
Təb gəmisinə lövbər nə lazım?

Gözlər tox olsa, sevgi çox olsa,
Dava yox olsa, əsgər nə lazım?

Şahin qəfəs yox, ənginlik istər,
Tuti deyildir, şəkkər nə lazım?

*15.10.1995*

***

Mən canımı qurban eləmək fikrinə düşdüm,
Cananıma ehsan eləmək fikrinə düşdüm.

Əldən verib imkanları imkansızam indi,
İmkansıza imkan eləmək fikrinə düşdüm.

Hər dərdimi bilmərrə yadımdan çıxarıb da,
Hər dərdinə dərman eləmək fikrinə düşdüm.

Düşdüm çölə, göz yaşı axıtdım o qədər ki,
Səhranı gülüstan eləmək fikrinə düşdüm.

Üsyan eləyir gündə təmiz sevgiyə əğyar,
Əğyarı da insan eləmək fikrinə düşdüm.

Sanki elə zərgər, elə kimyagərəm indi
Adi daşı mərcan eləmək fikrinə düşdüm.

Allahsıza təlqin eləyib düzlüyü hər dəm,
Allahı da heyran eləmək fikrinə düşdüm.

Şişmişsə də qəlbim neçə müşküllər içində,
Çox müşkülü asan eləmək fikrinə düşdüm.

Canan dedi: - Can xəstələnib eşqinə düşcək,
Şahin, səni loğman eləmək fikrinə düşdüm.

*23.10.1995*

***

Bir zamanlar demişəm təkcə xəyal istəyirəm,
Nə xəyaldır bu ki, mən indi vüsal istəyirəm.

Eşqdir ümdə zülalı bu həyat aləminin,
Dəmbədəm hər kəsə eşq adlı zülal istəyirəm.

Həmişə yerdə - vəfa, yerdə - sədaqət, sevda,
Hər zaman göydə - günəş, göydə - hilal istəyirəm.

Vətənim çoxmu fəğan eyləyəcəkdir görəsən?
Mən Nəbi istəyirəm, Rüstəmi-Zal istəyirəm.

Yazmağa şerimi illərlə macal vermişdir,
Mən əcəldən neçə müddət də macal istəyirəm.

Gül camal axtarar idi nəzərim hər yerdə,
Mən camalın yerinə indi kamal istəyirəm.

Mənə heç bənzəməyir, çox gülə eşqin söylər,
Hərzə hər bülbülü, əlbəttə ki, lal istəyirəm.

Şahin, ilham pərisi indi halal zövcəmdir,
Deyiləm çünki haramzadə, halal istəyirəm.

*3.11.1995*

***

Bişərəflər ki görürlər şərəf olmuş kimiyəm,
Toy tuturlar mənə döyməklə, dəf olmuş kimiyəm.

Bilirəm, gövhəri çoxdur bu qəzəl aləminin,
Düşünüblər ki, mən isə sədəf olmuş kimiyəm.

Yazıram şerimi elm öyrənib ustadlardan,
Ey sələflər, sizə layiq xələf olmuş kimiyəm.



İstiqamət nə sağ olmuş, nə də sol, düz gedirəm,
Sən tərəfsizliyə bax, bitərəf olmuş kimiyəm.

Yerə girsin məni yersiz qınayanlar, yarəb,
Çox məzəmmət oxuna mən hədəf olmuş kimiyəm.

Sərv tək fikrim ucalmaq idi, amma qurudum,
Su verən yox mənə, bağban, ələf olmuş kimiyəm.

Qədrimi bilmədilər qədrbilənlər, əfsus,
Yaşamaqdırmı bu, Şahin, tələf olmuş kimiyəm.

*7.11.1995*

***

Gözə görsəndi fəraq güzgüsü sənsiz, gözəlim,
Bağiban bir neçə yol qaldı süsənsiz, gözəlim.

Nə gözəldir bu ki, sərhədləri aşdım gəldim,
Şahdağı görmədə gözlər yenə çənsiz, gözəlim.

Qürbətin hər gülü bir qarə tikan şəklində...
Bir qərib bülbül idim orda çəmənsiz, gözəlim.

Tökülən göz yaşımı yığmağa cam lazımdı...
Rahətəm indi o camsız və ləyənsiz, gözəlim.

Dərk edə bilməyirəm, tərk eləyib bir müddət
Qalmışam mən necə yad ölkədə sənsiz, gözəlim.

Vətənim qürbətə qəlbimdə gedibdir amma,
Deməyibdir mənə bir kimsə vətənsiz, gözəlim.

İnanırsanmı ki, həsrət məni öldürmüşdü?
Dözmüsən sən nə təhər həsrətə mənsiz, gözəlim?

Bez yanar ahim ilə, amma ki, torpaq yanmaz,
Dəfn elə Şahini qəbrində kəfənsiz, gözəlim.

*17.11.1995*

***

Aşiqəm, məndə nə təqsir, açılıbdır bəxtim,
Qırılıb qoldakı zəncir, açılıbdır bəxtim.

Oxucu, sanki sinəmdən ox ucu keçmişdi,
Qulaq as şərh eləyim bir, açılıbdır bəxtim.

Dözə bilməz daha kəndir mənim təzyiqimə,
Açılıbdır daha kəndir, açılıbdır bəxtim.

Gizli saxlardım əzəl sirrimi mən, indi isə
Açıram aləmə bir sirr: Açılıbdır bəxtim.

Gündə təsvir eləyərdi qələmim dildarı,
Edirəm mən yenə təsvir, açılıbdır bəxtim.

Bəxtimi kimsə daha bağlaya bilməz bişəkk,
Olmuşuq bəxt ilə əlbir, açılıbdır bəxtim.

Yarımın zülfü kimi bəxt düyünlənmişdi,
Şahina, yar gəlibdir, açılıbdır bəxtim.

*13.01.1996*

***

Mən məhəbbət gülşənində çox sənubər görmüşəm,
Ey gülüm, yalnız səni mən tazəvü tər görmüşəm.

Xeyli vaxtdır zənn edir eşq əhli kimyagər məni,
Kimiyadır eşqimiz, mən eşqdə zər görmüşəm.

Laf edən çoxdur həqiqət söyləyib böhtanına,
Mən həqiqət məxmərindən don geyən şər görmüşəm.

Çəkmişəm hərdən bəla mən aşinalardan, könül,
Dildə "dostam" söyləyiblər, əldə xəncər görmüşəm.

Amma comərdlər də cəm olmuş mənim ətrafıma,
Meydanında mərdlərin nər görmüşəm, ər görmüşəm.

Mən tamam etməkdən ötrü bir kitablıq şerimi
Min qələm işlətmişəm, minlərlə dəftər görmüşəm.

Söylədi yarım: -Yaxıbdır Şahini sevda odu,
Şahini şahin görürlər, mən səməndər görmüşəm.

*29.01.1996*

***

Sitəmindən savayı qeyri sitəm istəmərəm,
Mənə ver hər qəmini, kim dedi qəm istəmərəm.

Çox deyən var ki, diyar içrə hərəmxanə dolu...
Bil ki, səndən savayı qeyri hərəm istəmərəm.



İstəmək tək səni gündüz-gecə istər könlüm,
Özgə heç bir sənəmi istəmərəm, istəmərəm.

İstiqamət mənə yalnız sən olan məskəndir,
Başqa bir səmtə yönəlməz bu qədəm, istəmərəm.

Olmasın qoy mənə qismət daha qürbət səfəri,
Tutmasın gözlərimi bir daha nəm, istəmərəm.

Dolmasa tərifin ilə nəyə lazım dəftər?
Yazmasa vəsfini hərçənd qələm istəmərəm.

Həsrətindən yanıram, yar, Kərəm söylə mənə,
- Şahinimsən, - dedi, - addırmı Kərəm? İstəmərəm!!!

*12.02.1996*

***

Elmə aludəliyim varsa səmər verməliyəm,
Gecə-gündüz çalışıb xəlqə əsər verməliyəm.

Ən gözəl söz seçirəm sözlər içindən, gözəlim,
Mən ki söz zərgəriyəm hey sənə zər verməliyəm.

Zövq alırsansa o göyqurşağının rəngindən,
Sənə göyqurşağı rəngində kəmər verməliyəm.

İynənin sən ucu boyda mənə xoşbəxtlik ver,
Qətrə versən mənə sən, mənsə Xəzər verməliyəm.

Ehtiyacın ola gər quş südünə, quş südü nə,
Yerdə yer kürrəsini, göydə qəmər verməliyəm.

Mən gərək eşqimizi aləmə elan eləyim,
Xəbərin var bu xəbərdən ki, xəbər verməliyəm?

Bir qədər qıyma mənim ömrümə, ey çərxi-fələk,
Görəcəksən hələ mən xəlqə nələr verməliyəm.

Ağacam öylə ki, az-çox bəhərim var mənim,
Bağiban, gəl məni sən kəsmə, bəhər verməliyəm.
Üzmüşəm mən gecə-gündüz canı dərd etməkdən,
Şahinəm, cismə dözüm, qəlbə təpər verməliyəm.

*6.03.1996*

***

Yarəb, sözümü indi o cananə deyər kim?
Nifrinlə deyər, amma səmimanə deyər kim?

Bir molla göründü, görəsən saqi hayanda?
Məsciddi bura, yoxsa ki meyxanə, deyər kim?

Görmüşmüsünüz məst ilə məstanədə fərqi?
Məstanə mənəm, qeyriyə məstanə deyər kim?

Eşqim görünür, yaxşı baxan olsa, gözümdə,
Gerçək görünən eşqimə əfsanə deyər kim?

Fərq olmalı hər kəsdə və hər şeydə təfavüt,
Mirvariyə mərcan, zərə dürdanə deyər kim?

Durmuş aramızda görəsən kim o sənəmlə?
Hər yolvurana mən kimi mərdanə deyər kim?

Naməhrəm olan dilbərə məhrəm demək olmaz,
Məhrəmsə nigarım ona biganə deyər kim?

Miskin görürəm mən yenə əğyarı, döyüblər...
Miskin görünən bir kəsə şahanə deyər kim?

Olmazmı müyəssər görəsən aşiqə imkan?
Dağ boyda ümidsizliyi imkanə deyər kim?

Şahin quşudur yoxsa nə quşdur başım üstdə?
Ruhimdi, uçur göydə, bunu canə deyər kim?

*13.04.1996*

***

Qeysdən xəbərin vardı, Leylanı bilirdim,
Mən məktəbə getməzdən sevdanı bilirdim.

Şeri başa düşməkdən olsam da uzaq mən,
Əzbərləyərək beyti, misranı bilirdim.

Sözlərdə, kəlamlarda məna arayırdım,
Mənalı deyimlərdə mənanı bilirdim.

Pünhan idi ağ dağı, Şahdağı görürdüm,
Göz yaşını bilmirdim, dəryanı bilirdim.

Mən təkliyə vurğundum, tənhalığa məftun,
Günlərlə xəyal eylər, xülyanı bilirdim.



Yumşaq idi rəftarım, bərk olsa da zərbəm,
Hərdən savaş eylərdim, qovğanı bilirdim.

Dünya hələ bilmirdi varəmmi, yoxammı,
Amma, mən isə, Şahin, dünyanı bilirdim.

*20.04.1996*

***

O dilbərdən qəbul etdim nə işvə mən, nə naz aldım
Və isti xisləti satdım bazar içrə ayaz aldım.

Bilənlər bildilər, siz həm bilin, nəfsim deyildir çox,
Nə ifrat almağa meyl eylədim həzzi, nə az aldım.

O qeyrətsiz vətəndaşlar neçin satmış vətən mülkün?
Məgər mümkünmü görsünlər Samur satdım, Araz aldım?

Yaman çoxdur mənim dərdim, sayı yaddan çıxır, bir gün
Görərlər saymaq üçün dərdi sayğac tək cihaz aldım.

Neçə dərvişlə dost oldum mən əfqanlar diyarında,
Mənəm dərviş - nə malü mülk, nə pal-paltar, palaz aldım.

Nə lazımdır qılınc almaq ələ əldə qələm varkən?
Əlimdən xəncəri atdım yerə hiddətlə, saz aldım.

Daha rindanəlik divanəlikdir, bəsdir, ey Şahin,
Kifayətdir şərab ilə, mey ilə dəstəmaz aldım.

*22.05.1996*

***

Sevgi öyrətdim sənə, şerimlə imdad eylədim,
Sevgilim, şad olmuşam, çünki səni şad eylədim.

Bilməyimdən quş dili pərt oldular əğyarlər,
Mən Süleyman olmuşam, əğyarı Şəddad eylədim.
Saf qəzəllər yazmaq üçün cəhd edənlər varsa da,
Əcnəbi hər kəlmədən şeri mən azad eylədim.

Tapdalanmış yolla getməkdən könül zövq almayır,
Mən də bir bəhri* əruz vəznində icad eylədim.

* Mən həmən bəhri şərti olaraq "Şahini" adlandırmışam. Ölçüsü belədir: "Müftəilün failün, failün, failün"

Mən ki, yetdim çox kəsin fəryadına dad eyləyib,
Yetmədi bir kimsə dadə hər qədər dad eylədim.

Rəbb eşitməzsə mənim fəryadımı vay halıma!
Allah-Allah, bəs neçin günlərlə fəryad eylədim?

Eşq mülkün azca həm abad etmək naminə
Şahina, mən öz xoşumla ömrü bərbad eylədim.

*14.01.1997*

***

Ey ovçu, şikar olmayacaqdır, bunu bildim,
Tale sənə yar olmayacaqdır, bunu bildim.

Bezdirdi səyahət məni, məskən mənə bir də
Bir qeyri diyar olmayacaqdır, bunu bildim.

Mən Məcnuna heykəl qoya bilsəm şəhərimdə,
Qəlbimdə qübar olmayacaqdır, bunu bildim.

Eşqin qədəhi boşsa, qədəhlərlə mey içsə,
Cananə xumar olmayacaqdır, bunu bildim.

Dünya dönə Eşqistana! Bundan daha göyçək
Dünyadə qərar olmayacaqdır, bunu bildim.

Məndən də təmizdilli qəzəlxan görünmür,
Bir güllə bahar olmayacaqdır, bunu bildim.

Əlbəttə, əruz aləminin pöhrəsiyik biz,
Hər pöhrə çinar olmayacaqdır, bunu bildim.

Vardırmı mərəz qorxusu, loğmanı o yarsa,
Şahində azar olmayacaqdır, bunu bildim.

*1.02.1997*

***

Allah-Allah, yuxuda mən yenə Leyla gördüm,
Nə Qeys dəydi gözə, amma nə səhra gördüm.

Görmədim bir kərə də Şirin ilə Fərhadı,
Gözümə dəydi nə Vamiq, nə də Əzra gördüm.



Tapmadım heç necə baxdımsa cırılmış köynək,
Gözümə dəydi nə Yusif, nə Züleyxa gördüm.

Leyli görməkdə gözüm hər gecə... Bədbəxt Məcnun!
Göz yaşından yaranan bir neçə dərya gördüm.

Nə üçün Leyli gəlir təkcə mənim röyamə?
Bu müəmmadı mənimçin ki, müəmma gördüm.

Fəhmidə ilqarı gördüm, Babada pünhan söz*,
Bitəmənnadə** gözəl şerə təmənna gördüm.

Ey qəzəlxan, nə gərəkdir qəliz olsun qəzəlin?
Bunda gördüm nə zərurət, nə də məna gördüm.

Mən də yazsaydım o cür, yarə lüğət lazımdı,
Yarə mən sadə deyib şerimi sevda gördüm.

Eşqini heç kəsə bildirmə, sükut, ey Şahin,
Adı dillərdə gəzən aşiqi rüsva gördüm.

*8-9.05.1997*

***

Uduzub eşqdə bədbinliyi, sevda uddum,
Odu söndürmək üçün qəlbdə, dərya uddum.

Nakəsə gərçi dedim fikrimi sərrast, bəzən
Saxlayıb çox sözümü qafiyə, misra uddum.

Özümü əfv eləyə bilmirəm hərdən, çünki
Surətin xətrinə bica yerə məna uddum.

Bağiban bağladı hərdən bağı aşiq üzünə,
Neçə eyhamını ya ərz elədim, ya uddum.

Bitəmənna görünən kimsələrə eşq olsun!
Saxlayıb mən də təmənnamı təmənna uddum.

Dalğanı qarşıma göndərmə, ey ümman, bil ki,
Mən çıxıb dalğana qarşı neçə dalğa uddum.
Olmadım nəfsimə tabe, edirəm zənn, Şahin,
Fani dünyanı uduzdumsa da üqba uddum.

*26.05.1997*

***

Mütilik var isə gözdə, nəzərindən məlum,
İtilik var isə sözdə, kəsərindən məlum.
Çox qəzəlxan dilə yad kəlmələrə bənd olmuş,
Dilini sevməyi, əlbət, əsərindən məlum.

* İlqar Fəhmi və Baba Pünhan
** Əliheydər Bitəmənna

Çox deyən var igidəm, güvvəliyəm, boş-boşuna...
İgidin qüvvəsi varsa zəfərindən məlum.

Səfərim olmayacaqdır daha Kabul sarı, bu -
Səfərin vahiməsindən, xətərindən məlum.

Bir qəşəng ölkəni bərbad elədi məlunlar,
Qəznisindən, Təxarından, Konərindən* məlum.

- Xoş vüsal gəlmədədir, getmədə hicran, - dedi yar,
Sözünün xoşluğu xoş-xoş xəbərindən məlum.

Belə məlumdu ki, bağ içrə gözəl güllər var,
Bağıban, məlumat, əlbət, çəpərindən məlum.

Tuşlayıbdır uca göylər gözünü yer tərəfə,
Ulduzundan, günəşindən, qəmərindən məlum.

Sənə göyqurşağı rəngində kəmər verdim mən,
Göyü çox sevməyim, ey gül, kəmərindən məlum.

Tuti olmuş yenə Şahin, gözəlim, tutiliyi
Süzülən hər qəzəlindən şəkərindən məlum.

*20.06.1997*

***

Sanma büsat arzusuna düşmüşəm,
Başqa həyat arzusuna düşmüşəm.

Tuti olandan bəri şirin sözə,
Qəndü nabat arzusuna düşmüşəm.

Mən çeçenin əzmü səbatın görüb,
Əzmü səbat arzusuna düşmüşəm.

Hardadı Şah İsmayılın ləşkəri?
Rumlu, bayat** arzusuna düşmüşəm.

Varmı görən at yenə Düldül kimi?
Öylə bir at arzusuna düşmüşəm.

Ağçayı, Kabul çayını*** görmüşəm,
Dəclə-Fərat arzusuna düşmüşəm.

Bir kərə batdımsa da, amma yenə
Mən Batabat**** arzusuna düşmüşəm.

Xan Qarabağ yurduna sahiblənib
Eyşü nişat arzusuna düşmüşəm.

---

* Rus qoşunları tərəfindən viran edilmiş Əfqanıstan vilayətləri
** Qızılbaş qəbilələri
*** Əfqanıstanda çaylar
**** Naxçıvanda çay



Kəlməbaşı "yar" deyib, Şahina,
Mən nəqərat arzusuna düşmüşəm.

*30.06.1997*

***

Getdi yarım, bitdi büsatım mənim,
Yox dözümüm, itdi səbatım mənim.

Şəkkərə meyl eyləməyən tutiyəm,
Oldu acı sanki nabatım mənim.

Molla da, zahid də bu gün yad mənə,
Düşdü gözümdən həzəratım mənim.

Qüssə dənizdir, gəmiyəm mən sınıq,
Batmadayam, yoxdu nicatım mənim.

Gör ki, haçandır qəzəlim susmada,
Harda rübaimlə bayatım mənim?

Nəğməsi ömrün, gözəlim, sevgidir,
Sevgi olubdur nəqəratım mənim.

Mən bu fikirlərdə ikən gəldi yar,
Ərşə bülənd oldu nişatım mənim.

Seyr edirəm zülfünü hey, Şahina,
Tükdən asılmışmı həyatım mənim?

*4.07.1997*

***

Bağçada hər kəs alağ gördüsə, mən gül gördüm,
Sən qəfəs görmədəsən, mən isə bülbül gördüm.

Dadıram Qudyalımın gilli suyundan bal tək,
Qudyalımda elə zənn eyləmirəm gil gördüm.

İki sahil, iki dövlət, iki Azərbaycan -
Hərə bir dövlətə məxsus iki sahil gördüm.

Birləşən qollarımızdan cərəyan axmaqda,
Gözəlim, qollarımız tək iki naqil gördüm.
Ulu Tanrım mənə yar oldu həyatımda müdam,
Özümü mən bütün istəklərə nail gördüm.

Əqli artırmada Qurandakı hikmət, amma
Kim xurafatə uyubsa onu cahil gördüm.

Yazığım gəlmədə qəflətdə qalan şəxslərə,
Mənə qafil deyən hər bir kəsi qafil gördüm.

Umma hər Həccə gedəndən hacılıq, ey Şahin,
Hacılıq mərtəbəsində səni, Mail, gördüm.

*16.07.1997*

***

Leyla kimi cananəyə gəlməkdədi heyfim,
Məcnun kimi divanəyə gəlməkdədi heyfim.

Yoxdur canı şəmin, nə qədər yansa sevinnəm,
Vardır canı, pərvanəyə gəlməkdədi heyfim.

Yarəb, niyə əğyarın olur qisməti hərdən -
Tər nəstərənə, nanəyə gəlməkdədi heyfim.

Viranədə gündüz-gecə bayquş ulayırsa,
Abad ola, viranəyə gəlməkdədi heyfim.

Namərd adamın qətli savab, qanı halaldır!
Vermiş canı mərdanəyə gəlməkdədi heyfim.

Heyfa, bulaşıq şerinə dürdanə deyən var,
Billah ki, dürdanəyə gəlməkdədi heyfim.

Şahin, yetərək kamə qocalmırsa mənim tək,
Hər doğmaya, biganəyə gəlməkdədi heyfim.

*24.07.1997*

***

Fəryad eləmə sən deyibən "zərgər itirdim",
Sən zərgər itirdinsə, gülüm, mən zər itirdim.

Sən - sözləri gövhər kimi qiymətli qəzəlxan,
Mən - bəlkə də bənzərsiz olan gövhər itirdim.

Yetmir sənə - şerimdəki avaz, mənə - nəğmən,
Sən Zəmzəm itirdin, mən isə Kövsər itirdim.
Gənclikdə dəcəllik mənə həm yar idi, indi
Şadəm ki, qələm mən taparaq, xəncər itirdim.



Sağdır sözü qalmışsa ədibin, deməRəm ki,
Mən Seyyid Əzim, Hadi, Əli Əkbər itirdim.

Gülşəndə qıran gülləri əğyarə daş atdım,
Əğyar - itirdi başı, mən - qəmbər itirdim.

Cırdım neçə dəftər qəzəli, çünki qəlizdi,
Şahin, gözüm aydın ki, neçə dəftər itirdim.

*27.07.1997*

***

Bilsəm sevəcəksən məni məstanə olardım,
Gündüz-gecə şam hüsnünə pərvanə olardım.

Bilsəm gülabı təsdiq edirsən meyi inkar
Mən saqiyə, meyxanəyə biganə olardım.

Bilsəm ki, xoşun gəlmədədir nanədən, ey gül,
Dərhal ayağın altda bitən nanə olardım.

Zülfünlə əgər bağlasalar cismimi şadəm,
Bilsəm olacaqdır belə, divanə olardım.

Sənsən ki, məni eyləmisən böylə səmimi,
Hər nazəninə sanma səmimanə olardım.

Ölsəm, doğulub gəlsəm əgər bir də cahanə,
Aşiq təzədən Azəribaycanə olardım.

Canan dedi: - Şahanə gəzirsən yenə, Şahin,
Yazsaydım elə, mən dəxi şahanə olardım.

*7.08.1997*

***

Meyxanədən hərçənd nə müddətdi kənarəm,
Mey şişədə qalmış, necə olmuş ki, xumarəm.

Hərdən məni ağuşə çəkir yarla diyarım,
Hərdən də ki, dərviş sayağı tərkidiyarəm.

Kəs var ona qurban gedərəm qoç kimi, amma
Mən kəsməliyəm nakəsi hər yerdə, mişarəm.

Ey cahil adam, aqilə daş atma, sınarsan,
Sən sarmaşıq oldunsa əgər, mənsə çinarəm.
Düzgün kəsə təsir eləməz əyri adamlar,
Səddəm, çəpərəm, əyriliyə qarşı hasarəm.

Kəc baxma mənə, bir gecəlik şam deyiləm mən,
Vulkan kimiyəm, mən hələ illərlə yanarəm.

Şahin, girəcəksən məzara sən dəxi, amma
Bir kəs deməyibdir mənə ki, mərdiməzarəm.

*14.08.1997*

***

Çatsaydı gücüm mən elə imkan eləyərdim,
Yer kürrəsini Azəribaycan eləyərdim.

Əsla cahanı bölgələrə bölməz idim mən,
Hər guşəsini sünbülü reyhan eləyərdim.

Hər müşkülatın həllini asan qılardım,
Hər bir mərəzə çarəvü dərman eləyərdim.

Tərs yolda dayandıqlarını ərz eləyib də,
Kafərləri dərsimlə müsəlman eləyərdim.

Hal əhlinə təzim eləyib hər səhər-axşam,
Qal əhlinə gündüz-gecə üsyan eləyərdim.

Aşiqləri şad, eşqi uca, hicri peşiman,
Əğyarləri zarü pərişan eləyərdim.

Aqillərə şövq ilə mükafat verər idim,
Cahilləri cövr ilə ciyərqan eləyərdim.

Kəs var ki, deyir "canım ola rəhbərə qurban",
Mənsə canı cananıma qurban eləyərdim.

Məcnunə dönüb, Leyli çölündə fəğan etdim,
Getsəydim ora mən yenə əfğan eləyərdim.

Ey Şahin, utanmaq dilimi bağladı, yoxsa
Kimdirsə Baş Aşiq elə elan eləyərdim.

*27.08.1997*

***

Səfərim bəsdi, Azərbaycana getmək dilərəm,
Ölkəmə mənsub olan hər yana getmək dilərəm.
Var "Nizami" çığırıb Gəncəyə varmaq meylim,
Sabirin yurdu olan Şirvana getmək dilərəm.



Bəzi torpağımı işğal eləyib namərdlər,
Mən də cəng əhli kimi meydana getmək dilərəm.

"Qanı qan ilə yumaq!" fikri gəzir beynimdə,
Vətənim, asi olub üsyana getmək dilərəm.

Üzdə üzmək mənə layiqmi? Dayazdır dərya!
Dibə baş vurmaq üçün ümmana getmək dilərəm.

Yusifi yad eləyib bağda Züleyxa dedi ki:
- Gülşəni neyləyirəm, zindana getmək dilərəm!

Məni bezdirdi xəyal ilə səma pərvazı,
Şahinəm, şir oluban ormana getmək dilərəm.

*4.09.1997*

***

Mənə dərd verməyin, öz dərdi-sərim var mənim,
Ürəyim birsə də, min bir kədərim var mənim.

Mən də Sabir sayağı əyriyə həmvar demərəm,
Sözü kəskin deyirəmsə, kədərim var mənim.

Bağiban, hər alağı rədd eləyirsən, əhsən,
Əcnəbi hər sözə qarşı çəpərim var mənim.

Boş xurafatla məni qorxuda bilməz zahid,
Aləmin çox xəbərindən xəbərim var mənim.

Fars-ərəb məxəzinin bir çoxu məlumdu mənə,
Nəzəri çox deyimə öz nəzərim var mənim.

Var adam millətinə bircə bəhər bəxş etməz,
On kitabım var isə, on bəhərim var mənim.

Qubamın tarixini vəcd ilə aldım qələmə*,
Hələ elm aləminə çox səfərim var mənim.

Yazıram tarixini xəlqimizin şövq ilə,
Bu vətən mülkünə, Şahin, səmərim var mənim.

---

*"Quba tarixi" kitabı

***

Nə qədər ahü fəğan eyləmişəm!..
Düşəli eşqə ziyan eyləmişəm.

Dəxi meyl eyləməyi cananə
Özümə mən qadağan eyləmişəm.

Yazıram şerimi... Yox gül seyri,
Gülü mən gülləbaran eyləmişəm.

Hicrə ki "yaxşı" dedim, çox yaxşı!
Yaxşı ki, vəsli yaman eyləmişəm.

Mənə lazımmı o gen məskənlər?
İndi bir küncü məkan eyləmişəm.

Dəftərim əldə, qədəh qarşımda,
Təbimi şöləfəşan eyləmişəm.

Ey qələm, sın, bu nə sözlərdi belə?
Başımı meylə duman eyləmişəm.

Yazmaram bir də bu cür misralər,
Eh, görün bir nə bəyan eyləmişəm!..

Meyi atdım yerə. Düz sevdanı
Şahina, əyri güman eyləmişəm.

*19.10.1997*

***

Bu nə yoldur ki, gəlir yar, uzaqdırmı bəyəm?
Xorasandırmı, Yəməndirmi, İraqdırmı bəyəm?

Neçə gündür ki, gözüm görmür onu, kor kimiyəm,
Yarımın gözləri məşəlmi, çıraqdırmı bəyəm?

Yar getdi, elə bildim ki, qiyamət gəldi,
Allahım, qeyri qiyamət olacaqdırmı bəyəm?

Doğrudan da cünun imiş, dəli imiş Məcnun,
Gözünün yaşları axmaqda, uşaqdırmı bəyəm?

Qələmi görməyəcək kimsə qələmdanımda,
Xəncərimmi qələmim, qeyri yaraqdırmı bəyəm?



İki "Divan"ı yazıb şövq ilə, bihal oldum,
Məni bihal eləyən təkcə fəraqdırmı bəyəm?

Dedilər yarıma Şahindi gələn, söylədi ki,
Məndən ötrü bəs ölürdü, hələ sağdırmı bəyəm?

*13.10.1997*

***

Olsun gözüm aydın, pərimi mən yenə gördüm,
Dan ulduzumu, ülkərimi mən yenə gördüm.

Gül çöhrəsi gülçöhrələrin düşdü gözümdən,
Sərv qəddi olan sərvərimi mən yenə gördüm.

Çox başçıya rəhbər demişik, başsız olublar,
Allahə şükür, rəhbərimi mən yenə gördüm.

İnnən belə gövhər kimi çoy qədri bilinsin,
Gövhərşünasam, gövhərimi mən yenə gördüm.

Təbim neçə müddətdi uzaqlarda gəzirdi,
Qarşımda qələm-dəftərimi mən yenə gördüm.

Zənn eylər idim mən ki, meyindir cana cövhər,
Saqi, nədi mey, cövhərimi mən yenə gördüm.

Çoxdandı qıfıl vardı mənim sanki dilimdə,
Dilləndi dilim. - Dilbərimi mən yenə gördüm.

Şahin, elədim qəlbini qeysər kimi qarət,
Canan dedi: - İsgəndərimi mən yenə gördüm.

*17.10.1997*

***

Gəldi yaz, açdı çiçək, çıxdı mixək, susən həm,
Yanıram mən, alışıb-yanmadadır gülşən həm.

Bizə cövr eyləyənin bağrı qan olsun, ey Qeys,
Gəzirəm indi çölü sən kimi tənha mən həm.

Şövqüm ölmüşdü mənim, indisə təbim söndü,
Gəmi qərq olduğu dəm batmalıdır yelkən həm.

Yandım eşqinlə, fəqət qorxmayıram yanmaqdan,
Qorxuram mən ki, bu oddan alışarsan sən həm.

Yuxu gördüm, yuxuda yarım ilən göydəydim,
Var imiş göydə də bağ, bağça, bulaq, məskən həm.

Qəzəli saf yazıram mən, mənə alqış vardır,
Eşidilməkdədi Şahin sözünə əhsən həm.

*20.10.1997*

***

Dinc olsa bu dünya evi əsgər nəyə lazım?
Parlarsa həqiqət günəşi şər nəyə lazım?

Boylanmada ardımca mənim gündə sənubər,
Sən bağə gəlirsənsə sənubər nəyə lazım?

Zənnimcə mənim bir yara bir yar gərəkdir,
Şirin var isə, Xosrova Şəkkər nəyə lazım?

Bərbər peşəsi get-gedə dəbdən düşəcəkdir,
Məcnun olan aşiqlərə bərbər nəyə lazım?

Yazmır kağıza şerini, Şahid* - sinədəftər,
Şahid kimi şer əhlinə dəftər nəyə lazım?

Zərgər, mənə söz sərvəti bəs, zər sənin olsun,
Fəth olsa könüllər söz ilə, zər nəyə lazım?

Rast eyləməsin qəddini kim "Rast"ı unutsa,
Olsun tərə qərq kim desə "Şüştər" nəyə lazım?

Tərtər çayını göylərə çəksin qoy İlahi,
Tərtər var isə Zəmzəmü Kövsər nəyə lazım?

Öldürmək üçün Şahini bir söz də kifayət,
Göstərmə, gülüm, zülfünü, ləşkər nəyə lazım?

*25.10.1997*

***

Bir mən olum, bir çəmən, bir o pəri, vəssalam,
Qoy mənə dəysin yenə xoş nəzəri, vəssalam.

Şanki şəkərdir sözün, mən şəkərin şakəri,
Üstümə məcun kimi səp şəkəri, vəssalam.

---

* Ələkbər Şahid



İstəyirəm bağlayım belinə göyqurşağı,
Dinmə, belindən tez ol aç kəməri, vəssalam.

Çatmaq üçün şadlığa, yetmək üçün şənliyə
Boğ qəhəri vəssalam, qov kədəri vəssalam.

Bəsdi, a qürbətsevən, arxada qalmış vətən,
Qoy yəhəri vəssalam, min kəhəri vəssalam.

Dövrələyən var bu gün yad söz ilən şerini,
Yıx hasarı vəssalam, sök çəpəri vəssalam.

Şahina, şəkkər, yağır kəlmələrimdən, fəqət,
Bir neçə namərdə var söz zəhəri, vəssalam.

*4.12.1997*

***

Gecəmi saqi ilə, meylə sabah etməmişəm,
Məscidə getməyirəm, çünki günah etməmişəm.

Nikbinəm öylə ki, ah ilə kəbin kəsməmişəm,
Boşayıb şadlığı dərd ilə nikah etməmişəm.

Sanmayın təkcə dilim var silahım yoxdu mənim,
Kim deyir mən qələmi əldə silah etməmişəm?

Demişəm qarəyə "qarə" ağa "ağ" hər vədə,
Mən hələ ulduzu "kövkəb", ayı "mah" etməmişəm.

Gərçi ömrüm boyu çox fərdə pənah etsəm də,
Bəlli ki, mən hələ əğyarə pənah etməmişəm.

Dağılar dağmı fəqət ahım ilən? Ah eləsəm
Dağılar yer kürəsi, yaxşı ki, ah etməmişəm.

Şahina, kim deyəcəkdir qəzəlin şahı odur?
Hələ mən öz yerimə heç kimi şah etməmişəm.

*13.12.1997*

***

Bitsəydi bu hicran ürəyi şad eləyərdim,
Vəsl ilə fəqət dərdimə imdad eləyərdim.

Qıldıqda namazı edib on dördə əlavə*
Məcnun kimi divanəni həm yad eləyərdim.

---

* 12 imam, həzrət Məhəmməd peyğəmbər və Fatimeyi-Zəhra

Imkan ələ düşsəydi əgər, cahilə qarşı
Billah, özümü fəxr ilə Şəddad eləyərdim.

Məsciddə tamahkarlıq edən molla çoxalsa,
Yüz məscidi bir ah ilə bərbad eləyərdim.

Çox yaxşı ki, meydanıma namərd girə bilmir,
Yoxsa, nə qədər mərəkə icad eləyərdim.

Ovçu, qanın olsun, ovu öldürmə, et azad,
Düşsəydi ələ mən onu azad eləyərdim.

Şahin, daha Vahid kimi ustad görünmür,
Canan dedi: - Mən Şahini ustad eləyərdim!

*23.12.1997*

***

Yarım içmir daha mey, şənliyimiz var bizim,
Şerimizdən alacaq həzzini dildar bizim.

Söyləyin saqiyə kəssin səsini, var səsimiz,
Ney bizim, cəng bizim, saz bizim, tar bizim.

Mənliyi varsa əgər gəlməyəcək, qovlamışıq,
Tökəcək zəhləmizi birdəmi əğyar bizim?

Özüm oldum bu bağın bağibanı, gəl yanıma,
Bağ bizim, bağça bizim, ey pəri, gülzar bizim.

Hər işin mehrü vəfadır, hər işim zövqü səfa,
Hələ bundan belə min bir işimiz var bizim.

Əruzun söz bağı olsun hər alağdan xali,
Fikrimiz olmalıdırmı yenə inkar bizim?

Niyyətim - məqsədim uğrunda savaşdır, Şahin,
Hamıya olmalıdır niyyətimiz car bizim.

*28.01.1998*

***

Hərçənd olub sevgili canan nəsibim,
Hərdən də olubdur acı hicran nəsibim.

Dərman vüsalındı sənin xəstələnəndə,
Rəhm et, yenə olsun elə dərman nəsibim.



Qalxanı əlimdən qocalıq aldı, gücüm yox,
Ey Tanrı, olaydı yenə qalxan nəsibim.

Qalxan ilə birlikdə qılınc həm götürərdim,
Olsaydı əgər zərrəcə imkan nəsibim.

Saç-saqqalım ağdırsa da, düşmən qaralardı,
Olsaydı əgər bir dəxi meydan nəsibim.

Məcnun yatan məskəni görmək diləyiylə
Bir gün olacaqdır Ərəbistan nəsibim.

Şahin, məşədi olmaq üçün Məşhədə getdim,
Qismət var imiş, oldu Xorasan nəsibim.

*10.02.1998*

***

Aləmin ümdə müəmmasını görməkdə gözüm:
Aşiqin eşq təmənnasını görməkdə gözüm.

Nə olan şeydi məhəbbət? Nədi eşq? Sevgi nədir?
Adəmin adəmə sevdasını görməkdə gözüm.

Yuxu gəlcək gözümə pakizə röyalərimin
"Leyli-Məcnun" kimi röyasını görməkdə gözüm.

Köhnə dünya təzələnmişsə də, divanələrin
Köhnə zəncirini, səhrasını görməkdə gözüm.

Kafərin həmləsi artarsa müsəlmanə belə
Kərbəlanın təzə qovğasını görməkdə gözüm.

Daha yoxdurmu, məgər bircəmi Babül-məndəb*?
Nə qədər göz yaşı dəryasını görməkdə gözüm.

Nəzərim dəymədə hər ləhzə Imadəddinimə
Və... "Ənəlhəq"dəki mənasını görməkdə gözüm.

* Babül-məndəb ərəb dilində "Göz yaşı qapısı" deməkdir. Ərəbistan yarımadasının cənub-şərq qurtarajağı ilə Afrika arasında boğazdır. Babül-məndəb Qırmızı dənizi Ədən körfəzi və Ərəbistan dənizi ilə birləşdirir.

Bu ad rəmzi məna daşıyırf və müxtəlif fəlakətlər üzündən həmin boğaza çoxlu göz yaşı axıdılmasını özündə əks etdirir.

Baxaraq diqqət ilə hər tərəfə, ey Şahin,
Tanrının nurü təcəllasını görməkdə gözüm.

*14.02.1998*

***

Zərgərəm, amma güman etmə zər istər könlüm,
Nəzərin bəsdi mənə, bir nəzər istər gönlüm.

Kədərin varsa, tərəddüd eləmə, ver gəlsin,
Şənliyin qoy sənin olsun, kədər istər könlüm.

Neçə saətdi yox olmuş yenə ilham pərisi,
Xəbərim yoxdu pərimdən, xəbər istər könlüm.

Götürüb bir şüşə mey, gəl yanıma, ey saqi,
Səfərə çıxmalıyam, həmsəfər istər könlüm.

Zahida, təsbehini vermə, dəyibdir əlinə,
Faidə qoy sənin olsun, zərər istər könlüm.

Gedirəm ziddinə sərhəd çəkənin mən, amma
Mənlə əğyar arasında çəpər istər könlüm.

Həmlə eylərsə Yezidlər, Hüseyn timsalı
Kərbəlayə gedərəm mən, xətər istər könlüm.

Əfqanıstanda kəhər yolladılar, istəmədim,
Versələr, Düldülə bənzər kəhər istər könlüm.

Qarabağ məskəni ağ günlərə çıxsın, Şahin,
Bu gözəl niyyətim üçün zəfər istər könlüm.

*7.03.1998*

***

Əqlimi xülyayə dəyişdirmərəm,
Gerçəyi röyayə dəyişdirmərəm.

"Xəmsə" yazan olsa qəliz dillə gər,
Mən onu misrayə dəyişdirmərəm.

Şair olub guşənişin olmuşam,
Guşəmi dünyayə dəyişdirmərəm.

Səhv eləyir göz görə, hər kim desə
Surəti mənayə dəyişdirmərəm.



Göz yaşı mirvariləşən qətrədir,
Qətrəni dəryayə dəyişdirmərəm.

Yanmada yarın gözü ulduz kimi,
Ulduzu mən ayə dəyişdirmərəm.

Mən - şəhərin sakini! Səhra nədir?
Şəhrimi səhrayə dəyişdirmərəm.

Şahinəm, ey Qeys, cünun olmaram,
Yarımı Leylayə dəyişdirmərəm.

*14.03.1998*

***

Gəh mərəkədi, gəh də səadətdi bu aləm,
Allah siyasətçi, siyasətdi bu aləm.

Söz yox ki, olur həm kədəri, qüssəsi həm də
Meydir, məzədir, eyşü ziyafətdi bu aləm.

Varsa dağıdan aləmi, memarı da vardır,
Fəxr eyləyirəm mən ki, fəxarətdi bu aləm.

Hərdən görünür amma əmanətdə xəyanət,
Həqdən bizə, əlbəttə, əmanətdi bu aləm.

Ömr eyləmək əql ilə, zəka ilə şərəfdir,
Cahil başa düşmür ki, şərafətdi bu aləm.

Əğyarlığı ləğv eləmək olsa müyəssər,
Sevdadı gözəl, eşqü məhəbbətdi bu aləm.

Zülfün bir əlimdə, qədəhim başqa əlimdə,
Yarım, de özün Şahinə: Cənnətdi bu aləm!

*12.04.1998*

***

Vətənim, qoynunu aç, qoy ki qucağından öpüm,
Bağiban, ver mənə fürsət yenə bağından öpüm.

Olmuşam səndən uzaq bir neçə müddət, qoy ki,
Neçə pərvanə kimi mən də çırağından öpüm.

Dağıdıb bir dağı Fərhad... Diyarım, mənsə
İstərəm Şahdağa bənzər neçə dağından öpüm.

Var qəzəlxan çobanı şerinə layiq bilmir,
Ey çoban, istəyirəm mənsə çomağından öpüm.

Durmusan qəsdinə, ceyranı burax, ey ovçu,
Ona sən rəhm eləsən, qoy ki, bıçağından öpüm.

Aparıb qürbətə yarın darağın söz verdim
Xatirə zülfü düşən dəmdə darağından öpüm.

Əlini öpməyə qoymazsa nigarım, Şahin,
Mən gərək xahiş edib onda ayağından öpüm.

*6.05.1998*

***

Mən yanında elə bezdim, dayana bilməyirəm,
Üz tutum indi əlindən hayana, bilməyirəm.

Sən vuran zərbələrin yox sayı ulduzlar tək,
Nə qədər zərbə dəyibdir bu cana, bilməyirəm.

Görürəm hövsələ bitməkdə, fəğanım bitmir,
Gələn olmuşmu mənim tək fəğana, bilməyirəm.

Faidəm yoxdu cahan içrə, ziyan eyləmişəm,
Daha cismim dözəcəkmi ziyana, bilməyirəm.

Nərdivan ilə behiştin bağına çıxmaqçın
Çatacaqdırmı əlim nərdivana, bilməyirəm.

Söyləyirlər ki, ölənlər görüşür üqbadə,
Belə fürsət olacaqmı, ay ana, bilməyirəm.

Aləmin əvvəli heçdir, sonu heç, ey Şahin,
Görəsən mən niyə gəldim cahana, bilməyirəm.

*12.05.1998*

***

Yarımın bir də kənar olmasını istəmirəm,
Qəlbimin bir daha zar olmasını istəmirəm.

Işlədib hiylə çoxu saqini məst etməkdə,
Saqinin mənsə xumar olmasını istəmirəm.

Mənə aqillərimiz qoy havadarlıq eləsin,
Cahilin mən havadar olmasını istəmirəm.



Qoy ağarsın saçımız ömrümüzün qış fəsli,
Mən bahar əyyamı qar olmasını istəmirəm.

Canavardan daha çox ahunu ovlar ovçu,
Ahunun mənsə şikar olmasını istəmirəm.

Oxudum Hafizi təkrar... Xəcalət çəkdim,
Əlimin bir də qabar olmasını istəmirəm.

Qayə, Şahin, ne şerdir, nə də şairlikdir,
Qələmin əldə bekar olmasını istəmirəm.

*13.05.1998*

***

Niyə tüğyan eləyir hiyləvü şər, bilməyirəm,
Niyə gündən-günə artmaqda kədər, bilməyirəm.

Nə gərəkdir bu qədər sərhədi yer kürrəmizin,
Nəyə lazım axı sərhəddə çəpər, bilməyirəm.

Bəllidir ki, hamı Adəm babanın övladı,
Bəşəri bəs niyə qırmaqda bəşər, bilməyirəm.

Şərri batil edəcəkdirmi həqiqət günəşi
Və həqiqət çalacaqdırmı zəfər, bilməyirəm.

Iki məzhəb niyə bir dinə zərər vurmaqda?
Mən zərərli bu zərərdən də zərər bilməyirəm.

Nə qədər fırlanacaqdır görəsən yer kürəsi?
Hələ çox dövr edəcəkdirmi qəmər, bilməyirəm.

Aləmin əvvəli heçdir, sonu heç, ey Şahin,
Yapışıblar niyə heçdən bu qədər, bilməyirəm.

*18.05.1998*

***

Etməyir bir də təbəssüm mənə sevda, neynim?
Gəlməyir gözlərimə azca da röya, neynim?

Yenə getmək diləyir yar gedən səmtə ayaq,
Məni əldən salacaqdır bu təmənna, neynim?

Biri dünya, biri üqba - buna şəkkim yoxdur,
Biri gerçək, o biri amma müəmma, neynim?

Üç gözəl surəti yaddan çıxara bilməyirəm:
Biri Şirin, biri Əzra, biri Leyla, neynim?

Qəzəlim öylə şirindir ki, edən var qibtə,
Biri qənddir, biri həlva, biri xurma, neynim?

Şerimin verdiyi ahəngi verirlər guya:
Biri tardır, biri neydir, biri zurna, neynim?

Tək deyilsən quyuda ah eləyən, ey Yusif,
Şərə salmış məni də indi Züleyxa, neynim?

Hər gözüm göy Xəzərə bir neçə dərya axıdır,
Qarışır bir dənizə bir neçə dərya, neynim?

Demişəm bir kərə səhrayə ki, Məcnun oluram,
Güləcəkdir yenə, Şahin, mənə səhra, neynim?

*8.08.1998*

***

Qabağında gözümün mən yenə canan görürəm,
Aləmi, bəh, nə gözəldir ki, çırağban görürəm.

Kədərim çoxsa da, ah etməyirəm çoxlar tək,
Elə ki, ah edirəm, yarı pərişan görürəm.

Haçan aşiqləri tərk eyləyəcək qəm-qüssə?
Yenə fəryad eşidir, mən yenə əfğan görürəm.

Bəzi cahillər ilən cəngim olur hərdənbir,
Elə ki, sülh edirik, ortada şeytan görürəm.

Katib idim, yeni "Məcməş-şüəra" sədri mənəm,
Neçə gündür neçə bədxahı peşiman görürəm.

Yazılıb türk qəzəli əcnəbi sözlərlə müdam,
Qəzəli seyr eləyib mən yenə nöqsan görürəm.

"Saf yazıb lovğalanır - söyləməsinlər", Şahin,
Mən bu gün təkcə özümdə belə imkan görürəm!

*10.08.1998*



***

Yar gəlibdir yenə, haləti xürrəm mənəm,
Həmdəm olubdur mənə, meysiz olan dəm mənəm.

Sirdaşıyam yoldaşın, yoldaşıyam sirdaşın,
Yol daşıyam sirdaşın, həmdəmə həmdəm görürəm.

Bir kəsə dərd alsa yan sanki mənəm bağrıqan,
Dərdi başından aşan, hey daşıyan qəm mənəm.

Tutduğa yol düppədüz, cəhdi təmiz, cəhdi düz,
Peymanı saf, əhdi düz, qayəsi möhkəm mənəm.

Hər nə qədər biz varıq eşqə xilaf olmarıq,
Yun çubuğundan arıq varsa bir adəm - mənəm.

Şahini Aşiq sayın, sevgiyə layiq sayın,
Qəlbi bu gün arxayın, fikri bu gün cəm mənəm.

*7.09.1998*

***

Mən yenə gülzarə gəlim-gəlməyim?
Gəlmədə gül zarə, gəlim-gəlməyim?

Tənə edib yaraləyibsən məni,
Qan axıdır yarə, gəlim-gəlməyim?

Əllərini ver eləsin çarəmi,
Almaq üçün çarə gəlim-gəlməyim?

Batdı günəş, göydə bədirləndi ay,
Ol mənə ayparə, gəlim-gəlməyim?

Badə deyil, məst eləyir eşq məni,
Mən meyi inkarə gəlim-gəlməyim?

Olmasa eşq, dar ağacım gözləyir,
Çıxmaq üçün darə gəlim-gəlməyim?

Mən sənə ağ gün dilərəm, yoxdu şəkk,
Oldu günüm qarə, gəlim-gəlməyim?

Eşqdə israr eləyir Şahinin,
Eşqimi israrə gəlim-gəlməyim?

*1.10.1998*

***

Dedi zərgər "zəri, dürdanəni üstün tutdum",
Mənsə ömrüm boyu cananəni üstün tutdum.

Nəzərimdə arabir doğmalarım yadlaşdı,
Elə vaxt oldu ki, biganəni üstün tutdum.

Mən kimi özxoşuna cismini yandırmaqda,
Şamı yox, ey pəri, pərvanəni üstün tutdum.

Deməyin çapdı dağı, söyləməyin oldu dəli,
Dağçapan aşiqi, divanəni üstün tutdum.

O səbəbdən ki verir ətrini yarın saçının,
Bağiban, bağçadakı nanəni üstün tutdum.

Mey canı məst eləyir, sevgi isə məstanə,
Məsti yox, bəlli ki, məstanəni üstün tutdum.

Döyüşə atlanıban öndə özü getmişdir,
Şah Xətai kimi mərdanəni üstün tutdum.

Bihəya molla olan məscidə getməkdənsə,
Şahina, mən yenə meyxanəni üstün tutdum.

*6.10.1998*

***

Gəlmisən, dərdim gedib, qüssəm gedib, qəm görmürəm,
Ey pəri, səndən səva dünyadə adəm görmürəm!

Gülşənin hər şəbnəmi axmışdı gözdən, indisə
Göz də var, gülşən də var, gülşəndə şəbnəm görmürəm.

Hər tərəf, hər yan sərasər indi cənnətdir mənə,
Söyləyirlər var cəhənnəm, mən cəhənnəm görmürəm.

Görmürəm sərdarı da, dildarı da, əğyarı da,
Şəkk yox, aləmdəyəm, amma ki, aləm görmürəm.

Dağyaran yox, çölgəzən yox, yandıran yox cismini,
Görmürəm, eşq əhlini eşqində möhkəm görmürəm.

Xəstələnsəm, ey təbibim, çarə vəslindir fəqət,
Qeyri həb görsənməyir, mən qeyri məlhəm görmürəm.



Şahina, billah bu misradən xoşum gəlməkdədir:
Ey pəri, səndən səva dünyadə adəm görmürəm!

*13.10.1998*

***

Günümü qarə edibdir o qədər yar mənim,
Başıma yağmadadır gör nə təhər qar mənim.

Niyə kəsmir daha əqlin bıçağı əğyarı?
Hələ əğyar ilə çox haqq-hesabım var mənim.

Demə "kim qılsa namaz cənnət onun", ey zahid,
Bu işin təsdiqi olsun sənin, inkar mənim.

Cənnətə düşməyi bir zat müəyyən edəcək,
Ürəyimdə yaşayır tək ona iqrar mənim.

Təsbehin danələrindən neçə qat çox günəhin,
Ağzımı açma, günəhlər sənin, izhar mənim.

Var dua eyləməyin min bir əməl xatirinə,
Ürəyim oldu fəqət eşqə giriftar mənim.

Şahinəm, sözlərim içrə yamanını varsa əgər
Kəndiri qoy sənin olsun, baş ilə dar mənim.

*30.10.1998*

***

Aşiq olcaq əməlim öylə əyan oldu mənim,
Elə sandım ki, şaham, cümlə cahan oldu mənim.

Günlərin bir günü bir yaxşı silah aldım mən,
Oxu düşmənlərimə batdı, kaman oldu mənim.

Talayırlar neçə ildir nə qədər sərvətimi,
Mənfəət qeyrisinə çatdı, ziyan oldu mənim.

Çox təəssüf ki, itirdim nə qədər torpağımı,
Feyziyab özgələri oldu, fəğan oldu mənim.

Qorumaqçın gülü bir bağda keşik çəkdim mən,
Arxayınlıq gülün oldu, həyəcan oldu mənim.

Dörd fəsil qismət ola ömrünə, yarəb, hamının,
Ikisi - gendə, biri - öndə, xəzan oldu mənim.

Şahina, mən canı canana verib şad oldum,
Aldı canan canımı, söylədi: - Can oldu mənim!

*Lənkəran, 17.12.1998*

***

Bu gecə qüssədən, ey yar, kənar olmalıyam,
Saqi mey verməsə də məstü xumar olmalıyam.

Əzm ilən qəddim ucalmaq diləyir əflakə,
Sarmaşıqlar bunu bilsin ki, çinar olmalıyam.

Bir zaman görməyəcəklər səni, ey Yer kürəsi,
Sən yox olsan belə mən daima var olmalıyam.

Etinasızlığa zidd olmuşam aşiqlikdə,
Nə qədər ki diriyəm, mən yara yar olmalıyam.

Atını sən Qarabağdan yana səyritmişsən,
Ey süvari, yerə düş sən ki, süvar olmalıyam.

Məni şad eyləyəcəkdir, bilirəm, iqbalım,
Yoxsa, əlbəttə ki, ömrüm boyu zar olmalıyam.

Şahina, düşmənimi qovmalıyam yurdumdan,
Canavar qovmaq üçün mən canavar olmalıyam!

*4.01.1999*

***

Ey yar, olacaqdırmı kamal əhlinə yardım?
Şer əhlinə, eşq əhlinə, hal əhlinə yardım?

Şahin qarabəxtin nə üçün bəxti açılmır?
Hey fikr eləyir, yoxmu xəyal əhlinə yardım?

Şairdi - uğursuz hələ, aşiqdi - zavallı,
Etmək diləmir kimsə zaval əhlinə yardım.

Biçarələrin dərdinə dərman olacaqmı?
Rəbbim də edir cahü cəlal əhlinə yardım.

Can oldu yarımcan kimi, qəlb oldu məlallı,
Ey Tanrı, edilməzmi məlal əhlinə yardım?

Getdikcə suallar çoxalır məndə, tez eylə
Bir yaxşı cavab ilə sual əhlinə yardım.



Şahiń ki, vüsal aşiqidir yardıma möhtac,
Vəslin diləyir, et bu vüsal əhlinə yardım.

*21.01.1999*

***

Yarsız yox kimiyəm, amma ki, yar ilə varam,
Məni xoşbəxt eləyən nazlı nigar ilə varam.

Yenə qan qaynamada, güllər açılmaqda, gülüm,
Ilin ilk fəsli mübarəkdi, bahar ilə varam.

Mən xumar istəmirəm saqi meyindən gəlsin,
Mənə versən sən əgər mey o xumar ilə varam.

Qəlbimi eşq oyununda mən uduzdum dərhal,
Qumarı sevmirəm, amma bu qumar ilə varam.

Məni qürbət küləyi çox eləyib zar, amma
Giləvar əssə Xəzərdən giləvar ilə varam.

Mən şüarbaz deyiləm bəzi siyasətçi kimi,
Amma "Qoy var ola sevda!" - bu şüar ilə varam.

Kəsici hər silahı, aləti rədd eyləyirəm,
Dilə yad kəlmələri kəssə, mişar ilə varam.

Bu günün şeri yazılsın sözü ilən bu günün,
Şahinəm, mən yenə əvvəlki qərar ilə varam.

*26.01.1999*

***

Hanı səhra yolu, ey Qeys, şəhərdən qaçıram,
O yolu tapmıram, hərçənd səhərdən qaçıram.

Quru böhtanın əlindən qurudum taxta kimi,
Indi şər yağmadadır, mən quru şərdən qaçıram.

Qorxuram bəd nəzərindən bədəsil insanın,
Dəyməməkçin nəzərə bir də, nəzərdən qaçıram.

Kədərim yerləşə bilmir daha dar mənzilimə,
Uzaq olmaq diləyim var ki, kədərdən qaçıram.

Zərərimdən nə qədər mərdiməzar faydalanıb,
Faidə görməyibən indi zərərdən qaçıram.

Gəzdirib söz arada gəl məni agah eləmə,
Ey xəbərçi, məni bezdirmə, xəbərdən qaçıram.

Şahinəm, zənn edirəm qovmayacaqsan məni sən,
Hanı səhra yolu, ey Qeys, şəhərdən qaçıram.

*5.03.1999*

***

Könlümün iqrarı elmdir, elm,
Sevgili dildarı elmdir, elm.

Cahili inkar eləsəm var yeri,
Cahilin inkarı elmdir, elm.

Ağladı ilham pərisi ilə yar:
- Yarımızın yarı elmdir, elm.

Biz ki, ikiydik, niyə üçləşmişik?
Yarı bizik, yarı elmdir, elm.

Qəlbini bəs bizlərə vermişdi o?
Qəlbinin ilqarı elmdir, elm.

Var-yoxu guya ki, biz idik onun,
İndi onun varı elmdir, elm.

- İnciməyin, - söylədim israr ilə,
Alimin isrları elmdir, elm.

Şahinə üç sevgili etmiş vəfa,
Ümdə vəfadarı elmdir, elm!

*7.03.1999*

***

Ey məni bədbin görən, zülmü sitəm görmüşəm,
Dağ kimi dərd çəkmişəm, sel kimi qəm görmüşəm.

Vəslə ümid eyləyən aşiqi - ümmidvar,
Eşqə ümidsiz baxan gözləri - nəm görmüşəm.

Əyninə zahid geyib sanki kəfəndən libas,
Başdakı əmmaməmi, yoxsa kələm görmüşəm?

Elm hara, cahil hara, qoy eşidə bisavad,
Mən ki, kitab açmışam, mən ki, qələm görmüşəm.



Kim ki, halalzadədir, yox işi dəllal ilə,
Mən nə sələm vermişəm, mən nə sələm görmüşəm.

Dinləmişəm şerini bir neçə şairciyin,
Zurnanı zornan çalan zurnaçı həm görmüşəm.

Cəm baxıban caminə görmüş idi aləmi,
Camə baxıb mən isə, Şahina, Cəm görmüşəm.

*14.03.1999*

***

Xəbərin gəlmədi, canan, yenə yoxdur xəbərim,
Təzədən oldu könül qan, yenə yoxdur xəbərim.

Əsəbim öylə gərilmiş ki, əlacım yoxdur,
Xəbərin varmı, a loğman, yenə yoxdur xəbərim.

Mən ki dərmanı heç halətdə pəsənd etməzdim,
Gətirin tez mənə dərman, yenə yoxdur xəbərim.

Dəli şeytan salıbdır araya hicranı,
Lənət olsun sənə, şeytan, yenə yoxdur xəbərim.

Yol uzun, mənzil uzaqdır, nə gələn var, nə gedən,
Bilmirəm kimdədi nöqsan, yenə yoxdur xəbərim.

Neçə yol böyləcə qeyb olmuş idi imkanım,
Yenə yoxdur mənə imkan, yenə yoxdur xəbərim.

Şahin olmuş təzədən zar xəbərsizlikdən,
Xəbərin varmı, a canan, yenə yoxdur xəbərim.

*15.04.1999*

***

Sevib hərçənd ki, çox nalə, fəğan öyrəndim,
Bəxş edib canımı cananıma can öyrəndim.

Nə qədər şöhrətü şan kəsb eləmiş adəm var...
Nə böyük şöhrətə çatdım, nə də şan öyrəndim.

Neçə alim neçə illər boyu baş sındırdı,
Mən isə rəmzü müəmmanı asan öyrəndim.

Kimi yaylaq, kimi qışlaq, kimi səhra, kimi dağ,
Kimi öyrəndi şəhər, mənsə cahan öyrəndim.

Biri qansız, biri qanlı, biri qanmaz çıxdı,
Baxıban zərrəbin ilə neçə qan öyrəndim.

Dedilər "xeyri unutdun", dedilər "oldu ziyan",
Beləyəm mən, unudub xeyri ziyan öyrəndim.

Çox elmdən xəbərim olmadı, Şahin, amma
Mən məhəbbət deyilən elmi yaman öyrəndim.

*16.04.1999*

***

Mən bütün namərdlərə biganə olmaq istərəm,
Öyrədin, ey mərdlər, mərdanə olmaq istərəm.

Bir neçə rəhmətliyin əfsanəyə dönmüş adı,
Ölməmişdən mən isə əfsanə olmaq istərəm.

Çox gözəllər könlümü məst eyləyibdir, indisə
Tək səninlə, ey gülüm, məstanə olmaq istərəm.

Şam olub yandırmışam, əfsus, çox pərvanəni,
İndi mən pərvanəyə pərvanə olmaq istərəm.

Lütf elə, yarım, mənim cismim qarışsın zülfünə,
Yox saçında nanə ətri, nanə olmaq istərəm.

Çaldıranda sən uduzdun cəngi, ey Şah İsmayıl,
Sən təkin məğrur olub, şahanə olmaq istərəm.

Şahinəm, əql əhli olmaqdan uzaqlaşdım, bilin,
Mən daha Məcnun kimi divanə olmaq istərəm.

*24.04.1999*

***

Yumuram gözlərimi dilbəri görməkdə gözüm,
Açıram kipriyimi dəftəri görməkdə gözüm.

Saf qəzəllər yaradan azdı bizim məclisdə,
Necə şadəm ki, bu gün Ənvəri görməkdə gözüm.

Görürəm saqini meyxanədə, məsciddə isə
Baxmıram zahidə heç, minbəri görməkdə gözüm.



Dedilər çoxdu pəri, yadıma yarım düşdü,
Görmürəm çox pərini, bir pəri görməkdə gözüm.

Mənə Zəmzəm elə Qudyal çayıdır yurdumda,
Görmürəm Kövsəri mən, Tərtəri görməkdə gözüm.

Varmı rəhbər ola Şah İsmayıla tay, hələ də
Şah Xətai kimi bir rəhbəri görməkdə gözüm.

Biri "Qeysəm" dedi səhrayə qaçıb, dilləndim:
Elə aşiq tək olar, sərsəri görməkdə gözüm.

Bu səlis, saf qəzəlim dilbəri heyran elədi,
Dedi: - Şahin, elə bil zərgəri görməkdə gözüm.

*2.05.1999*

***

*Məşhədi yuxuda gördüm...*

Fikrimə cananı gətirməkdəyəm,
Cananı yox, canı gətirməkdəyəm.

Mən təzədən Məşhədə meyl eylədim,
Meylimə imkanı gətirməkdəyəm.

Eyləsə də şad Xorasan məni,
Xatirə Şirvanı gətirməkdəyəm.

Sən mənə mey süzdün acı, saqiya,
Mənsə sənə şanı gətirməkdəyəm.

Var gətirən şerə şəkər sözləri,
Mən - şəkəristanı gətirməkdəyəm.

Sədi "Gülüstan"ı yazıb, mən dəxi
Şerə gülüstanı gətirməkdəyəm.

Cövrünə tab eyləmirəm hicranın,
Qətlinə fərmanı gətirməkdəyəm.

Göz önümə, Şahina, hər ləhzə mən
Azəribaycanı gətirməkdəyəm.

*4.07.1999*

***

Cahilə biçarə deyən şairəm,
Qarəyə mən qarə deyən şairəm.

Öylə sanırlar ki, qəmim yox mənim,
Mən qəmi qəmxarə deyən şairəm.

Yarə yar olmaqdı mənim niyyətim,
Niyyətini yarə deyən şairəm.

Məsləkə yad, aşiqə yad, eşqə yad! -
Bunları ağyarə deyən şairəm.

Düşdü çölə tərk eləyib şəhrini,
Məcnuna avarə deyən şairəm.

Qıyma könül mülkü pərişan ola, -
Xahişi memarə deyən şairəm.

Edama Həllac "əleyküm" dedi,
Mən də "salam" darə deyən şairəm.

Şahinə bax, çoxlarına ağ olur,
Qarəyə mən qarə deyən şairəm.

*21.07.1999*

***

Nə o əvvəlki dilim var, nə səsim var mənim,
Başqa dünyayə tələshatələsim var mənim.

Qanadım varsa da gəlmir ümidim pərvazə,
Uçmağın mümkünü yoxdur, qəfəsim var mənim.

Bizə dinsizliyi təlqin edib Allahsızlar,
Nə bu gün başda araxçın, nə fəsim var mənim.

Məni Isa nəfəsi ölməyə qoymur sanki,
Can üzülmüşsə də, lakin nəfəsim var mənim.

Meşəsindən qəzəlin kol-kosu ləğv eyləyirəm,
Palıdım var, söyüdüm var, vələsim var mənim.

Mən ki bu aləmi fəth eyləmədim, ey Şahin,
O biri aləmi tutmaq həvəsim var mənim.

*31.10.1999*



***

Yarım ilən görüşə ahü fəğansız gedirəm,
Daha mən söyləmirəm vəslə gümansız gedirəm.

Hanı əvvəlki duman-çən, hanı bəs qarə bulud?
Şahdağın örpəyi düşmüş və dumansız gedirəm.

Çıxmışam çox səfərə, faidə verməkdi peşəm,
Bu mənəm, getdiyim hər səmtə ziyansız gedirəm.

Gözlənilməz görüşün zövqü, səfası çox olar,
Mən bəyan etməmişəm yarə, bəyansız gedirəm.

Iztirabım yox olubdur və əzabım bitmiş,
Rahətəm, arxayınam, mən həyəcansız gedirəm.

Bu gecə sevgilisi Şahini xoşbəxt elədi,
Canı cananə verib, şəst ilə cansız gedirəm.

*14.12.1999*

***

*Tamridaya!*

Yenə var ah, kədər, qüssə fəğanımda mənim,
Təkliyin var yenə təhlükəsi canımda mənim.

Dəymişəm könlünə hərdən, məni əfv eylə, gülüm,
Etiraf hiss edəcəksən bu bəyanımda mənim.

Uğurum var isə, uğrumda təlaşındı fəqət,
Çox olubdur əməyin şöhrətü şanımda mənim.

Dövrümün vəlvələsindən canıma ağrı dolub,
Qoca sinnimdə, bu çağımda, zamanımda mənim.

Mən sənin cənnətə yollanmağını istəmirəm,
Çünki, sən olmalısan, ey pəri, yanımda mənim.

Qulluq etmək sənə zənn etmə ziyan oldu mənə,
Nə qədər mənfəətim var ziyanımda mənim.

Dedilər Səncər ədalətli olubdur, var isə
Göstərin ədli zamanımda, məkanımda mənim.

Var gümanım ki, baş aşiq var isə yerdə, mənəm,
Bilmirəm varmı həqiqət bu gümanımda mənim?

Saflığı təlqin edib bağlamışam bir "Divan",
Dilimin təntənəsi var "Divan"ımda mənim.

O cahan eşqini, Şahin, hələ dərk eyləmirəm,
Dadmışam həzzini eşqin bu cahanımda mənim.

*11.02.2000*

***

Mən yenə avarəyəm, qarşına gəlməkdəyəm,
Ömrü, günü qarəyəm, qarşına gəlməkdəyəm.

Bir-birini seyr edir daima səyyarələr,
Gör necə səyyarəyəm qarşına gəlməkdəyəm.

Birgə idik, bir zaman tam idi xoşbəxtliyim,
İndi isə parəyəm, qarşına gəlməkdəyəm.

Gözdə yaşım dupduru, Baxçasaray qupquru,
Gözləri fəvvarəyəm, qarşına gəlməkdəyəm.

Gəlmədəyəm qarşına, ey pəri, əğyar yox,
Başqa üzüqarəyəm, qarşına gəlməkdəyəm.

Gəl demə "biçarədir" Şahinə əvvəlki tək,
Dərdlərinə çarəyəm, qarşına gəlməkdəyəm.

*16.04.2000*

***

Yar, eşitməzsən kəlamım, vəssalam,
Bir də görməzsən salamım, vəssalam.

Güzgü tək sən qəlbimi sındırmısan,
Eşqinə yoxdur inamım, vəssalam.

Bil ki, səndən bir daha kam almaram,
Dilbəra, şer oldu kamım, vəssalam.

Şam idi qəlbim mənim, yanmaz daha,
Cismimi yandırdı şamım, vəssalam.

Məşhədi, həm kərbəlayi olmuşam,
Var halalım, yox haramım, vəssalam.



İntizamım daş-dəmirdən bərk olub,
İndi möhkəmdir nizamım, vəssalam.

Şahinin meyxanəsindən düş uzaq,
Düşdü badəm, sındı camım, vəssalam.

*16.05.2000*

***

Sözün üstünlüyü, əlbət, kəsərindən məlum,
Zərgərin düzlüyü, məlum ki, zərindən məlum.

Əməyi bağibanın gördüyü işdən bəlli,
Ağacın bağdə ömrü səmərindən məlum.

Qarabağ torpağı azad olunar inşallah,
Millətin mərdliyi, əzmi zəfərindən məlum.

Asimanın yeri seyr etməyi heyran-heyran
Ulduzundan, günəşindən, qəmərindən məlum.

Milli sərvətləri öldürmədə insan, bu onun
Kür çayından, Arazından, Xəzərindən məlum.

Çox kitab çap eləyənlər bunu bilmirlər ki,
Şairin qiyməti şerin dəyərindən məlum.

Demirəm mən sizə ömrüm nə sayaq ötmüşdür,
Şahinin ömrü təmamən əsərindən məlum.

*25.05.2000*

***

Qovğa zamanı nərgizü reyhan nəyə lazım?
Sevda zamanı xəncərü qalxan nəyə lazım?

Fərmanı sayılmırsa, gərəkmi elə sultan?
İcra eləyən yoxdusa, fərman nəyə lazım?

Sabitsə ədalət, nə gərək ölkəyə hakim?
Yoxdursa oğurluq, bağa bağban nəyə lazım?

Mən ziddinəyəm hər cürə dinin kürəmizdə,
Olmazsa küfr yerdə, müsəlman nəyə lazım?

Biganə deyim çox!.. Üyüdən ər gərək olsun!
Olmazsa dəyirmançı, dəyirman nəyə lazım?

Vəslin, əgər olmazsa hicr, qədri bilinməz,
Amma, deməyək aşiqə hicran nəyə lazım?

Şahin, belə misra çox olub, mən də deyim qoy:
Cananəyə olmazsa fəda, can nəyə lazım?

*13.07.2000*

***

Misə meyl eyləmə ki, zər verrəm,
Cövhərimdən sənə gövhər verrəm*.

Mənə dərd ver səni bidərd eləyim,
Ağu ver, mən sənə şəkkər verrəm.

Mənə sən bircə tikan bəxş eləsən,
Sənə mən lalə, sənubər verrəm.

Təki sən cəng elə əğyar ilə,
Əlinə şəst ilə xəncər verrəm.

Ya Ilahi, daha bəsdir Şəddad,
Söylə ki, aləmə Səncər verrəm.

Yaz, a şair, qəzəli Şahin tək,
Dəftərin olmasa, dəftər verrəm.

*15.09.2000*

***

Zənn edirlər yenə xoş növrağımız var bizim,
Amma, hicranın əlindən dağımız var bizim.

Qarışıbdır neçə rəng bir-birinə, Allahım,
Etməsin qürrə qəra rəng, ağımız var bizim.

Boy atır bəzən alağ otları yerdən, amma
Yetirən lalə, sənubər bağımız var bizim.

Örtərək yarpağını Adəmə Həvva dedi ki,
Yox utancaqlığımız, yarpağımız var bizim.

---

*"- Əql tacəst, çenin goft betəmsil Əli:
- Tac ra gövhəri-nov bəxş to əz cövhəri-xiş".
Tərcüməsi:
"Bənzədib əqli taca böylə buyurmuşdur Əli:
- Cövhərindən yeni gövhər elə bəxş tacına sən".

**Mövlana Cəlaləddin Rumi**



Ola qoy natəmiz əllər vətənimdən aralı,
Bir müqəddəs, bir ulu torpağımız var bizim.

Qüvvəli düşmənimiz varsa da, gücsüz deyilik,
Onu cırmaqlamağa dırnağımız var bizim.

Gördü Şahin yarı bədbin, dedi nikbinliklə:
- Gözəlim, batma qəmə, xoş çağımız var bizim.

*5.10.2000*

***

Mən yuxumda mey dolu meyxanələr yandırmışam,
Badələrdən məst olan məstanələr yandırmışam.

Mən xəyalımda, cünun timsalı sərgərdan olan
Dərvişi evsiz görüb kaşanələr yandırmışam.

Saf sözə laqeyd olan kəs yar yox, biganədir,
Saf dilə həmdəm mənəm, biganələr yandırmışam.

Ey xürafat, olmuşam mən dinimin divanəsi,
Ey nağılçı, düz mənəm, əfsanələr yandırmışam.

Doğrudur, namərd olan adəmlərə od vurmuşam,
Mən haçansa, kim deyər, mərdanələr yandırmışam?

Piltəmin son hissəsi yanmaqdadır şamdanda,
Öylə şəməm, Şahina, pərvanələr yandırmışam.

*27.12.2000*

***

Mənə nöqsanmı ki, "Eşq" kəlməsini car edirəm,
Tutiyəm, xoşladığım kəlməni təkrar edirəm.

Bülbülün dərdi, gülün dərdi, elin dərdi mənim...
Özümü gör nə qədər dərdə giriftar edirəm.

Baxıram hey göyə, amma dəli zənn eyləməyin,
Eşqimi asimana mən belə izhar edirəm.

Nə mühəndis gərəyimdir, nə kömək bənnadən,
Könlümün təmiri üçün yarı memar edirəm.

Şahinin dini fəqət sevgi-məhəbbət dini!
Əlli ildir ki, bütün dinləri inkar edirəm.

*5.01.2001*

***

Hərdən ki çəkirdin mənə dağ, inciməmişdim,
Səndən, gözəlim, heç bu sayaq inciməmişdim.

Gözlərdəki göz yaşları tək damcılayırsan,
Bir damcı da yardan, a bulaq, inciməmişdim.

Bir dəfə uzaqdan yarı görcək elə aşdım,
Düşdüm yerə zirvəndən, a dağ, inciməmişdim.

Hərdən dodağından mənə eyham gələndə
Dil bilməsə də, bildi dodaq, inciməmişdim.

Hərdən yara baxmaq diləyərkən gecə vaxtı,
Təbim kimi sönmüşdü çıraq, inciməmişdim.

Hərdən gileyim vardı mənim göz qapağından,
Hərdən məni qoymuşdu oyaq, inciməmişdim.

Hərdən də subaylar kimi tək bağda gəzəndə
Bağban məni qovmuşdu, a bağ, inciməmişdim.

Yarım bu gecə gəlmədi röyamə, nə işdir,
Şahin, hələ yardan bu sayaq inciməmişdim.

*9.03.2001*

***

Eşqi idrak edibən sən gözələ yar oldum
Və səni dərk eləyib eşqə giriftar oldum.

Bacarıq məndə mühəndisliyə yoxdur, amma
Qəlbini təmir edəndən bəri memar oldum.

Bilməyirdim nədi pərgar, nədi nöqtə, nədi qövs,
Dolanıb sən gözəlin başına pərgar oldum.

Bəsləmək gül daha müşküldü kitab yazmaqdan,
Bağiban güldü mənə, gör nə sayaq xar oldum.

Kimsəni zar eləmə, Tanrı, mənə rəhm eylə,
Zar olan bəndələri seyr eləyib zar oldum.



Saqinin verdiyi meydən hamımız nuş elədik,
Dostların hər biri məst oldu, mən hüşyar oldum.

Yox idi sadə qəzəl Vahid öləndən sonra,
Şahinəm, mən qəzəli var eləyib var oldum.

*26.03.2001*

***

Qocalıq gəldi yaman tez, pozulub növrağım,
Sarılıb belimə canan qolu tək qurşağım.

Oylağım Çənlibel idi, Babadağ, Şahdağdı,
İndi eyvandı fəqət, evdi fəqət ovlağım.

Hanı əyyam ki, bardağla içərdim badə?
Badə yoxdur qabağımda, qırılıb bardağım.

Qaldırardım neçə pudluq daşı dırnağımla,
İndi qaldırmayır hətta tükü də dırnağım.

Məni düşmənmi salıb böylə hala, Allahım?
Girə düşmənlərimin gözlərinə barmağım.

Özgə torpaqda gözüm yox, bunu bilsin yağı,
Amma, öz torpağıma sancılacaq bayrağım!

Yamyaşıl bir ağac oldum o qəzəl bağında,
Saralıb indi xəzəlləşmədədir yarpağım.

Gəzirəm torpağımın üstdə bu gün mən, Şahin,
Olacaq sinəmin üstündə sabah torpağım.

*27.07.2001*

***

*Möcüzanə*

Nə mey sərməst edir canı, nə canan ilə məşğuləm,
Bu günlər məndə qəm vardır və hicran ilə məşğuləm.

Əsər yoxdur əzəlki şənliyimdən az da, məlum ki,
Canımda həzzə yer yoxdursa əfğan ilə məşğuləm.

Zamanın gərdişindən olmuşam bietina öylə,
Nə müşkillə işim vardır, nə asan ilə məşğuləm.

Sədaqət padişahı söyləyir millət mənə, lakin
Nə hökmüm var, nə əmrim var, nə fərman ilə məşğuləm.

Qəzəl bağında güllər bəsləməkdir niyyətim daim,
Bu bağdan bağıban getmiş, gülüstan ilə məşğuləm.

Dünən mən də firavandım, dünən canan da şad idi,
Bəla əskik deyil məndən, bu gün can ilə məşğuləm.

Pərişandan pərişandır didərginlər bu saətdə,
Pərişanxatirəm, çünki pərişan ilə məşğuləm.

Saçım ağ, saqqalım ondan da ağdır, Şahina, sanki
Peşəm buğda üyütməkdir, dəyirman ilə məşğuləm.

*3.08.2001*

***

Nə ağır gün oldu, yarəb, elədim həzər bu gündən,
Mənə mey gətirmə, saqi, mənə ver zəhər bu gündən.

"Səfərin xətərsiz olsun" deyə sən dua edərdin,
Məni gözləyir sərasər, gözəlim, xətər bu gündən.

Mənə vacib oldu səhra, belə bir qərara gəldim:
Yeni Qeysə qəh-qəh ilə güləcək şəhər bu gündən.

Mənə eşq meydanında deyilib təpərli aşiq,
Daha qalmayır canımda mənə bir təpər bu gündən.

Itilik sözümdən itdi, quruluq gözümdən itdi,
Acı göz yaşım sel oldu, daşacaq Xəzər bu gündən.

O şirin dilinlə hərdən mənə "tuti" söyləyərdin,
Hanı şirnidə şirinlik, acıdır şəkər bu gündən.

Uça bilməyir bu Şahin, qaça bilməyir bu Şahin,
Aramızda səddə bənzər çəkilib çəpər bu gündən.

*19.09.1995*

***

Yenə gəl bu padşahın sənə ehtiyacı olsun,
Başının tacı yox olmuş, yenə gəl ki, tacı olsun.

Yenə gəl ki, xəstəhaləm umuram sənin şəfanı,
Sevənin məzacı yoxdur, yenə gəl məzacı olsun.

Gözəlim, beş-altı loğman edə bilməyib əlacım,
Mənə çarə et özün ki, qəmimin əlacı olsun.

Saçının qulacı olsun günəşin şüası boyda,
Günəşin şüası boyda saçının qulacı olsun.

Təzədən şer bağında yenə qarğalar edir qarr,
Yaraşar o bağə bülbül, o bağın turacı olsun.



Tələsək, cəza gərəkdir, təzədən çoxaldı əğyar,
Hanı Musanın əsası əlimin ağacı olsun.

Qəzəlin zamanıdırmı, nə qəzəl yazır bu Şahin?
Hanı Ağqoyunlular ki, qəzəlin rəvacı olsun.

*27.09.1995*

***

Ey könül, valeh olubsan elə cananəyə sən,
Bənzəmirsən daha, əlbəttə ki, viranəyə sən.

Biz məhəbbətdə əzəldən elə sabitqədəmik,
Mərdə timsal özüməm, ey pəri, mərdanəyə sən.

Bir kitab söz danışırsan məni hər vaxt görcək,
Döndəribsən, gözəlim, qəlbi kitabxanəyə sən.

Ətri vardırmı qərənfil gülünün bir zərrə?
Bənzəyirsən bu cəhətdən necə də nanəyə sən.

Ey gözüm, cəlb eləyibdir səni məhrəm, parla,
Mərhəba, baxmayacaqsan daha biganəyə sən.

Bu cahanın niyə dürdanəsi az, dürrüsə çox?
Dürrə oxşar görürəm çoxları, dürdanəyə sən.

Gözəlim, Şahini divanə edibdir zülfün,
Zülfünü zəncir elə indi bu divanəyə sən.

*13.11.1995*

***

Çox sevən görsə də illərlə yaşından Şahin,
Açmayır baş neçə yurdun savaşından Şahin.

Narahatlıq elə dolmuş canına, çox vədə
Tapmayır yer özünə heç təlaşından Şahin.

Tuşlanıb gəlsə də, biganə daşından qorxmaz,
Həmişə qorxmada aşina daşından Şahin.

Üstünə cumsa da bir dəstə adam, tərpənməz,
Amma ki, qaçmada canan dalaşından Şahin.

Neçə şahin quşunun seyr eləmiş pərvazın...
Geriyə qalmayacaqdır adaşından Şahin.

Nənə sac yandırar idi bizə hər gün, yenə də
Nənənin kaş ki, dadaydı lavaşından Şahin.

Demədimmi ona gənclikdə ki, az fikr etsin,
Qoca görsənmədədir indi yaşından Şahin.

Başı qürbətdə çəkibdir o qədər zillət ki,
Şama bənzər, yanacaq, yansa, başından Şahin.

*15.11.1995*

***

Gəlməzsən əgər əl çəkəcək can canımdan,
Gəlsən, gedəcəkdir acı hicran canımdan.

Gəlsən, sənə bağban kimi xidmətdəyəm, ey gül,
Eyvah, çıxıbdır neçə imkan canımdan.

Sən canını bənd eyləmisən canıma, yoxsa
Etmək diləyirsən canını yan canımdan?

Asiliyim, əlbət, sənə bəlli, mənə bəlli,
Cari olacaqdır yeni üsyan canımdan.

Biz bir bədən içrə iki can olmuşuq, indi
Çək canını mümkünsə, a canan, canımdan.

Hiss eyləyirəm mən açıq-aşkar, Ilahi,
Can çıxmada ahəstəcə, pünhan canımdan.

Hərçənd müayinə edib canımı, amma
Bir söz deməyibdir mənə loğman canımdan.

Canan dediyim Azəribaycandı, a Şahin,
Ayrılmayacaq Azəribaycan canımdan!

*1.12.1995*

***

Xəstə idim, o göründükdə babat oldum mən,
Nə gözəllikdi bu yarəb belə, mat oldum mən.

Neçə həzrət yaşayır məndə: Əli, Əhməd, Nuh...
Mənə həzrət deməsinlər, həzərat oldum mən.

Canfəda olmağı tədris eləyiblər öylə,
Nə qədər mötəbər insanə nicat oldum mən.

Təlqin etməksə muradım hamıya əzmü səbat,
Elə başdan-ayağa əzmü səbat oldum mən.

Mənə hər xahişi fərman kimi bildir, gözəlim,
Əsgərin tək səni görcək farağat oldum mən.



Qəddimin əyriliyi sanma qocalmaqdandır,
Sənə təzim eləməkdən ikiqat oldum mən.

Tək məhəbbət oyunundan açıram baş, sənsə
Oynayırsan elə şahmat ki, mat oldum mən.

Halva zəqqum idi sənsiz, şəkər - ağu, mey - acı,
De ki, sən tutiyə, əlbəttə, nabat oldum mən.

Yazmışam gör nə qədər nəğmə sənə, - söylədi ki,
Sənin hər nəğmənə, yarım, nəqərat oldum mən.

Sevməsəydin məni, çoxdan ölümüm yetmişdi...
Dedi: - Şahin, sənə şadəm ki, həyat oldum mən.

*20.12.1995*

***

Elə elm aləminə mail olubdur Şahin,
Birbəbir məqsədinə nail olubdur Şahin.

Bənd olandan bəri Leyla kimi bir dildarə,
Əqlini tərk edəli aqil olubdur Şahin.

Gəncliyimdən tanıyırlar məni çox imzadə,
Bir dəyişkən cərəyan, naqil olubdur Şahin.

Gah olub Fərzəli, gəh Fərzəlibəyli, hərdən
Şahini ləğv eləyib Fazil olubdur Şahin.

Çox bəla girdabına düşdü canım qürbətdə,
Çox bəla sellərinə sahil olubdur Şahin.

Bəli, sarmış məni qəflət də, bilin, çox vədə,
Bəd əməllər sarıdan qafil olubdur Şahin.

Yuxumu qoymayıram mən yaxına, vaxt azdır,
Cəhl olar söyləsələr cahil olubdur Şahin.

Söyləyir "məndən ədalətli adam yox", amma
Yuxunu qətl eləyib qatil olubdur Şahin.

*28.12.1995*

***

Şah deyirsən mənə, yarım, yenə şahmat olsun,
Gər bacarsan, o təhər oyna ki, şah mat olsun.

Mənə bir busə verib borclu edibsən özünə,
Əvəzində ürəyim qoy sənə sovqat olsun.

"Öl" deyirsən ölürəm, "öl" deməyirsən ölürəm,
Daha eşqim sənə, söylə, necə isbat olsun?

Cövrünü sən mənə, ey şux, neçə qat artırdın,
Elə cövr eylə ki, artıb neçə yüz qat olsun.

Məni təmin eləmir gündə görüm surətini,
Edirəm arizu meylim sənə ifrat olsun.

Sən muğamat oxuyanda deyirəm: - Dincəldim,
Istirahət mənə hər ləhzə muğamat olsun.

Səni, peyğəmbəri, Allahı müdam vəsf edirəm,
Qoy fəxarət mənə nət ilə minacat olsun.

Əfqanıstanda ki, təltiflə mükafatlandım,
Vətənimdə mənə tək sevgi mükafat olsun.

Neyləyim, xislətimə mat ol bilmir bu mələk,
Şahinə azca qalıbdır ki, fələk mat olsun.

*29.12.1995*

***

Təzədən, ey gözəlim, söhbətə sən xoş gəldin,
Ayrılıqdan usanıb, vəhdətə sən xoş gəldin.

Bir müqəddəs yerə, bir ülvi yola əzm etdin,
Belə qüdsiyyətə, ülviyyətə sən xoş gəldin.

Ey Məhəmməd yolunun yolçusu, hicrətdimi bu?
Ey məhəbbət mələyi, hicrətə sən xoş gəldin.

Niyyətin oldu şərəf, eşqi şərəfləndirdin,
Bu şərafətli, şərif niyyətə sən xoş gəldin.

Izdiham içrə gəzib əhd eləyərdim daim,
Səni xəlvətdə görüm, xəlvətə sən xoş gəldin.



Sədd olub qarşımı kəs qürbətə meyl eyləməyim,
Bir daha söyləməyim "qürbətə sən xoş gəldin".

Gərək əzm ilə, inam ilə ölüm, ey Şahin,
Deyələr göydəkilər: - Cənnətə sən xoş gəldin!

*1.02.1996*

***

Seçmişəm mən elə gül eşq gülüstanından,
Heç qızılgül ötə bilməz bu gülün yanından.

Durmuşam qoç yerinə olmaq üçün qurbanın,
Xəbərin varmı sənin, ey pəri, qurbanından?

Tuta bilsəm küləyi, bil ki, cəza verməliyəm,
Küləyin təqsiri var, ötdü sənin yanından.

Hökm elə, hökmünü hakim kimi bildir, gözəlim,
Məgər olmazmı hökm bəndəyə sultanından?

Bir zamanlar mənə hicrin dəxi ilham vermiş,
Almıram mən daha ilhamımı hicranından.

Görüşək gəl ki açıq-aşkara qurtulmaq üçün
Neçə sözgəzdirənin bir neçə böhtanından.

Düşmüşəm dərdə ki, Şahin, mənə dərman - vəsli!
Dəmbədəm lütf eləsin xəstəyə dərmanından.

*10.02.1996*

***

Yar, arabir düşsə də işlərimə gər düyün,
Zar edə bilməz mənim halətimi hər düyün.

Bir gülü sevməkdəyəm mən bu gülüstandə,
Vəsl ipinə atmasın lalə, sənubər düyün.

Gəl darayım şövq ilə zülfünü, zülfün kimi
Işlərimə düşməsin bir dəxi, dilbər, düyün.

Tanrı, düyünlənməsin işləri eşq əhlinin,
Sinədə qövr eyləyən yarəyə bənzər düyün.

Çox düyünə mübtəla eyləmisən sən məni,
Salma düyün üstünə bir də sərasər düyün.

Rəhm elə aşiqlərə, rəhm elə şairlərə,
Ömrü boyu çox görüb Mirzə Ələkbər düyün.

Yar dedi: - Tutimi, yoxsa bu şahinmidir?
Gör ki necə eyləyib bir sözü əzbər: "Düyün".

*22.02.1996*

***

Tanıyırsanmı, əzizim, görəsən heç səni sən?
Valeh etdin özünə çox gülü sən, gülşəni sən.

Hər hüceyrəndə sənin sakin olubdur sevgi,
Sən məhəbbət kimi bir möcüzənin məskənisən.

Qəni aşiq o sevəndir ki, varı - sevgi varı,
Qənidən həm qəni vardır, qənilərdən qəni - sən!

Diş sədəf, inci əgər sözsə, dodaq mərcandır,
Mərhəba, gör nə qədər inci, sədəf mədənisən.

Hüsnünü görməyirəm mən arabir gün sayağı,
Günəşim, qov buludu, qov dumanı, qov çəni sən.

Dinlərəm hər sözünü nəğmə kimi, hərdənbir
Dinləyib özgələri dinləməyirsən məni sən.

Sahili arzu edən yelkənə bənzər Şahin,
Gözəlim, dön geriyə, sahilə çək yelkəni sən.

*25.02.1996*

***

Şeytanın fitnəsinə aldanacaqsan bir gün,
Pakizə eşqimizi sən danacaqsan bir gün.

Gözəlim, sanma ki, dümdüzdü həyatın gedişi,
Sən şüa timsalı, əlbət, sınacaqsan bir gün.

Yaşayıb hicr ilə ötməkdə olan günlərini,
Qeyb olan günləri tez-tez anacaqsan bir gün.

Od - olur kül, külü döndərmək oda mümkünmü?
Ümid etmə! Nə sayaq odlanacaqsan bir gün?



Mənə biganə olanlar səni biganə edib,
Oxuyub "Divan"ımı şadlanacaqsan bir gün.

Ərimməz şam dili yanmazsa, uzundillik edib
Şahina, sən də dilindən yanacaqsan bir gün.

*2.03.1996*

***

Bir təmənna eylərəm, ey sevgilim, Allahdən:
Lütfünü az etməsin yerlərdə hər xoşxahdən.

Gəh fəraqdır, gah hicr, hicrandı gəh, gah ayrılıq,
Vəslə imkan olmayır bir dəm də bu gəh-gahdən.

Sevgilim, mən vəslinə səbr ilə ümmid eylərəm,
Iltifat olsun gərək mən bəndəyə sən şahdən.

Yox təəccüb bezsələr təkrarçılıqdan, amma ki,
Bezmək olmaz "Qülhüvallah" ilə "Bismillah"dən.

Bədr Şirvanidən əskik şair olmazdım, əgər
Görsə idim ehtiram bir zərrə şirvanşahdən.

Mehdi gəlmir, gözləməkdən gözlərim ağlar müdam,
Sanki giryan olmağı öyrənmişəm timsahdən.

Mən sevinnəm, Şahina, yar vursa yarə cismimə,
Ummaram heç bir kömək dünyadə heç cərrahdən.

*21.03.1996*

***

Qoy şam kimi fəraq sönsün,
Bəlkə sinəm içrə dağ sönsün.

Hüsnün ki, yanır, çıraq nə lazım?
Naz ilə üfür çıraq sönsün.

Sanki dağa lalə od vurubdur,
Yarəb, daha qoyma dağ sönsün.

Gündüz-gecə qaynayır qanım tək,
Qoyma quruyub bulaq sönsün.

Bağ yanmada gül-çiçək içində,
Yol vermə yanan bu bağ sönsün.

Əllərdə yananda lalə, nərgiz
Evlərdəki çilçıraq sönsün.

Sülhün günəşi həmişə yansın,
Hər bölgədəki nifaq sönsün.

Bir qeyriyə gər maraq edərsəm,
Könlümdə tamam maraq sönsün.

Təbim ki, mənim yanar ocaqdır,
Şahin, nə gərək ocaq sönsün?

*24.03.1996*

***

*Şahinanə*

Neyləmişik hicrana orda sən, burda mən,
Düşmədəyik əfğana orda sən, burda mən.

Sevgililər hər yanı seyr edir, seyr edir,
Çıxmayırıq seyrana orda sən, burda mən.

Həzzə yaxın düşmürük, amma ki, amma ki,
Qüssə ilə yan-yana orda sən, burda mən.

Həmdəmimiz, yarımız gül-çiçək, gül-çiçək,
Bənzəyirik bağbana orda sən, burda mən.

Cövr eləyir qüssə-qəm dəmbədəm, dəmbədəm,
Gəlmədəyik tüğyana orda sən, burda mən.

Dərmanımız, sevgilim, sevgidir, sevgidir,
Müntəzirik dərmana orda sən, burda mən.

Amma xilaf olmarıq əhdə biz, əhdə biz.
Etdik əməl peymana orda sən, burda mən.

Hicrin əgər yatmasa dalğası, dalğası
Fırtınayıq, fırtına orda sən, burda mən.

Bərkiməsə eşqimiz daş kimi, daş kimi,
Badə kimi qoy sına orda sən, burda mən.

Göydə mələklər bizə göz qoyur, göz qoyur,
Uymamışıq şeytana orda sən, burda mən.



Söz qoşuruq fəxr ilə daima, daima
Şanlı Azərbaycana orda sən, burda mən.

*31.03.1996*

***

Ey saqi, daha hər qəmə tab etməliyəm mən,
Meyxanəçini xanəxarab etməliyəm mən.

Onlarla şer dəftəri vardır masam üstdə,
Dəftərlərimi indi kitab etməliyəm mən.

Cövrün ki edibsən mənə, yoxdur sayı, canan,
İndi oturub zülmü hesab etməliyəm mən.

Kim eyləsə hörmət mənə hörmət görəcəkdir,
Hər kim ki əzab etdi əzab etməliyəm mən.

Kim sorsa ki "Var eşq?", deyirəm mən ona "Var eşq",
Bir çox sualı böylə cavab etməliyəm mən.

Nöqsanını çox söylədim əğyarə, düzəlmir,
Son dəfə o məlunə xitab etməliyəm mən.

Çiynimdə mələklər oturub namə yazırlar,
Şahin, gələrək əqlə savab etməliyəm mən.

*4.04.1996*

***

Özünü sən ki özün Şahinə yar eyləmisən,
Niyə bəs sirrimizi aləmə car eyləmisən?

Sirrimiz sirr idi, sən sirdaş idin, indi isə
Dilini sən nə üçün sirrə açar eyləmisən?

Sən mənim eşq məkanımda qərar tutmuşdun,
İndi bəs hansı məkan içrə qərar eyləmisən?

Gözünü açdı Koroğlun ki mən idim, özünü
İndi bəs hansı "Koroğlu"yə nigar eyləmisən?

Sən ki qış fəslimi eşqinlə bahar etmişdin,
Qışını hansı kəsin indi bahar eyləmisən?

Özümə tapmayıram mən geniş aləmdə məkan,
Başıma sən nə üçün aləmi dar eyləmisən?

Sənə yox, mən özümə yağdırıram qarğışımı,
Səni zar olmayasan, sən məni zar eyləmisən.

Var ikən qəm yoxa çıxmışdı tamam, ey Şahin,
İndisə yox qəmimi gör necə var eyləmisən.

*16.04.1996*

***

Can şişəsinə dəydi cəfa daşı qəfildən,
Qudyal sayağı axdı gözün yaşı qəfildən.

Zənn eylədi yoldaşı deyil yol daşı idi,
Yoldaşə vida eylədi yoldaşı qəfildən.

Eyş eşqinə salmaq ilə meyxanədə saqi
Pis günlərə qoydu neçə əyyaşı qəfildən.

Can-başla yönəlməkdə idi şəmə bu aşiq,
Pərvanə kimi yandı onun başı qəfildən.

Car etmək ilən sirrini biganəyə canan,
Biryolluq itirdi belə sirdaşı qəfildən.

Sevdayə vida eylədi bir naşı, düzəldi,
Şahin, düzələydi belə hər naşı qəfildən.

*22.04.1996*

***

***Səməd Vurğuna!***

Baxıram Leylimə gendən-genə məcnun-məcnun,
Gözə görsənmədə gündən-günə solğun-solğun.

O, Xuraman ki deyildi mənə, boynum sınsın,
Bilmədim qədrini, lənət mənə, məlun-məlun.

Məcnunun gəzdiyi səhraları nəmləndirəcək,
Gözlərimdən yaş axır sel kimi Ceyhun-Ceyhun.

Hanı şəkkər o dodaqdan alınan bal busə?
Ağaməmməd şaha dad etmədi məcun-məcun.



Bu nə sözlərdi düzürsən yenə muncuq sayağı?
Nə şerdir yazılır dəftərə məhzun-məhzun?

Hanı şövq ilə tərənnüm eləyən Fərhadı?
Söz qoşan hardadı Şirinlərə mövzun-mövzun?

Ey böyük Vurğunumun yazdığı təlxək, rədd ol,
Nə baxırsan üzümə sən yenə meymun-meymun?

Ey Səməd Vurğunumuz, sən bizi əfsunlamısan,
Nə deyimlərdi deyibsən belə əfsun-əfsun?

Kim olar bircə ömürdə neçə ömr ömr eləyən?
Fəxr ilən söylədilər Şahinə: Vurğun! Vurğun!

*29.04.1996*

***

Hər adi kəlamimdən məstanə olardın sən,
Qeyri sözə, ey canan, biganə olardın sən.

Dost - nəşəyə, hər həzzə, sərməstliyə olduqca,
Düşmən - kədərə, dərdə, əfğanə olardın sən.

Pərvanəlik eylərdim sən şəmə dönərdinsə,
Mən şəm olardımsa pərvanə olardın sən.

Mərdanəlik eylərdin hifz eyləyərək eşqi,
Mərdanəliyimdəndir mərdanə olardın sən.

Dür mücrüsüdür aləm, dür danəsidir qızlar,
Dür danələri içrə dürdanə olardın sən.

Divanəyəm, ey zahid, divanələrə gülmə,
Şahin kimi sevsəydin divanə olardın sən.

*9.06.1996*

***

O qədər gəldi bəla aşiqə hicranından,
Bilmədi bir neçəsi qurtula hicr anından.

Biri Vamiq idi Əzra ilə əhd etmişdi,
Biri Fərhad idi əl çəkdi şirin canından.

Biri Vərqa, biri Gülşa, birisi ibn-Salam,
Biri Məcnun idi həzz almadı peymanından.

Biri Ramin idi Vis hicrinə tab eyləmədi,
Biri Yusif idi ah eylədi zindanından.

Biri Sənan idi bir gürcüyə bənd olmuşdu,
Biri Vaqif idi yan oldu Xuramanından.

Amma baş əymədi hicranə, deyərlər bir gün
Biri Şahin idi əl çəkmədi cananından.

*28.09.1996*

***

Sevda mənim olsun, təki sevda sənin olsun,
Bir daxma bəsim, ey pəri, dünya sənin olsun.

Tənqid eləyiblər səni bir çoxları, zahid,
Sövq et məni gerçəkliyə, xülya sənin olsun.

Ölsəm, məni dəfn etməyə meyxanəçi yolla,
Quran oxuya bilməsə, molla sənin olsun.

Eşq rəmzini aram ilə öyrət mənə, ey şeyx,
Hər mərəkə yaddır mənə, qovğa sənin olsun.

Bir zərrə xəyanət eləsəm eşqimə, yarım,
Fərman-mənim qəlb üçün, icra sənin olsun.

Arzu elədim mən sənə dəryaca səadət,
Bir damcı kifayət mənə, dərya sənin olsun.

Etdikcə nəsihət sənə şadəm, qulağında
Sırğa eləsən sözləri, sırğa sənin olsun.

Səhrayə məni eyləmə dəvət daha, Məcnun,
Şahin şəhərin sakini, səhra sənin olsun!

*24.12.1996*

***

Qəhrəman tək elə ki, oldu əyan Şeyxəli xan*,
Bir Quba var idi, Rusiyyə, İran - Şeyxəli xan.

Bir də osmanlıların hərbi görünməkdəydi,
Neçə hərb oxlarına oldu nişan Şeyxəli xan.

Oğul istərdi bu həngamədə baş qaldırsın,
Gördü baş qaldırıban sel təki qan Şeyxəli xan.

* "Quba tarixi" adlı kitabımda getmiş qəzəl



Şahdağın zirvəsi tək həm dumana qərq oldu,
Həm də gün tək çıxaraq qovdu duman Şeyxəli xan.

Hərdən eylərdi səfər Şirvana, hərdən Şəkiyə,
Hərdən eylərdi Dağıstanda məkan Şeyxəli xan.

Həm yürüş var idi, həm müstəqil olmaq meyli,
Həm gülüş var idi, həm ahü fəğan - Şeyxəli xan.

Neçə xan üz tutuban dərgəhinə gəlmişdi,
Fətəli xan sayağı xanlara xan Şeyxəli xan.

Müstəqillik deyilən yolda cəfa görmüş çox,
Sözü tam, əmri qəti, hökmü rəvan Şeyxəli xan.

Şahina, öylə igidlər bizə çox lazımdır,
Bəs zühur eyləyəcək bir də haçan Şeyxəli xan?

*29.01.1997*

***

Yarə eləyən qəlbimi yar düşdü gözümdən,
"Yoxdur" deməyin, illəti var, düşdü gözümdən.

Yandırdı biri, digəri döndərdi dinindən
Aşiqləri. Əsliylə Xumar düşdü gözümdən.

Yar var idi, min şövqə gəlib tar çalardım,
Yarım yox olubdur deyə tar düşdü gözümdən.

Gördükcə oyunbazlığı sevda qumarında
Çox yaxşı olubdur ki, qumar düşdü gözümdən.

Ömrüm boyu çox yaxşı adam qaldı yadımda,
Amma nə qədər mərdiməzar düşdü gözümdən.

İllərlə bizim vəslimizin şahidi idi,
Yox təqsiri, amma ki, çinar düşdü gözümdən.

Hər dəm sevinərdi giləvar əsdiyi dəmdə,
Əsmir niyə tez-tez, giləvar düşdü gözümdən.

Bir zərrəcə əyləncə daha yoxdu gözümdə,
Şur düşdü, Segah düşdü, Qatar düşdü gözümdən.

Meyl eylə, a Şahin, meyə yox, indi gülabə,
Saqi, meyi rədd eylə, apar, düşdü gözümdən.

*2.03.1997*

***

Bağiban, gəldi bahar, nanəni göndər gəlsin,
Gülü yox, yanıma gülxanəni göndər gəlsin.

Yanıram vəslə ümid eyləyibən şam kimi,
Allahım, vəslimə pərvanəni göndər gəlsin.

Doğmanın qədrini bilməz, bilirəm, biganə,
Deməram mən sənə biganəni göndər gəlsin.

Etina etməyirəm həmləsinə namərdin,
Üstümə, lütf elə, mərdanəni göndər gəlsin.

Dedi molla ki, adam məst olacaq üqbadə,
Mən ki məstəm, bura məstanəni göndər gəlsin.

Halsızam, yoxdu gücüm getməyə meyxanə sarı,
Saqiya, yanıma meyxanəni göndər gəlsin.

Leylican, zənn eləmə Şahini Məcnun döyəcək,
Dəliyəm mən dəxi, divanəni göndər gəlsin.

*26.03.1997*

***

Rəbbim, daha yol vermə ki, sevdadə qəm olsun,
Aşiqlərimiz qoy həmişə möhtərəm olsun.

Qabil də özün, hər şeyə qadir də özünsən,
Gəl vermə icazə daha dərdü ələm olsun.

Gülzardə qoy nəğmə desin şövq ilə bülbül,
Meyxanə əgər var isə qoy badə həm olsun.

Qılmanda tamahım, nə də huridə gözüm yox,
Cənnətdə məni qarşılayan kəs nənəm olsun.

Dağ çapmağa Fərhad gedə, çöl gəzməyə Məcnun,
Yanğınçıların başçısı amma Kərəm olsun.



Leylanı giriftar eləmə ibni-Salamə,
Yol verməməli üzdə kədər, gözdə nəm olsun.

Təsbeh də götürmək ələ mümkündür, a Şahin,
Barmaqlara, amma ki, bəzək qoy qələm olsun!

*28.03.1997*

***

Olmayaydı mənə qismət görüm, eykaş, bu gün,
Olmadı yar mənim sirrimə sirdaş bu gün.

Gəlirəm cərgənizə mən dəxi, ey nakamlar,
Mənə təzim edəcəkdir nə qədər baş bu gün.

Mən dünəndən qırıb atdım, daha yoxdur badəm,
Mənə eyham edəcəkdir neçə əyyaş bu gün.

Bu gün hicranı görüb çoxlu şer yazmalıyam,
İlhamım, çağla bu gün çeşmə kimi, daş bu gün.

İynə tək sancmalıyam sözlərimi, ey dil, mən,
Dilimi yondu qələm tək o qələmqaş bu gün.

Daha yaylıq nədi, dəsmal da kifayət eləməz,
Tutası olsa əgər gözlərimi yaş bu gün.

Mən ki, daş qaldırar idim çoxunun qəlbindən,
Şahina, düşdü mənim qəlb evimə daş bu gün.

*12.05.1997*

***

O şirin yarı anıb etmədəyəm dad bu gün,
Bir daha düşmədədir yadıma Fərhad bu gün.

Bisütun Fərhadın olmuş idi, Şahdağ mənim,
Yetişir hər iki dağdan yenə fəryad bu gün.

Şənliyim şadlığımın əvvəli olmaqdaydı,
Şənliyi qeyb elədim, olmayıram şad bu gün.

Məcnunun imtahanından üzüağ çıxmalıyam,
Məni şagird götürübdür axı ustad bu gün.

Ey qazaxlar, məgər olmazmı Aral[*] göz yaşımız?
Yeni bir duzlu dəniz etmişəm icad bu gün.

Məgər azdırmı bizim aqilimiz cahildən?
Olmayır bəs niyə dünya evi abad bu gün?

Nə yarın yetdi, a Şahin, nə də Allahın əli,
Görəsən eyləyəcək kim sənə imdad bu gün?

*13.05.1997*

***

Hər dövrdə çəkic olmuş əli rüzgarlərin,
Xeyri yox döyməsələr başinə mismarlərin.

Qəm çəkən olmasa hərgah mənim tək hər gün,
Silinər hafizələrdən adı qəmxarlərin.

Səni inkar edəni sən dəxi inkar eylə,
Elə inkar özüdür təsdiqi inkarlərin.

Qəddarın mərhəməti qədrini artırmayacaq,
Nə zaman rəhmi olubdur axı qəddarlərin?

Tazə ruh bəxş edir Alim[**] muğamə, necə ki,
Səsi heyran eləmişdi bizi Cabbarlərin[***].

Bisütunda həmi arx çəkdi, həm heykəl yondu,
Fəxri Fərhad olacaqdır hələ memarlərin.

Şahina, mən daha dərd etməyi tərk eyləyirəm,
Nə gücüm var ki çəkim dərdini dildarlərin.

*26.07.1997*

***

Mən ölüb getməliyəm, sən isə var olmalısan,
Qəzəlim, nəğməli dillərdə şüar olmalısan.

Ey qəzəlxan, qəzəli yazmadığın gün yoxdur,
Hələ ilham atına gündə süvar olmalısan.

Ulu şairlərimiz eşqə mərəz söylədilər,
Bu gözəl xəstəliyə yaxşı düçar olmalısan.

---

[*] Aral - Qazaxıstanda dəniz idi, qurudu.

[**] Alim Qasımov

[***] Cabbar Qaryağdıoğlu



Qüssələr üstünə gəlməkdə tatar ləşkəri tək,
Qüssələrdən daha, əlbəttə, kənar olmalısan.

Əslinin nəslini andıqda qəzəblənməlisən,
Xumarı anmaq ilə amma xumar olmalısan.

Ey qəzəl munisi olmuş ürəyim, həssas ol,
Əcnəbi kəlmələrə qarşı hasar olmalısan.

Bulaşıq şer bu gün könlü bulandırmaqda,
Sən ətir səpməlisən, rayihədar olmalısan.

Istəmirsənsə əgər ot kimi tapdanmağı sən,
Şahina, cəhd eləyib onda çinar olmalısan.

*4.08.1997*

***

Laqeyd qalan canana can görməmişəm mən,
Etməkdəyəm hər yanda bəyan: Görməmişəm mən.

Qan rənginə bənzətmə şəfəq rəngini, şair,
Göz görmədə gül rəngini, qan görməmişəm mən.

Kim nalə görür - öz işidir, eşqdi məncə
Bülbüldə, gülüm, nalə-fəğan görməmişəm mən.

Dəymir gözümə güldə tikan, çöldə şoranlıq,
Mən dağ görürəm, dağda duman görməmişəm mən.

Baş qoşmayıram cahilə, fazillər içində
Mən görmədəyəm yaxşı, yaman görməmişəm mən.

Eşqin bağı içrə nə gözəl qönçələr açmış,
Yaz fəslidi bu bağda, xəzan görməmişəm mən.

Əfqan elini, Türkiyəni, Iranı gəzdim,
Ölkəm kimi heç yerdə məkan görməmişəm mən.

Var öylə qəzəlxan ki, deyib eşqə "ziyandır",
Vallahi ki, eşq içrə ziyan görməmişəm mən.

Şadəm, mənə ömrüm boyu hətta qoca yaşda
Canandı hayan, qeyri hayan görməmişəm mən.

Canan dedi: - Ardınca nigarın daha qaçma,
Ey Şahin, əsa ilə qaçan görməmişəm mən.

*19.08.1997*

***

Varsa şair mən kimi, hal əhli peyda eyləsin,
Yoxsa, üz tutsun, şer məndən təmənna eyləsin.

Varsa, gəlsin, xəlqi sözlər, milli sözlər gözləyir,
Söz düzüb zərgər kimi yan-yanə misra eyləsin.

Adətimdir eyləyim xülya, gülüm, gündüz-gecə,
Heç xəyalpərvər mənim tək varmı xülya eyləsin?

Yar yolunda atmasın aşiq gərək dəsmalə əl,
Gözlərindən göz yaşı axdıqca dərya eyləsin.

Mən bilən, səhv eyləyir cananla sevda eyləyən,
Əvvəl, aşiq kəs könüllə, canla sevda eyləsin.

Kimdə vardır möhtəşəm qüvvət Xudavənddən səva
Bəxş edib can, torpağı Adəmlə Həvva eyləsin.

Mərd gərək mərdanəlik etsin, adam var, söyləyir:
"Mərd olan kəs etməsin mərdanəlik, ya eyləsin".

Şahina, aləmdə qəm var, məndəsə aləm qəmi,
Kim dilərsə qəm gəlib məndən təmənna eyləsin.

*21.08.1997*

***

Şadəm necə, dilbər, nələri Şahinə verdin,
Düşməz gecə bir də, səhəri Şahinə verdin.

Yerləşmədə köksündə sənin eşq cahanı,
Şadəm ki, cahanı, a pəri, Şahinə verdin.

Ariflər içində zəfərimdən sözü saldın,
Alimlər içində hünəri Şahinə verdin.

Heyran eləyibdir səni şerimdəki siqlət,
Şadəm ki, bu göyçək xəbəri Şahinə verdin.

Divanıma sən "rayihəli butə" deyibsən,
Şadəm ki, bu yüksək dəyəri Şahinə verdin.

Bülbüldə fəğan, güldə tikan görməyirəm mən,
Şadəm ki, bu nikbin nəzəri Şahinə verdin.



Mavi Xəzərin saflığı şerimdə göründü,
Şahdağ onun idi, Xəzəri Şahinə verdin.

Şahanə və Ülviyyə mənim şah əsərimdir,
Yarım, iki mövzun əsəri Şahinə verdin.

Gördün ki, şənəm sənlə, kədər varsa da məndə,
Şənlik sənin oldu, kədəri Şahinə verdin.

Şadəm ki, sənin dərd-sərin yoxdur, a dilbər,
Çünki, yığıban dərd-səri Şahinə verdin.

*10.09.1997*

***

Qələm hazırlasalar aşiqə orman-orman,
Yazacaq eşqini cananına dastan-dastan.

Kim qarışqayə baxar mən kimi aciz-aciz?
Kim Süleymanə baxar mən kimi sultan-sultan?

Gözəlim, məndə fərəh var idi dərya-dərya,
Gözlərimdən yaş axır indisə ümman-ümman.

Əfqanıstandakı dərvişlərə həmkar oluban
Gəzmişəm bir neçə il qürbəti nalan-nalan.

Orda seyr etməmişəm Leylini məcnun-məcnun,
Gözümü dikməmişəm huriyə qılman-qılman.

Göyə uçmurdu xəyalım, ayaq altındaydı,
Çiynim üstdə var idi qəm yükü batman-batman.

Şən yanımda yox ikən var idi canımda azar,
Üstümə gəldi təbiblər neçə loğman-loğman.

Indisə, şükr edirəm həqqə, fərağım bitdi,
Yazıram xəlqi şer xəlqimə asan-asan.

Yazmaq olmur qəzəli öz sözümüzlən guya,
Mənə söz söyləməsinlər belə hədyan-hədyan.

Özü tək saf yaranır Azəribaycan qəzəli,
Mən qəzəl göstərərəm sizlərə divan-divan.

Bulaşıq şeri büküb tulladı canan, dedi ki,
- Oxumaq istəyirəm Şahini heyran-heyran!

*12.09.1997*

***

Nə bəladır ki, bəlanı belə zar eyləmisən,
Sən bəlayə o bəlanı da düçar eyləmisən.

Ayrılıq gəldi, hamar oldu yolu sayəndə,
Yolunu ayrılığın xeyli hamar eyləmisən.

Mən piyada, sən isə atlı olubsan, gözəlim,
Özünü yüyrək ata yaxşı süvar eyləmisən.

Sən "salam" kəlməsini gör ki haçandır unudub,
"Əlvida" kəlməsini dildə şüar eyləmisən.

Bəllidir aləmə ki, ov quşu şahin quşudur,
Sənsə, şahin quşunu indi şikar eyləmisən.

Şəhriyarı neçə il məst elədin, ey Hafiz,
Məni həm sən neçə müddətdi xumar eyləmisən.

Ey qəzəlxan, daha aqilləri cahil görməz,
Cərgəmizdən onu sən yaxşı kənar eyləmisən.

Qəzəlin sadə olan zirvəsi aiddi sənə,
Şahina, sən nə uca yerdə qərar eyləmisən.

*6.10.1997*

***

Əl dəyən tək yandırırsan cismimi, naqilmisən?
Qətl edirsən sən məni, ey sevgilim, qatilmisən?

Leyli-Məcnun məktəbindən almışam mən dərsimi,
Aşiqəm, yarım, mükəmməl, sən dəxi kamilmisən?

- Gəh sənə Şahin deyirlər, gəh də Fazil, - güldü yar,
Bilmədim Şahinmisən sən, yoxsa ki, Fazilmisən?

Söylədim: - Həm Şahinəm, həm Fazıləm saf şerdə,
Qabiliyyət səndə həm vardır, məgər qabilmisən?

Istərəm yüksəlməyi mən şahə qalxan dalğa tək,
Dalğayam mən, qaytarırsan dalğanı, sahilmisən?

Mən buludlardan da yüksək bir məqamə nailəm,
Ey qızılquş, sən də mən tək uçmağa nailmisən?



Bircə busə mən təmənna eylədim hər şerimə,
Sən ədalətdən vurursan dəm, məgər adilmisən?

Gül də məst, bülbül də məstdir, saqi də, Şahin də məst,
Məst deyilsən sən neçin, bizdən məgər aqilmisən?

*20.11.1997*

***

Ey dil, yenə dildarə maraq altda qalıbsan,
"Varmı belə gülçöhrə?" soraq altda qalıbsan.

Yarın saçını oxşamayır əllərim, eyvah,
Ey zülf, nə vaxtdır ki, darağ altda qalıbsan.

Ey xal, sənin həzzinə var qibtə canımda,
Bir gör neçə müddətdi dodaq altda qalıbsan.

Ey gül, məni əfv et, ayağım üstünə düşdü,
Döydüm başıma, çünki ayaq altda qalıbsan.

Pərvanə, dedimmi çırağın üstünə cumma,
Yandın, bu səbəbdən də çıraq altda qalıbsan.

Könlüm çıxa bilmir yenə eşqin bucağından,
Dilləndi müəllim ki, bucaq altda qalıbsan.

Var idi şəhidlər, papaq altında oğullar...
Ey baş, təəssüf ki, papaq altda qalıbsan.

Batmaqdadı hicrin bıçağı cismimə hər dəm,
Şahin, neçə vaxtdır ki, bıçaq altda qalıbsan.

*26.01.1998*

***

Eşqin mənə nöqsan kimidir, istəmirəm mən,
Vəslin acı hicran kimidir, istəmirəm mən.

Tənqid ki edibsən məni bir vəqt, nigarım,
Hər kəlməsi böhtan kimidir, istəmirəm mən.

Hərçənd sənin busələrin öylə şirindir,
Dərd əhlinə dərman kimidir, istəmirəm mən.

Aləmdə fərəh bolsa da, dərd-qəm daha çoxdur,
Göz yaşları ümman kimidir, istəmirəm mən.

Əsla görünən ondakı sakitliyə uyma,
Sakitliyi üsyan kimidir, istəmirəm mən.

Bilməm niyə qılmanları huri kimi olmuş,
Huriləri qılman kimidir, istəmirəm mən.

Azad doğulurmuş bəşər övladı, yalandır,
Azadlığı zindan kimidir, istəmirəm mən.

Tərk eylə bu dünyanı, a Şahin, daha bəsdir,
Dünya qoca canan kimidir, istəmirəm mən.

*7.02.1998*

***

Saqi görünür, istəyirəm camı görüm mən,
Ənamdı mey bizlərə, ənamı görüm mən.

Pərvanəni yandırdı yenə, göz yaşım ilə
Söndürməliyəm atəşini, şamı görüm mən.

Gül - paltarını cırdı, soyun sən də libası,
Ey gül, libas altında gül əndamı görüm mən.

"Yarım qocalarmış!.." deyə eyham eləyibsən,
Yarım, nə gərəkdir yenə eyhamı görüm mən?

Sal xislətimi yadə, sərəncamını bildir,
Əncam olası dərdə sərəncamı görüm mən.

Bayramdı vüsalın mənə bayramlar içində,
Layiq olası Şahinə bayramı görüm mən.

*1.03.1998*

***

Saqi, nə görübdür yenə biganədə Şahin?
Çoxdandı görünmür niyə meyxanədə Şahin?

Seyr eylər idi gülşəni həmdəmləri ilə,
Çıxmır neçə müddətdi ki, seyranə də Şahin.

Viran eləyib könlünü məsciddə, yatıbdır,
Yarəb, nə tapıbdır yenə viranədə Şahin?

Mərd adəmə yad gizli əməllər ona yaddır,
Mərdanələrə, bəlli ki, mərdanə də - Şahin.



Həm yanmağı vardır, həmi yandırmağı vardır,
Ziddiyyətə bax - şəm də, pərvanə də Şahin.

Gerçək yeni aşiq özüdür, qeyrisi yoxdur,
Olmuşmu xəyalı qala əfsanədə Şahin.

- Səndən, dedi canana ki, baş açmayıram mən,
Məscid də gözəldir sənə, meyxanə də, Şahin.

*17.06.1998*

***

Bu nə işdi düşdüm əldən əlimə əsa gələndən,
Gözəlim, havam çatışmır başıma hava gələndən.

Nə gözəl müğənnidir bu... necə xoş nəvadı böylə?
Ürəyə fərəh dolubdur qulağa nəva gələndən.

Elə can fəda dəmadəm! Ola yan bəla dəmadəm!
Edirəm dua dəmadəm dilimə dua gələndən.

Nə sevinc zamanıdır bu, elə sanma ki, sevindik
Sənə "afərin" gələndən, mənə "mərhəba" gələndən.

Yuxuda ziya göründü gözümə: Məhəmməd idi!
Ürəyim ziyalı oldu gözümə ziya gələndən.

Ürəyim səda eşitdi: "Daha cahili eşitmə!"
Qulağım sədayə düşmür ürəyə səda gələndən.

O gözəl göründü, Şahin dedi: Xoş bəlayə tuşəm,
Canıma şəfa dolubdur yanıma bəla gələndən.

*5.07.1998*

***

O qədər var inamım eşqdə ilqarə dərin,
Etiqad eyləyirəm sevgili dildarə dərin.

Şeyx Sənanə müsəlman deyə bilməz kimsə,
Saldı öz meylini kafər kimi zünnarə dərin.

Dağıdıb dağ elə zənn etdi ki, xoşbəxt olacaq,
Bisütunda vurulubdur yara memarə dərin.

Bacara bilmədi Yusif dəxi aşiqliyini,
Quyuya düşdü gedib, bir quyu ki, qarə, dərin.

Dəlilikdə məni inkar eləmə, ey Məcnun,
Eləsən, başlayaram mən dəxi inkarə dərin.

"Yar, yar" söyləyən əğyarə sözüm var böylə:
Yarə üstdən vururam mən sənə çox yarə dərin.

Gülüm, eşq ordusunun Şahin olub sərdarı,
Dedi ki, var inamım sən təki sərdarə dərin.

*17.08.1998*

***

Fərəhdən yan olub bir də... Kədər görməkdədir Şahin,
Gözü giryan olub bir də... Qəhər görməkdədir Şahin.

Yarı var idi, yar olmur, varı var idi, var olmur,
Xəta ondan kənar olmur, xətər görməkdədir Şahin.

Şevincindən əsər yoxdur, məlalı dağdən hündür,
Önündə bağdən hündür çəpər görməkdədir Şahin.

Uzaqdır yavərü yardan, saçı rəng almada qardan,
Ilandan yox, adamlardan zəhər görməkdədir Şahin.

Çəfadən yan duran yoxmu, bəladən yan duran yoxmu?
Üzərrik yandıran yoxmu, nəzər görməkdədir Şahin.

Onu meyxanədən saqi qovur, məsciddən molla,
Qədirbilməz adamlardan nələr görməkdədir Şahin.

*23.08.1998*

***

Imtahandır bu cahan mülkü, sınaqdır deyəsən,
Hər vüsalın sonu, ey yar, fəraqdır deyəsən.

O səadət ki, gülümsər üzümə ulduz tək,
Çox yaxın zənn edirəm, amma uzaqdır deyəsən.

Dedilər surətə şer əhli çıraq, mən demirəm,
Surətindirmi yanır böylə, çıraqdır deyəsən.

Şöyləyirlər ki, ürəkdən süzülür göz yaşımız,
Ürəyin qanı deyil qırmızı, ağdır deyəsən.

Ey ki dünyadəki nemətlərə aludə olan,
Zənn edirsən bu işi haqq, nahaqdır deyəsən.



Hər büluğ həddinə çatmış deyir aşiq özünə,
Mən olan yerdə çox aşiq uşaqdır deyəsən.

Döyüşürsən neçə əğyar ilə, Şahin, daim,
Sanmıram əldə qələmdir bu, bıçaqdır deyəsən.

*26.08.1998*

***

Gözəlim, bir daha yol vermə ki, hicran olsun,
Görmədim mən hələ hicranə dözən can olsun.

Hicrdən görmədim aşiqləri dad eyləməsin,
Yeri istərsə dağ, istərsə biyaban olsun.

Gəh bulaq üstdə idi, gəh də gülüstanda görüş,
Bizə əvvəlki təki qoy yenə imkan olsun.

Məni təşvişə salan qırmızı rəngdir təkcə,
Lalənin bağrı kimi qıyma könül qan olsun.

Ey gözəllikdə qənirsiz, nə gözəllikdir bu!
Qoy gözəllər yığışıb hüsnünə heyran olsun.

Əmrinə müntəzirəm, hökmünə qul tək hazır,
Bülbülə gül dodağından yenə fərman olsun.

Əmr elə, qoyma gedə qürbətə Şahin bir də,
Daima məskənimiz Azəribaycan olsun.

*8.08.1998*

***

Elə ki, mənzilimə gəldi o canan birdən,
Oldu aram təlatümdə olan can birdən.

Razıyıq biz həmişə bir-birimizdən, çünki,
Bağlanıb xoşluq ilən əhd ilə peyman birdən.

Çox nahaq qovlamışam bağibanı bağımdan,
Bağiban getdi deyə soldu gülüstan birdən.

Qəzəli əcnəbi sözlər bürüyüb, getsə belə
Dilini qeyb edəcək Azəribaycan birdən.

Dilimin saflığı qayəmdi, buna baxmayaraq
Məni incitmədə bir xeyli qəzəlxan birdən.

Fikrimi tənqid edənlər tapılır hərdənbir,
Olacaqdır hamısı şerimə heyran birdən.

Şahinin var dözümü tənqidə, öyrəncəlidir,
Nuhə dəyməz xətəri qopsa da tufan birdən.

*23.09.1998*

***

Onda ki, görməyirəm çöhrəsini cananın,
Üzünü görməsələr yaxşıdı bu heyranın.

Çünki, heyranı olandan bəri Məcnun kimiyəm,
Deyirəm Leylimə kəssin yolunu hicranın.

O deyir yolkəsənin ismi Ərəbzəngi olub,
Sən özün kəs yolu vardırsa əgər imkanın.

Neyləyim mən qaragün, ağ günə həsrət qaldım,
Dözürəm cövrünə biçarə olub dövranın.

Deyirəm öz-özümə pis yaşayırdınmı məgər?
Qəlbi cananəyə verdin niyə, çıxsın canın!

Şahina, etmə qənaət daha göz yaşlarına,
Buludun ağlaması - gülməsidir bostanın.

*4.10.1998*

***

Neçə gündür mənə, ey gül, nəzərin yoxdu sənin,
Tutiyəm, tutiyə neyçün şəkərin yoxdu sənin?

Soruşurlar: Hanı Dürrən, necə Vurğunsan sən?
Nəbisənsə, nə səbəbdən Həcərin yoxdu sənin?

Mənə cövr etmədəsən sən, sənə mən mehrü vəfa,
Zərərin var mənə, amma zərərin yoxdu sənin.

Aşiqin halını guya eləyir sevda şad,
Ölürəm mən kədərimdən, kədərin yoxdu sənin.

Boy-buxun, işvə, nəzakət, mədəniyyət, iffət,
Naz var, qəmzə də vardır, nələrin yoxdu sənin.



Geymisən əyninə, ey yar, ipəkdən paltar,
Kəmərin qollarım olsun, kəmərin yoxdu sənin.

Şahinəm, ovlayaram mən səni hökmən bir gün,
Şahinin yoxsa ovundan xəbərin yoxdu sənin?

*10.10.1998*

***

*Füzulidən ilhamlanaraq*

Demirəm ya əlimi kəs, gözəlim, ya ətəyin,
Gedirəm tutmağa Məcnun kimi səhra ətəyin.

Daha bihudə yerə dalmalıyam xülyayə,
Çox xəyal aşiqisə tutmada xülya ətəyin.

Röya başlardı yuman tək gözümü, ey dilbər,
Çəkə bilməm gözümə mən daha röya ətəyin.

Iki əl varsa da, cəhd eylə yapış dördəlli,
Heç zaman atma əlindən yerə sevda ətəyin.

O qədər qan tökülüb üstünə ki, qırmızıdır,
Bilmirəm mən yumayırlar niyə dəva ətəyin?

Var Fələstin savaşı, var Qarabağ mərəkəsi,
Sarıyıblar biləyə gör necə qovğa ətəyin.

Əlli ildir yazıram mən, hələ çox yazmalıyam,
Buraxa bilməyirəm heç cürə misra ətəyin.

Sən qəzəldə həmişə izləmisən mənanı,
Şahina, üzmə əlindən yenə məna ətəyin.

*2.12.1998*

***

Çəkdiklərimi bilmədi dilbər, özü bilsin,
Eşq zərgərini anlamadı zər, özü bilsin.

Güllər şahı, əlbəttə, qızılgüldü bağ içrə,
Çox-çoxdu qızılgül, o sənubər özü bilsin.

Yerdən göyə baxdım onu tapmaq ümidiylə,
Göydən yerə göz vurmadı ülkər, özü bilsin.

Sahildə mənəm, amma təlatümlüdü dünya,
Sevda gəmisi atmadı lövbər, özü bilsin.

Vəsf eyləmişəm, indisə həcv eyləyirəm mən,
Həcvimlə dolar bir neçə dəftər, özü bilsin.

Şirinsə də, şəkkərlə rəqabətdən uzaqdır,
Eylərsə rəqabət ona şəkkər özü bilsin.

Mən sarmaşıq oldum, o ucaldıqca ucaldım,
Şahin, yenə sərvimdi o sərvər, özü bilsin.

*6.08.1999*

***

Ağ günümü qarə edib getmisən,
Aşiqi biçarə edib getmisən.

Məndə əsər var idimi yarədən?
Köksümü sən yarə edib getmisən.

"Vəsli unut, tik evini hicranın!"
Əmrini memarə edib getmisən.

Sənlə bu aşiq necə aram idi,
Aramı avarə edib getmisən.

Göz suyu qalmaz bu sayaq çağlasa,
Sən suyu fəvvarə edib getmisən.

"Çəkməli dərd sən kimi sərdarlər!"
Hökmünü sərdarə edib getmisən.

Sənlə tam idi ürəyi Şahinin,
Tam ürəyi parə edib getmisən.

*23.08.1999*

***

Səndən mənə yar olmayacaqdır, bilirəm mən,
Mən yarə nigar olmayacaqdır, bilirəm mən.

Eşqin mənə dünya qədəri var idi, söndü,
Eşqin daha var olmayacaqdır, bilirəm mən.

Könlün məni küsdürməyi almışsa qərarə,
Bir qeyri qərar olmayacaqdır, bilirəm mən.

Gəlməkdə hava başıma, yoxdur havadarım,
Heç kim havadar olmayacaqdır, bilirəm mən.



Eyş nərdi qapanmış o təhər ki, daha məndən
Qəm-qüssə kənar olmayacaqdır, bilirəm mən.

Şerimdəki hər sözdə əyan idi xumarlıq,
Söz bir də xumar olmayacaqdır, bilirəm mən.

Şahin, yeni "Divan"ını təqdim elə xəlqə,
Bir güllə bahar olmayacaqdır, bilirəm mən.

*3.09.1999*

***

Mən dünən şadiman idim, ələmim var bu gün,
Fərəhim qum kimi, dağ boyda qəmim var bu gün.

Məni tərk eylədi canənə gözüm nəmləndi,
Qorxuram göz çürüyə, gözdə nəmim var bu gün.

Iki idi hərəmim, getdi biri, qaldı biri,
Bircə ilham pərisi tək hərəmim var bu gün.

Aqil olmaqsa məram - ötdü cavanlıq dövrüm,
Xəncəri sındırıb atdım, qələmim var bu gün.

Qəzəlim varidatımdır, mənə yoxsul deməyin,
Neçələlim, neçə dinar-dirəmim var bu gün.

Hər cılız şairi şerin yoluna qoymazlar,
Şahinəm, şer yolunda qədəmim var bu gün.

*27.10.1999*

***

Artırar ətrini bağçam, çəmənim sən gəlsən,
Gedərəm bəlkə özümdən, sevənim, sən gəlsən.

Izdiham içrə, inan ki, özümü tək sanıram,
Istərəm mən sənə yalnız güvənim sən gəlsən.

Söyləyən olsa inanma kimisə xoşlamışam,
Ola bilməz kimisə mən bəyənim, sən gəlsən.

Lənkəran adlı şəhər indi olubdur vətənim,
Qədrini artıracaqdır vətənim sən gəlsən.

Kəfənim iplə deyil, zəncir ilə bağlansa,
Açılar bil ki, həmin dəm kəfənim, sən gəlsən.

Şahinin baş daşını bircə kərə silkələsən,
Canlanar, ey pəri, cansız bədənim, sən gəlsən.

*Lənkəran, 2.11.1999*

***

Günlərlə oyaq oldum həsrət yükü çəkməkdən,
Saç-saqqalı ağ oldum xiffət yükü çəkməkdən.

Hambalınam, ey Tanrım, ver yüklərini tay-tay,
Amma məni azad et minnət yükü çəkməkdən.

Məstanəliyim bitdi, divanəliyim yetdi
Leyla kimi, ey Məcnun, afət yükü çəkməkdən.

Ömrüm-günüm azadə, şair babayam sadə,
Şöhrət bu ki, qurtuldum şöhrət yükü çəkməkdən.

Söz-söhbət olur hərdən idrakı dayazlarla,
Bezdim yaramazlarla söhbət yükü çəkməkdən.

Mən bəxtli cavan oldum, şadəm qocaman oldum,
İllər boyu yan oldum sərvət yükü çəkməkdən.

Əfqan eli, Türkiyyə, İran kimi qürbətlər...
Qəddim əyilib, Şahin, qürbət yükü çəkməkdən.

*10.11.1999*

***

"Pərvanə mənəm, eşqimə yan" söyləmişəm mən,
Bica sözü cananə haçan söyləmişəm mən?

Şerində çətin sözlə çətinlik yaradan çox,
Hər bir sözümü xəlqə asan söyləmişəm mən.

"Eşq əhlinə aşiqdi tərəfdar cahanda,
Aşiqlərə eşq əhli hayan" söyləmişəm mən.

"Öz qiymətini, qədrini bil, sevgili yarım,
Sənsiz boşalar bil ki cahan" söyləmişəm mən.

Röyadə məni Qeys eləyir çöllərə dəvət,
"Şahdağ mənə ən yaxşı məkan" söyləmişəm mən.

Canan, dilim üstündə mənim can gülü bitdi,
Çünki sənə gündüz-gecə "can" söyləmişəm mən.



Sən Şahinə qəmsiz demisən hansı əsasla?
Dilbər dedi naz ilə: - Yalan söyləmişəm mən.

*12.12.1999*

***

Sevda həvəsi sən kimi cananəyə çatsın,
Ətri saçının düş bağa ki, nanəyə çatsın.

Fəryadımı onsuz da bilir doğma adamlar,
Yarım, harayım qoyma ki, biganəyə çatsın.

Şəməm, yanıram, "yanğımı söndür" demirəm ki,
Şəmin alovu sən kimi pərvanəyə çatsın.

Yüksək tutuban eşqini rədd eylədi vəsli,
Varmı bir ağıl sahibi divanəyə çatsın?

İllərlə edib saqiyə, meyxanəyə tənə,
Yol verməməli şeyxə ki, meyxanəyə çatsın.

Bilsin o rəqibim qəzəlin ərşi mənimdir,
Varsa gücü Şahin kimi şahanəyə çatsın.

*22.02.2000*

***

***Riyakar bir adama***

Minsifətsən, mənə millət, sənəsə şah yaxın,
Sənə meyxanə yaxınsa, mənə Allah yaxın.

Şənliyim tüstü kimi uçmadadır qəlbimdən,
Qəlbə gündən-günə qüssə, kədərü ah yaxın.

Ey həsədkar, yaxın gəlmə mənə, qovlayaram
İstəsən bir dəxi olmaq mənə hərgah yaxın.

Nifrətim var mənim bir də ki məddahlərə,
Düşməsin qoy mən olan yerlərə məddah yaxın.

Arabir olmada ilham pərisi məndən uzaq,
Daim olsun mənə, yarəb, o xeyrxah yaxın.

Necə pərvanədi yarın ey olan şəm Şahin,
Gah olur şəmə o pərvanə uzaq, gah yaxın.

*29.03.2000*

***

Eşq mülkün, gözəlim, qoy yenə abad olsun,
Halətin şən gözə dəysin, ürəyin şad olsun.

Dönmüşəm yurduma, ey gül, mənə "xoşgəldin" de,
Gülşəni eşqimizin qoyma ki, bərbad olsun.

Su gətirdim sənə Həzrət Əli içmiş quyudan,
Su - mənə çarə edibdir, sənə imdad olsun.

Biz gərək ömr uzunu sevgi təmənna eləyək,
Sənə yad olsa təmənna mənə həm yad olsun.

Arabir qürbətə yollanmalıyam mən yenə də,
Nə gərək maniə, dərviş gərək azad olsun.

Sən bilirsən ki, gəzib çox yeri Şahin Fazil,
Amma, istər yeri hər il yenə Bağdad olsun*.

*Bakı, 25.11.2000*

***

Nakəsə cövr etməyi, ey pəri, öyrənmisən,
Hicrə tərəf çəkməyi xəncəri öyrənmisən.

Mən günəşəm sənsə ay, axtarıram hey səni,
Eyləməyi sən məni sərsəri öyrənmisən.

Söylədi: - Ey şairim, sən təzə Fərhadsən,
Şirini öyrənmisən, Şəkkəri öyrənmisən.

Bisütuna varmısan, zirvəsini yarmısan,
Heykələ döndərməyi mərməri öyrənmisən.

Söylədim: - Ey nazənin, əsgərinəm mən sənin,
Zabit olub, mərhəba, əsgəri öyrənmisən.

Mən sinədəftər kəsəm, cır sinəmi, razıyam,
Kiprik ilə cırmağı dəftəri öyrənmisən.

Zər təki qiymətli söz düzmədəyəm şerimə,
Sən ki, bu Şahin kimi zərgəri öyrənmisən.

*28.11.2000*

---

* P.S. Bağdad səfərindən qayıdıb, saat 21.40-da Bakıda oldum, 22.09-da isə güclü zəlzələ baş verdi.



***

Hər dərdinə əncam olunub çarə çəkilsin,
Iqbalinə yox, gözlərinə qarə çəkilsin.

Məcnun ilə birlikdə idim, çöl məni yordu,
Könlüm quşu istər ki, çəmənzarə çəkilsin.

Meyxanəyə dəvət eləmə hər kəsi, saqi,
Əmr et qabağımdan neçə avarə çəkilsin.

Aşiqləri, ey Tanrı, xəcil eyləmə, amma
Qoy şilləsi aşiqlərin əğyarə çəkilsin.

Hər vədə bütövlükdü məramım, gözəlim, bil,
Mən sevgini tam istəyirəm, parə - çəkilsin.

Şahin yenə söylər: Başımın başçısı sənsən,
Yoxlaşsa haçan başçı başım darə çəkilsin!

*29.12.2000*

***

*Sayılan dostlardan olan "Say" qəzetinin*
*baş redaktoru Hacı Rafiqə*

Bu gün gülzar neçin məhzun, biyabanlar neçin küskün?
O ceyranlar neçin qaçqın, bu ormanlar neçin küskün?

Pərişan olmuş aşiqlər gözəllər zülfü tək, eyvah,
Pərişanlar neçin dalğın, pərişanlar neçin küskün?

Var insanlar ki, beynində müdam torpaq təmənnası,
O insanlar neçin bədxah, o insanlar neçin küskün?

Bir acgöz qonşu həm vardır... Səbəb çoxdan əyandır ki,
Pənah xanlar neçin məyus, Cavad xanlar neçin küskün?

Gözümdən ümman axmaqda, su sahildən çıxıb-getdi,
O sahillər neçin gücsüz, bu ümmanlar neçin küskün?

Nə Daşkənd eyləyir yardım, nə Bişkekdən pənahım var,
Müsəlmanlar neçin dalğın, müsəlmanlar neçin küskün?

Şəhidlər yatdı köksündə... Xiyaban var şəhidləşmiş...
Xiyabanlar neçin məhzun, xiyabanlar neçin küskün?

Bu Şahin ölkə dərdin çəkmədə, amma deyir əğyar:
- O cananlar neçin qəmgin, bu cananlar neçin küskün?

*7.03.2001*

***

Canana səhəng əldə bulağ üstdə dayansın,
Söz gözləyən eşqimsə sorağ üstdə dayansın.

Ey yar, yanar təndirə girrəm sınaq üçün,
Mümkünmü hər insanə ocaq üstdə dayansın?

Yığ zülfünü üzdən ki, baxım xurmayı xalə,
Lütf eylə nəzər həm də yanaq üstdə dayansın.

Yer kürrəsi, ey Tanrı, nə cür göydə dayanmış?
Hər cism gərəkdir ki, dayaq üstdə dayansın.

Yad ölkədə parlaq idi gün, amma qayıtdım,
Mümkünmü ki, pərvanə çıraq üstdə dayansın?

Oldum şahı eşqin, tac alıb taxta oturdum,
Heç şahə rəvadırmı ayaq üstdə dayansın?

Şahin, neçə müddətdi fəraq vəsli boğurdu,
Əmr eylə vüsal indi fəraq üstdə dayansın.

*26.03.2001*

***

Hicran seli axmaqda qüvvətlə uzaqdan,
Gözlər gözə baxmaqda şəfqətlə uzaqdan.

Qəlbimdən Araz boyda həsrət çayı axdı,
Etdim nə qədər xiffət həsrətlə uzaqdan.

"Hər tədbiri xəlq üçün xəlq eyləmişəm mən...",
Xaliqmi danışmaqda xilqətlə uzaqdan?

Hey söyləyirik Babək, Rövşən, Nəbi, Mehdi...
Fəxr eyləyirik boş-boş şöhrətlə uzaqdan.

Elliklə girək cəngə, çox çəkdi bu dəva,
"Gəl" səsləri gəlməkdə sürətlə uzaqdan.

Dilbər Qarabağ yurdum viranəyə dönmüş,
Seyr eyləyirəm mənsə diqqətlə uzaqdan.



Dövlət bu yaxın dərdə əncam edə bilmir,
Şahinsə danışmaqda dövlətlə uzaqdan.

*15.03.2001*

***

Əmr, fərman gərəksizdir, əməl məndən - rica səndən,
Dava-dərman gərəksizdir, mərəz məndən - şəfa səndən.

O dəm ki, eşq əyan oldu həya can içrə can oldu,
Gülüm, hər dəm əyan oldu abır məndən - həya səndən.

Dilək var, sevgilim, nur tək, ürək var bizdə büllur tək,
Yağır hər vədə yağmur tək vəfa məndən - səfa səndən.

Sözüm çoxdur, ömür yarı... Varım vardır - qəzəl varı!..
Bizik şerin həvəskarı, əruz məndən - heca səndən.

Çal, ey tarçı, bir az barı "Zəminxarə", "Arazbarı",
Aşıq, dinsin o saz barı, qulaq məndən - səda səndən.

Gülüm, hər ləhzə bayram et, yarımsa həzzini tam et,
Unutsam əhdi iqdam et, cism məndən - cəza səndən.

Çatırmı səs-soraq, ayə, bu dünyadən o dünyayə?
Yağır Məcnunə, Leylayə dua məndən - dua səndən.

Veribsən Şahinə şuri, alış-yan, ey gözüm nuri,
Günəş qılmansa, ay huri şüa məndən - ziya səndən.

*14.04.2001*

***

Ey tuti, mənim şerimi şəkkərmi bilirsən?
Hər beytimi yarım kimi əzbərmi bilirsən?

Təkrar eləyirsən dediyim hər sözü gündə,
Ey tuti, məgər "Şur" ya "Şüştər"mi bilirsən?

Pərvaz elə bundan belə azadlığa doğru,
Sən mənzili gülzarə bərabərmi bilirsən?

Göz yaşları qəlb içrə tükənməkdədi, ey yar,
Göz yaşımı dəryaçəmi, Tərtərmi bilirsən?

Aşiqlərə sərvər məni bildir, səni mən - şah,
Ey şah, məni sən yenə sərvərmi bilirsən?

Yaz şerini mərcan dodağınla sinəm üstdə,
Hər dəftəri köksüm kimi dəftərmi bilirsən?

Bildim qəzəlin qədrini zər timsalı, ey dost,
Zər qədri bilən hər kəsi zərgərmi bilirsən?

Hər yoldaşa yoldaş demə, yoldaş, uduzarsan,
Hər gövhərə bənzər daşı gövhərmi bilirsən?

Peyğəmbəri vəsf eyləməyə başladı çox kəs,
Hər nət yazan şairi Ənvərmi* bilirsən?

Hər Şahin olan kimsəyə şair demək olmaz,
Hər Sabiri sən Mirzə Ələkbərmi bilirsən?

*18.04.2001*

***

Qeysəm, o gözəl ahu Leylayə dönər bir gün,
Könlümdə həzin duyğu sevdayə dönər bir gün.

Tənhalığa ziddəm mən, təklik məni sıxmaqda,
Gözdən süzülən yaşlar dəryayə dönər bir gün.

Bəhr içrə sədəf dən-dən mirvariyə dönmüşdür,
Qəlbimdəki saf sözlər misrayə dönər bir gün.

Günlərlə cəfa çəkdim hər bir qəzəl üstündə,
Misramə qəmiş qoyma, zurnayə dönər bir gün.

Yad, özgə deyimlərdən diqqətlə təmizlənsə
Şerim şəkərə, qəndə, xurmayə dönər bir gün.

Çarpan gözə çöhrəmdə sakitliyə aldanma,
Gör ki, su da sakitdir, dalğayə dönər bir gün.

Qursun yuva qəlbimdə mən xoşladığım dilbər,
Bağban bağa baxmazsa səhrayə dönər bir gün.

Pakizə yerin vardır, ey sevgi, ürəklərdə,
Sənsiz, yer üzü, billəh, qovğayə dönər bir gün.

Dünya, köç edər səndən Şahin də bir aşiq tək,
Saqqal ağarar qar tək, bel yayə dönər bir gün.

*Lənkəran. 23.04.2001*

---

* Ənvər Nəzərli



***

Yenə fəryad edirəm, yar, neçin gəlmirsən?
Gəlməməkdə edib israr neçin gəlmirsən?

Getdiyin gün elə ilham pərim öldürdü özün,
Olmusan qətlə səbəbkar, neçin gəlmirsən?

Sevəni şad eləyərlər, sən isə eyləmisən
Qəlbimi dərdə giriftar, neçin gəlmirsən?

Gecələr ahü fəğandır mənə, gündüz nalə,
Məni qürbətdə qoyub zar, neçin gəlmirsən?

Göz yaşımla dolacaq badə, güman cam da dola,
Hələ çox ağlamağım var, neçin gəlmirsən?

Həzz alaq bir-birimizdən yenə əvvəlki təki,
Sevgi olsun bizə meyar, neçin gəlmirsən?

Hər görən Şahini söylər ki, "dönüb sərçə olub",
Gəlib et Şahini şonqar, neçin gəlmirsən?

*2.05.2001*

***

Yaxına gəlmə, a canan, uzaqlaş məndən,
Qoy ki tənha yaşasın can, uzaqlaş məndən.

Sən pərişan-pərişan edirsən nalə,
Mən peşiman-peşiman, uzaqlaş məndən.

Bağlanıb yolları vəslin, qapanıbdır qapısı,
Qırılıb əhd ilə peyman, uzaqlaş məndən.

Mən sevirdim səni, sən sevgimi yoxlaşdırdın,
Sevməyə yox daha imkan, uzaqlaş məndən.

Sanma vəslindən uzaq qərq olaram hicranə,
Mənə xoş gəlmədə hicran, uzaqlaş məndən.

Demə əfğan gələr, bir də şən olmaz halım,
Məni qoy öldürə əfğan, uzaqlaş məndən.

Bilirəm, aləmi sən qaldıracaqsan üzümə,
Edərəm aləmə üsyan, uzaqlaş məndən.

Sadəyəm, sadəliyim doğmada ariflikdən,
Gəl demə arifə dastan, uzaqlaş məndən.

Aşiqin bəxti, deyirlər ki, gülür bir dəfə,
Məni güldürmədi dövran, uzaqlaş məndən.

Məni sirdaş sanıb yaxşı yaxınlaşmışdın,
Şahini indi uzaq san, uzaqlaş məndən.

*4.05.2001*

***

Nə gərəkdir ki, odunlarla ocağım yansın,
Məni ağuşə çəkib quc ki, qucağım yansın.

Sən gedəndən bəri yanmır çırağım, ey dilbər,
Bir daha gəl ki, mənim bir də çırağım yansın.

Bağıbanəm, gözəlim, gəl ki, açılsın güllər,
Bağıban qoymayacaqdır daha bağım yansın.

Düşmən hərçənd alağ tək bürüyüb torpağımı,
Ya Ilahi, elə hökm et ki, alağım yansın.

Suyu Qudyal çayının Şahdağımın göz yaşımı?
Az qalıbdır qəzəbindən Babadağım yansın.

Xəncərim yağıların köksünə saplansın qoy,
Al günəşdən alaraq şölə bıçağım yansın.

Vətənim yağıdan, əlbəttə, təmizlənməlidir,
Qoymaram bir daha, Şahin, Qarabağım yansın.

*2.06.2001*

***

***"Fövcül-füsəha" şairlərinə!***

Şerdir qəlbə verən zövqü səfa, var olsun,
Şer üçün çəkdiyimiz cövrü cəfa var olsun.

Şerdə gərçi əruz vəzni böyük zəhmətdir,
Arabir zövq verən xəlqə heca var olsun.

Əruzun Seyyidi var, Sabiri var, Vahidi var,
Ya Ilahi, həmişə dahi, düha var olsun.

Həmişə yad eləsin bir-birini şairlər,
Qolda güc, üzdə gülüş, gözdə ziya var olsun.

Eşqdə dərdü bəla var isə mən xoşhaləm,
Böylədirsə bu əgər, dərdü bəla var olsun.



Vəslə yetsəydi olardı yer üzü Məcnunsuz,
Barı, Məcnun kimi hər bəxtiqara var olsun.

Lüğətimdən daha "əğyar" silinsin-getsin,
Sevilənlərdə, sevənlərdə vəfa var olsun.

Şahina, sidq ilə "Məcməş-şüəra" ərz eylər:
Füsəha məclisi "Fövcül-füsəha" var olsun!

*Lənkəran, 12.06.2001*

***

Yataqlar yox, otaqlar yox, bu gün meydan məkan olsun,
Oğullar pəhləvan olsun, oğullar qəhrəman olsun.

Giribdir düşmənim cəngə, yetişmişdir sınaq dövrü,
Gərək hər bir vətəndaşə bu günlər imtahan olsun.

Şuşam matəm libasında, bu gün Xankəndi möhnətdə,
Hanı Babəklərim gəlsin, pənahim Cavidan olsun.

Döyüş vaxtı çəkib xəncər girib meydanə əlbəttə
Gərək Şah Ismayıl tək hökmranlar hökmran olsun.

Xilas olsaq nifaqlardan, sevinnik ittifaqlardan,
Ilahi, qıyma Od yurdum məbada Çaldıran olsun*.

Yazıblar çox yaman olmuş Cahanşah**, var mənim şəkkim,
O cür göyçək qəzəllər sahibi sanmam yaman olsun.

Alağlardan təmizlənsin gərək yurdum qətiyyətlə,
Vətən dönsün gülüstanə, bu Şahin bağıban olsun.

*17.06.2001*

***

Təhlükədədir el-oba, mərdanə ayılsın,
Qıysın vətən uğrunda şirin canə, ayılsın.

Bir gör neçə ildir ki, yatır qış yuxusunda,
Atsın özünü şir kimi meydanə, ayılsın.

---

* Çaldıran - Şah Ismayıl və Sultan Səlimlə 23 avqust 1514-cü ildə baş verən döyüş yerinin adıdır.
** Cahanşah Qaraqoyunlu - məşhur hökmdar və şair (1397-1467).

Qar vaxtı yetibdir başa, sünbüllər oyansın,
Açsın gözünü lalə-süsən, nanə ayılsın.

Eşq elmini gündüz-gecə tədris eləyib mən
Artırmadayam elmini cananə ayılsın.

Saqi, gözümə gəlsə yuxu, bir də su səpmə,
Mey vur üzümə bəlkə bu məstanə ayılsın.

Əskiltmə daha atəşini, öylə yanıb ki,
Ey şəm, çətin ki, daha pərvanə ayılsın.

Məcnun kimi aqil arayır hey dəli Şahin,
Ətrafdə çoxdur dəli... Divanə ayılsın!

*21.06.2001*

***

Doluban qəlbimə əfğan nə istər məndən?
Eləyib halı pərişan nə istər məndən?

Görmüşəm mən bu həyat aləminin hər üzünü,
Bir neçə görməmiş insan nə istər məndən?

Mən həyasızlığa ziddəm və həyasızlar çox...
Ey canım, bir neçə nadan nə istər məndən?

Ermənistan eləyib zəbt mənim torpağımı,
Söyləyir "Azəribaycan nə istər məndən?"

Bir tərəfdən ona Rusiyyə də imdad eləyir,
Ey müsəlmanlar, o şeytan nə istər məndən?

Yarsız, guya, deyirlər ki, olubdur eyşim,
Düşmüşəm böhtana, böhtan nə istər məndən?

Neçə vaxtdır mənə dikmiş gözünü hicran həm,
Qalmışam mat ki, hicran nə istər məndən?

Nə gəlib çıxdı nigarım, nə də canım çıxdı,
Şahına, ah, həzin can nə istər məndən?

*23.06.2001*

***

Ver qərarın qərar üstündən,
Adlayaq ahüzar üstündən.



Nə bəla gəldi ki, nəsib oldu
İntizar intizar üstündən.

Çiləsin eşqimiz yağmur tək
Etibar etibar üstündən.

Eləyək biz fəxr sevgiylə,
İftixar iftixar üstündən.

Gül-çiçək dalbadal boylansın,
Laləzar laləzar üstündən.

Əgər ölsəm, gülüm, bu nisgillə,
Od çıxar bir məzar üstündən.

Şahinin qaldı dərd altında,
Ver qərarın qərar üstündən!

*4.07.2001*

***

Yarəb, nə qədər baxmaq olar yarə uzaqdan?
Et çarə ki, yalvarmaya biçarə uzaqdan.

Möhkəmdi Züleyxanın əlindən əli hicrin,
Etməkdə yenə köynəyimi parə uzaqdan.

Mən burda susuz-yanğılı, fəvvarə uzaqda,
Təsir eləməz yanğıya fəvvarə uzaqdan.

Daim nəzərim göyləri gəzməkdə, nə sirdir?
Bir gün gələcək gözlərimə qarə uzaqdan.

Bilmir bunu bir kimsə ki, dərdim nə böyükdür,
Xırda görünür gözlərə səyyarə uzaqdan.

Gəl yanıma, dilbər, yenə şövq ilə yaxınlaş,
Göstərmə yaxınlıq bu cəfakarə uzaqdan.

Şahin çağırır, çarəsi yoxdur daha, gəl çıx,
Eşq dərdinə mümkünmü ola çarə uzaqdan?

*29.07.2001*

***

Ey yar, səadət vallah özünsən,
Aləmdə məlahət billah özünsən.

Mənlən qoşalaşdın, sevdayə yol açdın,
Dünyanı dolaşdın, səyyah özünsən.

Əğyar olan kəs bir sirrimi bilməz,
Hər sirrimə sirdaş hərgah özünsən.

Sən ki eləyirsən düşmənlərə nifrət,
Bədxahə müqabil bədxah özünsən.

Cahillərə güldün, qafillərə güldün,
Çox rəmzi bilirsən, agah özünsən.

Yalnız sənə məlum çəkdim nə qədər ah,
Etdin məni gümrah, cərrah özünsən.

Dilbər dedi: - Eşqə bir şah gərəksə,
Yox başqası, Şahin, ol şah özünsən!

*30.08.2001*

***

Siz də eşq əhlinə izz ilə, səmimanə baxın,
Nə qiyamət yaraşır aşiqə cananə, baxın.

Tutmasınlar mənə irad gülüstandı yerim,
Görmək üçün gülü gülzarə, gülüstanə baxın.

Sevgi çox məsləkə məcbur eləyərmiş adamı,
Əvvəli şeyx idi, eyvah, o Sənanə baxın.

Saldı heydən məni bir neydəki əfsunkarlıq,
Neyə dönmüş qamışı, bəh, bu neyistanə baxın.

Dedilər "ay ilə gün bir-birinə aşiqdir",
Ay böyüklükdə, günəş boyda bu nöqsanə baxın.

Görmədən bir-birini kim kimə aşiqlik edər?
Yanırıq bir-birimizçin, mənə, cananə baxın.

Etsəniz arizu ki, qüssəli can olsun məst,
Belə Şahin kimi, cananəyə məstanə baxın.

*3.09.2001*

✦✦✦

*Lənkəranda fəaliyyət göstərən "Ziya" ədəbi məclisinin sədri şair Ziyafətə*

Hər zaman "Allah" desin ellər, duasız qalmasın,
"Qülhüvallah" söyləsin dillər, sədasız qalmasın.



Çəkməyirlər torpağımdan göz bu acgöz qonşular,
Kim bəla vermiş bizə, ya Rəbb, bəlasız qalmasın.

Haqq həqiqət göylərində qoy günəş tək parlasın,
Al günəş daim şüa saçsın, şüasız qalmasın.

Gah Irandır məskənim, gah Türkiyə, gahi Iraq,
Macəra gəzməkdə şair, macərasız qalmasın.

Mən "Ziya"nı gördüyüm dəmdən ziyalanmış gözüm,
Ya Ilahi, Lənkəran mülkü "Ziya"sız qalmasın!

Aşinalardan sədaqət görmüşəm hər yerdə mən,
Aşina, ey sevgilim, qoy aşinasız qalmasın.

Cümlə aşiqlər səfa eylər rica, Şahin - cəfa,
Yığ cəfalər qəlbimə, qəlbim cəfasız qalmasın.

*Lənkəran, 11.09.2001*

✦✦✦

Ey fələk, şənliyi cananıma göndər gəlsin,
Dərdisə qıyma ona, canıma göndər gəlsin.

Küsdü bağban görübən Şahini yarsız, getdi,
Qoca bağbanı gülüstanıma göndər gəlsin.

Qarabağ dərdinə acizdi bu gün loğmanım,
Iksiri, ecazı loğmanıma göndər gəlsin.

Göz dikən yurdumuza ibni-Salamlar çoxalıb,
Məcnunam, Nofəli meydanıma göndər gəlsin.

Baxıban görməyirəm indi Ərəbzəngiləri,
Çox Ərəbzəngini dövranıma göndər gəlsin.

Bizi kafərlərə qırdırma pərakəndə edib,
Birliyi indi müsəlmanıma göndər gəlsin.

Şahinəm, gündə qəzəl yazmadayam şövq ilə,
Kimdə ilham var isə yanıma göndər gəlsin.

*27.09.2001*

✦✦✦

Iki yar var, a dilbər, biri sənsən, biri mən,
Biri zərdir, biri zərgər, biri sənsən, biri mən.

Araya Məşdi Ibadlar girə bilməz əsla,
Biri Gülnaz, biri Sərvər, biri sənsən, biri mən.

Əgər olmazsa biri, digəri tüğyan eylər,
Biri qındır, biri xəncər, biri sənsən, biri mən.

Qurduğum dövləti abad iki kəs eyləyəcək,
Biri Başçı, biri Rəhbər, biri sənsən, biri mən.

Eşq bağında bu gün cəlb eləyən hər fərdi
Biri sərvdir, bir sərvər, biri sənsən, biri mən.

Atəşi eyləməsəm yaxşıca tər, yandıracaq,
Biri atəş, biri Tərtər, biri sənsən, biri mən.

Olmalı zabitə zabitdə, nizam əsgərdə,
Biri zabit, biri əsgər, biri sənsən, biri mən.

Dedi canan: - Xülasə iki kəs var, Şahin,
Ulu aşiqlərə bənzər - biri sənsən, biri mən.

*20.10.2001*



Etməyirsə məni cəlb gül və çiçək, ey Şahin,
Buna bais o mələkdir, o mələk, ey Şahin.

Söylədim: - Ayrılığın cövr eləyir qəlbə, - dedi:
Hicranın qədrini lazımdı bilək, ey Şahin.

- Gəl tutum mən ətəyindən, - dedim, - ey ceyranım,
Dedi: - Ceyranda məgər varmı ətək, ey Şahin?

Söylədim: - Sevgi ipiylə bələyim qəlbə səni,
Dedi ki, körpəyə lazımdı bələk, ey Şahin.

Söylədim: - Ağlar olub daima şairlərimiz,
Dedi: - Çox ağlamışıq, indi gülək, ey Şahin.

Söylədim: - Bir diləyim var ki, o da busəndir,
Dedi: - Yoxdurmu məgər qeyri dilək, ey Şahin?

Söylədim: - Əyməmişəm şahə də baş ömrümdə,
Dedi: - Sevda qabağında əyilək, ey Şahin.

*15.02.2002*



Çox səslədi dil ismini, dilbər, görünürsən,
Sən tazə dəyirsən gözümə, tər görünürsən.



Yaş axmada idi gözümün hər şırımından,
Mən söyləmirəm bir daha "Tərtər, görünürsən".

Varsan deyə ləl ilə cəvahirdə gözüm yox,
Qiymətli nigarım, mənə gövhər görünürsən.

Zövqüm çoxuna bəllidi, zövqün mənə bəlli,
Zərgər gözüdür məndəki, sən zər görünürsən.

Yarım, məni cəlb eyləməyir bağçada güllər,
Sən yasəmənü lalə, sənubər görünürsən.

Baxdım göyə diqqətlə münəccim kimi, amma
Ülkər gözümə dəymədi, ülkər görünürsən.

Məcnun kimi, Yusif təki görsənmədəyəm mən,
Leylayə, Züleyxayə bərabər görünürsən.

Yarım dedi: - Sözlər ki düzürsən belə, Şahin,
Arif gözünə sən yenə zərgər görünürsən.

*15.05.2002*



Vəslin yox olubdur deyə hicran görünübdür,
Yoxsan deyə sən naləvü əfğan görünübdür.

Ovqatı pərişandı bu zatın yenə, çünki
Zülfün mənə röyadə pərişan görünübdür.

Azər vətənim od mənə, atəş mənə vermiş,
Hicranımı yandırmağa fərman görünübdür.

Ey bədbin olan kəs, məni qorxutmadı müşkil,
Müşkil sənə - müşkil, mənə - asan görünübdür.

Azər nəri, azər əri, azər bəyiyəm mən,
Azər bəyinə Azəribaycan görünübdür.

Fərhadı anarkən gözümə dağ görünmüş,
Məcnuni anan dəmsə - biyaban görünübdür.

Şahin, dedilər yar gəlir, kaş elə olsun,
İcrası üçün meylimin imkan görünübdür.

*25.09.1995*



Əldən elə düşdüm ki, fəğanım daha yoxdur,
Sağ qalmağıma indi gümanım daha yoxdur.

Qəlbimdə mənim var idi saf sevgi cahanı,
Yıxdın o cahanı ki, cahanım daha yoxdur.

Cəlladə deyin gözləyirəm qətlimi, gəlsin,
Bir kipriyi ox, qaşı kamanım daha yoxdur.

Olsa ikiqat bir gecədə qəddim, o dilbər
Dad eyləyəcəkdirmi cavanım daha yoxdur?

Şirin soracaqdırmı ki, memarım hayanda?
Xummar deyəcəkdirmi çobanım daha yoxdur?!

Dam uçmadadır üstümə, yoxdur o güləndam,
Yer qaçmadadır, sanki məkanım daha yoxdur.

Şahin desə "yoxdur canı" şəkk eyləməsinlər,
Cismimdi görürlər, hanı, canım daha yoxdur.

*29.09.1995*



***Valeh Layiq Gəncəliyə-***
***"əfqan" dostuma!***

Mən vüsal istəyirəm qarşıma hicran çıxır,
Hicr gəlcək, bədənimdən elə bil can çıxır.

Kabulun dağları qurşaq kimi qucmuş şəhəri,
Xatirimdən dağa baxdıqda biyaban çıxır.

Çəkəcək, hiss edirəm mən ki, bu dağlar mənə dağ,
Vətənim, sanma yadımdan o gülüstan çıxır.

Bəlxi vəsf eylədiyim dəmdə düşür yadə Bakı,
Əfqanıstan yazıram Azəribaycan çıxır.

Baxıram göylərə, tez-tez gözümə qan görünür,
Dan yerindən üfüqün sanki qızıl qan çıxır.

Zənnə bax məndəki, ey çərx, nə həngamədi bu,
Mən mələk gözləyirəm, ortaya şeytan çıxır.



Ey qəzəlxan, belə yazma, bu nə bədbinlikdir,
Nikbin ol, gündə əlindən yenə imkan çıxır.

Bu qədər rəng arasında qara rəng axtarma,
Görməyirsənmi çiçək, gül necə əlvan çıxır?

Sən gəlirkən, gözəlim, gözlərə huri görünür,
Mən gəlirkən, elə bil qarşına qılman çıxır.

O səbəbdən ki, sənin xahişini xoşlamıram,
Dodağından mənə hər dəm neçə fərman çıxır.

Elə şirindi vüsalın ki, xəyalım - səndə,
Tutinin sanma yadından şəkəristan çıxır.

Saf qəzəl gülşənimi kim ki gəzir, ey Şahin,
Söyləyirlər oradan daima heyran çıxır.

*10.10.1995*



Aşiqin, ey pəri, günlərlə güman içrə gəzir,
Elə bir yolçuya bənzər ki, duman içrə gəzir.

Dildə eşq, gözdə işıq, qanda mehr, canda alov,
Şövqün, ey yar, neçə ildir ki, bu can içrə gəzir.

Keçirəm Ağrı dağından* yada Şahdağ düşür,
Gedirəm Məşhədə, fikrimsə Muğan içrə gəzir.

Ötürəm Dəşti-Kəbirdən** anıram mən Aranı,
Şair İrandasa da, sanki Aran içrə gəzir.

Edirəm öylə təsəvvür ki, yenə Bəlxdəyəm,
Mənim hərdən də xəyalım Həmədan içrə gəzir.

Daha bəsdir, cahanı tazə sevənlər gəzsin,
Bu sevən gör neçə müddətdi cahan içrə gəzir.

Dolaşır çölləri, yarəb, nə olubdur Qeysə?
Faidə olmadığındanmı ziyan içrə gəzir?

Bu məkan içrə nə vardırsa deyildir əbədi,
Nəzərim indi mənim başqa məkan içrə gəzir.

---

* Türkiyədə dağ
** İranda səhra

Məqsədim bir neçə "Divan"da bəyan olmuşdur,
Şairin məqsədi, əlbəttə, bəyan içrə gəzir.

Həyəcan içrə günüm keçdi yenə, söylədilər:
- Necə şahindi bu uçmur, həyəcan içrə gəzir?

*19.10.1995*

✦✦✦

Nə misri qılıncım, nə də ki at varımdır,
Həqdən mənə təbim kim sovqat varımdır.

Bir isminə peyğəmbərin Əhməd deyilibdir,
Əhməd kimi həzrət, Əli tək zat varımdır.

Varımdı Nizamim, hələ ustad Füzulim,
Sokratə bərabər neçə Sokrat varımdır.

Tanrım mənə lütf eyləyibən söz varı vermiş,
Nətim, qəzəlim var, minacat varımdır.

Ey saf qəzəlimçin mənə irad eləyən kəs,
Iradına qarşı neçə isbat varımdır.

Cərrah fələk öylə kəsib cismimi, onda
Qürbət bıçağıyla əməliyyat varımdır.

Onda nə qədər həzz, ömürdən neçə ləzzət,
Onda nə qədər yarə də, heyhat, varımdır.

Çatmaq dilərəm vəslinə yarın ki, hicrdən
Şahin, ürəyimdə nə qədər çat varımdır.

*20.11.1995*

✦✦✦

Rahət oldum, dilbərim, səndən xəbər göndərdilər,
Möhtac ikən, tutiyə sanki şəkər göndərdilər.

Sözlərimdən şur itmişkən, şirinlik verdilər,
Gözlərimdən nur getmişkən, nəzər göndərdilər.

Yanına payi-piyadə getməyə səbrimmi var?
Yetmək üçün yanına yarın kəhər göndərdilər.

Aləmin mahiyyətin sordum, cavabı gəldi: Eşq!
Xahiş etdim müxtəsər söz, müxtəsər göndərdilər.



Söylədim əğyarə: - Bica eşqdən umdun dəva,
Sən dəva eylərkən arizu, zəhər göndərdilər.

Hicri təcrid eyləməkdir vəsli təqdir eyləmək,
Qılmaq üçün onları ayrı, çəpər göndərdilər.

Sevgi zərdir, mənsə zərgər, Şahina, lütf eyləyib
Zərsiz ikən, zərgərə bir gör nə zər göndərdilər!

*15.12.1995*

✦✦✦

Əhdə vəfa etməyən nazlı nigarım gedir,
Hicrə tərəf üz tutan sevgili yarım gedir.

Öz yerini tərk edir gör necə gülsüz qışa...
Gözləmədən vaxtını güllü baharım gedir.

Çal tarını tarzən, tarımı sındırmışam,
Hafizədən büsbütün "Şur"ü "Qatar"ım gedir.

Getsə əlimdən əgər var-yoxum, ah etmərəm,
Eşqü məhəbbət kimi sərvətü varım gedir.

Olmayıb Eyyubdə məndə olan hövsələ,
Indi əlimdən mənim səbrü qərarım gedir.

Sən məni illər boyu məstü xumar etmisən,
Mən necə qəmlənməyim, saqi, xumarım gedir.

Tez məni yelpikləyin, almayıram mən nəfəs,
Varmı hava udmağa, yox, havadarım gedir.

Yarına izhar edin sözlərini Şahinin:
Getsə azarım gəlir, gəlsə azarım gedir.

*22.12.1995*

***

Gördünüz öylə ki siz qarşıma dildar gəlir,
Əl çalın rəqs eyləyim, yar gəlir, yar gəlir.

Halım olmuşdu pərişan mənim yar gedəli,
O da getmişdi pərişan və xummar gəlir.

Allah-Allah, üzündə vüsalın şöləsi var,
Eləyib ayrılığı, hicranı inkar, gəlir.

Nə deyim, ayrılığın bəlkə də yoxmuş səbəbi,
Bu səbəbsiz ki deyildir o səbəbkar gəlir.

Ya Ilahi, yadımızdan çıxa bilmirsən heç,
Hər könüldən Sənə hər dəm neçə ilqar gəlir.

O məqamın bizə mübhəm, bizə əsrarəngiz...
Hardasan? Üstünə sirrin yenə əsrar gəlir.

Göylərin sirrini dərk etməyə cəhd eyləyirəm,
Mənə söz meydanı, söz yox ki, bu gün dar gəlir.

Hərənin bir şeyə məlumdu giriftarlığı,
Mən görüncək deyilir "Eşqə giriftar gəlir".

Düşünürdüm axırım çatdı mənim, ey Şahin,
Viran olmuşdu könül məskəni, memar gəlir.

*12.01.1996*



Yaxşıdır öylə sevən eşqi yaman eyləməyir,
Dilbərin cövrünü hər yerdə bəyan eyləməyir.

Elə adəm görürəm mən günü rahətcə ötür,
Özünü sevgi yolunda nigəran eyləməyir.

Sünilikdən aralı olsa əsl sevdadə,
Hər kimin mənfəəti varsa, ziyan eyləməyir.

"Qana qan" söyləməyən aşiqə can qurbandır,
Canfəda olsa da hətta, özü qan eyləməyir.

Elə aşiq tapılır müşkili yoxdur zərrə,
Niyə Allah işimi öylə asan eyləməyir?

Yansa barmaq azacıq, eyləyirik biz fəryad,
Kərəmin cismi yanır, amma fəğan eyləməyir.

Şahinin düzlüyünə şəkk eləyən yox, çünki
Tutduğu doğru yolu əyri güman eyləməyir.

*15.01.1996*



Hər şəmə yanan sən kimi pərvanə deyildir,
Hər dürr özünü öysə də dürdanə deyildir.



Mərdin təpəri bəllidi mərdanəliyindən,
Hər kimsənə "mərdəm" desə mərdanə deyildir.

Eşq aləminin zövqünü əsla duya bilməz,
Eşq əhlinə hər kim ki səmimanə deyildir.

Mən dilbərə bəndəmsə bu yaşda, o demək ki,
Gözlər hələ gerçəkliyə biganə deyildir.

Vermir saçının ətrini gülşəndəki güllər,
Saçmaqda ətir heç birisi nanə deyildir.

Viranədə guya tapılır varsa xəzinə,
Var öylə xəzinəm yeri viranə deyildir.

Qəlbimdə mənim söz varı vardır neçə xalvar,
Gerçəkdi sözüm, Şahina, əfsanə deyildir.

*5.02.1996*



Söz söyləməsən yaxşı, dəyərsiz qalacaqdır,
Artırmasa zərgər zəri, zərsiz qalacaqdır.

Düzgünlüyə bəndəm deyə, bağban, sanıram ki,
Bir gün gələcək bağça çəpərsiz qalacaqdır.

Gündüz-gecə Həvvalarımız şənlənəcəklər,
Adəmlərimiz qüssə-kədərsiz qalacaqdır.

Cəng olmayacaq, hərbə məhəl qoymayacaqlar,
Qəhr olmayacaq, ölkə qəhərsiz qalacaqdır.

Atəşkəsi kəssən, yenə başlansa əgər hərb
Yarəb, neçə məsum pəri ərsiz qalacaqdır.

Var öylə inamım, inan bilməyirəm ki,
Bir gün susacaq qəlb, təpərsiz qalacaqdır.

Yazmazsa əgər gündə şəkər şerini Şahin,
Təb tutisi, əlbəttə, şəkərsiz qalacaqdır.

*8.02.1996*



Yer kürrəsi bir yanda gülab ilə dolubdur,
Bir yanda tikan ilə, əzab ilə dolubdur.

Hicranı qovub eyləmisən tərk günahı,
Şadəm, ürəyin indi səvab ilə dolubdur.

Şadəm ki, mənim qəlb evimi təmir edibsən,
Aləm, gözəlim, xanəxərab ilə dolubdur.

Qəlbimdə sənin şəninə yüzlərlə kitab var,
Çoxdan bu kitabxanə kitab ilə dolubdur.

Hicrin məni yaxmış, ciyər olmuşdu kabab tək,
Çox canmı ciyər yansa, kabab ilə dolubdur.

Var öylə cavablar ki, sual altına düşmüş,
Var öylə suallar ki, cavab ilə dolubdur.

Şirin dəmimi eylər acı, badəni tulla,
Saqi, hanı fincan ki, doşab ilə dolubdur?

Xoşbəxt elədin Şahini, rəftarına əhsən,
Vəslin camı, ey yar, şərab ilə dolubdur.

*19.02.1996*

✦✦✦

Geridə qaldı vüsal, ortada hicran görünür,
Hicranın boz sifəti aşiqə hər an görünür.

Canımın yarısı cananım idi, yarısı mən,
Yarısı getdi hara, can yarımcan görünür.

Arada bir neçə iblislik edən adəm var,
Var mələk çöhrəli adəm, mənə şeytan görünür.

Mənə eyham ilə hərdən söz atanlar tapılır,
Yox həqiqətdən əsər bir gilə, böhtan görünür.

Nə əlac eyləyənim var, nə şəfa bəxş edənim,
Nə təbib nüsxəsi peyda, nə də loğman görünür.

Amma hicran mənim təbimə təsir eləməz,
Təbimin köhləni üçün yenə meydan görünür.

Ayda bir şer yazan var, mən isə gündə neçə,
Ona müşkil görünən şey mənə asan görünür.

Yarı Leyla görürəm mən, özümü Qeys kimi,
Vətənim Azəribaycan Ərəbistan görünür.



Dayanıb ibn-Salam baxmada şaşqınlıqla,
Mənə Nofəl köməyi yoxsa da, imkan - görünür.

Qələmimdən bu qəzəl çıxdı pərişan, dedilər:
- Bu qəzəl, sahibi tək xeyli pərişan görünür.

*20.02.1996*

✦✦✦

Kim deyir dağ üzərində daha çən görsənmir?
Yaxşı baxsın! O çəni indi çəkən görsənmir.

Bağiban, asmalıyam sərv ağacından səni mən,
Nə üçün gözlərimə lalə, süsən görsənmir?

Görmürük biz neçə vaxtdır Əli tək bir igidi,
Hüseyn yoxdu, nə müddətdi Həsən görsənmir.

Hanı Düldül ki, tutaq busəyə dırnaqlarını?
Zülfüqar yoxdu daha, indiyəcən görsənmir.

Hanı Mehdi, nə zaman eyləyəcəkdir o zühur?
Hanı Şah Ismayılım ki, ona tən görsənmir.

Ağqoyunlu Həsənim hardadı çəksin xəncər?
Var vətən, amma ki, vahid o vətən görsənmir.

Misirin misri qılıncı daha par-par yanmır,
Şadü xürrəm nə Misir var, nə Yəmən görsənmir.

Necə xoşbəxtdi bu Şahin çəkir aləm qəmini,
Amma, Şahin qəmini varmı çəkən? Görsənmir!

*7.03.1996*

✦✦✦

Can alandır, can gedir, cananə yoxdur etibar,
Etibar cananə yoxsa, canə yoxdur etibar.

Gərçi cəzb eylər səni, aldanma şəmin nurinə,
Yandırar bir ləhzədə, pərvanə, yoxdur etibar.

Bir zamanlar var idi imkanımız dağ yarmağa,
Günbəgündən qeyb olur, imkanə yoxdur etibar.

Naxçıvanlı, Lənkəranlı, Nardaranlı fərqi yox!
Yerlibazlıq eyləyən sultanə yoxdur etibar.

Əmr var, fərman da vardır, hökm də - icrası yox,
Ömrə yoxdur, hökmə yox, fərmanə yoxdur etibar.

Üsyan olcaq qan axıb ümman olur - Qan ümmanı,
Baş gedir, sirdaş gedir, üsyanə yoxdur etibar.

Məzhəbindən eşqi uğrunda dönən aşiq hanı?
Öldü-getdi, bir yeni Sənanə yoxdur etibar.

Gəh vüsaldır, gəh də hicran, gəh hicrdir, gəh vəsl,
Həm vüsalə, həm də ki hicranə yoxdur etibar.

Ad dəyişdirmək də vardır, Şahina, dövrandə,
Qeysi Məcnun eyləyən dövranə yoxdur etibar.

*19.03.1996*

✦✦✦

Ildə bir yol kiməsə kimsə əgər qurbandır,
Şahin isə sənə hər şamü səhər qurbandır.

Gözəlim, yerdə sənə yerdəki hər zər-zivər,
Mələyim, göydə günəş, göydə qəmər qurbandır.

Hələ öyrənməliyəm rəngini göyqurşağının,
Sənə göyqurşağı rəngində kəmər qurbandır.

Aləmin xoşladığın hər şeyi qurbandı sənə,
Dağda meh, bağçada gül, bağda bəhər qurbandır.

Hələ Şahdağ sənə qurban, özüm etdim bəxşiş,
Sənə Qudyal çayı bir yanə, Xəzər qurbandır.

Ən şirin sözləri bəxş etməliyəm hər ləhzə,
Şəkərim, tutiyə, əlbəttə, şəkər qurbandır.

Şəmə pərvanə əgər yanmasa pərvanə deyil,
Bu sevən hüsnünə ondan da betər qurbandır.

Bir qəzəldən, gözəlim, özxoşuma əl çəkdim,
Bir qəzəl yox, sənə yüzlərlə əsər qurbandır.

Dəfələrlə sınayıbsan sözümün düzlüyünü,
"Qurbanam" söyləyən hər şəxs məgər qurbandır?

Çəpər üstdən keçə bilmir bağa yarım yenə də,
Bağiban, yıx çəpəri, yarə çəpər qurbandır.



Mən vüsal aşiqiyəm, bəsləyirəm vəslə ümid,
Ölərəm, söyləmə "biçarə hədər qurbandır".

Şahinin kəsmə qapından ayağın, ey dilbər,
Ayağın kəsmə, başın kəssən əgər, qurbandır!

*27.03.1996*

✦✦✦

Göydə qəmər gün gəzir, gündə qəmər dərdi var,
Yerdəsə insanların gör nə qədər dərdi var.

Maviliyindən əsər qalmayacaq get-gedə,
Kimdə nöyüt iştahı, kimdə Xəzər dərdi var.

Nırxı çoxalmaqdadır ölkədə gündən-günə,
Tuti bu gün lal olub, onda şəkər dərdi var.

Qaçdı verib yurdunu düşmənə arvad, kişi...
Indi Nəbi həsrəti, indi Həcər dərdi var.

Zülfü qar olsam da mən istəyirəm zülfüqar,
Ya Əli, Düldül hanı, məndə kəhər dərdi var.

Qəlbimi qəmləndirir hər qəmi aşiqlərin,
Sanki veribdir mənə hər pəri hər dərdi var.

Xəlvət olan bir bucaq indi bəsimdir mənim,
Amma ki dərvişdəsə seyrü səfər dərdi var.

Canda şer yanğısı dəftərimi yandırır,
Kimdə gümüş meyli çox, kimdəsə zər dərdi var.

Gündə çəpər bərkidir bağda yenə bağiban,
Kimdə süsən həsrəti, kimdə çəpər dərdi var.

Kimdə əgər şəxsi dərd, fərdi kədər var isə,
Dərdli bu Şahindəsə külli-bəşər dərdi var.

*9.05.1996*

✦✦✦

Inkar eləyən eşqini dildarə sözüm var,
Olmuşsa əgər rəngi sözün qarə, sözüm var.

"Əğyar" sözü dilbərə həm nisbət olundu,
Yarım idi bir vədə, o əğyarə sözüm var.

Guya mənə sevdası ki var idi saf idi,
Saf eşqini etmiş niyə bəs parə, sözüm var.

Yoxdur deyə həzz təntənəsi dərd varımızdır,
Var dərdimizə yoxdu neçin çarə, sözüm var.

Peyman məgər böyləmi, peymanə sualım,
İlqar məgər böyləmi, ilqarə sözüm var.

Yoxdur daha sirr pərdəsi bir sirrimiz üstdə,
Cövr etdi, cəfa etdi, cəfakarə sözüm var.

Dildarlərin dilləri möhkəm gərək olsun,
Şahin, bu sözümlə nə qədər yarə sözüm var.

*21.05.1996*



Hər dəmim, ey gözəlim, qəm yaradır,
Hər qəmim sanki cəhənnəm yaradır.

Söyləyir gündə bu dil "qəm" o qədər
Deyəsən bir yeni "Dilqəm" yaradır.

Ürəyimdən süzülən qüssələrim
Bəbəyimdə həmişə nəm yaradır.

Çox dedim Qudyala tərif, deyəsən
Qubalı bir yeni Zəmzəm yaradır.

Nə təzaddır görəsən beynimdə -
Həm yaratmır təzə şer, həm yaradır.

Yorulan dəm özümə əmr edirəm:
Təbi süst etmə ki, möhkəm yaradır!

Üşüdür cismimi tərif küləyi,
Bu külək məndə sətəlcəm yaradır.

Dedi şer aləmimi seyr eləyən:
- Bir baxın Şahinə, aləm yaradır!..

*2.06.1996*



Dilbəra, zənn eyləmə məndən dözüm, təmkin qaçar,
Dözmüşəm, dözməkdəyəm, vəslin gələr, hicrin qaçar.



Qəmliyəm, görsənməyirsən, gəl ki, görsəm hüsnünü
Bir nədir, yüz-yüz nədir ki, qəmlərim min-min qaçar.

Vardı kin qəlbimdə çoxlu, yoxdu ümmid eşqinə,
Ey nigarım, sən mənə sevdanı bildir, kin qaçar.

Can nənəm, biz qorxmuruq cindən daha, ətrafdə
Öylə çoxdur cinsifət insan ki, görsə cin qaçar.

Qiyməti qalxır bazarda əppəyin gündən-günə,
Hikkəsindən təknə - çatlar, sac - sınar, ərsin - qaçar.

Ruhpərvər, qəlbişən kəslərlə var ünsiyyətim,
Məclisimdə hər zaman nikbin - qalar, bədbin - qaçar.

Çox şükür, dəymir gözə çoxdan bəri əğyarlər,
Bəlli ki, şahin görüncək sərçə, bildirçin qaçar.

*20.08.1996*



***Mir Cəlal Zəkiyə***

Şəmə yandırmağa öz canını pərvanə gəlir,
Bu əməl aciz olan aşiqə biganə gəlir.

Ruhin ölməzliyi haqqında hədislər çoxdur,
Qayıdıb ruh, deyirlər, təzədən canə gəlir.

Bu əgər böyləsə Vahid yenə peyda olacaq,
Görərik Mirzə Ələkbər yenə dövranə gəlir.

Yuxu gördüm ki, dirilmiş təzədən Seyyid Əzim,
Bu həmin Seyyid Əzimdirmi ki, Şirvanə gəlir?

Mənce ürfan ilə mənadə, təsəvvüf birdir,
Neçə məna ki, təsəvvüfdədi ürfanə gəlir.

Qəlbidar öylə adam var ki, görüb göz - qaralar,
Gözümə nur gəlir onda ki, cananə gəlir.

"Novbəharı bu könül bağının, ey gül, sənsən,
Getmə, sənsiz ki, xəzan sineyi-viranə gəlir"*.

Bağiban qaldı məəttəl səni görcək, çünki
Qarşına səcdəyə nərgiz yüyürür, nanə gəlir.

Şahinəm, amma ki şahanə, çıxıb "Divan"ım,
Dedi yar: - Şahinə bax, gör necə şahanə gəlir.

*23.08.1996*

✦✦✦

Sənə bir yar, iki, üç yar, mənə bir yar lazımdır,
Mənə eşqi pəsənd etmək, sənə inkar lazımdır.

Məcazi eşqə aldanmış, vüsal istər əqlsizlər,
Ey aşiqlər, sizə Məcnun kimi sərdar lazımdır.

Məhəbbət öylə nemətdir ki, hifz olsun gərək daim,
Nə lazımdır nifaq etmək, bizə ilqar lazımdır.

Qərarın, ey könül, eşqi cahanda bərqərar etmək!
İnamın var isə iqrarına, israr lazımdır.

Sözüm haqdırsa da, təsiri az... donmuş beyin gördüm,
Yeritməkçin o cür haqlı sözü mismar lazımdır.

Gülüstanda alağ olsa uçar bülbül, məkan etməz,
Təmizlənsin gülüstan, bülbülə gülzar lazımdır.

Mənəm, memarı tək gəldim sözün, amma deyən yoxdur:
- A Şahin, yaxşı gəlmişsən, bizə memar lazımdır.

*1.10.1996*

✦✦✦

Sevdim səni, sevdin məni, sevdayə səbəb var,
Əlbəttə, səbəb var deyə qəlb içrə tələb var.

Sevmək dəbi ən pakizə dəbdir dəb içində,
Aləmdə əzəldən bəri, xoşdur ki, bu dəb var.

Heyran eləyibdir məni hər yerdə nəzakət,
Bülbüldə meyl, bağdə gül, güldə ədəb var.

Mey var, rübab var... vara rəğbətim artır,
Meyxanədə cananə də vardırsa, əcəb var.

Aşiqlik edən adəmə könlümdə məhəbbət,
Əğyarə dönən hər kəsə qəlbimdə qəzəb var.

Həzrət Əli timsalı adamlar daha yoxsa,
Əfsus ki, Mülcəm yenə vardır və Ləhəb var.

---
* Beyt Məhyəddinindir (XIX əsrin sonu - XX əsrin əvvəli).



"Məcnun" dedi, "Leyla" dedi, "səhra" dedi Şahin...
Az qaldı səda eyləyələr: Burda ərəb var!

*3.10.1996*

✦✦✦

Cəhd edib tapmağa dürdanələri hərdənbir,
Gəzirəm mən dəxi viranələri hərdənbir.

Yarımın saçlarının ətrini yad eyləyərək
Dərirəm, qoxlayıram nanələri hərdənbir.

Məni əqrəb kimi sancmaq diləyənlər vardır,
Sancıram mən elə biganələri hərdənbir.

Mənə haqsız atılır tənə daşı danə kimi,
Dənlərəm quş təhəri danələri hərdənbir.

Mən ki, ömrüm boyu namərdlərə üz tutmamışam,
Səslərəm mərdliyə mərdanələri hərdənbir.

Ulu aşiqləri təqdim edib ariflər tək,
Yaradaq çox yeni əfsanələri hərdənbir.

Məcnunun qədri bilinsin deyə divanə kimi,
Çağıraq məclisə divanələri hərdənbir.

Meyü meyxanəni tənqid eləyək hiddətlə,
Bəlkə hüşyar ola məstanələri hərdənbir.

Yazaraq biz ki, yanırlar can atanlar vəslə,
Qoruyaq, Şahina, pərvanələri hərdənbir.

*7.10.1996*

✦✦✦

Allahı sevib bildim hikmət nə olan şeydir,
Qüdrət nə olan məfhum, qüvvət nə olan şeydir.

Bir sahəyə baş qoşmam, öyrənmədəyəm küllü,
Xacə haradan bilsin külfət nə olan şeydir.

Var-yoxda gözüm yoxdur, sərvət mənə eşqimdir,
Zər-zivərə meyl etməm, sərvət nə olan şeydir.

Bihudə edir cəh-cəh bülbül gülü gördükdə,
Eşq anları başlarsa söhbət nə olan şeydir.

Vacibsə əgər hicrət, olsun! Axıariflər
Öyrəndi Məhəmməddən hicrət nə olan şeydir.

Aqillərə müştaqəm, cahillə edib söhbət,
Bildim nə imiş vəhşət, dəhşət nə olan şeydir.

Dövlət mənə dövlət yox, dövlət mənə - "Divan"ım,
Qafil haradan bilsin dövlət nə olan şeydir.

Iqdam elə çox elmə, gəlməkdə əcəl hər dəm,
Şahin, hələ bilmirsən fürsət nə olan şeydir.

*4.11.1996*

✦✦✦

Vardırmı günahım ki savabında gözüm var,
Həzzində gözüm yoxdu, əzabında gözüm var.

Görcək məni allandı yanağın, bu nə sirdir?
Sirdaşına aç sirri, cavabında gözüm var.

Tərk eyləmişəm badəni, gül şövqü başımda,
Saqi, mənə mey vermə, gülabında gözüm var.

Dünyayə ayıq baş ilə baxmaq daha yaxşı,
Ərz eyləmərəm bir də şərabında gözüm var.

Yandır məni eşqinlə, ciyərsiz deyiləm mən,
Od səndə, ciyər məndə, kababında gözüm var.

Şahin sənə bir tazə kitab eylədi ithaf,
Yar dindi: - Sənin tazə kitabında gözüm var.

*15.11.1996*

✦✦✦

Leylayə desinlər, sənə ülkər deməsinlər,
Məcnunə desinlər, mənə sərvər deməsinlər.

Eşqin o çətin təliminin əsgəriyəm mən,
Təlimdə zəif əsgərə əsgər deməsinlər.

Məstəm, gözəlim, çünki mey içdim dodağından,
Hər kəs ki içir mey ona kafər deməsinlər.

Sandıqçama hər xoş sözünü zər kimi yığdım,
Zər qədrini bilməzlərə zərgər deməsinlər.



Eşqin gülünü mən kimi dərməz daha kimsə,
Əl dərdiyini dərdi, yenə dər deməsinlər.

Yar etdi qələm - kipriyini, sinəmi - dəftər,
Bir şairə mən tək sınədəftər deməsinlər.

Şahin quşuyam, amma səməndər də deyən var,
Quş atəşə dözməzsə səməndər deməsinlər.

*8.12.1996*

✦✦✦

Yarəb, bir əməl varmı hesab olmayacaqdır?
Bir dövr olacaqdırmı əzab olmayacaqdır?

Əğyar eləyir, kimsənə etməz o günahı,
Əğyardə bir zərrə savab olmayacaqdır.

Eşq barədə sorsan sənə məlumdu cavabım,
Məndə, gözəlim, qeyri cavab olmayacaqdır.

Mərdəm elə mərdanəliyim aləmə bəlli,
Fərdəm elə, heç kim mənə bab olmayacaqdır.

Heyfim o gülə gəlmədi torpaq olacaqdır,
Heyfim o gülə gəldi gülab olmayacaqdır.

Saqi dedi gəl məclisə mey var, rübab var,
Saqi, o nə məclis ki, rübab olmayacaqdır?

Aşiq, ciyərin var isə yan, ağciyər olma,
Heç öylə ciyər varmı kabab olmayacaqdır?

Hətta daha fironları da mumyalamırlar,
Varmı elə bir qəsr xarab olmayacaqdır?

Aləm qəmini mən kimi azdır çəkən indi,
Bir gün gələcək cismdə tab olmayacaqdır.

Şahin, elə yaz şerini olsun sənə layiq,
Yazma elə dəftər ki, kitab olmayacaqdır.

*20.12.1996*

✦✦✦

Zövq əhlini gər indi də heyran edəcəkdir,
Təbim gələcək əsrdə tüğyan edəcəkdir.

Yazdıqlarımı dil hələlik aşikar etmir,
Qəlbim hələ çox gövhəri pünhan edəcəkdir.

Bir yol da mənim yanıma loğmanı çağırma,
Mən xəstəyə Rəbbim səni loğman edəcəkdir.

Vəslin nə qədər olsa cana can gələcəkdir,
Hicrin isə tam canı yarımcan edəcəkdir.

Təklif eləsən hər nə qədər neməti, amma
Tuti yenə xahiş şəkəristan edəcəkdir.

Mehdi ki, zühur eyləyəcək, ədlinə qurban!..
Qal əhlini hal əhlinə qurban edəcəkdir.

"Divan"ıma qarşı nə qədər var isə asi,
Şahin o qədər asiyə üsyan edəcəkdir!

*18.01.1997*



Izzətli, şərafətli bir xan Fətəli xandır*,
Qeyrətli, şücaətli insan Fətəli xandır.

Bir bölgədə dörd-beş xan, hər xanda qəzəb, tüğyan...
Birləşdi Quba, Şirvan, sultan Fətəli xandır.

Rüzgar acı, gün qarə, göz yaşları fəvvarə...
Vəhdətsə əgər çarə, loğman Fətəli xandır.

Vəhdət çiçəyi solsa, basqın Qubaya olsa,
Düşmən Qubaya dolsa, qalxan Fətəli xandır.

Qudyal çayı bir yanı, üç yan isə ormanı,
Gəl gəz bu gülüstanı, bağban Fətəli xandır.

Əlbirliyi xar olsa, yurdumsa şikar olsa,
Yağı canavar olsa, qaplan Fətəli xandır.

El düşsə yaman halə son qoymalı cəncalə!
Şahin, belə amalə heyran Fətəli xandır.

*28.01.1997*



***Bir cahilə***

Sənə eşqin ki, əlifbasını öyrətmişlər,
Hələ zənn etmə ki, mənasını öyrətmişlər.

* "Quba tarixi" adlı kitabımda getmiş qəzəl



Xəbərin varmı sənin sevginin əsrarından?
Mənə əsrarü müəmmasını öyrətmişlər.

Yazaraq sadə qəzəl möcüzə göstərməyirəm,
Xəlqi şerin mənə bərpasını öyrətmişlər.

Sən əbəs cəhd eləyib şerimə əmma qoyma,
Mənə şerin neçə əmmasını öyrətmişlər.

Nəzəri musiqini bəlkə də öyrənmişsən,
Mənə, bil ki, onun ifasını öyrətmişlər.

"Lailahə" sözünü söyləmə "illəllah"sız,
Mənə inşasını, imlasını öyrətmişlər.

Şənə elm ümmanının sirri mücərrəd görünür,
Ümmanın Şahinə məcrasını öyrətmişlər.

*23.03.1997*



Gizlənibdir elə möhkəm kədərim görsənmir,
Faidəm məhz budur ki, zərərim görsənmir.

Tutiyəm şirnisevən mən, acıdır rüzgarım,
Daha qənddən xəbərim yox, şəkərim görsənmir.

Rəml atıb aşikar etdim gələcək əyyamı,
Qürbətə bir dəxi, yarım, səfərim görsənmir.

Könlü sındırmağı çoxdan qadağan eyləmişəm,
Hamı qoy arxayın olsun, xətərim görsənmir.

Demişəm bağbana yıxsın çəpəri biryolluq,
Kim gəlir bağıma gəlsin, çəpərim görsənmir.

Baxışımdan mənim, ey şux, fələk baş açmaz,
Baxıram mən sənə, amma nəzərim görsənmir.

Şerimin qiymətini, Şahina, hər kəs görməz,
Zərgərəm mən elə mahir ki, zərim görsənmir.

*14.05.1997*



Dünyanın o afət kimi heç afəti yoxdur,
Varmı elə məclis ki, onun söhbəti yoxdur.

Fürsətgəzənəm, gəzmədəyəm fürsəti, kəs var
Yarın yanına getmək üçün fürsəti yoxdur.

Dəvət şəhərə mən elədim Məcnunu, dindi:
- Səhra kimi dünya evinin cənnəti yoxdur.

"Qürbət" sözünü silməliyəm tez lüğətimdən,
Şadəm ki, bu qürbətgəzənin qürbəti yoxdur.

Şadəm ki, bu zəngin fəqirin var-yoxu eşqdir,
Sərvətli o aşiq ki, onun sərvəti yoxdur.

Meyxanə sarı baxmayıram göz ucu hətta,
Sevməm elə bir saqini ki, şərbəti yoxdur.

Sevda bazarında mənə divanə deyirlər,
Şahin, o bazarda kamalın qiyməti yoxdur.

*19.05.1997*

✦✦✦

Ey yar, vüsalın yenə imkanı görünmür,
Bilməm ki, bu dərdin niyə dərmanı görünmür.

Leyla görünür, amma bu Leyla o deyildir,
Məcnun görünür, amma biyabanı görünmür.

"Peyman!" deyənin eşqdə peymanı tapılmır,
"Vicdan!" deyənin bir tikə vicdanı görünmür.

Əğyarlərin bağda alağ tək sayı artıb,
Dildarlərin bəs niyə üsyanı görünmür?

Heç molla da Quranə mükəmməl əməl etmir,
Kafərmi olub xəlq, müsəlmanı görünmür.

Işlər elə bir halda ki, tənzimlənə bilmir,
Ey bəndə, bu mülkün niyə sultanı görünmür?

Bülbül, bu məkanın gülü solmaqda ömür tək,
Tuti, bu diyarın şəkəristanı görünmür.

Şahin yenə hicranı görüb halsız olubdur,
Cismi görünür canlı kimi, canı görünmür.

*28.05.1997*



✦✦✦

Vardır elə loğman ona aqil də deyirlər,
Ya, var elə nadan ona cahil də deyirlər.

Mən vəsldə nakam adamam, eşqdə nail,
Nakam da deyirlər mənə, nail də deyirlər.

Illər qovaraq bir-birini çay kimi axdı,
Ömrün qışı çatdı, buna sahil də deyirlər.

Mən bülbül idim sən gülə, hicran yeli əsdi...
Fikri yenə də bülbülünün güldə deyirlər.

Sevda seli axmaqda idi şah damarımdan,
Indi cərəyan yoxmu bu naqildə deyirlər.

Baş aşiqi Şərq aləminin Məcnun olubdur,
Müdrik də deyirlər ona, kamil də deyirlər.

Kimdir bacaran mən kimi şairliyi, gəlsin,
Şahindir adım, amma ki, Fazil də deyirlər.

*28.06.1997*

✦✦✦

Ərz oldusa da çarəmi loğman edə bilmir,
Bir kimsə mənim dərdimə dərman edə bilmir.

Üsyan edirəm hər cürə haqsızlığa qarşı,
Hər asi olan mən kimi üsyan edə bilmir.

Azad elədim mən qəzəli əcnəbi sözdən,
Etdiklərimi bircə qəzəlxan edə bilmir.

Islamıma yox şəkk, nə də Quranıma şübhə,
Allah niyə dünyanı müsəlman edə bilmir?

Cananə fəda etməyə can hazıram, amma
Hər aşiq olan canını qurban edə bilmir.

Gəlsin, oxusun dərsini eşq məktəbim içrə
Hər kimsə ki, dildarı xuraman edə bilmir.

Şahin, dodağım üstdə sükut möhrü vurulmuş,
Amma, o nigar sirrini pünhan edə bilmir.

*19.07.1997*

✦✦✦

Tələbin aşiqə, ey yar, təmənna kimidir,
Asıram mən qulağımdan, mənə sırğa kimidir.

O hərflər ki, deyirsən mənə - sözdür sanki,
Hər sözünsə mənə şerimdəki misra kimidir.

Elə adəm görürəm bənzədirəm dünyayə,
Bivəfadır, bu cəhətdən elə dünya kimidir.

Keçmişəm mən elə məktəb neçə il qürbətdə,
Qürbəti görməyən insanə müəmma kimidir.

Əfqanıstandakı yoldaşlara minnətdarəm,
Həmi arzu, həmi xülya, həmi röya kimidir.

Süzürəm mən, gözəlim, sevgi səmasında o cür,
Söyləyirlər ki, bu aşiq elə durna kimidir.

Surəti, öylə adam var ki, bəyənmir, amma
Surətin öylə gözəl ki, mənə məna kimidir.

Şahinə öylə şirinsən acılıq yox səndə,
Söyləsən gər acı söz həm, ona xurma kimidir.

*16.08.1997*

✦✦✦

*Azərbaycan muğamının mahir bilicisi və ifaçısı Məşədi Vaqif Əliyevə*

Azca da hiss etmirəm mən daha qar ətri var,
Qış sona yetməkdədir, çöldə bahar ətri var.

Qətrə sel olmaqdadır, qönçə gül olmaqdadır,
Gözlərim aydın mənim, tazə nübar ətri var.

Söyləməyin bağçada ətri gülün yox hələ,
Gül nədi, yarım gəlir, bağçada yar ətri var.

Şurə gətirmiş məni ətri muğamatımın,
Çünki muğamatdə "Şur"ü "Qatar" ətri var.

Zövqünə mat olmuşam mən Məşədi Vaqifin,
Onda rübab, onda saz, onda setar ətri var.

Elminə olmuş təməl musiqinin tarixi,
Əhsən ona, elminin "Bəstənigar" ətri var.



Sən Ağaxan aşiqi, Əlbabanın munisi,
Hər iki ustaddə bir peşəkar ətri var.

Gah qələm tutmusan, gah da mizrab sən,
Bəxş elə, mizrabını ver mənə, tar ətri var.

Düşmür əlimdən qələm, mən qəzəlin fəhləsi,
Fəxr edirəm fəhləyəm, əldə qabar ətri var.

Gəl mənə tədris elə indi muğamatımı,
Milli muğamatdə milli də var ətri var.

Xeyli şirin arizu dəfn elədim qəlbdə,
Qəlbinə bax Şahinin, orda məzar ətri var.

*11.10.1997*

✦✦✦

Dizlərimdə əyilib-qalxmağa taqət yoxdur,
Taqətin yoxsa namaz qılmağa hacət yoxdur.

Edirəm amma ibadət sənə, sən canımsan,
Gözəlim, qeyrisinə məndə ibadət yoxdur.

Məni əfv eylə, sənin könlünə dəydim yenə də,
Bəlli ki, məndə əzəldən də siyasət yoxdur.

Gözlərin yoxmu? Işarət edirəm, görmürsən,
Amma səndən mənə çoxdandı işarət yoxdur.

Üç qəzəl dəftərimin itməsi yandırdı məni,
Şükr ola, mülkümü çoxdan belə qarət yoxdur.

Neçə gün bir-birimizdən yenə də gen düşdük,
Saqiya, məndə meyl, səndə cəsarət yoxdur.

Ovçuluq çıxdı yadımdan, mənə şahin demə gəl,
Gözəlim, olmağa şahin daha fürsət yoxdur.

*23.11.1997*

✦✦✦

Dilimin gərçi bu gün öz şanı var, şöhrəti var,
Qəlbimin qəbrə qədər var olacaq xiffəti var.

Hər qəzəlxanə dilin saflığı şərt olmalıdır,
Saf qəzəlxanə elin hörməti var, izzəti var.

Şərqşünasəm, ərəbi, farsı mən az-çox bilirəm,
Şərqşünas olmayanın gör nə sayaq möhnəti var.

Yox əlac qeyri, gərək cibdə lüğət gəzdirəsən,
Cibi yoxdursa, lüğət gəzdirənin zilləti var.

Yazıram mən qəzəli azərbaycanlı kimi,
Dədə Qorqud dili tək xəlqimizin sərvəti var.

Çəkilək xəlvəti bir guşəyə hərdən, gözəlim,
Aşiqin məşuqa xəlvət sözü var, söhbəti var.

Qeyri-rəsmi vəkil olmuş dilə Şahin Fazil,
Dedi canan: - Nə şərafətli onun sənəti var!

*1.12.1997*



Bu sevən şəxsə üzün bir də çıraq olsa əgər
Azmaram mən yolumu səndə maraq olsa əgər.

Sındırıbsan məni bir yol sınağından keçirib,
Sınağından çıxaram bir də sınaq olsa əgər.

Məndə hərçənd ki, Şahdağ dözümü zahirdir,
Dözmərəm mən ürəyimdə yenə dağ olsa əgər.

Verməerəm bircə qarış torpağı bundan sonra
Əllərimdə təzədən Xan Qarabağ olsa əgər.

Öyərəm mən özümü vəslinə yetsəm bir də,
Döyərəm mən özümü bir də fəraq olsa əgər.

Bığı mən neyləyirəm, saqqalı mən neyləyirəm?
Bu kifayətdi sənə məndə dodaq olsa əgər.

Çoxalar bir neçə qat, bil ki, mənim ilhamım
Əllərim zülfünə on dişli darağ olsa əgər.

Susmaram, söyləyərəm şerimi gündüz-gecə mən,
Üzümə göz dikən adəmdə qulaq olsa əgər.

Gözəlim, Şahinə bax, gündə şer yazmaqda...
Hələ çox söz qoşacaqdır canı sağ olsa əgər.

*14.12.1997*



O cəfalər ki, mənə sevgili cananə edir,
Xəbəri yox ki, məni sevgiyə biganə edir.

Bağiban, bağə yaxın qoyma məni, yalvarıram,
Güllərin ətri məni bağdə divanə edir.



Oluram güllərinin öylə pərəstişkarı,
Fikrimi cəlb nə məscid, nə meyxanə edir.

Bir tərəfdən məni bihuş eləyir al lalə,
Bir tərəfdən də sevən qəlbi xumar nanə edir.

Bir tərəfdən ürək aludə olur ney səsinə,
Bir tərəfdən onu bülbül səsi məstanə edir.

Nə sehrdir bu ki, əfsanə - olur gerçəklik,
Necə əfsun bu ki, gerçəkliyi əfsanə edir.

Nə tacım var, nə təxtim, oluram şah amma,
Nə kəramətdi qəzəl, Şahini şahanə edir.

*28.12.1997*



Cism - iki, can isə eşq var isə - bir danə olar,
Gün gələr biz gedərik, eşqimiz əfsanə olar.

Olmasan, olmaram, ey gül, buna yoxdur şübhə,
Mənə cananə fəqət sən kimi cananə olar.

Görmədim mən elə zərgər tapa dürdanəsini,
Çox olar dürr, fəqət bircəsi dürdanə olar.

Aramızda neçə şeytansifət insan var ikən,
Niyə insanların lənəti şeytanə olar?

Vəslin üqbadəki ülviyyətini dərk eləsək,
Meylimiz bəlkə bu minval ilə hicranə olar.

Ey Qeys, yalvarıram, qalma yadımda, qeyb ol,
Baş qoşan sən kimi divanəyə divanə olar.

Şahina, tapmayıram mən bu sualın cavabın:
Görəsən mərdlər içində neçə mərdanə olar?

*3.01.1998*



*Azərbaycandan Azərbaycana təşrif gətirmiş üç şairin - Pərviz Asimin, Əsgər Şahizadənin və Mirzə Hüseyn Kəriminin şərəfinə*

Şövqüylə vüsalın neçə sirdaş gəlibdir,
Olsun gözüm aydın, gözümə yaş gəlibdir.

Əlbəttə, sevinc yaşları axmaqda gözümdən,
Qardaş evinə bir neçə qardaş gəlibdir.

Ilham pərisi qeybə çəkilmişdi yanımdan,
Vəsf etməyə eşqi o qələmqaş gəlibdir.

Əflakə ucalmış yenə vəslin başı, amma
Hicrin başına dağ uçulub, daş gəlibdir.

Təsvir eləyim mən təhər? Qəlbimiz içrə
Sevdasını nəqş etməyə nəqqaş gəlibdir.

Çox gəlsə də izzətli qonaqlar bizə, amma
Təbrizli qonaqlar hamıdan baş gəlibdir.

Şahin yenə təkrar eləyir öndəki sətri:
Şövqüylə vüsalın neçə sirdaş gəlibdir!

*10.02.1998*



Meyl eyləyirəm qürbətə, sevda məni qoymur,
Baxmaq diləröm surətə, mənə məni qoymur.

Səhrayə yönəlmək diləyim var cünun tək,
Amma, bilərək meylimi Leyla məni qoymur.

Kipriklərimin hər biri bir neştər olubdur,
Röya nə gəzir gözdə ki, xülya məni qoymur.

Var ehtiyacım aram olum, dinc olum, amma
Qovğayla aram yoxsa da, qovğa məni qoymur.

Gəlmək dilərəm yanına şövq ilə Sənin mən,
Ya qibleyi-aləm, niyə dünya məni qoymur?

Sülh ordusunun əsgəri bir-bir dağılıbsa,
Bir ləhzə də qəm ləşkəri tənha məni qoymur.

Dərd dalğası, Şahin, məni qərq eyləyəcəkdir,
Çıxmaq dilərəm sahilə, dərya məni qoymur.

*17.02.1998*



Əlbəttə, fəxr mənbəyi insanə vətəndir,
El sevgisini qaynaq edən canə vətəndir.



Qürbətdə günün keçsə də naz-nemət içində,
Qəlbi gətirən naləvü əfğanə vətəndir.

Səhrası da birdir mənə, gülzarı da birdir,
Zənnimcə, bərabər daşı mərcanə vətəndir.

Fəxr eyləməsin dürrü ilə zərgər olan kəs,
Olsun qoy onun dürr, mənə dürdanə - vətəndir.

Pərvanəyə bənzətsəm onu - şəmi mən ollam,
Mən şəmə dönərsəm, mənə pərvanə vətəndir.

Qeyrətli vətəndaş keçə bilməz vətənindən,
Vadar eləyən adəmi üsyanə vətəndir.

Meyxanəyə mey naminə yollanmamışam mən,
Şahin kimi dərd əhlinə meyxanə - vətəndir!

*26.02.1998*



Neyləyim, hərdən cahan əfsanə görsənməkdədir,
Hər kimə aqil dedim divanə görsənməkdədir.

Meypərəstdən görmürəm məstanəlik zahir ola,
Amma, mey nuş etməyən məstanə - görsənməkdədir.

Öylə "mərdəm" söyləyən var mərdliyindən yox nişan,
Öylə dilbər var gözə mərdanə görsənməkdədir.

Var şəhər fəth eyləyən adəm ki, aciz görsənir,
Amma, eşqin fatehi şahanə görsənməkdədir.

Bağibanə söyləsinlər gülləri hifz eyləsin,
Bağlasın dərvazəni, bıganə görsənməkdədir.

Şairim, hər beytini şahbeyt təqdim eyləmə,
Zərgərim, tək-tək fəqət dürdanə görsənməkdədir.

Məyus olma, görsənib bədbin, ümidsiz söz demə,
Şəmə dön, Şahin, gözə pərvanə görsənməkdədir.

*8.04.1998*



*Ərəbşünas dostum Valeh Tağıyevə*

O qədər məsləki yox, təqsiri çox kəslər var,
Inana bilməyirəm indi müqəddəslər var.

"Qülhüvəllah" səsi gəlməkdə, eşitmirsənmi?
Hələ səssizlik içində nə qədər səslər var.

Birmidir, beşmidir el malını öz malı bilən?
Eli bədbəxt eləyən çoxlu filankəslər var.

Çoxu ümmid eləyir göydəki azadəliyə,
Amma, bilmir bunu ki, göydə də məhbəslər var.

Ərəbi təqlid edib molla araxçın qoydu,
Azalır indi araxçın, yerinə fəslər var.

Nə edib yerdə ki, göy dərdinə etsin çarə?
Şahina, çarəni göydən diləyən kəslər var.

*23.04.1998*

✦✦✦

Vardır elə övlad ki, əcdadı bəyənmir,
Ya, var elə əcdad ki, övladı bəyənmir.

Göz qoymadayam aləmə, adəmlər içində
Var öylə əzazilləri Şəddadı bəyənmir.

Şan-şöhrətə, zər-zivərə aşiq yenə var yar,
Şirin vurulub Xosrova, Fərhadı bəyənmir.

Qovsan belə bir Leylidən ötrü çölə düşməz,
Məcnun dünən etdiyi fəryadı bəyənmir.

"Ərbabi-zəfər taqi-müəllalər içində..."
Matəm ki, neçin sadə dili Hadi bəyənmir?

Cahilləri artır niyə "Məcməş-şüəra"nın?
Şagird görürəm bir neçə, ustadı bəyənmir.

Şahin, nə təzaddır belə, Şahin, nə bəladır:
Viranə gərək bayquşa, abadı bəyənmir.

*25.04.1998*

✦✦✦

Zənn eyləməsin kimsə cism canə yaxındır,
Candan daha çox cisminə canana yaxındır.

Mərdanə adamlarla görürlər məni hər dəm,
Mərdanələrə, bəlli ki, mərdanə yaxındır.

Şəhrimdən uzaq olmağı tərk eyləmişəm mən,



Məcnun kimilər gərçi biyabanə yaxındır.

Sönməkdə ikən şöləsi nagah çoxaldı,
Şəmin alovu artdı ki, pərvanə - yaxındır.

Ülviyyəti, şahanəliyi gər çoxunun var,
Ülviyyə yaxındır mənə, Şahanə yaxındır.

Yarım, Həcəri* öpməyə meyl eyləmiş idim**,
Meylim deyəsən indisə imkanə yaxındır.

Həsrətdən ölürdüm, mənə saqi dedi: - Şahin,
Gəl, Kəbə uzaqlardasa, meyxanə yaxındır.

*6.06.1998*

✦✦✦

Ey fələk, qəlb içrə dağın gah olur, gah olmayır,
Dadə yetməkçin sorağın gah olur, gah olmayır.

Açmıram baş, ey nigarım, sən nə cür şagirdsən,
Eşq dərsində marağın gah olur, gah olmayır.

Istəyirdin şair olmaq sən də şairlər təki,
Yazmağa şeri varağın gah olur, gah olmayır.

Hüsnün ilə hər zaman olsun çırağban mənzilin,
Mənzilin içrə çırağın gah olur, gah olmayır.

Zülfünə barmaqlarım bəzən sığal çəkməkdədir,
Neyləyim, yarım, darağın gah olur, gah olmayır.

Olmaz idi yox fərağın bir zaman illər boyu,
Indi, şadəm ki, fərağın gah olur, gah olmayır.

Xəlq içində günbəgün tüğyan edir əğyarlər,
Şahina, neyçün yarağın gah olur, gah olmayır?

*8.06.1998*

✦✦✦

Yoxdu vüsalın, yenə hicrandır,
Yoxdumu qanın, ciyərim qandır.

---

* Həcərül-əsvəd - Kəbədəki qara daş

**"Zairi-kuyinəm, ey məh, gəl öpüm xalından,
Həcəri öpməyənə xəlq deməzlər haci".
**Mirzə Ələkbər Sabir**

Şahinə de dərdini çəksin sənin,
Dərdini çəkmək ona dərmandır.

Şeyxə varımdır neçə ərzim mənim:
Məncə, təsəvvüf elə irfandır.

Gərçi bu gün çoxları zər yığmada,
Zər tamahı arifə nöqsandır.

Sorma müsəlman niyə kafər olur,
Kafərimiz var ki, müsəlmandır.

Nazil olan hər kitabın qədri var,
Gərçi müqəddəs mənə Qurandır.

Mollaya cənnət - Ədəmin bağçası,
Məcnuna cənnətsə - biyabandır.

Şeyxəna! Hicrin axırı vəsl isə,
Onda vüsalın sonu hicrandır.

Çərxi-fələkdir üyüdən bizləri,
Sanki bəşər mülkü dəyirmandır.

Yar dedi: Gülmür üzü qüssədən,
Şahinə bax, gör nə pərişandır.

*12.07.1998*

✦✦✦

Gəh rəhm eləyib qəlbimizi şad eləyirlər,
Gəh zülm edərək şadlığı bərbad eləyirlər.

Yarəb, bu gözəllərdə nə adətdi əzəldən
Gəh bəndə salırlar, gəhi azad eləyirlər.

Asudəliyi yox kəsə fəryad təbii,
Asudə olanlar niyə fəryad eləyirlər?

Fatehlərə heyrət! Neçə şəhri dağıdırlar,
Amma ki, məzarıstanı abad eləyirlər.

Asdıqda qulaq hər quyudan səs eşidirsən,
Yusiflərimiz yoxsa yenə dad eləyirlər?

Imdad eləsə Şahinə yar varmı təəccüb?
Aciz kəsə, yox şübhə ki, imdad eləyirlər.

*16.07.1998*



✦✦✦

Niyə, ey saqi, şərabım yoxdur?
Harada qaldı, kababım yoxdur.

Mənə zülm etməyə yoxdur haqqın,
Elə zənn etmə savabım yoxdur.

Tər qəzəllər diləyirsən hər gün,
Neçə müddətdi kitabım yoxdur.

Mən gülab əttarı idim bir vaxt,
Ovcunu açma, gülabım yoxdur.

Mənə çoxdandı sual vermirsən,
Yox sualın ki, cavabım yoxdur.

Iztirabından əzab çəkməyirəm,
Iztirabım var, əzabım yoxdur.

Şahinəm, amma uça bilməyirəm,
Neyləyim, uçmağa tabım yoxdur.

*18.07.1998*

✦✦✦

*Şirin söz-söhbətli dostum*
*Adil Əlizadəyə*

Rüzgar acıdır, amma bahar ilə şirindir,
Əlbəttə, bahar fəsli nübar ilə şirindir.

Gəlməklə nigar eylədi zəqqum günü şirin,
Ovqatı keçirmək o nigar ilə şirindir.

Hərçənd əziyyətlə keçir gün qərib eldə,
Sənanə cahan mülkü Xumar ilə şirindir.

Ömrün şəkəri, şirnisidir eşqü məhəbbət,
Sanmam ki, ömür dövlətü var ilə şirindir.

Adil, niyə səqqalını qırxdırdı nigarın?
Meylin var idi, meyl qərar ilə şirindir.

Saqi harada qaldı, canım, tar necə oldu?
Məclis mənə saqi ilə, tar ilə şirindir.

Bilməm nə görübdür acı meydə qoca Şahin?
Mey gərçi acı olsa da, yar ilə şirindir!

*26.07.1998*

✦✦✦

Təlimin yoxdur deyə hər yazdığın nöqsan olur,
Qətrədir təbin sənin, zənn etmə ki, ümman olur.

Gər sənə "gəl" söyləsəm mən gəlməsin təbim dilə,
Get daha, qaldıqca sən hər ləhzə könlüm qan olur.

Hər özündən dəm vuran, əlbəttə, Xaqani deyil,
Kim yetişsə təxtü tacə sanmasın xaqan olur.

Varmıdır mən tək bu gün aləmdə üsyan eyləyən?
Ləhzə-ləhzə, dəmbədəm məndən sənə üsyan olur.

Öz yolun yox, düz yolun yox, adilərdən adisən,
Adi bir daş kim görübdür ki, dönüb mərcan olur.

Çox yazıblar sadə yazmaq barədə, sal yadına,
Şah Füzulimdən nə müddətdir sənə fərman olur.

Şahinəm, sultanı oldum saf qəzəllər mülkünün,
Hər gəda fikr etməsin ki, mən təki sultan olur.

*28.07.1998*

✦✦✦

Ey nigarım, sən gedən gündən günüm şad olmayır,
Saqidən hətta mənə bir zərrə imdad olmayır.

Şux gözəllərdən cahan, əlbəttə ki, xali deyil,
Ey pəri, könlümdə sakin hər pərizad olmayır.

Vəsl evindən birbəbir qopmaqda kərpiclər bu gün,
Mülkü bəs hicrin neçin, ey Tanrı, bərbad olmayır?

Şahdağı yarmaq xəyalıyla əbəs cəhd eylədim,
Dağ yaran hər kimsədən bildim ki, Fərhad olmayır.

Mən qəzəl mülkündə təmir işləri görməkdəyəm,
Öylə bərbad eyləyiblər qəsri abad olmayır.

Şahinəm, dürdən düzəldib sözləri satdım sizə,
Adi daşdan söz düzəldənlərdən ustad olmayır.

*14.08.1998*



✦✦✦

Kimə yaqut, kiməsə dürri-Ədən lazımdır,
Mən vətəndaşə isə təkcə vətən lazımdır.

Kimə torpaq, kimə irmağ, kimə ovlağ, kimə dağ,
Kimə dağ üstdəki örpək təki çən lazımdır.

Qədəhi bir daha təqdim eləmə, ey saqi,
Yığmağa göz yaşımı indi ləyən lazımdır.

Qarabağ bağü çəmənzarı çıxıbdır əldən,
Mənə yad əllərə düşmüş o çəmən lazımdır.

Qürbətin güllərini eyləməyin töhfə mənə,
Mənə yurdumdakı nərgiz və süsən lazımdır.

Qələm olmuş qoluna Abbasın and olsun ki,
Hüseyndir mənə lazım və Həsən lazımdır.

Dedi Şahin: - Çıxarın köynəyimi əynimdən,
Mənə köynək yerinə indi kəfən lazımdır!

*21.08.1998*

✦✦✦

Eşqin bağı gülləndi, gül var, tikan yoxdur,
Kim gördüsə dilləndi: Bağ var, xəzan yoxdur.

Səhrayə Qeys getmir, Fərhad dağa... Indi
Səhradəki ah itdi, dağ üstdə fəğan yoxdur.

Köynək sarıdan Yusif olmuş daha xatircəm,
Eşq öylə olub azad təşviş, həyəcan yoxdur.

Lakin bunu kim təsdiq eylər mənə xəlq içrə:
Şeyxin sözü düzgündür, zahiddə yalan yoxdur?

Illər boyu hökm əhli xəlqi talayıb-çapmış,
Kim söyləyər ölkəmdə əvvəlki talan yoxdur?

Dünya olacaqdırmı şərdən görəsən xali?
Vardırsa ümid amma bir zərrə güman yoxdur.

Sözlər ki dedim xalis, qiymətlidi gövhərdən,
Heyfa zər alan çoxdur, amma söz alan yoxdur.

Saf şeri edib təlqin, Şahin, elədim fayda,
Hərçənd canım getdi, amma ki, ziyan yoxdur.

*1.09.1998*

✦✦✦

Sən kimi bir cahilə biganə olmaq yaxşıdır,
Mərd mən, namərd sən, mərdanə olmaq yaxşıdır.

Şah olmaqdansa fironluq edib Xosrov kimi,
Bəlkə də Fərhad tək şahanə olmaq yaxşıdır.

Meylimi çəkmir mənim mey, ey könül, meyxanədə,
Mehri ilən saqinin məstanə olmaq yaxşıdır.

Yandırandan qorxmuşam mən hər zaman, şam - yandırır,
Qoy yanım, yandırmayım, pərvanə olmaq yaxşıdır.

Çox gözəldən fərqlənirsən, ey pəri, Leyla kimi,
Bəllidir ki, dürr çox, dürdanə olmaq yaxşıdır.

Şahinəm, aqilliyimdən bir xeyir görsənmədi,
Bəlkə də Məcnun kimi divanə olmaq yaxşıdır.

*4.11.1998*

✦✦✦

Bildinizmi ürəyimdən nə üçün ah çıxır:
Kimə xoşxah oluramsa, mənə bədbah çıxır.

Meyi - hüşyar eləyir, söylə, nə meyxanədi bu?
Saqiya, məst gələn yanına gümrah çıxır.

Qəzəli öylə yazan var ki, oyunbazlıq edir!
Kimdi "Zabul" oxuyan, qoyma, "Çahargah" çıxır.

Elə təqlidçi də var ki, vurulub yad deyimə,
"Ay" demək istəyir, amma yerinə "mah" çıxır.

Zülm edirlər mənə hərdən, oluram təngnəfəs,
Gah çıxmır qəzəbimdən nəfəsim, gah çıxır.

Amma şadəm ki, olur xeyri mənim dərslərimin,
Neçə qafil ki, gəlir yanıma agah çıxır.



Qəzəlin şahı yox idi, vəzir idi çoxusu,
Qəzəlin taxtına Şahin kimi bir şah çıxır.

*10.11.1998*

✦✦✦

"Yoxdu canım" söylədim, fikrimdə nöqsan olmayır,
Nakam aşiqdə, gülüm, cism olsa da, can olmayır.

Gül gülü, bülbül məni səslər bu dəm gülzardə,
Sən ki yoxsan, gözlərim gülzarə heyran olmayır.

Dərdə dərman istədim loğmandən, dilləndi ki,
Yoxdu, sevda dərdinə bizlərdə dərman olmayır.

Qansız adəm görmüşəm mən qərq olubdur qanına,
Qansız adəmlərdə kimdir söyləyən qan olmayır?

Ey Füzuli şerinin hər beytini irfan bilən,
Şəkk yoxdur şairin hər beyti irfan olmayır.

Mey də var, dilbər də var şer içrə, "Həmmamiyyə" də,
Ayinə gerçəkliyi əks etsə nöqsan olmayır.

Şahina, hərdən qəzəl yox, mən xəzəl görməkdəyəm,
Hər "qəzəl yazdım" deyən kəsdən qəzəlxan olmayır.

*15.11.1998*

✦✦✦

Bu nə güldür ki, gülü burda tikan üstələyir?
Bu necə mənfəət olmuş ki, ziyan - üstələyir?

Gözəlim, mən yenə eşqimdə sədaqətlə varam,
Qətilik aşiqini sanma güman üstələyir.

İçmirəm mən daha mey, saqi isə bilmir ki,
Bu çətin müşkili hal əhli asan üstələyir.

Çatmışam Şahdağa, çoxdan günə dəymir nəzərim,
Ey günəş, yoxsa səni dağda duman üstələyir?

Nə savaşdır bu, nə qovğadı ki, sakitləşmir,
Qələmi, hiss edirəm mən ki, kaman üstələyir.

Gül solur, amma tikan isə qalır, ey Şahin,
Yaxşının ömrünü, heyfa ki, yaman - üstələyir.

*22.11.1998*

✦✦✦

Tuti timsalı müdam ismini təkrar eylər,
Aşiqin gündə sənə eşqini izhar eylər.

Qəzəlim tazə qəzəldir ədəbiyyat içrə,
"Ol xəbərdar" deyib xəlqi xəbərdar eylər.

Xəlqiləşməkdə qəzəl mülkü, mənim etdiyimi
Inana bilməyirəm bir neçə memar eylər.

Qəzəlim saf, yarım saf, özüm saf, ey dil,
Qeyri-saf hər şeyi şerim yenə inkar eylər.

Varsa da gərçi bu gün baltalayanlar adımı,
Gələcəkdə adımı millətimiz var eylər.

Gözəlim, indisə gəl seyrə çıxaq gülzarı,
Ürəyim sənli səyahətləri iqrar eylər.

Sevməyib Yusifi heç vədə Züleyxa, Şahin,
Hansı yar yarını zindanə giriftar eylər?

*4.12.1998*

✦✦✦

Kişinin hər damarında kişilik cövhəri var,
Kişi ol şəxs deyildir ki, onun xəncəri var.

Bilmirəm mən ona adəmmi deyim, ya əqrəb?
Bənzəmir əqrəbə, amma dilinin neştəri var.

Açmıram baş oyunundan qocaman dünyanın,
Nə oyundur bu ki, nərdtaxtası itmiş, zəri var.

Necə pərtəm ki, ölüb getdi Məhəmməd Hadi,
Necə şadəm ki, böyük Mirzə Əli Əkbəri var.

Çox suallar mənə mübhəmdi, müəmma kimidir,
Yoxmu Leyla kimisi, ya yenə öylə pəri var?

Dedi canan: - Bu cahan içrə gözəllər çoxdur,
Fələyin Leyli kimi xeyli mələkmənzəri var.

Sanma Məcnun tək olub, ya da ki, Şahin təkdir,
Bu biyabanda, əzizim, hələ çox sərsəri var.

*23.12.1998*



✦✦✦

Yara, ey yar, yar lazımdır,
Olmasa intihar lazımdır.

Qartala dağ başı, qaya üstü,
Bülbülə laləzar lazımdır.

Töhfəsi dərvişin - yaşıl yarpaq,
Dərvişə, sanma, var lazımdır.

Zahidin qəddi nal şəklində,
Yaş ötübdür, məzar lazımdır.

Intizar istə, ey könül, hərdən,
Şairə intizar lazımdır.

- Şahina, ver canın, - dedi canan, -
Mənə bir yadigar lazımdır!

*7.01.1999*

✦✦✦

Nə üçün güldə məlahət yoxdur?
Niyə əvvəlki təravət yoxdur?

Canamaz var, namaz az qılınır,
Yaradan var, ibadət yoxdur.

Niyə nalayiq olur layiqlər,
Niyə əvvəlki ləyaqət yoxdur?

Hicrə bax, vəsli qovubdur təzədən,
Zərrəcə onda nəzakət yoxdur.

Ey cavanlar, deyiləm çox da qoca,
Bəs can içrə niyə taqət yoxdur?

Hanı, qarətçi gözəllər harada?
Nə üçün qəlbimi qarət yoxdur?

Şahina, var ikisindən birisi:
Mən yoxam, ya da məhəbbət yoxdur.

*16.01.1999*



Məni tərifləmə, xanəndə səsindən bilinir,
Zili yoxdursa, heç olmazsa pəsindən bilinir.

Aşiqin hər nəfəsi "sevgi" deyir, "eşq" deyir,
Mən təkin aşiq olan kəs nəfəsindən bilinir.

- Xəbər alma, - dedilər, - sinnini cananələrin,
Sinni aşiqlərin isə həvəsindən bilinir.

Hər ağaclıq meşə adlanmamalı, çünki meşə
Palıdından, cökəsindən, vələsindən bilinir.

Görən olmuşmu məgər sərçə salınsın qəfəsə?
Bülbülün qiyməti, əlbət, qəfəsindən bilinir.

Şahina, səbri kiçikdir, əcəlin, hazırlaş,
Əcəlin səbri "tələshatələs"indən bilinir.

*23.01.1999*



Təkrar eləyibdir dil: Dildar nə göyçəkdir!
"Dildar" isə təkrarım, təkrar nə göyçəkdir!

Yaxşı adamı inkar etməkdə qəbahət var,
Əğyar edilibdirsə inkar nə göyçəkdir!

As ki, papaq üçündür divarda olan mismar,
Qəddar asılıbdırsa, mismar nə göyçəkdir!

Düz yolla, hamar yolla addımlayan insan çox,
Bir yol demədim mənsə həmvar nə göyçəkdir.

Yar əksini nəqş etdi memar dağ üstündə,
Şirin nə gözəllikdə!.. Memar nə göyçəkdir!

Baş qoşma, təbib, çıx get, azar ilə şadəm mən,
Dildar veribdirsə azar nə göyçəkdir!



Gülzardə, ey Şahin, güllər şahı - yarımdır,
Gər şah o nigar isə, gülzar nə göyçəkdir!

*3.03.1999*



Yığdım o qədər gül ki, sənubər dedi "bəsdir",
Dərdim o qədər busə ki, dilbər dedi "bəsdir".

Xosrov nəçidir, mən o qədər eşq elədim ki,
Şirin mənə "çoxdur" dedi, Şəkkər dedi "bəsdir".

Sultan olanın zülmü bu gün həddini aşdı,
Səncərdə dözüm qalmadı, Səncər dedi "bəsdir".

Möminlik edənlər o qədər göz yaşı tökdü,
Məsciddə səbr qalmadı, minbər dedi "bəsdir".

Şairciyəzə bir daha şair deməsinlər,
Seyyid dedi "bəs", Mirzə Ələkbər dedi "bəsdir".

Qurtardı qələmlər, bu qədər yazmaq olarmı?
Boş bircə varaq qalmadı, dəftər dedi "bəsdir".

Söz zərgərinə mən o qədər söz zəri verdim,
Məmnun olaraq Şahinə zərgər dedi "bəsdir".

*16.03.1999*



Ey gözlərimin yaşları, Tərtər daha bəsdir,
Zəmzəm daha bəsdir, hələ Kövsər daha bəsdir.

Eyham qərəzli, mənə böhtan qərəzli,
Rişxənd kifayət adıma, şər daha bəsdir.

Söz qənbərini ey mənə bihudə atanlar,
Tənə daha bəsdir mənə, qənbər daha bəsdir.

Çəksəm sözümün xəncərini qan düşəcəkdir,
Dad eyləyəcəksiz belə: Xəncər daha bəsdir.

Saf sözlə rəqabət bacaran qarşıma gəlsin,
"Xahər"* nə gərəkdir dilə, "Düxtər"** daha bəsdir.

Söz zərgəri olmuş yazaraq sadə bu Şahin,
Röyamda Füzuli dedi "Zərgər daha bəsdir".

*23.03.1999*



Aşma gəl həddini, ifratı düşün hərdənbir,
Səbəbi fikr elə, isbatı düşün hərdənbir.

Göyün altındasan, ey həddini aşmış cahil,
Göyün üstündə olan zatı düşün hərdənbir.

Belə fəxr eyləmə həzz ilə keçir ovqatın,
Daima təlx olan ovqatı düşün hərdənbir.

Demə "Dür at", demə "Qır at", demə "Boz at"ım var,
Yeri, "Düldül" kimi bir atı düşün hərdənbir.

Tövbə et varsa günahın ki, ölüm sovqatdır,
Əcəlin verdiyi sovqatı düşün hərdənbir.

Dedi "Bildim bunu ki, bilməyirəm mən heç nə",
Şahina, gəl ulu Sokratı düşün hərdənbir.

*26.03.1999*



Təmənna varmı bir zərrə? Bu sevda başqa sevdadır,
Müəmma yoxdu bilmərrə, bu Leyla başqa Leyladır.

Mənim röyamda qan yoxdur, şikayət var, fəğan yoxdur,
Həqiqət var, yalan yoxdur, bu röya başqa röyadır.

Nə girdab, nə burulğan var, deyən yoxdur "burul, qan var",
Nə tufan var, nə tuğyan var, bu dərya başqa dəryadır.

Həqiqət var - fəlakətdir, fəlakət var - həqiqətdir,
Bu surət başqa surətdir, bu məna başqa mənadır.

Çəmən var gül dərən yoxdur, bilən var bildirən yoxdur,
Ölən var öldürən yoxdur, bu qovğa başqa qovğadır.

---

* "Xahər" - fars dilində "bacı" deməkdir.
** "Düxtər" - fars dilində "qız" deməkdir.



Riya bitdi, yalan gəldi, filan getdi, filan gəldi,
Ölən yoxdur, çalan gəldi, bu həlva başqa həlvadır.

Nə göz nəmdir, nə üz qəmdir, nə Şahinçin məhərrəmdir,
Bu aləm özgə aləmdir, bu dünya başqa dünyadır.

***10.04.1999***

***

Əsərim çoxdu, səninsə əsərin görsənmir,
Nə hünər sahibisən ki, hünərin görsənmir.

Itiribsən tutalım təsbehini, ey zahid,
Niyə meyxanəyə çoxdan səfərin görsənmir?

Görünür oğru yox olmuş daha yurdumda mənim,
Bağıban, gör neçə vaxtdır çəpərin görsənmir.

Bədnəzərdən uzaq ol sən ki, nəzər dəydi sənə,
Sənin, ey şux, haçandır nəzərin görsənmir.

Sən zərərdən çox uzaqsan mənə, ey fayda verən,
Faidən göz qabağında, zərərin görsənmir.

Sənə göyqurşağı rəngində kəmər vermişdim,
O qədər incədi belin kəmərin görsənmir.

Şahinəm, "Divan"ımın tazəsi həm hazırdır,
Deyə bilməz mənə heç kim səmərin görsənmir.

***20.04.1999***



Ülfətimiz nisgilə dönməkdədir,
Bir günümüz bir ilə dönməkdədir.

Həsrət olandan o zərif zülfünə,
Cismim, əzizim, telə dönməkdədir.

Bir kürəyəm ki, odu əksilmədə,
Bir küləyəm ki, yelə dönməkdədir.

Zahir olubdur yeni sel mənbəyi,
Göz yaşım, ey sel, selə dönməkdədir.

Gündə təbiətdə təzad artmada,
Açdı tikan gül, gülə dönməkdədir.

Əcnəbi sözdən yapışan kor kimi
Aqilimiz cahilə dönməkdədir.

Məcnun olub bir vüsalın qatili,
Rəhbərimiz qatilə dönməkdədir.

Bax qəm əlindən oxuyan aşiqə,
Şahinə bax, bülbülə dönməkdədir.

30.04.1999

✦✦✦

Kəsilibdir mələyin nəğməsi şeytan oxuyur,
Allah-Allah, yenidən çıxdı bıçaq, qan oxuyur.

Nəğməni nəğmə əvəz etmədədir hərdənbir,
Nəğməsi vəslimizin bitdi və hicran oxuyur.

Tökülən qanlara dünya nə zaman son qoyacaq?
Təzə qurbanmı gərəkdir ona, meydan oxuyur.

Şövq ilən rəqs eləyir, nəğmə deyir kafərlər,
Görürəm amma müsəlmanı pərişan oxuyur.

Oxumaq nəğməni dərddən də olurmuş, yarəb,
Təzədən bülbül edir nalə, gülüstan oxuyur.

Oxuyub nəğməni getdin sıramızdan, ey Qeys,
Səni hüzn ilə anıb yandı biyaban, oxuyur.

Araz üstündə durub, Şahina, bir gün görərik
Can atan bir-birinə Azəribaycan oxuyur.

10.05.1999

✦✦✦

Fərz eylə ki, zər əlində yoxdur,
Şahin kimi xoş dilin də yoxdur?

Fərz eylə közüm qalıb kül içrə,
Bir zərrə közün külündə yoxdur!

Ey yar, əlimi kənar edibsən,
Çoxdandı əlim belində yoxdur.

Əvvəlki telin sığallı idi,
Əvvəlki sığal telində yoxdur.

Sən öylə çoxaltmısan tikanı,
Bir damcı ətir gülündə yoxdur.



Şahin yenə qərq olub cəfayə,
İnsaf o cəfa selində yoxdur.

2.07.1999

✦✦✦

Göstərmə beş-on gül mənə, gülzar varımdır,
Misqal əməyin var isə, xalvar varımdır.

Yad istilahı şerinə peyvənd eləyirsən,
Biganə sözə məndəsə inkar varımdır.

Xəlqi sözü yazmazdısa Vahid yaşamazdı,
Söz mülkünə Vahid kimi memar varımdır.

Olmaz hədəfə tuş bar olmazsa ağacda,
Hey daş atılır üstümə ki, bar varımdır.

Hərçənd bu gün nəğməpərəstik ikimiz də,
Amma, mənə gəl çalma düdük, tar varımdır.

Güldən-gülə qonmaq arıya xas əməldir,
Əğyar tək arsız deyiləm, ar varımdır.

Şahin, məni dünya varı zəngin edə bilməz,
Qəlbimdə məhəbbət varı tək var varımdır.

28.07.1999

✦✦✦

Zəfərimdən nə xəbər var, nə soraq qalmışdır,
Hələ yurdumda mənim amma qoçaq qalmışdır.

Söyləyirlər ki, papaq qeyrətidir millətimin,
Ölkəmizdə görəsən çoxmu papaq qalmışdır?

Papaq altında oğullar ki var idi, öldü,
Ləçək altında qadınlar sinədağ qalmışdır.

Xeyli vaxtdır üzü gülmür nə qədər insanın,
Yağılardan üzümüzdə şapalaq qalmışdır.

Hər silah əllərimizdən yığılıb, məlumdur,
Gər, silahlar yığılıbdırsa, çomaq qalmışdır.

Hey deyib biz "Qarabağ" inləyirik, tək qaramı?
Düşmənin tapdağı altda neçə bağ qalmışdır.

Dedilər: - Dağ dağılardı bu qədər dərd altda,
Bu qədər dərd ilə Şahin necə sağ qalmışdır?

13.09.1999

✦✦✦

Gözüm ondan savayı, bəlli ki, insan görmür,
Nə olub, bəs nə üçün mehrimi canan görmür?

Güzgünü bir əli tutmuş, darağı başqa əli,
Niyə halım kimi göz zülfü pərişan görmür?

Bilirik Sədi "Gülüstan"ı yazıb çoxdandır,
Niyə dünyanı cahan əhli gülüstan görmür?

Bəlli ki, bir giləyə əksilməyəcək imkanı,
Sülhə Allah-taala niyə imkan görmür?

Acıdır gün, nə uzun çəkdi "Keçid mərhələsi"?
Bibəristan görürük, göz şəkəristan görmür.

Zərrəbin icad ediblər ki, görünsün zərrə,
Kafərin məkrini görmür ki müsəlman, görmür.

Qərq olubdur bəşəriyyət nə qədər nöqsanə,
Gözümüz sevgilimizdə niyə nöqsan görmür?

Bağiban, söyləmə "Şahin məni görmür bağda",
Bağda gül var isə Şahin gözü bağban görmür.

*21.09.1999*

✦✦✦

Saqini məstanəliyim qorxudur,
Canani divanəliyim qorxudur.

Heyrətə salmış gülü bülbüllüyüm,
Şəmisə pərvanəliyim qorxudur.

"Mən dəxi Leyla sevənəm" söylədim,
Qeysi səmimanəliyim qorxudur.

Get-gedə əfsanələşən aşiqəm,
Gerçəyi əfsanəliyim qorxudur.

Bir neçə miskin ayağımdan çəkir,
Miskini şahanəliyim qorxudur.

Söyləmirəm sirrimi sirdaşıma,
Sirdaşı biganəliyim qorxudur.

Qorxmazı mən, Şahina, qorxutmuram,
Qorxağı mərdanəliyim qorxudur.

*Lənkəran, 8.11.1999*

✦✦✦

Verdin mənə dərd, lütf elə, dərmanı da gəl ver,
Viran elədin ömrümü, səhmanı da gəl ver.

Xahişlərini eyləmə, xahiş edirəm ki,
Fərmanı unutma, mənə fərmanı da gəl ver.

Ləl isə əgər eşq, vüsal - aşiqə mərcan,
Lütf eyləmisən ləlini, mərcanı da gəl ver.



Cismim ki, təlatümdədi sakitliyi sevmir,
Dəryanı veribsən, mənə tufanı da gəl ver.

Şeyx ərz edəcək Allaha gər cənnətə düşsə:
"Hurini veribsən mənə, qılmanı da gəl ver".

Canan dedi: - Şahin, mənə sən qəlbini verdin,
Yetmək diləsən vəslə əgər canı da gəl ver!

*14.11.1999*

✦✦✦

"Hədsiz məni sev" söyləmə, ey can, o qədərdir,
Meylim, həvəsim çoxsa da, imkan o qədərdir.

Sən eşqə "dəva" söyləmisən, sevgiyə "dərman",
"Çox ver mənə dərman" demə, dərman o qədərdir.

Şeytanını dövrün yenə artırmısan, ey çərx,
Şeytanə "azalmış" demə, şeytan o qədərdir.

Əğyarlığın ziddinə tüğyanım azalmır,
Pislik nə qədər çoxdusa tüğyan o qədərdir.

Yarəb, niyə birləşməyirik kafərə qarşı?
Ulduz nə qədərdirsə müsəlman o qədərdir.

Ey Tanrı, geniş meydanı vardır yeni şerin,
Meydanımı dar eyləmə, meydan o qədərdir.

Bir zərrədi nöqsanı bu Şahin qarabəxtin,
Şəkk eyləmə nöqsanıma, nöqsan o qədərdir.

*15.11.1999*

✦✦✦

Aşiqəm, hər yerdə mənə yar var,
Harda vəfa varsa vəfadar var,

Tazələnir köhnə qəzəl mülkümüz,
Namixuda, bir yeni memar var.

Baş verən hər şeydə səbəb gəzməli,
Var səbəbi, çünki səbəbkar var.

Ey ki, şoranlıq görən hər guşədə,
Gör nə qədər gülşənü gülzar var.

Dərk edirik baş verəni ölkədə,
Sanma yatıbdır hamı, hüşyar var.

Aşsa da başdan, gözəlim, qəm seli,
Qəm yemərəm, sən kimi qəmxar var.

Sərvəti yoxdursa da yoxsul deyil,
Şahinə pak eşqi kimi var var.

*8.12.1999*

✦✦✦

Ey yar, gedək kəndə, şəhərdən gileyim var,
Saf dağ çayına indi Xəzərdən gileyim var.

Dərvişlər ilən faydalı çox-çox səfər etdim,
Dərvişlərə bihudə səfərdən gileyim var.

Sevda oyununda udaraq, nərddə uduzdum,
Ey gücsüz oyunçu, sənə zərdən gileyim var.

Dərdü kədər həm gəldi var ikən qəmü qüssə,
Qəm-qüssəyə dərd ilə kədərdən gileyim var.

Məndən sənə bəd söz dedi, kimdir o xəbərçi?
Yarım, xəbərin varmı, xəbərdən gileyim var.

Belində qolum tək kəmərin vardı təbii,
Qucmuş belini süni kəmərdən gileyim var.

Çoxdan bağa dəymir qədəmin, gül sənə həsrət,
Səndən gülə, bağbana çəpərdən gileyim var.

Yansın canı, qoy bədnəzərin gözləri çıxsın,
Neyçün üzünə dəydi, nəzərdən gileyim var.

Şahin, gileyin ardını saxla, gecə düşdü,
Dəng eyləmisən yarı səhərdən "gileyim var".

*4.01.2000*

✦✦✦

Adəm yaradıb, aləmə Həvva yaradıbdır,
Əlbət, Yaradan aləmi əla yaradıbdır.

Bir kimsə onun varlığını dərk edə bilmir,
Tanrım nə gözəllikdə müəmma yaradıbdır.

Alimlərə sevda dolu mənalı təfəkkür,
Aşiqlərə məna dolu sevda yaradıbdır.

Var eşq ki, eşq əhlini məqsudə yetirmiş,
Var eşq ki, eşq əhlinə qovğa yaradıbdır.

Bəzən edirəm zənn ki, Allah-taala,
Ey Qeys, sənin xətrinə səhra yaradıbdır.

Var öylə qəzəlxan - qəzəli ildə bir oldu,
Bəh-bəh, kişi bir aydə misra yaradıbdır.



Hər gözdən axan yaş yaratmaz yeni dərya,
Şahindəki göz yaşları dərya yaradıbdır.

*7.01.2000*

✦✦✦

Neçə gündür yanıma sevgili yarım gəlmir,
Bu nə mövsüm, nə fəsildir ki, nübarım gəlmir.

✦✦✦

Neçə yol şövq ilə "sim-sim" demişəm bihudə,
Xoş vüsal qəsri qıfıllandı, açarım gəlmir.

Mən də sən tək dəyişib məzhəbimi, ey Sənan,
Şeyxə döndüm qoca sinnimdə, Xumarım gəlmir.

Alağ artıb, soluxub gül, oxumur bülbüllər,
Daha bu bağdə qalmağə qərarım gəlmir.

Qapıdan saqini qovduqda gəlir pəncərədən,
Bu nə həngamədi, ey Tanrı, o yarım gəlmir.

Mən səfimdən aralandım və qatarım getdi,
Durna oldum qərib ellərdə, qatarım gəlmir.

Ömrümün fəsli dəyişmir daha, Şahin, nə üçün?
Əvəz eylər qışı qış fəsli, baharım gəlmir.

*11.01.2000*

✦✦✦

Dərdim çoxalıbdır yenə, dərmanı görünmür,
Ölsün elə bir xəstə ki, loğmanı görünmür.

Hər dərdə əlac var deyiblər, belədirsə
Bilməm nə hicrdir bu ki, imkanı görünmür.

✦✦✦

Əl çalıban qəm başıma fırlanır,
Gör necə möhkəm başıma fırlanır.

Röyada Qeys idi, Kərəm, Xançoban...
Bir neçə sərsəm başıma fırlanır.

Şad eləmək istəyir əhvalımı,
Camı içib Cəm başıma fırlanır.

Yar yenə loğmanım olub, çəkmədən
Yarəmə məlhəm, başıma fırlanır.

Bəlli ki, hərdən bürüyür gözləri,
Amma bu gün nəm başıma fırlanır.

Ey Qeys, sənə daima rəhmət deyirəm mən,
Vardırmı çəkən sən kimi hicranı, görünmür.

Qaçqınları, köçkünləri illərlə didərgin,
Yarəb, bu necə ölkədi sultanı görünmür?

Üzlərdə kədər cilvəsi, gözlərdə həzinlik,
Asi nə qədər çoxsa da, üsyanı görünmür.

Xəlqin görürəm çoxdu qəzəl şairi, amma
Xəlqi qəzəlin mən kimi heyranı görünmür.

Şahin, yuxuda mən bu gecə Maili gördüm,
Dindi oxuyub şerimi: Nöqsanı görünmür!

*23.01.2000*

✦✦✦

Söyləyirlər ki gəlirsən, bu xəbər düzmü olar?
Yalan oldu bu gecə, söylə, səhər düzmü olar?

Gözlərimdən yenə timsah kimi yaş yağdırıram,
Göz yaşımdan böyüyüb daşsa Xəzər düzmü olar?

Gərək olsa, gedərəm hər yerə təyyarə ilə,
İndi, ey Qeys, ayağ ilə səfər düzmü olar?

"Getdi zülmati-şəbi-tirə, çıxıb mehri-münir"*,
Söyləsəm mən bu dilə həftəbecər düzmü olar?

İstəsəm mən də bu sözlərlə kitablar yazaram,
Əcnəbi söz calasam şerə məgər düzmü olar?

Gözü çıxsın "göz"ü "çeşm" ilə tərənnüm edənin,
Söyləsəm özbaşına mən "baş"a "sər" düzmü olar?

"Əndəlib" yazmadadır "bülbül"ü şairlərimiz,
"Bülbül"ü mən "solovey" yazsam əgər düzmü olar?

Guya ədviyyəsidir xarici sözlər qəzəlin,
Köhnəlibdir bu nəzər, tazə nəzər düzmü olar?

Dilə yad kəlmələrin faydası yoxdur, Şahin,
Mən də versəm qəzələ indi zərər düzmü olar?

*21.02.2000*

---

* Əbdülxaliq Yusifin qəzəlindən (Bax: "Deyilən söz yadigardır" kitabı, Bakı, 1981, səh.39)



Molla töküb göz yaşı dövr etmədə,
Saqisə xürrəm başıma fırlanır.

Bitdi qəzəl, yoxdu adım məqtədə*,
Dünyəvü aləm başıma fırlanır.

*25.03.2000*

✦✦✦

Deməsinlər mənə Leylavü Züleyxa təkdir,
Öz yarım bənzəmədə onlara ya, ya təkdir.

Mən də bir vaxt qərib ellərə getdim, gəldim...
Səfər etməkdə qərib ellərə durna təkdir.

Göz yaşımdan yeni dərya yaranıbdır, dedilər:
- Göz yaşından yaranıbdırsa o dərya, təkdir.

Mənə eşq oldu təmənna bu cahanda, əğyar,
Nə təmənna eləyirsən, bu təmənna təkdir.

Saf deyildir "ləbi-cu, nəşeyi-mey, payi-çinar"**,
Saf isə, sözləri saf-saf bu misra təkdir.

Şahina, kor kimi tutma bu fəna dünyanı,
Başqa dünya dəxi vardır, demə dünya təkdir.

*5.04.2000*

✦✦✦

*Azərbaycan nəzəri əruz karvanının sarbanı*
*ustad Əkrəm Cəfəri məhəbbətlə yad edərək*

Əruzun püxtə olan zərgəri Əkrəm Cəfər,
Vətənin ali vətənpərvəri Əkrəm Cəfər.

Tanıyırdım onu çox yaxşı, xeyirxahlıqla
Döndərib zabitə çox əsgəri Əkrəm Cəfər.

Neçə xoşxah adamın elmdə yolgöstərəni,
Neçə bədxah adamın neştəri Əkrəm Cəfər.

Neçə aqil adamın yollarını pak eləyib,
Qurdu cahil önünə səngəri Əkrəm Cəfər.

---

* Məqtə - qəzəlin son beyti

** Ləbi-cu (bulaq ağzı), nəşeyi-mey (mey nəşəsi), payi-çinar (çinar ayağı) - Bax: Əbdülxaliq Cənnətinin bir qəzəli, "Deyilən söz yadigardır" kitabı, 1981, səh.60.

Neçə il hər günə sürgündə vida eyləyərək,
Oldu Məcnun sayağı sərsəri Əkrəm Cəfər.

Şairin, bəlli ki, ilham pərisi bircə olur,
Etdi müştağ özünə çox pəri Əkrəm Cəfər.

Azəribaycan əruzu nə gözəldir, Şahin,
Öz əruz elmimizin sərvəri Əkrəm Cəfər.

*30.04.2000*



Daha rahətliyi eşqin xətərindən çoxdur,
Bu işin faydası, yarım, zərərindən çoxdur.

Varlığından ulu Rəbbin xəbəri yox məncə,
Xəbərim, bəlkə də, şeyxin xəbərindən çoxdur.

Yoxsa, tutmaz idi o qeyri-münasib işlər,
Fərəhi, nəşəsi qat-qat kədərindən çoxdur.

Bəşəriyyətdə savaşsız ötüşən gün varmı?
Aləmin qəmli kəsi bəxtəvərindən çoxdur.

Heyf olsun o gözəl günlərə ki, gendə qalıb,
Zərgərin hövsələsi indi zərindən çoxdur.

Ey qəzəlxan, səni incitdi o bədxahın, döz,
Səndə var öylə dözüm ki, təpərindən çoxdur.

Ruhdən düşmə həyatın gedişindən, Şahin,
Düşmənin varsa da, dostun qədərindən çoxdur.

*20.05.2000*



Hər dilbərə Leyla kimi dilbər deməyirlər,
Hər aşiqi aşiqlərə sərvər deməyirlər.

Zülm etsə də, hər zalimə Zöhhak deyilməz,
Hər şahə ki, adil ola, Səncər deməyirlər.

Hərdən gözümün yaşları Tərtər kimi cari,
Neyçün gözümün yaşinə Tərtər deməyirlər?

Əğyar neçin incidi şairlərimizdən?
Əğyarə axı zərrə qədər şər deməyirlər.



Yazmış sinəm üstündə nigarım neçə şerin,
Dəftərsə də sinəm sinədəftər deməyirlər.

Zərgər kimi zər qədrini - yar qədrini bil ki,
Zər qədrini bilməz kəsə zərgər deməyirlər.

Şahin, yanıram eşq oduna, ölmürəm amma,
Neyçün mənə xəlq içrə səməndər deməyirlər?

*2.06.2000*



Surətə məna donu geydirdilər,
Eşqə təmənna donu geydirdilər.

Hər ötəri hissi məhəbbət sanıb
Şəhvətə sevda donu geydirdilər.

Bir də görürsən mey içənlər coşub
Saqiyə Həvva donu geydirdilər.

Bəziləri baş qoşub əfsanəyə
Gerçəyə xülya donu geydirdilər.

Şövq ilə yaltaqlıq edib rəhbərə,
Fərmana icra donu geydirdilər.

Yetmiş ilin çox günəhi verdi baş,
Rəbbə müəmma donu geydirdilər.

Molla Füzuli, səni sevmiş deyə
Şahinə molla donu geydirdilər.

*26.06.2000*



Tanrım ki, mənə söz varı tək var veribdir,
Bir qeyriyə zənn etmə bu miqdar veribdir.

Söz yox ki, Füzuli deyilik, köhnə zamanlar
Raci yetiribdir, sözə Əttar veribdir.

Hər gündə şer yazmağa vermiş mənə ilham,
Yarım, səbəbi var ki, Səbəbkar veribdir.

Qoşqar dağının zirvəsi yayda qara möhtac,
Şahdağın isə zirvəsinə qar veribdir.

Məcnunə biyabanı verib, Xosrova taxtı,
Mənsurə isə çərxi-fələk dar veribdir.

Şahin nə deyib dilbərə? Dil darə çəkilsin!
Dərdim bu ki, dərdim mənə dildar veribdir.

*7.07.2000*

✦✦✦

Qovlayın, gəlməsin, eyvah, özüdür,
Qanadan qəlbimi cərrah özüdür.

Qəmlədir gah xəyalı yarın,
Məni pəjmürdə qılan gah özüdür.

Gah barəmdə mənim səhv eləyən,
Gah edən səhvini islah özüdür.

Şahdən çarə umarlar, işə bax
Məni biçarə edən şah özüdür.

Deməyin ağladı timsah kimi,
Ağlayan mən kimi timsah özüdür.

Eşqbaz oldu bu Şahin Fazil,
Aşiqəm, sevgilim Allah özüdür.

*28.06.2000*

✦✦✦

Bizə məlumdu bu dünya, bəs o dünya necədir?
Görəsən orda o Məcnun ilə Leyla necədir?

Orda da varmı təmənna sevişən kəslərdə?
Bu təmənna bizə bəlli, o təmənna necədir?

Burda dərya görürəm mən suyu zəqqum sayağı,
Dadı vardırmı görən, ordakı dərya necədir?

Əmri icra eləyirlərmi görən? Burda isə
Var əmr, bir soruşan yoxdu ki, icra necədir?

"La ilahə..." deyən adam deyə qoy "...illəllah",
Bilsə, arif biləcəkdir ki, bu misra necədir.



Gər qəlizdirsə qəzəl, qədri bilinməz məncə,
Dadmasa kim biləcəkdir axı həlva necədir.

Kim necə istəsə yazsın, sən isə, ey Şahin,
Sadə yaz, qoy bilələr sözdəki məna necədir.

*30.06.2000*

✦✦✦

Eşqi yoxdursa əgər hər kimsənin nöqsanı var,
Bəxtəvər sandım fəqət ol şəxsi ki, canını var.

Kim deyibsə "...eşq dərdi qabili-dərman deyil",
Yəni ki, dərmanı yoxdur, düz deyil, dərmanı var.

Həlli var hər istəyin gər istəsə Pərvərdigar,
Ol cənabın, bəlli ki, hər müşkülə imkanı var.

Həm kədər, həm qüssə, həm qəm dəmbədəm gəlməkdədir,
Mərhəba, mən sarıbanın gör necə karvanı var.

Daima cəhd etmişəm mən mənəvi zənginliyə,
Aşiqin sevda adında ləli var, mərcanı var.

Dar da var, kəndir də var - Həllac Mənsur tək deyil,
Asi şəxsin hər dövrdə cəngi var, üsyanı var.

Qoç kimi qurban mənəm, qoç bürcüdür bürcüm mənim,
Bəxtəvərdir sevgilim: Şahin kimi qurbanı var!

*2.07.2000*

✦✦✦

Nigarım naz edir, Allahu əkbər,
Qəmi dəmsaz edir, Allahu əkbər.

Nə şerimdən deyir əzbər sətirlər,
Nə də avaz edir, Allahu əkbər.

Nə möcüzdür ki, ecazdan olub yan,
Yenə ecaz edir, Allahu əkbər.

Və ömrün güllərin biçməkdə əllə,
Əli dəryaz edir, Allahu əkbər.

Nə şahindir bu ki, quşdur qanadsız,
Yenə pərvaz edir, Allahu əkbər!..

*14.08.2000*



Cansızam, məndə o dəm can görünər,
Elə ki, sevgili canan görünər.

Olar, əlbəttə, gözəllik zahir,
Adi daş həm gözə mərcan görünər.

Acılıq şirniləşər bir dəmdə,
Bibəristan şəkəristan görünər.

Nə gülümsər üzümə cin-şeytan,
Nə gözə quli-biyaban görünər.

Qanqalı lalə təsəvvür edərəm,
Gözə səhra da gülüstan görünər.

Həll olar qarşıdakı hər müşkül,
Çox çətinlik mənə asan görünər.

Edərəm hicri vüsal ilə əvəz,
Qələt eylər daha hicran görünər.

Qəm görünməz gözümə, ey Şahin,
Elə ki, sevgili canan görünər.

*24.08.2000*



Məndə olan can gülüstandadır,
Çünki o canan gülüstandadır.

Mən daha əczaxanaya getmərəm,
Dərdimə dərman gülüstandadır.

Rəmzü meyl mənbəi eşq - aşiqə,
Arifə - irfan gülüstandadır.

Güllərə biganə adam burda yox,
Güllərə heyran gülüstandadır.

Tutmayacaq baş diləyi oğrunun,
Mən təki bağban gülüstandadır.

Sən daha bazardə axtarma qoç,
Ey pəri, qurban gülüstandadır.



Şah da fərman eləsə xeyri yox,
Şahinə fərman gülüstandadır.

*29.08.2000*



Kədərim dağdan uca, görsə onu dağ qaralar,
Önünü kəsməliyəm, yoxsa bu növraq qaralar.

Qara dərd ağ ümidin rəngini bir halə salar
Bürüyər tüstü kimi hər tərəfi, ağ - qaralar.

Cəlb edərdi məni bağ bağrı yaşıl rəngində,
Qarabağ oldu qara, bilməz idim bağ qaralar.

Qaraquş caynağını qoy uzaq etsin məndən,
Caynağım öylə sıxar caynağı caynaq qaralar.

Qoy ağarsın qaralan taleyimiz, ey saqi,
Meyi çox saxlama bardağdə bardaq qaralar.

And ola Allaha ki, yazmadığım gün yoxdur,
Qələm işlətsə əgər kim belə barmaq qaralar.

Qanadım öylə böyük ki, ayırar dünyanı,
Şahinəm, uçsam əgər mən göyə torpaq qaralar.

*4.09.2000*



Gözəlim, səndə vəfa, məndə sədaqət vardır,
Bu cəhətlər bizə yardır ki, məhəbbət - vardır!

Eşqi Adəm baba, Həvva nənə miras qoymuş,
Ulu eşq içrə həya var, ləyaqət vardır.

Çox qəbr sahibi illərlə ziyarətsizdir,
Bir qəbrsiz kəsi hər vədə ziyarət vardır.

Rəhmət olsun sənə Məcnun, a böyük Divanə,
Sənin eşqində dözüm var, dəyanət vardır.

Əsl Aşiq təki iz qalmalıdır məndən də,
Əsl Aşiqdə şərəf var, şərafət vardır.

Mənə cananə əsir, mən də əsir cananə,
Bu əsirlikdə böyük fəlsəfə, hikmət vardır.

Yaşasın öylə əsarət ki, məhəbbətdir adı,
Necə xoşdur ki, a Şahin, bu əsarət vardır.

*16.09.2000*

✦✦✦

Neyləyim, ərzimi cananıma göndərmədilər,
Nə də cananımı tez yanıma göndərmədilər.

Nə rica oldu vəsldən ki, yetişsin yanıma,
Nə də "gəl" hökmünü hicranıma göndərmədilər.

Bağımın bağbanı, heyfa, nə salam göndərdi,
Nə mənim müjdəmi bağbanıma göndərmədilər.

Istədim üzrümü təqdim eləyim qoymadılar,
Nə də ki, üzrümü sultanıma göndərmədilər.

Nə onun məktubu gəldi, nə mənim yazdığımı
Gəncəmə, Bərdəmə, Şirvanıma göndərmədilər.

Şahinəm, razıyam alsın canımı cananım,
O Ərəbzəngimi meydanıma göndərmədilər.

*25.09.2000*

✦✦✦

Ey fələk, köksümdəki can ətridir,
Uçmasın heç yanə, canan ətridir.

Hər ətr yerdən deyil, göydən gəlir,
Ətri zənn etmə gülüstan ətridir.

Ətr vardır mütilikdən dəm vurur,
Ətr həm vardır ki, üsyan ətridir.

Ətr vardır ki, fəraq ismindədir,
Ətr həm vardır ki, hicran ətridir.

Ətri güllərdən çəkir bülbül müdam,
Tutiyə xoş - şəkkəristan ətridir.

Bircə gün olmazsa fərmanı ölər,
Saxlayan sultanı fərman ətridir.



Şahinə, meyl ətrinin var öz yeri,
Ən gözəl ətr isə imkan ətridir.

*11.10.2000*

✦✦✦

Dil peşmandır, ürək ondan betər,
Gül pərişandır, çiçək ondan betər.

Arizu dəymiş daşa, sönmüş dilək,
Arizu pərtdir, dilək ondan betər.

Ya kəsilsin əl, - deyirlər, - ya ətək,
Əl kəsilmişdir, ətək ondan betər.

Çərx tək hər dəm fələk fırlanmada,
Çərx qəmgindir, fələk ondan betər.

Hər tərəfdə düzlük olsa bərqərar,
Hiylə qan ağlar, kələk ondan betər.

Çək-çevirlər şiddətindən pərt olub,
Qəlb üzülmüşdür, ürək ondan betər.

Saqi ölmüş, Şahin olmuşdur qoca,
Kuzə sınmışdır, lülək ondan betər.

*13.10.2000*

✦✦✦

Mənə təb ver ki, qəzəlxanın olum hərdənbir,
Lütf elə, ey pəri, mehmanın olum hərdənbir.

Ay da, ulduz da qəşəng gözlərinin heyranı,
Istərəm mən dəxi heyranın olum hərdənbir.

Sən ki etməkdəsən, ey yar, əzəmət sevdası,
Bəndənəm, hökm elə sultanın olum hərdənbir.

Sadiqəm, pozmayıram əhdi, gözəllər var ki,
Söyləyirlər mənə "cananın olum hərdənbir".

Şövq ilən mən sənə qurban olaram inşallah,
Arabir əmr elə qurbanın olum hərdənbir.

Olsa lazım çoban ollam, Xumarım, min sürüyə,
Mənə tapşır sürü, Sənanın olum hərdənbir.

Hurisən, zərrəcə etmir buna Şahin şübhə,
Mənə sən lütf elə qılmanın olum hərdənbir.

*24.10.2000*



Qürbət ki mənə məkan olubdur,
Halım təzədən yaman olubdur.

Sərhəddə keşikçilər dayanmış,
Yollar yenidən duman olubdur.

Yoxdursa da yan-yörəmdə oğru,
Könlümdə mənim talan olubdur.

Zülm eyləyəcək Fəraq müəllim,
Hicran yenə imtahan olubdur.

Qürbətdə edən məni ciyərqan
Şirvan, Qarabağ. Muğan olubdur.

Dostlar qınayıb "qayıt" deyirlər,
Cananə də bağrıqan olubdur.

Söz gülləsi yağmada yağış tək,
Biçarə canım nişan olubdur.
Çox yaxşı idim vətəndə, Şahin,
Halım nə yaman, yaman olubdur.

*29.10.2000*



Get, nə olsun ki, xəyalın ki qalır,
Hafizəmdə o camalın ki qalır.

Ey vəfa ölkəsinin sultanı,
Sevgi tək cahü cəlalın ki qalır.

Xatirimdən silinər çox şerin,
Yaddaşım içrə kamalın ki qalır.

Demisən "hər gecənin gündüzü var",
Belə onlarla misalın ki qalır.

Sənə yüzlərlə cavabım - məlum,
Mənə minlərlə sualın ki qalır.



Xeyri nə həzzimi artırmışsan,
Dağ böyüklükdə məlalın ki qalır.

Yetərik vəslə öləndən sonra,
Şahininlə o vüsalın ki qalır.

*3.11.2000*



Hər yara cananə deyən səhv edir,
Əğyara mərdanə deyən səhv edir.

Bir gülə ver sirri gülüstandə,
Sirri gülüstanə deyən səhv edir.

Küfr eləyən var mənə kafər kimi,
Küfrü müsəlmanə deyən səhv edir.

Rəmzdi məstanəlik aşiqlərə,
Sərxoşa məstanə deyən səhv edir.

Dilbər imiş dərdli kəsin çarəsi,
Dərdini loğmanə deyən səhv edir.

Aşiqəm, əfsanə deyil, gerçəyəm,
Gerçəyə əfsanə deyən səhv edir.

Siz mənə Divanəbaşı söyləyin,
Şahinə Divanə deyən səhv edir.

*7.11.2000*



Yarım, hanı gülabın? Can xəstəhal olubdur,
Görsənməyir cavabın, səndən sual olubdur.

Həzz iztiraba döndü, dərdim kitabə döndü,
Keyfim əzabə döndü, eyşim məlal olubdur.

Şam yandı, şam yox oldu, cam sındı, cam yox oldu,
Səbrim tamam yox oldu, gəl gör nə hal olubdur.

Həsrət qalan nigarə eşq əhlinə nə çarə?
Hicrindir aşikarə, vəslin xəyal olubdur.

Sənsiz, a gülcamalım, hər dəm dəyişdi halım,
Eşq əhlinə, a zalım, məlhəm vüsal olubdur.

Əlbət budur günahin: Heç yetməyir pənahin,
Sən Leylisiz bu Şahin Məcnunmisal olubdur.

*13.11.2000*



Nə adəm mülküdür adəm görünmür?
Nə dünyadır bu ki, məhrəm görünmür?

Gül altında tikan gördüm sərasər,
Gül üstündə neçin şəbnəm görünmür?

Çaram yoxdur bu gün, var çarəsizlik,
Yaram çoxdursa da, məlhəm görünmür.

Neçin Nofəl, neçin Zeyd qeyb olubdur?
Neçin aşiqlərə həmdəm görünmür?

Neçin divanə olmur indi bəs Qeys?
Neçin Leyla gözündə qəm görünmür?

Nə Rövşən var, nə vardır bir cəlali*,
Nə Babək var, nə var xürrəm**, görünmür.

O dünyayə ümid eylə, a Şahin,
Bu dünyanın ipi möhkəm görünmür.

*1.12.2000*



Məlumdu müqəssir, mənə sən hakimi göstər,
Kimdir sovuran yellərə əmlakimi göstər.

Cism içrə əsəblər sarı sim tək gərilibdir,
Tarımda tarım çəkdilər, eyvah, simi göstər.

---

* Rövşən (Koroğlu) məşhur cəlali hərəkatının (XVI əsrin sonu, XVII əsrin əvvəlləri) başçısı olmuşdur.
** Babək hərəkatı xürrəmilər hərəkatı adlanırdı.



Məzlumlərin naləsi onsuz da əyandır,
Cəhd eylə bu gün aləmə sən zalimi göstər.

Düşmənlərmin, indi Məlikməmməd olub, mən
Sındırmalıyam tilsimini, tilsimi göstər.

Məlumdu o yanda Yaradan var, bu yanda
Hər dərdə dəva eyləyəcək alimi göstər.

Eyvah, bu gün şerimə qiymət verən azdır,
Kimdir o, müəyyən edə idrakimi, göstər.

Zövq əhli dedi: - Şairimiz çoxdu, a Şahin,
Vardırmı qəzəllər yaradan sən kimi, göstər.

*4.12.2000*



Yanağım öylə ki, ey yar, o rüxsarə dəyər,
Çarəsiz aşiqə sanki təzədən çarə dəyər.

Saç qara, qaş qara, gözlər qara, kiprik də qara,
Ey ağüzlüm, nəzərə gör nə qədər qarə dəyər.

Yenə ox kipriyin hər gün vuracaq yarə mənə,
Şadimanəm ki, bu gündən mənə hey yarə dəyər.

Eşqdən başqa, gülüm, hər şeyi inkar elədin,
Eşqi təsdiqləməyin bir neçə inkarə dəyər.

Söyləyirlər ki, o dünyadə gözəllər çoxdur,
Hansı dildar bu dünyadə bu dildarə dəyər?

Nə sayaq eylədi abad könül mənzilimi?
Əməli sevgilimin bir neçə memarə dəyər.

Ürəyim sanki döyünmür, ciyərim parələnir,
Elə ki, yanimə gec-gec o ciyərparə dəyər.

Acı söz söyləyən hər kəs məni eylər bihal,
Sanki, Şahin, açılıb şairə qumbarə dəyər.

*7.12.2000*



Zənn eyləyirəm dərdimə dərman olacaqdır,
Bir gün o vüsalə yenə imkan olacaqdır.

Səhra kimidir indi könül mülkü - çiçəksiz,
Səhra, gələcək gün ki, gülüstan olacaqdır.

Var idi, yox oldu, yenə var olsa, əzizim,
Ülviyyətimiz aləmə dastan olacaqdır.

"Qurbanın olum" çox deyibən olmadın, indi
Qurbanın olum, kim mənə qurban olacaqdır?

Saf ol, a müsəlman, daha kafərliyə uyma,
Küfr eyləmə, kafər də müsəlman olacaqdır.

Meyxanəyə gəldim təzədən köhnə həvəslə,
Mən saqiyə, saqi mənə heyran olacaqdır.

Şahin, qəzəlin yoxdu qumarbazı mənim tək,
Kim mənlə qumar oynasa üryan olacaqdır.

*8.12.2000*



Başına aşiqinin yar ki, qovğa gətirir,
Elə bil Yusifə qovğanı Züleyxa gətirir.

Necə ilhamdı bu ki, məndə tükənmək bilmir,
Qələmim dəftərə hər dəm təzə misra gətirir.

İlk bahar gəldi, gülüm, sən də qayıt durna tək,
Baharın müjdəsini aləmə durna gətirir.

Məni şad eylə gəlib sevgi təmənnası ilə,
Nəzərə al ki, təmənnanı təmənna gətirir.

Qulağından asılır kəlmələrim sırğa kimi,
Sanki, aşiq yara hər gün yeni sırğa gətirir.

Gözəlim, duy sözümün verdiyi hər mənanı,
Bir sözüm bəzən olur bir neçə məna gətirir.

Gəl mənim məktəbimə eşq əlifbası ilə,
Bəlli ki, məktəbə şagird əlifba gətirir.



Dedi yarım: - Nə şirin sözlə gəlirsən yanıma,
Sanki şahin quşu mən tutiyə xurma gətirir.

*14.12.2000*



Hurini gör, qılmana meyl eyləmir,
Ahu dəxi ceyrana meyl eyləmir.

Yırtıcı düşmən qanadıb yurdumu,
Azəri xalqım qana meyl eyləmir.

Zabitimiz əmrə məhəl qoymayır,
Əsgərimiz fərmana meyl eyləmir.

Düşmənimiz çox yeri tutmaq dilər,
Təkcə Azərbaycana meyl eyləmir.

Ovqatımız öylə pərişan olub,
Gözlərimiz reyhana meyl eyləmir.

Gör ki, zərər bizləri qərq eylədi,
Faidəmiz imkana meyl eyləmir.

Yasə batıb, asi olub xəlqimiz,
Asi neçin üsyana meyl eyləmir?

Şahina, bağbanmı küsüb bağdən?
Yoxsa ki, bağ bağbana meyl eyləmir?

*17.12.2000*



Şadəm ki, həmin yarı yenə şad görürlər,
Gül çöhrəsini qüssədən azad görürlər.

Səyimlə məhəbbət yenidən qəlbinə doldu,
Bərbad olan məskəni abad görürlər.

Əfsus, çox evdən göyə şənlik səsi qalxmır,
Fəryad ki, şənlik nədi, fəryad görürlər.

Övladlığı əxz eylədim aşiq babalardan,
Məcnunə misal indi az övlad görürlər.

Yarmazsam əgər Şahdağı eşqim haram olsun,
Görcək - səni Şirin, məni Fərhad görürlər.

"Allahə təvəkkül" deyib imdadə yetişdim,
Əlbəttə ki, Allahdən imdad görürlər.

Heyhat, ögeylik görürəm millətə hərdən,
Çox doğma müsəlmanı bu gün yad görürlər.

Əldən Qarabağ getdi, ədalət necə oldu?
"Ey dad" eşidirlər bu gün "ey dad" görürlər.

Mən yazmadayam xəlqi qəzəllər gecə-gündüz,
Şahinmi, xeyr, sanki bir ustad görürlər.

*6.01.2001*

✦✦✦

Mənlə o ki, gəzməyə hərdən çıxır,
Qəlb həmin ləhzə kədərdən çıxır.

Ver mənə, ey Rəbb, qəzəl şirnisin,
Verme şirinlik ki, şəkərdən çıxır.

Vermə xəbər sən mənə hicrandən,
Başqa xəbərlər o xəbərdən çıxır.

Sevgiyə əğyar zərər verməde,
Sanki onun xeyri zərərdən çıxır.

Tüstüyə bax, çıxdı başımdan mənim,
Atəşə bax, sanki ciyərdən çıxır.

Bir yuxu gördüm: Daha əğyar yox!
Namixuda, sevgi xətərdən - çıxır.

Mərhəba, qəlbimdə mənim, Şahina,
Eşq o qədərdir ki, qədərdən çıxır.

*8.01.2001*

✦✦✦

Gözəlim, rəhmin olarsa yenə sevda dirilər,
Surətin dəysə gözə sözdəki məna dirilər.

Kimsəyə gizli deyil, təbimi öldürmüşsən,
Ruh versən sən əgər təbimə misra dirilər.



Ehtiyacım sözədir, aşiqinə söz söylə,
Ya ölər bircə sözünlə bu sevən, ya dirilər.

Dirilib çoxları Isa nəfəsindən, amma
Nəfəsin dəysə əgər, ey pəri, Isa dirilər.

Unudulmuş Qarabağ qovğası... Şah Ismayılım
Başçılıq eyləsə ləşkərlərə qovğa dirilər.

O qədər halva sevəndir ki, öləndən sonra
Töksələr mədəsinə halvanı molla dirilər.

Gözəlim, öldüyü dəm çıxsa dilindən qəzəli,
Şahinin bir də görərlər olub ehya dirilər.

*28.01.2001*

✦✦✦

Yaxşılıq bir yana qalsın ki, yamanlıqlar var,
Dəyişib indi zəmanə, nigaranlıqlar var.

Qırmızı, yağlı şüarlar məni azdırmışdı,
Nə bilirdim axı mən öndə qaranlıqlar var.

Asiman mavi, çəmənlərsə yaşıl rəngdəydi,
Heç güman eyləməz idim ki, toranlıqlar var.

Keçirərdim günü günlərlə gülüstanda müdam,
Bilməyirdim hələ çox yanda şoranlıqlar var.

Gəzər idim Babadağ, Şahdağımı asudə,
Görməyirdim ki, o dağlarda dumanlıqlar var.

Üç hərf ismimə "Ş.a.h."dı, əməlim şahanə,
Bilməyirdim hələ zillətli çobanlıqlar var.

Dönəcək, zənn edirəm, cənnətə bir gün yer üzü,
Hələ xoş günlərə qəlbimdə gümanlıqlar var.

Altmış yaş qocalıqdırmı məgər, ey Şahin,
Bu qədər qəm yemə gəl, öndə cavanlıqlar var.

*25.02.2001*



*Müasir qəzəlxanların qəzəllərini dinlədikcə görürəm ki, onlar bu günün Azərbaycan qəzəlinin yaranmasına az da olsa cəhd etməyəcək, dilimizdə vətəndaşlıq hüququ qazanmayan ərəb, fars və başqa dillərdəki sözlərin, ibarələrin, çoxpilləli izafət tərkiblərinin işlənməsindən əl çəkə bilməyəcəklər, axı müasir xəlqi qəzəlimizin yazılması şairdən çox böyük zəhmət və vətəndaşlıq heysiyyəti tələb edir.Kədərlənib bir qəzəl yazdım:*

Asi könlüm nə olubdur yenə qovğa eylər?
Mərəkə xəlq eyləyib sonra təmaşa eylər.

Nə düşübdür ona ki, faş eləyir əğyarı?
Ya Züleyxa kimi cananəni ifşa eylər?

Sulanır yarımı andıqca gözüm, var qorxu
Yar fərağında gözüm aləmi dərya eylər.

Tutmasınlar mənə irad ki, hey "yar" deyirəm,
Məcnunun könlü müdam Leyli təmənna eylər.

Nə qədər adəmi, Yarəb, qovurur buğda kimi,
Bu fələk bizləri axırda qovurğa eylər.

Bu qəzəl sahibi neyçün bu qədər fikr eləyir?
Bu fikirlər onu getdikcə müqəvva eylər.

Nə üçün bir belə təbliğ edirəm saf qəzəli?
Niyə dil haqda dilim bir belə dəva eylər?

Kimə var dəxli ərəb sözləri könlümcə deyil?
Hey deyirlər ki, "dilin tənqidi bica eylər".

Ya ki, fars kəlməsi könlümcə deyildir kimə nə?
Kim qulağında mənim kəlməmi sırğa eylər?

Kimə lazım qəzəlin saflığı məndən başqa?
Əvvəl-axır bu dilim mərəkə peyda eylər.



Almayıb layiq olan qiyməti Şahin Fazil,
Gün gələr ki, gələcək nəsl onu ehya eylər.

24.03.2001



Yazıram sözlərimi dilbərə dəftər-dəftər,
Mənə ad qoymuş hamı eşqdə sərvər, sərvər.

Eşq köksümdə mənim qaldı ömürlük, yarım,
Eşq köksündə sənin saldımı lövbər, lövbər?

Bəslərəm sevgimi gövhər sayağı can içrə,
Nə gərəkdir mənə bundan belə gövhər, gövhər?

Canı hicran odu, canan, elə yandırmış ki,
Təşnəyəm mən, su gərəkdir mənə Tərtər-Tərtər.

Söyləyin tarzənə "Şur"i gətirsin şurə,
Qoy çalınsın yenə "Zabul" ilə "Şüştər", "Şüştər".

Sürtülübdür üzü əğyar olanın, görsəydim,
Vurar idim başına bir neçə qənbər, qənbər.

Düşmənimdən neçə ildir ki, zərər yetməkdə,
Barı keçsin sinəsindən neçə xəncər, xəncər.

Nə qəzəl vaxtıdı, at dəftəri, gir meydanə,
Şahina, qismət ola qoy sənə səngər, səngər.

30.03.2001



Dövr ilə dövran əlahiddədir,
Sevgili canan əlahiddədir.

Zahida, sevmək yarı nöqsan isə,
Incimə, nöqsan əlahiddədir.

Qeysə çaşıb quli-biyaban demə,
Quli-biyaban əlahiddədir.

Səsləməsinlər məni meyxanəyə,
Aşiqə meydan əlahiddədir.

Çox kədəri, çox qəmi var aləmin,
Amma ki, hicran əlahiddədir.

Dərdi verən kəs verəcək dərmanı,
Dərd ilə dərman əlahiddədir.

Ətri gülabdan da gəlir güllərin,
Amma gülüstan əlahiddədir.

Bir də rica etmə ki, "fərman elə",
Ey pəri, fərman əlahiddədir.

Mən şaha sən sultan olubsan, demə
Şah ilə sultan əlahiddədir.

Hər şeyi verdim sənə, tək canımı
Verməmişəm, can əlahiddədir.

Xeyli gözəldirsə cahan, Şahina,
Azəribaycan əlahiddədir.

*1.04.2001*

✦✦✦

"Təzə gün" - "novruz"umuz tazə nübar ilə gəlir,
Köhnə gün gendə qalır, tazəsi var ilə gəlir.

Soyuğu köhnə ilin, ey pəri, qar ilə gedir!
Quşları seyr eləyib gör nə qatar ilə gəlir!

Seyrana, seyrə çıxanlarla dolur dörd tərəfim,
Musiqi əhli kamança ilə, tar ilə gəlir.

Təzədən göz qoyuram bağibanın mən əlinə,
Mərhəba bağibana, əldə qabar ilə gəlir.

Biri ilham pərisi, digərisə yarımdır,
Dedilər şairə bir bax iki yar ilə gəlir.

Neçə Məcnunə dikilmiş neçə Leyla nəzəri,
Möhtərəm Rövşənimiz şanlı Nigar ilə gəlir.

Sən bahar aşiqisən, Şahina, əhsən, çünki,
Çiçəyin rayihəsi, ətri bahar ilə gəlir.

*12.04.2001*

✦✦✦

Göz xeyrxahları gördükcə ziyandan qorxmur,
O qədər yaxşı görübdür ki, yamandan qorxmur.

Qoca dünyanı çox ildir ki, çəkir çərx, amma
Dəmbədəm çəkdiyimiz ahü fəğandan qorxmur.



Qüssədən təngə gəlib mən nə qədər misranı
Hey bəyan eyləyirəm, qüssə bəyandan qorxmur.

Qonşumuz meyl elədi yurduma əğyar təki,
Qan tutub gözlərini öylə ki, qandan qorxmur.

Bir kamanqaş məni bənd eləyəndən sonra
Elə xoşlandı könül bir də kamandan qorxmur.

Sənə çox yanmağı, ey can, qadağan etdi könül,
Daha öyrəncəlidir can, qadağandan qorxmur.

Dilbərin zülfünü öpdüm məni zahid gördü,
Dedi: - Qorxmazdı bu Şahin ki, ilandan qorxmur.

*13.04.2001*

✦✦✦

Tutmursa yaxamdan ələmin dincliyi olmur,
Yazmırsa ələmdən qələmin dincliyi olmur.

Canana gedəndən canıma vəlvələ düşmüş,
Bir ləhzə mənim vəlvələmin dincliyi olmur.

Dərdin zili var həm bəmi, zil düşdü sədadən,
Bilməm nə səbəb var ki, bəmin dincliyi olmur?

Yer titrədi, titrətməsini kəsdi, canımda
Titrətməyə bax, zəlzələmin dincliyi olmur.

Təmkinliyə, şənlik kimi, yer yoxdu ürəkdə,
Biçarə ürək oldu əmin, dincliyi olmur.

Şəm yandı hərarətlə ki, pərvanə alışsın,
Pərvanə alışmırsa şəmin dincliyi olmur.

Mən dincliyimi şəst ilə etdim qəmə qurban,
Şahin, məni tapmırsa qəmin dincliyi olmur.

*16.04.2001*

✦✦✦

Yar əgər olmasa bir qeyri pənahım yoxdur,
Dünənim yox, bu günüm yox və sabahım yoxdur.

Lağ edirlər mənə ki, söyləmişəm eşqə matah,
Bəli, eşqim təki qiymətli matahım yoxdur.

Kiminin xəncəri vardır, kiminin qalxanı,
Var mənim həm qələmim, başqa silahım yoxdur.

Bircə Şah Ismayılım vardı ki, yoxdur çoxdan,
Şah - yardır mənə ancaq, daha şahım yoxdur.

Eşqdir təkcə tamahım, bu tamahdan qeyri
Aləmin var-yoxuna zərrə tamahım yoxdur.

Mən günəh bilmirəm eşqi, Qənisə*ərz eləyir:
"Eşqdən başqa mənim qeyri günahım yoxdur".

Diqqətim yarım olan səmtə yönəlmiş, Şahin,
Istiqamət belədir, özgə cinahım yoxdur.

*19.04.2001*



Məclisdə bu gün mən kimi məstanə də vardır,
Şərbət də süzülməkdədi, canana də vardır.

Eşq şəminə yanmaqda tərəddüd edən ey kəs,
Səndə kişilik yoxsa da, pərvanədə vardır.

Bağbanə deyin gəlsə bura nanə gətirsin,
Cənnət gülünün rayihəsi nanədə vardır.

Qoy söyləməsinlər "daha əfsanə yaranmır",
Dastan da yazılmaqdadı, əfsanə də vardır.

Hərçənd vətənpərvəri çoxdur bu diyarın,
Amma ki, təəssüf ola, biganə də vardır.

Qoy yurd şərafətlənə mərdanələr ilə,
Çünki kişilik xisləti mərdanədə vardır.

Canan dedi: - Şahin, məni sən əqlə gətirdin,
Çünki burada sən kimi divanə də vardır.

*21.07.2001*



Elə ki, əyləşirik ortaya şahmat düşür,
Sənə hər vədə uduş, Şahinəsə mat düşür.

* Həkim Qəni



Cəlb edir diqqətimi surətin, ey şux, məgər
Yada şahmatdə az həm əməliyyat düşür?

Oyunu seyr eləyənlərsə deyir "Maşallah!"
Mənə bir zərrə düşürsə sənə qat-qat düşür.

Deyirəm hər işin ustadı gərək, bənnalər
Suvağı çəkməsə yaxşı barıya çat düşür.

Kiminin fikri yönəlməkdə fəqət zər səmtə,
Kiminin yadına hər ləhzə muğamat düşür.

Kimə aləmdə gözəllik, kiməsə - kamillik,
Kimə - dünyadə qənaət, kimə - ifrat düşür.

Söyləyirlər mənə "pak eşqini isbat eylə",
Bu yetibdirsə sübutə buna isbat düşür?

Qəzəli mən ki, bu cür şövq ilə islah elədim,
Dedilər "Şahinə, əlbəttə, mükafat düşür".

*14.09.2001*



Öylə ki qırmancını hicran çəkir,
Mən çəkirəm zilləti, canan çəkir.

Göz yaşı selləndi didərginlərin,
Ermənidən zülmü müsəlman çəkir.

Indi yer altda neçə qan nəhri var,
Torpağımız gör nə qədər qan çəkir.

Çərxi-fələk köhnə dəyirmançıdır,
Yer kürəsi isə dəyirman - çəkir...

Gör neçə müddətdi əcəl şövq ilə
Ağuşə hər saniyə bir can çəkir.

Heç görəsən eyləməyirmi həzər,
Bir bu qədər töhməti dövran çəkir.

Ətrini əttar çəkir güllərin,
Zəhmətini amma ki, bağban çəkir.

Bir də "qəzəl yaz" deməyin Şahinə,
Harda tüfəngim, məni meydan çəkir.

*22.09.2001*

✦✦✦

Ciyər ahı ilən tər yandıran var,
Töküb göz yaşı Tərtər yandıran var.

Nə Fərhadsan ki, Şirindən xəbər yox,
Nə Xosrovsan ki, Şəkkər yandıran var.

Nə şairsən ki, düz yoxdur sözündə?
Zəifsə təbi dəftər yandıran var.

Adam vardır ki, mənliksizdir, amma
Uduzsa cəngi xəncər yandıran var.

Bilən çoxdurmu gül qədrin bağ içrə,
Əzən lalə, sənubər yandıran var.

Kabab istərsə, ey molla, o saqi
Odun olmazsa minbər yandıran var.

Qəzəlxan görmüşük xamdır, di gəl ki,
Diliylə Şahin, Ənvər yandıran var.

*3.10.2001*

✦✦✦

*Bu gün Amerika-Əfqanıstan müharibəsi başlandı. Bəlalı Əfqanıstan, cəfalı əfqanlar... Amma əfqan ölər, basılmaz!*

Olmuş nə bu dövranə, düzəlmir ki düzəlmir,
Düşmür işi sahmanə, düzəlmir ki düzəlmir.

Səhraləri dəryalərə möhtac qalıb da
Dönmürsə gülüstanə, düzəlmir ki düzəlmir.

Aləm düşüb əfganə bəd insan əməlindən,
Dünya bulaşıb qanə, düzəlmir ki düzəlmir.

Şəmə nə deyim mən, oduna yandığı dəmdən
Yanmaqdadı pərvanə, düzəlmir ki düzəlmir.

Məcnun kimi divanə olan kəs yenə vardır,
Düşməkdə biyabanə, düzəlmir ki düzəlmir.



Dünyayə gözün açdığı gündən elə bil ki,
Göz dəydi müsəlmanə, düzəlmir ki düzəlmir.

Dərda, yeni bir xaç yürüşü başladı kafər,
Etdi hücum əfğanə, düzəlmir ki düzəlmir.

Eylərsə də, Şahin, yeri aqillər idarə
Lənət dəli şeytanə, düzəlmir ki düzəlmir.

*7.10.2001*

✦✦✦

Sözlərində öyiə ki, sevdalı bir ahəng olur,
Istəmir çıxsın ayağım məclisindən, ləng olur.

Amma, şairlər də vardır söz yazırlar, şer yox,
Söz deyirsən sözləri haqqında qovğa, cəng olur.

Şerinə irad edirsən irada irad edir,
Dözməyirsən, etməyirsən tab, adam diltəng olur.

Əcnəbi sözdən uzağəm büsbütün, hər gün mənə
Şəhriyarın yatdığı sanki qəbirdən zəng olur.

Amma xəlqi şerimə əmma qoyanlar yox deyil,
Dinlədikcə onları, yarəb, qulağım dəng olur.

"Tənəyi-əğyarə bu eşq ilə, ey dil, tab qıl,
Nəxli-baravər, məsəldür zəxmdari-səng olur"*.

Şahinəm, mən həm qəliz yazmaq bacarram, amma ki,
Xəlqi sözdən rəng alanda söz bağım xoşrəng olur.

*29.11.2001*

✦✦✦

"Könlümün halını ol dilbəri-tənnaz bilir,
Mən özüm bilmirəm, ol sərvi-sərəfraz bilir"**.

Bilməyir ki, mən onun dərdi ilən xoşhaləm,
Mənə çox verdiyi dərdi sənəmim az bilir.

Hüsnü görsəndisə heç kim gözümə görsənmir,
Bu sevən kəs o gülün hüsnünü ecaz bilir.

---

*Beyt Hacı Əbülhəsən Racinindir.

** Beyt Hacı Əbülhəsən Racinindir.

Daima bəxş eləyir aşiqə gül xoş ovqat,
Gülü vardırsa könüllər qışı da yaz bilir.

Elə kəs var nə gözəldən, nə qəzəldən xoş olur,
Nə "Çahargah"ə bələddir, nə də "Şahnaz" bilir.

Kəs də vardır ki, nə Şahid *, nə də Samit ** tanıyır,
Salmanı*** Rəmzi**** sanır, Rəmzini Mümtaz bilir.

Bağdən qovlamışam çöllərə şahbaz quşunu,
Bu səbəbdən də hamı Şahini şahbaz bilir.

*17.12.2001*

✦✦✦

Əmri icra eyləmək başqa, sərəncam başqadır,
Eşqə əncam eyləmək başqa, hər əncam başqadır.

Müstəqim sözlər dedim hər şəxsə, eyham etmədim,
Müstəqim söz söyləmək bir başqa, eyham başqadır.

Zahid həm huri həmi qılman təmənna eyləyir,
Zahidin xülyası başqa, aşiqin tam başqadır.

Doğmayıbdır gün hələ saqi edir mey təklifi,
Mey səhər həm yaxşıdır, amma ki, axşam yaxşıdır.

Şeyxülislam Allaha şükr eyləməzsə şükr itər,
Şeyxülislamin məramı mən bilən bambaşqadır.

Ya Məhəmməd, ya Rəsulillah, din əldən gedir,
Sanki müslim başqa müslim, sanki islam başqadır.

Sən siyasətçi deyilsən, eşqdən yaz hər zaman,
Şahina, şükr etməli ilhamə, ilham başqadır.

*6.01.2002*

✦✦✦

Saqiya, məstəm, bu məst məstanədən əskikmidir?
Ey nigar, eşqim mənim dürdanədən əskikmidir?

Məhrəmik, yurdum, sənə, biganəyə meyl eyləmə,
Ey vətən, məhrəmlərin biganədən əskikmidir?

---

* Ələkbər Şahid
** Rüstəm Samit
***Salman Mümtaz
****Cəfər Rəmzi



Əqldən Məcnun uzaqdı, amma çox məşhur olub,
Biz təkin aqillərin divanədən əskikmidir?

Fərhada əfsanə yazmış bir çoxu, dastan mənə,
Dasitanım, ey pəri, əfsanədən əskikmidir?

Hüsnünün şəmində çox pərvanə odlandırmısan,
Sevgilim, Şahin məgər pərvanədən əskikmidir?

*29.01.2002*

✦✦✦

Nə qədər ki, fələyin çərxi çəkir, gərdişi var,
Aşiqin, bəlli ki, qəbr içrə də min təşvişi var.

Qoca dünyadı bu dünya, hələ çox ömr edəcək,
Salacaqdır hələ çox nəsli yola, vərdişi var.

Aqili, cahili var, fazili var minlərlə,
Şeyxi var, zahidi var, mollası var, dərvişi var.

Nə qədər dövrü olub, dövrün isə dövranı,
Hər keşakeşli dövrdə kişi var, nakişi var.

Hər nə vardırsa o tənzim olunur, ey Şahin,
Hər tükün öz işi var başda, başın öz işi var.

*8.05.2002*

✦✦✦

Qar əriyibdir bütün... Gərçi bahar ətri var,
Bitsə də qar mövsümü, var, yenə qar ətri var.

Ayrılığa bənd olub hicrə yaman dözmüşəm,
Orda kədər zilləti, dərdü qübar ətri var.

Mən daha bundan belə ölkəmi tərk etmərəm,
Özgə yerin özgə el, özgə diyar ətri var.

Yazdı, kamandan bu gün "Şur" ətir yaymada,
Qoxlayıram, tardə "Bəstənigar" ətri var.

Dağda nəsim dillənir, bağ yenə bülbüllənir,
Vəsl ağacı güllənir, tazə nübar ətri var.

Söyləməyin Şahinə "pəncərəni aç" daha,
Pəncərəni açmıram, evdə nigar ətri var.

*12.05.2002*



Aşiqə, dilbər, xitabın gah yaxşı, gah pis,
Dillənir sevda rübabın gah yaxşı, gah pis.

Inqilab icad edirsən, ey fələk, hər əsrdə,
Olmasın kaş inqilabın gah yaxşı, gah pis.

Iztirabından həmişə pisləşibdir halətim,
Olmamışdır iztirabın gah yaxşı, gah pis.

Böylə olsa, bir də mən meyxanəyə üz tutmaram,
Saqiya, neyçün şərabın gah yaxşı, gah pis?

Mən gərək heç bir günahə verməyim yol bir daha,
Ücrəti olmaz savabın gah yaxşı, gah pis.

Qolların gücdən düşübdür, gözlərinsə nurdən,
Can nənəm, heyfa, qutabın gah yaxşı, gah pis.

Ey mühasib, et hesab hərdən mənim sən yarəmi,
Ol dəqiq ki, haqq-hesabın gah yaxşı, gah pis.

Intizarından vüsalın qorxmayıb hicranə döz,
Sevgilim, cism içrə tabın gah yaxşı, gah pis.

Hər kitabın kaş olaydı yazdığın "Divan" kimi,
Olmasın, Şahin, kitabın gah yaxşı, gah pis.

*1.05.1996*



Əl qələmə, dəftərə eylər həvəs,
Dil təzədən dilbərə eylər həvəs.

Əğyarı görcək, başına vurmağa
Aşiq əli qənbərə eylər həvəs.

Qədrini billəm gözəlin zər kimi,
Bəllidi zərgər zərə eylər həvəs.

Yonmadayam Şirinimin büstünü,
Mən kimi kim mərmərə eylər həvəs?

Gəlsə də hey xatirə Kabul çayı,
Qəlb Araza, Tərtərə eylər həvəs.



Göydə gözün tək elə ki parlayır,
Göz gecələr ülkərə eylər həvəs.

Şairimiz çoxsa da, xəlqim mənim
Mirzə Əli Əkbərə eylər həvəs.

Mən daha şahin deyiləm! El dedi:
- Tuti olub, şəkkərə eylər həvəs.

*8.05.1996*



Munisinə etibarın gah yaxşı, gah pis,
Hökmdarımsan, qərarın gah yaxşı, gah pis.

Eyləyirsən iftixar gəh vəsl ilə, gəh hicr ilə,
Iftixarım, iftixarın gah yaxşı, gah pis.

Intizarınla sənin şerin sayı artmaqdadır,
Dilbərimsən, intizarın gah yaxşı, gah pis.

Gahi şadəm, gahi qəmli, gahi asi, gəh həlim,
Ey mənim yarım, bu yarın gah yaxşı, gah pis.

Gahi bənd oldum gülabə, gahi bənd oldum meyə,
Bəndəsi Pərvərdigarın gah yaxşı, gah pis.

Gəh məni saqi xumar etməkdədir, gahi şərab,
Xisləti vardır xumarın - gah yaxşı, gah pis.

Şahina, hər bir şeyin pis-yaxşısı məlumsa da,
Olmayıb, olmaz nigarın gah yaxşı, gah pis.

*21.12.1996*



Zərgərin qəlbi gülər olsa əgər zər xalis,
Yazdığım hər qəzəlim gövhərü cövhər xalis.

Xəlqilik anlayışı könlümə yardır yar tək,
Bu qəzəl sahibinin seçdiyi sözlər - xalis.

Sözümü, şerimi haqsız yerə tənqid edənin
Sözü başdan-başa böhtandı mənə, şər xalis.

Mən təbii adamam, düşməniyəm süniliyin,
Gülşənimdə özümün lalə, sənubər xalis.

Süni mərmər də düzəldənlərimiz var, amma
Hələ gizlində qalıbdır neçə mərmər xalis.

Hər təmiz, saf qəzəlim xislətimə uyğundur,
Belə xalis ola bılməz, gözəlim, hər xalis.

Qəzəl uğrunda müdam tər tökürəm, çimməliyəm,
Hanı Tərtər ki, olubdur bədənim tər xalis.

Deməsinlər mənə Sabir də qəliz... Dövrə görə
Söyləyibdir sözünü Mirzə Ələkbər xalis.

Saf yazanlar gələcək gün gələcəklər qəzələ,
Zabitin vay halına olmasa əsgər xalis.

Sən muğamat oxuduqca həvəsim tazələnir,
Dediyin şərqilərin hər biri "Şüştər" xalis.

Bu təmiz şeri eşitdikdə yarım söylədi ki,
Şahinim canlı kitabdır, sinədəftər xalis!

*24.01.1997*



Sənə daş yağmada hər gün, a vətən, daş məyus,
Tuta bilmirsə yağan daşı vətəndaş məyus.

Neçə ildir bizi məyus eləyiblər yersiz,
Ola düşmənlərimiz biz təki, eykaş, məyus.

Ola bilməz mənə qəm çəkmədə heç kəs həmtay,
Hamı məyus və pərişan, mən isə Baş Məyus.

Çox təəssüf ki, mənim dərdimi çox kəs bilmir,
Kim olubdursa bu günlər mənə sirdaş - məyus.

Görəsən çox çəkəcəkdirmi bu qırğın, Yarəb?
Qanına qərq görüb yoldaşı yoldaş məyus.

Şahina, heyf, yaşım əsgəri yaşdan keçmiş,
Mən xəcalətli, ömür səksəkəli, yaş məyus.

*20.03.2001*



*Füzulişünas Ramiz Fasehə*

Dünya da zərurət, xilqət də zərurət,
Onlar arasında ülfət də zərurət.

"Qürbət" deyə bir gün mən Təbrizə getdim,
Qürbət vətən olsa, qürbət də zərurət.

Imkan ilə fürsət hərgah ələ düşsə,
Imkan da zərurət, fürsət də zərurət.

Qüvvətli olurlar qüdrətli adamlar,
Qüdrət də zərurət, qüvvət də zərurət.

Sərvətlisə dövlət hər hökmü rəvandır,
Dövlət də zərurət, sərvət də zərurət.

Bir yerdə iqamət təhlükəsi varsa,
Istərsə Məhəmməd hicrət də zərurət.

Ey yar, səmimi olmaqsa muradın
Istək də zərurət, niyyət də zərurət.

Tale üzə gülsə, qismət mənə - vəslin,
Tale də zərurət, qismət də zərurət.

Hər dosta məhəbbət olmuşsa zəruri,
Hər düşmənə qarşı nifrət də zərurət.

Eyham ilə qiybət... Əsla deməirəm ki,
Eyham da zərurət, qiybət də zərurət.

Şerimdəki sözlər şərbət kimi şirin,
Dildar şirinsə şərbət də zərurət.

Şahin, sənə örnək surətdəki mənə,
Mənə da zərurət, surət də zərurət.

*23.11.1995*



Bir şəxsə ki, dünyadə əzab olmadı qismət,
Həzz oldusa da qisməti, tab olmadı qismət.

Gəldim o gülün bağçasına, vermədilər yol,
Bax bəxtimə, gülşəndə gülab olmadı qismət.

Tərk etdi məni yar deyib "varmı məhəbbət",
Hərçənd sual etdi, cavab olmadı qismət.

Nuş eyləmək istər dodağım mey dodağından,
Mey bir yana qalsın ki, şərab olmadı qismət.

Eyvah, səvab əhli günah etməyə bilmir,
Əfsus, günəhkarə səvab olmadı qismət.

Ləzzətli qutabın, nənəcan, yadimə düşdü,
Heç vədə mənə öylə qutab olmadı qismət.

Var öylə adam ki, bala dönməkdə doşabı,
Amma eləsi var ki, doşab olmadı qismət.

Bilmək dilədim mən sayını şerimin, amma
Çoxdur sanı ulduzca, hesab olmadı qismət.

Şükr eylə, a Şahin, hələlik on kitabın var,
Var öylə qəzəlxan ki, kitab olmadı qismət.

*19.12.1995*



Yar vursa əgər yarə yara yarə nə hacət?
Qəmxarım əgər qəm verə, qəmxarə nə hacət?

Bir mətləbi illər boyu təkrar eləyən var,
Bir mətləbi illər boyu təkrarə nə hacət?

Bica yerə idrakına şübhəylə baxanlar
Mənsurı çəkirlər təzədən darə, nə hacət?

Yarəb, sənə, əlbət ki, təmənnadı bu ərzim:
Xəlq eylə savabkarı, günəhkarə nə hacət?

Qış vaxtı əgər yağsa idi yaxşı olardı,
Yay vaxtı çaşıb yağsa əgər qarə nə hacət?

Rahətliyi var eyləyə bilməzsə əgər var,
Yoxluq daha üstündü, könül, varə nə hacət?

Tərifinə çıxmır daha bir kəlmə dilimdən,
Lal eyləyəcəksə dili, dildarə nə hacət?

Memar idi guya... Elə bərbad eləyib ki,
Qəlb içrə, a Şahin, daha memarə nə hacət?

*8.01.1997*



Demirəm mən neçə gündür "məni, ey yar, eşit",
Deyirəm dərdimi divarə "a divar, eşit".

Allahım, yaxşı bilirsən ki, giley xoşlamıram,
Bir cəfakarın əlindən gileyim var, eşit.



Bəlkə bəxt ulduzumu sən təzədən yandırasan?
Bu həzin halıma bəxtimdi səbəbkar, eşit.

Taleyimdir gözümü göz görə giryan eləyən,
Çox təmənna edirəm, etmə məni zar, eşit.

Naləsi ərşə çıxır zərrə qədər qəm çəkənin,
Qəm yüküm amma mənim bir neçə xalvar, eşit.

Bitəcək-bitməyəcəkdirmi mənim israrım?
Gəl eşit ki, daha mən etməyim israr, eşit.

Qar yağıbdır başına Şahinin, amma ərimir,
Başqa baş yoxmu ağartmaq üçün, ey qar, eşit!

*22.09.1997*



Aqillə görüşdükdə dünyadən olur söhbət,
Məcnun iləsə yalnız Leyladən olur söhbət.

Cəng əhli olanlarla ünsiyyətimiz varsa,
Günlərlə, saatlarla qovğadən olur söhbət.

Qiymət bahalaşdıqca artır güzəransızlıq,
Molla ilə çox vədə halvadən olur söhbət.

Hər kəs yatağandırsa "röya" sözünün canı!
Zahidlərə baş qoşma, xülyadən olur söhbət.

Irfanü təsəvvüfdən söhbətlərə baş vursaq,
Surətdən olur söhbət, mənadən olur söhbət.

Bunlarda təəccüb yox, bihudə deyildir ki,
Şahinləsə günlərlə misradən olur söhbət.

*20.01.1998*



*Quba şairləri Cabir Albantürkə və Namiq Qırxlara!*

Yox məndə əzəldən dürə, dürdanəyə diqqət,
Daim edirəm amma ki, cananəyə diqqət.

Gördüm ki, mənim əqlimi bir zərrə edibdir,
Bir zərrə də yoxdur daha meyxanəyə diqqət.

Yoxdur buna şəkk qəlb evi abad olacaqdır,
Memar eləsə bir də o viranəyə diqqət.

Gəh qoxlayıram nanəni, gəh zülfünü bağda,
Var məndə əzəldən, gözəlim, nanəyə diqqət.

Biganə baxanlar dilinə doğma deyillər,
Sanki edirəm bir neçə biganəyə diqqət.

Yad sözləri atdım süpürüb mən qəzəlimdən,
Vardır "darağ"ım, eyləmirəm "şanə"yə diqqət.

Bülbül elə bülbüldü, neçin "əndəlib" olsun?
Vardırsa "yuva" dildə, neçin "lanə"yə diqqət?

Mərdanə girib meydana cövlan edirəm mən,
Vardırmı edən mən kimi mərdanəyə diqqət?

Pərvanə kimi yanmada cahilsə həsəddən,
Şəm eyləməyir yaxdığı pərvanəyə diqqət.

Sevdayə düşəndən bəri divanədi Şahin,
Eyvah, görünmür niyə divanəyə diqqət?

*23.02.1998*

✦✦✦

Bu əzabkeş, gözəlim, həmdəmin olmuş bir vaxt,
İndi qəm çəkmədədir, xürrəmin olmuş bir vaxt.

Razı ol qəmlərinin mən yenə sərməsti olum,
Mənə həmdəm gecə-gündüz qəmin olmuş bir vaxt.

Çox sınıq qəlbə dəva etmiş idi kəlmələrim,
Sözlərim var ki, sənin məlhəmin olmuş bir vaxt.

Səni Tanrı, məni sən əfv eləsən xoşbəxtəm,
Ürəyim əfvimiz üçün əmin olmuş bir vaxt.

Mənzilimdən bağa həm düşməyirəm günlərlə,
Göz yaşım, lalə, sənin şəbnəmin olmuş bir vaxt.

Haqqımız var hamımız cənnətə getsək, Şahin,
Çünki cənnət atamız Adəmin olmuş bir vaxt.

*8.10.1998*



✦✦✦

Donduq daha, ey Tanrı, yağış, qar kifayət,
Rəhm eylə, kərəm qıl, acı rüzgar kifayət.

Aqillərini var elə aləmdə, İlahi,
Cahil ilə, qafil ilə, əğyar kifayət.

Yüz memar ola könlümü abad edə bilməz,
Əlbət, mənə yarım kimi memar kifayət.

Eşq badəsini mən görürəm badə görəndə,
İrfanı sevək, badəni inkar kifayət.

Tarçı, məni yandırma, bu cür çalma yanıqlı,
Tar etdi məni dərdə giriftar, kifayət.

Bağban, nə qədər gülqıranı bağə buraxdın,
Gül zar olacaqdır, daha gülzar kifayət.

Dünya aramızda əgər, ey şeyx, bölünsə,
Dünyanı götür, Şahinəsə yar kifayət.

*10.07.1999*

✦✦✦

*Muğamatın mahir bilicisi və ifaçısı Əkrəm Məmmədova*

Haqq ecazıdı, ləldi, gövhərdi muğamat,
Zərgərdisə xanəndə əgər zərdi muğamat.

Cənnət bağının çeşməsi tək etdi təcəssüm,
Zəmzəm suyunun əksidi, Kövsərdi muğamat.

"Rast" ilə, "Rahab" ilə, "Segah" ilə "Nəva"dır,
"Şur" ilə "Çahargah"dı, "Şüştər"di muğamat.

Olmuşsa da hərdən ona çox həmlə qəzəblə,
Hər mərəkədən çıxdı, müzəffərdi muğamat.

Əks oldu muğamatdə Şahdağ vüqarı,
Kürdür və Arazdır bizə, Tərtərdi muğamat.

Aşiqlərə xas duyğu edib onda təzahür,
Ovqatı pərişan neçə dilbərdi muğamat.

Dünya təzələnmişsə də, köhnəlməsi yoxdur
Dövr etsə də dövran təzədi, tərdi muğamat.

Avazı gələn dəmdə şəkər düşdü gözümdən,
Avazə dönən şirnidi, şəkkərdi muğamat.

Zülmətdə işıqdır və ziyadır gözə, Şahin,
Quran nuru var onda, münəvvərdi muğamat!

*1.10.2001*

✦✦✦

*Məşhur xanəndə Canəli Əkbərova!*

Qəm varsa əgər, qəlbdə qəmxarı - muğamat,
Sevda evimin var əzəli yarı - muğamat.

"Rast" ilə "Segah" ilə "Qatar" var deyilmi?
Varsız deyilik, xəlqimizin varı muğamat.

Biganə deyildir hələ avazına kimsə,
Biganəliyin bəlkə də inkarı - muğamat.

Qəlbin gözü heç bir şeyi tutmur daha öylə,
Lap körpəliyimdən onun ilqarı muğamat.

Xandır ki, muğamatə əta eylədi şöhrət,
Məşhur elədi Zülfünü, Cabbarı muğamat.

Şadəm ki, muğamatıma "əhsən" dedi ellər,
Nikbinliyimin ümdə səbəbkarı - muğamat.

Şahin, səsi tarın yenə məstanə ucaldı,
Bildim ki, yenə məst elədi tarı muğamat.

*18.01.2002*

✦✦✦

Sevdin məni, sevdim səni, dildar, nə oldu?
Olmuş bu sual ilə bu dil zar, nə oldu?

Peyman eləmişdin mənə sən əhd ilə birgə,
Ilqar eləmişdin mənə, ilqar nə oldu?

Artardı görüş meyli bu aşiqlə dəmadəm,
Israr eləyirdin buna, israr nə oldu?



Rəftarın ilə sən məni ovsunlamış idin,
Bəs səndə olan pakizə rəftar nə oldu?

Qəlbində sənin guya məhəbbət varı vardı,
Qəlb içrə məhəbbət dediyin var nə oldu?

"Vardırmı gözəllərdə vəfa?" sorğusu vaxtı
Mən "yoxdu" deyərdim, sən isə "var", nə oldu?

Şahin ki bu gün sevgini inkar eləyibdir,
Yarım, hanı inkarımı inkar, nə oldu?

*17.02.1996*

✦✦✦

Etiraz eyləyərək vəslə dedin nazdır bu,
Gözəlim, naz deyildir bu, etirazdır bu.

Busə etsən sən əgər aşiqini hər ləhzə,
Yenə də söyləyərəm mən çox elə, azdır bu.

Ağladım mən o qədər dözməyərək hicranə,
Göz deyildir dedilər, Kürdü bu, Arazdır bu.

Hər dərinlik məni qane eləmir, Allahım,
Girib ümmanə dedim çay kimi dayazdır bu.

Təqdim etməkdədi aşiq təki əğyar özünü,
Söylədim xəlqə bu aşiqmi, anlamazdır bu!

Baxdı eyham ilə bir naşı saza, dad elədim:
- Etinasız belə gəl baxma buna, sazdır bu.

"Nəş'ə"ni "nə'şə" ilə eyni sananlar vardır,
Nəşələndim, dedilər bəlkə nəşəbazdır bu?

Şahin eylər o qədər səcdə bu cananəyə ki,
Bixəbərlər elə zənn eyləyir namazdır bu.

*16.09.1996*

✦✦✦

Gir şer gülşəninə gör necə rəngindir bu,
Söyləyirlər ki, sənubərdi bu, nəsrindir bu.

Bu əsr şerimi əsdirdi, bulanlıq durulur...
Yeni "Divan" yazılıbdır, yenə mümkündür bu!

Duvağ altında qalan dilbərə bənzərdi qəzəl,
Yaşayır indi əruz həm, bizə təskindir bu.

Tutmuşam mən ətəyindən, əli kəs, ya ətəyi,
Gəh ətəkdir yeri, gəh zirvədə sakindir bu.

Xalça üstündəki təsvir məgər canə gələr?*
Var xurafat ilə cəngim ki, məgər dindir bu?

Bu nə şairdi yazır saf bu qədər? Söylədilər:
- Qeyriyə bənzəri yox bir gilə, Şahindir bu!

*30.03.1997*

✦✦✦

Ömrüm boyu hərçənd mənə ah yar oldu,
Hərdən də fərəh qəlbimə gah-gah yar oldu.

Məcnun ilə yol qət elədim Leyli çölündə,
Həmrahlərim! Həmraha həmrah yar oldu.

Fərhad başın yardı, Şirin Xosrova çatdı,
Bədəbəxtliyə bax, kim kimə, eyvah, yar oldu.

Bir kimsəyə bildirməmişəm sirrimi, amma
Hər dərdimə, hər qüssəmə agah yar oldu.

Cərrah yarıb köksümü tək yarımı gördü,
Bir başqa adam görmədi cərrah, yar oldu.

Eşq aləminin yar - şahı, mənsə - qulamı,
Xoşbəxt o adamdır ki, ona şah yar oldu.

Çox niyyətə, çox məqsədə yetdim bu həyatda,
Allahsevənəm, Şahinə Allah yar oldu.

*5.05.1997*

✦✦✦

Cəhdə bax, istəyirəm mən çıxa səhradən su,
Susuzam, içmirəm amma daha dəryadən su.

Bir müəmmadı, neçin mən qəzəli saf yazıram,
Yandırar, umma qətiyyən bu müəmmadən su.

---

* Guya silahsız mömin bir müsəlman öz otağında ikən ona bir neçə silahsız adam hücuma keçir. Həmin şəxsin tikə-tikə doğranmaq ehtimalı varmış. Amma, birdən-birə möcüzə baş verir. Xalça üzərində təsvir edilən şir cana gəlir, xalçadan yerə düşür, hücuma keçənləri məhv edir, sonra isə yenidən həmən təsvirə çevrilir və xalçada öz əvvəlki yerini tutur. Xurafat!!!



Mən ki, hər şerimin üstdə bu qədər tər tökürəm,
Axacaq sıxsan əgər çay kimi misradən su.

Qovğanı başlasa hər kəs araya qan düşəcək,
Gözləyər kim axı başlandısa qovğadən su?

Istədim vəslini, od tutdu təmənna, yandı,
Gözəlim, ummadayam mən bu təmənnadən su.

Aşiqin adəti göz yaşları tökməkdi yerə,
Tükənər ağlamasaq, bəlli ki, dünyadən su.

Yanıram eşqin üçün, ey pəri, Şahin deyiləm,
Adəməm, istəyirəm sən kimi Həvvadən su.

*1.02.1998*

✦✦✦

Vəslini yarın edirəm arizu,
Tək o nigarın edirəm arizu.

Şaqi xumar eylədi meysiz məni,
Öylə xumarın edirəm arizu.

Şur ilə ötməkdə ömür, xəlqimin
"Şur"ü "Qatar"ın edirəm arizu.

Avazını özgə rübabın deyil,
Saz ilə tarın edirəm arizu.

Mənəvi vardır mənə yar sevgisi.
Gör necə varın edirəm arizu.

Getdi qışı ömrümüzün, ey fələk,
Bir də baharın edirəm arizu.

Şahina, Yer kürrəmizin daima
Odlu Diyarın edirəm arizu.

*20.07.1998*

✦✦✦

Dil yenə dildarı edir arizu,
Yar təzədən yarı edir arizu.

Üzmədədir bülbülü altun qəfəs,
Şövq ilə gülzarı edir arizu.

Bir gözəlin gözləri səhra gəzir,
Başqası memarı edir arizu.

Bir sənəmə eşqi bəzəkdir fəqət,
Qeyrisi mirvarı edir arizu.

Vadi kimi boşluğu var qəlbimin,
Əhd ilə ilqarı edir arizu.

Açmayınız kəndiri Həllacdən,
Boynu onun darı edir arizu.

Gülməyəcəkdirsə vüsalım mənim
Könlüm evi zarı edir arizu.

Şahinə şəkkər daha lazım deyil,
İndi zəhrmarı edir arizu.

*15.09.1998*



Həmdəm mənə, ey can, qəhər oldu, qəhər oldu,
Neynim, yenə mehman kədər oldu, kədər oldu.

Yarım, hara getdin məni təkliklə qoyub tək?
Əfsus, ümidim hədər oldu, hədər oldu.

Halım, düşünürdüm günü-gündən olacaq xoş,
Halım günü-gündən betər oldu, betər oldu.

Şirin günü dünya nə səbəbdən acı etdi?
Şərbət ki verirdi, zəhər oldu, zəhər oldu.

Hicranı vüsal böylə təsəvvür eləmirdi,
Hicran isə vəslə çəpər oldu, çəpər oldu.

Çatdır mənə dərhal özünü, harda qalıbsan?
Sənsiz mənə, ey gül, zərər oldu, zərər oldu.

Şahin düşünürdü bu gecə bitməyəcəkdir,
Gün çıxdı nəhayət, səhər oldu, səhər oldu.

*26.11.1998*



Leylimin gözləri aydın, əməyim zay oldu,
Bu qəzəl sahibi Qeys olmadı, rüsvay oldu.



Şad edəydi gününü Qeys gərək vəslə yetib,
Havayı yerdə onun günləri ah-vay oldu.

Ən fəxarətli işarəmdi nida, ey dilbər,
Qəddimə bax ki, qəmindən əyilib yay oldu.

İstədim dərviş olum, əksi bunun baş verdi:
Başlayıb yazmağa dərviş mənə həmtay oldu.

Eşidərlər bu yaxınlarda ki, "Şahin çayı" var,
O qədər çağladı göz yaşı dönüb çay oldu.

Məni Aşiqbaşı etdi yığışıb eşq əhli,
Bilməyirsizmi bu günlərdə qurultay oldu?

Oxatan əyri atıb ox xəcil oldu, Şahin,
Hər qəzəlxan ki, əruz bilmədi rüsvay oldu.

*18.09.1999*



Gəl Qubaya, ey pəri, dövrələyib bağ onu,
Cazibədar eyləyib gör necə Şahdağ onu.

Xan Fətəli sağ idi, günləri parlağ idi,
Eyləyə Pərvərdigar qoy yenə parlağ onu.

Mənəvi qaynağ ilə biz elə bağlanmışıq,
Mümkün olan iş deyil məndən ayırmaq onu.

Eyləyirik arizu şöhrəti bərpa ola,
Biz yenə əvvəlki tək görməliyik çağ onu.

Torpağa bel bağlayan şəxsi firavan görək,
Qoy üzüağ eyləsin daima torpaq onu.

Kimsə olarsa əgər eşq yolunda şəhid,
Zənn eləyin ölməyib, zənn eləyin sağ onu.

Dərvişə bax, bir yaşıl yarpağı bəxşiş verir,
Şahinə, zəngin edib bir dənə yarpaq onu.

*Quba, 9.04.2000*



Mən tutandan bəri ilham ilə misra yolunu,
Surətində görürəm, ey pəri, məna yolunu,

Keçdilər çoxları sevda yolunu izzətlə,
Başa çatdırmalıyam mən dəxi sevda yolunu.

Hər xeyirxahə xeyirxah adam oldum daim,
Şairəm, seçməmişəm cəng ilə qovğa yolunu.

Atıb əl-qol yoluma çıxmada bəzən əğyar,
Ya qolun kəsməliyəm mən o kəsin ya yolunu.

Qorxmuram, Əlbabayam, zərrə də qırx quldurdan,
Sindibadəm, keçirəm şövq ilə dərya yolunu.

Qorxusuz qoy ola durna yolu - qansız, qadasız...
Asiman, gözləyirəm daima durna yolunu.

Neçə gündür yuxu gəlmir gözümə, ey Şahin,
Gözümün kim qapayıbdır yenə röya yolunu?

*17.01.2001*



Hicranı gətirmə dilə, ey yar, olan-oldu,
Bundan belə ol vəslə tələbkar, olan-oldu.

Quldur sayağı kəsdi mənim qarşımı sərhəd,
Zülm eylədi illərlə o qəddar, olan-oldu.

Əfqan udu əfğanə gəlib inlədi, indi
Oynaq havalar çalmalıdır tar, olan-oldu.

Aşiq nə qədər ney kimi fəryad edəcəkdir?
Nikbinlik ola qoy ona meyar, olan-oldu.

Köksümdə kaman oldu ürək, xisləti - nalə,
Bəsdir ki, kaman öylə sızıldar, olan-oldu.

Çox çəkdi sənin xiffətini Şahdağı yurdun,
Çox çəkdi mənim dərdimi Qoşqar, olan-oldu.

Israr eləmə bir daha söyməkdə fərağı,
Bəsdir, gözəlim, eyləmə israr, olan-oldu.



Şahinliyi Şahin deyəsən tərk eləyibdir,
Tuti kimi eylər elə təkrar "olan-oldu".

*3.04.2001*



Səni görcək, elə ki, qəlbimə sevda doldu,
Gül vücudinlə sənin hər gecə röya doldu.

Eşq dərsində cavanlıqda çox inşa yazdım,
Sənin isminlə fəqət, ey pəri, inşa doldu.

Elə təşbih elədim ki, sayı ulduzdan çox,
Hüsnünün vəsfi ilən gör neçə misra doldu.

Elə şirindi vüsalın mənə, yarım, təzədən
Şairin sözlərinə qənd ilə xurma doldu.

Sanma xurma ilə, qənd ilə kifayətləndim,
Sözə şəkkərdən əlavə hələ həlva doldu.

Məni qərq eylədi töhmət seli tənha görcək,
Kükrədi, daşdı dəniz, sahilə dalğa doldu.

Söyləyən var ki, "dolub badə gözüm yaşıyla...",
O qədər ağlamışam mən neçə dərya doldu.

Elə qışqırmasın əğyar, qulağı cırılar,
Nalədən yerdə qulaq, göydə Sürəyya doldu.

Şahina, heç birini Məcnuna bənzətmədilər,
Bir yığın Qeys ilə hərçənd ki səhra doldu.

*7.04.2001*



Bu dəva bir sınaq imiş, bu dəva imtahan oldu,
Adamlarda yaman-yaxşı əlamətlər əyan oldu.

Sanırdım saqi həmdəmdir mənə, meyxanəçi munis,
Nə həmdəm halıma yandı, nə munis mehriban oldu.

Bu saət çox kəsin fikri vətən dərdiylə məşğuldur,
Ümidlər naümidləşdi, gümanlar nagüman oldu.

Sədaqətlərdə düzlük yox, həqiqətlərdə gerçəklik,
Sədaqətlər xəyal imiş, həqiqətlər yalan oldu.

Sənin yurdun, mənim yurdum, onun yurdu dağılmaqda,
Sənin yurdun, mənim yurdum, onun yurdu talan oldu.

Yatıb röyadə gördüm ki, ovulmuş düşmənin burnu,
Bu Od yurdunda hər bəndə mənim tək qəhrəman oldu.

Ayıldım uyqudan gördüm ki, qaçqınlar fəğan eylər,
Yatırkən çəkdiyim ləzzət dönüb ahü fəğan oldu.

Nə saqi mey verir, Şahin, nə canana verir busə,
Mənim çərxim neçin döndü, neçin halım yaman oldu.

*14.07.2001*



Canan elə ki, getdi gözümdən uzaq oldu,
Sərrast deyim bitdi, sözümdən uzaq oldu.

Güc-qüvvəni yar naminə can hifz eləyirmiş...
Güc-qüvvə qolumdan və dizimdən uzaq oldu.

Hər dəm sevinərdim o gülü seyr elədikcə,
Hətta o təbəssüm də üzümdən uzaq oldu.

Şəksiz ki, nigarımda da yoxdur daha şənlik,
Eyvah, sevinc aybənizimdən uzaq oldu.

Birlikdə girərdik dənizin qoynuna hərdən,
Canan izi sahildə izimdən uzaq oldu.

Artır Xəzərin şorluğu, yar çimmir azalsın,
Şahin, o şirinlik dənizimdən uzaq oldu.

*25.08.2001*



Görəsən millətə üz verdi haçandan qorxu?
Həmlə etməz canavar olsa çobandan qorxu.

Necə dəhşətli zaman oldu zamanım, Yarəb,
Son zamanlar duyuram mən bu zamandan qorxu.

Neçə alim eləyib kəşf silahın getdi,
Gedənin qorxusu yox, var qalandan qorxu.

Nə yamandır ki, yaman çoxdu yaman insanlar,
Çəkirik biz necə, eyvah, yamandan qorxu.



Qopacaqmı görəsən yer kürəsindən təşviş?
Nə zaman yan olacaqdır bu cahandan qorxu?

Ey qəzəlxan, yaman qorxu düşübdür canına,
Eşqi vəsf eylə ki, çıxsın yenə candan qorxu.

Tökəcək qanımı kipriklə qaşın, cananım,
Var o yandan mənə təhlükə, bu yandan qorxu.

Öpərəm zülfün ilan olsa belə, Şahində
Gözəlim, zərrə qədər yoxdur ilandan qorxu.

*20.09.2001*



Saldım gözünü yadə, qətran gecə ağ oldu,
Yetdin o sayaq dadə zülmətdə çıraq oldu.

Kafər sıradan çıxdı, xəncər yaradan çıxdı,
Hicran aradan çıxdı, vəsl isə qonaq oldu.

Ömrüm şəkərə döndü, hər ləhzə zərə döndü,
Qollar kəmərə döndü, əl zülfə daraq oldu.

Mən bəndəyə əhsən ki!.. Ey şah, fərəhsən ki!..
Qəmxarıma əhsən ki, qəm məndən uzaq oldu.

Vəsl aləminə vardım hicran ilə qurtardım,
Allah elədi yardım can canə calaq oldu.

Gər yarı nəzər salmaz aşiqdə ürək qalmaz,
Şahin daha tək qalmaz, eşq eşqə dayaq oldu.

*6.02.2002*



Zəhmət də tamam oldu, hasil də göründü,
Ömrün gəmisi artıq sahildə göründü.

Hərdən bu qəzəlxan kəs Tehranı da gəzdi,
Istambula baş vurdu, Kabildə göründü.

Zənn etmə günüm keçmiş hər vədə sığallı,
Nakamlığı da oldu, nail də göründü.

Gah eşqə könül verdi, gah elmə girişdi,
Divanə də görsəndi, aqil də göründü.

Çox keçdi sınaqlardan, aldı neçə qiymət,
Cahil də gözə dəydi, qabil də göründü.

Yetdim nə qədər vəslə, hicranı da gördüm,
Tez-tez bu cəfakeşdə nisgil də göründü.

Naqilsə - həyat eşqim, olmazsa - yoxam mən,
Qüvvəm cərəyan oldu, naqildə göründü.

Bülbüllərimiz varkən söz gülşəni içrə,
Şahin də əyan oldu, Mail də göründü.

*12.10.1995*

✦✦✦

Səni görcək neçə cananə gözümdən düşdü,
Söz dedin dürr kimi - dürdanə gözümdən düşdü.

Zülfünün ətrini, ey gül, verə bilməz nanə,
Qoxladım saçlarını nanə gözümdən düşdü.

Qarabağdan neçə biganəyə torpaq verdim,
Bir də düşməz yada biganə, gözümdən düşdü.

Elədim düşməni düzgünlüyə dəvət, qaçdı,
Mərd tək gəlmədi meydanə, gözümdən düşdü.

Mən ki, cananımı Leyla, məni Məcnun gördüm,
"Leyli-Məcnun" kimi əfsanə gözümdən düşdü.

Öyrənib yanmağı pərvanələr aşiqlərdən,
Hansı aşiq ki, qıyır canə, gözümdən düşdü.

Şahina, qisməti pərvanələrin yanmaqdır,
Yanmayan atəşə pərvanə gözümdən düşdü.

*21.10.1995*

✦✦✦

Baxaraq mən tərəfə öylə ki, dilbər güldü,
Sanki şirin dodağı "gəl" dedi, şəkkər güldü.

Bu gülü çox sevirəm qeyrilərindən, çünki
Eşq bağında bitən rayihəli, tər güldü.

Şirinin şəklini Fərhad kimi yonmaq dilədim,
"Şirinin şəkli yonulmuş" dedi, mərmər güldü.



Var qəzəlxan ki, bu gün bəhsə giribdir mənlə,
Qətrədir, qətrəyə, əlbəttə ki, Tərtər güldü.

Axı, şair ilə şairdə təvafüt vardır,
Zər deyən öz misinə misgərə zərgər güldü.

"Həzrəti-cəlli-əla eylədi icad qələm"*,
Bu qəliz cümləyə eyham ilə dəftər güldü.

Şərqşünasıq, yazarıq öylə, fələk baş açmaz,
Elə şairlərə Şahin kimi Ənvər** güldü.

*2.11.1995*

✦✦✦

Mənsur asılıb həzzi əgər dardə gördü,
Aşiqsə könül həzzini dildardə gördü.

Vardırsa da, çoxdan bəri yoxdur nəzərimdə
Kim ki, özünün varlığını vardə gördü.

Bülbül gözə görsənmədi, gözlər kor olaydı,
Bayquşları ol vəqt ki gülzardə gördü.

"Gəl, gəl yanıma bir də" dedim, nazla dedin "yox",
Aşiq, gözəlim, təsdiqi inkardə gördü.

Üzlər gözünün qarəliyindənmi qaraldı?
Gözlər üzünün ağlığını qardə gördü.

Almışsa da hərdən yara gər yarın əliylə,
Əlbəttə, yenə çarəni yar yardə gördü.

Lütf eylədi, öldürdü nəhayət məni... Şahin
Axır ki, vəfanı o cəfakardə gördü.

*21.01.1997*

✦✦✦

Mən yanmaram atəşlərə biganədən ötrü,
Yanmaqda canım şam təki, mərdanədən ötrü.

---

* Misra Əbdülxaliq Cənnətinindir ("Deyilən söz yadigardır" kitabı. Bakı. 1981. səh.53).

** Şair Ənvər Nəzərli

Olmuşmu günəh məndə? Cavab gəldi qeybdən:
"Batdın günəhə bir neçə pərvanədən ötrü".

"Bənzər qoxusu nanəyə zülfün, mənə nanə" -
Xahiş olacaq bağbana hey nanədən ötrü.

Dastançı gəlib seyr eləsin, odlu sinəmdə
Saf eşq yaranmış neçə əfsanədən ötrü.

Xaliq məni, neynim ki, bu cür xəlq eləyibdir,
Zay etməmişəm günləri meyxanədən ötrü.

Heç vədə pəsənd etməyəcək daş-qaşı könlüm,
Yalvarmaram Allahə də dürdanədən ötrü.

"Can qalmadı Şahində" deyən varsa eşitsin:
Qurban elədim mən canı cananədən ötrü!

*2.02.1997*

✦✦✦

*Mən ölsəm - sən yaşayacaqsan, amma sən ölsən - mən də öləcəyəm!*

Hərçənd vüsalə atırıq can daha güclü,
Hərdənbir olur amma ki, hicran daha güclü.

Hər dərdliyə dərman olacaq eşq ilə yalnız,
Zənn eyləmirəm mən ola dərman daha güclü.

Kafərləri həm kafərə eşq eylədi bağlı,
Sevməzmi müsəlmanı müsəlman daha güclü?

Mən sevgi yolunda nə qədər tufana dözdüm,
Tufan edə bilməz daha tüğyan daha güclü.

Qəlbimdəki ülviyyətə, qüdsiyyətə dözdüm,
Heyransa da, mən heyrana heyran daha güclü.

Hərçənd təsəvvüf də kəramətlidi, amma
Arif olan aşiqlərə irfan daha güclü.

Aşiq ilə aşiqdə təfavüt məgər azmı?
Güc çoxsa da aslandə, qaplan daha güclü.

Tüğyan ilə üsyanə çıxıbdır yenə hicran,
Tüğyan özü üsyansa da, üsyan daha güclü.



Heç kimsə Züleyxa kimi böhtan ata bilməz,
Atmaqda Züleyxa bizə böhtan daha güclü.

Hökm eyləmə, əmr eyləmə, fərman elə, yarım,
Hökm ayrı, əmr ayrıdı, fərman daha güclü.

Gəl tapdamayaq gülləri gülzardə, yoxsa
Tənə edəcəkdir bizə bağban daha güclü.

Yoxdur buna şəkk, Şahini sən güclü sevirsən,
Şahin səni sevməkdəsə, canan, daha güclü!

*12.02.1997*

✦✦✦

Tutdum elə ki, mən o mələkmənzərə güzgü,
Az qaldı ki, düşsün həsədindən yerə güzgü.

Yan dur, əlidaşlı ay uşaq, gəlmə, kənar ol,
Rəhm eylə, toxunsa sınacaq qənbərə güzgü.

Bəxt güzgüsüdür, bəxtimi sındırma, amandır,
Sındıqda, lüzum olsa, dönər xəncərə güzgü.

Mat oldu baxıb surətinə güzgüdə dilbər,
Nurlandı təmaşa eləyib dilbərə güzgü.

Vəsfində onun söylədiyim ilk qəzəlimdir,
Bundan belə tez-tez düşəcək dəftərə güzgü.

Təhqir elədim bir bəyi mən, çünki demişdi:
- Güzgü bəyə lazım, nə gərək mehtərə güzgü?

Dildarıma məşşatə də, bərbər də mən oldum,
Məşşatəyə məqqaş gərək, bərbərə güzgü.

Şahin, ulu Tanrı sənə ilham veribdir,
Xızra - dirilik suyini, Isgəndərə - güzgü.

*15.10.1997*

✦✦✦

Meyi mən canə zərər söyləmişəm, düzdürmü?
Söyləyirlər ki, hədər söyləmişəm, düzdürmü?

Bu gecə dişləmişəm mən qəmərin çöhrəsini,
Çöhrənə mən ki, qəmər söyləmişəm, düzdürmü?

Eşqi yox, mən arabir canımı üstün tutdum,
Faidəm oldu zərər söyləmişəm, düzdürmü?

Çoxalır canda şəkər busələrindən, şəkərim,
Tutiyə verınə şəkər söyləmişəm, düzdürmü?

Illər ötdükcə mənim qayəmə oldun tabe,
Mənə zərgər, sənə zər söyləmişəm, düzdürmü?

Can ölür, ruh dönür bir neçə ildən sonra,
Ölümə mən də səfər söyləmişəm, düzdürmü?

Bağiban, sök çəpəri, yıx hasarı biryolluq,
Nə gərək bağə çəpər söyləmişəm, düzdürmü?

Diş dibindən çıxan hər söz yaraşır əğyarə,
Mənsə ondan da betər söyləmişəm, düzdürmü?

Kəhərə "əsb" deyənlər nə edir kəsb, ey dil,
Kəhərə mənsə "kəhər" söyləmişəm, düzdürmü?

Yəhəri "zin" eləyən zənn edirəm haqsızdır,
Yəhərə öylə "yəhər" söyləmişəm, düzdürmü?

Gölməçə təbi ilə fəxr eləyən var, Şahin,
Təbimə mənsə Xəzər söyləmişəm, düzdürmü?

*21.12.1997*

✦✦✦

Bağban, yadıma bağda məhəbbət gülü düşdü,
Iffət çiçəyi düşdü, sədaqət gülü düşdü.

Yəni, o gülüm bir də görünmür, hara getdi?
Yoxsa, nəzərimdən o məlahət gülü düşdü?

Sal xatirinə, görcək onu söyləmiş idim:
- Göydənmi enib bağə səadət gülü düşdü?

Üst-üstə düşübdür nə qədər gül qabağımda,
Məna gülünün üstünə surət gülü düşdü.

Amma görə bilmir o gülü bir də bu gözlər,
Bilməm bu çəməndən niyə heyrət gülü düşdü.



Gül hüsnünü gördükdə demişdim ona "Əhsən!",
Şahin, nəzərimdən daha cənnət gülü düşdü.

*5.02.1998*

✦✦✦

Gözümün yaşı kimi yar gözümdən düşdü,
Dilimi bilmədi, dildar gözümdən düşdü.

Mən ki, hər sirrimizi gizlər idim, indi isə
Aləmə eyləyirəm car: Gözümdən düşdü.

Yoxdu bir zərrə kədər məndə, gözüm gülgündü,
Qum qədər indi qəmim var, gözümdən düşdü.

Bir səbəb varmı məgər bir də fərəhlənməyimə?
Nəşəyə, həzzə səbəbkar gözümdən düşdü.

Donuram, çoxmu hələ göydəki qar ehtiyatın?
Allahım, göydəki ambar gözümdən düşdü.

Hanı Mail ki, qəzəl gülşəni bülbülsüzdür,
Bülbülü yox deyə gülzar gözümdən düşdü.

Eşqi mən təbliğ edərdim həmişə, ey Şahin,
Edirəm indisə inkar, gözümdən düşdü.

*Nardaran kəndi*
*20.06.2000*

✦✦✦

Qaldırıb baş yenə canımda o canan şövqü,
Qalmayıb məndə nə gülşən, nə gülüstan şövqü.

"Müstəqillik!" deyə meydanə qədəm basdıq biz,
Son zamanlar bürüyüb çox kəsi meydan şövqü.

Kimi dağ şövqünə düşmüş, kimi bağ eşqində,
Kimisə Məcnuna döndərdi biyaban şövqü.

Az deyil öyləsi ki, yarına qurban olmaz,
Məndəsə olmağa var qoç kimi qurban şövqü.

Səni gəzmək, səni tapmaq, səni görmək dilərəm,
Nə təhər faş eləyim mən neçə pünhan şövqü?

Sən ki yoxsan, deməli Şahinə yoxdur dərman,
Yoluxubdur yenə mən xəstəyə dərman şövqü.

*15.05.1998*

✦✦✦

Canımı üzmədi canana, gözümdən düşdü,
Elə ki, rəhm elədi canə gözümdən düşdü.

Nəzərimdən elə düşmüş o qədər aşina,
Demirəm bir daha biganə gözümdən düşdü.

Dürr üçün bir neçə qovğanı görəndən sonra
Hələ dürr bir yana, dürdanə gözümdən düşdü.

Nağıla, dastana aldanmağımın vaxtı keçib,
Gerçəyəm, ey pəri, əfsanə gözümdən düşdü.

"Dağa çıx" söyləmə, ya əmr eləmə "çöllərə düş",
Məni qərq eyləmə fərmanə, gözümdən düşdü.

Mütilikdir deyə pərvanələrin yanmaları
Şəmə yanmış neçə pərvanə gözümdən düşdü.

Mey də vardır, hələ meyxanəçi də, ey Şahin,
Saqi yoxdur deyə meyxanə gözümdən düşdü.

*Moskvaya yol, təyyarə,*
*27.04.2000*

✦✦✦

Göz yaşı rəvandı səndən ötrü,
Çünki, nigərandı səndən ötrü.

Yarım, başıma hava gəlibdir,
Yarın havalandı səndən ötrü.

Bağrımda yerin xətərsiz idi,
Bağrım başı yandı səndən ötrü.

Məşəl təki atəşin deyimlər
Şerimdə bəyandı səndən ötrü.

Şairmi məgər bu sözqoşan kəs?
Ey Sara, çobandı səndən ötrü.

Qoldur bu, ya Musanın əsası?
Sən səmtə uzandı səndən ötrü.



Zahirdə qoca göründü Şahin,
Batində cavandı səndən ötrü.

*19.08.2000*

✦✦✦

O zamandan ki, gözüm gördü o canan üzünü,
Görə bilmir o zamandan bu yana can üzünü.

Görməyibdir deyə islamə sitayiş eləyir,
Bütpərəst olmalıdır görsə müsəlman - üzünü.

Onu gördükdə qızılgül başını dikdi yerə,
Üzünü gördüyü dəm gizlədi reyhan - üzünü.

Şeytanın xisləti məlum, hamını görmədədir,
Görməyib amma ki, bir kimsənə şeytan üzünü.

Bülbüləm, güllərə bəndəm, məni öldür, Yarəb,
Gözlərim gər görə bilməzsə gülüstan üzünü.

Cənnətə düşsəm əgər, öylə gözüm qorxub ki,
Görərəmmi görəsən orda da hicran üzünü?

Mənə qoy huri çata qılman isə - mollayə,
Şahinəm, istəmirəm görməyi qılman üzünü.

*4.02.2001*

✦✦✦

Qış ki bitmiş, eşidən yox daha qarın sözünü,
Gül-çiçəklər danışır indi baharın sözünü.

Biri meyxanəyə getməkdədi, məscidə biri,
Dinləmək istəyirəm mənsə çinarın sözünü.

Sevgilim oldu pərişan məni zar eyləyəli,
Deyəcək kim o pərişanə bu zarın sözünü?

Doğmayam, daima can-başla eşit sözlərimi,
Vur qulaq ardına, ey yar, kənarın sözünü.

Şövq ilən mən gecə-gündüz sənə "sim-sim" deyərəm
Ürəyin dinləyəsi olsa açarın sözünü.
On üç il doğma elin xiffətini çəkdim mən,
Mənə qürbətdə deyən yoxdu diyarın sözünü.

Şahinə söz demə, zahid, sözünün faydası yox,
Qulağım təkcə eşitməkdə nigarın sözünü.

*15.06.2001*

✦✦✦

Bütpərəstin namazı mümkünmü?
Susuzun dəstəmazı mümkünmü?

Etiraz eyləməyir cananə,
Aşiqin etirazı mümkünmü?

"Yazıya yoxdu pozu" söylədilər,
Pozu yoxdursa yazı mümkünmü?

Günəhim varsa da, cənnət - diləyim!
Tanrının imtiyazı mümkünmü?

Zahida, gəl sənə mən dərs verim,
Dərin etmək dayazı mümkünmü?

Yenə hədyan danışır bir molla,
Anlamaq anlamazı mümkünmü?

Vahid olsun deyə ölkəm, Şahin
Içmək istər Arazı, mümkünmü?

*17.03.2002*

✦✦✦

Dönmüşəm mən doğma yurda, qüssə yoxdur, qəm də yox,
Başda sevdası Xumarın həm varımdır, həm də yox.

Ölkə gördüm - dərdçəkən adəm də var, xürrəm də var,
Ölkə gördüm - dərdçəkənlər olsa da, xürrəm də yox.

Günlərim çox yaxşı keçdi, amma hicran etdi cövr,
Burdakı dərdin əlacı ordakı məlhəmdə yox.

Hər nə etsəm aşikardır, mübhəm işlər yad mənə,
Aşikarlıqdan əlamət, sevgilim, mübhəmdə yox.

Şəbnəmə yox məndə rəğbət - bənzəyir göz yaşına,
Mən çəkən dərdin dəvası güldə var, şəbnəmdə yox.

Şahinəm, dilbər yanımda, şişə öndə əldə gül,
Öylə bir aləmdəyəm ki, aləmim aləmdə yox.

*Gürcüstan səfərindən*
*qayıtdıqdan sonra,*
*Bakı, 29.05.1998*



✦✦✦

Ciyərim indi qan olmuş ki, ciyərparəsi yox,
Amma, aşiq görürəm mən yarı var, yarəsi yox.

Köhnə avarələrin Məcnunu məşhur idi,
Tazə avarələrin mən kimi avarəsi yox.

Ağlamaqdan bədənimdə su tükənməkdəydi,
Neçə gündür gözümün yaxşı ki, fəvvarəsi yox.

Varmı səyyarə ki, aşiqləri yetmir vəslə?
Fələyin, zənn edirəm, yer kimi səyyarəsi yox.

Qələmim oldu silahım, döyürəm əğyarı,
Şairin gülləsi yox, mərmisi, qumbarəsi yox.

Oxumaqdan gecə-gündüz gözümə tor gəldi,
Gözümün qarəsi ağ oldu, daha qarəsi yox.

Gözəlim, mən kimi biçarəyə bir çarə elə,
Dedi: - Şahin, yeri, biçarə kəsin çarəsi yox!

*19.08.1998*

✦✦✦

Bu necə bağdı, bağban, çəpəri yoxdur, yox,
Oğrunun bəlkə də bundan xəbəri yoxdur, yox.

Gözlərim gör necə axtarmada göyqurşağını,
Asimanın neçə vaxtdır kəməri yoxdur, yox.

Məni dəmdən dəmə üzməkdə qaranlıq bu gecə,
Bu gecə xeyli uzandı, səhəri yoxdur, yox.

Anlaya bilməyirəm indi qəzəlxanları mən,
Söyləyirlər sözü, amma kəsəri yoxdur, yox.

Yenə əfqan elini arzularam, çoxdandır
Əfqanıstanə bu şəxsin səfəri yoxdur, yox.

Ayırıb Maili bizdən çalağan oldu əcəl,
Məclisin indi o cür mötəbəri yoxdur, yox.

Qəzəlim bir çoxunun iynə olubdur gözünə,
Nə deyirlərsə desinlər, xətəri yoxdur, yox.

O cahanda görəsən böylə pəri vardırmı?
Bu cahan içrə bu saflıqda pəri yoxdur, yox.

Əsl od, bəlli ki, eşq içrə olur, ey Şahin,
Sevməyən kəslərin oddan xəbəri yoxdur, yox.

*10.06.2000*

✦✦✦

Qocalmışdı, ölüb-getdi, bağım var, bağıbanım yox,
Özüm bağbanlıq eylərdim, deyil mümkün ki, canım yox.

Biri taxt-tac şövqündə, biri bir sac şövqündə,
Canım merac şövqündə, Ilahi, nərdivanım yox.

Kitablar yazmışam, məndən gəlib pulsuz aparsınlar,
Mənim zər mədənim vardır, mənim zərgər dükanım yox.

Məgər təbliğimə iqdam edən olmuşmu bir kimsə?
Bəyanım var əyanım yox, əyanım var bəyanım yox.

Mənim namehriban adəmlərə hey heyrətim vardı,
Mənəm namehriban indi, Ilahi, mehribanım yox.

Məhəbbət bilmirəm neyçün əziyyətdən deyil xali?
Məgər olmuşmu aşiq ki, bəyan etsin "fəğanım yox"?

Təzadın məskəni olmuş canım, sakindi ziddiyyət,
Bu dövranə mənim, Şahin, ümidim var, gümanım yox.

*17.10.2000*

✦✦✦

Əl götür, ey qəm, məni rahət burax,
Et yenə xürrəm, məni rahət burax.

Hicr bitəndən bəri mən rahətəm,
Rəhm elə sən həm, məni rahət burax.

Qeyrisi yoxdurmu bəyəm, indi ol
Qeyriyə həmdəm, məni rahət burax.

Eyləmisən cismimi sən qupquru,
Gözsə olub nəm, məni rahət burax.



Cənnətə bənzərdi həyat, indisə
Oldu cəhənnəm, məni rahət burax.

Hətta ədəbsizlik edib söymüşəm
Mən səni möhkəm, məni rahət burax.

Xeyli məni sən əsəbi etmisən,
Eyləmə sərsəm, məni rahət burax.

Şahinə yar həm belə məhrəm deyil,
Ey mənə məhrəm, məni rahət burax.

*27.12.2000*

✦✦✦

*"Su" deyibdir mənə əvvəldə anam, "ab" ki yox,*
*"Yuxu" öyrətdi uşaqlıqda mənə, "xab" ki yox.*

*O ki ilk dəfə çörək verdi mənə "nan" demədi,*
*Əzəlimdə mənə "duzdanə" "nəməkdan" demədi.*

*Anam "əxtər" deməyibdir mənə, "ulduz" deyib o,*
*Su donanda deməyib "yəx"di, bala, "buz" deyib o.*

*"Qar" deyib, "bərf" deməyib, "dəst" deməyib, "əl" deyib o,*
*Mənə heç vaxt "biya" söyləməyib, "gəl" deyib o.*

*Məhəmmədtəqi Zehtabi*

Dil deyir "dildar", amma Şahinə dildar yox,
Yox deyə dildarı vardır çox qəmi, qəmxar yox.

Mən ki acgöz mollalardan çox qəbahət görmüşəm,
Niyyətim təsdiq olubdur badəni, inkar yox.

Həndəsə elmində mahirdir arı, göz qoymuşam,
Memarı çoxdur cahanın, öylə bir memar yox.

Təmin olmuş ehtiyacı arifin irfan ilə,
Aşiqə eşqindən üstün qeyri bir meyar yox.

Ey qəzəlxanlar, ucaldın saf dilin bayrağını,
Vahid ölmüşdür, qəzəldə indi bayraqdar yox.

Siz bu gün "aşiqlər"i "üşşaq" edirsiz, eyb ola,
Cəminə "şer"in "şerlər" söyləyin, "əşar" yox.

Sərvətm yoxdursa da, saf söz varım vardır mənim,
Şahinə şerindən özgə dürr yoxdur, var yox!

*13.07.2001*

✦✦✦

Eşq öylə həqiqətdi ki, inkarə lüzum yox,
Sevda elə zinətdi ki, memarə lüzum yox.

Mənsur kimi çəkmə, fələk, aşiqi darə,
Cananə alırsa canı gər, darə lüzum yox.

Qoy yaxşı düşünsün yara ilqar edən adəm,
Süstdürsə məhəbbət ipi ilqarə lüzum yox.

Əfsus ki, eşq içrə vəfa rəsmi azaldı,
Mən ki görürəm böylə, vəfadarə lüzum yox.

Vardırsa çəmənzar gərək seyri də olsun,
Bülbülləri yoxdursa çəmənzarə lüzum yox.

Təsdiqimi inkar eləyirsən mənim, ey şeyx,
Inkar eləmə təsdiqi, inkarə lüzum yox.

Hər yerdə həqiqətləri çılpaq dedi Şahin,
Gəldikdə vüsal axşamı paltarə lüzum yox.

*4.09.2001*

*Mərsiyəxan dostum*
*Molla Əzizağaya!*

✦✦✦

Cananı gördüm, əlhəmdülillah,
Loğmanı gördüm, əlhəmdülillah.

Iranı gəzdim, Turanı gəzdim,
Əfqanı gördüm, əlhəmdülillah.

Mən din yolunda, həqqin yolunda
Üsyanı gördüm, əlhəmdülillah.

Dərk etməyimçin qədrin vüsalın
Hicranı gördüm, əlhəmdülillah.



Bir gün deyib "gəl" yar etdi fərman,
Fərmanı gördüm, əlhəmdülillah.

Həzzim yox ikən, dərdim çox ikən,
Dərmanı gördüm, əlhəmdülillah.

Varkən qürurim, çoxkən qüsurim,
Nöqsanı gördüm, əlhəmdülillah.

Zənn eyləyirdim mümkünsüzəm mən,
Imkanı gördüm, əlhəmdülillah.

Eşqimdə düzgün, əhdimdə pakəm,
Peymanı gördüm, əlhəmdülillah.

"Allah" dilimdə! Şahin, əlimdə
Quranı gördüm, əlhəmdülillah!

*8.05.1998*

✦✦✦

*Hacı Əlisəftər Nailə!*

Kimdə varsa vəfa, bismillah,
Eləməzsə cəfa, bismillah.

Ey şəfanı gəzən sevdadə,
Tapacaqsan şəfa, bismillah.

Gəl ki, eşq aləmi göyçəkdir,
Görəcəksən səfa, bismillah.

Niyyətin eşq isə, üstündən
Ötəcək hər bəla, bismillah.

Oxu avaz ilən Quranı,
Nə gözəl bir səda, bismillah.

Mənə zəvvarlıq bəxş olsun,
Necə göyçək dua, bismillah.

Getmişəm Məşhədə üç dəfə,
Öndədir Kərbəla, bismillah.

Diləyim var gedim həm Həccə,
Şahina, mərhəba, bismillah!

*13.03.1999*

✦✦✦

Şəpələr bir də günəş aləmə zər inşallah,
Üzə, əlbəttə, gülər bir də səhər inşallah.

Soldu sevda ağacı, eşqü məhəbbət ağacı,
O ağaclar gətirər bir də bəhər inşallah.

Tutiyəm, yarsızam, şirnisizəm, tənhayəm,
Tutiyə qismət olar qəndü şəkər inşallah.

Bağiban vermir icazə görüşüm yarımla,
Sökülər, zənn edirəm, mən o çəpər inşallah.

Hanı Kabuldakı dərvişü qələndər kişilər?
Əfqanıstanı edər tərk kədər inşallah.

Mən Füzuli babamın qəbrinə baxdım, baxdım,
Qonacaq bir də o torpağə nəzər inşallah.

Yarım il ötdü Iraqə səfərimdən, Şahin,
Edərəm mən yenə Bağdadə səfər inşallah.

*18.05.2000*

✦✦✦

O zamandan ki o dilbər mənə ilqar etmiş,
Ürəyim yox kimi olmuşdu, onu var etmiş.

Mübtəla dərdə olan xeyli sevən var... Nə qədər
Dərdlinin dərdi məni dərdə giriftar etmiş.

Bağiban, qoyma daha bağə girə əğyarı,
Kim giribdirsə bu gülzarə gülü zar etmiş.

Bəzəyən qəlb evimi yar nə gözəl memardır!..
Hansı memar onu bilməm belə memar etmiş.

Gərək aşiqləri rəhbər seçələr, aşiqlər
Sülhü təqdir eləyib, dəvanı inkar etmiş.

Saqi, zənn etmə ki, meydəndi xumarlıq məndə,
O pəriçöhrənin eşqi məni xummar etmiş.

Bir cananı sevir, başqası yalnız özünü,
Şahin isə hamını sevmədə israr etmiş.

*27.01.1996*

✦✦✦

"Can" desəm, mərcan dodağı canə "can" eylərsə xoş,
Vəslini yarım dübarə ərməğan eylərsə xoş.



Mehribanəm, amma ki, namehriban olmaqdayam,
Mehribanı mehribanım mehriban eylərsə xoş.

Qarə günlər bəxş edib, ağ günlərin boşdur yeri,
Mən kimi ağsaqqalı dilbər cavan eylərsə xoş.

Gərçi, qarğış eyləməkdən çox kənarəm, taleyi
Lalə tək hər bivəfanı bağrıqan eylərsə xoş.

Dilbərim bilsin ki, mən az bilmirəm loğmandən,
Aşiqi hər dərdinə loğman güman eylərsə xoş.

Gərçi mən eşqində yarın bir sınaqdan çıxmışam,
Yarını yarım dübarə imtahan eylərsə xoş.

Yar fərağı artırır şerin sayın, könlüm mənim
Dəmbədəm yarın fərağıyçün fəğan eylərsə xoş.

Görmürəm heç bir rəqibin fəhmini, idrakını,
Fəhmini, idrakını bir gün əyan eylərsə xoş.

Ey Füzuli, söyləyibsən "afəti-can" eşqə sən,
Eybi yoxdur, eşqdən Şahin ziyan eylərsə xoş.

*5.03.1997*

✦✦✦

Su tək ardınca sənin gündə rəvan olsam xoş,
Harda olsan, gözəlim, orda əyan olsam xoş.

Bir cahansan mənə - ruhani, ey ilham pərisi,
Ey cahanım, bu cahan içrə cahan olsam xoş.

Yaxşı insanə yamandırmı olarsam yaxşı?
Yaxşıdır ki, yaman insanə yaman olsam xoş.

Rahətim yox o səbəbdən ki, deyilsən rahət,
Təki aram özün ol, mən nigəran olsam xoş.

Sən baxırsan mənə, amma deyəsən görmürsən,
Mənə Rəbbimmi deyir yoxsa nihan olsam xoş.

Yenə meyxanədə yoxdur gülabı saqimizin,
Saqidən, öylə isə, mən dəxi yan olsam xoş.

Leylican, mən də bu gündən şəhəri tərk edirəm,
Daha Məcnun kimi səhradə əyan olsam xoş.

Gəlib evdən aparıb kimsə şer dəftərimi,
Gər talançım sən olubsansa talan olsam xoş.

Şahinəm, oxlayacaqdır məni bir gün nadan,
Bəlkə, kiprik oxuna indi nişan olsam xoş?

*22.06.1997*

✦✦✦

Dünyəvi eşq kifayət mənə, xülya ötmüş,
Sanmasınlar yaş ötübdür deyə sevda ötmüş.

Bivəfa yardən eşq ummayıram, rədd olsun,
Daha yoxdur o təmənna ki, təmənna ötmüş.

Nə qədər fırtınaya, tufana dözdüm, üzdüm,
Batmamışdır bu gəmi, bir neçə dərya ötmüş.

Mən səmanı süzürəm daima şahinsayağı,
Bu səmadən neçə illər neçə durna ötmüş.

Bivəfadır bu cahan, yox daha Musa kimilər,
Tərk edibdir yeri Yəhya da, Məsiha ötmüş.

Saf qəzəl şövqü ilə uyquya həsrət qaldım,
Gözlərimdən nə qədər kim bilə röya ötmüş.

Bu qəzəlxan geridə qalmadı yoldaşlardan,
Ya bərabər gedə bilmiş bu yolu, ya ötmüş.

Ömrümün şəmini cananla əritdim, Şahin,
Nəyə lazım elə bir ömr ki, tənha ötmüş.

*9.12.1997*

✦✦✦

Gərçi tutmuş neçə dərya, neçə ümman almış,
Daha üzmür gəmi, öz sahilinə yan almış.

Yəni artıq mənə asudəliyim lazımdır,
Yenidən yan-yörəmi amma ki, tufan almış.

Ehtiyac yox sənə, get, qəbrimə cansız gedirəm,
Əzrayıl, gəlmə daha, canımı canan almış.

Mümkünüm vardı olum Qeys, olum mən Fərhad,
Fələyi gör ki, əlimdən neçə imkan almış.



Nisgilim qalmayıb amma, üzə sevda gülmüş,
Mən alan zövqü, düşünməm ki, Süleyman almış.

Belə sevda qədəhi qismət olub təkcə mənə,
Nə onu şah götürmüş, nə də sultan almış.

Amma hər bir qəmimin oldum özüm qəmxarı,
Min kərə cismim üzülmüş, təzədən can almış.

Qatlasın barmağını, kim mənə etmiş çarə?
Dərdə düşdükdə canım kim mənə dərman almış?

Saqi mey verdi kitab istədi məndən dərhal,
Bu fəqir saqi dilindən yeni fərman almış.

Məgər adəmmi o, Şahin, elə adəm var ki,
Nə qələm şövqünə düşmüş, nə qələmdan almış.

*12.12.1997*

✦✦✦

Zahidi dinləmə, arif, sözünü şər bilmiş,
Mey gətir, saqi, içənlər onu Kövsər bilmiş.

Bağla nərdtaxtanı, ey mənlə oyunbazlıq edən,
Bu nə zərdir ki, gətirdin yenə, ey zərbilmiş?

Yazıram söz, qələmim adi qələmdir, amma
Elə adəmlərimiz var onu xəncər bilmiş.

Kafərin qədrini kafər kimilər bilmişlər,
Müslimin qədrini zənn eyləmə kafər bilmiş.

"Bilirəm" söyləyən az kəs görürəm "bilmiş"dir,
Məni bilmişmi bu məclisdə məgər hər bilmiş?

"Qülhüvəllahu əhəd" həkk olunub hafizəmə,
Bu qəzəlxan doğulan gün bunu əzbər bilmiş.

Vahidin qiymətini siz soruşun Şahindən,
Bir məsəl var ki, "zərin qədrini zərgər bilmiş".

*29.04.1998*

✦✦✦

Hər bir sözünün içrə sanki şəkər istanmış,
Kəlmən necə şirindir! Ağzın şəkəristanmış.

Zənnimdə heca - huri, fikrimdə əruz - qılman,
Huri belə huriymiş, qılman belə qılmanmış.

Mənа ilə surətdə hökm ilə itaət var,
Bəndə elə bəndəymiş, sultan elə sultanmış.

Gərçi ürəyim parə, hər parədə min yarə,
Eşq oldu mənə çarə, eşqin mənə dərmanmış.

Əsl aşiq imiş dahi vallahi və billahi,
Məcnun isə gər şahi, səhra da gülüstanmış.

Zahid, demə "eşq oddur, yandırmasa dinc olmaz",
Aşiq oda aşiqmiş, aşiq oda heyranmış.

Şahin də yanan ərdir, Şahin də səməndərdir,
Şahin o odu görmüş, Şahin o oda yanmış.

*16.07.2000*

✦✦✦

Pis əməl yaxşı ki, gündən-günə islah olmuş,
Ürəyim düz əmələ indi qərargah olmuş.

Köksüm içrə yeri var həm kədərin, həm həzzin,
Amma çox vaxt təbəssüm yerinə ah olmuş.

Xeyli şadəm ki, cahan xali deyil insandan,
Çox xeyirxah bu xeyirxahə xeyirxah olmuş.

Olmayıbdır əri, amma ki, doğub Isanı,
Məryəmi boylu edən Həzrəti-Allah olmuş.

Neçə yerdən oxa tutmuş canımı namərdlər,
Qorxusu yoxdu, nigarım mənə cərrah olmuş.

Niyyətim tək o gülə bəlli olub hər vədə,
Bir bütüm var ki, məramım ona agah olmuş.

Qələbə çalmışam hər şəxsə mən ondan qeyri,
Eləyən Şahini məğlub o şəhənşah olmuş.

*6.08.2000*

✦✦✦

Ayrılığa kim ki səbəbkar imiş,
Qəlbinə təfriqəçilik yar imiş.



Tərsinə fırlandıralar çərxini!
Çərxi-fələk gör nə zülümkar imiş.

Söylədilər yarına heykəl yonub,
Şairə bax, şairə, memar imiş.

Eşq evimi qarət edib getmisən,
Ey pəri, qarətçiliyin var imiş.

Hər pəridən umma vəfa, ey könül,
Hər kəsi zənn etmə vəfadar imiş.

Şahina, ruhim göyə uçmaqdadır,
Sanki ona Yer kürəsi dar imiş.

*3.12.2000*

✦✦✦

O şair ki, onun yarı gedib əğyarə yar olmuş,
Qəzəl yazmağı tərk etsin gərək, bietibar olmuş.

Biri olmuş dəli, bir qeyrisi dinsiz, biri yanmış,
Haçan aşiqlərin keçdikləri yollar hamar olmuş?

Adam var ki, baharı ömrünün qışdan da çovğunlu,
Adam həm var onun qış mövsümü dönmüş bahar olmuş.

Üzün dönsün, fələk, "Pərvərdigar oldum" deyənlər var*,
Dünənki bir gəda oğlu bugünkü hökmdar olmuş.

Zamanın həm məkanın ixtiyarı Rəbbə məxsusdur,
Cahanın sahibi, əlbəttə ki, Pərvərdigar olmuş.

"Tamam aşiqlərin məşuqəsin gördüm kənarında,
Mənim də dilbərim, ey dil, əcəb məndən fərar olmuş"**.

Iki məbəddən əl çəkmir, əcəb avarədir Şahin,
Nə məsciddən, nə meyxanə kənarından kənar olmuş.

*10.07.2001*

✦✦✦

*Şərqşünas dostum Vasim Məmmədəliyevə*

Beynimdəki xülya dolu sevda niyə sərxoş?
Məst olmamışamsa hələ misra niyə sərxoş?

---

* "Deyəsən mən Allah oluram" - Ölüm ayağında Roma imperatoru Tit Flavi Vespasionun son sözləri. Vespasion (69-79-cu illər) Flavilər sülaləsinin banisi olmuşdur.

** Beyt Seyid Qarabağınındir (XIX əsr).

Etməzdi meyl buğdaya olsa idi hüşyar,
Adəm soruşa bildimi Həvva niyə sərxoş?

Divanə o Məcnuni məhəbbət meyi etdi,
Yoxdursa şərab eşqdə Leyla niyə sərxoş?

Meyxanədə mey varsa təəccüblü deyildir,
Məsciddə əgər yoxsa bu molla niyə sərxoş?

Olmazsa əgər sahili dərya da var olmaz,
Dalğa dağıdır sahili, dərya niyə sərxoş?

Hərdən coşuban titrəməsi zəlzələdirmi?
Dərk eyləmirəm mən hələ dünya niyə sərxoş?

Sevda meyini nuş eləyibdir yenə Şahin,
Bildim yenə şerindəki məna niyə sərxoş.

*11.03.2002*

✦✦✦

Elə ki tapdı bu aşiq o gözəl cananı,
Əlinə düşdü o gündən yaşamaq imkanı.

Girmişik bostana, əfv et bizi, ey bostançı,
Oxumaq istəmişik Sədi yazan "Bustan"ı.

Neçə yol qovlamışam bir də olubdur peyda,
Əcəba, can evimə kim buraxıb hicranı?

Vəslə onsuz da ümid eyləməyirdim, Allah,
Mənə bildir görünübdür bu ilin tufanı.

Dərdimə çarə edən varmı Azərbaycanda?
Bu böyüklükdə yerin yoxmu məgər loğmanı?

Neçə arif kəsin irfanını öyrəndim mən,
Gəzib əfqan elini, Türkiyəni, Iranı.

Hanı mən tək görəsən saf qəzəlin müştağı?
Mən ki, qarşımda bu gün boş görürəm meydanı.

Amma eşq elmini öyrənmədə aciz qaldım,
Çünki, elm eşqinə verdim bilərəkdən canı.



Qeyri kəs qəlbini cananə divan üstdə açır,
Şahinəm, bağlayıram mənsə qəzəl "Divan"ı.

*17.10.1995*

✦✦✦

Səni gördüm yenə gülşəndə, gülüm, gül sayağı,
Ataraq dərdimi oldum yenə yüngül sayağı.

Dərd var - dağdan ağırdır, buna şəkk eyləmirəm,
Amma yoxdur elə bir dərd ola nisgil sayağı.

Hər dəmim bir günə bənzərdi, ayım - bir ayə,
Mənə hər ləhzə görünməkdə idi il sayağı.

Bir də eylərsə hücum eşqə, bəla sellərinin
Önünü kəsməliyəm bənd kimi, sahil sayağı.

O səbəbdən ki, ürəkdə neçə eşq öldürmüş,
Görürəm düşməni cəllad kimi, qatil sayağı.

Elə bir zat gərəkdir bizə, olsun Əli tək,
Elə bir at gərəkdir ola Düldül sayağı.

Məst edən könlümü yoxdur burada sən təhəri,
Dağda al lalə kimi, bağda qərənfil sayağı.

O buluddurmu səma içrə azalmaqda belə?
Gözümə yoxsa dumandır görünür tül sayağı?

Şahinəm, tərk eləyib şövqünü şahinliyimin,
Oluram mən sənə, ey gül, yenə bülbül sayağı.

*22.10.1995*

✦✦✦

Gözümdən, zənn edirdim ki, çıxan fəvvarə qurtardı,
O yaşdan - göz, kədərdən - can, cismdən - yarə qurtardı.

Daşa ərz eyləyərdim dərdimi, divarə söylərdim,
Daha ərz eyləmək dərdi daşa, divarə qurtardı.

Deyin Leyla çölündə olmasın avarə bir kimsə,
Mən idim, Qeys idi... Yoxdur daha avarə, qurtardı.

Bu gün yardımçı olmur dərdimə bir kimsə aləmdə,
Aman, ummaq mədəd həmkardən həmkarə qurtardı.

Məhəbbət macərasında üzüm ağdır, günüm qarə,
Həmişə zənn edərdim ki, mənimçin qarə qurtardı.

Dünən hicranı qovmaqçın gücüm, qüvvəm tükənmirdi,
Bu gün çarə nədir hicranə, yoxsa çarə qurtardı?

Məramından dönən çoxdur bu gün, yoxdur Imadəddin,
Heyf Həllac Mənsurdan, çəkildi darə, qurtardı.

Bu gün, Şahin, sözüm bitmiş və əhvalım pərişandır,
Güman etməzdim heç vədə sözüm qurtarə, qurtardı.

*24.10.1995*

✦✦✦

Bağının aç qapısından daha, bağban, qıfılı,
Dönəcəkdir geriyə görsə o canan qıfılı.

Dikməsinlər dağa göz, dağ qıfılı Fərhadın,
Bəxş edib Qeysə isə Tanrı biyaban qıfılı.

Bağlayıblar yolu, var öndə qıfıl, gendə qıfıl,
Bənd edibdir neçə yerdən yenə şeytan qıfılı.

Mən Süleyman kimi, yarım, bilirəm quş dili də,
Dili ilə açacaq açsa Süleyman qıfılı.

Neçə əğyarı tutub damlamaq istər könlüm,
Onları damlamaq üçün hanı zindan qıfılı?

Allahım, doğmalarım yurdunu tərk eylədilər,
Düşməsin yad əlinə Azəribaycan qıfılı.

Açacaqdır nə zaman bəxtimi tale açarı?
Nə zaman sındıracaq cümlə müsəlman qıfılı?

Ruh uçar can qəfəsindən, canının qədrini bil,
Hər ömürdə açılır bircə kərə can qıfılı.

Bəndəyəm mən sənə, yat, ehtiyacın yox qıfıla,
Neyləyir bəndəsi varkən axı sultan qıfılı?



İstəyir həbs eləsin birkərəlik hicranı,
Hansı alverçi satar Şahinə hicran qıfılı?

*30.01.1996*

✦✦✦

Gəlmirsə o gül naz ilə, xürrəm mənə qarşı,
Gəlməkdə kədər, qüssə dəmadəm mənə qarşı.

Əlbirliyi var ziddimə yar ilə fərağın,
Səngər quracaqlar yenə möhkəm mənə qarşı.

Artmaqda, sənəm, get-gedə nəm gözlərim içrə,
Qorxum bu ki, ümmanə dönər nəm mənə qarşı.

Dəydikdə sənin bilməyərək könlünə hərdən,
Üsyan edirəm sən kimi mən həm mənə qarşı.

Var qorxusu qurddan çobanın, mən nə edim bəs,
Gəlməkdə yeyin bir sürü dərd-qəm mənə qarşı.

Hər yerdə mənim ehtiramım var, di gəl ki,
Saziş eləyib bir-iki sərsəm mənə qarşı.

Tək sən hayan ol, arxadaş ol Şahinə, sonra
Çıxsın, gözəlim, lap bütün aləm mənə qarşı.

*4.03.1996*

✦✦✦

Sevda nədi bilmirdim, Leyla gözümü açdı,
Leyla nədi bilmirdim, sevda gözümü açdı.

Bifaidə səhradə günlərlə anıb Qeysi,
Daim qalacaqdım mən, səhra gözümü açdı.

Dən-dən gözümün yaşı bihudə rəvan idi,
"Bəsdir, - dedi, - mən varəm", dərya gözümü açdı.

Xurmayə dedim: "Şirin sənsən ya dili yarın?"
Dilləndi: "Dili yarın!", xurma dilimi açdı.

Qürbətdə idim, gördüm bir durna düşüb səfdən,
Göz qorxdu qəriblikdən, durna gözümü açdı.

Son "Divan"ı yazmışdı Seyyid mənim ölkəmdə,
"Divan"ımı yazmaqçın misra gözümü açdı.

Rahətliyi görməkçin çəkdim nə qədər zillət,
Gördüm nə qədər qovğa, qovğa gözümü açdı.

Röyamda görünmüşdü yetmiş sənə azadlıq,
Röya gözümü yumdu, amma gözümü açdı.

Insanda xəbislikdən əsla xəbərim yoxdu,
Şahin, gözübağlıydım, dünya gözümü açdı.

*27.04.1996*

✦✦✦

Bizə imdad eləyibsən eşidib dadımızı,
Görürük səndə, Ilahi, yenə imdadımızı.

Kafərin niyyəti qırmaqdı müsəlmanlarını,
Bildirək biz kimə, ey Tanrı, bu iradımızı?

Neçə cəllad eləyibdir bizi qərq al qanə,
Qana qərq eyləməyirsən hələ cəlladımızı.

Ey fələk, aləmi abad eləməkdir niyyət!
Etmə viran Mədain kimi, abadımızı.

Zülmün artıb elə getməz dağı dağ yarsam da,
Bisütun qərq elədi qanlara Fərhadımızı.

Müştərək sirrimizi söyləmisən əğyarə,
Gözəlim, gəl daha rüsvay eləmə adımızı.

Tökmüsən çiyninəcən saçlarını, yığ, qulağın
Bu səbəbdən də eşitmir daha fəryadımızı.

Anırıq gündə Nizami və Füzuli babanı,
Hadi tək, Mirzə Ələkbər kimi əcdadımızı.

Bizi yad eyləyəcəklərmi görən, ey Şahin,
Dəmbədəm yad edirik biz neçə ustadımızı.

*2.05.1996*

✦✦✦

Əlimin çatmasa da başqa şeyə imkanı,
Səbrimin zənciri ilən döyürəm hicranı.

Görürəm göydə günü, yerdə gülü... əfsuslar
Neçə müddətdi ki mən görməyirəm cananı.

Aşikara sözümün səmti dəyişmiş, amma
Ona gendən-genə göz qoymadayam pünhanı.



Yerə yağdırmada Allah-təala yağışı,
Mənə yağdırmada bir çoxları çox böhtanı.

Qədrimi bilmədi, əfsus, müsəlmanlarımız,
Gedibən gürcü qızından soruşun Sənanı.

Elə zənn eyləməsinlər ki, müdam ah edirəm,
Ağlamaq olmayacaq dərdimizin dərmanı.

Mənə, əlbəttə, sədaqətli olan insan çox,
Indi sadiqlər ilən bağlayıram peymanı.

"Yaşasın Eşq!" deyib eşqə qulam olsam da,
Şahinəm, şah tək imzalayıram fərmanı.

*26.05.1996*

✦✦✦

Çıxmış yenə hicran üzə, sevda yoxa çıxdı,
Sevda yoxa çıxmaz idi, amma yoxa çıxdı.

Göylərdə deyirlər ki, mələk var, nə üçün bəs
Yerlərdə mələk olmadı peyda, yoxa çıxdı?

Var idi qəsr eşqimizin layihəsində,
Atmışdı bina tazəcə... bənna yoxa çıxdı.

"Yoxsan" deyərək eşqə müəmma yaradıblar,
Yarəb, görərikmi bu müəmma yoxa çıxdı?

Hey göz yaşı içməkdə... bu torpaq niyə doymur?
Gözdən süzülən torpağa dərya yoxa çıxdı.

Səhra dəlisindən neçə ildir ki, xəbər yox,
Yusif quyuda qaldı, Züleyxa yoxa çıxdı.

Varlıqların eyniyyəti yoxmuş cahan içrə,
Vamiq gözə görsənmədi, Əzra yoxa çıxdı.

Imzamı bu günlər təzə "Divan"da görərlər,
Fikr eyləməsin kimsə ki imza yoxa çıxdı.

Hicran yatağında yuxu gəlməz gözə, Şahin,
Əlbət bu səbəbdən yenə röya yoxa çıxdı.

*31.05.1996*

✦✦✦

*Şair Ayaz Arabaçıya!*

Yer günəş tək saralıb... Gül sarıdır, nanə sarı...
Bu nə əldir ki, yaxıbdır yenə hər yanə sarı?

Varmı bağban ki yaşıllıq yeri tərk eyləməsin?
Yox ümid! Baxmayıram mən daha bağbanə sarı.

Ehtiyat eyləmədim, bir kərə qan düşmüşdü...
Məni çəkməkdədi eşqim təzədən qanə sarı.

Əzmimi eşq idi bərpa eləyən, ey tale,
Əzm ilən, qoy ki, gedim mən yenə imkanə sarı.

Mənə divanə deyirlər dəli yox, əqlim var,
Daha divanəni sövq etmə biyabanə sarı.

Əllərim düşsə də gücdən, ayağım qüvvətdən
Bir topal tək sürünüm qoy yenə cananə sarı.

Elə ki, ağ olacaq qarə günüm yar ilə,
Həsədindən olacaqdır neçə biganə sarı.

Mən ki, meyxanəyə mey şövqü ilən getməyirəm,
Saqinin eşqi çəkir Şahini meyxanə sarı.

*1.06.1996*

✦✦✦

Qoymuşsa əgər kim məni cananə tamarzı,
Qoysun onu Allah şirin canə tamarzı.

Əfqan elini, Türkiyəni, Iranı gəzdim,
Qaldım niyə, Məcnun, Ərəbistanə tamarzı?

Çoxdandı düşüb cəng odu Iranla Iraqə,
Qalmış o müsəlman bu müsəlmanə tamarzı.

Çoxdandı o dildar bu gülşəndə görünmür,
Gül tək üzünə, lalə, süsən, nanə tamarzı.



Çoxdandı deyirlər ki, Bədəxşandə var ləl,
Qaldım orada ləli-Bədəxşanə tamarzı.*

Dürdanələr içrə elə dürr danəsisən sən,
Dürr danəsinə gör neçə dürdanə tamarzı.

Yandırmalıyam şəm kimi qəlbimi hökmən,
Bir şəm oduna bir neçə pərvanə tamarzı.

Ceyran tapılır az, elə bir gün gələcək ki,
Insan olacaq bəlkə də insanə tamarzı.

Qoy birgə düşüm yar ilə zindanına eşqin,
Qoyma məni, yarəb, elə zindanə tamarzı.

Möhtac eləmə bir də şirin vəslə nigarı,
Şahin isə olsun acı hicranə tamarzı.

*13.09.1996*

✦✦✦

*"Məcməüş-şüəra"nın bəzi xəbis üzvlərinə*

Şahinəm, mən bilirəm uçmağı sizdən yaxşı,
Göydəyəm, seyr edirəm torpağı sizdən yaxşı.

Ucadan yaxşı görünməkdə təbiət, görürəm
Bağı sizdən daha göyçək, dağı sizdən yaxşı.

Bəzi alçaqları təmin eləmir xəlqi dilim,
Hündürəm mən, görürəm alçağı sizdən yaxşı.

Vurğunun şerinə eyhamla baxanlar vardır,
Vurğunun bir atılan dırnağı sizdən yaxşı.

Dilə yad sözləri ovlar neçəsi ovçu kimi,
Görürəm həm ovu, həm ovlağı sizdən yaxşı.

Elimin qurbanıyam, mən dilimin qurbanıyam,
Yazıram qoşma, qəzəl, varsağı sizdən yaxşı.

Qara yaxmaqla mənə gəlməyəcək ağ gözümə,
Seçirəm həm qaranı, həm ağı sizdən yaxşı.

* Bədəxşan Əfqanıstanda bu sətirlər müəllifinin üç il işlədiyi vilayətdir.

Nə oyundur belə yad sözləri çəkdiz rəqsə,
Oynayan olmayacaq qaytağı sizdən yaxşı.

Neçə əsr öncə Füzuli daha yazmış sadə,
Yazdılar Cənnəti, Məmmədtağı* sizdən yaxşı.

Ərəbi, farsı mənim tək bilən azdır burada,
Şahinin dərk eləyir başmağı sizdən yaxşı.

*27.12.1996*

✦✦✦

Bir də gəlməz, geridə qaldı nübar əyyamı,
Ötdü həzz mərhələsi, gəldi qübar əyyamı.

Qocalıq gəldi ağappaq elədi saçlarımı,
Yetdi qış fəsli, yaman başladı qar əyyamı.

Daha axmır gözümün yaşları əvvəlki təki,
Suyu artır çayın, əlbəttə, bahar əyyamı.

Mənə sən naz eləyərdin, mən olardım sərbəst,
Harada qaldı, əzizim, o xumar əyyamı?

Mən uduzdum, sən isə eşq oyununda uddun,
Məni pis günlərə qoydu bu qumar əyyamı.

Mənə mey ver təzədən, aç qapısından qıfılı,
Saqi, meyxanəni aç, yetdi açar əyyamı.

Bağiban aldı hasarə bağı, gülzarı yenə,
Hasarı yıxmadayam mənsə hasar əyyamı.

Fürsəti fövt eləmə, sonra olar gec, Şahin,
Yaz-yarat, gəlmədə sürətlə məzar əyyamı.

*9.03.1997*

✦✦✦

Ey dil, eşidə bilməsə dildar duamı,
Gündüz-gecə dillən, elə təkrar duamı.

Dillən, ona ərz eylə ki, peymanı unutma,
Bil düzlüyə, düzgünlüyə meyar duamı.

* Məmmədtağı Sidqi (XIX əsr)



Kölgən kimi gəzməkdədir ardınca duam da,
Rəbbim yarıda qoymasın, ey yar, duamı.

Göz nuri kimi əhdini hifz eylə, amandır,
Eykaş, şərəfləndirə ilqar duamı.

Çox yaxşı ki, yer xali deyil yaxşı adamdan,
Təsdiq eləsin, etməsin inkar duamı.

Eşq əhli yetirsin yara sözlər ki, dedim mən,
Amma, yetirə bilməsin əğyar duamı.

Şahin sənə, həm yarə dua etmədə, Ya Rəbb,
Ömrüm nə qədər var isə et var duamı.

*29.06.1997*

✦✦✦

Görmədim mən ola heç dilbəri səndən yaxşı,
Yerdə vardırmı məgər bir pəri səndən yaxşı?

Yaşadan aləmi Allah ilə sənsən yalnız,
Fırladan təkcə odur məhvəri səndən yaxşı.

Səni zər zənn edirəm mən, bilirəm qiymətini,
Qeyri zər cəlb eləməz zərgəri səndən yaxşı.

Çox gözəllər daş atıb üstünə əğyarlərin,
Tullayan görməmişəm qənbəri səndən yaxşı.

Heç deyən varmı şer sən kimi məftunluqla?
Oxuyan görməmişəm "Şüştəri" səndən yaxşı.

Venə hər şerimə bir busə verirsən, gözəlim,
Sözümə yoxdu mənim müştəri səndən yaxşı.

Qoru dəftərlərini, Şahin, öləndən sonra,
Hifz edən olmayacaq dəftəri səndən yaxşı.

*29.07.1997*

✦✦✦

Gəldi yanıma sevgili canan gecə vaxtı,
Zülmətkən evim oldu çırağban gecə vaxtı.

Mey qırmızı, saç qarə, dodaq al, əl-ayaq ağ,
Yatmaqmı müyəssərdi bu əlvan gecə vaxtı?

Bir kimsə daha qönçəni üzmür, gülü dərmir,
Asudə olur bağü gülüstan gecə vaxtı.

Sevdim gecəni, çünki sükut ilə xoşam mən,
Daim yaranır təbimə imkan gecə vaxtı.

Əhsən gecəyə, ovçu baba yuxlayacaqdır,
Tuş olmayacaq gülləyə ceyran gecə vaxtı.

Düşdükdə qaranlıq eləmirlər daha cəng həm,
Sanki qapanır üzlərə meydan gecə vaxtı.

Şahin, gecəni sevməyimə ümdə səbəb var:
Nazil olunubdur yerə Quran gecə vaxtı.

*28.10.1997*



Taybatay idi əzəl seyrü təmaşa qapısı,
Bağlanıbdır üzümə indi təmənna qapısı.

Neçə gündür daha xülya başımı tərk eləyib,
Qapanıb gözlərimə indi də röya qapısı.

Etsələr hər kimi zindanə giriftar, əlbət,
Ya onu pəncərəsi cəlb eləyər, ya qapısı.

Bir neçə cahil ilə cəng eləmək meylim var,
Xəncərim hazır əlimdə, hanı qovğa qapısı?

Görməyib öylə ki, divanəliyindən bir əsər
Rədd edibdir nə qədər aşiqi səhra qapısı.

Daha surət deyəsən diqqətimi cəlb eləmir,
Daxil olmaq dilərəm mən, hanı məna qapısı?

Nə qədər ki, gözəlim, sən içəri girməmisən,
Üzünə bağlana bilməz daha sevda qapısı.

Qarə bəxtim kimi, Şahin, deyəsən bağlanacaq,
Gör nə vaxtdır açılıb üzlərə dünya qapısı.

*12.11.1997*



Bəs deyilmi, görəsən bir də kədər vardırmı?
Bir daha qürbətə, ey Tanrı, səfər vardırmı?



Kabulun son on ili keçdi xətərnak mənə,
Yenə yollarda o əvvəlki xətər vardırmı?*

Qarabağ çıxdı əlimdən hələlik, bilməyirəm
Qarabağ köhləni qalmışmı, kəhər vardırmı?

Görmədim bircə şirin şerini mən, ey acıdil,
Dilin altında sənin az da şəkər vardırmı?

Neçə yol söyləmişəm sök çəpəri, sökməmisən,
Bağiban, bağdə əvvəlki çəpər vardırmı?

Köksün altında ürək yox, dolu şər mücrüsü var,
Yenə, ey şərçi, mənə atmağa şər vardırmı?

Zəncinin çöhrəsi sabunla ağarmaz, Şahin,
Cahilə söz deməyin xeyri məgər vardırmı?

*22.07.1998*



Dedilər varmı qəzəlxan ola səndən yuxarı?
Qiyməti sözlərinin dürri-Ədəndən yuxarı!

Söz deyən var ki, duman tək sözü sovrulmadadır,
Özünü amma güman eyləmədə ən yuxarı.

Yuxarı qalxsa da dağdan, dağa çən neyləyəcək?
Bəlli ki, olmalıdır dağ aşağı, çən yuxarı.

Aşağı sanmıram, ey Rəbb, özümü sultandan,
Sənə məlumdu kiməm, mən aşağı, sən yuxarı.

Əli övladı Hüseynin gücünə yox şübhə,
Hansı kəsdir ola qüvvətdə Həsəndən yuxarı?

Şahinəm, uçmadayam şer səmasında uca,
Başqa şahin uça bilməz hələ məndən yuxarı!

*3.09.1998*



Kim əgər zülm eləyib qoydusa ac möhtacı,
Tapmayıb dərdə dəva oldu əlac möhtacı.

Hökmdar olsa idim çoxlu kitab toplardım,
Eləməzdim özümü bacü xərac möhtacı.

---

* Bu beytdə mənim Əfqanıstana 3-cü və 4-cü səfərim dövrü (1978-1988) - Əfqanıstanda Səvr (Aprel) çevrilişinin tüğyan etdiyi illər nəzərdə tutulmuşdur.

Əlinin zülfüqarı var idi, Musadə əsa,
Oluram mənsə olub asi ağac möhtacı.

Qulac olmuş hörüyün sünbülə bənzər, bəri gəl,
Toxuna zülfünə, ey büt, bu qulac möhtacı.

"Qəzəlin şahı mənəm" söyləyirəm, ey Şahin,
Oluram şah kimi mən dəxi tac möhtacı.

*16.11.1998*

✦✦✦

Olmuşsa da illər boyu tüğyan mənə qarşı,
Tüğyanda fəqət olmadı imkan mənə qarşı.

Idrakı zəif, qəlbi qara kimsələr oldu
Ağ-ağ dedilər bir neçə böhtan mənə qarşı.

Cəhd eylədilər eyləməyə şerimi inkar,
Təsiri bunun olmadı bir an mənə qarşı.

Sürdüm gəmini, həm də sükan qaldı əlimdə,
Dərya qopara bilmədi tufan mənə qarşı.

Amma, bilirəm yaxşı, hücumlar yenə vardır,
Daim olacaqdır yeni üsyan mənə qarşı.

Çünki yeniyəm, gəzməyirəm köhnə yerişlə,
Hərçənd tuturlar bunu nöqsan mənə qarşı.

Sabitqədəməm son günəcən amma yolumda,
Tərk eyləmərəm çıxsa da dövran mənə qarşı.

Şahin, çıxaram qarşısına əjdahanın da,
Allah eləsin çıxmaya canan mənə qarşı.

*8.01.1999*

✦✦✦

*Gözəl qəzəlxan Əli Səyyaha ithaf olunur.*

Könlüm ola bilsin ki, olar şahə yabançı,
Amma ola bilməz ulu Allahə yabançı.

Sındırmış idim qəlbini, etdim yenə çarə,
Yarım, niyə oldun belə cərrahə yabançı?



Hər kəs ki, əzizim, bu günün qədrini bilmir,
Billah, olacaqdır neçə sabbahə yabançı.

Əlbət, yeniyəm mən ki, bu gün köhnəpərəstlər
Olmaqda qəzəl mülkünü islahə - yabançı.

Bədxahlərin meylini inkar eləyənlər
Xoşdur mənə ki, olmadı xoşxahə yabançı.

Ötdükcə zaman aləmə nikbinliyim artır,
Olmaqdadı qəlbim kədərə, ahə yabançı.

Şahin kiməsə bəlkə yabançı ola bildi,
Əsla ola bilməz Əli Səyyahə yabançı!

*12.12.1999*

✦✦✦

Edirəm hər sevənə car: Əlimdən çıxdı,
Sevgi adlı ulu meyar əlimdən çıxdı.

Bülbüləm, sanma ki, gülzarımı verdim əldən,
Hər nəyim vardısa, ey yar, əlimdən çıxdı.

Niyə barmaqlarımı yumruğa döndərmədi əl?
Bilmirəm kimdi günəhkar, əlimdən çıxdı.

Mən ki, illərlə gedirdim düşüb ardınca onun,
Ayağım getmədi təkrar, əlimdən çıxdı.

Daha peymanımı mən bağlamıram heç kəslə,
Daha yaddır mənə ilqar, əlimdən çıxdı.

Sanki bir aləm itirdim, mənə aləm yoxdur,
Edirəm aləmi inkar, əlimdən çıxdı.

Tuti tək dillənər idi gecə-gündüz Şahin,
Qoy dili lal ola, dildar əlimdən çıxdı.

*13.04.2000*

✦✦✦

Xilqət içrə eləsi varmı adamdan yaxşı?
Görəsən yaxşı nə var yaxşı məramdan yaxşı?

Məni dünyayə verən Fazili tez-tez anıram,
Halalı daima bilmişdi haramdan yaxşı.

Babamın yoxluğuna dözmədi biçarə nənəm,
Nənəmə munis olan yoxdu babamdan yaxşı.

Deyiləm Cəm, fələyim, tazə cihaz icad et,
Cahanı göstərə bilsin mənə camdan yaxşı.

Mənə uç, məndə alov var elə, ey pərvanə,
Atəşə qərq edərəm mən səni şamdan yaxşı.

Ey fəzl sahibi, çox yaxşı kəlamlar tapdın,
Yenə tap yaxşı kəlam yaxşı kəlamdan yaxşı.

Salamı hər kəsə verdim geriyə qaytardı,
Şahina, görməyirəm heç nə salamdan yaxşı.

*22.05.2000*



Çıxdı gül, açdı çiçək, yetdi bahar əyyamı,
Bağiban, hör hasarı, çatdı hasar əyyamı.

Bürümüşdü yeri ağ yorğana qış, indi isə
Yerini tərk eləyibdir gülə qar əyyamı.

Sevgidən şölələnir gözləri çox-çox sevənin,
Bəh ki, naz ilə yetişməkdə xumar əyyamı.

Öndə eşq nərdi və əllərdə məhəbbət zəri var,
Başlanıbdır yenə şövq ilə qumar əyyamı.

Çal-çağırdır yenə, heç nə əbədi olmasa da,
Əbədi olmalıdır "Şur"ü "Qatar" əyyamı.

Gəncliyimdə vətənin xiffətini çox çəkdim,
Neçə müddət məni zar etdi qübar əyyamı.

Saçlarımda gümüşüm var, gümüşümdə əməyim,
Məni zəngin eləyibdir belə var əyyamı.

Təb gəldi, əlimi heç də qabar qorxutmur,
Şahinəm, başlanacaq indi qabar əyyamı.

*17.06.2000*



Dərd əhlinə dərman eləyər istəsə Tanrı,
Hər xəstəni loğman eləyər istəsə Tanrı.

Cananəni ifritəsifət etməyə qadir,
İfritəni canan eləyər istəsə Tanrı.



Quran oxudar kafərə islah eləməkçin,
Şeytanı müsəlman eləyər istəsə Tanrı.

Fironları dünya evinin indi də vardır,
Fironlara fərman eləyər istəsə Tanrı.

Hər məscidi abad eləyər Kəbə misalı,
Meyxanəni viran eləyər istəsə Tanrı.

İstərsə biyabanı edər qərq gülə, ya
Gülzarı biyaban eləyər istəsə Tanrı.

Mərcanı dəyirmandakı dən tək üyüdüb də,
Adi daşı mərcan eləyər istəsə Tanrı.

Şahin ki, qəzəl mülkünə bir bəndədi aciz,
Ol bəndəni sultan eləyər istəsə Tanrı.

*18.07.2000*



Geydi elə ki, əyninə cananə libası,
Az qaldı həvəsdən alışıb yanə libası.

Torpağı yaşıl məxmərə bənzər, gülü əlvan,
Kim geydirib, ey gül, bu gülüstanə libası?

Boldursa da hərçənd libasım, mənə xoşdur
Məscid libası ilə meyxanə libası.

Şəmin oduna bəlkə də yanmaz idi böylə
Geysəydi əgər əyninə pərvanə libası.

Dilbər, geyimin öylə alıb əqlimi başdan
Bir gün geyərəm mən dəxi divanə libası.

Zəngindi bəşər gör necə, bir yarpaq olubdur
Həvva nənə, Adəm babanın canə libası.

Hər duyğudan üstündü həya duyğusu, Şahin,
Geydirdi həya duyğusu insanə libası.

*9.09.2000*



Saqi, hanı mey camı, uzaqmı?
Pərvanə gəlir, şamı uzaqmı?

İqbalı neçin qarə göründü,
Ağ günlərin Ağdamı uzaqmı?

Çox dərdə yaxın əlac tapıldı,
Eşq dərdinin əncamı uzaqmı?

Bilmir yaza bir şer o "şair",
Biçarənin ilhamı uzaqmı?

Sahibzamanın bəşər xüsusda
Fərmanı, sərəncamı uzaqmı?

Yer kürrəsinə yeganə din tək
Peyğəmbərin islamı uzaqmı?

Şahin dama qonmaq istər, ey Rəbb,
Yeddinci göyün damı uzaqmı?

*17.09.2000*



Eykaş, "xəyanət" sözü əfsanə olaydı,
Aşiqlərimiz pisliyə biganə olaydı.

Şərtdirsə də cananədə cananəlik, amma
Cananələrin hər biri mərdanə olaydı.

Güllər saçının ətrini vermir mənə, ey yar,
Ətrinlə rəqabət aparan nanə olaydı.

Aşiqlərin, ey eşq, riya bilməyə idi,
Aşiqlərin, ey eşq, səmimanə olaydı.

Elm eşqi, muğam eşqi, diyar eşqi, yar eşqi...
Qismət bu qədər eşq hər insanə olaydı.

İfrat zərərdir, mənim eşqimdə var ifrat,
Eşqin zərəri hey bu sevən canə olaydı.

Yarım dedi: - Şahin həmişə "eşq" deyir, kaş
Divanə olanlar belə divanə olaydı.

*23.02.2001*



Hər pəri, ey Qeys, şöhrət, hər pəri şan olmadı,
Heç pərişan sən pərişan tək pərişan olmadı.



Amma bəxtin var imiş, Leylayə qurban olmusan,
Çox Qeyslər görmüşük Leylayə qurban olmadı.

Sevmisən, xoşbəxt imişsən, ey sevənlər sərvəri,
Eşq meydanında çox bədbəxtə meydan olmadı.

Mərhəba, ibni-Salam əğyar yox, Aşiq imiş,
Hansı əğyarı cahanın eşqə nöqsan olmadı?

Nofəlim, sən mərd imişsən, mərdə əhsənlər düşür,
Mərdlər çox var, amma dərdə dərman olmadı.

Ey Füzuli, yanə-yanə bağladın "Divan"ını,
Hansı şair var ki, bağrı cıyərqan olmadı?

Var bir dərdim mənim: Yox öylə aşiqlər daha,
Dərdimi izhar qıldım, xəlqə pünhan olmadı.

Şahinəm mən, qəbrin istərdim ziyarətgah edəm,
Tapmadım mən qəbrini, ey Qeys, imkan olmadı.

*2.03.2001*



Giriftarəm bu gün hicrə, xilaskarım tapılsaydı!..
Cəfakarım yaman çoxdur, vəfadarım tapılsaydı!..

Bilir hal əhli rəftarım mənim incəydi, sərt oldum,
Hanı rəftarım, ey zalım, o rəftarım tapılsaydı!..

Hanı "inkarı inkar" adlanan düstur, vardırmı?
Mən inkar eylədim inkarı... İnkarım tapılsaydı!..

Müdam ilham pərisi adlanan bir yarə məftundum,
Nə oldu, harda qaldı, hardadır, yarım tapılsaydı!..

Deyildir şakərim güldən-gülə qonmaq, bilənlər var,
Çəmənsiz bülbüləm tənha, çəmənzarım tapılsaydı!..

İnamım qeybə çıxmışdır mənim billah, inam öldü,
Mənim eşq adlı varım var idi, varım tapılsaydı!..

Nə gün gördüm cahan mülkündə mən bədbəxt, ey Şahin,
Xərab olmaqdadır can mülkü, memarım tapılsaydı!..

*12.04.2001*

✦✦✦

Yar getdi, könül, ol sən əmin, söhbəti qaldı,
Xatirdə ömürlük sənəmin söhbəti qaldı.

Əfsus, fərəh söhbətini eylədi, getdi,
Biçarə canım, indi qəmin söhbəti qaldı.

Söhbətlərimiz eşqü məhəbbətdən olardı,
Söhbət ki həmin idi, həmin söhbəti qaldı.

Şəkliylə danışdım öpərək şəklini hər dəm,
Min söhbəti oldu, yenə min söhbəti qaldı.

Çoxdandı sinəm sinəsinə həsrət olubdur,
Yar sinəsi ilə sinəmin söhbəti qaldı.

Qürbətdə idim mən nənəm öldükdə, uzaqdım,
Heyfa ki, mənimlən nənəmin söhbəti qaldı.

Coşğundu səsim, gör necə ahəstələnibdir,
Zil - söhbəti qurtardı, bəmin - söhbəti qaldı.

Şahin, yanıram şəm təki, pərvanəsə gəlmir,
Pərvanə buyursun ki, şəmin söhbəti qaldı.

*21.05.2001*

✦✦✦

Xəzan əsdi, gülümdən güclü çıxdı,
Gülümdən, sünbülümdən güclü çıxdı.

Təvan uçdu əlimdən, natəvanım,
Təvansızlıq əlimdən güclü çıxdı.

Sevinc olmur müyəssər söyləyim ki,
Qəmimdən, nisgilimdən güclü çıxdı.

Dilim bülbül kimi cəh-cəh vurardı,
Sükut, eyvah, dilimdən güclü çıxdı.

Gözüm görmür, sönüb məşəl gözümdə,
Qaranlıq məşəlimdən güclü çıxdı.



Qürur hissi neçin Şah Ismayıldan,
Neçin Sultan Səlimdən güclü çıxdı.*

Xətayim, Şahina, ölmüşmü? Yox, yox,
Ölümsüzlük ölümdən güclü çıxdı.

*10.06.2001*

✦✦✦

Dağa mərdanəni göndər ki, aşa sağ - dağı,
Fəth edə bilməyəcəkdir axı qorxaq dağı.

Qoparırmış ulu şair dağı dırnağı ilə **,
Görəsən ram eləyə bildimi dırnaq dağı?

Fələyin caynağı güc rəmzidi, qüvvət rəmzi,
Qaldıra bilməz idi yoxsa o caynaq dağı.

Zirvə sevdasına düşmək ağır işdir, qardaş,
Bağça zənn eyləmə, ya fikr eləmə bağ - dağı.

Yarıram Şahdağı mən, hər tikəsi tunc kimidir,
Sən isə yarmadasan amma ki yumşaq dağı.

Hər dağı doğmaq üçün hamilə olmuş torpaq,
Sanma ki, rahət ucaldıb göyə torpaq dağı.

Dağ önündə dayanıbdır, özü dağdır Şahin,
Əvvəl-axır yaracaqdır deyəsən dağ dağı.

*26.06.2001*

✦✦✦

Nə bəla çəkmişəm, ey yar, bilirsən yaxşı,
Etmişəm mən sənə izhar, bilirsən yaxşı.

Bu cavan yaşda mənim başıma sürətlə belə
Nə səbəbdən ələnib qar, bilirsən yaxşı.

Ayrı düşmək uzun illər vətənimdən, səndən
Mənə zülm eylədi aşkar, bilirsən yaxşı.

Indi bitmişsə də hicran hələ bitmir dərdim,
Nə qədər qüssələrim var, bilirsən yaxşı.

---

*1514-cü ildə türkün türkü qırdığı qardaş qırğınına - Çaldıran döyüşünə işarədir.
** "Kuhkən künd eyləmiş min tişəni bir dağ ilən,
Mən qopardıb salmışam min dağı bir dırnaq ilən".
**Məhəmməd Füzuli**

Əyridir göydə hilal, yerdə sual tək qəddim,
Ermәni oldu səbəbkar, bilirsən yaxşı.

Igid övladımız hər dəfə şəhid olduqca
Oluram mən nə qədər zar, bilirsən yaxşı.

Ümidim var ədalət çala tezliklə zəfər,
Etmirəm mən bunu inkar, bilirsən yaxşı.

Çox cəfa çəkdi bu aləmdə bu Şahin Fazil,
Az qalıb ömrümə, ey yar, bilirsən yaxşı.

*17.08.2001*

✦✦✦

Dilləndi dilim yar geyən dəmdə libası:
Olmaz belə heç kimsənin aləmdə libası!

Kim musiqidə mən kimi çılpaqlığı görmüş?
Görməkdədi kim "Şur"də, "Dilqəm"də libası?

Üryan eləyir sinələri matəm olanda,
Əllər görürəm parələyir qəmdə libası.

Divanə olan Qeysə bir az bənzəmək üçün
Qayçıyla kəsir bir neçə sərsəm də libası.

Görməkdə bəsirət gözümüz amma bu dəm də
Isadə uzun köynəyi, Məryəmdə libası.

Fəxri geyimiylə öyünən varlı ey insan,
Yarpaq əvəz etmirdimi Adəmdə libası?

Şahin buna şəkk eyləməyir: Kafərə hökmən
Oddan biçəcək dərzi cəhənnəmdə libası.

*7.09.2001*

✦✦✦

Desən yox, "yox" sözün, ey şux, ölüm fərmanı olmazmı?
Mənim canım məgər cananəmin qurbanı olmazmı?

Sənin qəsrin, yarım, bağlı, izn ver, yollarım bağlı,
Qulam mən qollarım bağlı, qulun sultanı olmazmı?



Səsin sussa - kar ollam mən, gözün sönsə - kor ollam mən,
Karın dərmanı olmazmı, korun loğmanı olmazmı?

Adamlar var yalağ olmuş, bəd işlərlə calağ olmuş,
Qəzəl bağı alağ olmuş, bağın bağbanı olmazmı?

Xəzan hal qoymayıb bizdə, solubdur lalə-nərgiz də,
Yox olmuşdur cüyür düzdə, çölün ceyranı olmazmı?

Sənin, ovçu, qolun sınsın, xarab olsun tüfəngin qoy,
Dağım var qaldı tərlansız, dağın tərlanı olmazmı?

Dəmadəm söz külüngüm sancılır əğyar olan şəxsə,
Gözəllər gəlsə təngə onların üsyanı olmazmı?

Dedim: - Divan yazımmı şəninə? - dilləndi dildarım:
- Bu cür divanənin, Şahin, məgər divanı olmazmı?

*18.09.2001*

✦✦✦

Qəmsizliyə əhsən ki, bu gün qəm yoxa çıxdı,
Hər dəm bürüyən gözlərimi nəm yoxa çıxdı.

Həmdəmdi dəmadəm mənə dərdim neçə müddət,
Könlümdəki dərd adlı o həmdəm yoxa çıxdı.

Pis halə salan aşiqi nalə - hanı nalə?
Fəryad tükəndi və kədər həm yoxa çıxdı.

Əfğan elə eylərdi güman ömrü uzundur,
Möhkəm necə gəlmişdisə möhkəm yoxa çıxdı.

Saqqalı təraş eyləməsəm də, elə şadəm
"Məcnuni" olan məndəki görkəm yoxa çıxdı.

Girdim bağa, güllər üzə güldü, çiçək açdı,
Tər qönçələr üstündəki şəbnəm yoxa çıxdı.

Inkar eləmirsən daha sən cənnəti, Şahin,
Aləm ki cəhənnəmdi, cəhənnəm yoxa çıxdı.

*26.10.2001*



*Nazilə Fazilə!*

Ağla ki, aldı əlindən məzarıstan ananı,
Ey yetim, verməyəcəkdir geri dövran ananı.

Xoş vüsal etmiş idi qəlbi sevincək, heyfa,
Indisə aldı əlindən acı hicran ananı.

Acıdır indi bu dünya ki, şirin idi mənə,
Bir şəkər tək itiribdir şəkəristan ananı.

Dərdimin çarəsi yoxdur deyirəm dünyadə,
Rəbbimiz bilmiş idi dərdimə dərman ananı.

Günlərin bir günü ismim belə yaddan çıxsa,
Unuda bilməyəcəkdir bu həzin can ananı.

Ananın rayihəsindən yazan olsa deyərəm:
Andırır bağda çiçək, bağçada reyhan ananı.

Dağa, torpağə, daşa Azəribaycan dedilər,
Bilmədə Şahin isə Azəribaycan ananı.

*24.12.2001*



*Ata cəfakeşi*
*Əkrəm Məmmədəminoğluya!*

Günlərin bir günü tərk etsə əgər can atanı,
Can kimi daima sevsin gərək insan atanı.

Dərdimin çarəsi yoxdur, bilirəm indi fəqət
Tanrı etmişdi bütün dərdimə loğman atanı.

Deməsinlər ki, neçin böylə pərişan oluram,
Arabir eyləmişəm çünki pərişan atanı.

Tutmuşam mən ətəyindən kölə tək sultanın,
Səd heyf, bilməmişəm mən mənə sultan atanı.



Atamı güclü bilirdim bütün insanlardan,
Düşünürdüm yıxa bilməz yerə aslan atanı.

Atamız etdi ata bizləri ki, sevməliyik
Qəlbdə hər nə qədər var isə imkan atanı.

Bir kaman tək əyilib qəddi ki, yoxdur atası,
Şahinin aldı əlindən acı hicran atanı.

*25.12.2001*

## BAHARIYYƏ

Təslim etdi elə ki qış yerini novbahara,
Qarışıb torpağa qar yar saçı tək oldu qara.

Hələlik öz yerini tərk eləyib hopdu yerə,
Xəbəri yox ki, bir azdan dönəcəkdir buxara.

Suların üstünü örtüb hələ... çox çəkməyəcək
Olacaqdır iri buz parçaları parə-para.

Baba ki, "Şaxta" qoşulmuş adının əvvəlinə,
Üç fəsildən sora təzim edəcək burda qara.

Bu tərəflər gülər üzlə çıxacaq qarşısına,
Etibar sahibi etməzmi əməl etibara?

Gözləyənlər baharın gəlməsini şad olacaq,
Ulu Tanrı təzədən son qoyacaq intizara.

Qış nəfəs çəkdi dərindən, əridi buz nəfəsi,
Dəmbədəm tazə nəfəs gəldi qoca ruzigara.

Torpağın sinəsi altında toxumlar cücərib,
Yamyaşıl rəngə boyandırdı yeri aşikara.

Başladı sərçələrin cik-ciki, cikkiltiyə bax,
Qarğalar "qarr" eləyib uçdu uzaq bir diyara.

Əsərək gahi xəfifcə daradı saçlarımı,
Gah iti əsdi külək, sanki dönübdür çapara.

Çal-çağır vədəsi yetdi, sevişir qız, oğlan,
Çalınır tarü kamança, döyülür dəf, nağara.

Elə ki açdı qızılgül qızıl oldu hər yan,
Əqlimi, huşimi az qaldı başımdan apara.

Yerbəyerdən neçə gül göylərə baş qaldırdı,
Gül - bahar gəldi hara, altda yerin qaldı hara?

Gül çoxaldıqca bağın sinəsi gülzar oldu,
Lalə artdıqca çəmən bənzəmədə taləzara.

Dağılıbdır sürülər düzlərə, dağlar döşünə,
Durnalar gör necə səf-səf düzülüblər qatara.

Güllərə dəyməyə, eykaş, nəzəri əğyarın,
Lalənin bağrı qara, bədnəzərin qəlbi qara.

Neçə müddətdi ki, gəlmirdi şirin avazı,
Gül görən bülbülü gör, döndü həmən nəğməkara.

Ucalan güllərə baxdıqca qəzəbləndi elə,
Sarmaşıq həm ağaca açdı ayaq, həm hasara.

Coşdu ilham, əlimi bir də qabar etdi qələm,
Əlini bağibanın bel təzədən etdi yara.

Ötəcək vaxt mən əgər şeri bu cür ləng yazsam,
Novbahar öz yerini tərk edəcəkdir bahara.

*13-15.12.1996*

## FARSCA ŞERLƏR

Fəsli-gol aməd-o oşşaq ra hoşyar konim,
Gəşti-golzar rəvim, seyri-çəmənzar konim.

Ektefa mostəhəbəst, mötəkefi-yar şəvim,
Hər ke hər çe tələbəd, ma tələbi-yar konim.

Canəm əz dəst berəft - o şodeəm dəsttohi,
Beforuşim çe məta vey ra xəridar konim?

Dustan əz tərəfi-man səzavar şodənd,
Nasəza ra çe səzayist səzavar konim?
Mordeyi-mey şode əyyaş çe guyəm xizəd?
Ma çenin xofte ra əz xab çe bidar konim?



"Eyn"im - o, "şin"im - o, "qaf"im ze sər ta pa ma,
In horufi ra horufi şode təkrar konim.

Qəzəli-Hafez - o Sədi çe geranmayetərəst!..
Qəzəliyyati-do Şirazi-ra meyar konim.

"Nist dər xoşk-o təri bişeyi-mən kutahi,
Çubi-hər nəxl ke mənbər nəşəvəd dar konim"*.

Mən betorki qəzəli-xas sorudəm, Şahin,
Qəzəli-ra ke təqəllod şode enkar konim!

*29.12.1996*



*"Buyi-cuyi Movliyan ayəd həmi,*
*Yad yari-mehriban ayəd həmi".*
**Rudəki**

Rah dehid, bağiban ayəd həmi,
Suyi-gol-o golsetan ayəd həmi.

Firqəti-u kərd məra nagoman,
Həst gomanəm goman ayəd həmi.

Can ze tənəm rəfte coda gəşte bud,
Tən ze vorudəş be can ayəd həmi.

Pir nəbudəm, şodeəm pirtər,
Yari-cəvanəm cəvan ayəd həmi.

Ruhi-rəvanəm bodi ənduhgin,
Ruhi-rəvanəm rəvan ayəd həmi.

Aya, koca rəft pərişlaniəm?
Şad şodəm, şadiman ayəd həmi.

Çeşm derəxşəndetərəst, guiya
Suyi-zəmin kəhkəşan ayəd həmi.

Dovr-o bərəm gəşt sefid, Şahina,
Mahi-xoda z-asiman ayəd həmi.

*2.01.1997*

* Beyt məşhur Iran şairi Nəziri Nişapurinindir.

# MÜXTƏLIF ŞERLƏR

## GƏLIB ÇIXMADIN

Günorta gəlməyi vəd eləmişdin,
Günəş düz başımın üstündə idi,
Gəlib çıxmadın.
"Gəlib sağaldaram səni" demişdin,
Sənin bu aşiqin pis gündə idi,
Gəlib çıxmadın.

Gün başım üstündən əyildi yana,
Sürüşüb qürubun üstündə durdu.
Yenə od vururdu intizar cana,
Gündüzüm qaralıb qürub olurdu.

Rəhmin bir zərrədir gözəgörünməz,
İnsafın iynənin ucundan kiçik.
Neçin mərhəmətin gözə görünməz?
Həsrət böyüdükcə biz kiçilmişik.

İntizar mərəzi yoluxub mənə,
Təbibim, ən ağır xəstə mənmişəm.
Görəsən bəllimi, bəllimi sənə
Sənin həsrətinlə xəstələnmişəm?

Yenə bir görüşə fəraq yazıldı,
Hicran vəsli qovub necə də gəldi,
Gəlib çıxmadın.
Gündüzün nizamı yenə pozuldu,
Nizam-intizamla gecə də gəldi,
Gəlib çıxmadın.

*18.09.1995*

## ZAMAN YARAMIZI SAĞALTMAYACAQ

Fəğana düşmüşük düşüb aralı,
Fəğan yaramızı sağaltmayacaq.
Sən də yaralısan, mən də yaralı,
Zaman yaramızı sağaltmayacaq.

Fəraq yarasından yenə qan gəlir,
Günlər bir-birindən pərişan gəlir,
Xeyir görünməyir, hey ziyan gəlir,
Ziyan yaramızı sağaltmayacaq.

Bahar xəzan olub, xəzan görürəm,
Əhdin gülü solub, tikan görürəm.



Gerçəyə bənzəyən yalan görürəm,
Yalan yaramızı sağaltmayacaq.

Aradan ayrılıq dumanını qov,
Hicrin yaxşısı yox, yamanını qov,
"Hər şey unudulur" gümanını qov,
Güman yaramızı sağaltmayacaq.

Kərəm alovlanır, Əsli, harayla,
Canım oda yanır, Əsli, harayla,
Sən də Şahin kimi vəsli harayla,
Hicran yaramızı sağaltmayacaq.

*20.09.1995*

## YUXUDAN OYANMAQ ISTƏMIRƏM MƏN

İstərəm biryolluq yumum gözümü,
Yuxudan oyanmaq istəmirəm mən.
O biri dünyada görüm özümü,
Yuxudan oyanmaq istəmirəm mən.

Kaş bütün yatanlar oyanıb dura,
Günəşin nuruna boyanıb dura,
Əcəlsə yaxında dayanıb dura,
Yuxudan oyanmaq istəmirəm mən.

Bir hicran ümidi para eləyib,
Bir loğman qəlbimi yara eləyib,
Bir canan günümü qara eləyib,
Yuxudan oyanmaq istəmirəm mən.

Bir daha səhərim açılmasın qoy,
Baxışım, nəzərim açılmasın qoy.
Kipriklər çəpərim açılmasın qoy,
Yuxudan oyanmaq istəmirəm mən.

Niyyət mənzilinə müstəqim gedir,
Niyyətim, mənzilim istəyimcədir,
Kimin nə borcuna istəyim nədir,
Yuxudan oyanmaq istəmirəm mən.

Qəlbimə dola qəm sonuncu dəfə,
Gözümü tuta nəm sonuncu dəfə,

Yatmaq istəyirəm sonuncu dəfə,
Yuxudan oyanmaq istəmirəm mən.

Qoy kimsə etməsin and-aman mənə,
Sifariş yollayıb asiman mənə...
Yuxu son ümiddir, son güman mənə,
Yuxudan oyanmaq istəmirəm mən.

Qara ağ olmadı, oldu ağ qara,
Günümü elədi necə dağ qara,
Qara bəxtim kimi Qarabağ qara,
Yuxudan oyanmaq istəmirəm mən.

Necə rəzaləti görməmək üçün,
Necə xəyanəti görməmək üçün,
Necə qəbahəti görməmək üçün,
Yuxudan oyanmaq istəmirəm mən.

Mən piyada oldum, atlı - arzular,
Itdi xoş ümidlər, batdı arzular,
Uyudu diləklər, yatdı arzular,
Yuxudan oyanmaq istəmirəm mən.

Pəsənd eləsə də çoxu dərmanı,
Yaxına qoymazdım axı dərmanı...
Içərək bir ovuc yuxu dərmanı,
Yuxudan oyanmaq istəmirəm mən.

Neyləyim, bir adəm eşitmir məni,
Səslərəm dəmadəm, eşitmir məni,
Xudavəndi-aləm eşitmir məni,
Yuxudan oyanmaq istəmirəm mən,
Yuxudan oyanmaq istəmirəm mən.

*5.10.1995*



## SƏNƏ ŞER YAZA BILMIRƏM DAHA

Belə yandırmazdı sevən sevəni,
Sənə şer yaza bilmirəm daha.
Elə soyutmusan özündən məni,
Sənə şer yaza bilmirəm daha.

Yaxşı bir başlanğıc yamanda bitdi,
Ümid də qurtardı, güman da bitdi,
Sənə həsr etdiyim "Divan" da bitdi,
Sənə şer yaza bilmirəm daha.

Hanı ünsiyyətin, hanı ülfətin?
Belə dərdə dözmək mənə çox çətin!
Baisi özünsən bu müsibətin,
Sənə şer yaza bilmirəm daha.

Bağbana yazıram, bağa yazıram,
Çobana yazıram, dağa yazıram,
Köksümə çəkdiyin dağa yazıram,
Sənə şer yaza bilmirəm daha.

Hanı bu aşiqin o xoş, çağ günü?
Qapqara olubdur ağappaq günü,
Vəsf edə bilmirəm daha hüsnünü,
Sənə şer yaza bilmirəm daha.

Sənsiz dəli idim, divanə idim,
Sənin şam hüsnünə pərvanə idim,
"Bilməmək" sözünə biganə idim,
Sənə şer yaza bilmirəm daha.

Səni xatırlayıb hər an yazardım,
Sevgidən yazardım, yasdan yazardım,
Bir gündə sənə bir dastan yazardım,
Sənə şer yaza bilmirəm daha.

Tutiydim, sözlərin şəkkərim idi,
Hər kəlmən, ibarən əzbərim idi,
Sənə şer yazmaq şakərim idi,
Sənə şer yaza bilmirəm daha.

Fələyin gərdişi dönə bilərmiş,
Təb quşum pərvazdan enə bilərmiş,
Alışan ilhamım sönə bilərmiş,
Sənə şer yaza bilmirəm daha.

Əməl eləmədin sözünə özün,
Təəccüb etmirmi sözünə sözün?
Yamanlıq elədin özünə özün,
Sənə şer yaza bilmirəm daha.

Qoy məni tək görüb gülşən qınasın,
Qızılgül qınasın, süsən qınasın,
Dost rişxənd eləsin, düşmən qınasın,
Sənə şer yaza bilmirəm daha.

Qəlbimdə söndürdün şer közümü,
Hanı şair gücü, aşiq dözümü?
Aciz bilməz idim belə özümü,
Sənə şer yaza bilmirəm daha.

Xəyal uçur göyə, yadımdan çıxır,
Bilmirəm heç niyə yadımdan çıxır...
Ay aman, qafiyə yadımdan çıxır,
Sənə şer yaza bilmirəm daha.

*21.11.1995*

## GÜLÜM, SƏN GÜLÜRSƏN, MƏN AĞLAYIRAM

*(Bir türk şerinin təsiri ilə)*

Məni ağladırsan gülə-gülə sən,
Gülüm, sən gülürsən, mən ağlayıram.
Bəlkə insaf edib yola gələsən?
Gülüm, sən gülürsən, mən ağlayıram.

Yar peymanı elə, yar andı belə...
Qəlbimdə göynəyən yarandı belə...
Bu təzad nə təhər yarandı belə,
Gülüm, sən gülürsən, mən ağlayıram.



Eşq asan deyilmiş hər aşiq kəsə,
Məhəbbət cəbr imiş, sevgi həndəsə...
Bir sevinc bölərdik sənlə, indisə
Gülüm, sən gülürsən, mən ağlayıram.

Sübhəcən tökürəm gündə göz yaşı,
Şeh tək parıldayır gündə göz yaşı...
Səndə göz işığı, məndə göz yaşı,
Gülüm, sən gülürsən, mən ağlayıram.

Gülürsən pərişan üz görə-görə,
Hər şerimdə acı söz görə-görə...
Evimi yıxırsan göz görə-görə,
Gülüm, sən gülürsən, mən ağlayıram.

Kaş qala həmişə gendə sızıltı,
Bilməsin hər sevən bəndə - sızıltı,
Səndə təbəssüm var, məndə - sızıltı,
Gülüm, sən gülürsən, mən ağlayıram.

Bir gün görəcəksən Məcnun tək həm mən
Möhtəşəm bir eşqin fövqündəyəm mən,
Elə eləmə ki, onda deyəm mən:
Gülüm, mən gülürəm, sən ağlayırsan,
Gülüm, mən gülürəm, sən ağlayırsan...

*26.11.1995*

## ÖNÜNDƏ ƏL AÇIB DILƏNÇI KIMI...

Niyə duymayırsan bu istəyimi,
Sədəqə umuram gözəlliyindən.
Önündə əl açıb dilənçi kimi
Sədəqə umuram gözəlliyindən.

Gedirsən üzünü yana döndərib,
Sevən bir ürəyi qana döndərib,
Sənə gözəlliyi təbiət verib,
Sədəqə umuram gözəlliyindən.

Dikilib gözlərim, gülüm, dik sənə,
Sən də gözlərini mənə diksənə,
Havayı verilib gözəllik sənə,
Sədəqə umuram gözəlliyindən.

Bir şair diləyi yaralı qalıb,
Bir aşiq ürəyi yaralı qalıb,
Əlim ətəyindən aralı qalıb,
Sədəqə umuram gözəlliyindən.

Hövsələm tükənib, taqətim qaçıb,
Bir təmənna mənim dilimi açıb...
Dizimi qatlayıb, əlimi açıb
Sədəqə umuram gözəlliyindən.

Hanı qədir-qiymət, səbir tərk olur,
Qiymət bazarında qədir tərk olur...
Neçin gözəllərin əli bərk olur,
Sədəqə umuram gözəlliyindən.

Yoxmudur Şahinin məgər çarası?
Yanından düz ötür ciyərparası.
Sən ey gözəllərin Hacı Qarası,
Sədəqə umuram gözəlliyindən.

*31.12.1995*

## "MƏCMƏÜŞ-ŞÜƏRA"YA!

*Çox hissəsi qalmış suda bir buz dağıyam mən,*
*Qafillərimiz var hələ bilmir nələrim var.*

***Bir qəzəlimdən***

*Ey-y-y, yaxşı eşit sən də, yoxdursa fəzl səndə,*
*Şahin ola bilsən də, Fazil ola bilməzsən.*

***Bir qəzəlimdən***

Hər bağban çalışır öz bağçasında,
Görünmür əməkdən, zəhmətdən uzaq.
Mən də bir bağbanam söz bağçasında,
Qibtədən aralı, qiybətdən uzaq.



Sözündə gözüm yox mənim heç kəsin,
Bəllidir sözümün odu, atəşi.
"Məcməüş-şüəra" adlı məclisin
Sadə bir üzvüyəm, bir cəfakeşi.

Adi görünürəm çox gözlərə mən,
Dinib-danışmamaq qəbahət daha.
Təvazödən uzaq olsa da, həmən
Məlumat verməyim zərurət daha.

Şer ümmanımın dibinə baş vur,
Fikrim üzdə deyil, fikrim dərində.
Elmi əsərlərim nəşr olunubdur
Dünyanın müxtəlif ölkələrində.

Yetkinlik dövrümə yetmişəm bu gün,
Mənəm! Mənliyimi dərk etmişəm mən.
Şerim, şairliyim elmimdən üstün,
Elmim, alimliyim şairliyimdən.

Sadə qəzəllərə meydan yox idi,
Mənəm saf əruza meydan yaradan.
Yüz ildən çoxdur ki, "Divan" yox idi,
Mənəm bu əsrdə "Divan" yaradan.

Təqlidə qoşulmaq məndən qaçaqdır,
Mənəm müəllifi neçə bəyanın.
Həyatda öz izi qalmayacaqdır
Başqa iz üstündə addımlayanın.

Üzlərə baxaraq təəccüblə mən
Həsədə mübtəla gözlər görürəm.
Kitabım çıxanda fərəhlənməyən
Sifətlər görürəm, üzlər görürəm.

Şairin özünü əks edir kitab,
Zərin özündədir zərin dəyəri.
Böyük olmayacaq qocalsa da lap
Böyük şairlərin təqlidçiləri.

Sevərək həmişə fəxr eləmişəm
Elimin Seyidi, Sabiri ilə.
Xalqı alimiylə tanıyır aləm,
Xalqı tanıyırlar şairi ilə.

Mənim on üç ilim firqətdə keçib,
Bəxtinə düşməsin fəraq heç kəsin.
Bütün cavanlığım qürbətdə keçib,
Barı qocalığım qürbət görməsin.

Sizlə birgə olmaq zülaldır mənə,
Sizlə zəhər içsəm şərbət olacaq.
Sizinlə görüşüm vüsaldır mənə,
Sizdən ayrılığım qürbət olacaq.

Hər bağban çalışır öz bağçasında,
Görünmür əməkdən, zəhmətdən uzaq.
Mən də bir bağbanam söz bağçasında,
Qibtədən aralı, qiybətdən uzaq.

*17-18.01.1996*

## MƏNIM MƏHƏBBƏTIM SINDI GÜZGÜ TƏK

Sanırdım həmişə şəffaf olacaq,
Mənim məhəbbətim sındı güzgü tək.
Deyirdim ömürlük bütöv qalacaq,
Mənim məhəbbətim sındı güzgü tək.

Hissin ən alisi, başı atıldı,
Sevda üzüyünün qaşı atıldı,
Üstünə laqeydlik daşı atıldı,
Mənim məhəbbətim sındı güzgü tək.

Şöhrətim sınsaydı dözə bilərdim,
Şövkətim sınsaydı dözə bilərdim,
Qamətim sınsaydı dözə bilərdim,
Mənim məhəbbətim sındı güzgü tək.

Bir qəlb bu yaranı yara sanmadı,
Sanıram ürəyi yaralanmadı,
Onun məhəbbəti paralanmadı,
Mənim məhəbbətim sındı güzgü tək.



Mən kiməm? Aləmin bir qara günü,
Məhəbbət üzgünü, sevda üzgünü.
Calamaq çətindir sınan güzgünü,
Mənim məhəbbətim sındı güzgü tək.

Bütün gözəllərin vəfası yoxmu?
Gözəl vəfasızsa şəfası yoxmu?
Güzgü sındıranın cəzası yoxmu?
Mənim məhəbbətim sındı güzgü tək.

Ülvi bir məhəbbət yetişdi sona,
Müəmma deyimmi, yoxsa sirr buna?
Qanun məcəlləsi nə deyir buna?
Mənim məhəbbətim sındı güzgü tək.

Fəna şərbətini içdiyi zaman,
O biri dünyaya köçdüyü zaman,
Nə cavab verəcək güzgü sındıran?
Mənim məhəbbətim sındı güzgü tək.

Sındı, bir məhəbbət ziyana düşdü,
Könül bu sınıqdan fəğana düşdü...
Görən, sınıqları hayana düşdü?
Mənim məhəbbətim sındı güzgü tək.
Sındı güzgü tək.

*25.01.1996*

## BAŞIMI KƏSƏCƏK SEVGI QILINCI

Əzizim, sonu var hər bir yolun da,
Başımı kəsəcək sevgi qılıncı.
Şəhid olacağam sevgi yolunda,
Başımı kəsəcək sevgi qılıncı.

Üstümə əlvida çəni enibdir,
Kəfənim hazırdır, ütülənibdir,
Qılıncın tiyəsi itilənibdir,
Başımı kəsəcək sevgi qılıncı.

Kimsə mənim kimi aşiq deyildi,
Vəfalı deyildi, sadiq deyildi,
Başım kəsilməyə layiq deyildi,
Başımı kəsəcək sevgi qılıncı.

Məni hicran əli üzə bilmədi,
Mənə səmum yeli əsə bilmədi,
Hətta misri qılınc kəsə bilmədi,
Başımı kəsəcək sevgi qılıncı.

Sanki eşq yolunda cəfa az imiş,
Iztirab az imiş, cəza az imiş,
Başımın çəkdiyi bəla az imiş,
Başımı kəsəcək sevgi qılıncı.

Kəssin, məndə nə and-aman olacaq,
Nə ah-vay olacaq, əfğan olacaq,
Başım məhəbbətə qurban olacaq,
Başımı kəsəcək sevgi qılıncı.

Kimdi Şahin Fazil? Zülfü qar kimi,
Qeyri həmdəmi yox onun yar kimi,
Enəcək üstümə zülfüqar kimi,
Başımı kəsəcək sevgi qılıncı.

*21.02.1996*

## SÖNDÜ ÜRƏYIMDƏ SEVGI ATƏŞI

Mənə bəxş etməyir daha sevgi qəm,
Söndü ürəyimdə sevgi atəşi.
Səni mən bir daha sevməyəcəyəm,
Söndü ürəyimdə sevgi atəşi.

Elə təndir idi, elə ocaqdı,
Məni zülüm-zülüm yandıracaqdı,
Yaxşı ki, göz yaşım üstünə yağdı,
Söndü ürəyimdə sevgi atəşi.



Vüsalı dönəndə görmüsünüzmü?
Hicranı dinəndə görmüsünüzmü?
Ulduzu sönəndə görmüsünüzmü?
Söndü ürəyimdə sevgi atəşi.

Mən ki, tək deyiləm cahan içində,
Qalan Məcnun kimi fəğan içində...
Atəş külə döndü bir an içində,
Söndü ürəyimdə sevgi atəşi.

Qoy bir də bu ürək sevgi bilməsin,
Peyman bağlamasın, əhd edilməsin,
Daha yanmasıda cəhd edilməsin,
Söndü ürəyimdə sevgi atəşi.

Könül, şadlan indi, könül, gül indi,
Bu gündən sazişim təklik iləndi,
Üstünə əlvida suyu çiləndi,
Söndü ürəyimdə sevgi atəşi.

Nə qədər diriyəm, nə qədər sağam,
Sevgimi bir daha anmayacağam,
Şahinəm, yandırıb yanmayacağam,
Söndü ürəyimdə sevgi atəşi,
Sevgi atəşi.

*11.03.1996*

## HƏR GÜLÜN ÖZ ƏTRI VAR...

*"Hər gülün öz ətri var,*
*Nərgizinki başqadır".*
**Tərlan Quliyev**

Bulaq suyu bal kimi,
Dənizinki başqadır.
Şirindir vüsal kimi,
Kəhrizinki - başqadır.

Bağban əməli - gözəl,
Qabarlı əli - gözəl,
Fərlinin gülü gözəl,
Fərsizinki başqadır.

Yazın gəlişi - gözəl,
Gülün gülüşü - gözəl,
Kabul görüşü - gözəl,
Təbrizinki başqadır.

Sənanın eli başqa,
Xumarın dili başqa,
Xosrovun gülü başqa,
Pərvizinki başqadır.

Rəssam, dağı, düzü çək,
Şəkildə gül izi çək,
Qar izi əriyəcək,
Qar izinki başqadır.

Üstümdə gül çətri var,
Şerimdə gül sətri var,
"Hər gülün öz ətri var,
Nərgizinki - başqadır".

*1.04.1996*

## DILININ ƏYLƏCI OLMADI NIYƏ?

Sarmışdı bədbinlik dumanı səni,
Üstünə saçmırdı işığını gün.
Qoydum mən yan-yana ziyanı, səni...
Ziyanımmı üstün, yoxsa sən üstün?

Dedim ziyanıma dözə bilərəm,
Təki sənə dəysin köməyim mənim.
Sevinc əvəzinə hücum etdi qəm,
Neçin hədər oldu əməyim mənim?

Sərvi vəslimizin səmər vermədi,
Eşqimiz uğradı ümidsizliyə.
Əlimin zəhməti bəhər vermədi,
Dilinin əyləci olmadı niyə?

Dilinin əyləci olmadı nədən?
Arada yox idi üçüncü nəfər.
Neçin sirrimizi car elədin sən?
Niyə eşitdilər, neçin bildilər?



Qapandı nə üçün açdığın qapı?
Açıldı nə üçün qapadığın qəm?
Bağlandı nə üçün eşqin kitabı?
Neçin zülmət oldu nurlu bir aləm?

Dilini dişinlə sıxmadın niyə?
Kim səni dilindən tutub çəkirdi?
Axı bu aşiqin səni həmişə
Qüssənin əlindən tutub çəkirdi.

Sənin öz əlinlə yetişdi mənə,
Sənin öz əlinlə yara vurdu eşq.
Axı bu aşiqin oyun naminə
Əyləncə xətrinə aramırdı eşq.

Bir zaman sözümdən xoşun gələrdi,
Bir zaman deyərdin "üzündə nur var".
Bir zaman səsimdən xoşun gələrdi,
Mənə məftun idin açıq-aşikar.

Özün sirrimizi əğyara dedin,
Sarsıldı aşiqin sənə inamı.
Özün öz əlinlə yandırmış idin,
Özün öz əlinlə söndürdün şamı.

*7.04.1996*

## AXIRIN ƏVVƏLI

Vüsaldan mənə nə, sənə nə düşdü?
Mənə az görünən sənə çox imiş.
Axırın əvvəli nə tez yetişdi,
Demək, aramızda sevgi yox imiş.

Şahin zirvəsindən endi aşağı,
Sən də saxlamadın müvazinəti.
Sevgi səadətsə, nə üçün axı
Qoruya bilmədin o səadəti?

Uzaqda olanı yaxına çəkdin,
Qəfil yaxınlaşdı əvvəlin sonu.
Sən mənim qədrimi bilməyəcəkdin,
Gərək əvvəlcədən biləydim bunu.

Nə yaman sarsıtdın inamımı sən,
Nə deyim, nə deyim mənim zənnimə.
"Məni sevirsənmi?" sualı verən
Özü sevməyirmiş məni sən demə.

Neçin sirrimizi dedin nakəsə,
Əbəs dedin əbəs, bilməməliydi.
Bir sirr iki kəsin sirri idisə,
Onu üçüncü kəs bilməməliydi.

Səni məst edərdi mənim nəfəsim,
Ömürlük bu isti nəfəsi unut.
Xoşuna gələrdi həmişə səsim,
Unut, xoşladığın o səsi unut.

Nə sən o adamsan, nə mən o adam,
Bülbülə nə oldu, gülə nə oldu?
Gözünü gözümə dikərdin müdam,
Sevgidən danışan dilə nə oldu?

Görüşə gələrdin boranda, qarda,
Indisə bahardır, görünməyirsən.
Səni harda tapdım, itirdim harda,
Nə "görün" deyirsən, nə "gəl" deyirsən.

Daha görüşsək də olmaz faydası,
Sən yara vurmusan aşiq qəlbinə.
Sevinc əvəz etməz bir də bu yası,
Bir də dəyməyəcək bu sinə sənə.

Qara gün yetişdi, bir də əllərim
O ağ əllərinə toxunmayacaq.
Hey sığalladığın bəyaz tellərim
Qıvrım tellərinə toxunmayacaq.



Daha dolmayacaq vəsfinlə varaq,
Nə sən pərvanəsən, nə də mənəm şam.
Özümü yamanca hala salaraq,
Mən səni yaxşıca tanımamışam.

Yalan deyirsənmiş demək sən mənə,
Mənsə sandım səni məsum bir pəri.
Doğma olmamısan qətiyyən mənə,
Yada yazmışammış o şerləri.

Yada demişəmmiş qəzəllərimi,
Yada yazmışammış "Divan"ımı mən.
Leylini itirən bir Məcnun kimi
Ömürlük itirdim cananımı mən.

Yaddaş zəifliyi varsa da səndə,
Yadından çıxmasın gərək son nida.
Xatırla, son dəfə biz görüşəndə
Sən "sağ ol" söylədin, mənsə "əlvida".

Vüsaldan mənə nə, sənə nə düşdü?
Mənə az görünən sənə çox imiş.
Axırın əvvəli nə tez yetişdi,
Demək, aramızda sevgi yox imiş.
Sevgi yox imiş!

*5.05.1996*

## MƏN SƏNƏ INANAN DEYILƏM DAHA

Könül sındırmısan, inam qırmısan,
Mən sənə inanan deyiləm daha.
Neçə yol dil töküb inandırmısan,
Mən sənə inanan deyiləm daha.

Ayna - saflığını gözümdə gördü,
Qızılgül - ətrini sözümdə gördü,
Qulağım eşitdi, gözüm də gördü,
Mən sənə inanan deyiləm daha.

Sözünü lap gedib şaha inandır,
Yalandan çəkdiyin aha inandır,
Kimi istəyirsən daha inandır,
Mən sənə inanan deyiləm daha.

Olubmuş həmdəmim - yabançım mənim,
Sanırdım eşqindir qazancım mənim,
Səndin etibarım, inancım mənim,
Mən sənə inanan deyiləm daha.

Qəlbi - amalından uzaq elədin,
Canı zülalından uzaq elədin,
Məni vüsalından uzaq elədin,
Mən sənə inanan deyiləm daha.

Desəm "gözüm qalıb səndə" inanma,
Desəm "eşqin yaşar məndə" inanma,
Mənim sözlərimə sən də inanma,
Mən sənə inanan deyiləm daha.

Kədər mənə qaldı - şər - yalançıya,
Zəhər mənə qaldı, zər - yalançıya...
Inana bilərəm hər yalançıya,
Mən sənə inanan deyiləm daha.

Qəhətə çıxmışdı həqiqət məgər?
Sən kimi mələyə yaraşarmı şər?
Qurandan da köynək geyinsən əgər
Mən sənə inanan deyiləm daha.

Düzü - görməmişdim hələ mən əyri,
Əyri söz eşitdim dilindən, əyri,
Dilin çiynindəki telindən əyri,
Mən sənə inanan deyiləm daha.

Əhdimiz olsaydı əgər düz bizim,
Dürdanə olardı dürrümüz bizim...
Müştərək sirr idi sirrimiz bizim,
Mən sənə inanan deyiləm daha.

Bələd deyiləmmiş əsla sən demə,
Bu gizli aləmə, aydın aləmə...
Neçin sirrimizi yaydın aləmə?
Mən sənə inanan deyiləm daha.



Axı haçan vurdum yara yaranı
Yağdırdı üstümə qara-quranı...
Görüm ilan vursun ara vuranı,
Mən sənə inanan deyiləm daha.

Yanına gələrdim gülə-gülə mən,
Həzzimi bölərdim gülə-gülə mən,
"Öl" desən ölərdim gülə-gülə mən,
Mən sənə inanan deyiləm daha.

Şahin, dəyişmərəm şaha adımı,
Yar ucuz elədi baha adımı...
Dilinə gətirmə daha adımı,
Mən sənə inanan deyiləm daha,
Mən sənə inanan deyiləm daha!

*16.05.1996*

## ƏCƏL GƏLIR...

Gözlərimdən həyat nuru
uçub gedib...
Getsin, nə qəm?
Füzulini təqlid edən
şairlərə vida edib,
Füzulini axtarmağa
gedəcəyəm!

*4.07.1996*

## GÖYƏRƏ BILMƏDI ÜMID AĞACI

Heç başa düşmədim bu əsrarı mən:
Göyərə bilmədi ümid ağacı.
Arzu yarpaqları saraldı birdən,
Göyərə bilmədi ümid ağacı.

Deyirdim əlacım asan məsələ,
Deyin, əlacıma nə oldu belə?
Mənim ağacıma nə oldu belə?
Göyərə bilmədi ümid ağacı.

Əkən o ağacı şair əliydi,
Məğrur bir şairin qadir əliydi,

Göyərə bilmədi, göyərməliydi,
Göyərə bilmədi ümid ağacı.

Onda açacaqdı lətafət gülü,
Fəxarət çiçəyi, sədaqət gülü,
Yaman bitəcəkdi məhəbbət gülü,
Göyərə bilmədi ümid ağacı.

Meylimi salmışdım ürəkdən ona,
Ümid eləmişdim axı mən ona,
Məgər olmadımı su verən ona?
Göyərə bilmədi ümid ağacı.

Bəhəri səsimə hay verəcəkdi,
Səməri səsimə hay verəcəkdi,
Mənə meyvəsindən pay verəcəkdi,
Göyərə bilmədi ümid ağacı.

Yer verdi hicrana vüsalım mənim,
Daşı da zar etdi bu halım mənim,
Xal kimi qaraldı iqbalım mənim,
Göyərə bilmədi ümid ağacı.

Elə getdi sevinc, elə gəldi qəm,
Özümə gəlmərəm mən hələm-hələm,
Göyərdi əlimdə tutduğum qələm,
Göyərə bilmədi ümid ağacı.

Alağ da göyərdi, kol da göyərdi,
Tapdaq-tapdaq olan yol da göyərdi,
Sağ da yaşıllaşdı, sol da göyərdi,
Göyərə bilmədi ümid ağacı.

Könlümdə hələ də güman səsi var,
Yalvarış nidası, fəğan səsi var,
Hətta daşların da göyərməsi var,
Göyərə bilmədi ümid ağacı.

Əzmim polad idi, oldu mum daha,
Olmadı hicrana hücumum daha,



Mən elə ağacdan nə umum daha?
Göyərə bilmədi ümid ağacı.

Nisgili ürəkdə qaldı ömürlük,
Arzuda, diləkdə qaldı ömürlük,
Soluxan çiçəkdə qaldı ömürlük,
Göyərə bilmədi ümid ağacı.

Müdam əsiriyəm həmin nisgilin,
Sonu olmayacaq qəmin, nisgilin,
Səsi susmayacaq Şahin Fazilin:
Göyərə bilmədi ümid ağacı,
Göyərə bilmədi ümid ağacı...

*25.08.1996*

## QORXULU BIR YUXU GÖRDÜM BU GECƏ

Əzizim, gözümü yuman kimi mən
Qorxulu bir yuxu gördüm bu gecə.
Gördüm ki, yanıma dönməyəcəksən,
Qorxulu bir yuxu gördüm bu gecə.

Elə intizar var - zülümdən betər,
Qüssə var, qübar var - zülümdən betər,
Yanıma dönməmək - ölümdən betər,
Qorxulu bir yuxu gördüm bu gecə.

Elə çoxaldı ki, gülüm, vəslə şəkk
Yuxudan oyandım fəğan edərək,
Yuxumu tez suya danışım gərək,
Qorxulu bir yuxu gördüm bu gecə.

Nisgildir, qəhərdir gördüyüm yuxu,
Məşum bir xəbərdir gördüyüm yuxu,
Vüsala çəpərdir gördüyüm yuxu,
Qorxulu bir yuxu gördüm bu gecə.

Qorxulu yuxuda nələr var imiş,
Vahimə var imiş, xətər var imiş,

Iztirab var imiş, kədər var imiş,
Qorxulu bir yuxu gördüm bu gecə.

Vüsala məqbərə hördüm yuxuda,
Hicrin əvvəlini gördüm yuxuda,
Fələyə ucaldı dərdim yuxuda,
Qorxulu bir yuxu gördüm bu gecə.

Qorxusuz bir adam, qorxulu yuxu...
Cana lərzə saldı amma bu yuxu,
Tükü də ürpədən yuxuydu yuxu,
Qorxulu bir yuxu gördüm bu gecə.

Yarəb, yar ol daha yuxu görməyim,
Fəraq kamanında oxu görməyim,
Gedibdir ömrümün çoxu, görməyim,
Qorxulu bir yuxu gördüm bu gecə.

Qorxuram odlanam, yanam - Kərəm mən,
Şahinəm, Fazिləm, nərəm, ərəm mən.
Bir də yuxu görmək istəmərəm mən,
Qorxulu bir yuxu gördüm bu gecə,
Qorxulu bir yuxu gördüm bu gecə.

*2.09.1996*

## IMTINA EDIRƏM GÖRÜŞDƏN DAHA

Imtina etməzdim ölsəm də belə,
Imtina edirəm görüşdən daha.
Qəlbim ağlayacaq gülsəm də belə,
Imtina edirəm görüşdən daha.

Məndə hey var idi görüş arzusu,
Canda yaşar idi görüş arzusu,
Mən isti, sən soyuq, mən od, sənsə su,
Imtina edirəm görüşdən daha.

Ürəyin halıma daha yanmasın,
Qolların qoluma calaqlanmasın,



Məhəbbət kitabım varaqlanmasın,
Imtina edirəm görüşdən daha.

Ömrümə bəzəkdi hər görüşümüz,
Ülvi bir diləkdi hər görüşümüz,
Lazımdı, gərəkdi hər görüşümüz,
Imtina edirəm görüşdən daha.

Çox şer yazmışam ulu sevgidən,
Isti ümidlərlə dolu sevgidən,
Imtina edirəm mən bu sevgidən,
Imtina edirəm görüşdən daha.

Elə sarsıdıbsan inamımı sən,
Vurubsan daşlara eşq camımı sən,
Tamam küsdürübsən ilhamımı sən,
Imtina edirəm görüşdən daha.

Yoluma eşq nuru çiləsən də lap,
Hər gün görüşməyi diləsən də lap,
Görüşü sığorta eləsən də lap,
Imtina edirəm görüşdən daha.

Mənə sanırdım ki, pənah səndədir!
Min kədər məndədir, min ah səndədir,
Səbəb özündədir, günah səndədir,
Imtina edirəm görüşdən daha.

Sevda - diləyimin təzahürüydü,
Sevgi - ürəyimin təzahürüydü,
Görüş - istəyimin təzahürüydü,
Imtina edirəm görüşdən daha.

Mənə daş atanı daş - tutacaqdır,
Daş atsam - gözünü yaş tutacaqdır,
Sanma görüşümüz baş tutacaqdır,
Imtina edirəm görüşdən daha.

Daha məni anma görüş naminə,
Yanıma yollanma görüş naminə,

Atəşimə yanma görüş naminə,
İmtina edirəm görüşdən daha.

Elə bürüyüb ki, duman sahili,
Gözə görünməyir güman sahili,
Yaman günə qoydun Şahin Fazili,
İmtina edirəm görüşdən daha!

*15.09.1996*

## EY GERIDƏ QALAN, BAĞIŞLA MƏNI

*Həsədkar bir adama*

Mən səni çox ötüb qabağa düşdüm,
Ey geridə qalan, bağışla məni.
Səndən ulduz qədər uzağa düşdüm,
Ey geridə qalan, bağışla məni.

Xam fikrə dalmağın əleyhinəyəm,
Zorla ucalmağın əleyhinəyəm,
Geridə qalmağın əleyhinəyəm,
Ey geridə qalan, bağışla məni.

Mən üzdüm, sən isə burulğandasan,
Sakitəm, sən isə həyəcandasan,
İndi mən hayanda, sən hayandasan,
Ey geridə qalan, bağışla məni.

Gerçəklik gəlirdi zarafat mənə,
Çox şeyi öyrətdi bu həyat mənə,
Ötə bilməsən də gəlib çat mənə,
Ey geridə qalan, bağışla məni.

Acı sözlərimin həqiqəti çox,
Qəlbimin odu çox, hərarəti çox,
Geridə qalanın ətaləti çox,
Ey geridə qalan, bağışla məni.



Eşitmək istərəm etirafını:
Haçan deyəcəksən sözün safını?
Görmürəm mən sənin inkişafını,
Ey geridə qalan, bağışla məni.

Bir-iki mətləbi etdin aşikar,
İndisə sözünün hamısı təkrar,
Hər kimin qabında görünür nə var,
Ey geridə qalan, bağışla məni.

Məqsədə yetməsəm geri qalaram,
İrəli getməsəm geri qalaram,
Ötəni ötməsəm geri qalaram,
Ey geridə qalan, bağışla məni.

Gec açdı, süsəni bağışlayıram,
Tez soldu, çəməni bağışlayıram,
İrəli gedəni bağışlayıram,
Ey geridə qalan, bağışla məni.

Güman eləməyin itəcəyəm mən,
Şahinəm, irəli gedəcəyəm mən,
Məndən irəlini ötəcəyəm mən,
Ey geridə qalan, bağışla məni.

*17.09.1996*

## ƏVVƏLIN AXIRI NƏ TEZ YETIŞDI?

Fərağın süst əli görünməkdədir,
Əvvəlin axırı nə tez yetişdi?
Axırın əvvəli görünməkdədir,
Əvvəlin axırı nə tez yetişdi?

Pis günə kim qoydu iqbalımızı?
Kimə ərz eləyək bu halımızı?
Hicran əvəz etdi vüsalımızı,
Əvvəlin axırı nə tez yetişdi?

Axı qərarımız deyildi belə,
Sevda şüarımız deyildi belə,

Əvvəl o yarımız deyildi belə,
Əvvəlin axırı nə tez yetişdi?

Hər ömrün yazı var, yayı var, qışı...
Necə keçirəcək o nigar qışı?
Bizi tutdu belə kimin qarğışı?
Əvvəlin axırı nə tez yetişdi?

Nə yaman can atdı axır əvvələ?
Axır əvvəldənmi baxır əvvələ?
Əvvələ haçandan qurubdur tələ?
Əvvəlin axırı nə tez yetişdi?

Fərəhi itirib dərdimi gəzdim,
Sevinci bitirib dərdimi gəzdim,
Vaxtında gəlsəydi dərd eləməzdim,
Əvvəlin axırı nə tez yetişdi?

Başınamı düşdü əvvəlin daşı?
Axır əvvəl ilə durdu yanaşı.
Axırın əlində əvvəlin başı,
Əvvəlin axırı nə tez yetişdi?
Nə tez yetişdi?

*19.09.1996*

## SƏN MƏNIM QƏDRIMI BILMƏYƏCƏKSƏN

Sevincim dillənmir, daşa dönübdür,
Sən mənim qədrimi bilməyəcəksən.
Kədərim gözümdə yaşa dönübdür,
Sən mənim qədrimi bilməyəcəksən.

Dönməsəm, göz yaşım üzümdə qalar...
"Əlvida" deməsəm, sözüm də qalar...
Bütün arzularım gözümdə qalar,
Sən mənim qədrimi bilməyəcəksən.

Olmaq əvəzinə başımın tacı,
Şirin həyatımı elədin acı.



Əgər əksəm belə qədir ağacı,
Sən mənim qədrimi bilməyəcəksən.

Daha etməyəcək şən - qədirbilən,
Ən qədirbilməzi ən qədirbilən,
Sən qədirbilməzi mən qədirbilən,
Sən mənim qədrimi bilməyəcəksən.

Əsəbim gərilib indi sim kimi,
Istədi kim kimi, sevdi kim kimi...
Mən sənin qədrini bildiyim kimi
Sən mənim qədrimi bilməyəcəksən.

Bu gün nida gəldi qeybdən mənə,
Lal bir səda gəldi qeybdən mənə,
Sanki vida gəldi qeybdən mənə,
Sən mənim qədrimi bilməyəcəksən.

Bilmədin qiyməti nədir bilənin,
Hörmət gözləyənin, xətir bilənin,
Qoy gedim yanına qədirbilənin,
Sən mənim qədrimi bilməyəcəksən,
Sən mənim qədrimi bilməyəcəksən.

*23.09.1996*

## "SEVIRƏM" SÖYLƏMƏ MƏNƏ YALANDAN

Mən şəkkə düşəndən canım sağ deyil,
"Sevirəm" söyləmə mənə yalandan.
Sevgi oyun deyil, oyuncaq deyil,
"Sevirəm" söyləmə mənə yalandan.

Arifəm, qətrədə dərya görmüşəm,
Şairəm, surətdə məna görmüşəm,
Mən uşaq deyiləm, dünya görmüşəm,
"Sevirəm" söyləmə mənə yalandan.

Aşiqə - yalançı yabançı olar,
Düzlüyü talayan talançı olar,
Yalana öyrəşən yalançı olar.

"Sevirəm" söyləmə mənə yalandan.

Hansı mətləbi düz söyləməmişəm?
Sənə "yalana döz" söyləməmişəm,
Qətiyyən yalan söz söyləməmişəm,
"Sevirəm" söyləmə mənə yalandan.

Yalanı od tutası, yanası belə,
Örtüyü elədir, cunası belə,
Yalan danışanın anası belə,
"Sevirəm" söyləmə mənə yalandan.

Düz sözü deməkdən usanmıram mən,
Müstəqim gedirəm, dayanmıram mən,
Onsuz da sözünə inanmıram mən,
"Sevirəm" söyləmə mənə yalandan.

"Yalan" istilahı mənə müəmma,
Yalan ayaq tutar, yeriməz amma,
Inanma, yalana sən də inanma,
"Sevirəm" söyləmə mənə yalandan.

Əgər adilsənsə ədaləti de,
Həqiqi eşqi de, məhəbbəti de,
Sən Şahin Fazilə həqiqəti de,
"Sevirəm" söyləmə mənə yalandan.

*30.09.1996*

## ÖLƏRƏM BALAN TƏKI

Deyirlər ki, sən yalan
Dünyasan.
Kədər verib həzz alan
Dünyasan.

Şəksiz, var sitəmin də,
Sevincin də, qəmin də.
Şairin aləmində
Həm sərt, həm də mehriban
Dünyasan.

Tacidara tacidar,
Şəhriyara şəhriyar,



Hökmdara hökmdar,
Hökmrana hökmran
Dünyasan.

Çox çəkib başın sənin,
Torpağın, daşın sənin,
Neçədir yaşın sənin,
Qocamısan, ya cavan
Dünyasan?

Canımı alan təki
Ölərəm balan təki,
Şahin Fazil kimdi ki,
Süleymana qalmayan
Dünyasan.

*2.10.1996*

## QƏBRIMI GÖRÜRƏM TEZ-TEZ YUXUDA...

Qəbrimi görürəm tez-tez yuxuda,
Görürəm üstündə baş daşı yoxdur,
Baş daşı üstündə göz yaşı yoxdur.

Qəbrimi görürəm tez-tez yuxuda,
Görürəm içində yanır bir çıraq,
Kimsə şer deyir pıçıldayaraq.

Qəbrimi görürəm tez-tez yuxuda,
Görürəm qəbirdir məqbərə kimi,
Içində görmürəm amma nəşimi.

Qəbrimi görürəm tez-tez yuxuda,
Deyirəm içi boş qəbirmi olar?
Ölüyə bu qədər cəbrmi olar?

Qəbrimi görürəm tez-tez yuxuda,
Bəlkə ölməmişəm, deyirəm, sağam,
Bəlkə bir qədər də yaşayacağam.

Qəbrimi görürəm tez-tez yuxuda,
Özümü görmürəm, məni sıxır qəm,
Deyirəm bəlkə də hələ diriyəm.

Qəbrimi görürəm tez-tez yuxuda,
Diri qalmağıma etirazım var,
Məni qəbrimə ver, ey Pərvərdigar.

Qəbrimi görürəm tez-tez yuxuda...

*4.10.1996*

## TEYMURLƏNGLƏR INDI DƏ VAR...

Teymurlənglər qəddar olur,
Hədd bilməyən hər qəddara
Hədd - dar olur.

Teymurlənglər yaddan çıxmaz,
Yaradanın hökmü ilə
Zaman-zaman olar peyda,
Başqa üzdə, başqa adda...

Teymurlənglər indi də var,
Elə güman edirəm ki,
Hər dövranda olacaqlar.

Teymurlənglər indi də var,
qırar, biçər,
doğrar, kəsər.
Arabir də,
sərf edərsə,
saray tikər,
imarətlər edər inşa.

Teymurlənglər indi də var,
Moskvada, Yerevanda,
Izraildə, Gürcüstanda,
Lap Daşkənddə,
Lap Bişkekdə,
Lap Bakıda,
Aşqabadda.

Teymurlənglər indi də var,
Başqa üzdə, başqa adda!

*28.10.1996*



## QƏMI GÖZLƏRINDƏN ÇIXARIM GƏRƏK

Mənə həyat oldun həyat içində,
Bu təzə həyatın həsrətindəyəm.
Nə üçün həsrətin təzad içində -
Üzündə təbəssüm, gözlərində qəm.

Üzündən gözəllik şer tək axır,
Mən şer aşiqi, söz aşiqiyəm.
Gözüm heyran-heyran gözünə baxır,
Kaş gözə gəlməyim, göz aşiqiyəm.

Görəsən şairlər qadir olubmu
Gözə nüfuz etsin mən kimi dərin?
Qəmi gözəl görən şair olubmu
Qəmi də gözəlmiş gözəl gözlərin.

Deyəsən yerdə də var imiş mələk,
Rübai yazılsın, qəzəl görünsün.
Istərəm dağılsın qəmi tüstü tək,
Bu gözəl daha da gözəl görünsün.

Çöhrəndə görünür təzad aləmi,
Amma bədbinliyin sözdə görünmür.
Üzünə yayılmır gözünün qəmi,
Üzdəki təbəssüm gözdə görünmür.

Tanrı lütf eləsin səni sevənə,
Geriyə qayıtsın baharım gərək.
Gülüm, təbəssümün qalsın qoy sənə,
Qəmi gözlərindən çıxarım gərək.

*30.10.1996*

## DÖZƏRƏM ÜRƏYIM PARTLAYANACAN

Yaman sındırıbsan mənim qəlbimi,
Belə zülm edərmi sevənə sevən?
Məni aldadıbsan yalançı kimi,
Görüşə bilmərəm yalançıyla mən.

Ümidvar etmişdin məni, ey mələk,
Neçin əvəz etdi vüsalı fəraq?

Ümidim, gümanım azaldığı tək
Amma məhəbbətim azalmayacaq.

Sənin eşqin idi mənim diləyim,
Vədin eşqin kimi yalanmış tamam.
Amma nə qədər ki vurur ürəyim,
Səni ürəyimdə yaşadacağam.

Sadəlövhəm, elə gəlirdi mənə
Mən bülbül timsalı, sən gül timsalı.
Yanıldım, qar gördüm bahar yerinə,
Qışda gül axtaran bülbül timsalı.

Çırpıldı daşlara o büllur eşqim,
Əlimdə qələm var, ürəyimdə qəm.
Qəmimi əlimdən ala bilər kim?
Qəmim tükənincə qəmlənəcəyəm.

Bilirəm, gələcək o məşum ölüm,
Əgər olmasa da gözləmək asan.
Sənin fərağına dözərəm, gülüm,
Dözərəm ürəyim... partlayanacan.

*2.11.1996*

## BƏDBINLIK BULUDUN DOLUB DEYƏSƏN

Ürəyim ağrıdı yenə, eşitcək
Sənin ürəyinin ağrıdığını.
Sənin ürəyini tərk eyləyərək
Qoy mənə yönəlsin ağrı yığını.

Bədbinlik buludun dolub deyəsən,
Axır gözlərindən qəm yağışları.
Nikbinlik yaylığı verim sənə mən
Qurutsun gözündən axan yaşları.

Hər sirri gizləmək gərəyin deyil,
Demə ev sənindir, demə sirr sənin.
Ağrıyan bəlkə də ürəyin deyil,
Ağrıyan köksündə qəlbindir sənin.

Bəlkə etinasız olmuşam sənə,
Qəlbin söz gözləyir, söhbət gözləyir.
Iztirab yerinə, həsrət yerinə



Etina gözləyir, diqqət gözləyir.
Al-ver dünyasıdır dünya əzəldən,
Ağrını ver mənə təbərrük kimi.
Dözərəm ağrına, əvəzində sən
Al mənim eşqimi, mənim eşqimi.

*3.11.1996*

## ÖZÜMDƏN SAVAYI YOXDUR DÜŞMƏNIM

Irad tutmasınlar, sözüm qəm dadır,
Mənim haqqım vardır buna bəlkə də.
Pislik göbələk tək çoxalmaqdadır,
Yaxşılıq çəkilir qeybə get-gedə.

Hərdən məkr yatır diləkdə neçin?
Niyə üstələyir bəzən xeyri şər?
Görəsən adamlar ürəkdə neçin
Paxıllıq qurdunu öldürməyirlər?

Nə üçün çirkaba qərq olub dəniz?
Hərdən niyə kobud gözəlin dili?
Dili nəsrimizin olub tərtəmiz,
Neçin təmizlənmir qəzəlin dili?

Adam var gündüz də yuxuya gedir,
Adam var gecə də yuxusu yoxdur.
Niyə bənövşənin boynu əyridir?
Neçin qərənfilin qoxusu yoxdur?

Bəzən başa çıxır nadanın biri,
Nə üçün yandırır pərvanəni şam?
Yersizin altında yerlinin yeri,
Yerini bilməyir neçin hər adam?

Qurtulmur tikandan niyə qızılgül?
Nədir sirri bunun, ey Pərvərdigar?
Şam tək yana-yana əriyən könül,
Şimal buzu kimi soyuq ürək var.

Başa düşməyirəm çox adamı mən,
Halalı var ikən haramı nədir?
Kişi var evində qadını varkən
Neçin neçə siğə həsrətindədir?

Nə üçün aləmdə şeytan da yaşar,
Mələk təbiətli insanla birgə?
Niyə Füzulidə təsəvvüf də var,
Durubdur yanaşı irfanla birgə?

Mənim ürəyimdən nisgil çəkilmir,
Sevinc əvəz etmir ahü-zarını.
Dünya kişiləri həll edə bilmir,
Fələstin, Qarabağ oyunlarını.

Yurdumuz, yerimiz olub tarimar,
Qeyrətsiz çox kişi bığını eşir.
Evinə, mülkünə yatır yığanlar,
Çadırda yatanı nə fikirləşir.

Ömrümün sonuna daha az qalıb,
Hər dəm qəmlənirəm, gülmürəm axı.
Dünyanın dərdini çiynimə alıb
Hambal tək daşıya bilmirəm axı.

Qəlbimə yığmışam nə qədər kədər,
Özüməm, özüməm, düşmənim mənim.
Mənə zülm eləyən yoxdur mən qədər,
Özümdən savayı yoxdur düşmənim.

*10.11.1996*

## BU MƏHƏBBƏT DEYIL, NAĞILDI YAXŞI

Seyrinə gedibsən bağın, çəmənin,
Mən də çox olmuşam yolda, səfərdə.
Səfərin yol kimi uzandı sənin,
Kaş xətərsiz olsun yol da, səfər də.

Gedibsən, səbrimi fəraq daşdırır,
Hövsələ qoymayır məndə, ey mələk.



İndi bu yol bizi uzaqlaşdırır,
Sonra bu yol bizi yaxın edəcək.

Hələ yol gedirsən, gedirsən, amma
Ümid işığıyla gözüm nurlanır.
Getdiyin yerlərdə, gülüm, yubanma,
Xəyalım dəmadəm hüsnünü anır.

Bir gün görünəcək o yolun sonu,
Geri dönəcəksən göyçək, səmimi.
Yaman başlayacaq vüsal oyunu,
Hicranın oyunu qurtaran kimi.

Görüş anlarımız gəlib yetən tək,
Əlimiz hicranı daşlayacaqdır.
Divanə ayrılıq ayrı düşəcək,
Dəli bir məhəbbət başlayacaqdır.

O dəm deyəcəyəm gəlmisən yenə,
Fərağın binası dağıldı yaxşı.
Təkrar edəcəyəm mən dönə-dönə:
Bu məhəbbət deyil, nağıldı yaxşı,
Bu məhəbbət deyil, nağıldı yaxşı!

*18.11.1996*

## QƏLIZDIL QƏZƏLXANLARA

Qəzəl yazmadasan cürət eləyib,
Xəlqi şer yazmaq diləyin deyil.
Sənin dediyini Füzuli deyib,
Füzuli tək yazmaq xörəyin deyil.

Dilini var edən sözün var sənin,
"Lüğət əzbərləyib söz deyin" demə.
"Söz"ə həmqafiyə "göz"ün var sənin,
Gözünə gah "çeşm", gah "eyn" demə.

Artırıb sayını dilənçilərin
Kəlmə dilənçisi, söz dilənçisi.
Yoxmudur əlacı bu dərdisərin?
Kiçik bir ölkənin yüz dilənçisi...

"Əcnəbi sözlərdən bəhrələn" deyir
Dilin cavanlara məclis zamanı.
Neçin türk sözündən bəhrələnməyir
Ərəb qəzəlxanı, fars qəzəlxanı?

Bir dilin sözüylə söz demək çətin,
Üç dillə qəzəli yaratmaq asan.
Övladı deyilsən bu məmləkətin?
Şeri öz sözünlə yaratmalısan!

Daşı ətəyindən yerə tulla gəl,
Ətəyə zərərdir, cana zərərdir.
Əcnəbi sözlərlə yazdığın qəzəl
Milli qəzəl deyil, həftəbecərdir.

Dilindən ötrü yan, dilə nur çilə,
Şam əgər yanmırsa ziyası yoxdur.
Füzuli diliylə, Seyid diliylə
Şer yazan kəsin həyası yoxdur.

Kol olma, ağac ol koldan ayrılıb,
Qəzəlin gül olsun, olmasın xəzəl.
Qeyrinin açdığı yoldan ayrılıb
Özün öz izinlə yerisən gözəl.

Heç bunun fərqinə varmısanmı sən
Niyə əl açırsan özgə önündə?
Nə xeyri yoxmusan, varmısanmı sən?
Heç şair olmasın sənin günündə.

Qəzəl yazmadasan cürət eləyib,
Xəlqi şer yazmaq diləyin deyil.
Sənin dediyini Füzuli deyib,
Füzuli tək yazmaq xörəyin deyil.

*22.11.1996*



## ÜRƏYİMƏ DAMIB Kİ...

Sağkən "qadirəm" dedi,
Sağkən sübut elədi
Zərgər zərgərliyini,
Dülgər dülgərliyini,
Həkim həkimliyini,
Hakim hakimliyini...
Ölümü bildirəcək
Şahinin kimliyini!

*3.01.1997*

## TƏSADÜFİ EŞQİ YAXINA QOYMA

Əgər zərurətdən yaranıbsa da,
Təsadüfi eşqi yaxına qoyma.
Dəli bir həsrətdən yaranıbsa da,
Təsadüfi eşqi yaxına qoyma.

Mənasız xülyadı təsadüfi eşq,
Gərəksiz sevdadı təsadüfi eşq,
Hiylədi, riyadı təsadüfi eşq,
Təsadüfi eşqi yaxına qoyma.

Ilahi vüsalı fəraq edəcək,
Səni pak eşqdən uzaq edəcək,
Fərəhnak eşqdən iraq edəcək,
Təsadüfi eşqi yaxına qoyma.
Bir gün xəcalətə səbəb olacaq,
Əzab-əziyyətə səbəb olacaq,
Qanuni nifrətə səbəb olacaq,
Təsadüfi eşqi yaxına qoyma.

Yaraşmır sinninə, yaşına sənin,
Kaş qəlbin bu işdən daşına sənin,
Oyun gətirəcək başına sənin,
Təsadüfi eşqi yaxına qoyma.

Gününü zəhrmar edəcək sənin,
Halını şərmsar edəcək sənin,
Qəlbini tarimar edəcək sənin,
Təsadüfi eşqi yaxına qoyma.

Yetəcək pak eşqin talanı belə...
Yalan danışanın yalanı belə!..
Yaxına qoysan da ilanı belə,
Təsadüfi eşqi yaxına qoyma!
Yaxına qoyma!

*11.01.1997*

## ÖNÜNDƏ SINƏMI NIŞANGAH EDIB...

Bu ox mən aşiqə ömürlük gərək,
Məhəbbət oxuna tuş olmuşam mən.
Sinəmi önündə üryan edərək
Məhəbbət oxuna tuş olmuşam mən.

Dünyada varsa da çox sevən belə,
Sanıram yarını yox sevən belə.
Görəsən varmıdır oxsevən belə?
Məhəbbət oxuna tuş olmuşam mən.

Fərəhlə doldurub gəlib sinəmi,
Dağıdıb köksümü, dəlib sinəmi...
Belə bəxtəvərlik qismət mənəmi?
Məhəbbət oxuna tuş olmuşam mən.

Ox keçdi sinəmdən sifarişimlə,
Çoxunu mat etdim bu sazişimlə...
Belə öz təmənnam, öz xahişimlə
Məhəbbət oxuna tuş olmuşam mən.

Çox aşiq bu oxa intizar olub,
Eşq oxu ömürlük mənə yar olub,
Sevgi kamanına minnətdar olub
Məhəbbət oxuna tuş olmuşam mən.

Bu ox çox aşiqə çox pənah edib!
Daim gözləməkdən onu ah edib,



Önündə sinəmi nişangah edib
Məhəbbət oxuna tuş olmuşam mən.

Özündən savayı kömək yox mənə,
Oxunu yollama daha çox mənə,
Tanrım, gərək deyil başqa ox mənə,
Məhəbbət oxuna tuş olmuşam mən.

Qoru bu vətəni qibtə oxundan,
Qoru hər sevəni qibtə oxundan,
Yarəb, qoru məni qibtə oxundan,
Məhəbbət oxuna tuş olmuşam mən.

Yolunda intizar olması bitdi,
Ürəkdə dərd, qübar olması bitdi,
Şahinin daha zar olması bitdi,
Yaman sevinmişəm, xoş olmuşam mən,
Məhəbbət oxuna tuş olmuşam mən!

*14.02.1997*

## ÖZÜM ŞAHIN KIMI OV OVLASAM DA...

Bülbüləm, çox gülə mail olmuşam,
Bu aşiq çoxuna ürək açıbdır.
Bütün istəyimə nail olmuşam,
Bütün diləklərim çiçək açıbdır.

Məzəmmət etməyin şerimə görə,
Deməyin uzundur yar saçı kimi.
Mənim fikirlərim sığışmır şerə,
Qısalda bilmirəm fikirlərimi.

Əl şer yazmaqdan yorulduğu dəm
Baş vurram tarixin qatlarına mən.
Vardır öz kəhərim, hətta minmərəm
Rövşənin, Nəbinin atlarına mən.

Arxamda kim durub, önümdə kim var,
Sözüm tək səsim də mənim səsimdir.
Hərçənd neçə dilə bələdliyim var,
Azərbaycan dilim amma bəsimdir.

Şerim sükutunu əsrin qıracaq,
Mənə bu qayədir, mənə bu məram.
Məni xəlqi şerim tanıtdıracaq,
Əcnəbi sözlərdən kömək ummaram!

Şerimə ögeydir yad söz, yad səda,
Təqlidçi kəslərin cəngindəyəm mən.
Özüm şahin kimi ov ovlasam da,
Elm ilə qəzəlin çəngindəyəm mən.

*23.02.1997*

## TƏZƏDƏN CÜCƏRDI NƏDƏN KÖHNƏ DƏN?

Buz kimi donurdu hərarətimiz,
Təzədən yadıma düşübsən mənim.
Yaman soyuyurdu məhəbbətimiz,
Təzədən yadıma düşübsən mənim.

Üzüm gülməyəcək bir də, hardasan?
Gözümə enəcək pərdə, hardasan?
Ürək dözməyəcək dərdə, hardasan?
Təzədən yadıma düşübsən mənim.

Gözəlim, aşiqəm sənə köhnə mən,
Qətiyyən danışma mənə köhnədən,
Təzədən cücərdi nədən köhnə dən,
Təzədən yadıma düşübsən mənim.

Yaddaşım olmurdu sirdaş mənimlə,
Deyirdi "ömürlük yadlaş mənimlə".
Zarafat edirmiş yaddaş mənimlə,
Təzədən yadıma düşübsən mənim.

Dünya bu aşiqə hayandı yenə,
Məhəbbət nuruna boyandı yenə...
Sevgimin yaddaşı oyandı yenə,
Təzədən yadıma düşübsən mənim.

Yenə şer yazır Şahin adına,
Yenidən qüvvə ver qol-qanadına.



Görən düşmüşəmmi sənin yadına,
Təzədən yadıma düşübsən mənim.

*28.02.1997*

## SƏN MƏNIM YANIMA NEÇIN GƏLMISƏN?

Sirrini gizləmə, əyan et mənə,
Sən mənim yanıma neçin gəlmisən?
Istəsən şerlə bəyan et mənə,
Sən mənim yanıma neçin gəlmisən?

Yenə eşq mülkündə nizam yoxmudur?
Dilində hicrana salam yoxmudur?
Yanına getməyə adam yoxdurmu?
Sən mənim yanıma neçin gəlmisən?

Ulduz tək sönübsən asimanımda,
Mehrin qalıbdırmı məgər canımda?
Nəyi unutmusan mənim yanımda?
Sən mənim yanıma neçin gəlmisən?

Əlində məhəbbət camın qalırmı?
Pərvanə yandıran şamın qalırmı?
Ürəkdə yenə də kamın qalırmı?
Sən mənim yanıma neçin gəlmisən?

Olarkən hər anım, dəqiqəm sənin,
Əsla qoymaz idim ola qəm sənin...
Neçin xatirinə düşmüşəm sənin,
Sən mənim yanıma neçin gəlmisən?

Ürəyə etmisən zülüm, soyuyub,
Ocağım soyuyub, külüm soyuyub,
Ayağım soyuyub, əlim soyuyub,
Sən mənim yanıma neçin gəlmisən?

Eşqimi bir daha bölən deyiləm,
Elə qəmliyəm ki, gülən deyiləm,
Mən sənin yanına gələn deyiləm,
Sən mənim yanıma neçin gəlmisən?

Düz danış, yalanı gətirmə dilə,
Bu qaranlıq sirrə aydınlıq çilə,
Bildir məqsədini Şahin Fazilə,
Sən mənim yanıma neçin gəlmisən?
Neçin gəlmisən?

*4.03.1997*

## ÜRƏYIM KƏDƏRLƏ DOLUDUR MƏNIM

Siz ey sevinənlər, ey şadlananlar,
Ürəyim kədərlə doludur mənim.
Ey eşq səmasında qanadlananlar,
Ürəyim kədərlə doludur mənim.

Mənə kədər gərək, mənə gərək qəm,
Kədərsiz bir ürək ürəkmi bəyəm?
Kədərim olmasa kədərlənərəm,
Ürəyim kədərlə doludur mənim.

Ürəyi etsə də yara kədəri,
Mənə axtar deyir, ara kədəri...
Mavi Xəzərimin qara kədəri,
Ürəyim kədərlə doludur mənim.

Ürəyim cəzb edir hər an kədəri,
Ayrılıq kədəri, hicran kədəri,
Təsəvvüf kədəri, irfan kədəri,
Ürəyim kədərlə doludur mənim.

Unutma kədəri, yaşa kədəri,
Ürəyin həsrətlə qoşa kədəri,
Xocalı kədəri, Şuşa kədəri,
Ürəyim kədərlə doludur mənim.

Nə bulud, nə duman, nə də çən görüm,
Ətirli gül görüm, göy çəmən görüm,
Hamını həmişə sevinən görüm,
Ürəyim kədərlə doludur mənim.

Gərək Məcnun kimi səhra, düz tutum,
Leylanın əlindən düzə üz tutum,
Məhəbbət yolunu düppədüz tutum,
Ürəyim kədərlə doludur mənim.

Kiminin əlinə şəkər düşübdür,
Kiminin dilinə zəhər düşübdür,
Mənim də bəxtimə kədər düşübdür,
Ürəyim kədərlə doludur mənim.



Dünyada hər şeyin qiyməti varsa,
Şahinin kədər tək sərvəti varsa,
Hərdən satacağam alan olarsa,
Ürəyim kədərlə doludur mənim.

*27.03.1997*

## GƏL MEŞƏYƏ GEDƏK, GÜLÜM, MEŞƏYƏ!

Gedək, ağacların dəlisi olmur,
Gəl meşəyə gedək, gülüm, meşəyə.
Qantökəni olmur, zəlisi olmur,
Gəl meşəyə gedək, gülüm, meşəyə.

Görərsən qırqovul nədir, turac nə,
Palıd nə, vələs nə, şam, qarağac nə,
Ölü ağac nədir, diri ağac nə,
Gəl meşəyə gedək, gülüm, meşəyə.

Oyunbaz eləyib şiri adamlar,
Şəhərdə seçilmir iri adamlar,
Ölü adamlardan diri adamlar,
Gəl meşəyə gedək, gülüm, meşəyə.

Meşədə ağaclar töhmət bilməyir,
Söyüş bacarmayır, lənət bilməyir,
Kinayə bilməyir, qiybət bilməyir,
Gəl meşəyə gedək, gülüm, meşəyə.

Şəkər zəhər olub, zəhər bezdirib,
Göz yaşı bezdirib, qəhər bezdirib,
Səni də, məni də şəhər bezdirib,
Gəl meşəyə gedək, gülüm, meşəyə.

Gedək, təzim etsin bizə ağaclar,
Gedək, meşədə də gül var, çiçək var,
Gedək, meşədə də yel var, külək var,
Gəl meşəyə gedək, gülüm, meşəyə.

Köynəyim olmasa yarpaq geyərəm,
Ağac qabığından başmaq geyərəm,
Meşəbəyi üçün şer deyərəm,
Gəl meşəyə gedək, gülüm, meşəyə.

Gedək, gözəlliyə biz kimi ac var,
Bəlkə dərdimizə orda əlac var,
Hərçənd şəhərdə də yaxşı ağac var,
Gəl meşəyə gedək, gülüm, meşəyə!

*12.03.1997*

## DÜNYANIN QULAĞI KAR OLUB YENƏ

Eşitmir səsimi nə üçün, nədən?
Dünyanın qulağı kar olub yenə.
Axı var gücümlə qışqırıram mən,
Dünyanın qulağı kar olub yenə.

Bəlkə qulağımın ağırlığı var,
Bəlkə eşitməkdən özüməm kənar,
Səsini eşitməz axı karın kar,
Dünyanın qulağı kar olub yenə.

Gələn buludu da eşidirəm mən,
Ölən umudu da eşidirəm mən,
Hətta sükutu da eşidirəm mən,
Dünyanın qulağı kar olub yenə.

Gün ilə tən oldu, vecinə gəlmir,
Kədərli şən oldu, vecinə gəlmir,
Dostum düşmən oldu, vecinə gəlmir,
Dünyanın qulağı kar olub yenə.

Pozulub növrağım, vecimə gəlmir,
Yer tutmur ayağım, vecimə gəlmir,
Əsla öz qulağım vecimə gəlmir,
Dünyanın qulağı kar olub yenə.

Deyəsən loğmana var ehtiyacı,
Car çəkək hər yana: Var ehtiyacı,
Bir ümman dərmana var ehtiyacı,
Dünyanın qulağı kar olub yenə.

Əksi-səda verir dağ dağa, dağam,
Hələ nə qədər ki səsim var, sağam,
Cavab gəlmədikcə qışqıracağam,
Dünyanın qulağı kar olub yenə.



Belə ucaldıqca Şahinin səsi,
Lərzəyə salacaq hələ çox kəsi...
Vallah, partlayacaq qulaq pərdəsi.
Dünyanın qulağı kar olub yenə,
Kar olub yenə!

*27.03.1997*

## NAĞILA INANMIRAM!

"Göydən üç alma düşdü...",
Varsa, göydə dayanmaz.
Görən haçan düşübmüş,
Eşidənlər inanmaz,
Nağıla inanmıram!

"Sədayi-qaibanə...",
Qeybdən gələn səs hanı?
Alma - nağıl, bəhanə,
Məlikməmməd bəs hanı?
Nağıla inanmıram!

Bir nağılçı neçə il
Nağıl danışdı bizə,
Nağıl bitdi, üç alma
Düşmədi əlimizə,
Nağıla inanmıram!

Amma, gözləyirəm mən,
Nə səs yetdi, nə də ün...
Əlimə düşənəcən
Çürüyəcək büsbütün,
Nağıla inanmıram!

Alma gözləmirəm mən,
Nə inanc var, nə inam.
Nağıla ümid edən
Ağıla ianmıram,
Nağıla inanmıram!

*8.04.1997*

## NÜFUZ ELƏYIBSƏN HƏR HÜCEYRƏMƏ

*"Bir gün Məcnun xəstələnib yatağa düşür. Müalicə üçün həkim çağırırlar.*
*Həkim "damarından qan almaq lazımdır" deyərək Məcnunun qolunu bağlayır. Iynəni batırhabatırda Məcnun dəlicəsinə qışqırır: - Burax, ey həkim... Qan almaqdan vaz keç...*
*Həkim Məcnunla zarafata keçir:*
*- Sən çöllərdə kükrəmiş aslanlardan belə qorxmursan. Indi qoluna batırılacaq bir iynədənmi çəkinirsən?*
*Məcnunun cavabı çox heyrətlidir:*
*- Mən neştərdən qorxmuram. Mənim vücudum, varlığım Leyla ilə doludur. Qorxuram ki, qoluma neştər batırarkən sən Leylanı incidəsən..."*

***Osman Nuri Topbaş. "Mövlana dərgahından əsintilər", Bakı, 1997, səh.61.***

Hüceyrə içinə necə giribsən?
Nüfuz eləyibsən hər hüceyrəmə.
Gündüz görməmişəm, gecə giribsən?
Nüfuz eləyibsən hər hüceyrəmə.

Elə göyçəksən ki, mələk hirslənib,
Xəyal havalanıb, dilək hirslənib,
Könül acıqlanıb, ürək hirslənib,
Nüfuz eləyibsən hər hüceyrəmə.

Yaxına qoymaram - diləkdəsənsə,
Pəsənd eləmərəm - ürəkdəsənsə,
Hamının cananı ürəkdə, sənsə
Nüfuz eləyibsən hər hüceyrəmə.

Qanımdan ayrılsan qanım da heçdir,
Canımdan ayrılsan canım da heçdir,
Başqa nüfuz əhli yanımda heçdir,
Nüfuz eləyibsən hər hüceyrəmə.

Gördü hüceyrəmi həkim ikiqat,
Indi ki, çoxalıb yüküm ikiqat,



Neçin çoxalmayıb çəkim ikiqat,
Nüfuz eləyibsən hər hüceyrəmə.

Fərağın önündə sədd, sipərəm mən,
Gərək hər təzyiqə sinə gərəm mən,
Hüceyrə sarıdan bəxtəvərəm mən,
Nüfuz eləyibsən hər hüceyrəmə.

Şadam, məndə hədər hüceyrə yoxdur,
Sanıram bu təhər hüceyrə yoxdur,
Heç kəsdə bu qədər hüceyrə yoxdur,
Nüfuz eləyibsən hər hüceyrəmə.

Insanın şərəfi, şanı - nüfuzu,
Yaxşı tanımısan, tanı nüfuzu!
Qeyri üzvlərin hanı nüfuzu?
Nüfuz eləyibsən hər hüceyrəmə.

Şahini sevəndən fazil olubsan,
Hicran sellərinə sahil olubsan,
Vücuduma elə daxil olubsan
Nüfuz eləyibsən hər hüceyrəmə,
hər hüceyrəmə!

*26-29.04.1997*

## BIR DƏLI ARTACAQ MƏCNUN DÜNYADA

Səsi çıxmayacaq daha nalənin,
Xoş gəldin, qəlbimin dağıldı qəmi.
Üzünə baxıram, üzündə sənin
Aləmin hüsnü var, hüsnün aləmi.

Xoş gəldin, aşiqin dili açıldı,
Tərsinə çevrildi sacı hicranın.
Vüsalın çiçəyi, gülü açıldı,
Qapısı bağlandı acı hicranın.

Xoş gəldin, gəldiyin o yola qurban,
Yapışdın qolumdan bu qəmli çağda.

O qədəmə qurban, o qola qurban,
Təpər qalmayacaq bir də fəraqda.

•

Güclü tükənəcək iztirabımın,
Bir də qalxmayacaq qəm bəmdən zilə.
Xoş gəldin, təpəri artdı tabımın,
Dözüm bəxş elədin Şahin Fazilə.

Dözüm bəxş elədin, elə dözüm ki,
Kəsəcək yolunu hikkənin, kinin.
Sevgi səmasında əvvəlki təki
Olacaq uçuşu yenə şahinin.

Yenə sevinəcək dostlar, tanışlar,
Yenə səslənəcək simi rübabın.
Köhnə şerləri deməyə nə var,
Sətri başlanacaq təzə kitabın.

Iztirab - keçəcək həzzin cənginə,
Əzab - düşməyəcək bir dəm də yada.
Ey ağıllı yarım, sevin ki, yenə
Bir dəli artacaq məcnun dünyada.

Səsi çıxmayacaq daha nalənin,
Xoş gəldin, qəlbimin dağıldı qəmi.
Üzünə baxıram, üzündə sənin
Aləmin hüsnü var, hüsnün aləmi.

*15.05.1997*

## YADIMA GƏLMIR

Daşdan çıxıb çörəyim,
Çox qövr edib ürəyim,
Səbrlə daşıdığım
Qövr yadıma gəlmir.

Kədərimi udmuşam,
Cövrü də unutmuşam,
Cəbrlə daşıdığım
Cövr yadıma gəlmir.
Imkansız - yaşamışam,
Canansız - yaşamışam,
Allahsız yaşadığım
Dövr yadıma gəlmir.

*22.05.1997*



## QAYITMA, BIR DAHA GERI QAYITMA!

Qadın olsan belə kişilik elə,
Qayıtma, bir daha geri qayıtma.
Gözü yerə dikmə, başı dik elə,
Qayıtma, bir daha geri qayıtma.

Qayıtma, özünün tam hakimi ol,
Fikrinin, sözünün tam hakimi ol,
Dönmə, oddan qaçan tüstü kimi ol,
Qayıtma, bir daha geri qayıtma.

Inan, gedəcəkdir cəhdin hədərə,
Yenidən etdiyin əhdin hədərə,
Geri qayıtmısan bir neçə kərə,
Qayıtma, bir daha geri qayıtma.

Ürəyi etmişdim sənə sadağa,
Amma, tablamadı çəkdiyin dağa...
Istəsən sola get, istəsən sağa,
Qayıtma, bir daha geri qayıtma.

Eşqə oyuncaq tək baxıbsan axı,
Məni yandırıbsan, yaxıbsan axı,
Kamandan ox kimi çıxıbsan axı,
Qayıtma, bir daha geri qayıtma.

Bu aşiq yenidən dindi: Uzaqsan,
Məndən ulduz qədər indi uzaqsan,
Yanıma dönən tək qayıdacaqsan,
Qayıtma, bir daha geri qayıtma.

Eşqi məram edə bilməyəcəksən,
Qəlbini şam edə bilməyəcəksən,
Şahini ram edə bilməyəcəksən,
Qayıtma, bir daha geri qayıtma,
Geri qayıtma!

*27.05.1997*

## ÖZÜMƏ!

Işıq görünən zaman
Işığı görmək asan!
Şahin Fazil,
çalış ki,
Qaranlıqda işığı
Görməyi bacarasan!

*16.06.1997*

## ÖLÜM HAYANDA QALDI?

Gəlmişəm qəm yeməyə,
Zülüm hayanda qaldı?
Söz tapmıram deməyə,
Dilim hayanda qaldı?

Yarımadım əzəldən,
Əl çəkdim o gözəldən.
Əlim üzüldü əldən,
Əlim hayanda qaldı?

Nə haldı bihal oldum?
Nə qaldı ki, qal oldum?
Bülbül idim, lal oldum,
Gülüm hayanda qaldı?

Ölüm mənə dərd - asan!
Ey Əzrayıl, hardasan?
Gəl, hansı yollardasan?
Ölüm hayanda qaldı?
Ilhamı çıxmır zilə,
Noldu Şahin Fazilə?
Gözümdə yaş - bir gilə,
Selim hayanda qaldı?

*19.06.1997*



## MƏNI ÇUXA KIMI KƏDƏR BÜRÜDÜ

Gözü yaş, ürəyi qəhər bürüdü,
Yenə zəbt olundu sevincin yeri.
Məni çuxa kimi kədər bürüdü,
Yenə zəbt olundu sevincin yeri.

Yoxsa ürək qəmə yalavac oldu,
Xudaya, nə yersiz ehtiyac oldu,
Niyə "yersiz gəldi, yerli qaç oldu"?
Yenə zəbt olundu sevincin yeri.

Mənim ehtişamım, izzim hardadır?
Babəkim hardadır, Bəzzim hardadır?
Şənliyim hardadır, həzzim hardadır?
Yenə zəbt olundu sevincin yeri.

Sancıldı fələyin xəncəri kimi,
Canıma işlədi neştəri kimi,
Kədər - Batı xanın ləşkəri kimi,
Yenə zəbt olundu sevincin yeri.

Şahinin qəddini kim əyə bilər?
Əgər belə getsə inləyə bilər.
Sevincin yerini kim deyə bilər?
Yenə zəbt olundu sevincin yeri,
Sevincin yeri.

*21.06.1997*

## SƏADƏT ƏLIMDƏN UÇDU QUŞ KIMI

Ağ günə öyrəşən bir ağ quş idi,
Səadət əlimdən uçdu quş kimi.
Ovcumda yenicə oturmuş idi,
Səadət əlimdən uçdu quş kimi.

Qisməti olmayan Hadi varıydı,
Adi aşiqinsə adi varıydı,
Fidan bir sevginin yadigarıydı,
Səadət əlimdən uçdu quş kimi.

Uçdu ərşə sarı, uçağana bax,
Uçdu, indi uçur, sonra yanacaq,
Günəşə çatanda qarsalanacaq,
Səadət əlimdən uçdu quş kimi.

Görən niyə uçdu, quşum gəlməyir...
Başıma o gündən huşum gəlməyir,
Quşlardan daha heç xoşum gəlməyir,
Səadət əlimdən uçdu quş kimi.

Özü gedibsə də izi qalıbdır,
Odu sönübsə də közü qalıbdır,
Ardınca bir aşiq gözü qalıbdır,
Səadət əlimdən uçdu quş kimi.

Məhəbbətsiz ötən bu çağlara vay,
Səadətsiz bitən bu çağlara vay,
Yumruğa dönməyən barmaqlara vay,
Səadət əlimdən uçdu quş kimi.

Məhəbbət ardınca qanad açırdım,
Səadət ardınca qanad açırdım,
Necə şahinəm ki, ovu qaçırdım,
Səadət əlimdən uçdu quş kimi,
Uçdu quş kimi...

*23.06.1997*

## QAR KIMI ƏRIDI ÜMIDLƏRIMIZ

Sonu əvvəlcədən görəydik gərək,
Bu dünya çox Kərəm, Əsli itirib.
Savab eləmişdik vəslə yetərək,
Günaha batmışıq vəsli itirib.

Mən də, sən də adi sevənlər kimi
Yanmışıq bu günün adi eşqinə.
Biz duya bilmədik Ağabəyimi,
Düşünə bilmədik Hadi eşqi nə?



Hicran şadlıq edir vüsal yanında,
Hicranda qələbə təntənəsi var.
Vüsal çiçəyinin soluxmasında
Tale günahkarmı, bəxtmi günahkar?

Səbəb bəxtdədirmi, eh, bu nə işdir,
Bəxti qınayıram mən gündüz-gecə.
Insana bu ecaz verilməmişdir,
Sonu əvvəlcədən görəydik necə?

Sonu əvvəlcədən olubmu görən?
Əvvəldən görünmür əvvəlin sonu.
Özüm də bilmirəm nə deyirəm mən,
Əvvəldən bir kimsə görməyib onu.

Canda güc, qəlbdəsə təpər qalmadı,
Qeyb etdik, itirdik ümidləri biz.
Şirin arzulardan əsər qalmadı,
Qənd kimi əridi ümidlərimiz.

Qəlbimi heç kimə verə bilmirəm,
Qəlbi verdiyim kəs gendə qalıbdır.
Bircə gözəli də görə bilmirəm,
Axı mənim gözüm səndə qalıbdır.

*7.07.1997*

## UNUTMUŞAM

Sözlərini eşidib
Sözümü unutmuşam.
Mən sənin gözlərinə
Dönə-dönə göz dikib
Gözümü unutmuşam.
Hər an səni yad edib,
Sənin izinlə gedib,
Izimi unutmuşam.
O qədər düşünürəm
Mən sənin haqqında ki,
Özümü unutmuşam,
Özümü unutmuşam!..

*13.07.1997*

## TƏNDIR SOYUYUBDUR, SÖNÜBDÜR OCAQ

Məni xatırlayıb dad edəcəksən,
Xatirə vərdişi sənə yar olsa.
Eşqimi həmişə yad edəcəksən,
Əgər yaddaşında etibar olsa.

Allahın bəlası gəlibdir sənə,
Günbəgün azaldır günah ağlını.
Əməl eləsəydin Allah deyənə
Başından almazdı Allah ağlını.

Mən nələr çəkmədim dilindən sənin,
Dilin sirrimizi elədi bəyan.
Oğurluq da gəlir əlindən sənin,
Sən mənim eşqimi oğurlamısan.

Son hökm çıxardan bir hakim kimi
Sənə qərarımı bildirim gərək:
Gətirmə dilinə bir də ismimi
"Şahinim" deyərək, "şahım" deyərək.

Daha qəlbi qızmaz sənə yarının,
Təndir soyuyubdur, sönübdür ocaq.
Əynimə geydiyim eşq paltarının
Sənə düymələri açılmayacaq.

*3.08.1997*

## SEVGI KÜLƏYININ ISTIQAMƏTI

Sabit bir sevginin zəmanətidir
Sevgi küləyinin istiqaməti.
Eşq ilahəsinin əmanətidir
Sevgi küləyinin istiqaməti.

Həmişə üz tutub mənim səmtimə,
Məni hədəf bilib külək sən demə...
Belə yönəlməyib hələ heç kimə
Sevgi küləyinin istiqaməti.

Sanıram özümü mətin, qürurlu,
Günəş tək edibdir günümü nurlu,



İstiqamət olub mənə uğurlu
Sevgi küləyinin istiqaməti.

Necə ki, qismıəti olub mən kəsin,
Qoy nəsibi olsun hər sevən kəsin!
Hərcayi külək tək dəyişilməsin
Sevgi küləyinin istiqaməti.

Sevgini ömürdən silləm dəyişsə,
Göz yumub həyata ölləm dəyişsə,
Dünyamı dəyişə billəm dəyişsə
Sevgi küləyinin istiqaməti.

*5.08.1997*

## SƏNI MƏN GÖZLƏYIRƏM!

Gedibən sən məni saldın kədərə, dərdə yenə,
Aramızda çəkilibdir, gözəlim, pərdə yenə,
Göyərərmi görəsən arzularım bir də yenə?
Səpərək torpağa ümmid dəni mən gözləyirəm,
Səni mən gözləyirəm!

Gəmiyəm öylə ki, görmüş sədəmə qovğadə,
Kimsə insaf eləmir, kimsə yetişmir dadə,
Yelkənim yox deyə üzməm, batıram dəryadə,
Məni qərq etməyəcək yelkəni mən gözləyirəm,
Səni mən gözləyirəm!

Bülbülə varmı gülüstan ilə gülşən fərqi?
Aşiqə varmı biyaban ilə məskən fərqi?
Bir can idik ikimiz, vardımı sən-mən fərqi?
Gözəlim, sən ki, mən idin, məni mən gözləyirəm,
Səni mən gözləyirəm!

Ağ günü görməyimə az da gümanım yoxdur,
Yerdəmi, göydəmiyəm, sanki məkanım yoxdur,
Deyəsən çox günəhim var ki, hayanım yoxdur,
Günəşin çıxması mübhəm, çəni mən gözləyirəm,
Səni mən gözləyirəm!

Sevgini ömr uzunu qayə bilən öylə kəsəm,
Deməsinlər "yaşayır" sənsiz əgər ömr eləsəm,
Dilim-ağzım quruyar qeyriyə gülçöhrə desəm,

Şahinəm, sən kimi gülçöhrəni mən gözləyirəm,
Səni mən gözləyirəm!

*12.08.1997*

## ONA

Şer yazmamışam heç zaman sənə,
Mənim vəsf etdiyim sən olmamısan.
Gəl bir də "Məcnunum" söyləmə mənə,
Çünki sən Leyliyə tən olmamısan.

Mənim "Divan"ımı çıxma adına,
Onda səndən əsər-əlamət hanı?
Bir daha salıram sənin yadına:
Sənə yazmamışam mən bu "Divan"ı.

Yalan deyə-deyə zar olacaqsan,
Yalana bükürsən sən həqiqəti.
Həqiqəti desəm xar olacaqsan,
Sən yalanı demə, mən həqiqəti.

*13.08.1997*

## TƏQLIDÇI QƏZƏLXANA

*"Bu günün qəzəl ədəbiyyatı - xaltura ədəbiyyatıdır. Qəzəlxanlar hazırda işlənməyən söz və ifadələri keçmiş dövrlərdə olduğu kimi yenə də gen-bol işlətməkdədirlər və təqlid yolunu tutmuşlar".*

***Professor Nizami Cəfərov (Televiziya ilə çıxışından)***

Ümiddən bir əsər qalmayıb yenə,
Arzu oddan qaçan tüstü kimidir.
Ölmək istəyirəm, bu saat mənə
Torpağın altı da üstü kimidir.

Ustadın yaxdığı tənqid oldu şam,
Qəzəlxan hamıdan başda yanmada.
Hamıya aidmi məgər o eyham?
Qurunun oduna yaş da yanmada.

Bülbüldüm, susmuşam söz çəmənimdə,
Yox könlün sevinci, var qəlbin yası.
Qeyri qəzəlxanla birgə mənim də
Basılıb alnıma təqlid damğası.



Dərdim üzdə deyil, dərdim dərində,
Bəli, qəzəlləri qəliz yazırlar.
Bir çox qəzəlxanın qəzəllərində
Orta əsrlərin yad havası var.

Görüb qəzəlini yumdum gözümü,
Ilahi, görməsin göz sözlərini.
Özgə kəlamıyla, yad kəlməsiylə
Əvəz eləyirsən öz sözlərini.

"Qəzəl qəliz gərək" - belə buyurdun,
Bu fikrə sübutun tapıla çətin.
Vətəndaşısansa əgər bu yurdun
Hanı vətəndaşlıq bəs ləyaqətin?

Mənim qüsurum nə, qəbahətim nə,
Deyirəm "Qəzəli öz sözünlə yaz.
Bugünkü qəzəli beş yüz il öncə
Işlənən dil ilə yazmaq yaramaz".

Pəsənd eləyirəm az qəzəlini,
Əcnəbi görürəm səni görəndə.
Necə yazırsansa, yaz qəzəlini,
Səbr də tükəndi, taqət də məndə.

Adi qəzəlxanıq, məğrur olma gəl,
Sənin taxtın yoxdur, mənimsə tacım.
Mən ərəb sözünə qoymuram məhəl,
Farsın kəlməsinə yox ehtiyacım.

Sənsə bilərəkdən-bilməyərəkdən
Yazırsan yabançı sözü o ki var.
Sənə qəzəbimi gizlətmirəm mən,
Əməlim aşikar, sözüm aşikar.

"Kim haqlı, kim haqsız?" - müəmma kimi
Bu sual dayanıb önümdə mənim.
Yanıb-qovruluram qovurğa kimi,
Bir şair olmasın günümdə mənim.

"Kim haqlı, kim haqsız?" - zaman deyəcək,
Bu gün bu suala cavab görünmür.
Sən tək günahkardan qaçasan gərək,
Neçin əməlində savab görünmür?

"Kim haqlı, kim haqsız?", bu gün zar olub,
Dilimdə sualım, əlimdə qələm.
Gələcək zamana ümidvar olub
Onun qərarını gözləməkdəyəm.

*2.09.1997*

## ÜZÜMƏ BAĞLANAN QAPI

Məni səndən araladı
Üzümə bağlanan qapı.
Ağ sevdanı qaraladı
Üzümə bağlanan qapı.

Örtdü imkan qapısını,
Qapadı can qapısını,
Açdı hicran qapısını
Üzümə bağlanan qapı.

Bir aşılmaz hasar oldu,
Bir keçilməz divar oldu,
Özü boyda qübar oldu
Üzümə bağlanan qapı.

Bir vulkanın közü boyda,
Təpəgözün gözü boyda...
Bir şillədir özü boyda
Üzümə bağlanan qapı.

Sanki yeni Çin səddidir,
Bir hicranın şər həddidir,
Bir vüsalın sərhəddidir
Üzümə bağlanan qapı.

Görən, tale mənə yarmı?
Açılmayan qapı varmı?
"Sim-sim" desəm açılarmı
Üzümə bağlanan qapı?



Cövr etsə də bu gün fərağ,
Çəkilsə də sinəmə dağ,
Şahin, bir gün açılacaq
Üzümə bağlanan qapı.

*2.10.1997*

## KƏNDIRI TAPMIŞAM, DAR AĞACI YOX...

*Səxavət və kərəm sahibi*
*Hacı İntiqama*

Bu aşiq cahanda neçin doğuldu,
Mən gərək heç zaman doğulmayaydım.
Sevda dənizində eşqim boğuldu,
Mən gərək heç zaman doğulmayaydım.

Sinəmdə boşluq var vadilər kimi,
Şairlər itirdim Hadilər kimi,
Peyğəmbər də köçdü adilər kimi,
Mən gərək heç zaman doğulmayaydım.

Bir diyar aləzar yetişdirirdi,
Başqası hər nə var yetişdirirdi,
Ölkəm allahsızlar yetişdirirdi,
Mən gərək heç zaman doğulmayaydım.

Gözüm dərd əlindən röya bilməyir,
Məcnunun qədrini Leyla bilməyir,
Varmıyam, yoxmuyam, dünya bilməyir,
Mən gərək heç zaman doğulmayaydım.

Zərrəyəm, məkanda nə etmişəm ki?
Ləhzəyəm, zamanda nə etmişəm ki?
Doğulub cahanda nə etmişəm ki?
Mən gərək heç zaman doğulmayaydım.

Mənim söz meşəmin qarağacı yox,
Ağac qatar-qatar, var ağacı yox,
Kəndiri tapmışam, dar ağacı yox,
Mən gərək heç zaman doğulmayaydım.

Tutub sevincimi qüssə boğubdur,
Bu dünya çox gözü nəmli doğubdur,
Məni doğan ana qəmli doğubdur,
Mən gərək heç zaman doğulmayaydım.

Tülkü də doğulur, şir balası da,
Bic də peyda olur, pir balası da...
Öləcək Fazilin bir balası da,
Mən gərək heç zaman doğulmayaydım.

Nə sözüm, nə də ki səsim qalacaq,
Ilahi, cahanda de kim qalacaq?
Iki ciyərparam yetim qalacaq,
Mən gərək heç zaman doğulmayaydım.

Bülbül oxuyacaq çəməndə mənsiz,
Şahinlər ötəcək ötəndə mənsiz,
Bir qəbir artacaq vətəndə mənsiz,
Mən gərək heç zaman doğulmayaydım.

*7.10.1997*

## ASILSA ASILIR BIR BAŞ BIR IPDƏN...

Belə kim şərabsız məstanə etdi,
Saqimi, yoxsa ki, o afət məni?
Məhəbbət kimisə divanə etdi,
Kamala yetirdi məhəbbət məni.

Çoxdan yox olmuşdu sinnin baharı,
Qəmimə yox idi çıxan müştərək.
Məni öldürürdü təklik azarı,
Mən yerdə tək idim, Allah göydə tək.

Məhəbbət sevincək etdi mən kəsi,
Təkliyim, nə yaman zülümə düşdün.
Gözümü nurlatdı sevgi sürməsi,
Gülüm, təbərrük tək əlimə düşdün.



Əgər inkar etsəm səni həyatda
Yetişsin həmin dəm ömrümün sonu.
Ittiham eləsin məni həyatda
Sevda məcəliəsi, sevgi qanunu.

Sanırdım şahinin əridi cismi,
Hüma quşu kimi yoxalmışam mən.
Möcüzə oldu lap, bir də gördüm ki,
Yoxalmaqda ikən çoxalmışam mən.

Asılsa asılır bir baş bir ipdən,
Bir idim, indisə min-min olmuşam.
Sənin hər telindən asılmışam mən,
Sənin telin sanı Şahin olmuşam.

*16.10.1997*

## LAP BOĞAZA KIMI BATSAM DA YERƏ...

Əzizim, sirrini demə heç kimə,
Sirrin qoy yığılıb məndə ola cəm.
Sirlər xəzinəsi Nizaminindi,
Sirlər mücrüsünün sahibi mənəm.

Deyirəm hər anın sevinclə dolsun,
Ürəyim hökm edir dilim deyənə.
Sevincini saxla, səninki olsun,
Amma hər dərdini bağışla mənə.

Izn ver baş qoyum daşının üstdə,
Qüssəni ver mənə qüssən azalsın.
Günəş qoy tac olsun başının üstdə,
Qoy duman azalsın, qoy çən azalsın.

Kimsəyə yükləmə hədər yükünü,
Ağırlıq altına verib çiynimi.
Sənin qəm yükünü, kədər yükünü
Çəkərəm cəfakeş aşiqin kimi.

Qorxutmur ağırlıq məni bir gilə,
Mən sənə hambalam nə qədər sağam.
Lap boğaza qədər batsam da yerə,
Sənin qəmlərini daşıyacağam.

*18.10.1997*

## MÜŞAHIDƏ

*Yorulmaz müşahidəçi Əli Vəlioğluya*

Dərdimiz göydəki ulduzlar qədər,
Yerdəki qumlara kədərimiz tən.
Qara bığ saxlayır yenə kişilər,
Amma Qarabağı veriblər əldən.

Bu dava ürəkdə qara xal kimi...
Nə qədər xəyanət bu davada var...
Şəhər də satıldı qaramal kimi,
Şəhərdə ev alır şəhər satanlar.

Fikrimi cəlb edir hər səs, hər səda,
Adi bir seyrçi deyiləm ki mən.
Bu adam da adam, adamdır o da,
Amma təfavütlər yerdən göyəcən.

Onun bağçasının gülü solmada,
Bununsa gülü min, çiçəyi min bir...
Yaxşı dəblər neçin unudulmada?
Məddahlıq nə yaman dəbə minibdir!..

Onun köynəyində ətir var yenə,
Bunun şalvarında yenə ütü yox.
Hücrədə yəqin ki, guşənişinə
Gecəylə gündüzün təfavütü yox.

Gül tək sözlər çıxır onun dilindən
Bununsa dilində tikan bərqərar.
Əlini uzadıb, titrək əlindən
Korun çəliyini oğurlayan var.

Onun hər cümləsi, hər sözü şirin,
Bunun dodağında yenə sükut var.
Yağış çoxdan yumur çirkini yerin,
Səmanı bürüyüb qısır buludlar.



Zəhər ağu edir onun sözünü...
Ilanınsa zəhər axır dişindən.
Ləbbadə geyməsə günün bir günü
Kənar edərlərmi şeyxi işindən?

Əyyaş tamahını saxlaya bilmir,
Ömrünü zəmanət araqçın qoyur.
Hələ bu suala cavab verilmir:
Molla nəyə görə araxçın qoyur?

Adam var görməyir öz gözü ilə,
Əlində əyrilik, dilində yalan.
Yazmır qəzəlini öz sözü ilə,
Yad libas geydirir şerə qəzəlxan.

Cümlə olar alağ, söz olar xəzəl,
Yaltaqlıq, məddahlıq dəbə mindisə.
Rütbə verilməzdi təlxəyə əzəl,
Canım, rütbə alır təlxək indisə.

Malı olmayanın çoxalıb malı,
Halı olmayan kəs halı xoş gəzir.
Kimin vecinədir alimin halı?
Alim başı dolu, cibi boş gəzir.

Kağız bahalaşıb, pul ucuzlaşıb,
Yüzlüyü götürmür dilənçi daha.
Bu gün ümidsizlik həddini aşıb,
Qalıbdır hər ümid, güman Allaha.

Xaricə daşınır ölkənin varı,
Işsiz iş axtarır, işçi iş gəzir.
Şəhərdə yaranıb "qul bazarları",
Əgər pulun varsa, qulun müntəzir.

Iştahı azalmır filankəslərin,
Sərvət tarac olur, ölkə soyulur.
Başında şlyapa olan kəslərin
Canında nə üçün təşəxxüs olur?

Şahdağın zirvəsi dumanlı bu gün,
Elə bil asılıb tül yuxarıda.
Qızılgülün yeri tikandan üstün,
Tikan altda bitir, gül yuxarıda.

Yenə əvvəlki tək oxuyur bulaq,
Çiyində görmürəm amma səhəng var.
Qadın görürəm ki, başı ağappaq,
Kişi görürəm ki, saçında rəng var.

Günə bax, yanmada mənə oxşayıb,
Rəngi saqqalımda həna olacaq.
O qadın necə də tumurcuqlayıb,
Görünür, bir azdan ana olacaq.

*8-10.11.1997*

## MƏNI YADDAŞINDA SAXLAMA DAHA

Poz mənim adımı, belədir qərar,
Məni yaddaşında saxlama daha.
Yoxsa, yaddaşını ağırlaşdırar,
Məni yaddaşında saxlama daha.

Elə ki, tab itdi, səbr daraldı,
Başımın üstünü duman, qar aldı,
Yaddaş lövhəsində adın qaraldı,
Məni yaddaşında saxlama daha.

Gəl amana, aha ümid eləmə,
Eşqimə bir daha ümid eləmə,
And olsun Allaha, ümid eləmə,
Məni yaddaşında saxlama daha.

Sanırdım üzüyəm, sən - qaşı kimi,
Məni tanımadın bir naşı kimi,
Götür, at eşqimi yad daşı kimi,
Məni yaddaşında saxlama daha.



Yeri, muradına başqasını yaz,
Bəxtinə, adına başqasını yaz,
Poz məni, yadına başqasını yaz,
Məni yaddaşında saxlama daha.

Bəxtimi hasar tək yıxarmışam mən,
Hicranın əlini sıxarmışam mən,
Səni yaddaşımdan çıxarmışam mən,
Məni yaddaşında saxlama daha.

Şahinəm, nə qədər acıq çəkmişəm,
Demişəm özümə "yazıq" çəkmişəm,
Adının üstündən cızıq çəkmişəm,
Məni yaddaşında saxlama daha,
Saxlama daha!

*13.11.1997*

## DAHA AŞIQ OLMAQ ISTƏMIRƏM MƏN

Aşiqlik hər kəsin işi deyildir,
Daha aşiq olmaq istəmirəm mən.
Yalandan söz deyən kişi deyildir,
Daha aşiq olmaq istəmirəm mən.

Poladdan tökülə biləyi gərək,
Yükdən yara ola kürəyi gərək,
Aşiqin dağ boyda ürəyi gərək,
Daha aşiq olmaq istəmirəm mən.

Onda Isa dəmi, eşq nəfəsi var,
Mənim səsim yoxdur, onun səsi var,
Aşiqdə ariflik mərtəbəsi var,
Daha aşiq olmaq istəmirəm mən.

Həmin mərtəbəyə əlim yetişməz,
Püşkü aşiqliyin adıma düşməz,
Bir də aşiq olmaq yadıma düşməz,
Daha aşiq olmaq istəmirəm mən.

Nur aşiqi olsam sönə bilərəm,
Qar aşiqi olsam dona bilərəm,
Yar aşiqi olsam yana bilərəm,
Daha aşiq olmaq istəmirəm mən.

Indi aşiqiyəm büllur qəzəlin,
Aşiqi olmaram heç bir gözəlin,
Sən də, ey gözəlim, məndən üz əlin,
Daha aşiq olmaq istəmirəm mən.

Olmaram bir daha məftun, kifayət,
Leyliyə meyl edən Məcnun kifayət,
Dürrəyə bənd olan Vurğun kifayət,
Daha aşiq olmaq istəmirəm mən.

Hər əməldə mahir ola bilərəm,
Hər sənətdə qadir ola bilərəm,
Istəsəm baş şair ola bilərəm,
Daha aşiq olmaq istəmirəm mən.

Şahin, aşiqliyin çox hikməti var,
Sirri var, sehri var, kəraməti var,
Divanə olurlar aşiq olanlar,
Daha aşiq olmaq istəmirəm mən.

*5.12.1997*

## NEÇIN GÖRMƏMIŞƏM GÖZƏLLIYINI?

Korluğumdan ötrü məni əfv elə,
Neçin görməmişəm gözəlliyini?
Istəsən ya yaşat, ya da məhv elə,
Neçin görməmişəm gözəlliyini?

Dilim bağlı idi, dindi, açılıb,
Qönçəydi, sözlərim indi açılıb,
Elə bil gözlərim indi açılıb,
Neçin görməmişəm gözəlliyini?



Yalan - aşiqlərin sözündən uzaq,
Birinə yaxınsa, yüzündən uzaq,
Boya, ənnik, kirşan üzündən uzaq,
Neçin görməmişəm gözəlliyini?

Çox yana qaçaraq yorulmuşam mən,
Məşəldim, ocaqdım, qor olmuşam mən,
Arif olsam belə kor olmuşam mən,
Neçin görməmişəm gözəlliyini?

Özüm eləmişəm asanı çətin,
Olacağı imiş bu da qismətin...
Sənin gözəlliyin - sənin ismətin,
Neçin görməmişəm gözəlliyini?

Mahir zərgər idim, eşq zərim idi,
Məcnun qabağımda əsgərim idi,
Gözəllik mənim ki şakərim idi,
Neçin görməmişəm gözəlliyini?

Çox gül qurutmuşam, gülab tapmıram,
Çox günah etmişəm, savab tapmıram,
Neçin sualıma cavab tapmıram,
Neçin görməmişəm gözəlliyini?

Üzümə bir mələk baxmada səndən,
Qəlbimdə şimşəklər çaxmada səndən,
Gözəllik yağış tək yağmada səndən,
Neçin görməmişəm gözəlliyini?

Çöksə saf ürəyə gil, çəkilməli!
Hədəri danışsa dil, çəkilməli!
Şahinin gözünə mil çəkilməli,
Neçin görməmişəm gözəlliyini?

*6.12.1997*

## ƏLIBOŞ QAYTARMA GƏL DILƏNÇINI

Qəlbimdə olanı gərək deyəm mən,
Əliboş qaytarma gəl dilənçini.
Qapına gəlmişəm, dilənçiyəm mən,
Əliboş qaytarma gəl dilənçini.

Ürəyim - yanar şam sevgi naminə,
Gözüm - yaş dolu cam sevgi naminə,
Dilənçi olmuşam sevgi naminə,
Əliboş qaytarma gəl dilənçini.

Göz içrə yaşa bax, yaşım doludur,
Cahilə atmağa daşım doludur,
Əlim boşdursa da, başım doludur,
Əliboş qaytarma gəl dilənçini.

Taqətim tükənir mənim get-gedə,
Dodağım əsmədə, dilim əsmədə,
Ayağım əsmədə, əlim əsmədə,
Əliboş qaytarma gəl dilənçini.

Sənə çatmayıbmı səsim-sorağım,
Yandır ki, sönməsin ömür çırağım,
Çiynimdə torbam var, əldə çomağım,
Əliboş qaytarma gəl dilənçini.

Dilənçi əl açıb nəva eləyər,
Dərdinə eşq ilə dəva eləyər,
Sənə ömrü boyu dua eləyər,
Əliboş qaytarma gəl dilənçini.

Donuram, gəlmədə, yar, qışım mənim,
Üç fəsli ötürdüm, var qışım mənim,
Səni bir gün tutar qarğışım mənim,
Əliboş qaytarma gəl dilənçini.

Bu kəsin fələyə çatır harayı,
Qəhərli, kədərli ötür hər ayı,



Dilənçi payı yox, ver aşiq payı,
Əliboş qaytarma gəl dilənçini.

Xəsislik etməsən halı şən mənəm,
Səndən sevgi uman, dilənən mənəm,
Şahinəm, Fazilən, gülüm, mən mənəm,
Əliboş qaytarma gəl dilənçini.

*25.12.1997*

## GƏL SƏNI GÖTÜRÜM QOLLARIM ÜSTƏ

Daha ayrılmarıq nə qədər sağıq,
Gəl səni götürüm qollarım üstə.
Yıxılsaq birlikdə yıxılacağıq,
Gəl səni götürüm qollarım üstə.

Nakam Leyli-Məcnun eşqi naminə,
Dürrə ilə Vurğun eşqi naminə,
Qəlbimin bu coşğun eşqi naminə,
Gəl səni götürüm qollarım üstə.

Qolum, arxayın ol, səni saxlayar,
Mən səni, yer isə məni saxlayar,
Bu gün qollarımda ilahi güc var,
Gəl səni götürüm qollarım üstə.

Inan ki, fəğanın cəbri qalmadı,
Vüsala hicranın cəbri qalmadı,
Gülüm, qollarımın səbri qalmadı,
Gəl səni götürüm qollarım üstə.

Daha düşmə yerə, qal qollarımda,
Şirin röyalara dal qollarımda,
Qiyamətə kimi qal qollarımda,
Gəl səni götürüm qollarım üstə.

Ey nigarım mənim, ey yarım mənim,
Köksüm mücrü olar, sən - varım mənim,

Varımı qoruyar qollarım mənim,
Gəl səni götürüm qollarım üstə.

Hərçənd ki, eşqinin mən sərxoşuyam,
Amma ən ayığa tən sərxoşuyam,
Səni buraxmaram, şahin quşuyam,
Gəl səni götürüm qollarım üstə,
Qollarım üstə!

*8.01.1998*

## SƏNIN GÖZLƏRININ IŞIĞI ILƏ

Mənim yollarımda işıq yanacaq,
Sənin gözlərinin işığı ilə.
Qaranlıq həyatım işıqlanacaq,
Sənin gözlərinin işığı ilə.

Bəxtimin günəşi doğarsa - yaxşı!
Işıq qaranlığı boğarsa - yaxşı!
Gecənin çadrası ağarsa yaxşı
Sənin gözlərinin işığı ilə.

Hədəfi biz tutaq işığa sarı,
Həmişə üz tutaq işığa sarı,
Işıqlı eləyək qaranlıqları
Sənin gözlərinin işığı ilə.

Könlümün möhnəti əriyəcəkdir,
Qəlbimin həsrəti əriyəcəkdir,
Hicranın zülməti əriyəcəkdir
Sənin gözlərinin işığı ilə.

Öndə var çox səfər, yol gedəsiyəm,
Yola çəkmə çəpər, yol gedəsiyəm,
Mən hələ nə qədər yol gedəsiyəm
Sənin gözlərinin işığı ilə.

Işığım azalır, eyvah, çoxaltsın,
Hiss edim özümü gümrah, çoxaltsın,



Gözümün nurunu Allah çoxaltsın
Sənin gözlərinin işığı ilə.

Yazır, gündə yazır zavallı Şahin,
Bir deyil, beş deyil, şerləri - min,
Işığı artacaq şerlərimin
Sənin gözlərinin işığı ilə.

*10.01.1998*

## SƏNI GÖRƏCƏYƏM YUXULARIMDA

Gülüm, kipriklərim qovuşur yenə,
Səni görəcəyəm yuxularımda.
"Yuxun şirin olsun" demisən mənə,
Səni görəcəyəm yuxularımda.

Qıvrım tellərini hörə bilməsəm,
Busəni gül kimi dərə bilməsəm,
Neçə gün yanımda görə bilməsəm,
Səni görəcəyəm yuxularımda.

Bizim fərağımız ölənə qədər,
Yenidən xoş vüsal gələnə qədər,
Ağlar gözlərimiz gülənə qədər
Səni görəcəyəm yuxularımda.

Pəsənd eləmirəm axı dərmanı,
Hər gün içəcəyəm yuxu dərmanı...
Beləcə qovaraq acı hicranı
Səni görəcəyəm yuxularımda.

Tez-tez görüm deyə bəyaz hüsnünü,
Bəzən yatacağam mən bütün günü,
Belə eləyəcək əvəz gün günü,
Səni görəcəyəm yuxularımda.

Həmişə, hər zaman yuxu diləyib,
Hər işdən olub yan, yuxu diləyib,

Allah-təaladan yuxu diləyib
Səni görəcəyəm yuxularımda.

Işi çoxdursa da, işini atıb
Şahin yuxlayacaq başını atıb...
Yuxu görməməyin daşını atıb
Səni görəcəyəm yuxularımda,
Yuxularımda.

*16.01.1998*

## ƏGƏR MƏNI "MƏN"DƏN AYIRA BILSƏN

*"Məni məndə gəzmə, məndə deyiləm,*
*Bir mən vardır məndə, məndən içəri"*
***Yunis Əmrə***

Heç kimə bənzərin olmayacaqdır
Əgər məni "mən"dən ayıra bilsən.
Tayın-bərabərin olmayacaqdır
Əgər məni "mən"dən ayıra bilsən.

Didərgin düşəcək məndəki "mən"lər,
Hər biri mən kimi, mən təki mənlər,
Məni görməyəcək məni görənlər
Əgər məni "mən"dən ayıra bilsən.

Səndə bircə "mən" var, məndə ikicə,
"Mən"lər daşıyıram, gücə bax, gücə...
Məni tərk edəcək "mən"lər sadəcə
Əgər məni "mən"dən ayıra bilsən.

Inad hafizəmdən silinəcəkdir,
Dilək neçə yerə bölünəcəkdir,
Ürək neçə yerə bölünəcəkdir,
Əgər məni "mən"dən ayıra bilsən.

Səni sevəcəyəm nə qədər sağam,
Acıyam, ağuyam, qənd olacağam,
Mən sənə ömürlük bənd olacağam,
Əgər məni "mən"dən ayıra bilsən.



Mən "mən"dən ayrılan mən olacağam,
Şahinəm, Məcnuna tən olacağam,
Bəlkə də mən deyil, sən olacağam
Əgər məni "mən"dən ayıra bilsən.

*18.01.1998*

## YETMƏK ISTƏMIRƏM MƏN BU VÜSALA

Məni addım-addım məlal izləyir,
Yetmək istəmirəm mən bu vüsala.
Hicranı qovaraq vüsal izləyir,
Yetmək istəmirəm mən bu vüsala.

Mənim hal əhlinə etirafım var:
Min yol sınanmışam, sınamasınlar.
Qoy məni aqillər qınamasınlar,
Yetmək istəmirəm mən bu vüsala.

Cahanın fərəhi cahanda qalır,
Zamanın sevinci məkanda qalır,
Vüsalın faydası ziyanda qalır,
Yetmək istəmirəm mən bu vüsala.

Bağımda təzə gül bitə bilmədi,
Canımda nisgilim itə bilmədi,
Məcnun Leylisinə yetə bilmədi,
Yetmək istəmirəm mən bu vüsala.

Üstün tutmadayam acı hicranı,
Sanıram başımın tacı hicranı,
Qardaş tək sevirəm bacı hicranı,
Yetmək istəmirəm mən bu vüsala.

Meylimi çəkdiyim hər ah da bilir,
Bədxah da halidir, xoşxah da bilir,
Başım üstündəki Allah da bilir,
Yetmək istəmirəm mən bu vüsala.

Haram eləməsəm, halal - gözləyir,
Vüsala yetişsəm, zaval gözləyir...
Şahini üqbadə vüsal gözləyir,
Yetmək istəmirəm mən bu vüsala,
Mən bu vüsala!..

***22.01.1998***

## ÇAYIN BAŞLANĞICI - SELLƏRIN SONU

Qarğış edəcəkdir, cövr edəcəkdir,
Yetişsin qoy yava dillərin sonu.
Gözə əvvəl-axır görünəcəkdir,
Fəndlərin axırı, fellərin sonu.

Sənin hər işinə vurğun olmuşam,
Leylisən, dərdindən Məcnun olmuşam,
Qulac tellərinə məftun olmuşam,
Dəyir topuğuna tellərin sonu.

Yaman soyuyubdur göyün çırağı,
Soyuğun düşməsi - qışın sorağı,
Bağban da yığışıb tərk edir bağı,
Ay aman, yetişir güllərin sonu.

Göyün xəlbirindən qar ələnməsin,
Dilimdən eləyin car: Ələnməsin!
Sellər çox da belə qürrələnməsin,
Çayın başlanğıcı - sellərin sonu.

Hər əməl olarsa həyatda gözəl,
Ömür qəşəng olar, həyatsa gözəl,
Ey Şahin, illəri belə qovma gəl,
Ömrün tamamıdır illərin sonu.

*4.02.1998*

## DÜNYANIN AXIRI HARADIR GÖRƏN?

Nə vaxtdır başıma bir fikir girib:
Dünyanın axırı haradır görən?
Fikir mücrüsünə belə sirr girib:
Dünyanın axırı haradır görən?

Sualım sənədir, ey Pərvərdigar,
Səndə səbr böyük, məndə intizar,
Yerin harasında tutmuşuq qərar?
Dünyanın axırı haradır görən?



Duman yolu da var, külək yolu da,
Tikan yolu da var, çiçək yolu da,
Zindan yolu da var, "Ipək yolu" da,
Dünyanın axırı haradır görən?

Hansı əvvəl olub: qaramı, ağmı?
Hansı tez yaranıb: dərəmi, dağmı?
Haçansa bu kələf açılacaqmı:
Dünyanın axırı haradır görən?

Ümidin ölümü - imkanın sonu,
Ümmanın axırı - ümmanın sonu,
Vüsalın əvvəli - hicranın sonu,
Dünyanın axırı haradır görən?

Atını yel kimi çapan olubmu?
Gedib axırına çatan olubmu?
Görəsən bu sirri açan olubmu:
Dünyanın axırı haradır görən?

Şahin, başlanğıcdan axır olarmı?
Qışmı əvvəl olub yerdə, baharmı?
Çevrənin əvvəli, axırı varmı?
Dünyanın axırı haradır görən?

*15.02.1998*

## MƏŞƏL TUTAN

*"Məşələ işıq üçün təşəkkür et, amma qaranlıqda o məşəl tutanı da unutma".*

***Rabindranat Taqor***

Oxunur xəlqimizin saf qəzəli,
Bəxtiyarəm, yazılır gör necə şəffaf qəzəli.
Nə gözəl dil varımızdır, sevinək,
Dilimiz, bil, varımızdır, sevinək.
Əcnəbi kəlmələrə yoxdu zərurət zərrə,
Çıxarıb atmalıyıq onları biz bilmərrə.
"Göz" var ikən niyə "çeşm" olmalıdır?

"Yun" var ikən niyə "pəşmı" olmalıdır?
Niyə "aşiqlər"i "üşşaq" eləyək?
"Qarğa"nı biz nə üçün "zağ" eləyək?
Niyə "xakistər"ə dönsün "kül"ümüz?
"Əndəlib"ləşməlidir bəs nə üçün "bülbül"ümüz?
Xəlqimin öz dili var, öz sözü var, öz səsi var,
Xəlqimin öz dili ilən yazılan nəğməsi var.
Xəlqimin qoşması var, təxmisi var, qitəsi var,
Xəlqimin səslər içində səsi var.
Oxuyub Vahidi könlüm çağ olur,
Oxuyub Bəxtiyarı gör necə həzzim dağ olur.
Deməli, öz sözümüzlən qəzəli yazmaq olur,
Hər iki şairimiz saf dilə əl tutmuşlar,
Saf qəzəl bayrağını, bəh, nə gözəl tutmuşlar.
Qələmin bəs niyə yad kəlmədən imdad gözlər?
Demə "ədviyyəsidir şerimizin yad sözlər"!
Dili təhqir eləmə,
Dili təhqir eləyib sən eli təhqir eləmə.
Soyunub-geyməlidir
Hərə öz paltarını,
Dilimizdən uzaq et əcnəbi söz paltarını.
Neçə il bundan əzəl
"dilimin xeyli genişdir, - demişəm, - imkanı",
Çeviriblər nə gözəl,
nə səlis dillə bizə "Quranı"!
Məqsədimdir ki, deyib öz sözümü qadir olum,
Dilimin sözlərinə mail olub, mahir olum.
Nə üçün söz dilənən şair olum?
Ərəbin şairi türkün sözünə bənd olmur,
Şeri farsın ki, şirindir şəksiz,
Niyə türk sözlərini əxz eləyib qənd olmur?
Dilə yersiz yerə olmuş o calaq sözlərdən,
O alağ sözlərdən
Dil təmizlənməlidir,
Dilimin söz gülü üstündə yatan tozlardan,
Qaralan tozlardan



Gül təmizlənməlidir.
İndi yad sözlər ilə söz demək acizlikdir,
Yad tələffüzlə ögey kəlmələri
Dilə bənd eyləmək acizlikdir.
Dilə böhtan atma,
Dilə böhtan ataraq öz-özünü aldatma.
Məni şair eləyib öz dilimin imkanı,
Öz dilimlən yazılıb əsrimizin "Divan"ı.
Əcnəbi sözləri tuti kimi əzbərləmə gəl,
Sən mənim saf dilimi şərləmə gəl.
Uğur olsun elə şairlərə ki,
Dilimin saflığı uğrunda tutublar məşəl.
Xəlqimiz var edəcək milli əruz şerimizi,
Başa düş sən bunu gəl,
"Söz"ümü bir də "süxən" eyləmə gəl,
Əcnəbi kəlməyə ədviyyə-filan söyləmə gəl.
Şər atıb şerimizə bir də yalan söyləmə gəl.
Şerimizdən düşəcəkdir aralı şər şəksiz,
Mən dəxi əl tutanam,
Mən də məşəl tutanam,
Gələcəkdə məni həm yad edəcəklər şəksiz.

*19.02.1998*

## MƏNIM ÜRƏYIMDƏ SEVGI GÜLÜ VAR

Şahinin həmişə sözləri aydın,
Mənim ürəyimdə sevgi gülü var.
Qoy olsun yarının gözləri aydın,
Mənim ürəyimdə sevgi gülü var.

Yasəmən, qərənfil nəyimə gərək?
Nəstərən, mixək, hil nəyimə gərək?
Bağiban, qeyri gül nəyimə gərək?
Mənim ürəyimdə sevgi gülü var.

Daha gərək deyil qoparmaq gülü,
Qoparıb yarıma aparmaq gülü,

Nəyimə gərəkdir daha bağ gülü,
Mənim ürəyimdə sevgi gülü var.

Azaldı bir tamah, gözəl azaldı,
Demək, bir yaramaz əməl azaldı,
Gülləri qoparan bir əl azaldı,
Mənim ürəyimdə sevgi gülü var.

Şahin olmayacaq gülü öldürən,
Qatil deyilmidir məgər gül dərən?
Bir də qatil olmaq istəmirəm mən,
Mənim ürəyimdə sevgi gülü var!

*21.02.1998*

## SƏSSIZ ELƏYIBDIR SƏSIN SƏSIMI

Mən qulaq kəsildim bu gün bir səsə,
Mən sənin səsini eşitdim, gülüm.
Əgər canan səsi xoş təranəsə,
Səs təranəsini eşitdim, gülüm.

Danışa bilmədim, dinə bilmədim,
Odsuz, tüstüsüz də aşiq yanarmış.
Elə alışdım ki, sönə bilmədim,
Sən demə səsin də atəşi varmış.

Məni məst eləyib yanğısı canın,
Bu gün dinməyəcək daha tarım da.
Bu gün çatmır mənə səsi kamanın,
Sənin səsin vardır qulaqlarımda.

Sarıb varlığımı o səs, o səda,
O səsin yanında nə ney, nə tütək?
Zurnan çatlasa da, zurnaçı baba,
Qulağım səsini eşitməyəcək.

Qaboy nə inləyir, şeypur nə deyir?
Danışa bilmirəm susub lal kimi.
Mənim öz səsim də eşidilməyir,
Səssiz eləyibdir səsin səsimi.



Bu gün ömr elədim sənin səsinlə,
Qeyri səs varmıdır ola səsin tək?
İndi Zeynəb xanım oxusa belə
Qulağım səsini eşitməyəcək.

*22.02.1998*

## SƏN MƏNIM YADIMDAN ÇIXAN DEYILSƏN

Vəfa süfrəsində eşq - payın olsun,
Sən mənim yadımdan çıxan deyilsən.
Əzizim, ürəyin arxayın olsun,
Sən mənim yadımdan çıxan deyilsən.

Hicran bizə sarı can atsa belə,
Ayrılıq qəlbimi qanatsa belə,
Yaddaşım dünyanı unutsa belə,
Sən mənim yadımdan çıxan deyilsən.

Məndə məhəbbətin elə odlanıb,
Cismim də alışıb, canım da yanıb,
Yaddaşın qapısı möhkəm bağlanıb,
Sən mənim yadımdan çıxan deyilsən.

Ömürlük bu eşqə yanacağam mən,
Məni tərk eləsən sınacağam mən,
Amma yenə səni anacağam mən,
Sən mənim yadımdan çıxan deyilsən.

Şirinsən Fərhadın Şirini təki,
Söhbətin duzludur, sözün nəməki,
Elə yazılmısan hafizəmə ki,
Sən mənim yadımdan çıxan deyilsən.

Varlıq sarayımı yıxsam da belə,
Əcəlin əlini sıxsam da belə,
Mən sənin yadından çıxsam da belə,
Sən mənim yadımdan çıxan deyilsən.

Yarın əlindədir aşiqin canı,
Şahinəm, yarını gəl yaxşı tanı,
Heç vaxt içməsəm də yaddaş dərmanı,
Sən mənim yadımdan çıxan deyilsən.

*6.03.1998*

## ÖZÜNƏ YETMƏKÇIN ÖZÜNDƏN ƏL ÇƏK

Bu bir məsləhətdir, özün bilərsən,
Özünə yetməkçin özündən əl çək.
Düzgündür-qələtdir özün bilərsən,
Özünə yetməkçin özündən əl çək.

Öz-özündən keçən az olmayıbdır,
Hələ ki, növrağın pozulmayıbdır,
Hələ ki, məzarın qazılmayıbdır,
Özünə yetməkçin özündən əl çək.

Vida yox, salamdır özünə yetmək,
İzzət, ehtiramdır özünə yetmək,
Ən ülvi məramdır özünə yetmək,
Özünə yetməkçin özündən əl çək.

Adam var ki, üzü çətin ağara,
Əməli də qara, işi də qara...
Dünya beş günlükdür, beşi də qara,
Özünə yetməkçin özündən əl çək.

Ruhmusan, canmısan, özünə qayıt,
Heçdən yaranmısan, özünə qayıt,
Özünü qanmısan, özünə qayıt,
Özünə yetməkçin özündən əl çək.

Heç vaxt sarmayacaq gözü qəm demə,
Qadirəm, hünərəm, dözüməm demə,
Özüməm, özüməm, özüməm demə,
Özünə yetməkçin özündən əl çək.



Sındırma var üçün şax vüqarını,
Aparan olmayıb dünya varını,
Şahin, bel götürüb qaz məzarını,
Özünə yetməkçin özündən əl çək.

*9.03.1998*

## SƏN HARDA ITMISƏN, HARDA BATMISAN?

Ay kimi batmısan gözdən itərək,
Sən harda itmisən, harda batmısan?
Səni mən çıraqla axtarım gərək,
Sən harda itmisən, harda batmısan?

Deyirlər ki, heç nə cahanda itmir,
Nalə də yox olmur, fəğan da itmir,
Kimsə nəsə tapır, tapanda - itmir,
Sən harda itmisən, harda batmısan?

Arxa zənn edirdim, hayan da səni,
Bilmirəm axtarım hayanda səni,
Qurban kəsəcəyəm tapanda səni,
Sən harda itmisən, harda batmısan?

Sevincim qar təki əriyib gedib,
Güman susub gedib, kiriyib gedib,
Ümid ayağını sürüyüb gedib,
Sən harda itmisən, harda batmısan?

Ürəyim sayğac tək kədər sayıbdır,
Nisgilim zərrəcə azalmayıbdır,
Səni gəzmədiyim yer qalmayıbdır,
Sən harda itmisən, harda batmısan?

Gülüm, bu gizlən-qaç nəyinə gərək?
Bu sirri mənə aç, nəyinə gərək?
Səni tapanacan başım itəcək,
Sən harda itmisən, harda batmısan?

Nə mən pərvanəyəm indi, nə sən şam,
Şahindim, dönərək tuti olmuşam,
Təkrar eləyirəm, gözəlim, müdam:
Sən harda itmisən, harda batmısan?
Sən harda itmisən, harda batmısan?..

*12.03.1998*

## YAXAM TƏRƏDDÜDÜN ƏLINDƏ QALIB

Irəli gedimmi, geri dönümmü?
Yaxam tərəddüdün əlində qalıb.
Günəş tək yanımmı, şam tək sönümmü?
Yaxam tərəddüdün əlində qalıb.

Məndə can var imiş, ciyər yox imiş,
Cəsarət yox imiş, hünər yox imiş.
Əsla qətiyyətdən əsər yox imiş,
Yaxam tərəddüdün əlində qalıb.

Mən - sevginin qulu, sevgi - hökmran,
Daim vəslə sarı cəhd eləyir can,
Amma göydə Allah, əlimdə Quran,
Yaxam tərəddüdün əlində qalıb.

Əynimə kədərim çuxa olubdur,
Ürəyim qüssədən yuxa olubdur,
Məni rüsvay edən yaxa olubdur,
Yaxam tərəddüdün əlində qalıb.

Elə ki, o əllə mən görüşmüşəm,
Dumana düşmüşəm, çənə düşmüşəm,
Ay aman, nə yaman günə düşmüşəm,
Yaxam tərəddüdün əlində qalıb.

Uymuşam fəndinə-felinə onun,
Düşmüşəm bir ümman selinə onun,
Yaxamı vermişəm əlinə onun,
Yaxam tərəddüdün əlində qalıb.



O əllə sovrulur ömür xərməni,
Görəsən o əldən kim çəkər məni?
Vallah öldürəcək bu kədər məni,
Yaxam tərəddüdün əlində qalıb.

Məni kim qarğıyıb, dili qurusun,
Bülbülü lal olsun, gülü qurusun,
Görüm tərəddüdün əli qurusun,
Yaxam tərəddüdün əlində qalıb.

Həyatım yeknəsəq, günüm qara, ağ,
Taqətim tükənib, yolsa dərə, dağ...
Əlini uzadıb məni boğacaq,
Yaxam tərəddüdün əlində qalıb.

Bir gün deyəcəklər: Bəli, var imiş,
Dünyada Şahin tək dəli var imiş,
Canım, tərəddüdün əli var imiş,
Yaxam tərəddüdün əlində qalıb...

*17.03.1998*

## MƏNIM ƏSƏBIMLƏ OYNAMA, BALA

*"Nə desəm avazım haqq avazıdı,*
*Şirin avazımla oynama, bala".*
**Zəlimxan Yaqub**

Oyna, qar yağsa da oyna özünçün,
Mənim əsəbimlə oynama, bala.
Dəvəni sal yada, oyna özünçün,
Mənim əsəbimlə oynama, bala.

Istəsən çırtma çal, "Qazağı" oyna,
"Heyvagülü" oyna, "Qaytağı" oyna,
Ən mahir rəqqasə sayağı oyna,
Mənim əsəbimlə oynama, bala.

Əl götür həcvdən, zəli olarsan,
Əgər cavab yazsam dəli olarsan,

Ayağım altında xəli olarsan,
Mənim əsəbimlə oynama, bala.

Yalanı döşəmə, dilin quruyar,
Bəməm, zilə qalxsam, zilin quruyar,
Elə həcv edərəm əlin quruyar,
Mənim əsəbimlə oynama, bala.

Mənə yerli-yersiz çox hücum olub,
Dağa hücum edən amma qum olub...
Bilmirsən Məcnunla dostluğum olub?
Mənim əsəbimlə oynama, bala!

*3.04.1998*

## NƏNƏNIN SANDIĞI DEYIL KI ÜRƏK...

Səni ürəyimdən çıxarmışam mən,
Məni ürəyində saxlama daha.
Axıt göz yaşı tək bəbəklərindən,
Məni ürəyində saxlama daha.

Əlvida! "Sev" demək olmur könülə,
Nə mən bülbül olum, nə sən dön gülə,
Dayanar, ağrıtma ürəyi elə,
Məni ürəyində saxlama daha.

"Çətinsən, - deyirdin mənə, - ağırsan",
Məni əzəlki tək yenə ağır san.
Ürəyin dağılar ağırlığımdan,
Məni ürəyində saxlama daha.

Sanma ki, qalıbdır gözüm orada,
Qalıbsa, qoy sönsün közüm orada,
Qalmaq istəmirəm özüm orada,
Məni ürəyində saxlama daha.

Ürəyin eşqimlə isinməyəcək,
Belə aşiq sənin nəyinə gərək?
Nənənin sandığı deyil ki ürək,
Məni ürəyində saxlama daha.

*7.04.1998*



## TAPMAQ ISTƏYIRƏM ÖZÜM ÖZÜMÜ

Sənlə haqq-hesabı bitirmişəm mən,
Tapmaq istəyirəm özüm özümü.
Səni yox, özümü itirmişəm mən,
Tapmaq istəyirəm özüm özümü.

Canımda əzəlki dözüm görünmür,
Kül altda közüm var, közüm görünmür,
Közüm var, sözüm var, özüm görünmür,
Tapmaq istəyirəm özüm özümü.

Axtarışda ötür hər günüm, ayım,
Heç kimə yetişmir hayım, harayım,
Gərək gecə-gündüz gəzim, arayım,
Tapmaq istəyirəm özüm özümü.

Külək deyiləm ki, görünməz olum,
Mələk deyiləm ki, görünməz olum,
Fələk deyiləm ki, görünməz olum,
Tapmaq istəyirəm özüm özümü.

Yoxamsa niyə bəs "görün" deyirəm,
Varamsa nə üçün görünməyirəm?
Bir dəm axtarışdan ərinməyirəm,
Tapmaq istəyirəm özüm özümü.

Məni muradıma yetirmisənmi?
Eşqimi sovqat tək götürmüsənmi?
Sən heç öz özünü itirmisənmi?
Tapmaq istəyirəm özüm özümü.

Hərçənd ki, həmişə uca olmuşam,
Bir vaxt cavan idim, qoca olmuşam,
Şahin, haradayam, necə olmuşam?
Tapmaq istəyirəm özüm özümü.

*24.07.1998*

## ÇILIK-ÇILIK OLDU GÜZGÜSÜ QƏLBIN

Dünən göydə idim, bu gün yerdəyəm,
Çilik-çilik oldu güzgüsü qəlbin.
Dünən şahin idim, bu gün heç nəyəm,
Çilik-çilik oldu güzgüsü qəlbin.

Kəlməmi don vurdu, sözüm buzladı,
Qəm öz ahəngini yenə sazladı,
Əlin gül atmadı, daş tulazladı,
Çilik-çilik oldu güzgüsü qəlbin.

Baxma ürəyimdən çıxan bu aha,
Çıx get, and verirəm səni Allaha,
Güzgü əks eləmir əksini daha,
Çilik-çilik oldu güzgüsü qəlbin.

Indi sevda deyil, nifaq gəzməli,
Daha vəsli atıb, fəraq gəzməli,
Güzgü sındırandan uzaq gəzməli,
Çilik-çilik oldu güzgüsü qəlbin.

Sən nə düşünürdün onu qıranda?
Yapışmaz bir ilə... Sındı bir anda...
Yapışqan da gücsüz, yapışdıran da,
Çilik-çilik oldu güzgüsü qəlbin.

Gözü bağlı kəsin gözü görünməz,
Əyrisi görünməz, düzü görünməz,
Güzgü sındıranın üzü görünməz,
Çilik-çilik oldu güzgüsü qəlbin.

Qapqara bir bəla aldı üstünü,
Güzgü tək bəyazdı Şahinin günü...
Hardan tapacaqsan elə güzgünü?
Çilik-çilik oldu güzgüsü qəlbin.

*1.08.1998*



## ƏVVƏLI TAPMIŞDIM, SONU ITIRDIM

Qoy qismət olmasın itki heç kimə,
Mən onu itirdim, onu itirdim.
Nə deyim bəxtimə, qara bəxtimə,
Əvvəli tapmışdım, sonu itirdim.

Sevgi ümmanımın sonası idi,
Tapmışdı onunla ömür yaraşıq.
Yolumda məşəl tək yanası idi,
Gözümə mil çəkin, görməyim işıq.

Artıq geridədir nurlu toy-düyün,
Nur daha həyatda köməyim deyil,
Bütün ulduzları söndürün bu gün,
Heç şam işığı da gərəyim deyil.

Kim mən tək eşidir işıq səsini?
Işıqda kim görür hayı-harayı?
Zülmətə qərq edin Yer kürəsini,
Günəşi söndürün, qaraldın ayı.

Fərəhi itirib tapmışam yası,
Çörək əvəzinə qəm yeyirəm mən.
Mənə mane olur işıq sədası,
Işıqsız sakitlik istəyirəm mən.

Sanırdım vüqarım uca dağ təki,
Mən elə bilirdim duman qalmayıb.
Bəxtimin çırağı elə söndü ki,
Bir də yanmasına güman qalmayıb.

Qoy qismət olmasın itki heç kimə,
Mən onu itirdim, onu itirdim.
Nə deyim bəxtimə, qara bəxtimə,
Əvvəli tapmışdım, sonu itirdim.

*30.08.1998*

## SƏNINLƏ BARIŞA BILMIRƏM NIYƏ?

Su ilə odu da barışdıraram,
Səninlə barışa bilmirəm niyə?
Doğmayla yadı da barışdıraram,
Səninlə barışa bilmirəm niyə?

Daha namələrin adıma gəlmir,
Kimsənin imdadı dadıma gəlmir,
Nə üçün küsmüşük yadıma gəlmir,
Səninlə barışa bilmirəm niyə?

Ürəyim eşqinlə daha yanmayır,
Amma, yanmağı da hələ danmayır,
Barışıq saziişi imzalanmayır,
Səninlə barışa bilmirəm niyə?

Düz əhdü peymanlı, düz diləkliyəm,
Haramla aram yox, duz-çörəkliyəm,
Sanki qurd yemişəm, qurd ürəkliyəm,
Səninlə barışa bilmirəm niyə?

Kür çayı Araza qarışa bilər,
Bütün küsülülər yarışa bilər,
Şahin hamı ilə barışa bilər,
Səninlə barışa bilmirəm niyə?

*5.09.1998*

## YAMAN PAYLAMIŞAM MƏHƏBBƏTIMI

Məndə yaranmışdı, mənə qalmadı,
Yaman paylamışam məhəbbətimi.
Neyləyim, azca da sənə qalmadı,
Yaman paylamışam məhəbbətimi.

Alıblar - vermişəm, çaram olmayıb,
Savab eləmişəm, haram olmayıb,
Mənim qənaətlə aram olmayıb,
Yaman paylamışam məhəbbətimi.

Birinin könlündə dilək olubdur,
Birinin əlində çiçək olubdur,



Kömək diləyənə kömək olubdur,
Yaman paylamışam məhəbbətimi.

Mənim məhəbbətim çox yanda qalıb,
Türkiyədə qalıb, İranda qalıb,
Özbəkdə yaşayıb, əfqanda qalıb,
Yaman paylamışam məhəbbətimi.

Qonub məhəbbətim xoyratı üstə,
Qonub qəzəl üstə, bayatı üstə,
Durnanın qırılmış qanadı üstə...
Yaman paylamışam məhəbbətimi.

Kəndə fərq qoymadan, Bakı bilmədən,
Quba düşünmədən, Şəki bilmədən,
Tərəzi almadan, çəki bilmədən
Yaman paylamışam məhəbbətimi.

Hərçənd çox ürəyi odlamışam mən,
İndi soyuyuram, indi qışam mən,
Şahin, Hacı Qara olmamışam mən,
Yaman paylamışam məhəbbətimi.

*13.09.1998*

## QƏLBIMDƏ YARANIB BUZ SOYUQLUĞU

Yanaşa bilmirəm, gülüm, heç kəcə,
Qəlbimdə yaranıb buz soyuqluğu.
İsti adam idim, amma indisə
Qəlbimdə yaranıb buz soyuqluğu.

Yenə bir sözünlə yana bilərdim,
"Yoxdur eşq" fikrini dana bilərdim,
İp-isti sevgini ana bilərdim,
Qəlbimdə yaranıb buz soyuqluğu.

Məndəki o həlim xislət tükənib,
Hövsələ tükənib, taqət tükənib,
Elə bil canımda qüvvət tükənib,
Qəlbimdə yaranıb buz soyuqluğu.

Əsəbim də deyir "mən gərilmişəm",
Qəzəbim də deyir "mən gərilmişəm",
Elə bil Sibirə göndərilmişəm,
Qəlbimdə yaranıb buz soyuqluğu.

O isti xislətim soyuqlayıbdır,
Qaynar təbiətim soyuqlayıbdır,
Odum, hərarətim soyuqlayıbdır,
Qəlbimdə yaranıb buz soyuqluğu.

Soyuqluq yaratdın qırıb qəlbimi,
Məni buza atdın qırıb qəlbimi,
Sən də yaradansan Yaradan kimi,
Qəlbimdə yaranıb buz soyuqluğu.

Həzzim dönüb aha, üşüməkdəyəm,
Şahin, neynim daha, üşüməkdəyəm,
And olsun Allaha, üşüməkdəyəm,
Qəlbimdə yaranıb buz soyuqluğu,
Buz soyuqluğu.

*17.09.1998*

## QURUYUR SÜRƏTLƏ ÜMID AĞACIM

Bu məşum zamanda, bu çək-çevirdə
Quruyur sürətlə ümid ağacım.
Ümid eləmirəm bar verə bir də,
Quruyur sürətlə ümid ağacım.

Dünən yaşıl idi... bu gün quru san...
Onda - quru gövdə, məndə - quru can...
Qupquru qurusun onu qurudan,
Quruyur sürətlə ümid ağacım.

Yox olur varlığım, dünən var idim,
Bu gün yarımıram, dünən yar idim,
Onun meyvəsinə ümidvar idim,
Quruyur sürətlə ümid ağacım.



Əzabla baxıram iztirab sarı,
Məni kim yönəltdi bu əzab sarı?
Yamyaşıl yarpağı oldu sapsarı,
Quruyur sürətlə ümid ağacım.

Fərəhim qüssədi, həzzim kədərdi...
Mənim nikbinliyim bura qədərdi,
Məni öldürəcək quruma dərdi,
Quruyur sürətlə ümid ağacım.

Kəsən ümidini bağdan neyləsin?
Ümidi quruyan sağ can neyləsin?
Ümidsiz ağacı bağban neyləsin?
Quruyur sürətlə ümid ağacım.

Kimdi atan səlbə, kimdi vuran daş,
Kimdi çalan balta? Bilə idim kaş!..
Şahin, böyüyürdü o yavaş-yavaş,
Quruyur sürətlə ümid ağacım.

*19.09.1998*

## QIZILI NEYNIRƏM, QIZILGÜLÜM VAR...

Bağbanam, sanmayın mənə zülüm var,
Qızılgül bitibdir sevgi bağımda.
Qızılı neynirəm, qızılgülüm var,
Qızılgül bitibdir sevgi bağımda.

Çox çiçək görüblər mənim yanımda,
Çox gül bitibsə də gülüstanımda
Qızılgül nisgili vardı canımda,
Qızılgül bitibdir sevgi bağımda.

Qızılgül - təzə bir növrağın gülü,
Ömrümdə ən yeni bir çağın gülü,
Həsəddən quruyub çox bağın gülü,
Qızılgül bitibdir sevgi bağımda.

Töküb tər əkmişəm qızılgül bitib,
Nilufər əkmişəm qızılgül bitib,
Sənubər əkmişəm qızılgül bitib,
Qızılgül bitibdir sevgi bağımda.

Indi mən qeyri bir gülü neynirəm,
Mixəyi neynirəm, hili neynirəm,
Məgər olmuşammı dəli, neynirəm,
Qızılgül bitibdir sevgi bağımda.

Ətri olmasa da hər qızılgülün,
Üstünə yağmasın şər qızılgülün!
Səfası çox imiş tər qızılgülün,
Qızılgül bitibdir sevgi bağımda.

Şahin, becərsə də əli bağbanın,
Gülü təklif edir dili bağbanın,
Indi özünündür gülü bağbanın,
Qızılgül bitibdir sevgi bağımda.

*24.09.1998*

## ƏLVIDA DEMIRƏM HƏLƏ SEVGIYƏ

Qocalıq əyyamım, gülüm, gəlibdir,
Əlvida demirəm hələ sevgiyə.
Ömrün bu çağında həvəsə bax bir,
Əlvida demirəm hələ sevgiyə.

Bilirəm sevgimin nə olduğunu,
Bilirəm mənimlə doğulduğunu,
Qoy bütün sevənlər eşitsin bunu:
Əlvida demirəm hələ sevgiyə.

Gülümü sevməyə doğulmuşam mən,
Elimi sevməyə doğulmuşam mən,
Dilimi sevməyə doğulmuşam mən,
Əlvida demirəm hələ sevgiyə.



Bağımda eşq adlı gülüm quruyar,
Bağbana eləyib zülüm quruyar,
Əlvida söyləsəm dilim quruyar,
Əlvida demirəm hələ sevgiyə.

Yenə Leyla eşqi məni isidir,
Bu aşiq Məcnunun bir varisidir,
Sevgi həyatımın mirvarisidir,
Əlvida demirəm hələ sevgiyə.

Gülüm, sevgi ilə güləcəyəm mən,
Sevgimin qədrini biləcəyəm mən,
Sevgim ölən zaman öləcəyəm mən,
Əlvida demirəm hələ sevgiyə.

Yaşım altmışı haxlamaqdadır,
Ilhamım hələ də çağlamaqdadır,
Şahin, hər qəzəlim sevgi haqdadır,
Əlvida demirəm hələ sevgiyə.

*28.09.1998*

## "EŞQ DÜNYASI"

Dünya! Vurulmuşam bu munis ada,
Dünya - böyük vətən, hamıya vətən.
Ikinci dünya var bizim dünyada,
Ikinci dünyanı yaratmışam mən.

Ikinci dünya da birinci kimi,
Məhəbbət üstündə tutubdur qərar.
Yaranıb onun da neçə iqlimi,
Onun da aşiqi, sevgilisi var.

O da eyş-işrətdən xali deyildir,
Onun da kədəri, məlalı vardır.
Onun da sevinci, fərəhi zahir,
Onun da hicranı, vüsalı vardır.

Yaratdım, bu nəcib sevda mənimdir,
Mən onun uğrunda can yandırmışam.

Mənim yaratdığım dünya mənimdir,
Onu "Eşq dünyası" adlandırmışam.

Sevilən sevgisi, sevən sevgisi
Onda cilvələnir açıq-aşikar.
Onda Allah eşqi, vətən sevgisi,
Onda əqidəmin təzahürü var.

Təsbehi asılıb yuxarı başda,
Qədəhi, badəsi, camı da vardır.
Odu ürəkdədir, buxarı başda,
Pərvanəsi də var, şamı da vardır.

Gülüm, yaxşı yandın oduna şamın,
Dünya yaratmışam sevib-sevilən.
Iki sakini var mənim dünyamın:
Birisi özüməm, o birisi sən!

*3.10.1998*

## SƏN MƏNIM EŞQIMƏ ÜMID ELƏMƏ

Gedib ürəyinə gir başqasının,
Sən mənim eşqimə ümid eləmə.
Eşqim əlindədir bir başqasının,
Sən mənim eşqimə ümid eləmə.

Suyun yanmasına ümidin olar,
Günün donmasına ümidin olar,
Ayın sınmasına ümidin olar,
Sən mənim eşqimə ümid eləmə.

Məni eləmişdin ümidsiz deyə,
Özün də uğradın ümidsizliyə.
Bildinmi ayrıyıq indi biz niyə?
Sən mənim eşqimə ümid eləmə.

Özünü yandırar məni yandıran,
Sən ümid gözləyən, mən ümid qıran.



Özün deyildinmi məndən yan duran?
Sən mənim eşqimə ümid eləmə.

Ümidin yolunu özün bağladın,
Dağım var sinədə, sinə dağladın...
Qayıt, nahaq məni sən soraqladın,
Sən mənim eşqimə ümid eləmə.

Əlin qüssə əkib, kədər becərsin,
Ziyan arzulayan zərər becərsin!
Ümid yonca deyil bir də cücərsin,
Sən mənim eşqimə ümid eləmə.

Şahinin, sanma ki, istəyi olar,
Eşqinə qovuşmaq diləyi olar.
Bir eşq bir ürəyin bəzəyi olar,
Sən mənim eşqimə ümid eləmə,
Ümid eləmə!

*7.10.1998*

## SEVGI LIBASI VAR ŞERLƏRIMIN

Nifrət libasını cırıb atmışam,
Sevgi libası var şerlərimin.
Çılpaq sözlərimi qırıb-çatmışam,
Sevgi libası var şerlərimin.

Söz var ki, eşidən mərdanə olar,
Söz də var dinləyən divanə olar,
Şerimi oxuyan məstanə olar,
Sevgi libası var şerlərimin.

Lüt-üryan misralar öldü, sağ deyil,
Şer oyun deyil, oyuncaq deyil,
Daha çılpaq deyil, soyuncaq deyil,
Sevgi libası var şerlərimin.

Döyüş libasını çıxarıb atıb,
Söyüş libasını çıxarıb atıb,

Əsl geyiminə nəhayət çatıb:
Sevgi libası var şerlərimin.

Sözdə istəmirəm xəzəl görünə,
Qoy qoşma görünə, qəzəl görünə,
Şer də, şair də gözəl görünə,
Sevgi libası var şerlərimin.

Nə həcv yazıram, nə məddaham mən,
Bədxahlar da bilir xeyirxaham mən,
Şerim şahanədir, özüm şaham mən,
Sevgi libası var şerlərimin.

Ey Şahin, şükr olsun ulu Allaha!
Sevgi libasına büründü daha,
Təzə kitablarım gedəcək baha,
Sevgi libası var şerlərimin.

*9.10.1998*

## BU DÜNYANI MƏN ARABIR SÖYMÜŞƏM

*Aktyor Əli Nur qardaşıma*

Demişəm ki, biri yoxdur, biri var,
Bu dünyanı mən arabir söymüşəm.
O dünyaya qoymasalar yeri var,
Bu dünyanı mən arabir söymüşəm.

Dünya mənə zülm edəndə arabir,
Zahir olur qəzəb məndə arabir,
Işlərimi salır bəndə arabir,
Bu dünyanı mən arabir söymüşəm.

Insanları bir-birini yeyəndə,
Millət yerli-yersiz tərif deyəndə,
O dünyanı molla təriflәyəndə,
Bu dünyanı mən arabir söymüşəm.



Yaltaqları xəli kimi görəndə,
Cahilləri zəli kimi görəndə,
Aqilləri dəli kimi görəndə
Bu dünyanı mən arabir söymüşəm.

Bilməmişəm, gözəlləri çox imiş,
Gözəl-gözəl qəzəlləri çox imiş,
Yaxşı-yaxşı əməlləri çox imiş,
Bu dünyanı mən arabir söymüşəm.

Demişəm ki, dünya qəmə hamilə,
Həzzə deyil, dərd-ələmə hamilə,
Gözlərimiz yaşa, nəmə hamilə,
Bu dünyanı mən arabir söymüşəm.

Neçə-neçə əməldə əngəl görüb,
Tüfəng tutan, güllə atan əl görüb,
Tikanını gülündən əvvəl görüb
Bu dünyanı mən arabir söymüşəm.

Yarımağa, yaratmağa dəyərmiş,
Yaşamağa, yaşatmağa dəyərmiş,
Daş atana daş atmağa dəyərmiş,
Bu dünyanı mən arabir söymüşəm.

Adam var ki, yolunda ölsən - dəyər,
Adam da var "yerimə öl sən" deyər...
Yaxşısını görməyibən müxtəsər
Bu dünyanı mən arabir söymüşəm.

Demirəm ki, alqışlasın bu dünya,
Ya, ömrümü naxışlasın bu dünya,
Allah, məni bağışlasın bu dünya,
Bu dünyanı mən arabir söymüşəm.

Adam gördüm onda ilan dişi var,
Düzündən çox əyri-üyrü işi var...
Şahin kimi bir söyüşkən kişi var,
Bu dünyanı mən arabir söymüşəm.

*11.10.1998*

## QAZANC VƏ XƏRC

Əruz da varidatım,
Heca da varidatım,
Qəzəl də varidatım,
Qoşma da varidatım,
Təxmisdir, rübaidir,
Bayatıdır həyatım.
Sələfləri oxuyub,
Sələflərdən öyrənib
Qazanmışam onları,
Mənim varım -
Söz varı!

Mən bu çətin sevdaya
Özxoşuma getmişəm,
Öyrənib-öyrətmişəm!
Olmamışam yabançı,
Olmamışam həsədkar,
Mənim şer qazancım,
Mənim şer varım var.

Əzabla qazanmışam
Qədirbilən yanında
Bütün etibarımı,
Əzabla tanışam mən.
Qazandığımdan artıq
Xərcləyərək varımı
Müflis olmamışam mən.

*12.10.1998*

## NƏVƏM VASIF VAQIFOĞLUYA

*Bir yaşı münasibətilə*

Uçub getdi nisgil, kənar oldu ah,
Göydən qaçdı bulud, cilvələndi gün.
Keçən il bir oğlan göndərdi Allah,
Dünyanın oğlanlar ordusu üçün.



Çoxaldı Şirvanın oğul sərvəri,
Zərgərin elə bil zəri göründü.
Bir qız uşağının gələcək əri,
Azəri yurdunun nəri göründü.

Yəqin ki, dünyada bütün babalar
Uğur diləməkdə nəvələrinə.
Böyük qələbələr olsun sənə yar,
Yetəsən millətin dərdisərinə.

Yaxşı ki, sevgi var, sevilmək olur,
Yar, diyar eşqiylə alışsın canın.
Dünyanın işini nə bilmək olur,
Fəxri olacaqsan bəlkə Şirvanın.

Uğurun gəlməsin saya, hesaba,
Əlvida dumana, çənə edəsən.
Gün o gün olsun ki, atanı baba,
Ananı ağbirçək nənə edəsən.

El yolun gözləyir xilaskarının,
Qulaq as, ağsaqqal sözünü dinlə:
Bəlkə də Qarabağ torpaqlarının
Xilası olacaq sənin əlinlə.

Bəlkə də dünyadan köçəndə baban
Məşhur olacaqsan şair kimi sən.
Bəlkə də əsərlər yaradacaqsan,
Seyid Əzim kimi, Sabir kimi sən.

Ən dəyərli varım arzu varıdır,
Yetişsin qoy sənə qəlbimin səsi:
Bunlar bir ürəyin arzularıdır,
Səndən asılıdır gerçəkləşməsi.

Ürəyincə olsun sənə ömür, gün,
Şahin baba kimi yaşa, düz yaşa.
Olasan sahibi şanlı bir ömrün,
Vasif Vaqifoğlu, yaşa, yüz yaşa!

*17.10.1998*

## MƏNIM ÜMID GÜLÜM AÇILACAQDIR

Arzu gülüstanım ətir yayacaq,
Mənim ümid gülüm açılacaqdır.
Dilim yenə də gül salamlayacaq,
Mənim ümid gülüm açılacaqdır.

Hər tərəfdə gül var, hər yanda çiçək,
Amma o gül-çiçək nəyimə gərək,
Bağbanı mənəmsə eləməyin şəkk,
Mənim ümid gülüm açılacaqdır.

Qulluq eləyirəm, zəhmət çəkirəm,
Əziyyət çəkirəm, möhnət çəkirəm,
Ona gecə-gündüz həsrət çəkirəm,
Mənim ümid gülüm açılacaqdır.

Gözümə qapandı röya qapısı,
Üzümə bağlandı xülya qapısı,
Qapansa vəslin də hətta qapısı,
Mənim ümid gülüm açılacaqdır.

Alağ bağımızdan kənar olanda,
Ülfətə yenidən qərar olanda,
Bu yara mehriban o yar olanda
Mənim ümid gülüm açılacaqdır.

Nisgilin canımdan qaçan vaxtıdır,
Eşqimin nurunu saçan vaxtıdır,
Gülümün çırtdayıb açan vaxtıdır,
Mənim ümid gülüm açılacaqdır.

Sanıram özümü növcavan kimi,
Sevdim o cananı, Şahin, can kimi,
Hicranın qapısı bağlanan kimi
Mənim ümid gülüm açılacaqdır.
Açılacaqdır!

*18.10.1998*



## AÇ QAPINI GEDIM, DÜNYA

*"Aç qapını gəlim, dünya" kitabçasının müəllifi Sona Xəyala*

Dünyanın qapısı varmı görəsən?
Bəs pəncərə necə, varmı dünyada?
Qapısı yoxdursa, pəncərəsindən
Çıxıb həyatımı verərdim bada.

Barışa bilməyir dünya mənimlə,
Mənsə səbəbini tapa bilmirəm.
Bəlkə küsən mənəm dünyadan elə?
Ürəyimdə qübar, gözlərimdə nəm.

Kədər qoşun-qoşun, qəm ləşkər-ləşkər,
Yenə artdı dərdim, çoxaldı dərdim.
Dünyanın qapısı olsaydı əgər
Açıb gedərdim,
Qaçıb gedərdim.

*28.10.1998*

## ƏZIZIM, SƏN MƏNI ITIRƏCƏKSƏN

Kədərim bir idi, min olur mənim,
Əzizim, sən məni itirəcəksən.
Ürəyimə daman çin olur mənim,
Əzizim, sən məni itirəcəksən.

Sevgi zahirsə də hər birimizdən
Kənara çıxmadı sirr birimizdən...
Hələ doymamışıq bir-birimizdən,
Əzizim, sən məni itirəcəksən.

"Olmuşam eşqindən xəstə" deyirdim,
"Məni sev" deyirdim, "istə" deyirdim,
Mən səni itirmək istəməyirdim,
Əzizim, sən məni itirəcəksən.

Bitəcək hər həzzim, hər iztirabım,
Gedəcək əlimdən taqətim, tabım...
Əlində olsa da neçə kitabım,
Əzizim, sən məni itirəcəksən.

Göynərti yeri var hər bir itkidə...
Ümidim azalır mənim get-gedə,
Yerim görünsə də, görünməsə də,
Əzizim, sən məni itirəcəksən.

Bir sevgi kəm olub kəsir tapacaq...
Ürəyin təsəlli, səbir tapacaq...
Bu nakam aşiqi qəbir tapacaq,
Əzizim, sən məni itirəcəksən.

Özün sevmiş idin, özün Şahini -
Biçarə Şahini, həzin Şahini,
Həmişə gəzəcək gözün Şahini,
Əzizim, sən məni itirəcəksən.

*20.10.1998*

## NEÇIN GƏLMƏDIN?

Acı intizardan varmı xəbərin?
Neçin gəlmədin?
Sözü şirin yardan varmı xəbərin?
Neçin gəlmədin?

Kədər hücum etdi yarlı-yarağlı,
Neçin dərk etmədi yarı yar ağlı?
Qapım da bağlıdır, bəxtim də bağlı,
Neçin gəlmədin?

Aynada köksümü yaralı gördüm,
Qəlbimi də gördüm, paralı gördüm,
Gözümün kökünü saralı gördüm,
Neçin gəlmədin?



Yox idi imkanım gəlməyə, gəldim,
Dərdimi səninlə bölməyə gəldim,
Belə qucağında ölməyə gəldim,
Neçin gəlmədin?

Əlini hicranın əlimi sıxdı?
Bulud köynəyindən dolumu sıxdı?
Önünə bir qara pişikmi çıxdı?
Neçin gəlmədin?

Bir günlük intizar - bir illik cəfa!
Budurmu etibar, budurmu vəfa?
Deyirdim gələrsən bəlkə insafa,
Neçin gəlmədin?

Sən yara bağlılıq bu yara - istək,
Aşiqi tərk edir əqli huşu tək,
Şahin təkrar edir tuti quşu tək:
Neçin gəlmədin?
Neçin gəlmədin?

*9.11.1998*

## QAYTARA BILMIRƏM YERINƏ SƏNI

Sən mənim gözümdən elə düşmüsən
Qaytara bilmirəm yerinə səni.
Şerimdən, sözümdən elə düşmüsən
Qaytara bilmirəm yerinə səni.

Həyatda çox əməl, çox iş müəmma,
Gəliş müəmmadır, gediş müəmma,
Yerin səhra kimi boş qalıb, amma
Qaytara bilmirəm yerinə səni.

Başladı solmağa gülün qəşəngi...
"Qaytağı" yerinə çalındı "Cəngi".
Sən məni elə bərk incitmisən ki,
Qaytara bilmirəm yerinə səni.

Mehrin yer tutmuşdu dərin, könüldə,
Daha od arama sərin könüldə,
Hələ qalıbsa da yerin könüldə
Qaytara bilmirəm yerinə səni.

Əzizim, xatirin xoş qalıbsa da,
Adın adlar içrə baş qalıbsa da,
Yerin ürəyimdə boş qalıbsa da,
Qaytara bilmirəm yerinə səni.

Gözüm bircəsini tutub - o da sən,
Yamanca salıbsan məni oda sən,
Bu Şahin, bu ürək, bu yer, bu da sən,
Qaytara bilmirəm yerinə səni.

*13.11.1998*

## TFU QOCAYA!..

Falçı yolum üstdə bəla var deyir,
Tfu bəlaya!
Təhlükə var deyir, xəta var deyir,
Tfu xətaya!

Hövsələm dəmadəm daralır mənim,
Söz bağım quruyur, saralır mənim,
Bəyaz ümidlərim qaralır mənim,
Tfu qaraya!

Yaxşı adamlarda həya görürəm,
Saxta kəlamlarda boya görürəm,
Şeyxin sözlərində riya görürəm,
Tfu riyaya!

Dərdliyə minnətsiz şəfa edən var,
Cəfakar əğyara vəfa edən var,
Vəfadar aşiqə cəfa edən var,
Tfu cəfaya!

Səni vəsf etməyir qəzəlim, - demə,
Canını alacaq öz əlim, - demə,



Şahinəm, qocayam, gözəlim, demə
Tfu qocaya!

*17.11.1998*

## NECƏ VƏSF ELƏYIM GÖZƏLLIYINI

Tərifin dəftərə, kiëtaba sığmaz,
Necə vəsf eləyim gözəlliyini?
Suala yerləşməz, cavaba sığmaz,
Necə vəsf eləyim gözəlliyini?

Məni heyran edən gül camal olub,
Gül camalındakı xəttü xal olub,
Danışa bilmirəm, dilim lal olub,
Necə vəsf eləyim gözəlliyini?

Daha gözlərimi o nəm tutmayır,
Qəlbimi qəm-kədər, ələm tutmayır,
Şadlıqdan barmağım qələm tutmayır,
Necə vəsf eləyim gözəlliyini?

Qaşa kaman dedim, kaman deyilmiş,
Saça ilan dedim, ilan deyilmiş,
Gözəlin tərifi asan deyilmiş,
Necə vəsf eləyim gözəlliyini?

Qaşın tərifindən göz inciyəcək,
Saçın tərifindən üz inciyəcək,
Şahin düz deməsə söz inciyəcək,
Necə vəsf eləyim gözəlliyini?

*18.11.1998*

## GÖRÜNMƏYIB BELƏ SEVGI DÜNYADA

Bənzəri yox sevgimizin, sevgilim,
Görünməyib belə sevgi dünyada.
Görünübsə, söylə mənə, mən bilim,
Görünməyib belə sevgi dünyada.

Bu sevgidən varsa, soraqla, ara,
Diqqət ilə ara, maraqla ara,
Dəmir çarıq geyib çıraqla ara,
Görünməyib belə sevgi dünyada.

Eşq diləsəm, qeyrisindən pənah yox,
Qeyrisi yox, demək məndə günah yox,
Bu sevgidə zərrə qədər tamah yox,
Görünməyib belə sevgi dünyada.

Kəməndi də, tələsi də var imiş,
Sərvəri də, köləsi də var imiş,
Sevgilərin beləsi də var imiş,
Görünməyib belə sevgi dünyada.

Ölən deyil hicrə fürsət düşsə də,
Aralığa acı həsrət düşsə də,
Milyonlarla sevgi görünmüşsə də,
Görünməyib belə sevgi dünyada.

Daş atsanız daşınıza dönüm mən,
Gözünüzdə yaşınıza dönüm mən,
A sevənlər, başınıza dönüm mən,
Görünməyib belə sevgi dünyada.

Desəydilər cahü-cəlal istəmir,
Deyərdim ki, nədir sual, istəmir,
Işə baxın Şahin vüsal istəmir,
Görünməyib belə sevgi dünyada.

*28.11.1998*

## MƏN SƏNIN YANINA GƏLƏN DEYILƏM

Kədərim əridi, ələm çəkildi,
Mən sənin yanına gələn deyiləm.
Daha gəlməyimə qələm çəkildi,
Mən sənin yanına gələn deyiləm.

Eşqin çox çıxmışam imtahanından,
Təzəcə ayrılıb canım canından...
Biryolluq getmişəm sənin yanından,
Mən sənin yanına gələn deyiləm.



Gərək gəlməyəsən gedərkən belə,
Özünü pərişan edərkən belə,
Əgər işdi-şayəd gəlsən sən belə,
Mən sənin yanına gələn deyiləm.

Daha bürüməyir gözlərimi nəm,
Əcəl də yanıma gələrsə, nə qəm,
Bilsəm ki, yanında diriləcəyəm,
Mən sənin yanına gələn deyiləm.

Qəddimi sevginin əzabı əyib...
Üzümə məhəbbət şilləsi dəyib,
Şahini incidən xeyir görməyib,
Mən sənin yanına gələn deyiləm,
Gələn deyiləm!

*1.12.1998*

## YAĞIŞDAN GÖZ YAŞI QOXUSU GƏLIR

Sənə hücum edir neçin qəm belə?
Nə iztirabdı bu, axı nə təlaş?
Neçin ah çəkirsən dəmadəm belə?
Bəyaz yanağında muncuqlanır yaş.

Qəlbi bu aşiqin gəlibdir zara,
Neçə göz yaşının, ahın əlindən.
Demirəm qoy gedə ahın dağlara,
Qorxuram dağları dağıdasan sən.

Göz yaşı duzludur deyirlər mənə,
Göz yaşı görünməz hamıda şirin.
Elə şirinsən ki, a dilbər, mənə
Sənin göz yaşının tamı da şirin.

Yaxşı ki, rəngi yox çəkilən ahın!
Ah da görünsəydi tüstü sayağı
Çatardı yanına ulu Allahın,
Qapqara olardı göylərin ağı.

Əzizim, Şahinin nədir xətası?
Bəlkə bizə sarı hicran yönəlir?

Küləkdən - çəkdiyin ahın sədası,
Yağışdan - göz yaşı qoxusu gəlir.

*3.12.1998*

## QALAN SEVGIM IKIMIZƏ BƏS EDƏR

Yarım, hədər tərəddüdə düşmə sən,
Qalan sevgim ikimizə bəs edər.
Zərrə qədər tərəddüdə düşmə sən,
Qalan sevgim ikimizə bəs edər.

Ürək, "yenə sev, hamını sev" demə!
Tamahsınan olursa da sevgimə,
Verməyirəm daha onu heç kimə,
Qalan sevgim ikimizə bəs edər.

Hicran birdir, vüsal birdir, iki - biz,
Hicr etməyək vəslimizi təki biz.
Çox deyilik, ikimizik, ikimiz,
Qalan sevgim ikimizə bəs edər.

Qafil olub görməmişəm sonu mən,
Cahil olub görməmişəm sonu mən...
Yerli-yersiz xərcləsəm də onu mən,
Qalan sevgim ikimizə bəs edər.

Şüşə kimi çilik-çilik olmasa,
Paralanıb dilik-dilik olmasa,
Əgər bizə maneçilik olmasa
Qalan sevgim ikimizə bəs edər.

Yad olubdur hiylə, yalan sevgimə,
Cavanlıqda düşdü talan sevgimə...
Arxayınam olub-qalan sevgimə,
Qalan sevgim ikimizə bəs edər.

Yaradandan qüvvə alıb, güc alıb,
Qanad çalıb, asimana ucalıb,
Gülüm, demə Şahin yaman qocalıb,
Qalan sevgim ikimizə bəs edər.

*8.12.1998*



## MƏNI DIRI-DIRI DƏFN ELƏSINLƏR

Kim ölü görübdür diri adamı?
Ölü görkəmində diriyəm bu gün.
Kiminin arzusu, kiminin kamı,
Mənimsə ümidim ölüb büsbütün.

Bir gözəl əhdinə sadiq olmadı,
Əhdin də yalanı, düzü olurmuş.
Eşqim nəvazişə layiq olmadı,
Dilin "yox" deməyə üzü olurmuş.

Elə bil çoxaldı gözümün nəmi,
Elə bil qısaldı boyum bir azca.
Vallah, istəmirəm azaldım qəmi,
Dərdimi kənara qoyum bir azca.

Heç başa düşmədim bu nə oyundu,
Yar neçin sındırdı bütöv qəlbimi?
Mərhəmət görməyib inkar olundu,
Eşqim bic doğulan bir uşaq kimi.

Oldu birdən-birə büsatım qara,
Həzzi kədər boğdu, təmtərağı qəm.
Allaha and olsun həyatım qara,
Allaha and olsun ölmək istərəm.

Indi ürəyimdə məskun olub qış,
Mənim surətimdə külün rəngi var.
Təşnə torpaq kimi üz qırış-qırış,
Saçımda kəfənin rəngi bərqərar.

Ömrümün çiçəyi saralır, solur,
Nakam bir şairi dəfn eləsinlər.
Ölülər onsuz da qəbrə qoyulur,
Məni diri-diri dəfn eləsinlər.

*12.12.1998*

## ÖZÜMƏ YAZIĞIM GƏLDI

Sənə cild-cild söz demişəm,
Sözümə yazığım gəldi.
Dözümümə "döz" demişəm,
Dözümə yazığım gəldi.

Hər uğurum zaval kimi,
Əyilmişəm hilal kimi,
Diz döyüldü qaval kimi,
Dizimə yazığım gəldi.

Soldu bağım, göyərmədi,
Qol-budağım cücərmədi,
Mənim közüm közərmədi,
Közümə yazığım gəldi.

Heç bilmədim haçan bitdi,
Aman, sevgim yaman bitdi,
Izim üstdə tikan bitdi,
Izimə yazığım gəldi.

Sinəm üstdə özgə sinə,
Yarım varkən özgəsi nə?
Şahin, uydum özgəsinə,
Özümə yazığım gəldi.

*13.12.1998*

## IKI ƏHVALI-RUHIYYƏ

Bu ləhzə, bu dəm
Sanki cahan boyda bir dinamitəm,
Partlatmaq istərəm yer kürəsini,
Hiylə kürəsini, şər kürəsini,
Altun kürəsini, zər kürəsini...

Sanki cahan boyda eşqəm, sevgiyəm,
Yaşatmaq istərəm yer kürəsini,
Canan kürəsini, ər kürəsini,



Comərd kürəsini, nər kürəsini
O ləhzə, o dəm...
Hamı belədirmi yer kürəsində?
Mən ki beləyəm!..

*15.12.1998*

## YENƏ GÖRÜŞÜNƏ GƏLƏCƏYƏM MƏN

Qoy ay nur paylaya, gün ziya saça,
Yenə görüşünə gələcəyəm mən.
Yüyürə-yüyürə, lap qaça-qaça
Yenə görüşünə gələcəyəm mən.

Yenə gülümsəyir üzə görüşün,
Təzə ümidimdir təzə görüşün,
Tutiya kimidir gözə görüşün,
Yenə görüşünə gələcəyəm mən.

Tənəm yoxa çıxır, gileyim gedir...
Arzunun ardınca diləyim gedir...
Görüşündən ötrü ürəyim gedir,
Yenə görüşünə gələcəyəm mən.

Canımda atəş var, odam, ocağam,
Belə olacağam nə qədər sağam,
Hicranın gözünü çıxaracağam,
Yenə görüşünə gələcəyəm mən.

Qoy paxıl kəslərin ciyəri yansın,
Neçə bədnəzərin nəzəri yansın,
Önümü kəsənin çəpəri yansın,
Yenə görüşünə gələcəyəm mən.

Etiraz eləyir gözlərim nəmə,
Tablaya bilməyir ürəyim qəmə.
Yaxanı kənara çəkib eləmə,
Yenə görüşünə gələcəyəm mən.

Şahin tək uçuram, qanad - varlığım,
Tərsəm əzəlki tək, inad - varlığım,
Sənə ki, bəllidir inadkarlığım,
Yenə görüşünə gələcəyəm mən.

*Lənkəran,*
*16.12.1998*

## AĞRIBILMƏZ ŞAHIN FAZIL...

Olmadı xətri, hörməti,
Zaman ağrıdı, ağrıdı.
Qalmadı qədri-qiyməti,
Məkan ağrıdı, ağrıdı.

Bədxahını incitdilər,
Xoşxahını incitdilər,
Bir dahini incitdilər,
Cahan ağrıdı, ağrıdı.

"Vallah"ını incitdilər,
"Billah"ını incitdilər,
Allahını incitdilər,
Quran ağrıdı, ağrıdı.

Oğru tək bağa vardılar,
Qızılgülü qopardılar,
Bir nadana apardılar,
Bağban ağrıdı, ağrıdı.

Yar ki, düşmədi kəməndə,
Mənim işim düşdü bəndə,
Ox hədəfə dəyməyəndə
Kaman ağrıdı, ağrıdı.

Hanı əhdin etibarı?
Itdi cəhdin etibarı...
Bir daş atdım dağa sarı,
Duman ağrıdı, ağrıdı.

Yar gedən tək gəldi nisgil,
Bu dərd çəkiləsi deyil,
Ağrıbilməz Şahin Fazil
Yaman ağrıdı, ağrıdı.

*21.12.1998*



## RÖYA ILƏ VIDALAŞMA

Gör mən nə saymışam, fələk nə sayıb...
Tanış olmamışıq elə bil ki biz.
Sanki aramızda heç nə olmayıb,
Röyada baş verib bizim vəslimiz.

Mənim olmamısan sanki heç zaman,
Mən yuxu olmuşam, sən isə röya.
Busə dərməmişəm gül dodağından,
Əlvida, ey mənim röyam, əlvida!

*27.12.1998*

## MƏNIM SEVGIM BU DÜNYADAN BÖYÜKDÜR

Kim bilmir ki, nə boydadır bu dünya,
Mənim sevgim bu dünyadan böyükdür.
Qabağımda balaca oldu dünya,
Mənim sevgim bu dünyadan böyükdür.

Böyüdüyü yuvasına sığışmır,
Öz elinə, obasına sığışmır,
Doğulduğu dünyasına sığışmır,
Mənim sevgim bu dünyadan böyükdür.

Mənim sevgim istəyir ki, yol aça
Əlacsızlıq mühitində əlaca...
Mənim dünyam bu sevgidən balaca,
Mənim sevgim bu dünyadan böyükdür.

Köksümdəki ürəyə sığmayırsa,
Ürəkdəki diləyə sığmayırsa,
Yerə, göyə, fələyə sığmayırsa,
Mənim sevgim bu dünyadan böyükdür.

Bir çoxuna böyük isə bu dünya,
Kiçik gəlir mənə nəsə bu dünya...
Kainatda bir zərrəsə bu dünya
Mənim sevgim bu dünyadan böyükdür.

*28.12.1998*

## MƏNIM DƏRDIM

*"Mənim dərdim çəkiləsi dərd deyil".*
**Bəhmən Vətənoğlu**

Şair Bəhmən sanki duyub dərdimi,
Mənim dərdim çəkiləsi dərd deyil.
Dərd varmıdır məndə olan dərd kimi,
Mənim dərdim çəkiləsi dərd deyil.

Xalqımdakı mərhəmətə görəmi
Qara Keşiş qəsb etdi yan-yörəmi?
Yanıq Kərəm, çal bir "Yanıq Kərəmi",
Mənim dərdim çəkiləsi dərd deyil.

Neçə kəhriz, neçə bulaq dağıldı,
Mərmi düşdü, gül yandı, bağ dağıldı,
Qəlpələrdən sel yandı, dağ dağıldı,
Mənim dərdim çəkiləsi dərd deyil.

Solun, sağın dərdi məni ağrıdır,
Bağın, dağın dərdi məni ağrıdır,
Qarabağın dərdi məni ağrıdır,
Mənim dərdim çəkiləsi dərd deyil.

Ellərimdə şücaət də göründü,
Cəsarət də, məharət də göründü,
Rəzalət də, xəyanət də göründü,
Mənim dərdim çəkiləsi dərd deyil.

Dağılanı bir gün tikən tapılar,
Zülm evini yıxan, sökən tapılar,
Çəkiləsi dərdi çəkən tapılar,
Mənim dərdim çəkiləsi dərd deyil.

Zəmanənin kədərsiz az mərdi var,
Kədərimə tab gətirmir dər-divar,
Bir yandan da məndə bəşər dərdi var,
Mənim dərdim çəkiləsi dərd deyil.



Ürəyimin meyli məni incidir,
Bir vəfasız Leyli məni incidir,
Məcnunluğum xeyli məni incidir,
Mənim dərdim çəkiləsi dərd deyil.

Mənim dərdim səhrada qum qədərdi,
Fil də gələ çəkə bilməz bu dərdi,
Kim desə ki, "mən çəkərəm", hədərdi,
Mənim dərdim çəkiləsi dərd deyil.

Şahin Fazil, bir üzə bax dərddəki!..
Ağırlığa çiyin verdim mərd təki.
Nə daş gərək, nə tərəzi, nə çəki,
Mənim dərdim çəkiləsi dərd deyil.

*30.12.1998*

## QƏZƏL SƏMASINDA ŞAHIN KIMI UÇMAQ NIYYƏTINƏ DÜŞƏN BIR "CÜLLÜTƏ"

*Çox hissəsi qalmış suda bir buz dağıyam mən,*
*Qafillərimiz var hələ bilmir nələrim var.*
**Bir qəzəlimin bir beyti**

Əsassız bir xülya başına gəlib:
Mənim qəzəllərim xoşuna gəlmir.
Mahir adamların xoşuna gəlib,
Mənim qəzəllərim xoşuna gəlmir.

Elə öz-özünə vurulmusan ki,
Guya həqiqət var sözündə sanki...
Sən kimin gözündə xoş olmusan ki?
Mənim qəzəllərim xoşuna gəlmir.

Gecə də oyağam, sənsə yatmısan,
Hayana yetmisən, hara çatmısan?
Özün nə yazmısan, nə yaratmısan?
Mənim qəzəllərim xoşuna gəlmir.

Bir cüt alababat qəzəl demisən,
Sənə elə gəlir gözəl demisən,
"Qəzəl" deməmisən, "xəzəl" demisən,
Mənim qəzəllərim xoşuna gəlmir.

Böyüyün sözünü bir az dinlə sən,
Həqir olacaqsan belə kinlə sən,
Gözə görünmürsən zərrəbinlə sən,
Mənim qəzəllərim xoşuna gəlmir.

Bu söz sahibinin hicranı gedir,
Şerinin önündə "Divan"ı gedir,
Onsuz da sarvanın karvanı gedir,
Mənim qəzəllərim xoşuna gəlmir.

Söz deməkdə xamsan, hələ naşısan,
Qaya qabağında çınqıl daşısan,
Şahinin önündə cüllüt quşusan,
Mənim qəzəllərim xoşuna gəlmir.

*2.01.1999*

## HƏVƏSLƏ GEDƏRƏM SƏN GEDƏN YERƏ

Gülüm, kimsəni yox, sən məni səslə,
Həvəslə gedərəm sən gedən yerə.
Səni candan artıq sevəni səslə,
Həvəslə gedərəm sən gedən yerə.

Heç kəsdə o səda, o səs yaranmaz,
O isti, o məhrəm nəfəs yaranmaz,
Saqi də çağırsa, həvəs yaranmaz,
Həvəslə gedərəm sən gedən yerə.

Qeysəm, sənin kimi mənə Leyli var,
Eşqim, məhəbbətim, mehrim xeyli var,
Könlümün tək sənə, sənə meyli var,
Həvəslə gedərəm sən gedən yerə.

Dilək də "gəl" desə qəbul etmərəm,
Mələk də "gəl" desə qəbul etmərəm,



Fələk də "gəl" desə qəbul etmərəm,
Həvəslə gedərəm sən gedən yerə.

Yönü - yarsız kəsin məzarə olsun,
Sənsiz bu Şahinə nə çarə olsun?
Mənə bir balaca işarə olsun,
Həvəslə gedərəm sən gedən yerə.

*10.01.1999*

## GÖZƏ GÖRÜNMƏZ

*"-Bu od söndükdə hara gedir?*
*-Sən əgər odun haradan gəlib yandığını mənə desən, mən onun hara getdiyini sənə deyərəm".*

Gəldiyi yer də var,
getdiyi yer də,
Amma dərk etmirik
o yerləri biz.
Hər gerçək önündə
gözə görünməz,
Bizə görünməz
Vardır nə isə...
Heç zaman olmayıb
səbəb səbəbsiz.

*11.01.1999*

## AĞLAYARSAN

Əzəlki tək sən yenə
Əzab verirsən mənə..
Sənə yox, özgəsinə
Baxaram, ağlayarsan.

Od ol, oda od gərək,
Mən od kimi, sən su tək...
Ürəyindən arzu tək
Çıxaram, ağlayarsan.

Şahin Fazili unut,
Mən şimşəyəm, sən bulud,

Mən ildırım, sən sükut,
Çaxaram, ağlayarsan.

*12.01.1999*

## ZƏRƏR KIFAYƏT MƏNƏ

Fərəh qoy sənin olsun,
Kədər kifayət mənə.
Gözün sevinclə dolsun,
Qəhər kifayət mənə.

Zərrənin üzü boyda,
Nöqtənin özü boyda,
Iynənin gözü boyda
Nəzər kifayət mənə.

Eyləyəli seyrini
Görməyirəm qeyrini,
Istəmirəm xeyrini,
Zərər kifayət mənə.

Qoyun şeyx hələ yatsın,
Cənnətə kəmənd atsın,
Kövsər qoy ona çatsın,
Xəzər kifayət mənə.

Şahini vurğun tanı,
Məcnunu yorğun tanı,
Neynirəm biyabanı,
Şəhər kifayət mənə.

*14.01.1999*

## OXUYARAQ FIKIRLƏŞ!

*"O, nə yazacaq ki!.."*

Mənim şerlərimi
Oxuyub sətir-sətir,
Dərk edib şer-şer,
Çevirib varaq-varaq
fikirləş.



Mənim şerlərimi
Fikirləşib oxuma,
Oxuyaraq fikirləş!

*15.01.1999*

## ŞAIRƏ NƏ OLUB GÖRƏSƏN BU GÜN?

Bircə misra belə şer deməyib,
Şairə nə olub görəsən bu gün?
Yenə də kim onun xətrinə dəyib?
Şairə nə olub görəsən bu gün?

Ötən gün var idi sözündə şəkər,
Indisə üzündə, gözündə kədər,
Yazardı, pozardı dünənə qədər,
Şairə nə olub görəsən bu gün?

Cırılıb varağı, sınıb qələmi,
Yoxalıb fərəhi, çoxalıb qəmi,
Sazı yenə çalır "Yanıq Kərəmi",
Şairə nə olub görəsən bu gün?

Onu biganəmi acıqlandırıb?
Yoxsa cananəmi acıqlandırıb?
Şamı pərvanəmi acıqlandırıb?
Şairə nə olub görəsən bu gün?

Canında qəzələ eşq yaşadıbdır,
Qanında gözələ eşq yaşadıbdır,
Onun bostanına kim daş atıbdır?
Şairə nə olub görəsən bu gün?

Onun məlalını bilə bilmədim,
Fikir-xəyalını bilə bilmədim,
Necə kömək edim ona mən yetim?
Şairə nə olub görəsən bu gün?

Bu gün misraları gəlməyib dilə,
Neçin ilhamına verib fasilə?
Görəsən nə olub Şahin Fazilə?
Şairə nə olub görəsən bu gün?

*18.01.1999*

## BIZI DOĞRAYACAQ HICRAN QILINCI

Haçansa bir şirin sevda dəmində
Bizi doğrayacaq hicran qılıncı.
Iki eşq öləcək eşq aləmində,
Bizi doğrayacaq hicran qılıncı.

Əgər vüsalımız möhkəm olmasa,
Könlümüz eşq ilə xürrəm olmasa,
Həmdəm həmdəminə həmdəm olmasa,
Bizi doğrayacaq hicran qılıncı.

Əllər bir-birindən aralanacaq,
Sevdalı könüllər yaralanacaq,
Cismimiz zərbədən paralanacaq,
Bizi doğrayacaq hicran qılıncı.

Eşqə xəyanəti edək yasaq biz!
Hər yava adəti edək yasaq biz!
Sirri sirdaş kimi qorumasaq biz,
Bizi doğrayacaq hicran qılıncı.

Kənara çıxarsa sirr birimizdən,
Allah keçməyəcək təqsirimizdən,
Soyusaq azca da bir-birimizdən,
Bizi doğrayacaq hicran qılıncı.

Əgər əhdimizdə təpər olmasa,
Ona peymanımız sipər olmasa,
Önündə vəslimiz xəncər olmasa,
Bizi doğrayacaq hicran qılıncı.

*24.01.1999*

## ŞAHINI YAŞAT, GÜLÜM

Ölüm yetər bir anda,
Elə ehtiyat, gülüm,
Mən səfərə çıxanda
Dalımca su at, gülüm.



Eşqimin ey möhtacı,
Baxma elə qıyqacı,
Etmə günümü acı,
Şirindir həyat, gülüm.

Bitdi səbr-qərar ki...
Çoxaldı intizar ki...
Öldürməyə nə var ki,
Şahini yaşat, gülüm.

*27.01.1999*

## BIR DAŞ ALTDA, BIR DAŞ ÜSTDƏ

Gözlərini gözümə dik,
Ayırmasın fələk bizi.
Deyirəm ki, həmişəlik
Hifz eləyək eşqimizi,
Bir daş altda, bir daş üstdə.

Ağlasaq da, özgəyə nə?
Öz gözümüz, öz yaşımız.
Həzzimizdən bir-birinə
Qoy qarışa göz yaşımız,
Bir yaş altda, bir yaş üstdə.

Odumuza çiləmə su,
Qoy alışsın ocaq belə.
Başbir olduq ömür boyu,
Məzarda da olaq belə -
Bir baş altda, bir baş üstdə.

*29.01.1999*

## MƏNI SEVMƏ

Daha bəsdir,
mənə olan sevgin haqda
ehtimalım gerçəkləşib,
Aramızda olan-olub,
keçən-keçib,
Məni sevmə.

Mən ki, sənə bu vaxtacan
"Məni sevmə" deməmişdim bircə kərə,
Demək, yoxmuş bir zərurət
o sözlərə,
Məni sevmə.
Aramızda yarğan durur,
uçurum var,
Onu keçmək, vallah, sənə zülüm olar,
Məni sevmə.

Ömrümüzü, günümüzü
yaz sanırdım, yay sanırdım,
sərt qış imiş...
Bu da bir növ qəza-qədər,
tale-filan, bir iş imiş,
Sənin sevgin bir aldanış,
bir oyunmuş,
vərdiş imiş,
Məni sevmə.

Mənə elə gəlirdi ki,
Sənə elə gəlirdi ki,
gözümüzə, könlümüzə
qarşılıqlı bir sevgidən gəlib işıq,
Ikimiz də yanılmışıq,
Məni sevmə.

Qəlbindəki
mənə olan
sevgimdir?
Xeyr, deyil.
Istəkmidir?
Xeyr, deyil.
Belə isə nədir, nədir onun adı?
Etdiyimiz əhdü peyman baş tutmadı,
Məni sevmə.

Məcnun olsam,
Heç dəlini, divanəni anarmısan?
Fərhad olsam,



Sən Xosrovdan məni üstün sanarsanmı?
Kərəm olsam,
alovuma yanarsanmı?
Məni sevmə.

Çətin anda, bərk ayaqda
Haraylasam gələrmisən?
Leylimisən,
Əslimisən,
Şirinmisən, Şəkərmisən?
Əzabımı çəkərmisən?
Məni sevmə.

Nə xeyri var, sevgimizin
Üstü duman, yolu çənsə.
Işdi-şayəd əgər məni sevmisənsə,
Məni sevmə.

Sən
tərəddüd içindəsən,
Səni belə görən kimi
Ürəyimdən səda qopdu:
Məni sevmə.
Əgər sevsən,
bir də gördün dünya qopdu,
Məni sevmə.

Məni sevmə,
bu sevginin
Olub-qalan işığı yox ola bilər.
Bu sevginin
səfasından cəfası çox ola bilər,
Məni sevmə.

Bəlkə də sən
düşünürsən
yaş çoxalıb,
azca qalıb,
dönəcəkdir külə sevgim,
birdən Allah eləməmiş

düşər dildən-dilə sevgim...
Qoy qəlbində ölə sevgim,
Məni sevmə.

Məni sevmə,
Mən sevirəm!
Gedib bu gün
Gözmuncuğu alacağam sevgim üçün,
Göz dəyməsin
təki sənə,
təki mənə,
təki bizə,
Mənim sevgim bəs eləyər ikimizə,
Məni sevmə,
Məni sevmə!

*4.02.1999*

## DADLI ACI

*"Həqiqət acıdır, dadlıdır amma..."*
**Hüseyn Cavid**

Həqiqət aşiqi, böyük bir düha
Acı həqiqəti acı bilməyib.
Acı hər nə varsa dadsız olsa da,
"Həqiqət acıdır, dadlıdır" deyib.

Üryan həqiqəti desin dilimiz,
Üz tutaq, yön alaq həqiqət sarı.
Riya libasını cıraq onun biz,
Biçilməsin ona yalan paltarı.

Həqiqət eşidin, həqiqət deyin,
Acı həqiqəti şirin sayıram.
Mənə çılpaq qadın təklif etməyin,
Mən çılpaq... həqiqət arzulayıram.

*5.02.1999*



## DOĞMA KƏDƏR

Tale ayırdımı, yoxsa bəxt bizi?
Nə oldu fərağı araya salan?
Elə sevirdik ki, bir-birimizi,
Leyli də yalandı, Məcnun da yalan.

Olmadı bizlərə vüsal müyəssər,
Ağrıtdı ayrılıq yükü ürəyi.
Amma, deyirəm ki, o doğma kədər
Tək-tənha qoymasın təki ürəyi.

Ömürlük sevirəm o kədərimi,
Nə qədər o varsa, bilin, varam mən.
Sağ qaldığım üçün bu vaxta kimi
Həmin kədərimə minnətdaram mən.

*6.02.1999*

## YARIMÇIQ, BÜTÖV...

Yamanca yuxadır mənim ürəyim,
Ac-susuz kəsləri andığım zaman
Yeyilmir, yarımçıq qalır xörəyim,
Çayım içilməyir heç vaxt sonacan.

Bütöv bir sevgi var hər əməlimdə,
Fəqət, istəyirəm, istəyirəm mən.
Dirilik suyu tək tutub əlimdə
Sevgi badəsini içim dibəcən.

*7.02.1999*

## SƏNSIZ OLDUQDA DA SƏNI... QUCURDUM

Kim deyir ki, hicran uzaqlaşdırır?
Ürəkdən sevirsə əgər yar-yarı,
Ayrılıq səddini inamla qırır,
Birlikdə keçirir ayrılıqları.

Yenə gözlərində gördüm əksimi,
Yenə də mən sənin önündə durdum.
Aləmdə yeganə bir aşiq kimi
Sənsiz olduqda da səni... qucurdum.

*8.12.1999*

## BÖLGÜ

Xoşladım səni mən, sevdim səni mən,
Bağladım səninlə əhdi, ilqarı.
Gülüm, paraladım, böldüm ürəkdən
Hissimi, duyğumu səninlə yarı.

Sən yarı sevəndən yarı sevənəm,
Adət eləmişəm daha mən buna.
Yarı hisslərimi qəbul et, sənəm,
Onları birbəbir qoyum ovcuna:

Məhəbbət mənim də, sənin də olsun,
Ləyaqət mənim də, sənin də olsun,
Ehtiram mənim də, sənin də olsun,
Xoş məram mənim də, sənin də olsun,

Sədaqət mənim də, sənin də olsun,
Səadət mənim də, sənin də olsun,
Səadət mənim də, sənin də? Yox, yox,
Israr eləmirəm mən adətimdə,
Mən onu bölgüsüz verirəm sənə,
Sənin olsun mənim səadətim də!

*9.02.1999*

## PƏRAKƏNDƏ

Elə ki, yanından aralanmışam
Pərakəndəyəm,
Paralanmışam.
Əsiri olmuşam qəmin, qüssənin,
Əsiri olubdur ürəyim sənin.
Düşüncəm yanında, fikrim yanında,
Gözüm yanında.



Ilhamım yanında, şerim yanında,
Sözüm yanında.
Yanında, büsbütün özüm yanında.
Cismim yanındadır, canım yanında,
Gəl, səni düşünüm, anım yanında.
Atəş yurdundanam, atəşpərəstəm,
Alışım yanında, yanım yanında.
Mən yoxa dönmüşəm, sənsiz heç nəyəm,
Gəl ki, dərbədərəm, pərakəndəyəm,
Gəlib, bir bütövlük canıma gətir,
Gətir, məni mənim yanıma gətir.

*10.02.1999*

## GECƏDƏN KÜSMÜŞƏM BU GECƏ

Gecədən küsmüşəm bu gecə,
Yazdığım cəmi bir sətirdi...
Huşumu başımdan apardı,
Röyamı gözümə gətirdi.

Gecədən küsmüşəm bu gecə.
Guya bu hörmətdi, xətirdi,
Yuxusuz gecələr yerinə
Gözümə yuxumu gətirdi,

Yazdığım cəmi bir sətirdi...
Bu gecə şerimi yazmadım,
Bu gecə yazmadım pozmadım.
Bu gecə qısırdır ilhamım,

Bu gecə barsızam ağac tək,
Bu gecə gəlmədi yanıma
Təbimin pərisi - o mələk.
Dərdliyəm, qəmliyəm mən necə,
Gecədən küsmüşəm bu gecə.

*11.02.1999*

## DƏDƏ QORQUDDAN XAHIŞ

Qorqud dədə!
Əllərinə qopuz deyil,
qılınc alıb,
gərək olsa qılınc çalıb
müsəlmanı qorxut, dədə,
qəzəlxanı qorxut, dədə,
Qorqud dədə.
Ümidim tək sənə qalıb,
De ki, günah etməsinlər,
Bağışlamaz Tanrı bizi,
hifz eləyək
Tanrı verən
adımızı, dilimizi.
Qəribədir millətimin
bəzi-bəzi müsəlmanı,
bəzi-bəzi qəzəlxanı...
Ad dilənir,
Söz dilənir.
Müsəlmana elə gəlir,
Qəzəlxana elə gəlir
Düz dilənir.
"Qış"ımızı "zimistan"a döndərən var,
"Baş"ımıza bir daş kimi
"Sər" sözünü endirən var.
"Səng" edirlər "daş"ımızı,
"Əbru" deyib,
Fars sözüylə anladırlar "qaş"ımızı.
"Maqbet" adı,
"Hamlet" adı,
"Telman" adı...
Əgər belə davam etsə,
Yadımızdan çıxacaqdır
"Qeyrət" adı,
"Şövkət" adı,
"Elman" adı.
Ingilisin ,
fransızın,
italyanın
başlarını kəssələr də,
Balasına "Ağamalı" söyləməzlər,



Uşağına "Imam" deməz,
"Ağa", "Alı" söyləməzlər.
Ya, onların dillərini kəssələr də,
Qələm tutan əllərini kəssələr də,
Sözümüzü
Sözlərinə
Eləməzlər calağ, dədə,
Biz də elə olaq, dədə!..

Qorqud dədə!
Əllərinə
qopuz deyil,
qılınc alıb,
Gərək olsa qılınc çalıb,
Müsəlmanı qorxut, dədə,
Qəzəlxanı qorxut, dədə,
Qorqud dədə, Qorqud dədə!

*16.02.1999*

## MƏHƏBBƏT IZTIRABI

Şahinin həzzi bitdi,
Daha o həzz görünməz.
Məhəbbət həzzi itdi,
Elədi onu əvəz
Məhəbbət iztirabı.

Bülbüləm gülsüz ötən,
Hər dəm mənə əzabdır.
Nə günah elədim ki,
Qarğıdı mənə kim ki,
Nəsibim iztirabdır -
Məhəbbət iztirabı.

Sarsıtsa da qəlbi qəm,
Buna tabım olacaq.
Amma yox buna şəkkim
Ömrümün sonunacan
Iztirabım olacaq -
Məhəbbət iztirabı.

*17.02.1999*

## HICRAN SOYUĞU, VÜSAL ISTISI

Soyuğunda hicranın
Qaxaca dönmüşəm mən.
Haçansa mənim canım
Isinərmi görəsən?

Xoş vüsal istisiylə
Alışıram, yanıram,
Yuyub-gedir tər məni,
Sanki isti ütüylə
Ütüləyiblər məni.

*18.02.1999*

## QARMAQARIŞIQ FIKIRLƏR

*"Arı mənə yaxınlaşır..."*
**Ramiz Qusarçaylı**

Çoxusundan ötüb-getdi,
Çoxusunun
yuxusundan ötüb-getdi,
Qəzəl mənə yaxınlaşır...

Şirin də mən, acı da mən,
Bir gözəlin
tamarzısı, acı da mən,
Gözəl mənə yaxınlaşır.

Gülzarımın solur gülü,
Xəzan gəlir
Heyf xəzəl olur gülü,
Xəzəl mənə yaxınlaşır.

Hanı, nicat uzun oldu,
Qarabağda
əməliyyat uzun oldu,
Əməl mənə yaxınlaşır.

Budur, gəlir, kimsə gəlir,
Biclik ilə
göygöz, kürən Həmzə gəlir,
Keçəl mənə yaxınlaşır.



"Hər doğulan öləcəkdir",
Yerimizə
yeniləri gələcəkdir,
Məsəl mənə yaxınlaşır.

Əzrayılın əli uzun,
Bir əlinsə
görünməyir yolu uzun,
Bir əl mənə yaxınlaşır.

Qorqud səsi, dədəm səsi...
Neçə vaxtdır
eşidirəm qədəm səsi,
Əcəl mənə yaxınlaşır.

*25.02.1999*

## BAŞIMDA DAŞ YERI VAR

Bilinir ağlamağım,
Gözümdə yaş yeri var.
Dağıldım dağım-dağım,
Bu sirri faş yeri var.

Sönsə də od ocaqda,
Alışacaq ocaq da,
Bizə Xan Qarabağda
Dava-dalaş yeri var.

Hey düşsək də təlaşa,
Başlamırıq savaşa,
Başım layiqdir daşa,
Başımda daş yeri var.

*26.02.1999*

## BIÇAQ GÖYƏRDI GÖMGÖY

Qılınc - qaşa nümunə,
Ağıl - başa nümunə,
Torpaq - daşa nümunə,
Torpaq göyərdi gömgöy.

O xış xışa oxşamır,
O quş quşa oxşamır,
Bu qış qışa oxşamır,
Yarpaq göyərdi gömgöy.

Meylim qızılgüləmi?
Güləmi, bülbüləmi?
Işlətməkdən qələmi
Barmaq göyərdi gömgöy.

Qarabağda yara - bağ,
Hara bağça, hara bağ?
Söyləməkdən "Qarabağ"
Dodaq göyərdi gömgöy.

Deyiblər ki, "qana qan",
Deməyiblər "qanı dan",
Göyərti doğramaqdan
Bıçaq göyərdi gömgöy.

*27.02.1999*

## BARMAQLARIM DARAQ DIŞI

Qolum canlı kəmər idi,
Kəmər belə dəyməyəcək.
Dodağın ki, şəkər idi,
Şəkər dilə dəyməyəcək.

Səs eşitmək - qulaq işi,
Söz danışmaq - dodaq işi,
Barmaqlarım - darağ dişi,
Darağ telə dəyməyəcək.

Məcnun gəzir çöl arası,
Bağban isə gül arası...
Məsafə var əl arası,
Əlim ələ dəyməyəcək.

Gül soldu, bülbül qurudu,
Bülbül uçdu, gül qurudu,



Sara axdı, sel qurudu,
Çoban selə dəyməyəcək.

Deməyirəm kimsən, nəsən,
Qəzəl adlı aləmdəsən,
Şahin zildə, sən bəmdəsən,
Bəmin zilə dəyməyəcək.

*10.03.1999*

## ILAN SANCACAQ MƏNI

Demirəm kimliyini,
Filan sancacaq məni.
Üzündə bəlli kini,
Yaman sancacaq məni.

Işlədəcək şər, kələk,
Qalmayacaq hiylə tək,
Riya məni didəcək,
Yalan sancacaq məni.
Görcək o nadan gəlir,
Gözlərimə qan gəlir,
Ay aman, ilan gəlir,
Ilan sancacaq məni.

*11.03.1999*

## ÖLMƏKDƏ ÖLÜMSÜZLÜYÜMÜZ VAR

*Sən ölümsüzlüyə inanırsanmı? Inanırsansa, deməli ölüm yoxdur və ölüm yeni həyatın başlanğıcıdır.*

Bir gün
yenə gəldi...
Bir gün
yenə getdi...
Ömrün günü bir gün də çoxaldı...
Amma ki, həyatımdakı tamlıq
Bir gün də itirdi,

Bir gün də itirdi və azaldı...
getmək də təbii,
Qalmaq da təbii.
Hər gün çoxalır ömrümüzün bir günü, amma
Amma bu çoxalmaqda azalmaq da təbii.
Bir gün gedərəm, amma ki, gəlmək yenə vardır,
Gəlmək sənə vardır, mənə vardır.
Bir gün görərəm mən ki, tapıb can yenə gəldim,
Bir gün deyərəm: - Ey yeni dövran, yenə gəldim.
"Seyyid, neçə yol gəlmiş idim mülki-cahanə,
Səd şükr, tapıb surəti-insan yenə gəldim".
Ölməksə ölümsüzlüyə meyar,
Ölməkdə ölümsüzlüyümüz var!

*15.03.1999*

## BIRI QORXULUDUR, BIRI QORXUSUZ

Xəncər də görürəm, tar da görürəm,
Biri qorxuludur, biri qorxusuz.
Əğyar da görürəm, yar da görürəm,
Biri qorxuludur, biri qorxusuz.

Halətim dəyişir mənim get-gedə,
Gözlərim çox şeydə təzad görmədə,
Buynuz kəllə də var, kəpənəkdə də,
Biri qorxuludur, biri qorxusuz.

Nəzərim cahil də, aqil də görür,
Haqqa da göz qoyur, batil də görür,
Nadana da baxır, fazil də görür,
Biri qorxuludur, biri qorxusuz.

*17.03.1999*

## ECAZIN KƏRAMƏTI

Söz idi, şer oldu -
Ecazın kəraməti.
Bağın köksü soyuldu -
Dəryazın kəraməti.



Nə müddətdi gülmürəm,
Nə mövsümdü bilmirəm,
Üzümdə gül açdı qəm,
Gül - yazın kəraməti.

Canımda şahin yaşar,
Qanımda şahin yaşar,
Şahinliyim, ey nigar,
Pərvazın kəraməti.

*21.03.1999*

## SUAL

Görürəm
göydə ay
hər gecə doğur,
Kişisi yoxdursa
ay necə doğur?

*27.03.1999*

## BALIŞI DEŞMƏYƏN GÜLLƏ

Bir zaman səni hey səsləyər idim,
Tamarzın kimi.
Yolunu həsrətlə gözləyər idim
Tamarzın kimi.

Indi mənim səsim sənə yönəlmir,
Nə də sənin yolun yön alır mənə.
Daha Şahin Fazil yanına gəlmir,
Səninsə düz yolun gedir tərsinə.

Qəlbimdən çıxarıb atdım səni mən,
Səndə də dönməyə üz ola bilməz.
Əks qütblərin kəsişməsindən
Söhbət ola bilməz, söz ola bilməz.

Ardımca çiləmə göz yağışını,
Təsiri olmaz.
Dalımca yağdırma söz yağışını,
Təsiri olmaz.

Qorxmuram mən sənin söz atəşindən,
Sənin kəlmələrin, sənin sözlərin
Hədəfə çatmayan şillə kimidir.
Açılsa da belə, dəysə də belə,
Balışı deşməyən güllə kimidir.

*30.03.1999*

## ŞER BELƏ OLAR, ŞAIR DƏ BELƏ!

*Qiymətli şairə!!!*

Sözün güldən gözəl, şirindən şirin,
Yaman artırırsan şer varını.
Sənin tək şairin - əsl şairin
Mələklər yazdırır misralarını.

Yüz illər, min illər ötsə də əgər,
Adın yaşayacaq xatirdə belə.
Oxuyub şerini söyləyəcəklər:
Şer belə olar, şair də belə!

*2.04.1999*

## OCAQ MƏNSIZ DARIXIB

Pərvanə almır vecə,
Çıraq mənsiz darıxıb.
Yaxın - qovur beləcə,
Uzaq - mənsiz darıxıb.

Kədər coşdu, çağladı,
Qüssə qəlbi dağladı,
Qəm məni qucaqladı,
Qucaq mənsiz darıxıb.

Özü səsləyir məni,
Sözü səsləyir məni,
Gözü səsləyir məni,
Bulaq mənsiz darıxıb.

O gül xar olub mənə,
Cahan dar olub mənə,
Hicran yar olub mənə,
Fəraq mənsiz darıxıb.



Yaman küskün olmuşam,
Belə neçin olmuşam?
Guşənişin olmuşam,
Bucaq mənsiz darıxıb.

Durna, telin əsməsin,
Bağban, gülün əsməsin,
Cəllad, əlin əsməsin,
Bıçaq mənsiz darıxıb.

Şahin, ələndi ələk,
Puç oldu arzu, dilək...
Quruyuram odun tək,
Ocaq mənsiz darıxıb.

*3.04.1999*

## MƏLƏYIN NƏ VECINƏ?

Çiçəkdən qoxu gəlmir,
Çiçəyin nə vecinə?
Gözümə yuxu gəlmir,
Bəbəyin nə vecinə?

Hicrə güman çoxaldı,
Canda fəğan çoxaldı,
Şeytan yaman çoxaldı,
Fələyin nə vecinə?

Dərd yağır, fikir yağır,
Neçə-neçə sirr yağır,
Qəmimi bir-bir yığır,
Ürəyin nə vecinə?

Istəyin sonu yoxdur,
Diləyin sonu yoxdur,
Mələyin donu yoxdur,
Mələyin nə vecinə?

Susdu Şahin ilhamı,
Yar - olmadı əncamı...
Söndürdü yanan şamı,
Küləyin nə vecinə?

*13.04.1999*

## SƏNI TAPACAĞAM, ƏZIZIM, YENƏ

Heç nə yox olmayır, heç nə itməyir,
Səni tapacağam, əzizim, yenə.
Xeyirdə zərər var, zərərdə xeyir,
Səni tapacağam, əzizim, yenə.

Sapanda daş qoyub hicrə at asan,
Mənə yetiş asan, mənə çat asan,
Civə deyilsən ki, itib-batasan,
Səni tapacağam, əzizim, yenə.

Səni düşünürəm bu ana qədər,
Gerçək olacağam gümana qədər,
Səni itirmişəm tapana qədər,
Səni tapacağam, əzizim, yenə.

Aşiq sevdasını tapdığı kimi,
Surət mənasını tapdığı kimi,
Bəbək ziyasını tapdığı kimi
Səni tapacağam, əzizim, yenə.

Rövşən Nigarını tapdığı kimi,
Sənan Xumarını tapdığı kimi,
Həsrət yar yarını tapdığı kimi
Səni tapacağam, əzizim, yenə.

Şair xülyasını tapdığı kimi,
Vəzn hecasını tapdığı kimi,
Misra misrasını tapdığı kimi
Səni tapacağam, əzizim, yenə.

Qocayam, amma güc bu çağımda var,
Atımı dördnala çapmağım da var,
Itirməyim də var, tapmağım da var,
Səni tapacağam, əzizim, yenə!

*17.04.1999*



## KƏDƏR YEMƏYIM GƏLIR

Baharım ötüb, qışam,
Qəhər yeməyim gəlir.
Yamanca acımışam,
Kədər yeməyim gəlir.

Zəfərli olmaq üçün,
Hünərli olmaq üçün,
Ciyərli olmaq üçün
Ciyər yeməyim gəlir.

Həyatımı acı bil,
Yarım, göz yaşımı sil,
Şəkər gərəyim deyil,
Bibər yeməyim gəlir.

Imkanı dar görəndə,
Hicranı var görəndə,
Cananı zar görəndə
Zəhər yeməyim gəlir.

Əğyar süsən dərəndə,
Mənə acıq verəndə,
Bağı bağlı görəndə
Çəpər yeməyim gəlir.

*19.04.1999*

## DƏLIDƏN DIVANƏYƏ

Sən aşiq,
Mən də aşiq.
Bir Leylinin eşqinə
Sən layiq,
Mən də layiq.
Sənə "gəl!"- dedi Leyli,
Getmədin.
"Vəslə yet" dedi Leyli,
Yetmədin.
Mənə "gəl" dedi, getdim,

"Vəslə yet" dedi, yetdim...
Nə irfan gözümdədir,
Nə təsəvvüf gözümdə.
Özümü axtarmışam
Və tapmışam özümdə.
Deyirlər kim yetərsə
vəslə
Deyildir aşiq.
Əgər bu belədirsə,
Demək, yer kürəsində
Yaranışdan bu yana
Olmayıb heç bir aşiq.
Məcnun qardaş,
Vüsalsız,
Qumlara axıdıb yaş,
Sən səhrada yaşadın,
Mən isə şəhərdəyəm.
Məcnun Şahindir bəyəm?
Şahin Məcnundur bəyəm?
Səhra şəhərə dəyər?
Sənə həmdəm qum oldu,
Mənə isə çiçəklər...
Sənə ağlayırdılar,
Mənəsə güləcəklər.
Aşiqlərin işləri
Ağlamalı, gülməli...
Sən - divanə,
Mən - dəli.

*6.05.1999*

## NIYƏ TUMURCUQLADI?

Ah, bu sevgi ağacı
Niyə tumurcuqladı?
Vardımı ehtiyacı?
Niyə tumurcuqladı?

Saralmada göy ömür,
Qaralmada göy ömür,
Tumurcuğu böyümür,
Niyə tumurcuqladı?



Rişəsi dərin deyil,
Kölgəsi sərin deyil,
Meyvəsi şirin deyil,
Niyə tumurcuqladı?

Ağacda həvəsə bax.
Bu "həvəsli" kəsə bax,
Bu ağac quruyacaq,
Niyə tumurcuqladı?

Sanırdım çaram oldu,
Bu sevgi haram oldu,
Tumurcuq - yaram oldu,
Niyə tumurcuqladı?

Bağbanı naşı idi,
Ömrünün qışı idi,
Qoca bir kişi idi...
Niyə tumurcuqladı?

Ah, bu sevgi ağacı
Niyə tumurcuqladı?
Vardımı ehtiyacı?
Niyə tumurcuqladı?

*9.05.1999*

## ÜMIDSIZ SEVGI

Gümanım yox ki, yaram
qəlbimdə sağalacaq,
Bir ümidsiz sevgiyə
yaman yoluxmuşam mən.
Ömrümün sonunacan
onda gözüm qalacaq,
Çıxara bilməyəcək
o, gözümü özündən.

*Gəncə, 12.05.1999*

## OXUDUM...

Vətəni -
çərək-çərək,
Nəğməni -
tütək-tütək,
Gülşəni -
çiçək-çiçək,
Çiçəyi -
ətir-ətir,
Buludu -
çətir-çətir,
Kitabı -
sətir-sətir,
Səni isə -
hüceyrə-hüceyrə
Oxudum!

*14.05.1999*

## XƏYALI YAR

Gül görən deməz
"Xarı görmədim".
Səhvi olmayan
Yarı görmədim.

İndi qəmxarı
Var xəyalımın,
Təzə bir yarı
Var xəyalımın.

İndi qəlbimə
Bir yar atmışam,
Mən xəyali bir
Yar yaratmışam.

*15.05.1999*

## BAŞ BIÇILSƏ YAXŞIDIR

Mən - batanam, sən - çıxan,
Mən - sönənəm, sən - yaxan,
Gözündən mey tək axan
Yaş içilsə yaxşıdır.



Kim durarsa qəsdinə
Görüm düşə pis günə!
Atılarsa üstünə
Daş kiçilsə yaxşıdır.

Vəsf elədim gündə mən,
Baş əydim önündə mən,
Sənə təzim etməyən
Baş biçilsə yaxşıdır.

*23.05.1999*

## ZƏIF ŞER

Yağış yenə yağdı,
hava oldu saf,
Göz yaşı da şəffaf,
yağış da şəffaf.
Sellər hər tərəfi
etdi təzə-tər.
Zülüm çəkməyəcək
süpürgəçilər.
Əlbəttə, təmizlik
zəhmət istəyir,
Hərə zəhmətinə
qiymət istəyir.
Dillənmir, susubdur
yağış verən kəs,
Yağışın pulunu
kim verəcək bəs?

*25.05.1999*

## MƏN ÖZGƏNIN YERIŞIYLƏ YERIMƏRƏM!

Məndə vardır
bu gün belə
dili
Keçmiş əsrlərin dili olan
Qəzəl dərdi,
Dağ olsaydı
əriyərdi,
Ərimədim.

Qəzəllərim təmiz, şəffaf,
Safdan da saf.
Yüzü məni təqdir edir.
Göz yummada
Olsa-olsa biri mənə,
Hərdən dedi biri mənə
"Elə yazma, kiri" mənə,
Kirimədim.

Mən qəlizdil qəzəlxana
"Yolunu tap,
Öz yolunla yeri" dedim,
"Şerimizdə
Köhnə yolla gedənlərin
qalmayacaq yeri" dedim.
Mən özgənin yerişiylə
yeriməərəm,
Yerimədim!!!

*28.05.1999*

## BU ADAM KIMƏ LAZIM?

Saçı ağ, günü qara,
Bu adam kimə lazım?
Günü çətin ağara,
Bu adam kimə lazım?

Gözlər nəm dağarcığı,
Sinə qəm dağarcığı,
Dərd - sitəm dağarcığı,
Bu adam kimə lazım?

Harda oturar-durar,
Adamlıqdan dəm vurar...
Quru adamlığı var,
Bu adam kimə lazım?

Qol qıran qolu yoxdur,
Izi var, yolu yoxdur,
Şeri var, pulu yoxdur,
Bu adam kimə lazım?



Isadır, ecazı yox,
Davuddur, avazı yox,
Şahindir, pərvazı yox,
Bu adam kimə lazım?

*30.05.1999*

## BƏS DEYILMI, EY FƏLƏK?

Dərd kədərə yanaşdı,
Qəm qəhərə yanaşdı,
Zülüm boğazdan aşdı,
Bəs deyil?

Şuşam zülümdə qaldı,
Adı dilimdə qaldı,
Cəfam əlimdə qaldı,
Bəs deyil?

Vüsalımı itirdim,
Cəlalımı itirdim,
Xocalımı itirdim,
Bəs deyil?

Hicrə "tələs" demirsən,
Cövrə "əbəs" demirsən,
Sən niyə "bəs" demirsən?
Bəs deyil?

*1.06.1999*

## AĞ SAÇIM VAR, QARA BAXTIM

Yaş gələndən yaşım üstdə,
Gün görmədim başım üstdə,
Duman gördüm.

Xeyir səpdim, fayda əkdim,
Qış da əkdim, yay da əkdim
Ziyan gördüm.

Gülşənimdə gül görmədim,
Gözlərimə əqrəb dəydi,
Ilan gördüm.

Ağ saçım var, qara baxtım,
Kimi gördüm, hara baxdım
Yaman gördüm.

*10.06.1999*

## ƏSIRIM OLARSAN, ARDIMCA GƏLMƏ

Elə Məcnunam ki, Leylim yox mənim,
Əsirim olarsan, ardımca gəlmə.
Səni əsir etmək meylim yox mənim,
Əsirim olarsan, ardımca gəlmə.

Səninlə danışıb-gülən deyiləm,
Hətta göz yaşını silən deyiləm,
Mən sənin ardınca gələn deyiləm,
Əsirim olarsan, ardımca gəlmə.

Işlədib tarixdə fələk çox kələk...
Taclı xatunsanmı, ya qeyri mələk?
Səni apararam Sultan Səlim tək,
Əsirim olarsan, ardımca gəlmə.

Əgər gəlsən belə faydası varmı?
Gəlməsən bağının gülü solarmı?
Bir də könlüm sənə əsir olarmı?
Əsirim olarsan, ardımca gəlmə.

Bəlalı könlümün dərd-məlalısan,
Mənim ki, fikrimdən yaxşı halısan,
Mənə etinasız yanaşmalısan,
Əsirim olarsan, ardımca gəlmə.

Bəlası çox olar əsir olmağın,
Cəfası çox olar əsir olmağın,
Xətası çox olar əsir olmağın,
Əsirim olarsan, ardımca gəlmə.

Sanma xəyalınla yenə bihuşam,
Indi mən sənsizlik oxuna tuşam...
Bilmirsən şahinəm, alıcı quşam,
Əsirim olarsan, ardımca gəlmə.

*8.07.1999*



## BIR QOL ÇIXSA QƏBIRDƏN...

Qəzəl cəfakeşiyəm,
Əqidəsi, məramı,
Yolu olan kişiyəm.
Əziyyətim, əməyim
Getməyəcəkdir hədər,
Ölümümdən sonra da
Yolumla gedəcəklər,
Mənim
yolum
olacaq!

Əyiləsi deyiləm
Haqsızın önündə mən.
Günlərin bir günündə
Bir qol çıxsa qəbirdən -
Əlində dəftər-qələm
Mənim
qolum
olacaq!

*13.07.1999*

## DƏLI AĞILLI IDI...

Bu düzdə arpa bitməz,
Taxıl çaşdırıb onu.
"Bu dəni daş üyütməz",
Paxıl çaşdırıb onu.

Aqil mələyi görmür,
Qafil kələyi görmür,
Cahil gerçəyi görmür,
Nağıl çaşdırıb onu.

Babam nağıllı idi,
Çörək-taxıllı idi,
Dəli ağıllı idi,
Ağıl çaşdırıb onu.

*15.07.1999*

## SINƏM ƏKIN YERIDIR

Sinəm əkin yeridir,
Əkinçiyəm, əkdiyim
Gah cücərir, gah da yox,
Gah göyərir, gah da yox.
Kədər əkdim
cücərdi,
Qəhər əkdim,
cücərdi,
Çəpər çəkdim
göyərdi...
Sinəm əkin yeridir,
Sevinc əkdim
bitmədi,
Nəşə tökdüm
bitmədi,
Fərəh səpdim
bitmədi...
Sinəm əkin yeridir...

*17.07.1999*

## BIR ŞAIRCIYƏZƏ

Nəyinə gərəkdir şer, nəyinə?
Səni kim bu işə vadar eləyib?
Sənin hər şerinin düzəlməyinə
Bir neçə şairin köməyi dəyib.

Sənin şairliyin ədəbi yalan,
Sənin astarına üz atılıbdır.
Yapışıb beytinin qulaqlarından
Heca dolanacan uzadılıbdır.

Sənin şerlərin kələkötürdü,
Səsləyə bilmirsən ilham pərini...
Onları kim yerdən ələ götürdü?
İndi kim düzəldir şerlərini?

*19.07.1999*



## ALOV SÖZÜMDƏN KEÇIB

*"Araz gözümdən keçirmiş..."*
**Həyat Şəmi**

Sözüm oxdu qovğada,
Tabım dözümdən keçib.
Dəyməzdən əvvəl yada
Sözüm özümdən keçib.

Kədər - mənim sirdaşım,
Iki əlim, bir başım...
Qurumayır göz yaşım,
Araz gözümdən keçib.

Qafillərin canına,
Cahillərin canına,
Qatillərin canına
Alov sözümdən keçib.

Sözü bir ikimizin,
Izi bir ikimizin,
Əzizim, sənin izin
Mənim izimdən keçib.

Deməsinlər dəlidi,
Dediyi gülməlidi,
Üzün işıq selidi,
Üzün üzümdən keçib.

Şahin, aşiqəm mən də,
Hicranla görüşəndə
Məcnun çölə düşəndə
Gəlib düzümdən keçib.

*24.07.1999*

## PƏRVANƏ YANDI, ÖLDÜ...

Axmada göz yaşlarım,
Sevinc gümandı, öldü.
Hanı qələmdaşlarım,
Hadi haçandı öldü.

Sabir əyandı, getdi,
Seyyid də yandı getdi,

Müşfiq cahandı, getdi,
Cəfər cavandı, öldü.

Gül soldu, bağ qalmadı,
Yaxın-uzaq qalmadı,
Loğman da sağ qalmadı,
O ki Loğmandı, öldü.

Nə Isa var, nə ecaz,
Nə Davud var, nə avaz...
Gül o qədər etdi naz,
Bülbül usandı, öldü.

Nə müddətdi gülmürəm,
Nəşə nədir, bilmirəm,
Mən yanıram, ölmürəm,
Pərvanə yandı, öldü.

*27.07.1999*

## ÖZÜNDƏN KEÇMƏYI BACARMALISAN

Keçməyə bilərsən sən öz sözündən,
Özündən keçməyi bacarmalısan.
Əl çəkib özündən, qaçıb özündən,
Özündən keçməyi bacarmalısan.

Uyma uyanların fitnə-felinə,
Düşmə ləl toruna, zər kəməndinə,
Əgər aşiqsənsə Xudavəndinə,
Özündən keçməyi bacarmalısan.

Olacaq, olub, var özündən keçən,
Yarına olar yar özündən keçən,
Tanrıya qovuşar özündən keçən,
Özündən keçməyi bacarmalısan.

Yaşat cəsarəti, mərdliyi canda,
Qaçıb çətinlikdən qalma asanda,
Sən qəzəl yazmağı bacarmasan da,
Özündən keçməyi bacarmalısan.



Hər cahil bu yolu seçə bilməyir,
Hər aqil bu meyi içə bilməyir,
Hər fazil özündən keçə bilməyir,
Özündən keçməyi bacarmalısan!
Bacarmalısan!

*4.08.1999*

## XAINƏ

Oyunçusan - naxələf!
Qeyrətini,
Şanını,
Ismətini,
Canını,
Qanını
etdin tələf.
Qarabağı uduzdun,
Bağı, dağı uduzdun,
Neçə kəndi, oymağı,
Neçə-neçə torpağı
uduzdun...
Oyun bilmirsən axı!
Əsl oyunçu özüməm -
Heç nərd oyununda da
Sevmirəm uduzmağı.

*12.08.1999*

## VƏFASIZ ŞAHIN

Dünyanı vəfalı bil,
Elə sevgili hanı?
Dünya
vəfasız deyil,
Vəfasız Şahindi ki,
Tərk edəcək dünyanı.

*10.08.1999*

## UÇUMMU, UÇMAYIMMI?

*"Ruzi daşdan çıxır indi,*
*Yarəb, acım, ya acmayım?"*
**Qiymət**

Təlaş yarandı məndə,
Qaçımmı, qaçmayımmı?
Əzrayılı gələndə
Qucummu, qucmayımmı?

Hicran əl-qol açıbdır,
Vüsalla dalaşıbdır,
Kələfim dolaşıbdır,
Açımmı, açmayımmı?

Adi şer yazanam,
Nə satım ki qazanam?
Qaynayan bir qazanam,
Daşımmı, daşmayımmı?

Dardı mənə bu aləm,
Ürəyimi üzdü qəm,
Adım Şahindi, bilməm
Uçummu, uçmayımmı?

*16.08.1999*

## YAR ƏTRI

Kiməsə
göy ətri,
Kiməsə
yer ətri,
Kiməsə
mey ətri,
Kiməsə
şer ətri,
Kiməsə
var ətri
Xoş gəlir.
Mənəsə
yar ətri
Xoş gəlir!

*17.08.1999*



## INDI SEVIR QARI MƏNI

Röya gördüm,
Röyada xoş sevda gördüm...
Gördüm o dəm
Yarım ilə cənnətdəyəm,
darı yemək istəyirəm...
Adəmi buğda qovdurdu,
Qovduracaq darı məni.

Qəzəlin mən tək acı var,
Içimdə şer ağacı var,
Varlı edib,
Barlı edib
Bu ağacın barı məni.

Gülü atıb qönçə gəzdim,
Bılsə idim eləməzdim...
Əlimə batmaq istədi,
Onu qanatmaq istədi,
Göz görəsi xar elədi
O qönçənin xarı məni.

Həm zəhəri, həm balı var,
Mənfi, müsbət
Bir cismdə tutub qərar.
Əvvəl mənə bal vermişdi,
Indi isə zəhər verib
Sancmaq istər arı məni.

Vaxt vardı ki, cavan idi,
Təbimə hökmran idi,
Indi isə Şahin kimi
Qocaldı ilham pərisi,
Indi sevir qarı məni.

*22.08.1999*

## BAŞIMA HAVA GƏLIB

Biri var, biri yoxdur...
Başıma hava gəlib.
Getməyə yeri yoxdur?
Başıma hava gəlib.

Eşqə ümid yoxaldı,
Az vermişdi, çox aldı...
Bir dəli də çoxaldı,
Başıma hava gəlib.

Aman, yenə yalan var,
Boş vədələr, yalanlar...
Ey havasız qalanlar,
Başıma hava gəlib.

Nəsim deyil, küləkdir,
Bir hiylədir, kələkdir,
Ciyərimə gərəkdir,
Başıma hava gəlib.

Şahinə yuva çatmır,
Dərdinə dava çatmır,
Şəhərdə hava çatmır,
Başıma hava gəlib.

*24.08.1999*

## TƏRƏZININ IKI GÖZÜ

Ağır göz aşağıda,
Yüngül göz yuxarıda.
Ağır söz aşağıda,
Yüngül söz yuxarıda...
Sol gözdə daş görürəm,
Sağ gözdə daşlar.
Sol gözdə baş görürəm,
Sağ gözdə başlar.
Sol gözdə şair,
Sağ gözdə şaircığazlar.
Daş ağır,
Daşlar yüngül,



Baş ağır,
Başlar yüngül...
Sağ gözdə şaircığazlar sözü,
Sol gözdə şair sözü,
Yuxarı qaldırıb sol göz sağ gözü...

Mən həm
Faş edib qəlbimdəki istəyimi,
Olmaq istəyirəm
Sol gözündə tərəzinin
Tərəzinin sol gözündəki
şair kimi!

*27.08.1999*

## FƏDA ETDIM BAŞIMI

Daşdan qorxmuram, təki
Daş ağrısı olmasın.
Üstümə daş gəldi ki...
Mən daşa öyrəşmişəm,
Kaş ağrısı olmasın.

Əlimdə dəftər-qələm
Yaratmağa mailəm...
Yaşım artsa da, nə qəm,
Təki xəcil olmayım,
Yaş ağrısı olmasın.

Görərək təlaşımı
Deməsinlər "naşımı?"
Fəda etdim başımı,
Qayğımı çəkənlərə
Başağrısı olmasın.

*30.08.1999*

## ŞAHINGÖZƏM, DÖRD TƏRƏFI SÜZMƏDƏYƏM

Kədər boğub fərəhimi aşıb-daşır,
Üç fəsil arxada qaldı.
Yaşın qışı yaxınlaşır,
Yaşayıram sola-sola.

Daim oldum təzə sözün sorağında,
Ömr edirəm hələ də mən

Alağları söz bağında
Bağban kimi yola-yola.

Şahingözəm, dörd tərəfi süzmədəyəm,
Ağlıma bax, səndən ötrü
Mən cahanı gəzmədəyəm
Sən canımda ola-ola.

*5.09.1999*

## QAPIMI DÖYMƏ DAHA

Xatırla əməlini,
Qapımı döymə daha.
Başına döy əlini,
Qapımı döymə daha.

Inamı gör ki, yanıb...
Bənd uçub, körpü yanıb,
Pəncərəmdən boylanıb
Qapımı döymə daha.

Mənliyimi anıb, dur,
Qapında qapanıb dur!
Üzünə qapanıbdır,
Qapımı döymə daha.

Gün daha qara deyil,
Gəlişin çara deyil,
Qapım nağara deyil,
Qapımı döymə daha.

Əl çək, bu işdən əl çək!
Əllərimlə həşrədək
Qapın döyülməyəcək,
Qapımı döymə daha.

Bəlli cavabım sənə,
Dözümüm, tabım sənə,
Açılmaz qapım sənə,
Qapımı döymə daha.



"Açılacaq!" deyirsən,
Nə özünü öyürsən?
Nə gözünü döyürsən?
Qapımı döymə daha,
Qapımı döymə daha!

*10.09.1999*

## ƏLIMDƏN GÖYƏRÇIN UÇURMUŞAM MƏN

Qəlbim son anacan onu anacaq,
Uçdu, mənsə düşdüm torpağa həmən.
Kiminsə əlinə uçub qonacaq,
Əlimdən göyərçin uçurmuşam mən.

Sevinc ürəyimdə sərasər idi,
O da görünürdü gözə sevincək.
Meyli istəyimə bərabər idi,
Onda meyl vardı, məndəsə istək.

Mükəmməl bələdəm hesab dərsinə,
Yarımın bir sözü olmurdu iki.
Amma, avand işim çöndü tərsinə,
Ürəyimdə qaldı ürəyimdəki.

Vüsalsız məhəbbət ötəri imiş,
Nakam bir şairin xülyası bitdi.
Vüsal məhəbbətin cövhəri imiş,
Vüsalsız məhəbbət sevdası bitdi.

Əli bənzəyirdi ağ göyərçinə,
Göyərçin əlini çəkdi əlimdən.
Məni bənzətməyin daha şahinə,
Əlimdən göyərçin uçurmuşam mən.

*12.09.1999*

## MƏN

Xoşlamıram
mətbəxdə xörək yeməyi,
Xörək yeyə-yeyə kitab oxumağı,
Kitab oxuya-oxuya
kim haqdasa düşünməyi,
fikrimi dağıtmağı...

Xoşlayıram
dondurmanı,
Soyuq ilə yaxşıdır aram,
Amma
Sibirdə yaşamağı
Xoşlamıram!

*22.09.1999*

## ZƏLZƏLƏ

*17 avqust 1999-cu ildə Türkiyədə dəhşətli bir zəlzələ baş verdi...*

Bəxtsizlərin bəxti tək
bu günlər gün qaraldı,
bu günlər gün tutuldu,
Yerdə zəlzələ oldu...
Günahkar yermi oldu,
aymı oldu,
günəşmi?
Ya, yerin altındakı
atəşmi
qıpqırmızı
"Cəngi" tək çıxdı zilə?
Zəlzələ!

Boylu qadın qarnı tək
Yerin qarnı titrədi...
Hamilə - insan doğar,
Insan uddu
Hamilə
zəlzələ.



Həsrət qaldı göz gözə,
baş bədənə,
əl ələ...
Zəlzələ...

Nə biləsən viranə
binaların altından
kim qayıda,
kim gələ?
Zəlzələ...
Ağlama Qorqud dədə,
Sızlama Yunus Əmrə,
Nikbin olmaq gərəkdir,
Həyat arabir elə
olur, arabir belə...
Zəlzələ...

*26.09.1999*

## QAN VƏ BUSƏ

Demişəm dönə-dönə:
Səxavətli kəsəm mən,
Inamın olsun,
Qanım
halaldır sənə,
Əgər
busə verməsən,
Haramın olsun!

*2.10.1999*

## ÜMIDYEYƏN

Acımışam yamanca -
Mən sədaqət acıyam,
Saf məhəbbət acıyam.
Iştihıma kilid yox,
Doymağıma ümid yox...
Ümid axırda ölür,
Qorxmayıram ölümdən,
Istərəm ki, ümidi
Yeyib sonra ölüm mən.

*17.10.1999*

## BƏDBIN ƏHVALI-RUHIYYƏ

Yaradan
Yaradandan bu günədək
Nə qədər adamı
Babamı, atamı
Məhv edib.
Bəlkə də,
Yuxarıdakı kişi
Aşağıdakı kişini
Həvva ilə birlikdə
Bizi yaratmaq üçün
Yaradanda
səhv edib...

*18.10.1999*

## SƏN ŞÜŞƏYƏ DAŞ ATIRSAN

Sənin başın daş kimidir
dediyimi başa düşmür.
Qoy daş məni bağışlasın,
bu töhmətim baş üçündür,
daşa düşmür.
Bu adamın başı yoxdur,
əvəzində
çiyni üstdə daş dikəlib.
Amma, ona elə gəlir
baş dikəlib.
Ey başı daş,
yavaş-yavaş
yağdırırsan neçə vaxtdır
sən daşları
mənə sarı.
Canım mənim deyil daşdan,
Sən şüşəyə daş atırsan,
ey daşatan.
Bir gün elə ola bilər
Səbr kasam dola bilər.
Şüşə kəsər
daş başını -
baş daşını,



birdəfəlik rahat olar
bu şüşə can.
Kəsilərsən,
Sən şüşəyə daş atırsan...

*19.10.1999*

## BOŞAMAQ ISTƏYIRƏM

Sanmayın ölə-ölə
yaşamaq istəyirəm,
ya ömrü gilə-gilə
yaşamaq istəyirəm.
Ilahi,
dünya ilə
Kəbinimi poz, onu
Boşamaq istəyirəm.

*20.10.1999*

## VƏFA ƏTRI GƏLMƏDƏ

Həyatım işıqlanıb,
Sözüm vardır Allaha:
Ömür çırağım yanıb,
Söndürmə onu daha.

Qalacaqdır əlimdə,
Çıxmayacaq könüldən.
Vəfa ətri gəlmədə
Bağımdakı gülümdən.

*28.10.1999*

## QARA BIR BUĞDA BITIB ÇÖHRƏNDƏ

Məni bezdirmədə addımlamağım,
Istərəm çapmağı, at almalıyam.
Niyyətim səmtinə getmir ayağım,
Qırat olmazsa Dürat almalıyam.

Neçə il səhvə uyubdur bu sevən,
Elədim qəlbimə həmdəm qəmi mən...
Bazara indi çəkib qüssəmi mən
Sataraq qüssə büsat almalıyam.

Ey sevənlər, ürəyim şad oldu,
Deyəsən sevgidən imdad oldu.
Acı sözlər dilimə yad oldu.
Dilimə qəndü nabat almalıyam.

Bağibanəm, məni bülbül gördün,
Əvəzində tikanın gül gördün...
Məni hərçənd ki, sən öldürdün,
Səni mən sağ-salamat almalıyam.

Şahinəm, fırlanıram dövrəndə,
Görürəm taleyimi tək səndə,
Qara bir buğda bitib çöhrəndə,
Neçədir qiyməti, sat, almalıyam.

*Lənkəran, 4.11.1999*

## SÖZÜMÜ DÖYƏCƏYƏM

Qabağında lal kimi
Gözümü döyəcəyəm.
Bu gündən qaval kimi
Dizimi döyəcəyəm.

Dilim, sevgilim, çaşıb...
Mən hara, söyüş hara?
Boğazımdan yapışıb
Qaldırmasam da dara
Özümü döyəcəyəm.

İzim üstdə izin yox,
İzi ikimizin yox.
Bağımda yetimləşən,
Qədəmindən gen düşən
İzimi tapdalayıb,
İzimi döyəcəyəm.

Ürəyimdə bir kobud
Söz demişəm dalınca,
Qınamışam səni mən.
Hünəri varsa, çıxsın



Həmin söz ürəyimdən,
Dilimə gələn kimi
Sözümü döyəcəyəm.

*Quba, 17.11.1999*

## ONA

Hər ağrı, ey nazənin,
Canından kənar olsun.
Yoxluğum isə sənin
Canını ağrıdacaq,
Qoy o ağrı var olsun!

*20.11.1999*

## BIR QƏDƏR IZTIRAB ÇƏKMƏYIM GƏLIR

*Gənc şair Şərif Ağayara*

Sükut istəyirəm... Səs o qədər ki...
Bir qədər iztirab çəkməyim gəlir.
Kef çəkmək istəyən kəs o qədər ki...
Bir qədər iztirab çəkməyim gəlir.

Bu gün acığına kef çəkənlərin,
Fərəh bazarından nəf çəkənlərin,
Iztirab önündə səf çəkənlərin
Bir qədər iztirab çəkməyim gəlir.

Ey vətən satanlar, oba satanlar,
Ey nənə satanlar, baba satanlar,
Qeyrəti bir bürünc qaba satanlar,
Bir qədər iztirab çəkməyim gəlir.

Babək ölüb getdi, Bəzzə nə var ki?
Hörmətə nə var ki, izzə nə var ki?
Sevincə nə var ki, həzzə nə var ki?
Bir qədər iztirab çəkməyim gəlir.

Mərdi qətiyyətdən uzaq görəndə,
Imkanı niyyətdən uzaq görəndə,
Şeri şeriyyətdən uzaq görəndə
Bir qədər iztirab çəkməyim gəlir.

Gördüm ki, düşərək izinə yarın,
Yarım bərabərdir yüzünə yarın,
Qəm tozu qonanda üzünə yarın
Bir qədər iztirab çəkməyim gəlir.

Yarpaq altındakı gül iztirabı,
Közün üstündəki kül iztirabı,
Oba iztirabı, el iztirabı...
Bir qədər iztirab çəkməyim gəlir.

Ürək talayırlar, bağ talamırlar,
Dilək talayırlar, dağ talamırlar,
Neçin əğyarları axtalamırlar?
Bir qədər iztirab çəkməyim gəlir.

Qəm cumur, dərd yağır gecəbəgündüz,
Həyat olur ağır gecəbəgündüz,
Efirdə çal-çağır gecəbəgündüz,
Bir qədər iztirab çəkməyim gəlir.

Şəhərdə çox dəli qəhəri atıb,
Qüssəni tərk edib, kədəri atıb,
Kəndə gedəcəyəm şəhəri atıb,
Bir qədər iztirab çəkməyim gəlir.

Sinəmdə dağım var, sinəm dağa - yar,
Kimdə bu dağ varsa deyil ağa - yar,
Sonu xeyir olsun, Şərif Ağayar,
Bir qədər iztirab çəkməyim gəlir.

Aparın Şahini iztirab sarı,
Hər başa yağmayır iztirab qarı,
Mənə çox görməyin iztirabları,
Bir qədər iztirab çəkməyim gəlir.

*23.12.1999*

## FATIMƏLƏŞDİ...

O qədər Fatimə dedi ki, dilim,
Şerim də, sözüm də Fatimələşdi.
Eşidib əzmini mənim sevgilim
Elə bil əzmdə Fatimələşdi.



Peyğəmbər dürrüydü... fədakar olub...
O dürrə məlahət, iffət yar olub...
Onun dözümündən xəbərdar olub
Analar dözümdə Fatimələşdi.

Həm acı ötübdür ömrü həm şirin...
Andıqca onu mən dərindən-dərin
Önümdə gördüyüm bu gözəllərin
Hamısı gözümdə Fatimələşdi.

*2.01.2000*

## AĞLADIM

*"Ömrün yükü qara günmüş bələkdən,*
*Qara günə endirib baş ağladım".*
**Ədalət Əsgəroğlu**

Qail oldum sənlə aza-çoxa mən,
Büküldü bel, ağardı baş, ağladım.
Ağlamazdım toxunsaydım oxa mən,
Ayağına toxundu daş, ağladım.

Muncuq kimi calasa da gün günə,
Yarım, yarı olmayanın günü nə?
Qiyyə çəkdim özgəsinin gününə,
Öz günümə yavaş-yavaş ağladım.

Aləm niyə eşq nuruna bürünmür?
Bivəfalıq yaşmaqlanmır, ərinmir,
Yeni Leyli, yeni Məcnun görünmür,
Aşiqlərdə görüb təlaş, ağladım.

Şair, ağla, öz əlindi, öz başın,
Yarım, məni dərdə saldı göz-qaşın,
Gözün dedi nə az imiş göz yaşın?
Gözün ilə edib savaş, ağladım.

Şahin, neçə şəhərimi itirdim...
Gör başıma necə oyun gətirdim:
Qarabağı verib ülgüc götürdüm,
Bığlarımı edib təraş, ağladım.

*9.01.2000*

## TƏNHA ÇINAR AĞACI

Bir qır səki,
Bir də ki,
Tənha çinar ağacı.

Gərək bağda bitəydin,
Çinarlar arasında
Tənhalığın itəydi,
Tənha çinar ağacı.

Yarpaq gözlərin ilə
Həmişə boylanırsan.
Deyəsən yanındakı
Evi çinar sanırsan,
Tənha çinar ağacı.

Yox, bu ev çinar deyil,
Çinarın damı olmaz.
Çinarın meyi olmaz,
Qədəhi-camı olmaz,
Tənha çinar ağacı.

Bu evin divarı var,
Çinar divarlı olmaz.
Içində nigarı var,
Çinar nigarlı olmaz,
Tənha çinar ağacı.

Tənhalıq yaman imiş,
Nigar da tək olmasın.
Ah imiş, fəğan imiş,
Çinar da tək olmasın,
Tənha çinar ağacı.

Gərək bağda bitəydin,
Çinarlar arasında.
Tənhalığın itəydi,
Tənha çinar ağacı!
Tənha çinar ağacı!

*12.01.2000*



## GÖZLƏRINI SOYUNDUR

Demədim ki, üryan ol,
Adəmin Həvvası tək
Qabağımda soyun, dur.
Fəqət ricamı eşit:
Gizləmə gözlərini,
Çək kiprik çəpərini,
Qaldır göz qapağını,
Gözlərini soyundur.

*13.01.2000*

## ÜÇ VƏZNLI BIR ŞER

Məni bihuş eləyibdir yenə məst uyğu gecə,
Yuxu gördüm bu gecə.
Giryan oldum oyanıb mən, bu gözümdür, bu da su,
Olacaqdırmı həqiqət bu yuxu?

Gördüm ki,
cızmaqara yazanlar
sındırıblar qələmlərini,
pulları da yoxdur ki,
təzə qələm alsınlar.
(Onlar gərək
əqlə gələrək
şer gülşəninə
fəhmlə
nəzər salsınlar,
deməsinlər qaraya ağ,
qara ağa,
bir də başlamasınlar
cızmaqara yazmağa.
"Məcməüş-şüəra" şairi
Mir Cəlal Zəki demişkən
"bu bədbəxtlər
bilməyirlər ki,
bilmirlər).

Sonra gördüm vətənim azad olub
Və adamlar şad olub.

Qarabağın qara bəxti ağ şəfəqə boyanıb,
Kişilərin bığı çıxmır, bığ tükləri dayanıb...

Bidar oldum, bu gözümdür, bu da su,
Görəsən varmı ümid ki, ola gerçək bu yuxu?

*16.01.2000*

## ALÇAQ BÖYÜKLƏR, YALTAQ ŞAIRLƏR

Böyüklər nə üçün alçaq olublar?
Dağlara nə oldu təpəyə döndü?
Şairlər nə yaman yaltaq olublar,
Dalğalar kiçilib ləpəyə döndü.

Bədlər bu millətin başı üstdə yük,
Elə insanlara lənət təbii.
Vicdanlı böyüyə ehtiram böyük,
Vicdanlı şairə hörmət təbii.

Varmı, Xətaim tək bir böyük hanı?
Fətəli xanım tək mahir görünmür.
Dərisindən ötrü didər cahanı,
Dərisi soyulan şair görünmür.

Böyük Uzun Həsən ölkə alardı,
Indiki böyüklər ölkə dağıdır.
Əvvəlki şairin qüruru vardı,
O indi ölkənin baş yaltağıdır.

Indiki böyüklər min fənd-felli,
Bu gün nə Cavanşir, nə Cavad xan var.
Sabir "Hop-hop" yazdı sübut-dəlilli,
Indiki şairlər "Gop-gop" yazırlar.

Böyüklər görür ki, bəhəri şirin
Sərvət ağacının, var ağacının.
Boynu öpülməyir daha şairin
Sabunlu ipiylə dar ağacının.



Böyüklər nə üçün alçaq olublar?
Dağlara nə oldu təpəyə döndü?
Şairlər nə yaman yaltaq olublar,
Dalğalar kiçilib ləpəyə döndü.

*20.01.2000*

## MƏLƏK GÖRÜNMƏZ

Bürüdü alağ bağı,
Neçin çiçək görünməz?
Sinəmdə fərağ dağı!
Daha dilək görünməz.

Aşiqinəm tək sənin,
Mənimmi? Ürək sənin!
Əl mənim, ətək sənin,
Əl var, ətək görünməz.

Çıxmayırsan üzə sən,
Gəlməyirsən bizə sən,
Görünmürsən gözə sən,
Dedi: - Mələk görünməz!

*1.02.2000*

## CAVAB QALDI QIYAMƏTƏ

Ya Ilahi, sözüm haqmı?
Bu dünyada
"doydum" deyən olacaqmı?
Əgər tapsa
Adam badam yeməkdədir,
Torpaq adam yeməkdədir,
Torpaq yeyən olacaqmı?

Doğrudanmı sənin əlin
Qurduğunu dağıdacaq,
əkdiyini biçəcəkdir?
Doğrudanmı nə zamansa
bizim ulu yer kürəmiz
göyün həzmi-rabesindən
keçəcəkdir?
Elə isə
düzü, dağı

bəs nə üçün yaratmısan?
Ya Ilahi, bu torpağı
bəs nə üçün yaratmısan?
O şəhəri, bu şəhəri
bəs nə üçün yaratmısan?
O günəşi, bu qəməri
bəs nə üçün yaratmısan?
O zamanı, bu zamanı
bəs nə üçün yaratmısan?
Laməkansan,
Sən məkanı
bəs nə üçün yaratmısan?

Deyəsən mən
Allah ilə
başlayıram siyasətə?
Suallarım elə çox ki...
Cavab qaldı qiyamətə.

*5.02.2000*

## ÜÇ SUAL

Sellər Saranı aldı,
Dəryanın günahımı?

Məcnun vüsalsız qaldı,
Leylanın günahımı?

Şahin cavan qocaldı,
Dünyanın günahımı?

*8.02.2000*

## GÖZÜN QAŞDAN YUXARI

Gəl daha savaşmayaq,
Həddimizi aşmayaq,
Bircə anlıq sülhümüz
Min savaşdan yuxarı,
Başın içindəsə də,
Ağıl başdan yuxarı.



Əzizim, həmişəlik
Gözünü gözümə dik,
Mən gözünün vurğunu,
Mən gözünün məftunu,
Qurban olum gözünə,
Gözün qaşdan yuxarı.

*9.02.2000*

## DAŞI - BU DAŞI DAŞI

Yer kürəsi daş kimi,
Daşı bu daşı, daşı.
Ol ona sirdaş kimi,
Daşı - bu daşı daşı.

Rahatlığı tərk olub,
Üzü yaman bərk olub...
Üstü-başı çirk olub,
Qaşı bu daşı, daşı.

Bəşər ilə əlbir ol,
Qafil olma, mahir ol,
Daşımağa qadir ol,
Naşı, bu daşı daşı!

*18.02.2000*

## QƏZƏLƏ MƏN HAKIMƏM!

Xam bir “qəzəlxan” səsi...
“Qəzəl”ə tuş olmuşam.
Xəzəldəndi gülləsi,
Xəzələ tuş olmuşam.

Üzdə həya təri yox,
Sözdəsə kəsəri yox...
Qələmdən xəbəri yox
Bir ələ tuş olmuşam.

O nəçidir, mən kiməm?
Qəzələ mən hakiməm!
Şahin, eləmirəm qəm,
Əfələ tuş olmuşam.

*24.02.2000*

## ÖLÜYƏ MƏZAR - ÇARA

Ulu Tanrı, bu da mən,
Qoyullam tabuta mən...
Səndən qeyri yox bilən
Yaşım neçə olacaq.

Çiyin yükü, əl yükü...
Daşıdım gözəl yükü,
Içində qəzəl yükü,
Başım necə olacaq?

Ölüyə məzar - çara,
Göməcəklər məzara...
Ağ olacaq, ya qara?
Daşım necə olacaq?

*26.02.2000*

## MIRVARI QARININ MIRVARI SUYU

Yox dövləti, sərvəti,
yox varı,
Çox sadəlövh qarıdır
bu qarı.
Kasıblıq ucbatından
salmayıbdır boynuna
mirvari ömür boyu,
Di gəl ki, gözlərindən
gəlir mirvari suyu.
Həkiminə söylədi:
- Əgər yığıb qurutsam
Gözlərimdən süzülən
mirvari suyunu mən,
Həkim, başına dönüm,
mirvari olar görən?

*28.02.2000*



## QOYUN MƏNI BU AĞACLA DANIŞIM

*"Uruz dedi: "Ay kafirlər, amandır,*
*Qoyun məni bu ağacla danışım".*
**Kitabi-Dədə Qorqud,**
**Bakı, 1988, səh.146.**

Ey insanlar, bezib sizdən qaçan dəm
Qoyun məni bu ağacla danışım.
Daha sizlə danışmaq istəmirəm,
Qoyun məni bu ağacla danışım.

Sənsən açan, Yarəb, bir kitab kimi,
Insana yox, ağaca aç qəlbimi,
Qırmayacaq mənim ağac qəlbimi,
Qoyun məni bu ağacla danışım.

Yerə baxıb, göyə dikib gözünü,
Öz dibinə bənd eləyib özünü...
Kəsmir ağac danışanın sözünü,
Qoyun məni bu ağacla danışım.

Ürəyini yada aça bilməyir,
Xəyal kimi göyə uça bilməyir,
Qaçqınlar tək ağac qaça bilməyir,
Qoyun məni bu ağacla danışım.

Budaqların əyrisi var, düzü var,
Yarpaqların əllisi var, yüzü var...
Ağacın da bəlkə mənə sözü var,
Qoyun məni bu ağacla danışım.

Həsrətimi mən bilirəm, o bilir,
Xiffətimi mən bilirəm, o bilir,
Söhbətimi mən bilirəm, o bilir,
Qoyun məni bu ağacla danışım.

Açacağam torpağına dərdimi
Yazmasam da yar bağına dərdimi.
Deyəcəyəm yarpağına dərdimi,
Qoyun məni bu ağacla danışım.

Deyəcəyəm ona meyin dərdini,
Həzin-həzin dinən neyin dərdini,
Bu mühitin, yerin, göyün dərdini,
Qoyun məni bu ağacla danışım.

Aləm bildi, qəlbim riya bilmədi,
Işığını şerim yaya bilmədi,
Sirdaşlarım məni duya bilmədi,
Qoyun məni bu ağacla danışım.

Duyan yoxdur Şahinin nisgilini,
Əcəl yuyur ömrümün sahilini,
Öyrənmişəm ağacların dilini,
Qoyun məni bu ağacla danışım.

*Quba, 24.04.2000*

## DARIXIB YAZDIĞIM CIZMAQARA

Yorğunluqdan bezmişəm,
Durğunluqdan bezmişəm,
Əməl gözləyir məni.

Mənə ümid edərək
Tərtəmiz, saf bir mələk -
Qəzəl gözləyir məni.

Gethagetdi, gəlhagəl,
Gözləyirəm mən - əcəl,
Əcəl - gözləyir məni.

*11.05.2000*

## BƏBƏK ÇÜRÜMÜR NIYƏ?

Füləyir tütəkçalan,
Tütək çürümür niyə?
Göz yaşıma qərq olan
Bəbək çürümür niyə?



Ləçəyinə meh enib,
Qırov düşüb, şeh enib...
Üstü yenə şehlənib,
Çiçək çürümür niyə?

Yar məni eşitməyir...
Fəğan niyə bitməyir,
Güman niyə bitməyir,
Dilək çürümür niyə?

Şahin tək üzgünmüsən?
Düzmüsən, düzgünmüsən?
Ürəyimi üzmüsən,
Ürək çürümür niyə?

*14.05.2000*

## INSAN DƏYIŞMƏSƏ DÜNYA DƏYIŞMƏZ

*Asif Ataya!*

Niyə hey "təzələn", hey "dəyiş" deyir,
Insan dəyişməsə dünya dəyişməz.
Neçin bu gerçəyi şair bilməyir,
Insan dəyişməsə dünya dəyişməz.

Taqəti yoxalır yerin get-gedə,
Hücumu çoxalır şərin get-gedə,
Pisi çox, yaxşısı az görünmədə,
Insan dəyişməsə dünya dəyişməz.

Hicranla döyüşmək istəməyirlər,
Şeytanla söyüşmək istəməyirlər,
Insanlar dəyişmək istəməyirlər,
Insan dəyişməsə dünya dəyişməz.

Vüsalın axırı fəraq deyilmi?
Hər xilqət aləmdə qonaq deyilmi?
Ömür insan üçün sınaq deyilmi?
Insan dəyişməsə dünya dəyişməz.

Qan axıb eləyir əlvan dünyanı,
Başına götürür əfğan dünyanı,
Dəyişmək istəmir insan dünyanı,
Insan dəyişməsə dünya dəyişməz!

*8.06.2000*

## MƏNƏ “OYAN” DEYIR GECƏ YARISI...

*Mənim qarlı yaşım, mənim qış yaşım -*
*Altmış yaşım.*
*Mənim çal saqqalım, ağarmış başım -*
*Altmış yaşım.*

Qadınlar get-gedə uzaqlaşırlar,
Könül o yarları bu yara çəkmir.
Onların içində bircəsi də var,
Məndən yaxasını kənara çəkmir.

Ayrıla bilmirəm ondan özüm də,
Özüm də sevirəm onu dəli tək.
Mənim qəzəlimdə, mənim sözümdə
Hər dəm cilvələnir o məsum mələk.

O, mənim cismimə, canıma girib!
Mənə “oyan” deyir gecəyarısı.
Bir də görürsən ki, yanıma girib
Təbimə yan deyir gecəyarısı.

Tez-tez pıçıldayıb mənim şerimi
Sərəncam eləyir əncam pərisi.
Özü də gözəldir ilahə kimi,
Adı da gözəldir: Ilham pərisi!

Şahini pərisiz görməyəcəklər,
Buna var qəlbimin inancı mənim.
Qələm nə yazıbsa bu vaxta qədər
Zəhməti onundur, qazancı mənim.

Qadınlar get-gedə uzaqlaşırlar,
Könül o yarları bu yara çəkmir.
Onların içində bircəsi də var,
Məndən yaxasını kənara çəkmir...

*10.07.2000*



## MÜDAM HICR AĞACI ÇIÇƏKLƏYIRSƏ...

Görübsən dumanla çəni birgə sən,
Amma, duman ayrı, çən isə ayrı.
Sən mənim qəlbimdə mənlə birgəsən,
Həyatda mən ayrı, sən isə ayrı.

Müdam hicr ağacı çiçəkləyirsə,
Fikrini bu aşiq çox hədər çəkir.
Ayrılıq nə qədər uzun çəkirsə,
Eşqin sərinliyi o qədər çəkir.

“Sevirdim”, “Sevmişəm”, “Sevirəm” demə,
Bu sevgi olmadı, qüssə, qəm oldu.
Daha od eşqimə ümid eləmə,
Eşqim soyuqluqdan sətəlcəm oldu.

*12.08.2000*

## SƏNI SEVDIYIMI DEMƏ HEÇ KIMƏ

*“Qoy sənə sevgimi təkcə mən bilim,*
*Təkcə mən eşidim bu sözü səndən”.*
**Ismayıl Öməroğlu**

Sözüm görünməsin sənə bayağı,
Səni sevdiyimi demə heç kimə.
Açma sirrimizi sandıq sayağı,
Səni sevdiyimi demə heç kimə.

Sevincək halımı zar eləsən də,
Olmayan qəmimi var eləsən də,
Bilib hər sirrimi car eləsən də,
Səni sevdiyimi demə heç kimə.

Bu haray-həşirdə, çək-çevirdə mən
Məna görmədəyəm fəqət sirrdə mən.
Bircə Allah bilir, bir sən, bir də mən,
Səni sevdiyimi demə heç kimə.

Hər ləhzə sevginin onu quruyur,
Əvvəli- yamyaşıl, sonu - quruyur...
Aşiq xəzinə tək onu qoruyur,
Səni sevdiyimi demə heç kimə.

Ayı da sevən var, günü də sevən,
Dumanı da sevən, çəni də sevən,
Səni də sevən var, məni də sevən,
Səni sevdiyimi demə heç kimə,
Heç kimə!

*20.09.2000*

## SÖZ QÖNÇƏMI ÇIÇƏK ETDIM

O dərya önümə çıxdı,
Üzməyə imkanım oldu.
Bu zirvə bir adamlıqdı,
Bu zirvə meydanım oldu.

Sanmayın savaş kəsildi -
Gözlərimdən yaş kəsildi...
Hardasa bir baş kəsildi
Sızıldayan canım oldu.

Söz qönçəmi çiçək etdim,
Bir qamışı tütək etdim,
Torpağımı döşək etdim,
Buludlar yorğanım oldu.

*1.10.2000*

## YALANÇI

Dünyaya "beşgünlük" deyən yalançı,
Onda sənin ömrün
bir saniyənin
mindən biridi...
...Yalançı adam
Sözümü eşidib susdu,
kiridi...

*3.10.2000*



## DAYANACAQLAR

Yaşım altmış!
Arxamda
yaz,
yay,
payız,
qış.
Keçmişəm üç dayanacaqdan:
yaz dayanacağından,
yay dayanacağından,
payız dayanacağından...
Eh, illər ötüb,
fəsillər ötüb...
Ömrümün yazı harda,
yayı harda,
payızı harda...
Dayanmamışam dayanacaqlarda,
çiçək də, qar da görmüşəm,
Şahin kimi, fazil kimi
ömür sürmüşəm.
Bundan sonra
dayanmağa
nə var axı?
Önümdə dayanıb
son dayanacaq -
qış dayanacağı!

*5.10.2000*

## QOÇ ILI

Min doqquz yüz qırxıncı ildə,
əjdaha ilində
qoç bürcündə,
bahar fəslində,
Fazil nəslində
doğulmuşam.
Təbiətcə,
xislətcə
qoç olmuşam.
Amma,

qoç ilində doğulanların
hamısı qoç deyil ki...
Qoç olmaq
çoxusundan ötüşüb,
mənim bəxtimə düşüb.
Xislətim
tez-tez özünü zahir edir...
Qoçluğum təzahür edir
Və alçaqlarla,
yaltaqlarla,
ağlı dayazlarla,
qafiyəpərdazlarla
gəlirəm kəllə-kəlləyə.
Amma buynuzlarım yoxdur,
Amma deyən var ki,
içəridədir onlar.
Qoy olsunlar,
buynuzlarım
içəridən möhkəmlədiblər beynimi,
başımı başlara vururam
qoç kimi.
Buynuzlarım
olmasaydılar əgər
beynim dözməzdi bu qədər
kəllə-kəlləyə,
dağılardı bir anda -
alçaqlarla,
yaltaqlarla,
ağlıdayazlarla,
qafiyəpərdazlarla
dalaşanda.
Kimsənin önündə
mümkün deyil
müti-müti əyiləm,
Qoçam,
mən qoyun deyiləm!

*6.10.2000*



## ŞAHIN HEYKƏLI

Şahin nəzərlərim seyr eyləyərək
Göyə heyran-heyran baxır haçaqdır.
Günlərin bir günü açıldığı tək,
Günlərin bir günü qapanacaqdır.

Məzarım deyəndə mənə "xoş gəldin",
Qoymayın üstünə hər daş heykəli.
Asimanı süzən heykəl dikəldin,
Şahin heykəli,
Bir quş heykəli.

*14.10.2000*

## XOŞLADIM

Bulağın, çeşmənin
Gözünü xoşladım.
Gözəlim, mən sənin
Özünü xoşladım.

Gəlməsin hicranın,
Olmasın əfğanın,
Düşünmə cananın
Yüzünü xoşladım.

Sözlüsən, ey nigar,
Sözün altda söz var,
Odun üstdə köz var,
Közünü xoşladım.

Ey nuru gözümün,
Əzbəri sözümün,
Yanında izimin
İzini xoşladım.

Aləmə yay nuru,
Ver bizə pay nuru,
Üzündə ay nuru,
Üzünü xoşladım.

Olmuşam heyranın,
Et məni qurbanın,
Şahinəm, peymanın
Düzünü xoşladım.

*21.10.2000*

## GÜNƏŞƏ ALQIŞ DE

Yuyuram üzümü
Yağışla, yağışla.
Deyirəm sözümü
Baxışla, baxışla.

Əhdimiz - saf əməl,
Unutsam, ey gözəl,
Deməρəm məni gəl
Bağışla, bağışla.

Vəslə çək darağı,
Səslə, çək darağı,
Hicranı, fərağı
Qarğışla, qarğışla.

Ömrü "çən almış" de,
"Arxada qal qış" de,
Günəşə alqış de,
Alqışla, alqışla.

Ey ömrün büsatı,
Şahinin nicatı,
Eşq ilə həyatı
Naxışla, naxışla.

*22.10.2000*

## MƏHƏBBƏT

Məhəbbət gərəkdir
Sənə də, mənə də.
Hey ürək-dirəkdir
Sənə də, mənə də.

Adəmdən soraqdır,
Həvvadan çıraqdır,



Arxadır, dayaqdır
Sənə də, mənə də.

Məhəbbət nicatdır,
Şəkərdir, nabatdır,
Bir şirin həyatdır
Sənə də, mənə də.

Xülyalı ömürdür,
Sevdalı ömürdür,
Mənalı ömürdür
Sənə də, mənə də.

Solmaz bir çiçəkdir,
Ölməz bir diləkdir,
Ömürlük bəzəkdir
Sənə də, mənə də.

*23.10.2000*

## SUS!

Qəbristana gələndə
qəlbini fəryada sal,
sus.
Altında
baş daşlarının
susanları
yada sal,
sus!

*27.10.2000*

## ƏGƏR GÜCLÜ YAZSA...

Qələmin
əlimdə
başı aşağı,
Yazır neçə vaxtdır,
yazır haçaqdır.
Əgər güclü yazsa,
sərv sayağı
Başımı
yuxarı qaldıracaqdır.

*29.10.2000*

## BINƏVA QAÇQINLARA!

*"Qara-qara qarışqalar*
*Kəpənəyi neylədiniz?"*
**Ramiz Rövşən**

Bağçanızda tənək vardı,
O tənəyi neylədiniz?
Tövlənizdə inək vardı,
Siz inəyi neylədiniz?

Üzüm qaldımı tənəkdə,
Dözüm qaldımı inəkdə?
Əkdiyiniz biçənəkdə...
Biçənəyi neylədiniz?

Şuşadadı, Laçındadı
Dağın dadı, daşın dadı...
Düşmən ocaq başındadı,
Dəyənəyi neylədiniz?

*30.10.2000*

## QƏRIBƏ ALƏM

Qəribə aləmdir
bu aləm:
Mən -
mənim deyiləm.
Ürəyim -
gözəl qəzəlin
yanında,
Əqlim -
elm məkanında,
Könlüm -
kitabda, dəftərdə,
Əlim -
Tanrıma dua üçün
göylərdə,
Ayağım -
məscidlə meyxanə



arasında,
Əksim -
ey sevgilim,
gözünün qarasında...
Qəribə aləmdir
bu aləm:
Mən -
mənim deyiləm.

*1.11.2000*

## QƏBRI BƏY PALTARI TƏK...

Göy təki göyqurşağı
Geyəcəyəm əynimə.
Adəm olub, yarpağı
Geyəcəyəm əynimə.

Şumer şərafətini,
Hunun cəsarətini,
Oğuzun qeyrətini
Geyəcəyəm əynimə.

Sədaqətdən don biçib,
Ləyaqətdən don biçib,
Onları on-on biçib
Geyəcəyəm əynimə.

Bağda dərib süsəni,
Nərgizi, yasəməni,
Dağda dumanı, çəni
Geyəcəyəm əynimə.

Dəfnim vaxtı, ey fələk,
Demə "gora gedəcək".
Qəbri bəy paltarı tək
Geyəcəyəm əynimə.

*4.11.2000*

## LALƏ ŞÖVKƏT

Gözlərində
gerçəkliyimizin eynəyi,
Ürəyində
dərdlərimizin göynəyi...
Şöhrət şövqü ilə
məst deyil,
Vəzifəpərəst deyil.
Yenilməz övladdı.
Sınar, amma əyilməz,
Poladdı.
Ucalıqda
Şahdağa təndi.
Alçaqlara, yaltaqlara
düşməndi.
Loğmandı,
həkimdi.
Amalı əyri-üyrü deyil,
müstəqimdi.
O, bəzi başlara ağrı,
bəzi çiyinlərə yükdü.
Qaməti
qeyrətindən,
Qeyrəti qamətindən
böyükdü.
Işi vətənə, xalqa
sədaqət işidi.
Qadınsa da,
qadın deyil,
Kişidi!!!

*5.11.2000*

## NARAZIDI BAĞBAN SƏNDƏN

Deməsinlər qoca mənə,
Meyl qalır, imkan qalır.
Eşq ucadan uca mənə,
Kim ki sevir cavan qalır.

Hicr anının itməsinə,
Hicranımın bitməsinə,
Xoş vüsalın yetməsinə
Ürəkdə min güman qalır.



Aman, fələk, aman səndən,
Kam almadı bu can səndən,
Narazıdı bağban səndən,
Gül tez solur, tikan qalır.

*8.11.2000*

## EY QƏLƏM!..

Bugünkü şerimin
var sabahı,
Öldüyüm gündən sonra da
sabahım olacaq.
Amma,
nə savabım görünəcək,
nə də günahım olacaq.
Ey qələm,
Xoşbəxtəm!

*11.11.2000*

## MEŞƏ NISGILIMƏ ÇOMAQ ÇƏKMƏDƏ

*Şair Iltifat Salehə*

Uduram havanı tamarzı kimi,
Yellər tellərimə daraq çəkmədə.
Dəniz təmizləyir ciyərlərimi,
Meşə nisgilimə çomaq çəkmədə.

Döysə də yağışlar izimi mənim,
Oxşayır gözəllik gözümü mənim.
Dinləyir dostlarım sözümü mənim,
Sözün ləzzətini qulaq çəkmədə.

Qaraya göz qoyma, gözüm, say ağı,
Dəliydim, olmuşam sakit sayağı...
Mənim xəyalımı maqnit sayağı
O qaya çəkmədə, bu dağ çəkmədə.

Hərdən toxunsa da məlalın əli,
Məni sığallayır xəyalın əli,
Elə aşiqəm ki, vüsalın əli
Hicrin boğazına bıçaq çəkmədə.

Əgər iki şair həyatda birsə,
Sevinc daşıyırsa, ələm çəkirsə,
Bu Şahin Fazili qələm çəkirsə,
Iltifat Salehi varaq çəkmədə.

*Astara, 23.11.2000*

## MƏN FƏRAĞI ÖLDÜRMƏSƏM...

Öz odumdan, ocağımdan
Kim elədi uzaq məni?
Dönə bilsəm uzağımdan
Yandırmazmı ocaq məni?

Pəncərəmə daş gələrsə,
Canıma təlaş gələrsə,
Gözlərimə yaş gələrsə
Sanmasınlar uşaq məni.
Əl eləyir, Şahin, ələm,
Qoşun-qoşun gəlir dərd-qəm...
Mən fərağı öldürməsəm,
Öldürəcək fəğan məni.

*Lənkəran, 24.11.2000*

## BU NƏYDI BELƏ?

*Yuxumda gördüyüm aşiq*
*bir qız anasına deyirdi:*

"Məni xülyalardan çəkdi, ayırdı,
Anacan, görəsən bu nəycdi belə?
Əli ürəyimi sığallayırdı,
Ay aman, görəsən bu nəydi belə?

Indi şübhə etdim hesab dərsinə,
Elə bir edirmiş bir üstəgəl bir.
Daha inanmıram kitab dərsinə,
Bildim, iki müsbət mənfi deyildir.

Gözləsən qönçənin gülü var imiş,
Xəyal qönçəsinin gülü açıldı.



Bilməzdim, sükutun dili var imiş,
Anacan, sükutun dili açıldı.

Qar kimi əridi çöhrədəki qəm,
Gecəmi ağartdı gözün işığı.
Əzəl bilməyirdim, indi bilmişəm
Səsin rəngi olur, sözün işığı.

Gerçəyi gümandan soruşmusanmı?
Yaxşını yamandan soruşmusanmı?
Sən də öz anandan soruşmusanmı
"Anacan, görəsən bu nəydi belə?"

*7.12.2000*

## AYAĞININ ALTI MƏNƏ...

Zirvədə demirəm duman,
Yamacda demirəm çən xoş.
Görüm günə qərq olasan,
Xoş ol sən ki, olum mən xoş.

Düyün... Yaman işdi düyün,
Eşq ipinə düşdü düyün...
Gəldin dünən, getdin bu gün,
Dünənki gün bu gündən xoş.

Yaşayıram sönə-sönə...
Qədəmin bas dönə-dönə,
Ayağının altı mənə
Bu torpağın üstündən xoş.

*19.12.2000*

## TƏZƏDƏN EVLƏNƏK, YARIM, YENƏ BIZ

Sən ahıl yaşında, mən isə qoca,
Təzədən evlənək, yarım, yenə biz.
Ehtiyac olmaya iki balınca,
Bəlkə cavanlaşa yenə eşqimiz.

Bütün gözəllərin sən ağıllısı,
Mənsə eşq çölünün dəlisi idim.

Sən vüsal elminin ən ağıllısı,
Mən hicrin qansoran zəlisi idim.

Elə sanırdıq ki, ömür boyu, yar,
Sevda nemətinin dadı azalmaz.
Elə zənn edirdik günəş soyuyar,
Amma eşqimizin odu azalmaz.

Nə yaman əriyir hərarətimiz,
Nə üçün istimiz soyuqlamışdır?
Niyə qeyb edirik hərarəti biz,
Evdən sərinliyi süpür, yığışdır.

Neçin itiririk biz tabı belə,
Niyə hicran oxu vəslə olur tuş?
Demək, qocalığın əzabı belə,
Demək ixtiyarlıq belə olurmuş.

Sən ahıl yaşında, mən isə qoca,
Təzədən evlənək, yarım, yenə biz.
Ehtiyac olmaya iki balınca,
Bəlkə cavanlaşa yenə eşqimiz.

*31.12.2000*

## MƏN ILANA INANMIRAM!

*Bu gün Erkək Ilan ili başladı*

Arxada
Əjdaha ili,
Öndə
Ilan ili bu gün.
Arxada
Əjdaha dili,
Öndə
Ilan dili bu gün...
Ümidlərim
Olsa belə çəmən-çəmən,
Gümanlarım
Olsa belə taya-taya
Mən ilanı



həmdəm bilmir, yar sanmıram,
Inanmadım əjdahaya,
Ilana da inanmıram!

Yolum üstdə
Neçə ildir əqrəb qalxıb,
ilan durub.
Qardaş, məni əqrəb sancıb,
Bacı, məni ilan vurub,
Mən ilana inanmıram!

Neçə ildir
Aramıza rəxnə salıb
ilan dili,
şeytan əli...
Əli! Vəli! Qurbanəli!
Mən ilana inanmıram!

Ilan ili!..
Ulu Allah,
Olmasın bu Ilan ili
hiylə ili, riya ili,
böhtan ili - filan ili,
Ilan ili!..

Qoy olmasın
boş vəd ili,
xülya ili, yalan ili,
Ilan ili!..
Qorxaqları,
məddahları,
yaltaqları
qoy yalasın,
lap dalasın
ilan dili
Ilan ili!..

Ilan ili!..
Mən ilanı həmdəm bilmir,
yar sanmıram.

Lap ilanın qarasına,
ağına da lənət ola.
Lap ilanın ölüsünə,
sağına da lənət ola.
Mən ilana inanmıram!

Ilan ili!..
Mən ilanı həmdəm bilmir,
yar sanmıram.
Ulu Allah,
ara-sıra
kimin isə
nəvazişi olsa belə,
Erkək deyil
ilan dişi olsa belə
Mən ilana inanmıram,
Inanmıram!!!

*1.01.2001*

## RÜSTƏM KIMI

*Azadlıq carçılarımızdan olan Rüstəm Eminliyə*

Çöhrələrdə tər parlasın
Zəmzəm kimi.
Yol verməyək şər parlasın
Şəbnəm kimi.

Hanı işıq, hanı mayak?
Şəhidlərin qanı - mayak!
Hər Məcnunu tanımayaq
Sərsəm kimi.

Azadlıqçın tökək qanı -
Ləl tək qanı, dürr tək qanı,
Üzümüzə sürtək qanı
Məlhəm kimi.

Olmasa da güc ağlayaq,
Canımızda güc saxlayaq,
Istiqlalı qucaqlayaq
Həmdəm kimi.



Çəkilsə də oğul dara,
Qorxu hara, oğul hara?
Alqış ola oğullara -
Rüstəm kimi!

*18.01.2001*

## ZƏLZƏLƏDƏN QAÇAN KIŞI...

Zəlzələdən qaçan kişi,
Qorxaq kişi, dovşan kişi,
Qorxunun əlindən
əsir-yesir kişi,
Adın tutalım ki,
Məmmədnəsir kişi,
Hara qaçırsan?
Dünya fələyin gərdişidi,
Zəlzələ Allah işidi,
Fələyin gərdişindən,
Allah işindən
Hara qaçırsan?
Bacına, anana deyirsən
"qaçın, mən qaçdım",
Qardaşına, qaynanana deyirsən
"qaçın, mən qaçdım",
Hara qaçırsan?
Papağını evdə qoyub qaçırsan,
Başmağını evdə qoyub qaçırsan,
Hara qaçırsan?
Sağ qalıb
yenə düşəcəksən zillətə,
qərq olacaqsan illətə,
Nə verəcəksən millətə,
hara qaçırsan?
Ey qorxudan ürəyi para-para,
Yoxdur olacağa çara,
Gərəkmi
yer tərpənən kimi
qorxub qaçaydın?
Gərək
bığını da qırxıb qaçaydın,

Hara qaçırsan?
Tutalım
fələk sənin evini
yerli-dibli
yerindən sildi,
sənsə sağ qaldın,
Sağ qalıb neyləyəcəksən?
Tutalım
hamı öldü,
sənsə sağ qaldın,
Sağ qalıb neyləyəcəksən?
Tutalım
sənə Əzrayıl dedi "itil,
sağ qaldın,
Sağ qalıb neyləyəcəksən?
Tutalım
sənə və sən kimilərə
Dövlət Komissiyası
bir çadır verdi,
bir-iki mitil,
sağ qaldın,
Sağ qalıb neyləyəcəksən?
Var-dövlətin
daş altda qalacaq,
Sərvətin
daş altda qalacaq,
Əgər varsa
qeyrətin
daş altda qalacaq,
Sağ qalıb neyləyəcəksən?
əhli-əyalın yox,
malın yox,
pulun yox,
Olacaq bir çadır, bir həsir,
bir də sən Məmmədnəsir,
Sağ qalıb neyləyəcəksən?
Onsuz da qaçqınlarımız çoxdu,
köçkünlərimiz çoxdu,
didərginlərimiz çoxdu,
dərd-sərimiz çoxdu,



ümidimiz də qaçıb,
yoxdu,
Sağ qalıb neyləyəcəksən?

Ey qorxunun əlində
əsir-yesir kişi,
Məmmədnəsir kişi,
Ey zəlzələ qorxusundan
ölü qaçan diri,
Ey şairə Fərqanənin
"qırmızı kişi"
obrazlarından biri,
Qoyub evdə
oğulu, qızı
hara qaçırsan?
Belə qırmızı-qırmızı
hara qaçırsan?
Zəlzələdən qaçan kişi,
qorxaq kişi, dovşan kişi,
Fələyin gərdişindən,
Allahın işindən
Başından baş açırmı?
Zəlzələdən görəsən
yaponlar da qaçırmı?..

*23.01.2001*

## TƏZADLI FIKIRLƏR, TƏZADLI DAHI...

*"Ox, neçin o məni sevdi?*
*Mən istəyirdim ki, sevdiyim*
*məni sevməsin..."*

**Cəfər Cabbarlı**

Ilahi, nə üçün
sevdi o məni?
Istərdim sevdiyim
məni sevməsin...
Neçin sevməməli
sevən sevəni?
Sevgi diləyidir
axı hər kəsin.

Cabbarlı gözümün
önündə durur...
Eşq, sevgi, məhəbbət
nədir, Ilahi?
Təzad aləminə
məni uçurur
Təzadlı fikirlər,
təzadlı dahi.

Çox rəmzin insana
gerçəkliyi - sirr...
Görən nədir sevgi,
hayandadır haqq?
Üqba aləminin
gerçəkliyidir
Vüsala yetişmək,
haqqa qovuşmaq!!!

*3.02.2001*

## ŞAM

*"...Şama öz işığından nə fayda?"*
**Hacı Fərhad Mirzə**

Işıq gərək deyil şama,
Yanmasaydı - yaşardı.
Yanmasaydı - yaşamağa nə vardı?
Yandı - öldü.
Şam
öz bütöv vücudunu
işıq zərrələrinə böldü.
Yanmasıyla
biz qaranlıqda olanları
Işıqlandırmağı bacardı,
Yanmasaydı - yaşardı...

*8.02.2001*



## ILDƏN QORXMAYIMMI BƏS?

Göy yudu sellə yeri,
Seldən qorxmayımmı bəs?
Üzümdə şillə yeri,
Əldən qorxmayımmı bəs?

Saldı nəzər - gələnə,
Axşam, səhər gələnə,
Baxmada hər gələnə,
Güldən qorxmayımmı bəs?

Qəmgindi, şən ki deyil,
Şahin həmənki deyil,
Qocalıram ilbəil,
Ildən qorxmayımmı bəs?

*11.02.2001*

## RƏSSAMLAR KƏSSINMI QULAQLARINI?

Sən ey qeyrisini təqlid edən kəs,
Atdığın addımın izi - özgənin.
Əcnəbi sözlərə az elə həvəs,
Şer özünündür, sözü özgənin.

Olubdur hər dövrün ədəbi dili,
Bu gün "söz" yerinə söyləmə "süxən".
Sevməyə bilərsən Şahin Fazili,
Amma ana dili sevməlisən sən.

Söyləmə "Füzuli belə söyləyib",
Demə "Seyid Əzim yazıbdır belə".
Hərə öz dövrünün sözünü deyib,
Hərə öz gözüylə baxıb qəzələ!

Həmişə cəhd elə öz yolun üçün,
Artır öz sözünlə şer varını.
Van Qoqa bənzəmək naminə bu gün
Rəssamlar kəssinmi qulaqlarını?

*14.02.2001*

## SƏNƏ DEYƏCƏYIM SÖZLƏR

Kimdi bu?
Bir az atəş,
bir az su:
Bir az comərd,
bir az sərt:
Bir az nikbin,
bir az pərt:
Bir az nadinc,
bir az dinc:
Bir az əğyar,
bir az yar:
Bir az sərxoş,
bir az xoş:
Bir az sərməst,
bir az məst:
Bir az sirdaş,
bir az daş:
Bir az səmum,
bir az mum:
Bir az qaya,
bir az qum...
Görünürəm
bir az qəmgin,
bir azca da şən kimi...
Məni kimsə
tanımadı
mən kimi!..

*17.02.2001*

## DÜŞÜNCƏLƏR

*"Tarixdə iz qoyanlar" kitabının müəllifi Telman Orucova*

### 1. IÇ ÜZ, IÇ QAT

Əks eləyir güzgü
üzü,
Əks eləmir
əqli,
fikri,

qəlbi,
sözü...
Cəhd elədim olum güzgü -
canlı güzgü həyatımda.
Mənə baxıb gördüyünüz
surətimdir, üzüm deyil,
mənim üzüm
iç üzümdə,
iç qatımda.

### 2. QÜRRƏLƏNMƏ!

Ey hökmdar,
Sən özün də dövrün qulu,
elə mən də.
Yox təfavüt
bu baxımdan
səndə,
məndə!

### 3. QALIB GƏLƏN AYAQ

Çəkir məni
baş - göylərə,
ayaq - yerə.
Baş üstündə -
neçə göylər, asimanlar.
Ayaq altda -
gələcək bir məzarım var.
Baş da deyir mənə "yaşa",
Ayaq da söyləyir "yaşa",
Nəhayətdə
ayaq
qalib gəlir
başa.

### 4. BUSƏ VƏ VÜSAL

*"Məhəbbətlə verilən bir boşqab göyərti nifrətlə verilən kökəldilmiş öküzdən yaxşıdır".*
**Çar Solomon (miladdan əvvəl X əsr)**

Mənə məhrəm olmusan,
Irəli gəl,
utanma

Və mənə bir busə ver,
məhəbbətlə ver amma.
Məhəbbətli busəni
dodaq gülüstanından
dərməliyəm gül kimi,
çəkməliyəm çiçək tək,
Məhəbbətsiz olarsa
Vüsalın
deyil gərək!

### 5. MÖHÜR KIMI

*"Məni möhür kimi öz ürəyinin üstünə vur..."*
**Çar Solomon "Şərqilər şərqisi" poemasından**

Sən həyat vəsiqəm ol,
Qoru məhəbbətimi
inci kimi, dürr kimi,
Ilahi qüvvə ilə
sonra
yerdən götürüb
ürəyinin üstünə
vur məni
möhür kimi.

### 6. HƏYAT YOLU

"Gəl" yolu, "Get" yoludur
Həyat yolu
əzəldən,
Təvəllüdün mübarək,
Bu yola xoş gəlibsən,
Xoş doğulubsan, bala.
Yolçu yolda gərəkdir
yolçu bala, can bala.
Sən
yolun ucundasan,
sonunda mənəm bu gün.
Gəlibsən - yaşamağa,
Gedirəm - ölmək üçün.



### 7. TƏNASÜX[*], YAXUD CAVABSIZ SUAL

Baş verirmi tənasüx?
Gedən vardır, gələn yox!..
Ilahi canlandırıb
görən neçə yol məni?
Bacar buna cavab gəz...
Bədən gözə görünür,
ruhu isə görən yox,
amma idarə edir
Görünməz Görünəni,
Görünməzi Görünməz.

### 8. MIKELANCELO VƏ MƏN, YAXUD RƏSSAM VƏ ŞAIR

*Məşhur Mikelancelo Buanorotti (1475-1564) deyirdi ki, yaratdığım hər bir heykəl mənim gözümdən gəlib keçir...*

Gəlib söz,
gəlib misra,
gəlib bənd,
gəlib şer
Əşya kimi, cism tək
bir-bir keçir gözümdən...
Görürəm onları mən
sizi gördüyüm kimi,
Sonrasa
bircə-bircə
köçürürəm varağa
hər sözümü,
misramı,
bəndimi
və...şerimi.
Ey gözüm, döz,
hələ döz,

[*] Tənasüx - ölümdən sonra ruhun bir bədəndən digərinə keçməsi barədə dini-fəlsəfi təlimdir. Sokrat, Platon, neoplatonçular, habelə Nəcməddin Naxçıvani, Cəlaləddin Dəvvani tənasüxün mövcudluğunu qəbul etmişlər. Bu məsələyə ibn Sina, Bəhmənyar və Şəhabəddin Sührəvərdinin münasibətləri tənqidi və mənfi olmuşdur.

bütün ömür boyu döz,
Axı nə var dözməyə?
Belə ki,
rəssamların
gözündən heykəl keçir,
şairlərin isə
söz.

## 9. MƏNIM INAMIM

*"...Yuxarı qalxmağıma kömək et...
aşağı düşməyi mən özüm bacararam".*

**Edam vaxtı Tomas Morun
(1478-1535) Tauer qalasının leytenantından xahişi**

Oxuduqca Quranı
dəyişməz, dəyişilməz
inam yarandı məndə:
Sənsən fəqət, Ilahi,
yuxarı
qaldıran da,
aşağı
düşürən də!

## 10. DƏLI ŞAIR

*Ispan divara mıx vuranda əgər çəkici sınsa, o, bu mıxı öz başı ilə vuracaqdır.*

**Ispan zərb-məsəli**

Bu şair -
dəli şair,
Qeyzli, hikkəli şair...
Fikri-zikri,
niyyəti
yazmaqdır onun ancaq.
Işdi-şayəd
haçansa
qurtarsa mürəkkəbi,
Kəsib damarlarını
şeri son nəfəsədək



qanı ilə yazacaq.
Qeyzli, hikkəli şair.
Bu şair -
dəli şair!..

## 11. DƏMIR KIMI

Möhkəməm dəmir kimi,
uçuram şahin təki,
vuruşuram şir kimi...
Cahil hər qəzəlxanın
üstümə ünvanlanan
əyri sözü,
bəd işi,
Zəmanənin ziddimə
yönəldilən gərdişi
mənə təsir eləmir.
Həddən çoxdur deyəsən
mənim qanımda dəmir.

## 12. HÖKMDAR MƏHƏBBƏTI

*"1453-cü ildə Konstantinopolun (Istanbul - Ş.F.) mühasirəsi vaxtı Mehmetin (Sultan Məhəmməd Fateh - Ş.F.) paşalarından biri Irena adlı bir gözəl yunan prinsessasını gətirdi. Bu qız qalib sərkərdəni gözəlliyi ilə elə valeh etdi ki, sultan üç gün ərzində ondan böyük həzz aldı.Lakin bu vaxt baş verən böyük hadisələrdən də o öz diqqətini yayındırmırdı. Dördüncü gün yeniçərilər (Osmanlı ordusunda Avropa ölkələrindən əsir tutulmuş gənc oğlanlardan ibarət xüsusi qoşunların əsgərləri - Ş.F.) səs-küy saldılar və sultanın çadırının yanına gəldilər ki, onun davranışı ilə əlaqədar öz narazılıqlarını bildirsinlər. Mehmet zəhmli addımlarla onların qarşısına çıxdı və gözəl əsir qızı da əlindən tutub gətirdi. O, bu vaxt əlini birdən qızın saçlarında gəzdirib, qılıncını çıxardı və bir zərb ilə onun boynunu vurdu. Sonra qəzəblə dedi:"Sizin imperator məhəbbətlə belə davranır".*

Tiran
dərk edə bilməz
heç zaman məhəbbəti.
Məhəbbətlər

həmişə
adilərin nəsibi,
adilərin qisməti.
Hökmdarda ürək var,
hökmdarda qəlb hanı?
Bir anda eləyər zar
sevdiyi,
xoşladığı
insanı.
Eləyibdir təzahür
hər hansı bir tiranın,
şahın,
xanın,
sultanın
şanında, şövkətində,
gücündə, qüdrətində,
daim xəracda-bacda,
taxt-taca ehtiyacda,
şöhrətə hərislikdə,
sərvətə hərislikdə,
dövlət-varda məhəbbət,
Olubmu,
olacaqmı
hökmdarda məhəbbət?

*18-22.02.2001*



## MƏNI SEVGI YAŞADIR

Məndə sevgi yaşayır,
Məni sevgi yaşadır!
Sinəmdə yer tutubdur bu hiss
dərindən-dərin,
Sevgi - ən gərəklisi,
ən nəcibi hisslərin.
Amma,
istisna deyil,
gələ bilər elə gün,
İri tonqal sayağı
indi yanan məhəbbət,
alovlanan məhəbbət
Sönə bilər büsbütün.



Elə olsa,
həmin dəm,
həmin ləhzə,
həmin an
Gözlərimi əbədi
yumacağam dünyada,
köçəcəyəm dünyadan!

*14.03.2001*

## ŞERIN YARANMASI

Necə yaranır şer?
Gecə fikir,
gündüz fikir,
hey fikir...
Deməyin ki, nə xəbərdir,
nə həşirdir,
nə haldır,
Az fikir et,
fikir - ömrü qısaldır,
carçısıdır qocalığın -
qocaldır!
Qoy qocalım bu yolda!
Mən yola can atıram,
şer adlı arzu - yolda.
Çatmamışam hələ ona,
çatacağam deyəsən,
Gecə-gündüz fikr edirəm,
onu düşünürəm mən.
Hər qafiyə,
hər şer -
Axtarışdır,
Tapıntıdır,
Fikirdir!

*17.03.2001*

## YENƏ GÖRMƏKDƏYƏM NƏM BAXIŞINI

Ürəyim təzədən üzüləcəkdir,
De, niyə sarıbdır qəm baxışını?
Göz yaşın bu saat süzüləcəkdir,
Yenə görməkdəyəm nəm baxışını.

Gizləmə məlalı ürəyindəki,
Qıyma aşiqin də sənin zar olsun.
Qəmini gizləmə xəzinə təki,
Kədərin günəş tək aşikar olsun.

Üzümə qonubdur üzündəki qəm,
Mənim də ürəyim qəhərlənibdir.
Bütün çəpərlərin əleyhinəyəm,
Yenə kipriklərin çəpərlənibdir.

Azla aram yoxdur, bəllidir sənə,
Gözəlim, çox elə, çox, təbəssümü.
Iztirab yerinə, kədər yerinə
Heyf, dodağının yox təbəssümü.

Heyf, baxışının alovu sönüb,
Heyf, nəzərinin odu azalıb.
Bəxtimmi dəyirman daşı tək dönüb?
Çaram Allahamı yenə də qalıb?

Allahım, dərdimin əlacı səndə,
Yenidən sevindir o baxışları.
Aləm sevinəndə, hamı güləndə
Yağmasın üstümə qəm yağışları.

Həmişə tutmuşam mən ətəyindən,
Ilahi, əl mənim, sənindir ətək.
Yenə xoşhal elə bu gözəli sən,
Axı sən etməsən kim rəhm edəcək?

Atalar sözünə rəğbətim böyük:
Dəmi dəm gətirir, gülüm, qəmi qəm.
Mənə kömək elə, həsrətim böyük,
Yenə sevincinin həsrətindəyəm.

Şuxluğu gözündə, sözündə saxla,
Səni nikbin görüm yenə mən gərək.
Bütün sevincini özündə saxla,
Qəmini bağışla mənə tütyə tək.



Ürəyim təzədən üzüləcəkdir,
De, niyə sarıbdır qəm baxışını?
Göz yaşın bu saat süzüləcəkdir,
Yenə görməkdəyəm nəm baxışını;

*9.04.2001*

## HƏLƏLIK - HƏMIŞƏLIK

*Vahid Əhmədova*

Qonaqkənddən
qonaq gəldi
Bakıya,
Uzaq kənddən
uşaq gəldi
Bakıya,
Deyən oldu
nahaq gəldi
Bakıya,
Bakı onu
tanımadı
hələlik.
Bakıya çox
adam gəlir,
nə olsun?
Səhər gəlir,
axşam gəlir,
nə olsun?
Qonaqkənddən
salam gəlir,
nə olsun?
Bakı onu
tanımadı
hələlik.
Bakı ilə
ilk görüşün
adı qəm.
Sözü kədər,
tamı qüssə,
dadı qəm,
Qonaqkəndli
qonaq dedi:
Vahidəm!
Bakı onu
tanımadı

hələlik.

Elm öyrəndi
həyatda
zirək oldu,
Ilğırın idi
arzusu,
gerçək oldu,
Çox sahədə
VAHID oldu,
tək oldu,
Bakı onu
tanıdı
həmişəlik!

*11.04.2001*

## ÜRYAN ETDIM SINƏMI

Axdı gözümün nəmi
Bulağın olmaq üçün.
Üryan etdim sinəmi
Varağın olmaq üçün.

Nə var acı - fəraq tək?
Vüsalın təmtəraq tək!
Əlimi telinə çək,
Darağın olmaq üçün.

Yanımda, ey dilaram,
Nədir çıraq, nədir şam?
Özümü yandırıram
Çırağın olmaq üçün.

*17.06.2001*

## MƏCNUN DƏLI OLARDI...

Söz qiymətdən düşərdi
Mənaya getməsəydi.
Pərakəndələşərdi
Misraya getməsəydi.



Cövr bizə dərd edər,
Dər, gülü yox, dərdi dər...
Ləçək bağlayardı hər
Davaya getməsəydi.

Əli-Vəli olardı,
Bir ac zəli olardı,
Məcnun dəli olardı
Səhraya getməsəydi.

*19.06.2001*

## QOCALTDIN ŞAHINI, NAZIN NƏ XEYRI?

Həyatdan gözünü çəkən bir kəsə
Çoxun nə xeyri var, azın nə xeyri?
Nadanı qoymayın budağı kəsə,
Kəsilmiş budağa yazın nə xeyri?

Ətri uçubdursa güldən nə fayda?
Yar beli qucmursa əldən nə fayda?
Əgər çalınmırsa teldən nə fayda?
Teli qırılıbsa sazın nə xeyri?

Eşqi, məhəbbəti sözündə saxla,
Qəlbində itirsən gözündə saxla,
Gözəlim, nazını özündə saxla,
Qocaltdın Şahini, nazın nə xeyri?

*1.07.2001*

## BIR ANA AĞLAYIR MƏZAR BAŞINDA

*Şəkidə şair Qiymət Məhərrəmlinin anası Tükəzban ananın məzarı başında başıma dolmuş düşüncələr*

Nəzəri qəbirdə, məzar daşında,
Gözünə görünmür yarı, yoldaşı.
Bir ana ağlayır məzar başında,
Ana ana üçün tökür göz yaşı.

Bir ildir göyərib kədər ağacı,
Bir ildir həsrətdir bağça bağbana.
Bir ildir nisgili zəqqumdan acı,
Bir ildir uyuyur Tükəzban ana.

Keçən il hicranı pis gündə idi,
Gör ki, xoş vüsala fələk nə etdi.
Keçən il torpağın üstündə idi,
Keçən il torpağın altına getdi.

Mənə nəsib oldu görüş bir kərə,
Kəlməsi dürr idi, sözü cəvahir.
Ləhcəsi batmışdı sanki şəkərə,
Özü də şairdi, qızı da şair.

Cahan sirlə dolu, həyat müəmma,
Ömür cümləsinə nöqtə qoyuldu.
Bakıya neçə yol gəlmişdi, amma
Bu gəliş sonuncu gəlişi oldu.

Zəbt etdi vüsalın yerini fəraq,
Tanrının əbədi əcəl qanunu
Bu fani həyatdan aralayaraq
Ərinin yanına yolladı onu.

...Nəzəri qəbirdə, məzar daşında,
Gözünə görünmür yarı, yoldaşı.
Bir ana ağlayır məzar başında,
Ana ana üçün tökür göz yaşı.

*Şəki, Vərəzət kəndi,*
*29.07.2001*

## SAXLAYA BILMƏDIN ŞAHIN QUŞUNU

Turacdın, mən isə şahin quşuydum,
Vurğundum, bilmədin amma qədrimi.
Aşiqin ən çılğın vurulmuşuydum,
Sevən olacaqmı səni mən kimi?



Qapandı... Açılmaz məhəbbət qapım,
Heç duya bilmədin bu məhəbbəti.
Sənin şadlığınsa mənim əzabım
Hicran suyu ilə yu məhəbbəti.

Göyə uçmaq üçün mənə güc verən,
Uca ənginlikdən endirən də sən.
Məndə eşq odunu atəşləndirən,
Məndə eşq odunu söndürən də sən.

Daim anacağam səni, ey pəri,
Günahımı yuyan savab kimisən.
Mən - yarımçıq qalan sevgi dəftəri,
Sən - tam oxunmayan kitab kimisən.

Bunumu istədin?.. İndi alqışla
Şahin pərvazını, quş uçuşunu.
Sənin əllərindən uçmuşam daha,
Saxlaya bilmədin şahin quşunu.

*25.10.2001*

## DÜNYA ILƏ DAVA-DAVA OYNAYIR

Oyunu var yenə Şahin Fazilin,
Başı içrə min bir xülya oynayır.
Mat qalıbdır səbrinə lal sahilin,
Sahil sakit, amma dərya oynayır.

Aləm təzə, meyxanəsi köhnəlib,
"Leyli-Məcnun" əfsanəsi köhnəlib,
Füzulinin divanəsi köhnəlib,
Məcnun çalır indi, Leyla oynayır.

Gözlərimdə zamanın əksi vardır,
Izlərimdə məkanın əksi vardır,
Tək gülün yox, qumun da əksi vardır,
Külək coşan dəmdə səhra oynayır.

Rəqqasıyam irfan adlı sənətin,
Surət çətin, mənə ondan da çətin...

Mənası var qəzəlimdə surətin,
Surət içrə neçə məna oynayır.

Çoxu təzə ayaq atar şerdə,
Bilmirlər ki, möcüzə var şerdə,
"Təqlid rəqsi" oynayırlar şerdə,
Bu havaya cavan-qoca oynayır.

Ey həsədkar kimsənələr, bağırın,
İlhamınız varsa dada çağırın,
Şərəfinə neçə-neçə uğurun
Qəzəlimdə min-min misra oynayır.

Dayanmadan gündüz-gecə yol gedir,
Yorulmadan o bəs necə yol gedir?
İllər boyu bax beləcə yol gedir,
Vallah-billah qoca dünya oynayır.

Bilməm sonu nə olacaq Şahinin?
Hikkəsinə, qeyzinə bax Şahinin,
Fikri nədir axı uşaq Şahinin,
Dünya ilə dava-dava oynayır.

*7.11.2001*

## ŞAHIN FƏLƏK ILƏ NƏRD OYNAMADA

*"Fələk mənlə nərd oynadı bu hayda..."*

**Əli Rza Xələfli**

Atılıb-düşmədə cavan yanımda,
Qocanın gücü yox, pərt oynamada.
Mənim damarımda, mənim qanımda
Qüssə rəqs etmədə, dərd oynamada.

Atdığı daşını qaldıra bilmir,
Daha savaşını qaldıra bilmir,
Namərddir, başını qaldıra bilmir,
Namərdin önündə mərd oynamada.



Hərdən arxayındır, hərdən tələşlı,
Gah gülərüzlüdü, gah gözü yaşlı,
Zəri gəlməsə də əməlli-başlı
Şahin fələk ilə nərd oynamada.

*8.11.2001*

## ÇAX-ÇAXI BAŞ AĞRIDIR...

Məni sanma üstümə
Atılan daş ağrıdır.
Qəmimdir ürəyimi
Yavaş-yavaş ağrıdır.

Mən həmişə tələşda:
Qovğa da var, savaş da,
Dava da var, dalaş da,
Dava-dalaş ağrıdır.

Külüm var ki közləşir,
Dilim var ki sözləşir,
Ürəyimi söz deşir,
Canı tələş ağrıdır.

Fələyin gərdişində
Dediyim söz işində,
Dəyirman öz işində,
Çax-çaxı baş ağrıdır.

*9.11.2001*

## SƏN MƏNI ÖZÜNDƏN ÖZÜN SOYUTDUN

Soyuqluq etməzdim, heç vaxt sənə mən,
Sən məni özündən özün soyutdun.
Yanmaq istəyirdim gündən-günə mən,
Sən məni özündən özün soyutdun.

Yanımda ay soyuq, günsə ayazdı,
Fələyin odu az, tüstüsü azdı,
İstimdən ocağın istisi azdı,
Sən məni özündən özün soyutdun.

İstiyə yabançı bil soyuqluğu,
Bülbülü soyutdu gül soyuqluğu...
İndi var canımda kül soyuqluğu,
Sən məni özündən özün soyutdun.

Mən daha alışıb yanaram çətin,
Ey gözüm, izini yu məhəbbətin,
Sonu soyuqluqmuş bu məhəbbətin,
Sən məni özündən özün soyutdun.

Sevgidən yanırkən neçə sevgili
Mənə "soyu" dedi soyuğun dili,
Buz kimi elədin Şahin Fazili,
Sən məni özündən özün soyutdun,
Özün soyutdun!

*20.11.2001*

## PORTRET, YAXUD HACI MAIL

Bu məclisdə naşı yoxdur,
Elə adam var ki,
başı var, papağı yoxdur,
Eləsi də tapılar ki,
papağı var, başı yoxdur.
Onda isə
hər ikisi vardı,
Başı papağına,
papağı başına yaraşardı.
Arifdi, ayıra bilirdi
namərddən mərdi,
az gülər, çox gülümsəyərdi.
Əli açıq,
dili açıq,
sözü açıq,
gözü açıq
adamdı,
Baməzəydi,
xoşkəlamdı.
Elm öyrəndi,
qəzəl yazdı,



Füzulibazdı.
İstəyinə,
istədiyinə
nail adamdı,
adil adamdı,
fazil adamdı,
qabil adamdı,
mail adamdı.
Mehribandı,
Həlimdi.
Aramızda kim bilməz ki,
bu portret sahibi
kimdi?

*22.11.2001*

## BAŞI GÜLÜR ŞAHİNƏ

Yer tutmayır ayağı,
Başı gülür Şahinə.
Başbilənlər sayağı
Naşı gülür Şahinə.

Gənckən hər işdə məndə
Vardı səriştə məndə,
Hədəfə dəyməyəndə
Daşı gülür Şahinə.

Təpərin yoxsa canda
Döz göz ələ baxanda...
Göz gözələ baxanda
Yaşı gülür Şahinə.

*27.11.2001*

## DÜNYA BÖYÜK BIR QAZANDI...

*Şair Qiymət Məhərrəmliyə*

Dünya
binayi-qədimdən
lap böyük bir qazandı...
Elə qazan ki,
ocağı

altında deyil
içində yandı.

Dünya kimi böyük qazanın içində var
başqa-başqa böyük-kiçik qazanlar:
kənd qazanı,
qəsəbə qazanı,
şəhər qazanı,
ölkə qazanı...
Ocağı
aşağıdan yanan
bu qazanların ocağının
haradasa
yuxarıdadır yandıranı.

Dünya qazanlarının
kiçik bir qazanının birində
su qazanının deyil
bəlkə də
süd qazanının birində
bu qazanlar dünyasının
Şəki adlı yerində
bir qız qaynardı,
əlində qələmi,
canında ilhamı vardı
Və... boyu kimi balaca
şerlər yazardı.

Əgər şer
şair qəlbinin aynasısa
o qız
mübaliğəsiz-filansız
şairdi şəksiz,
gözü eynəkli,
sözü eynəksiz.

Günlərin bir günündə
Şəki adlı süd qazanı
qaynadı, qaynadı,
aşdı, daşdı,



O qazandan
qaynaya-qaynaya,
bişə-bişə
Qərib bir durna uçub
Bakı qazanına düşdü,
doğmalaşdı.
Hələ bu nəydi ki,
Qərib durna
elm aləmini doğma bilib
o aləmə də baş vurdu,
Sübut sapandına
isbat daşı qoyub
yolunu kəsmək istəyənlərin başına
daş vurdu.

Bəli,
Şəkidən uçdu qərib durna,
Bakıya düşdü qərib durna.
Nə eybi var
təki qazan qazan olsun,
təki qərib durna
təkcə
uçan olmasın,
təkcə
başqa qazana düşən olmasın,
yazan olsun,
Bu qərib durnasa
yazandı!..

Dünya böyük bir qazandı...

*2.12.2001*

## ÜRƏYIM DAYANANDA

Gəl yanıma, əzizim,
Unut umu-küsünü,
Qoy sinəmə əlini.
Say sayğac dodağınla
Köksümün altındakı
Ürək döyüntüsünü,

Sonra
gedirsənsə get...
Qalmağın daha xoşdur
amma bu dəm, bu anda,
Xəbər verərsən mənə
ürəyim dayananda.

*11.12.2001*

## TANRIYA SUAL

İki min birinci il -
ilan ili olubdur,
süründük ilan kimi.
İki min ikinci il -
Tanrım, at ili olur,
at qaça biləcəkmi?
At uça biləcəkmi
yağı düşmənə sarı?
At
dırnaqları ilə
doğma Qarabağımdan
qopara biləcəkmi
vəhşi qəsbkarları?
Azərbaycanım üçün
çarpışa biləcəkmi
at Qırat, Dürat kimi?
İgidlərim irəli
sığıya biləcəkmi
at kimi?
Xain qonşu əlində
qalacaqmı bu il də
torpağımız, varımız?
"At muraddır" söyləyib
ata-babalarımız,
murad olacaqmı at?
At
olacaqmı murad?
İlanın zəhəri var,
Atın zəhəri yoxdur,
Tanrım, yar ol, deməyək
İlin səməri yoxdur.



Bir yoxlayaq qalıbmı
zor biləkdə,
güc dizdə?
İlan ili geridə,
At ili önümüzdə...
İki min birinci il -
ilan ili olubdur,
süründük ilan kimi.
İki min ikinci il -
Tanrım, at ili olur,
At qaça biləcəkmi?

*2.01.2002*

## SEVGİNİN YENİDƏN ÇIÇƏKLƏNMƏSİ

Sevgim çiçəkləyir qoca yaşımda,
İlahi, bağışla, məni bağışla.
Bir sevda cücərir qoca başımda,
İlahi, bağışla, məni bağışla.

Adını bayraq tək uca edirəm,
Mənə kömək elə, hara gedirəm?
İlahi, bağışla, rica edirəm,
İlahi, bağışla, məni bağışla.

Aparır dumanı, çəni bu sevgi,
Özümdən qoparır məni bu sevgi,
Hayana aparır məni bu sevgi?
İlahi, bağışla, məni bağışla.

Bu sevgi bu yaşda başladı niyə?
Başlayıb gözümü yaşladı niyə?
Eyhamla yaşımı daşladı niyə?
İlahi, bağışla, məni bağışla.

Sevgidən küsərəm bağışlamasan,
Canımı üzərəm bağışlamasan,
Sanmıram dözərəm bağışlamasan,
İlahi, bağışla, məni bağışla.

Gözümün yaşını yağışlayıram,
O eşqi eşqimlə naxışlayıram,
Alsın, həyatımı bağışlayıram,
Ilahi, bağışla, məni bağışla.

Sevgimin çiçəyi açır bu yaşda,
Ruhuma rayihə saçır bu yaşda,
Şahin şahin kimi uçur bu yaşda,
Ilahi, bağışla, məni bağışla.

*8.01.2002*

## "CANIM MƏNIM..."

Telefonun zəng səsi:
Bir səs... iki səs... üç səs...
Götürürəm əlimə dəstəyi,
Hələ səs gəlmir,
Hələ nəfəs... nəfəs... nəfəs...
Nəfəsin qəşəng səsi...
Sonrasa bir kəs...
Bir kəsin qəşəng səsi...
Əvvəlcə
əvvəlinci söz:
"Canım..."
sonra ikincisi:
"mənim..."
Danışır sevənim,
danışır sevilənim,
"Canım mənim..."

"Canım mənim...",
Hələ canın olmamışam,
hələ sənin olmamışam,
"Canım mənim..."

"Can" və "mən"...
Əgər canım səndəsə
"Can" və "sən!.."
Əgər səsini, sözünü mənalandıran
təsəvvüfsə, irfansa,



əgər can ruhsa,
əgər ruh cansa
canınammı sənin,
ruhunammı sənin,
Sevənim,
Sevilənim...
Tənasüx şeyxlərinin sözünə inansaq,
Tənasüx nəzəriyyəsinə inansaq
və həmin nəzəriyyəni düz sansaq
bir neçə kərə doğulur insan,
bir neçə kərə təzələnir can,
"Canım mənim..."

Amma hələ sağam,
Allah-taala izn versə
hələ yaşayacağam,
hələ ruhum uçmayıb göylərə,
hələ doğulmamışam ikinci,
üçüncü,
dördüncü kərə...
(Bəlkə də doğulmuşam,
bəlkə də kimsə idim
kimsə olmuşam,
amma sənə dönməmişəm hələ).
Hələ canın olmamışam,
hələ sənin olmamışarn
"Canım mənim...",
"Canım mənim..."

Telefonun zəng səsi:
Bir səs... iki səs... üç səs...
Sonra
bir kəs...
Sonra
nəfəs... nəfəs... nəfəs...
Sonra isə
səs və ikicə söz:
"Canım mənim..."

*10.01.2002*

## MƏN SƏNIN ƏLINDƏN NƏ TƏHƏR QAÇIM?

Əlindən qaçmışdım neçə gözəlin,
Mən sənin əlindən nə təhər qaçım?
Off mənim ayağım, off sənin əlin!..
Mən sənin əlindən nə təhər qaçım?

Doyummu, bezimmi, özü də kimdən?
Əlimi üzümmü, özü də kimdən?
Qaçağan olmadım körpəliyimdən,
Mən sənin əlindən nə təhər qaçım?

Nanə qoxusu var telində sənin,
Qollarım kəmərdir belində sənin,
Əllərim qalıbdır əlində sənin,
Mən sənin əlindən nə təhər qaçım?

Getmək istəyirəm dilin saxlayır,
Qopmaq istəyirəm telin saxlayır,
Qaçmaq istəyirəm əlin saxlayır,
Mən sənin əlindən nə təhər qaçım?

Ürəkdir bənd olan sənə, baş deyil,
Bu kəs o qədər də qəlbidaş deyil,
Məgər görməyirsən yaş o yaş deyil?
Mən sənin əlindən nə təhər qaçım?

Bəxtim bu tilsimi aça bilməyir,
Vəsl əli hicranı quca bilməyir,
Şahin uça bilir, qaça bilməyir,
Mən sənin əlindən nə təhər qaçım?
Nə təhər qaçım?

*11.01.2002*

## EVIMI IŞIQLANDIRAN QADIN

Evimə xoş gəlmisən,
Evimi işıqlandıran qadın.
Çıraqmı, məşəlmisən,
Evimi işıqlandıran qadın.



Gəldin gəlinə dönüb...
Hicran - telinə dönüb...
Işıq selinə dönüb
Evimi işıqlandıran qadın.

Elə ki işıq yandı
Gözüm də işıqlandı,
Sözüm də işıqlandı
Evimi işıqlandıran qadın.

Bitdi pərişanlığım,
Itdi nigəranlığım,
Azaldı qaranlığım,
Evimi işıqlandıran qadın.

Sığın, bu evə sığın,
Solmasın yaraşığın,
Azalmasın işığın,
Evimi işıqlandıran qadın.

*16.01.2002*

## SÖZ YEMƏYI BACARMIRAM

Sözün köz kimi yandırır,
Köz yeməyi bacarmıram.
Acı söz kimi yandırır,
Söz yeməyi bacarmıram.

Məhəbbətin naza dönüb,
Nazın etiraza dönüb,
Hərarətin buza dönüb,
Buz yeməyi bacarmıram.

Matəm etmə busatımı,
Silkələmə səbatımı,
Şəkər elə həyatımı,
Duz yeməyi bacarmıram.

*17.01.2002*

## BIR GÜNÜN BEŞ SAATI

Bir günün beş saatı...
Qayğı dolu ömrümün
qayğısız, xoş saatı.

Bir günün beş saatı...
Iki qəlbdə yaşayan
bir sevgini bəxş edən
Allahın mükafatı.
Bir günün beş saatı...
Beş saatın içində
neçə-neçə dəqiqə,
neçə-neçə saniyə...
Beş saatın içində
mənim gerçək həyatım
bənzədi əfsanəyə.

Bir günün beş saatı...
Beş ilə,
beş-beş neçə
illərə bənzər zaman
və sən
və mən,
bir də ki,
bu zamanı yaradan
min-min ləhzə,
min-min an...

Bir günün beş saatı...
Bir günün beş saatı
Hələ çox oxunası,
Hələ beşcə saatlıq
bir nəğmə nəqəratı...

*21.01.2002*

## YAXAN DÜYMƏLƏ, DÜYMƏLƏ...

*Erməni Qara Keşiş qızı Əslini sevən müsəlman Kərəmdən intiqam almağı qət edir və qızının toy paltarının düymələrini tilsimləyir. Toy gecəsi, Kərəm tilsimdən xəbərsiz halda, düymələri açmağa başlayır, lakin axırıncı düyməyə çatarkən başdakı düymə yenə bağlanır.*

Kərəm sanır baxan məni,
Yaxan düymələ, düymələ.
Yaxalayıb yaxan məni,
Yaxan düymələ, düymələ.



Əslilik səndə qalıbdır,
Gözlər sinəndə qalıbdır,
Çadra dünəndə qalıbdır,
Yaxan düymələ, düymələ.

Gözün bağlı, sinən açıq,
Qaç bu gündən, dünənə çıx,
Düymələri sinənə sıx,
Yaxan düymələ, düymələ.

Inanma ki, tam açılar,
Sanma ki, tamam açılar,
Qara Keşiş tilsimi var,
Yaxan düymələ, düymələ.

Qorxuram üzə qəm çıxa,
Şahinin də Kərəm çıxa,
Alovlana baxa-baxa,
Yaxan düymələ, düymələ.

*22.01.2002*

## CAVAN QƏZƏLXANA

Düşünmə qəzəldə mən olacaqsan,
Mənim qabağımda hələ uşaqsan,
Mən qoca Şahinəm, ərən Şahinəm.

Gözümə gecə də gülümsəyər gün,
Ilham pərisinin saçını hər gün
hörən Şahinəm.

Ulduz tək ucaldan göyə aqili,
Palaz tək önümdə neçə cahili
sərən Şahinəm.

Mənə çox əsrarı öyrədib fələk,
Qayadan qızılgül, daşdan çiyələk
dərən Şahinəm.

Dərədə ucalıq, dağda dərinlik,
Şəkərdə acılıq, duzda şirinlik
görən Şahinəm.

*28.01.2002*

## ONA

Vüsal sənə məlal olsa,
Istəyimə sədd qoyulsa,
vüsalını istəmərəm,
vüsal adlı zülalını istəmərəm.
Nəvaziş ki eləyirsən
mənə bəsdir,
Yolunda çəkdiyim qüssəm
müqəddəsdir,
Təki sən
ayırma məni qüssəmdən,
sənə olan hissimdən
ayırma məni,
Gərək duya bilsin
qəlbin
məni -
səni sevəni.
Mən
sənin qəlbindən
azca,
lap azacıq
mərhəmət dilərəm,
Yoxsa,
Inan Allaha,
ölərəm!

*31.01.2002*

## ILAHI, BAŞIMI ITIRMIŞƏM MƏN

Bu gün səmalardan enən mənəm mən,
Şahindim, göylərdən cüda düşmüşəm.
Səməndər quşuna dönən mənəm mən,
Alova düşmüşəm, oda düşmüşəm.

Allo, ulu Allah, uca Ilahi,
Nə olar, dinc elə sən təlaşımı.
Allo, eşit məni, köməyim ol ki,
Bənd edim çiynimə itən başımı.

Allo, səndən yaxşı məni kim duyub?
Gümanım itməyib, yenə qalıbdır.



Allo, ümidimin başı quruyub,
Başımın ümidi sənə qalıbdır.

Papağı atıram elə bu anda,
Ilahi, başımı itirmişəm mən.
Papaq nəyə gərək baş olmayanda,
Ilahi, başımı itirmişəm mən.

Nə yaman başladı baş axtarışı,
Başıma vurmağa daş axtarışı...
Bitəydi aşiqin kaş axtarışı,
Ilahi, başımı itirmişəm mən.

Müdam axtarıram, başım, hardasan?
Gözümü tapmıram, yaşım, hardasan?
Yaddaşım, hardasan, huşum, hardasan?
Ilahi, başımı itirmişəm mən.

Kimdən sual edim, kimə yanaşım?
Yoxsa ki, asılıb, dardadır başım?
Ey başı olanlar, hardadır başım?
Ilahi, başımı itirmişəm mən.

Həyatda əzəli qayda bərqərar:
Biri itirərsə, başqası tapar!
Başımı tapana mükafatım var,
Ilahi, başımı itirmişəm mən.

Şahin bir gözəlin maili kimi...
Bu sevgi sevgimin sahili kimi...
Bütün dəlilərin aqili kimi
Ilahi, başımı itirmişəm mən.

*1.02.2002*

## ÖZÜMDƏN QAÇIRAM MƏN

Sözüm məni izləyir,
Sözümdən qaçıram mən.
Izim isə gözləyir,
Izimdən qaçıram mən.

Bilə bilmirəm niyə
Gözüm dikilib göyə...
Baxmayıram güzgüyə,
Üzümdən qaçıram mən.

Itirmişəm dözümü,
Gecəmi-gündüzümü...
Tapmaq üçün özümü
Özümdən qaçıram mən.

*8.02.2002*

## SEVINCDƏN YOXDUR ÖLƏN

Sevincdən
yoxdur ölən...
Ölən -
kədərdən ölür,
Ölən -
ilan dişindən
gələn
zəhərdən ölür,
Ölən -
atdan yıxılır,
düşüb yəhərdən ölür...
Və sairə, sairə...

Yet dadına şairin,
imdadına şairin,
Inan ki,
qalımımdan
ölümüm daha şirin.
Əzab çəkmədəyəm mən,
əzabımı rədd edib
ölümümü istəsən
gəl görüşə yanıma,
mənim xanimanıma,
mənə sevinc bəxş elə,
Ürəyimə bu hissi
qaynaq elə, nəqş elə,



həzz alıb o sevincdən
ölüm mən,
sevincdən ölənlərin
birincisi olum mən.

Hələ ki
bu günəcən
sevincdən yoxdur ölən...

*23.02.2002*

## ASILIDIR

Yazığım gəlir kölgəyə,
Kölgə gündən asılıdır.
Oxun qıyma cana dəyə,
Canım səndən asılıdır.

Yaradanıq ya kölə biz?
Bilmirik bunu hələ biz.
Çatacaqmı hövsələmiz?
Gözləyəndən asılıdır.

Ay qiyməti, gün qiyməti...
Yan-yana düzün qiyməti...
Söz yox ki, sözün qiyməti
Söz deyəndən asılıdır.

"Zirvə gərək!" deyə-deyə
Sığışmıram yerə, göyə.
Qalxarammı o zirvəyə?
Pilləkəndən asılıdır.

Sevdim vətəni mən candan,
Ayrıdırmı bədən candan?
Şahin Fazil, vətən candan,
Can vətəndən asılıdır.

*27.03.2002*

## TƏNHAYAM...

Tənhayam,
Tənha şahin quşuyam.
Həyatın
"Hicran" adlı oxu ilə
vurulmuşuyam.
Varmı bədbəxt mənim kimi?
Itirmişəm sevdiyimi.
Həmdəmim varmı
qəmdən qeyri?
Qonşum yoxdur
kölgəmdən qeyri,
Tənhayam...
Tənhayam...

*3.05.2002*

## AĞLAMASAM BAĞ YANAR

Məndən əgər düşsə qəm
Torpağa torpaq yanar.
Dərdlərimi söyləsəm
Şahdağa Şahdağ yanar.

Olmasa yan hicranım,
Səngiməsə əfğanım,
Tüstülənər dörd yanım,
Sol alışar, sağ yanar.

Çox zaram, ey bağiban,
Yox çaram, ey bağiban,
Ağlaram, ey bağiban,
Ağlamasam bağ yanar.

*4.05.2002*

## SEVGI DOLU SINIQ ŞÜŞƏ

Ürəyim şüşə idi -
dolu bir şüşə,
elə bir şüşə ki,
sənin sevginlə dolmuşdu.
Qəfil bir daş atdın



şüşəni sındırdın.
Sənə nə olmuşdu?
Niyə qırdın o şüşəni?
Elə şüşəni ki,
sevgin ilə dolmuşdu.
Şüşə sındı,
ürək sındı, sevgi uçdu...

Ürəyim şüşə idi...

*9.05.2002*

## ƏLIN INCIMƏSIN AY QAPI DÖYƏN

Gül ətri dolacaq yenə mənzilə,
Qapımı döyürsən, gülüm, yenə sən.
Qoy qapım ağlasın, döy gülə-gülə,
Əlin inciməsin ay qapı döyən.

Məst etsin qapımı qapı nəğməsi,
Açılmaz qapı hər qapı döyənə.
Onu elə döy ki, döyüntü səsi
Evdə olmasam da yetişsin mənə.

Müdam zərbələrdən dağlı bu qapı!..
Yağdır, zərbələri qapıma yağdır.
Indi tumurcuq tək bağlı bu qapı
Üzünə gül kimi açılacaqdır.

Bu üzdə mən təkəm, o üzdə tək - sən,
Indicə olacaq qoşa - iki tək.
Qapıdan təkcə sən keçməyəcəksən,
Qapıdan dağ boyda sevgi keçəcək.

Qapı açılanda şadlanacağam,
Yenə də tutacaq əlin əlimi.
Qapı bağlananda bu tənha adam
Tənha olmayacaq bayaqkı kimi.

Qapımı döyürkən hicran çomağı
Fərağı qovladın, hicri itirdin.
Səni mən nə təhər sevməyim axı,
Sevgisiz evimə sevgi gətirdin.

Gül ətri dolacaq yenə mənzilə,
Qapımı döyürsən, gülüm, yenə sən.
Qoy qapım ağlasın, döy gülə-gülə,
Əlin inciməsin ay qapı döyən!!!

*10.05.2002*

## DƏLI EDƏCƏYƏM ÖZÜM ÖZÜMÜ

Vətənə payəndaz olmağa dəyər,
Xəli edəcəyəm özüm özümü.
Əlimə zülfüqar düşərsə əgər
Əli edəcəyəm özüm özümü.

Başımı cütəlli hey döyə-döyə
Bu gün sığışmıram mən yerə-göyə...
Bizdə də Məcnunlar yaransın deyə
Dəli edəcəyəm özüm özümü.

Şahin, dağıtdılar xanimanını,
Sənin Xocalını, Zəngilanını...
Bir gün içmək üçün düşmən qanını
Zəli edəcəyəm özüm özümü.

*14.05.2002*

## BU GÜN GƏLƏCƏKSƏN YANIMA MƏNIM

Yenə sevinc dolub canıma mənim,
Yer tutub ən şirin istək sinədə.
Bu gün gələcəksən yanıma mənim,
Bu gün olacaqsan mənim yenə də.

Təskinlik tapacaq nadinc istəyim,
Gülüm, edəcəksən yenə dinc məni.
Qoy Quran oxuyum, dua eləyim,
Yəqin öldürəcək bu sevinc məni.

Təşəkkür eləyib sevincimə mən
Ölmək istəyirəm lap elə bu gün.
Kədərli ölümdən, qəmli ölümdən
Sevincli bir ölüm deyilmi üstün?



Kimsə yoxluğuma qüssələnməsin,
Desin ki, dağ boyda sevinci vardı.
Sənin də gözünə qəm çilənməsin,
Söylə ki, Şahini sevinc apardı.

Tab edə bilmirəm bu sevincə mən,
Məşələm, tonqalam, odam, ocağam.
Hələ ki, sevincdən olmayıb ölən,
Deyəsən birinci mən olacağam.

*18.05.2002*

## GÜL VƏ TIKAN

Gethagetdi,
Yarım mənim
tənha getdi.
Hara baxdım
fəqət gördüm
yaxşı getdi,
yaman qaldı.

Ey bağiban,
bağındakı
gül dərildi,
gül qurudu,
gül çürüdü,
tikan qaldı.

*25.05.2002*

## GÜNƏŞ ŞAIRI

Qətrədən balaca, zərrədən kiçik
zəif bəşərəm.
Uçub müqtədir bir quş sayağı mən
Əgər çıxa bilsəm yerin cəzbindən
çatsam günəşə,
dözsəm oradakı oda, atəşə
günəşlənərəm,
olaram günəşdə günəş şairi!..
Aləmdə biz kimik -
yeri yaradan,
atəşi yaradan,
günü yaradan
Zərrənin biri!..

*2.06.2002*

# ÖTƏN ILLƏRIN ŞERLƏRI

## AÇIQLIQ

Yaddır gizli iş mənə,
Əməlim açıq-aşkar.
Gizlicə iş görənə
Açıqca nifrətim var.

Açığam, heç bir kəsə
Etməmişəm kinayə.
Açıqlıq mənə məqsəd,
Açıqlıq mənə qayə.

Gizli məqsəd daşıyır
Gizli əməl, gizli iş.
Öyrədənlərim mənə
Gizli iş öyrətməmiş.

Hamıya bəlli olur
Hər əməlim neyləsəm.
Mən
şüşədən tikilən
bir otağın içində
gizli iş görən kəsəm.

## SEVGI NƏZMI - SEVGI NƏSRI...

Ürəkdə eşq,
Əldə qələm
Neçə ildir sevgilimə
Sevgi nəzmi söyləyirəm.
Həmin gün ki, məhəbbətim
titrək-titrək gəldi dilə.
Mən başladım oxumağa
Həmin nəzmi qoşma ilə,
Sonra dastan yaradıldı,
Qəzəl adlı,
misraları şəkər dadlı
şəkəristan yaradıldı.
Sonra isə əruz qızın
Hər bəndindən öpə-öpə
sözlərimi təqdim etdim



o afətə.
Sətirləri bulaq kimi zümzüməli,
dərya kimi hay-haraylı
dedim ona çox müxəmməs,
çox gəraylı.
Dörd sətirdə
neçə mənə tərənnümün edə-edə
ona yazdım rübai də.
Sevgilimə on-on,
yüz-yüz
sevgi nəzmi oxudum mən...
Neçə illər keçib indi
eşqimizin əvvəlindən,
indi mənim nigarımı dərd alıbdır,
Söyləyir ki, çoxaldıqca yaşın sənin
Şerlərin azalıbdır.
Söyləyir ki,
qorxuram ki,
bir quruyan bulaq təki
təbin sönə.

Mehribanım, belə demə dönə-dönə,
belə demə.
Mən nəzmimə vəfadaram,
Allah qoysa,
hələ neçə-neçə günlər
hələ neçə-neçə aylar
hələ neçə-neçə illər
çox şerlər
yaradaram.
Əgər bunun əksi olsa,
yenə nə qəm,
Ürəkdə eşq,
əldə qələm
Sevgi nəsri söyləyərəm
sənin üçün.
Fikr eləmə, fikr eləmə,
a gülyanaq,
Mənim sənət aləmimdə
sevgi nəzmi
bitən kimi
sevgi nəsri
başlayacaq!

## ÖMÜR DƏYIRMANINDA

Döyüldüm dəmir kimi
Dəmir dəyirmanında.
Yumşaldım xəmir kimi
Xəmir dəyirmanında.

Yan-yörəmi qar aldı,
Canımı nigar aldı,
Bəxtim qaraya çaldı
Kömür dəyirmanında.

Hicran oldu vüsalım,
Dəyişdi hər dəm halım.
Ağardı saç-saqqalım
Ömür dəyirmanında.

## KABULDAN MƏKTUB

Yanına hələ çox gələcəyəm mən,
Qarşıda hələ çox görüş var, anam.
Yenə dönüşümü gözləməkdəsən,
Ay mənim narahat, intizar anam.

Ehtiyac içində, ümid içində
Ay səkkiz balanı böyüdən anam.
Nəsihət içində, öyüd içində
Kamala yetirdin bizi sən, anam.

Uzadırıq sənə qollarımızı,
Bizi canlandıran qurucan anam.
Hamar edə-edə yollarımızı
Dərisi büsbütün qırışan anam.

Çox da xoş keçməyib sənə ömür-gün,
Səndəki dözümə matam, heyranam.
Bizi ağ günlərə yetirmək üçün
Qara saçlarını ağardan anam.



* *

Yenə görüşərik, tək can sağlığı!..
Tükənməsin səbrin, hövsələn, anam.
Darıxa-darıxa darıxmaqlığı
Özünə bir peşə eləyən anam.

Darıx, darıxmasan baş verib nəsə...
Darıx bu hissinə, anam, qurbanam.
Biz səni beləcə görək həmişə,
Ay intizar anam, darıxan anam.

## KAŞ KI!..

*Kabul şəhərində bir gün "Dirilən adam" əsərinin müəllifi yazıçı Mir Cəlalın ölüm xəbərini eşitdik...*

Eşitdik keçinib böyük bir ustad,
Bu düzsə, yalana dönəydi kaş ki!
Yenidən eləyib oxucunu şad
Yüyrək nəsr atına minəydi kaş ki!

Bu xəbər olaydı boş xəbər kimi,
Bu səs yayılaydı böhtan, şər kimi.
Yaratdığı saysız surətlər kimi
Yenə danışaydı, dinəydi kaş ki!

Yoxkən yaşamağı, Şahin, et şüar,
Bundan da ilahi xoşbəxtlik olar?
"Dirilən adam"ı yazan sənətkar
Dirilən adama dönəydi kaş ki!

## IRƏLI!
*(Yürüş marşı)*

Ey qoca, ey ahıl, ey cavan
Irəli, irəli, irəli!
Dönmədən, durmadan, anbaan
Irəli, irəli, irəli!

Naxələf qonşuya ar ola,
Kimliyi aləmə car ola,

Qoy bizə Yaradan yar ola,
İrəli, irəli, irəli!

Bu vətən yaralı, dərdi var,
Vətənin Xocalı dərdi var...
Nə qədər comərdi, mərdi var
İrəli, irəli, irəli!

Vətəndə düşmüşük fərağa,
Sarılaq silaha, yarağa,
Qabağa, qabağa, qabağa,
İrəli, irəli, irəli!

Göynəyir ağrımız-acımız,
Bu vətən taxtımız, tacımız,
Hökm edir Salatın bacımız:
İrəli, irəli, irəli!

Haydı, xar eləyək düşməni,
Haydı, zar eləyək düşməni,
Tarimar eləyək düşməni,
İrəli, irəli, irəli!

Azca da yubansaq gec olar,
Tökülən qanımız heç olar,
Adımız-sanımız heç olar,
İrəli, irəli, irəli!

Vətənin sənədir ümidi,
Vətənin mənədir ümidi,
Eşit, ey igidlər igidi:
İrəli, irəli, irəli!

Alışaq, sönməyi unudaq,
Çalışaq sönməyi unudaq,
Geriyə dönməyi unudaq,
İrəli, irəli, irəli!



Taclı da, Xumar da narahat,
Həcər də, Nigar da narahat,
Şəhidlər məzarda narahat,
İrəli, irəli, irəli!

Ağbirçək nənələr naminə,
Nazənin sonalar naminə,
Didərgin analar naminə
İrəli, irəli, irəli!

Qoy güllə canında əriyə,
Yalquzaq biryolluq kiriyə!
Azca da yol yoxdur geriyə,
İrəli, irəli, irəli!!!

## XITAB

Qıratmı indi yoxdur?
Düratmı indi yoxdur?
Eşit, ey igid əsgər,
Son qələbəyə qədər
Güldü-sevindi yoxdur.

Qoru Azərbaycanı,
Fövtə vermə bir anı,
Istirahət zamanı
Sonra var, indi yoxdur.

Vuruş, qurban olduğum,
Döyüş, qurban olduğum,
Ölüm-dirim cəngidir,
Şığı, irəliyə cum,
Öldü var, döndü yoxdur!

## NƏSƏQÇİ!

*"Əfqanlar... cəng zamanı nizamla səf bağlayırlar. Öz dillərində "nəsəqçi" və "pəhləvan" adlandırdıqları döyüşçüləri də vardır... Döyüşçülərdən bir nəfər belə geri qaça bilməz, çünki nəsəqçiyə hökm olunmuşdur ki, döyüşdən qaçan hər kəsi amansızcasına qətlə yetirsin...*

*..İsfahanın mühasirəsində (1722-ci il - Ş.F.)əfqanların əcəmlərlə döyüşü zamanı mən... döyüşü izləyirdim. Sağ əli üzülmüş və səfin arxasına qayıtmış bir əfqan gördüm. Səfi mühafizə edənlər və nəsəqçi onun döyüşdən qaçdığını zənn edib, öldürmək istədilər. O, özünün kəsik qolunu göstərdi. Yenə də onun geri qaçmağı ilə razılaşmadılar. Dedilər: "Ey avara, əgər döyüş zamanı sənin sağ əlin kəsilibsə, gərək sol əlinlə cəng edəsən, yox, əgər sol əlin kəsilsə, gərək ağzınla döyüşəsən və düşmənin üzünə tüpürəsən ki, Allah-taaladan böyük mərhəmət görəsən". Bunu deyib, onu təzədən döyüş meydanına tərəf qovdular".*

**Y.T.Kruşinski. "Xristian səyyahın tarixi" kitabı, Bakı, 1993 (farscadan tərcümə edəni və çapa hazırlayanı Şahin Fazil)**

Dəmir qayda-qanun, tunc nizam üçün
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.
Poladdan da möhkəm intizam üçün
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Düzlərim, dağlarım azalmaqdadır,
Çöllərim, bağlarım azalmaqdadır,
Vətən torpaqların azalmaqdadır,
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Yağını salmamış dara, qaçırlar,
Bədəni almamış yara, qaçırlar,
Hara tələsirlər, hara qaçırlar?
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.



Dəyanət olarsa əsgər qaçarmı?
Mətanət olarsa əsgər qaçarmı?
Nəzarət olarsa əsgər qaçarmı?
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Geriyə bircə də addım atılmaz,
Zəfər şəkərinə zəhər qatılmaz,
Nəsəqçi olarsa, fərari olmaz,
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Düşməni qanına boyandırmağa,
Utanmaz üzləri utandırmağa,
Qaçanı qovmağa, dayandırmağa
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

İgid ərlərimiz çox olsa belə,
Şiri-nərlərimiz çox olsa belə,
Mərd əsgərlərimiz çox olsa belə
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Heyf, aramızda nifaq tapılır,
Rəzil peyda olur, alçaq tapılır,
Nə qədər ki hələ qorxaq tapılır
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Bu qoca canımda qövr edir yaram,
Düşməni salmağa bəndə hazıram,
Nəsəqçi olmağa mən də hazıram,
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Sağında qüvvəsi, solunda gücü,
Sərf etsin vətənin yolunda gücü,
Əlində tüfəngi, qolunda gücü
Nəsəqçi gərəkdir bizə, nəsəqçi.

Bu gün xainləri şilləməyə,
Bütün xainləri şilləməyə

Fərari kəsləri güllələməyə
Nəsəqçi gərəkdir bizə, nəsəqçi!

## YENƏ QAR YAĞACAQ

Bakıya müsibət gətirəcəkdir,
Yenə qar yağacaq, sevmirəm qarı.
Nə qədər əziyyət gətirəcəkdir,
Örtüb cığırları, kəsib yolları.

Vədlər ediləcək yenə boş yerə,
Vədlərə bir gilə etibarmı var?
Isti su yerinə yenə evlərə
Soyuq su vuracaq qazanxanalar.

Qar ilə dolacaq səki, tin, dalan,
Xəzri yollayacaq şəhərə Xəzər.
Isti pal-paltara tamarzı qalan
Uşaqlar yenə də üşüyəcəklər.

Girinci olacaq hey səksəkənin,
Qocalar, qarılar yerə dəyəcək.
(Atasına rəhmət metro tikənin),
Yenə avtobuslar işləməyəcək.

Qış yenə Bakıda tüğyan edəcək,
Bəzən şaxta kimi, bəzən qar kimi.
Hələ çox kişini yoldan edəcək
Ayağı sürüşkən qadınlar kimi.

Nə soba qızacaq, nə də buxarı,
Nə də ki çıxacaq buxarı başdan.
Qar çıxsa topuqdan bir az yuxarı,
Problem çıxacaq yuxarı, başdan.

Çörək dükanının yönünü alan
Növbələr qıtlıqdan xəbər yayacaq.



Üç çörək yerinə onunu alan
Kişilər şəst ilə addımlayacaq.

Qış hücuma keçib yenə qarıyla
Neçə qol, neçə qıç paralayacaq.
Küçədə oğlanlar qar toplarıyla
Qızların başını yaralayacaq.

Yollar sırsıralı, havalar sərin,
Əllərə düşəcək fürsət bir az da.
Tamahı artacaq alverçilərin,
Artacaq bazarda qiymət bir az da.

Qar iflic edəcək sanki şəhəri,
Nə keçid olacaq, nə yol olacaq.
Mənzil istismarı idarələri
Yenə istismarla məşğul olacaq.

Maşınlar aşacaq yenə yoxuşda...
- Yoldaşlar, sərt gəlib necə, qışa bax!..
Şəhər Sovetinin sədri bu qış da
Yalan rəqəmləri düzüb-qoşacaq.

- Qar üçün ayrılıb maşın bu qədər...
Bu qədər traktor işə çıxıbdır...
Qarı təmizləmək asanmı məgər?
Xərcimiz birdisə beşə çıxıbdır.

Döşə, canım sədr, döşə bu il də,
Səbəblər, sübutlar bayağı yenə.
Hazır olmayacaq qışa bu il də
Bakı ötən illər sayağı yenə.

## ŞAHDAĞ QALDI, QUBA QALDI

Ağac... yarpaq... külək... yuva...
Külək bitdi, səda qaldı.
Arzu yarpaq, ürək yuva,
Yarpaq düşdü, yuva qaldı.

Elədi bu zalım fələk
Həyatımı ələk-vələk...
Ürəyimdə neçə dilək,
Dodağımda dua qaldı.

Fələk köhnə, dünya qədim,
Dünya ilə sevda qədim,
Abır qədim, həya qədim,
Abır qaldı, həya qaldı.

Canımdakı təpər hanı?
Sözümdəki kəsər hanı?
Gəncliyimdən əsər hanı?
Gənclik itdi, xülya qaldı.

Şahin gedər, Şahin gələr...
Və Şahinlər min-min gələr,
Ürəklərə təskin gələr -
Şahdağ qaldı, Quba qaldı.

## SEVƏN KÖNÜL

Sevən könül!
Gözün aydın!!!
Gərək çoxdan sevə idin,
Gərək çoxdan vurulaydın...
Sevən könül,
Sevindirdi sevgi məni,
Bil ki,
məni
tənhalığın



çoxbarmaqlı caynağından
eşq çıxartdı,
Bununla da
dünyadakı aşiqlərin
bir vahid də sayı artdı.
Sevən könül,
Sevgi haqda
min-min şer deyilmişdir,
min-min dastan.
Aşiq olmaq asan işdir,
Aşiq qalmaq deyil asan.
Sevgi yolu!
Düşməmişəm bu yola mən
enişini, yoxuşunu,
ağrısını, acısını
öyrənmədən.
Leyli - Məcnun!
Şirin - Fərhad!
Əsli - Kərəm!
Aşiqləri öyrənərək
aşiqliyi öyrənmişəm.

## ATƏŞƏM

Yenə intizarda qoyursan məni,
Sənin əhdin budur, peymanın budur?
Küləkmi, yağışmı, soyuqmu səni
yoxsa qorxudur?

Xatırla dediyin sözü, a canan,
Mənə çox demisən sən ki, atəşəm.
Odur ki, durma gəl, donmayacaqsan,
mən ki, atəşəm!..

## AKSIOMA

Ölüm
bir ömrə də
qələbə çalacaq,
Nəşimi
bir məzar
qoynuna alacaq,

Qızlarım
atasız qalacaq.
Şerlərim
yetim olacaq
Mən öləndə.

## ÜZÜ QARA OLSUN YAMAN QONŞUNUN

Deyirəm var imiş gündüzdə gecə,
Gözlərim görərmiş gündüz də gecə...
Dönüb kölgəsinə qara niyyətin
Bizim qanımızı qaraltdı necə,
Üzü qara olsun yaman qonşunun.

Gəlib üzdəniraq bir qonaq oldu,
Elə buna görə üzə ağ oldu,
Mənim Qarabağım laləzar idi,
Mənim Qarabağım qara bağ oldu,
Üzü qara olsun yaman qonşunun.

Bu nə bəla idi çənginə düşdüm?
Bu nə dostluq idi cənginə düşdüm?
Həmişə yaxşılıq gəlib əlimdən,
Heç kəsə yamanlıq eləməmişdim,
Üzü qara olsun yaman qonşunun.

Ilahi, uzaq et bizdən qaranı!
Təmiz su yox edər gözdən qaranı.
Qara Keşiş kimi üzü qaralsa,
Ölüm də aparmaz üzdən qaranı,
Üzü qara olsun yaman qonşunun.

Onda arzuya bax, o xam arzuya,
Mən sudan gəlirəm, o gedir suya.
Cəsarətim də vr, dəyanətim də,
Çanım qurban ola yaxşı qonşuya,
Üzü qara olsun yaman qonşunun.

Kəsib kələyini, qırıb şəstini
Bir gün igidlərim alar üstünü.
Bizim günümüzü o ki qaraltdı
Çətin ki ağara onun da günü,
Üzü qara olsun yaman qonşunun.



## QARƏTÇILƏR

Qəlbimi talayan qarətçisən ki!..
Mənə yar olan gün onu yarmısan.
Zərrəcə qalmayıb sinəmdə sevgi,
Çünki, hamısını sən aparmısan.

Qəlbini talayan qarətçiyəm ki!..
Bu işi görmüşəm eşqə düşən dəm.
Zərrəcə qalmayıb sinəndə sevgi,
Çünki, hamısını mən götürmüşəm.

## KREDO

Qəlbim hisslərlə dolu,
Hər hissin öz yeri var.
Qəlbimdə hisslər yolu,
Qəlbimdə söz yeri var.

Mənim varım - söz varı,
Sevirəm hisslərimi,
Xərcləmirəm onları
Bədxərc adamlar kimi.

Xəsis deməyin mənə,
Varmayıram ifrata.
Yaşayıram sadəcə
Hissimdən çəkə-çəkə,
Sözümdən tuta-tuta.
Bir bəşərsevər kimi
Xərcləyirəm hamıya
Fəqət bircə hissimi:

Qəlbim hisslərlə dolu,
Hər hissin öz yeri var.
Sevgi birinci yerdə,
Ehtiras sonuncuda.
Bəlkə buna görə də
Xərcləyirəm sevgimi
Mən hamıya bolluca.

## MÜQAYISƏ
*(Zarafat)*

Deyiblər Məcnuna "Məhəbbət şahı",
Mən həmin fikirlə razı deyiləm.
Başqa aşiqlərin nədir günahı?
Şöhrət eşq uğrunda ölməkmi bəyəm?

Dastan yaradılıb, tərif edilib
Fərhad adında bir dağçapan kişi.
Vüsala yetməyib, başını dəlib,
Kəllə dağıtmaqmı aşiqin işi?

Əslinin dərdindən odlanıb Kərəm,
Mən başa düşmürəm bu "zərurəti".
Eşqimə yetməsəm yanan deyiləm,
Əgər yandırmasam yanmaram qəti.

Aşiqəm, onlardan fərqliyəm ancaq,
Mən heç kim deyiləm, elə mənmişəm.
Nə olmuşam dəli, nə çapmışam dağ,
Nə də Kərəm kimi tüstülənmişəm.

Onlardan üstünəm məhəbbətdə mən,
Gərək bir çox aşiq əlimi sıxsın.
Eyy, kimdir sözümə şübhə eləyən?
Əgər hünəri var irəli çıxsın!

## DÜNYANIN NƏ VECİNƏ

Bal kimi şirin deyil,
Xurmanın nə vecinə?
Mənası dərin deyil,
Misranın nə vecinə?

Gedən getdi-getmədi,
Gələn yetdi-yetmədi,
Çiçək bitdi-bitmədi,
Səhranın nə vecinə?



Hey bulanır, durulur,
Ləpələri yorulur,
Balıqları qırılır,
Dəryanın nə vecinə?

Vurğunlar elə düşmür,
Məcnunlar elə düşmür,
Qeys daha çölə düşmür,
Leylanın nə vecinə?

Ömür gəlib-gedəcək,
Əcəl alıb-gedəcək,
Şahin ölüb-gedəcək,
Dünyanın nə vecinə?

## ÇƏPƏR CÜCƏRDİ, CÜCƏRDİ...

Ürəyimdə, aman Allah,
Nələr cücərdi, cücərdi.
Halım oldu yaman, Allah,
Qəhər cücərdi, cücərdi.

Göz yaşımı siləcəkdim,
Guya mən də güləcəkdim...
Güman səpdim, ümid əkdim,
Kədər cücərdi, cücərdi.

Mənfəətim zərər kimi,
Şirin günüm - zəhər kimi.
Axşam boğdum kədərimi
Səhər cücərdi, cücərdi.

İstəyirdim sevinc dadım,
Başa yetmədi muradım.
Ahəstəcə pıçıldadım,
Xəbər cücərdi, cücərdi.

Yarım, bizim aramızda
Kim durdu, kim aramızda?
Mən gül əkdim, aramızda
Çəpər cücərdi, cücərdi.

## QAÇMAQ IGIDLIKSƏ...

*"Qaçmaq da igidlikdəndir"*
**Atalar sözü**

Mənim atalara ehtiramım var,
Atalar sözünə rəğbətim dərin.
Bunu nə niyyətlə deyib atalar?
Kimdir müəllifi həmin sözlərin?

Bu söz bir qorxağın dilindən qaçıb,
Bu söz bəraətdir bəd bir əmələ.
Hansı igidinsə əlindən qaçıb
O kəs yaxasını verməyib ələ.

O kəs ləyaqəti atıb ayağa,
Gözümdə zərrəcə hörməti yoxdur.
O kəs şərafəti atıb ayağa,
Cəsarəti yoxdur, cürəti yoxdur.

Qadın desə idi bağışlayardım,
Kişi bəs o sözü nə sayaq deyib?
Nə mərhəmət düşür ona nə yardım,
Əgər deyibsə də çox nahaq deyib.

Etmirəm qaçmağı təsəvvür hətta,
Olsun əmdiyi süd qaçana haram.
Qaçmaq igidliksə əgər həyatda
Mən igid olmağı arzulamaram!

## SƏSLƏR

*"Tişini xoçu, tişini..."*
**A.Voznesenski**

Külək səsi,
Qu səsi...
Quşların "quqqu" səsi...
Bulaqların axması...
Şimşəklərin çaxması...
Zavodların nərəsi...
Gözəllərin nəğməsi...



Səs-küy yağıdır təbə?
Səs-küy ilhama düşmən?
Yox! Vurğunam səs-küyə,
Səssizlik nəyə gərək?
Səs-küy istəyirəm mən,
Səs-küy istəyirəm mən!

## SƏN MƏNI QUCAQLA ƏVVƏLKI TƏKI

Yarım, qucaqlayıb məni yenə qəm,
Sən məni qucaqla əvvəlki təki.
Zərif qollarının həsrətindəyəm,
Sən məni qucaqla əvvəlki təki.

Aşiqə sitayiş neçin görünmür?
O peyman, o saziş neçin görünmür?
Əvvəlki nəvaziş neçin görünmür?
Sən məni qucaqla əvvəlki təki.

Əgər şəfəqqətin azalmayıbsa,
Odun, hərarətin azalmayıbsa,
Mehrin, məhəbbətin azalmayıbsa,
Sən məni qucaqla əvvəlki təki.

Eşqimin düşübdür dilə, yanmağı,
Zülümdür aşiqin belə yanmağı...
Yoxsa istəmirsən qucaqlanmağı?
Sən məni qucaqla əvvəlki təki.

Vüsal sevgimizə yaraşıq olsun,
Baxışın nur olsun, qoy işıq olsun,
Qolların yenə də sarmaşıq olsun,
Sən məni qucaqla əvvəlki təki.

Sevgi fəxr mənə, təntənə mənə,
Qolların nə gözəl məngənə mənə!
Qucaqla, qucaqla, qucaqla yenə,
Sən məni qucaqla əvvəlki təki.

## ÖLDÜRƏCƏK DÜNYA MƏNİ

Ağladandı, güldürəndi,
Öldürəcək dünya məni.
Yaradandı, öldürəndi,
Öldürəcək dünya məni.

El-el gəzdim dərviş təki,
Çöl-çöl gəzdim vərdiş təki...
Mən dünyaya neylədim ki,
Öldürəcək dünya məni.

Məlal məndən gen olmayıb,
Ürəyimdə kin olmayıb,
Yuxularım çin olmayıb,
Öldürəcək dünya məni.

Rəhmsizlik eləmədim,
Haqsız işə iş demədim,
Toyuğuna "kiş" demədim,
Öldürəcək dünya məni.

"Sevincini bildir" dedim,
Kədərimi bildirmədim,
Bir quşu da öldürmədim,
Öldürəcək dünya məni.

Qanlını qansız eləyir,
Canlını cansız eləyir,
"Var ol" deyir, "yox ol" deyir,
Öldürəcək dünya məni.

Var-yoxunda gözümmü var?
"Var" deməyə üzümmü var?
"Yox" deməyə sözümmü var?
Öldürəcək dünya məni.

Fərhad kimi, Məcnun kimi...
Müşfiq kimi, Vurğun kimi...
Varlığımdan yorğun kimi
Öldürəcək dünya məni.



Hələ məndə dözüm nə çox,
Deyilməyən sözüm nə çox,
Yol olmayan izim nə çox,
Öldürəcək dünya məni.

Pisliyim yox, ziyanım yox,
Yaxşıdır ki, yamanım yox...
Mənim ona gümanım yox,
Öldürəcək dünya məni.

Azalacaq səbrin sayı,
Çoxalacaq qəbrin sayı,
Zülmün sayı, cəbrin sayı,
Öldürəcək dünya məni,
Öldürəcək dünya məni.

## CAN BAHA, QURBAN OLUM

Gərək oduna yanam,
Can baha, qurban olum.
Mən ki sənə qurbanam,
Bir daha qurban olum.

Meyl elədim sevgiyə,
Sevgili sənsən deyə.
Əmr elə mən bəndəyə
Sən şaha qurban olum.

Sənsən mənə yaraşan,
Yar şərəfdir yara, şan,
Səni, məni yaradan
Allaha qurban olum.

## DUSTAQ

Bədənimdə
Ölüm yaşar,
Bədənim dustaq edib onu.
Demək, məndə

Həyat da, ölüm də var.
Mən ölən kimi
Biri yox olacaq, biri var.
Bədənimdə
Ölüm yaşar.

## QAPILAR

Səhər gündüzün,
Gündüz axşamın,
Axşam gecənin,
Gecə səhərin
qapısını açar...
Hey açılıb-örtülər
qapılar...

Sən mənim,
Mən sənin,
O bunun,
Bu onun
qapısını açar...
Hey açılıb-örtülər
qapılar...

Müxtəlif qapıları
açıb-örtməklə
keçir gün...
Bəzi qapıları açıram
örtməyim deyə,
Bəzi qapıları örtürəm
açmamaq üçün...

## ÖZBIOQRAFIYAM

Mən kiməm?
Nəçiyəm?
Nəyəm?
- Aşiqəm!
Dırnağımdan təpəmə qədər



Eşqəm,
Məhəbbətəm, Sevgiyəm!
Mən
sevda istiqamətində mövcud olan
Və
çoxları tərəfindən unudulan
Sədaqət bulağından su içmişəm,
Mən
Eşq Universitetinin
Sevgi fakültəsində
Məhəbbət dərsi keçmişəm.
Dərsliklərim
müxtəlif dillərdə...
adbaad...
Professorlarım:
Məcnun,
Kərəm,
Fərhad!!!

## MƏNI O DIYARA KIM GÖNDƏRIB BƏS?

*"Səni Əfqanıstana mən göndərməmişəm..."*
**(Əfqanıstandan yaralı qayıdan bir sovet əsgərinə sovet həkiminin dediyi söz).**

Dil necə qıyaraq o sözü deyib?
Məni o diyara kim göndərib bəs?
Sən göndərməmisən, o göndərməyib,
Məni o diyara kim göndərib bəs?

Hərə yaxşısını çəkir bir yana,
Gözü yaşlı qaldı nə qədər ana...
Kim mənə "get, - deyib, - Əfqanıstana"?
Məni o diyara kim göndərib bəs?

Kim məni yollayıb oda, ölümə?
Kim məni qurşayıb belə zülümə?
Qumbara, tapança verib əlimə
Məni o diyara kim göndərib bəs?

Günümüz qaraydı, ayımız qara,
Tale boğçasında payımız qara...
Tamarzı qoyaraq yoldaşa, yara
Məni o diyara kim göndərib bəs?

Əlim getməzdi heç badam qırmağa,
Yadam öldürməyə, yadam qırmağa...
Adam öldürməyə, adam qırmağa
Məni o diyara kim göndərib bəs?

Mənmi yaralıyam, yaralımı sən?
Həkim, duymayırsan məlalımı sən.
Karsan? Eşitmirsən sualımı sən?
Məni o diyara kim göndərib bəs?
Məni o diyara kim göndərib bəs?

## ƏFQAN DIYARINDA BƏRKIMIŞIK BIZ

*Əfqanıstanda neçə-neçə od-alovdan keçən Nizamiyə, Valehə, Mehmana, Asifə, Əliyə, Əhmədağaya, Şikara, Maya xanıma... və bütün tərcüməçilərə!*

Övlad doğularaq Azərbaycana
Əfqan diyarında bərkimişik biz.
Yollanıb qürbətə, düşüb əfğana
Əfqan diyarında bərkimişik biz.

Günlər keçirmişik o dost diyarda,
Kabulda, Heratda, Bəlxdə, Təxarda...
Yanmışıq günəşdə, donmuşuq qarda,
Əfqan diyarında bərkimişik biz.

Bizi salamlayan əl də görmüşük,
Qəhr edən, qarğıyan dil də görmüşük,
Güllə də görmüşük, gül də görmüşük
Əfqan diyarında bərkimişik biz.

Bizi sərtləşdirib əfqan iqlimi,
Çox zaman kobuduq, hərdən səmimi...



Bərkidik lap polad bərkiyən kimi,
Əfqan diyarında bərkimişik biz.
Tale əydirməyib biləyimizi,
Daşdan çıxarmışıq çörəyimizi...
Sevgi yumşaltsa da ürəyimizi
Əfqan diyarında bərkimişik biz.

Ölümdən qorxmayıb bir an da belə
Olarıq vətənə qurban da belə,
Nizami də belə, Mehman da belə...
Əfqan diyarında bərkimişik biz,
Bərkmişik biz!

## BU BALIQ NƏYƏ GÜLÜR?

Əldə dözüm qalmayıb,
Əlim məəttəl qalıb.
Dildə sözüm qalmayıb,
Dilim məəttəl qalıb.

Nağılçıda nağıl yox,
Taxılçıda taxıl yox,
Ağıllıda ağıl yox,
Dəlim məəttəl qalıb.

Sən duza bax, baldı ki...
Dəryazı ot çaldı ki...
Sərt elə yumşaldı ki,
Həlim məəttəl qalıb.

Qorxu-hürkü nədir ki?
Qorxmayanda gedir ki...
Rəhm elə zülm edir ki,
Zülüm məəttəl qalıb.

Var dözümlər yoxaldı,
Az - itirdi, çox - aldı,
Zülüm elə çoxaldı
Ölüm məəttəl qalıb.

Bu sahil niyə gəlir?
Bu balıq nəyə gülür?
Bu dəniz niyə ölür?
Gölüm məəttəl qalıb.

Bu çərx dönməyir niyə?
Sükut dinməyir niyə?
Bu od sönməyir niyə?
Külüm məəttəl qalıb.

## GÖZÜN HƏSRƏTLISƏ GÖZÜNƏ QURBAN

Aşiqin dürr dolu xəzinəsiydin,
Bir də, ey xəzinə, dönəcəkmisən?
Məni həzin edib nə səmtə getdin?
Rəhm edib həzinə dönəcəkmisən?

Dözürəm! Dözərəm! Dözüm dönərmi?
Mən sözübütövəm, sözüm dönərmi?
Gülüm, mənim səndən üzüm dönərmi?
Dönməzin üzünə dönəcəkmisən?

Dumanı sal yada, çəni sal yada,
Çəməni sal yada, məni sal yada,
Gəzdiyin yerlərdə izin qalmada,
Bir daha izinə dönəcəkmisən?

Odun sönübdüsə közünə qurban,
Gözün həsrətlisə gözünə qurban,
Sən ki, söz vermisən, sözünə qurban,
Verdiyin sözünə dönəcəkmisən?

Laləyə baxıram üzünə dönür,
Çiçəyə baxıram sözünə dönür,
Deyirlər ki, hər şey özünə dönür,
Cavab ver, özünə dönəcəkmisən?



## QOCA MƏCNUN

Ömrün son fəsli də yan aldı bizə,
Gedir son mənzilə ömür qatarı.
Bu ahıl çağda da bir-birimizə
Demirik sən "qoca", mən isə "qarı".

Həyatda o qədər sınanmışam ki!..
Sədaqət sınaq-zad vecinə almır.
Görüb sevgimizi inanmışam ki,
Insan qocalsa da, sevgi qocalmır.

Bir yana gedəndə mənsiz sən, nə sirr,
Vüsal arzusu hey sarır qəlbimi.
Səni görmək üçün ürək tələsir
Eynən cavanlıqda olduğu kimi.

Gözlərim dikilir yoluna mənim,
Gəlirsən, həsrətlə baxıram sənə.
Içəri girirsən, mənim əzizim,
Sanıram o ürkək gəlinsən yenə.

Mən qoca Məcnunam, "a Leylim" deyə
Başına dönürəm səni görən tək.
Dastan qoşulmursa bizim sevgiyə,
Əsrin Füzulisi hələ yox demək.

## AĞRI

Neçə gün olar
Canımda ağrı var, canımda dərd var.
Məni eləyibdir həyəcanlı dərd,
Ağrım canlı ağrı, dərdim canlı dərd.
Neçə gün olar ki, ey dilbərim, sən
Küsüb getmisən.
Gəlməsən əgər
Məni cansız edər
bu canlı ağrı,
Bu amansız ağrı,
bu ah-fəğanlı,
hicranlı ağrı...

## EPITAFIYA

Bir vaxt sən var idin, varlığın vardı,
Baş idin həmişə xeyirdə, şərdə.
Nə qədər xatirə səndə yaşardı,
Indi sən yaşarsan xatirələrdə.

## INSAN

Hava mənə - dövlət, torpaq mənə - var,
(Mənə necə varsız söyləmək olar?)
Başımın altında göyün yarısı,
Ayağım altında yer kürəsi var.

## QƏZƏLLƏ VIDALAŞMA

Göz yaşımla tərk edirəm səni, eyləmə
Mənim könül rübabımda gəl səda, qəzəl.
"Səni başa düşməyirlər" demək düz deyil,
"Səni yaza bilməyirlər"... Əlvida qəzəl!

## ISTƏYIRƏM

"Sevmək" sözü qəlbimə həkk,
Mən sevilmək istəyirəm.
Bu istəkdə gözəl, göyçək,
Nə var bilmək istəyirəm.

Eşq əbədi, ömür güdə,
Xoşdur eşqin zülümü də...
Ölən zaman ölümü də
Sevib ölmək istəyirəm.

## YAZIQLIQ ÇƏKƏN

Nə qədər yazıqlıq çəkir ürəyim...
Məni tanıyanlar bundan halıdır.
Rəhmim, mərhəmətim, rəhmdilliyim
Bütün hisslərimin ağsaqqalıdır.



Özünü dəyişib suya çevrilən
Kəhrəba tək qara yazığım gəlir.
Udub soxulcanı qarmağa keçən
Körpə balıqlara yazığım gəlir.

Dönüb qayqanağa cücə olmayan
Nakam yumurtaya yazığım gəlir.
Ayaqlar altında qalıb məhv olan
Fəhlə qarışqaya yazığım gəlir.

Dilindən qəfəsə düşən bülbülə,
Bəlalı bülbülə yazığım gəlir.
Peyin altda qalan hər qızılgülə,
Zərif qızılgülə yazığım gəlir.

Heyvan insanlara qoynunu açıb
Korlanan meşəyə yazığım gəlir.
Cild-cild kitabların yanından keçib
Mey alan kişiyə yazığım gəlir.

Bir kərə isti bir busə görməyib
Soluxan dodağa yazığım gəlir.
Sərxoş atasına "day içmə" deyib
Yalvaran uşağa yazığım gəlir.

Dahinin günlərin nəhs bir günündə
Pislənə adına yazığım gəlir.
Ərindən xəlvəti oynaş önündə
Soyunan qadına yazığım gəlir.

Qəlbimdən həmişə rəhm yüksəlir,
Başqa hissiyatım buna döyükmüş.
Çox kəsə, çox şeyə yazığım gəlir,
Mənim mərhəmətim necə böyükmüş!..

## BIR QADIN QIŞQIRIR...

Bir qadın qışqırır... Nə xoş bir səda...
Bir qadın çığırıb kömək diləyir.
Bu nalə, bu fəryad müdhiş olsa da,
Mənə, inanın ki, ləzzət eləyir.

Bir qadın ağrıdan çəkir əziyyət,
Bülənd olur göyə onun ah-zarı.
Məni şadlandırır ondakı həsrət,
Məni sevindirir hıçqırıqları.

Doğulur bir çağa... Artır bir ana...
Elə ki toxdadı qadının səsi,
Başqa səs yağ kimi yayıldı cana -
Çağa inqəsidir, çağa inqəsi...

## DÜZ MÜTƏNASIB

*Əfqanıstanda mənimlə birgə işləmiş, özü demişkən "sistemli təhlilçi" Əli Aslanova!*

Nə isə,
birdən-birə
canlandı xəyalımda
neçə-neçə xatirə.
Uşaqkən aralandığım
el-oba düşdü yadıma.
Şəhərlərin içində
ən gözəli sandığım
Quba düşdü yadıma.
Olub-keçənləri xatırladıqca mən
Gəlib-keçdi gözlərim önündən
müəllimlərim bir-bir.
Onlar
elm öyrədirdilər bizə...
Elə indi də öyrədirlər,
amma, başqa şagirdlərə.
Birdən-birə, nəsə
həndəsə



düşdü yadıma,
çünki yadıma
rəhmətlik Nəcəf müəllim düşmüşdü -
həndəsə müəllimim
Nəcəf müəllim...
Düz mütənasib!
Dağla düz -
tərs mütənasib!
Düzlə tərs -
tərs mütənasib!
Həyatla ölüm,
Rəhmlə zülüm -
tərs mütənasib!
Məhəbbətlə sədaqət -
düz mütənasib!
Məhəbbətlə xəyanət -
tərs mütənasib!

Ey sevgilim,
mənlə sən -
düz mütənasib!
Dayan bir görüm,
bu nə tənasüb?
Mənlə sən düz mütənasib?
Riyaziyyatçılar demişkən
Gərək
"sistemli şəkildə"
bunu təhlil eləyək:
Mən nəzmi sevirəm,
sən nəsri.
Bu oldu hansı tənasübdən?
Düz mütənasibdən!
Nə fərqi vardır,
bunların hər ikisi
Ədəbiyyat babanın
övladlarıdır.
Mən mahnı oxumağı sevirəm,
sən rəqs etməyi.
Bu hansı tənasübdən?
Düz mütənasibdən!

Nə fərqi vardır,
bunların hər ikisi
Incəsənət nənənin
övladlarıdır.
Mən sevirəm Etikanı,
sən Estetikanı.
Nə olar,
bunlar
qeyri-ədəb
və qeyri-gözəllik
dərsi deyil,
nə Etika Estetikanın,
nə də Estetika Etikanın
tərsi deyil.
Bəs bu oldu hansı tənasübdən?
Düz mütənasibdən!
Nə fərqi vardır,
bunların hər ikisi
qoca elm ağacının
qoşa budaqlarıdır...
Bu minvalla
çox tənasüblərimizi
sadalamaq olar, əzizim...
Deməli,
necə deyərlər
ulduzumuz göydə birləşib bizim.
Cavan ömrümüzə, göy ömrümüzə
ulduz olub nəsib,
ulduzla göy -
düz mütənasib!
Nə yaxşı ki,
tutub bizimki,
Anadan bir-birimizçin doğulmuşuq.
Nə yaxşı ki,
bir-birimizlə
düz mütənasib olmuşuq!!!



## IKI SÖZ - IKI KÖZ

Demədim, iki söz dodaqda qaldı,
Həmin ikicə söz yandırır məni.
Dünənim bugündən uzaqda qaldı,
Dünəndən iki köz yandırır məni.

Tərəddüd elədim deməli yenə,
Deməli, istəyə eləməyib şəkk.
Kaman tuşlananda hədəf səmtinə
Oxu tərəddüdsüz atasan gərək.

Deməli, sözümü deməyib hədər
Mətləbi saxladım bir kənarda mən.
Deməli, dünəndən bu günə qədər
Səni saxlamışam intizarda mən.

Dünənki tərəddüd gərəksiz imiş,
Deməli, şəkk otu səpdim çəmənə.
Dünənki tərəddüd nahaq iş imiş,
Nə sənə gərəkmiş, nə də ki mənə.

Ürəyim oxumur əzəlki kimi,
Deyir qırıq taram, sınıq neyəm mən.
Dünən görüşəndə demədiyimi
Bu gün görüşəndə deyəcəyəm mən.

Dodaq necə dözür bu iki közə?
Islah edəcəyəm bu gün dünəni.
Hazır ol, əzizim, o iki sözə,
Sənə deyəcəyəm: Sevirəm səni!
Sevirəm səni!

## MƏN SƏNƏ HEY "SALAM" SÖYLƏYƏCƏYƏM

Əlvida libası geyə bilərsən,
Mən sənə hey "salam" söyləyəcəyəm.
Mənə "xudahafiz" deyə bilərsən,
Mən sənə hey "salam" söyləyəcəyəm.

Aşiqi olmadım mən hər nigarın,
Canda yeri varsa əgər nigarın,
Salam adıdırsa Pərvərdigarın
Mən sənə hey "salam" söyləyəcəyəm.

Xoş niyyət varsa da "sağ ol" sözündə,
Şəfəqqət varsa da "sağ ol" sözündə,
Məhəbbət varsa da "sağ ol" sözündə
Mən sənə hey "salam" söyləyəcəyəm.

Ayrılıq salsa da cana vəlvələ,
Fəraq ardımızca sürünsə belə,
Bir qədər bayağı görünsə belə
Mən sənə hey "salam" söyləyəcəyəm.

Yaxınlaşan dəmdə bizə hicr anı,
Vəsl tərk edəndə hicrə meydanı,
Vüsala çevirib sanki hicranı
Mən sənə hey "salam" söyləyəcəyəm.

Saziş bağlamışıq axı səninlə...
Elə fəxr edirəm o saziş ilə
Sağollaşanda da, nəvaziş ilə
Mən sənə hey "salam" söyləyəcəyəm.

Əcəl əllərimi sıxanda belə,
Ölüm gözlərimə baxanda belə,
O uzaq səfərə çıxanda belə
Mən sənə hey "salam" söyləyəcəyəm.

Əsla deməyəcək dil "vida" sənə,
Ya da etməyəcək əl "vida" sənə,
Əzizim, yaraşmır "əlvida" sənə,
Mən sənə hey "salam" söyləyəcəyəm!

## XEYRIM ZIYANA OXŞAR

Qəddim tamam əyildi,
Ahım fəğana oxşar.
Şam söndü, şam əyildi,
Arzum gümana oxşar.



Yazım da var, yayım da,
Söz bağından payım da.
Günəşim də, ayım da,
Könlüm cahana oxşar.

Qabaqdan qışım gəlir,
Qarım, yağışım gəlir,
Xəzandan xoşum gəlir,
Ömrüm xəzana oxşar.

"Can" desəm "aman" demə,
"Aman" desəm "can" demə,
Yaxşıma yaman demə,
Yaxşım yamana oxşar.

Gün görmədim dünyada,
Cavanlıq getdi bada...
Yar dedi: - Qocalsa da,
Yarım cavana oxşar.

Çaldığım könüldümü?
Əlindəki güldümü?
Başındakı tüldümü?
Örpək - dumana oxşar.

Şahin olub ötmüşəm,
Nakəsi incitmişəm.
Elə xeyir etmişəm,
Xeyrim ziyana oxşar.

## ƏFSANƏLƏR ÇOXALDI

Adəm göründü yerdə...
Mərdanələr çoxaldı...
Həvva xanım sağ olsun,
Cananələr çoxaldı.

Torpaq oldu, göy oldu...
Qaplan oldu, ley oldu...
Meynə dönüb mey oldu,
Məstanələr çoxaldı.

Ot oldu, yaba oldu...
Insan var qaba oldu...
Evlər xaraba oldu,
Viranələr çoxaldı.

Insanda kin göründü...
Insan var divə döndü...
Kahalar evə döndü,
Kaşanələr çoxaldı.

Əğyar var - külə döndü...
Aşiq - bülbülə döndü...
Gözəllər gülə döndü,
Gülxanələr çoxaldı.

Gör necə odlandı şam,
Alışdı şam, yandı şam,
Qaranlığı dandı şam,
Pərvanələr çoxaldı.

Sevənlər xoş oldular,
Sevgiyə tuş oldular,
Sevib sərxoş oldular,
Əfsanələr çoxaldı.

## BU DÜNYANIN

Sinəmdə eşqin dağı var,
Dağı qara bu dünyanın.
Deməyin sarı yağı var,
Yağı qara bu dünyanın.

Dağılıram dağım-dağım,
Kimi görüm? Hara baxım?
Qara oldu Qarabağım,
Bağı qara bu dünyanın.

Bax ömrün ahıl çağına:
Bələndim qəm qundağına...
Mail olmayın ağına,
Ağı qara bu dünyanın.



## DÜNYA BELƏ DÜNYADIR...

*"Dünya belə dünyadır" kitabının müəllifi Hökümə xanım Bülluriyə*

Dünya boyda məhəbbət,
Dünya belə dünyadır.
Dərya boyda səadət,
Dünya belə dünyadır.

Tarixçəsi yazılıb,
Ona çox dağ basılıb,
Göydən ipsiz asılıb,
Dünya belə dünyadır.

Yazılıb sətir-sətir,
Pozulub sətir-sətir,
Qazılıb qəbir-qəbir...
Dünya belə dünyadır.

Gözəlləşir bir yanı,
Xəzəlləşir bir yanı,
Belə gördüm dünyanı,
Dünya belə dünyadır.

Quru gördüm dünyanı,
Sulu gördüm dünyanı,
Ulu gördüm dünyanı,
Dünya belə dünyadır.

Kimləri, nələri var...
Sevinci, kədəri var...
Şərbəti, zəhəri var,
Dünya belə dünyadır.

Bəzisinə acıdır,
Bəzisinin tacıdır,
Saray yeyir, tac udur,
Dünya belə dünyadır.

Torpağı var, daşı var...
Birinin daş-qaşı var,
Birinin göz yaşı var,
Dünya belə dünyadır.

Neçə möcüzəsi var,
Nəfəsi var, səsi var,
Hərdən zəlzələsi var,
Dünya belə dünyadır.

Nəğmə deyir yelləri,
Gül bitirir çölləri,
Şəlalələr - telləri,
Dünya belə dünyadır.

Isti-sərinli dünya,
Dayaz-dərinli dünya,
Fərhad-Şirinli dünya,
Dünya belə dünyadır.

Sözlərim yalan deyil,
Dağıtma, talan deyil,
Heç kimə qalan deyil,
Dünya belə dünyadır.

Gah həlim, gah yamandır,
Hər anı imtahandır,
Cahan belə cahandır,
Dünya belə dünyadır.

Bağı kimi bağ olmaz,
Dağı kimi dağ olmaz,
Dağıtmasaq dağılmaz,
Dünya belə dünyadır.

Təyyarəli, dəvəli,
Zürafəli, güvəli,
Hidrogenli, nüvəli,
Dünya belə dünyadır.



Yaşasın ki, yaşayaq,
Yaşa dəniz, yaşa dağ,
Dünyamızı yaşadaq,
Dünya belə dünyadır.

Axsın yolunda qanım,
Çıxsın yolunda canım,
Neynək, Hökümə xanım,
Dünya belə dünyadır...
Dünya belə dünyadır...

## INSAN ÖMRÜ

Təvəllüddən ölüməcən - ölümdür...
Təvəllüd - ön,
ölüm - son.
Təvəllüd bir, ölüm bir...
Təvəllüd bir!..
Ölümsə...
yox, ölüm bir deyildir.
Bir ömürdə təvəllüd bir, ölüm sirr.
Təvəllüd - ön,
Ölüm - son.
Son ölümə çatanacan
Neçə dəfə ölür insan, neçə dəfə dirilir.
Özüm həm
çox ölmüş, dirilmişəm,
sarsılmışam nə qədər...
Son ölümə çatanacan
Ölümdə var
ö l ü m l ə r.

## KÖLGƏ AĞIRLIĞI

*Bacım Naziləyə!*

Uğur məndən ötüşüb,
O nur məndən ötüşüb,
Üstümə kölgə düşüb -
Gərəksiz adamların,
Ürəksiz adamların
qara-qara kölgəsi.

Nura çata bilmirəm,
Nuru tuta bilmirəm,
Nuru uda bilmirəm
Qəlbiqara kəslərin,
Qəlbi para kəslərin
dura-dura kölgəsi.

Nura çıxa bilmirəm,
Nura baxa bilmirəm,
Nə müddətdir üstümü
alıbdı kölgə axı.

O nur məndən ötüşüb,
Üstümə kölgə düşüb,
Qalxmağa qoymur məni
bu kölgə ağırlığı.

## QALMADI

Kimlər keçdi dünyadan...
Bir nişana qalmadı.
Kimlər köçdü dünyadan...
Yana-yana, qalmadı.

Soldu qərənfilləri,
Sovuşdu bülbülləri,
Bağban dərdi gülləri,
Gülüstana qalmadı.

Ulduz da axdı-getdi,
Şimşək də çaxdı-getdi,
Məcnun da çıxdı getdi,
Biyabana qalmadı.

Qiyyəsi dağa düşdü,
Lələyi bağa düşdü,
Qartal torpağa düşdü,
Asimana qalmadı.



Atəş şamı əritdi,
Səbir də bitdi-getdi,
Qəbir də itdi-getdi,
Qəbristana qalmadı.

## ÖMRÜN YAZI-QIŞI VAR

Nə sehrdi, nə işdi -
Kəramət hasil oldu:
Iki könül sevişdi
Məhəbbət hasil oldu.

Baxışdan nur ələndi,
Dodaqlar busələndi,
Yanaqlar busələndi,
Məlahət hasil oldu.

Hər aşiqin var andı:
Yar peymanı, yar andı!
Evdə səfa yarandı,
Təravət hasil oldu.

Ömrün yazı-qışı var,
Enişi-yoxuşu var...
Duymayanda yarı yar,
Şikayət hasil oldu.

Vüsal çıxıb gedəndə,
Hicran gəlib yetəndə,
Bir gün ömür bitəndə
Fəlakət hasil oldu.

## INSANI ÖLDÜRMƏ, AMANDI, INSAN!

Tanrının cahanı insana qalıb,
Deyiblər "cahanda cahandı insan".
Cahanın gümanı insana qalıb,
Cahana ümiddi, gümandı insan.

Insan var qapılıb öz aləminə,
Bilməz ki, aləmin dərdi, qəmi nə.
Bəzi insanlara meymun-nümunə,
Gördüyü əməllə əyandı insan.

Qoy yaxşı əməlin səni tanıda,
Tikən, quran əlin səni tanıda,
Öldürmək günahdır lap heyvanı da,
Insanı öldürmə, amandı, insan.

Dənizin dibindən nefti çıxarma,
Demə ki, qazancdı, kefdi, çıxarma,
Demə sudan çıxan nəfdi, çıxarma,
Qoyma, dəniz yandı, su yandı, insan.

Insan var önünə baş atılmalı,
Insan var başına daş atılmalı,
Insan var əbədi yaşadılmalı,
Ey Şahin, yaxşıdı, yamandı insan.

## OXŞAMA, OXŞA...

Təkəm,
bulud kimi dolmuşam yenə,
Sən göysən,
mavi göy,
mən qara səma.
Sənsizəm,
pərişan olmuşam yenə,
Oxşama,
gözəlim,
mənə oxşama.
Gün çıxar
buludlar
dağılan kimi,
Gələrsən yanıma,
gülüm,
yenə sən.
Yenə şadyanalıq
sarar qəlbimi,



O zaman deyərəm
oxşa mənə sən!
Oxşa mənə sən!

## DEYIL

Dağ
zirvəsiz
dağ deyil!
Bağ
meyvəsiz
bağ deyil!
Şahin
sənsiz
sağ deyil!
Sağ deyil!

## ZAQATALA TORPAĞI

Elədi heyran məni
Zaqatala məskəni.
Gərək neçə aşiqi,
Gərək neçə sevəni
Eşqə sala torpağı,
Zaqatala torpağı.

Baxıram sola, sağa,
Heyranam bağa, dağa.
Meyvələri bir yana
Batıb başdan-ayağa
Yağa, bala torpağı,
Zaqatala torpağı.

Bu yerdə Car kəndı var,
Bərəsi var, bəndi var.
Çəkər yoldan ötəni,
Elə bil kəməndi var.
Meşə, tala - torpağı,
Zaqatala torpağı.

Düşmən haray qopardı,
Zərbi saray qopardı...
Çox igidin məskəni
Burda bir qala vardı,
Torpaq - qala torpağı,
Zaqatala torpağı.

Olsa zərurət, nə qəm,
Lap canımdan keçərəm.
Varsa yalan sözümdə
Razıyam elə bu dəm
Canım ala torpağı,
Zaqatala torpağı.

## QAXDA BAYATI DEDIM...

Qax hanı?
Armud hanı, qax hanı?
Qıtlıq fələyə çıxıb,
Hanı bunun baxanı?

Düşünürdüm Qaxda var
Fındıq da var, qax da var.
Bunların əvəzində
Gəlib gördüm şaxta var.

"Qal" demə ha, dönərəm,
Bəsdir, daha dönərəm.
Qorxuram ki, soyuqdan
Qaxda qaxa dönərəm.

Qax təki,
Şəhərim var Qax təki.
Kürmük çayı, təbim tək
Çağla təki, ax təki.

Gili su,
Aparacaq gili su.
Ağ örpəyə bürünmüş
Bir gəlindir İlisu.



İlisu,
Dağ qoynunda İlisu.
Qar yağıb, bu dağların
Ağ qoynunda - İlisu.

Süzdüm bağı, dağı mən...
Görməmişdim Qaxı mən.
Gözəlliyin önündə
Mat qalmışam axı mən.

Qax yada,
Hey düşəcək Qax yada.
Adamların dilindən
Burda avaz axmada...

## YEVLAXDA BAYATI DEDIM...

Yevlaxı,
Görməmişdim Yevlaxı.
Deyirdilər "bərbaddır",
Gəlib gördüm deyil axı.

Çoban dağa bəzəkdir,
Bağban bağa bəzəkdir.
Qudyal çayı Qubaya,
Kür Yevlaxa bəzəkdir.

## BARIŞDAN SONRA

Baxıram üzünə,
nə olub?
Gəl danış düzünə,
nə olub?
"Sevirəm" sözünə
nə olub?
Yaş axır, gözünə
nə olub?
Küsdürən bizi nə,
nə olub?
Mən sənərn,

Sən mənsən,
Mən, sən - biz
ikimiz, ikimiz, ikimiz.

Çalmışıq hicrana
qələbə,
Fəryada, fəğana
qələbə,
Çiskinə, dumana
qələbə,
Pisliyə, yamana
qələbə,
Sevgisiz hər ana
qələbə
Sənlə mən,
Mənlə sən,
Sən, mən, biz
ikimiz, ikimiz, ikimiz.

Yandıraq çırağı
təzədən,
Bəzəyək otağı
təzədən,
Gəl açaq qucağı
təzədən,
Görməyək fərağı
təzədən,
Çəkməyək o dağı
təzədən
Təki mən,
təki sən,
təki biz
ikimiz, ikimiz, ikimiz.



## NƏRD OYNAYAN QOCA KIŞININ HEKAYƏTI

*Dostum Adil Əlizadəyə*

Şeş qoşa... dörd çahar... pənc sə...
Zər atmışam həmişə,
Nərd oynamışam həmişə.
Zərlərimi
cütləmədən atmışam...
Gənc idim, cavan idim, yaxşı gəlirdi qoşam.
Şeş qoşa -
kəndimizdən instituta birbaşa...
Şeş qoşa -
əzdim qolçomaqları
qəzəbdən coşa-coşa...
Şeş qoşa -
çatdım düz Reyxstaqa...
Şeş qoşa -
zərimə zər düşdü - Tamaşa,
Gözümün nuru,
mənim canım - Tamaşaxanım.
O vaxtdan bu vaxta kimi
Tamaşaxanım əzizləyib sevgimi
bu lələşin yarı olub.
(Ay-hay, gidi dünya,
o vaxtlar ona "xanım" deyərdilər,
indi "qarı" olub...)
Şeş qoşa -
övladlarım qoşa-qoşa:
Əmirqulu, Əliheydər,
Ələkbər, Ələsgər.
Yaxşı gəlirsən, ey zər!..
Şeş qoşa -
nəvələrim də qoşa-qoşa:
Valeh, Saleh,
Adil, Paşa.
Dörd çahar!..
Ey zər, nə xəbərdir, nə var?
Dörd çahar!..
Zəhrmar!..
Dörd çahar!..

Şükür buna da, Pərvərdigar!..
Pənc-sə!..
Yeriyə bilmirəm əllərim əsaya dəyməsə...
Sə-dü!..
Ömürdən illər ötdü...
İndi yaşım səksəndir,
Dü-bir...
Dü-bir...
Dü-bir...

## HAMİLƏ YER

Sanki qarnıdır
dağların hər biri
hamilə Yerin.
Çəkdiyi ağrıdan tərpənişidir
Zəlzələ - Yerin.
Yer uzun əsrlər hamilə olur.
Günün bir günü
Vulkan adlı uşaq ondan doğulur.

## SÖZÜM, GÖZÜM, NURUM, DÜRRÜM, ODUM

Qəlbimdə sözüm var,
Özü də elə bir söz ki,
onu bircə kəsə söyləmək olar.

Qəlbimdə gözüm var,
Üzümün iki gözü
Həmin gözlə hamıya baxar.

Qəlbimdə nurum var,
Qaranlıqda qalıb qorxmayasan deyə
orada, ey yar.

Qəlbimdə dürrüm var,
Ürəyidir o mənim ilham pərimin,
Par-par yanar.
Qəlbimdə odum var,
Vermıməliyəm onu



payız güləklərinin ixtiyarına,
Aləmi yandırar.

## ROMANS

An kimi ötüb getdin,
Getməsəydin sən amma
Daxil ola bilərdin
Ömrümə, həyatıma.

Yenə gördüm, ey dilbər,
Gördüm bu gün səni mən.
Görüb işini illər,
Qar keçib başın üstdən.

Həm də artıb öz yaşım,
Ötüb neçə bahar, qış...
O vaxt axan göz yaşım
İndi də qurumamış.

## EY PALID AĞACI!

Acıq ona, acıq!..
Minnətdaram sənə, ey ağac,
Ey palıd ağacı.
Kişi kimi
yaxşı çıxdın heyfimi
Ondan -
Bıçaqla sənin gövdəni cızan
və səndə adını yazan
oğlandan.
Yaxşı yadımdadı,
Qış qurtarmışdı,
Yazdı.
O gövdəcızan
adını yazdı
sənin üstündə.
Buna görə mən də
dalaşdım onunla,
yıxdıq yerə bir-birimizi,

əzdik, əzildik o ki var...
Bu il görüşünə gəldim sənin,
Nə görsəm yaxşıdı,
cızılmış hərflərin yerini
örtmüsən qabığınla
o gövdəcızanın acığına.
O elə düşünürdü ki,
Adını cızmaqla səndə
adı yaşayacaq
sən yaşayana qədər.
Hədər düşünürmüş, hədər!..
Acıq ona, acıq!..
Minnətdaram sənə, ey ağac,
Ey palıd ağacı!

## EY AŞIQLƏR!..

O gündən ki,
o gül mənə könül açıb,
Gözlərimdən yuxu qaçıb.
Hər dəm
Onu düşünürəm.
Düşünürəm onu hər an.
Onun adı yaddaşıma həkk olandan
Bircə adı
eşitmədə qulaqlarım,
Belə məhrəm narahatlıq
yaradıbdır məndə yarım.
Bu halıma
amma
şadam,
Çevrilmişəm keyfiyyətə -
O afətə
Mən büsbütün
pərəstişəm,
sitayişəm,
etiqadam.
Indi başqa adım da var:
Aşiq adam!
Mənə



qorxub yaxın düşmür
daha ələm,
Bundan sonra daha mənə
nə dərd, nə qəm?
Çay-çay fərəh içmədəyəm,
Göl-göl sevinc içindəyəm.
Ah, bu dəmim nə gözəldir!..
Xoşbəxtəm ki, uçub gəldi
düz kəlləmə qondu mənim
sevgi quşu.
Mən
tənhalıq bayquşunun
caynağında əsir ikən
sevgi oldu qurtuluşum.
Xoş bəxtim var,
Anladım ki, xoşbəxtliyin
açarı var o gözəldə.
Mən aşiqi təbrik edək,
ey aşiqlər,
Eşqi bayraq edib əldə
bəşəri bir xoşbəxtliyə
doğru gedək,
ey aşiqlər.
Ağ bəxtim var,
Xoşbəxtəm ki,
qara gözlü bir gözələ
tuş olmuşam,
Ey aşiqlər, mən də sizin
cərgənizə qoşulmuşam.
Mən eşqimi sevəcəyəm
səma boyda,
dünya qədər.
Ey aşiqlər!..
Ey aşiqlər!..

## MƏSLƏK, MƏFKURƏ, ƏQİDƏ

Həyatda çox şeyi itirə billəm,
Mən
hələ kitaba çevrilməyən
dəftər şerlərimi,
şer dəftərlərimi
itirə billəm.
Dincliyimi,
rahatlığımı,
yuxumu
itirə billəm.
Günlərin bir günündə
varımı-yoxumu
itirə billəm.
Əgər taleyimə yazılıbsa
şöhrətimi, şanımı,
Şairlər demişkən,
canıma can verən cananımı
itirə billəm.
Çox şeyi itirə billəm
o itkilər
yer eləsələr də ürəkdə
dərd kimi,
Mərd gərək
hər itkiyə dözə
mərd kimi.
Itirərəm başımı!
Amma siz
nə heyfislənməyimi görərsiniz,
nə də duyarsınız təlaşımı.
Çox şeyi itirə billəmsə də,
Sözün cəmi:
Itirmərəm
məsləkimi,
məfkurəmi,
əqidəmi!



## KÜLƏK

Külək yarpaqları biri-biriylə
Vuruşdurmada.
Külək budaqları biri-birinə
Dolaşdıraraq,
dalaşdırmada.
Ya, bəlkə külək
Vasitəçi tək
Həsrət yarpaqları biri-biriylə
Öpüşdürmədə?
Bir "gövdə" ananın bətnindən çıxan,
Yanaşı dayanıb kənara baxan
Bala budaqları görüşdürmədə?..

## KIŞI KIMI

Kişi ol!, qadınım!
Yeri düşəndə
Olsun qoy səndə
bəzi kişilərdə olmayan
kişilik ləyaqəti.
Qoru
göz bəbəyin tək
məhəbbəti!
Qoru bizi!
Qoru bəşəri eşqin
bir zərrəsi olan
eşqimizi!
Qoru sülhü -
yer kürəsinin
ən ümdə işi kimi,
Kişi ol, qadınım!
Yaşa
Kişi kimi!!!

## ÜÇ SƏDA - HEÇ SƏDA

Üç səda...
Üç səda...
Üç səda...
Ötsə də əsrlər

bu qoca dünyada,
Quş qanadlı illər
quş kimi uçsa da,
Əbədi qalıbdır deyəsən
üç səda:
Boz bir çöl,
sərt bir dağ,
bir quyu -
Üç səda.
Bir Məcnun,
bir Fərhad,
bir Yusif -
Üç səda.
Bir Leyli,
bir Şirin,
Züleyxa -
Üç səda.

Bir Şahin,
bir afət,
bir azad məhəbbət -
heç səda!

## CAVANLIQ - QOCALIQ

Hər yaşın öz yeri - düşünürəm mən,
Ağac böyüdükcə çoxalır barı.
Yaşım qocalığa yetib deyəsən,
Ona lağ etməsin cavanlıq barı.
Hər buğda rüşeymi neçə sünbülün,
Çiçəklər - meyvənin,
qönçələr - gülün
Cavanlıqları!

## BUZƏRIDƏN

Isti ürəyimin yenə var buzu,
Bu buz axırıma çıxacaq mənim.
Haçan əriyəcək intizar buzu?
Hayanda qalıbdır Buzəridənim?



Görən, necə qovum yana hicranı?
Vüsal yazıq olub, düşüb kəməndə.
Könül qan olurmuş intizar anı,
Ürək çəkilirmiş göz yol çəkəndə.

Intizar alovmuş ömür isə şam,
Könlümü alışmaq qorxusu sarıb.
Sormayın ki, neçin şair olmuşam,
Sormayın ki, saçım neçin ağarıb.

Ayrılıq nisgili canı incidib,
Qəm yükü çəkmişəm hey hambal kimi.
Vətən intizarı məni zar edib,
Canan intizarı əyib qəddimi.

Isti məhəbbətmi canı qoruyub?
Dondurub buz məni, örtüb qar məni.
Qocalda-qocalda pis günə qoyub
Qürbətdə çəkdiyim intizar məni.

Hicran işi saılb yenə müşkülə...
Qar yağır, qoy yağsın, sevənə nə qəm?
Qar deyil, səmadan daş yağsa belə
Vədimi yerinə yetirəsiyəm.

Odur ki, vədimdə xilaf yox mənim,
Yamanca buz imiş intizar buzu.
Eybi yox, nazənin Buzəridənim
Gələrək edəcək indi zar buzu.

Mənə söz deyəcək yenə səmimi,
Yenə sevinəcək ürəklərimiz.
O intizar buzu əriyən kimi
Vüsal sularında çiməcəyik biz.

Amma, o gəlməyir, varmı səbəbkar?
Görəsən kim girib araya belə?
Buzmu səbəbkardır, qarmı səbəbkar?
Mən kimi çağırım haraya belə?

İsti ürəyimin yenə var buzu,
Bu buz axırıma çıxacaq mənim.
Haçan əriyəcək intizar buzu?
Hayanda qalıbdır Buzəridənim?

## GÖRÜNMƏYIRSƏN

Yenə aramızda duman göründü,
Görünməyirsən.
Ayrılıq göründü, hicran göründü,
Görünməyirsən.

Söylə, intizarım çoxmu çəkəcək?
Nisgilim, qubarım çoxmu çəkəcək?
Ürəyin çəkilsin sənin mənim tək,
Görünməyirsən.

Mən öz sızıltımı neydə görürəm,
Könsümü açmayır mey də, görürəm,
Sönən ulduzu da göydə görürəm,
Görünməyirsən.

Üzündə günəşi, ayı görürəm,
Səsində bulağı, çayı görürəm,
Mən səndə bir sevgi payı görürəm,
Görünməyirsən.

O isti vüsalın uzaqda qaldı,
Canımda bir soyuq, bir şaxta qaldı,
Sənin görünməyin havaxta qaldı?
Görünməyirsən.

Nəzərin üzümü yandıraydı kaş,
Baxışın gözümü yandıraydı kaş,
Atəşin özümü yandıraydı kaş,
Görünməyirsən.

Xəbər yox həzzdəsən, ahuzardasan,
Bəlkə çətindəsən, bəlkə dardasan,
A zalım balası, haralardasan?
Görünməyirsən.



Xəyalsan, ümidsən, gümansan, şəkksən,
Bir gözəgörünməz gülsən, çiçəksən,
Gözümə, de haçan görünəcəksən?
Görünməyirsən...
Görünməyirsən...

## ÖMRÜN PAYIZI

*"Quba tarixi" adlı kitabımın sponsoru olan dostum Fəxrəddin Qubalıya (Əliyevə) - qəlbi bahar insana!*

Gözüm bahar adlı pəridə qaldı,
Payızdan qorxuram, qorxuram nəsə.
Ömrün yay fəsli də geridə qaldı,
Payızdan qorxuram, qorxuram nəsə.

Artsa da arabir qəmi sinənin,
Qəlbini qırmadım bir kimsənənin,
Əlini sıxsam da payız nənənin,
Payızdan qorxuram, qorxuram nəsə.

Artsa da çal-çağır, toy həvəsləri,
Gəlsə də tar, kaman, zurna səsləri,
Bizi tərk eləyir durna səsləri,
Payızdan qorxuram, qorxuram nəsə.

Şairəm, qəlbimin söz aləmi var,
Yanğı aləmi var, köz aləmi var,
Hərçənd payızın da öz aləmi var,
Payızdan qorxuram, qorxuram nəsə.

Ağac məhrum olur ağac barından -
Ağac dövlətindən, ağac varından.
Yarpaqlar üzülür budaqlarından,
Payızdan qorxuram, qorxuram nəsə.

Bitir gül mövsümü, bağiban gedir,
Onun da qəlbindən qara qan gedir,
Payızın cövründən peşiman gedir,
Payızdan qorxuram, qorxuram nəsə.

Bahar, yay nəsimi üzə dəyməyir,
Ot-ələf boy atıb dizə dəyməyir,
Payızda bənövşə gözə dəyməyir,
Payızdan qorxuram, qorxuram nəsə.

Çox eli dərviş tək mən dolaşmışam,
Dərələr keçmişəm, dağlar aşmışam,
Nə qədər qorxudan uzaqlaşmışam,
Payızdan qorxuram, qorxuram nəsə.

Yaşın qış pilləsi geridə qalıb,
Qışın qış silləsi geridə qalıb,
Qışın cüt çilləsi geridə qalıb,
Payızdan qorxuram, qorxuram nəsə.

Kimi divanə tək daş həvəsində,
Kimi gül şövqündə, quş həvəsində,
İşə bax, mən isə qış həvəsində,
Payızdan qorxuram, qorxuram nəsə.

Ən mənhus inqilab payızda oldu,
İnqilabdan əzab payızda oldu,
Nə qədər iztirab payızda oldu,
Payızdan qorxuram, qorxuram nəsə.

Yol gedir qatarı payız ömrümün...
Çox da xoş keçməyib mənə ömür, gün,
Qorxuram payızda sənə ömür, gün,
Payızdan qorxuram, qorxuram nəsə.

Canım, nə tez gəldi payızı yaşın?
Ölüm arasında göz ilə qaşın,
İştahı artacaq əcəl qardaşın,
Payızdan qorxuram, qorxuram nəsə.

Hələ cahillərlə döyüşlərim var,
Hələ qafillərlə döyüşlərim var,
Hələ görülməmiş çox işlərim var,
Payızdan qorxuram, qorxuram nəsə.



Bir yara vurub ki, izləri aydın,
Qoy olsun şairin sözləri aydın:
Payızdan çıxanın gözləri aydın!
Payızdan qorxuram, qorxuram nəsə.

Ömrün payızından çıxacağammı?
Qışın sərt əlini sıxacağammı?
Qorxunun evini yıxacağammı?
Payızdan qorxuram, qorxuram nəsə,
Qorxuram nəsə...

## MƏCNUNA DÖNMÜŞƏM LEYLA XƏBƏRSIZ

Bir qoşma qoşuram o yar eşidə,
Deyil əhvalımdan qoşma xəbərsiz.
Dünyanın çoxaldı bir aşiqi də,
Sevdaya düşmüşəm sevda xəbərsiz.

Nə vaxtdır qopmayır məlal canımdan,
Cütəlli yapışıb xəyal canımdan,
Duyğumdan, hissimdən, həyəcanımdan
Xəyal xəbərsizdir, xülya xəbərsiz.

Dərd-sərim dünyanın vecinə deyil,
Kədərim dünyanın vecinə deyil,
Qəhərim dünyanın vecinə deyil,
Dünyadan küsmüşəm dünya xəbərsiz.

Qara gün qaradır, ağa çatmayır,
Bülbüləm, sorağım bağa çatmayır,
Səhranın istisi dağa çatmayır,
Dağın soyuğundan səhra xəbərsiz.

Ayrılıq ağırdır, hicran yamandır...
Poladmı, dəmirmi, canım nə candır?
Adım Şahin idi, amma haçandır
Məcnuna dönmüşəm Leyla xəbərsiz.

## TƏRƏZİ DAŞINI İTİRMİŞƏM MƏN

Cavanlıq üzüyün qaşı kimidir,
Üzüyün qaşını itirmişəm mən.
Sevincim gözümün yaşı kimidir,
Gözümün yaşını itirmişəm mən.

Günün yaxşısı var, günün pisi var,
Əlində zamanın tərəzisi var,
Tərəzi daşıdır günlər, a dostlar,
Tərəzi daşını itirmişəm mən.

Vüsala azalıb inamım mənim,
Bir də olacaqmı bayramım mənim?
Könül sirdaşımdı ilhamım mənim,
Könül sirdaşımı itirmişəm mən.

Düşübdür başıma qürbətin daşı,
Qəmim kədərimlə durub yanaşı,
Ey Şahin, hardadır kələfin başı?
Kələfin başını itirmişəm mən.

## QANADI QIRILMIŞ BİR ŞAHİN KİMİ

Yazdığım məktuba almıram cavab,
Yayın istisində donub qalmışam.
Bu nə sıxıntıdır, bu nə iztirab?
Quş tək bir budağa qonub qalmışam.

Adım çəkilərdi mərdanələr tək,
Dostlara baxıram biganələr tək,
Yar-yoldaşsız qalan divanələr tək
Tənha öz-özümə dinib qalmışam.

Vətəndən aralı inlədi könlüm,
Kim bunu bilməyir incədi könlüm?
Vüsala nə oldu, incidi könlüm,
Hicranın üzünə çönüb qalmışam.



Özümü bəxtəvər sanmıram daha,
Hətta yarımı da anmıram daha,
Od idim, atəşdim, yanmıram daha,
Üstümü kül basıb, sönüb qalmışam.

Kim duyar burada mənim dərdimi?
Daha çalınmayır qəlbimin simi.
Qanadı qırılmış bir şahin kimi
Səmadan torpağa enib qalmışam.

*Kabul şəhəri*

## SƏKKİZLİKLƏR

Mədh edirik sevgini, amma riya var ki, var,
Sevgidə sevgisizlik zahir imiş, bilmədim.
Əhdinə güvəndiyim o bivəfa yar ki var,
Əhdini sındırmağa qadir imiş, bilmədim.

Bəd günündə günlərin cana bəla o canan
Həzin şerlərimi həzin oxuyan zaman
Yoxluğumu dərk edib dillənəcək: Ay aman,
Mənim Şahin sevgilim şair imiş, bilmədim.

***

Həmənki deyiləm, tanı yarını,
Sən mənim yanıma qayıtsan haçaq
Üzünü, gözünü, dodaqlarını
Isti busələrim... şallaqlayacaq.

Daha tərk eləyib rəhm qəlbimi,
Gözlərəm yolunu "sərt" ürəklə mən.
Sən mənim yanıma qayıdan kimi
Səni döyəcəyəm... gül-çiçəklə mən.

***

Şer sərsərisi, söz sərsərisi! -
Məni layiq görün, layiq bu ada.
Qaçır ata minib ilham pərisi,
Mənsə izləyirəm onu piyada.

Şer xatirinə, söz xatirinə
Gərək verə mənə o pəri ilham.
Atı boşlayaraq lap peykə minə,
Mən kişi deyiləm ona çatmasam!

## DÖRDLÜKLƏR

Hava ağırlaşıb yenə elə bil,
Gərək ciddi qalaq hava qeydinə.
Oksigen balonu gərəyim deyil,
Balonsuz oksigen gərəkdir mənə.

***

Canan uzaqlarda, can fələkətdə,
Qüssə də burdadır, qəm də burdadır.
Ürəyim vətəndə, cismim qürbətdə,
Fikrim həm ordadır, həm də burdadır.

*Kabul şəhəri*

***

Sevgi adlı ağac hələ yenicə
Mənim sinəm içrə çiçəklənibdir.
Necə sevinməyim, gülməyim necə,
Ürəyim çiçəklə bəzəklənibdir.

***

Insanı ucadan, çalış, uca san,
Demə uca nə var zirvə boydaca?
Dağın zirvəsinə qalxırsa insan,
Dağın zirvəsindən deyilmi uca?

***

Yenə də tənhalıq!.. Nə zülümdü bu!..
Yanımda yar da yox, gözdə yuxu da.
Mənə yuxu göndər, Ilahi, yuxu,
Yarı heç olmasa görüm yuxuda.

***

Keçmişdə qəzəlxan şair adlanıb,
Indi isə şair qəzəlxan deyil.
Qəzəl külə dönüb... alışıb... yanıb...
Qəzəl külə dönüb... yox olan deyil!



***

Cismimi yandırır pərvanə özü,
Yanmaqdan savayı yox mənim peşəm.
Görür məhrəm gözü, biganə gözü
Şair tək yanmağa adət etmişəm.

***

Aşiq yorulubdur daha, ey yar, naz almır,
Hər badəyə gər saqi can istərsə, az almır.
Meyxanədə mey qeyb elədi təsiri, amma
Sevda meyinin təsiri artır ki azalmır.

***

Qəm yeriyir, qüssə gəlir, ah baxır,
Gah yüyürür, gah dayanır, gah baxır.
Zilləmişəm mən gözü yerdən göyə,
Şahina, göydən yerə Allah baxır.

***

Dərvişin seyrdən özgə işi vardırmı görən?
Aləmin Imrə kimi dərvişi vardırmı görən?
Dili "Leyla" dedi hər ləhzə yazıq Məcnunun,
Şahina, Məcnuna bənzər kişi vardırmı görən?

***

Yar ilən eyləyirəm iftixar hər ləhzə,
Iftixar eyləməyir mənlə yar hər ləhzə.
Şahina, ömr qısalmaqda dəmadəm, çünki
Saqqalım tək uzanır intizar hər ləhzə.

***

Biz də nəyi isə qorxudarıqmış!..
Elə birləşmişik bir-birimizə
O vüsal qənimi hicran karıxmış.
Yaxın düşə bilmir qorxudan bizə.

# QİTƏLƏR

(MÜQƏTTƏAT)

Qiymətin baş götürüb qalxması məlumdu mənə,
Ey xəbərçi, mənə gəl vermə xəbər qiymətdən.

Hər şeyin qiyməti artıbdır ölümdən başqa,
Mənəvi aləmimiz çəkdi zərər qiymətdən.

Harda qalmış görəsən dadə yetən kəs, ey dad?
Çoxmu dad eyləyəcəkdir bu bəşər qiymətdən?

Gül-çiçəkdən nə qədər yazmaq olar, ey şair,
Barı bir yol da yaransın qoy əsər qiymətdən.

Cəhd elə düz qəzələ hər sözü zərgər sayağı,
Düz düzülməzsə, düşər, bəlli ki, zər qiymətdən.

Elə şairlər olublar ki, şer satmışlar,
Şerimin qiyməti qiymətlidi hər qiymətdən.

*27.10.1995*

***

Nakam adamın halı yadımdan çıxa bilmir,
Şahin sayağı ağlayanın gülməsi müşkül.

Bülbül səsini mən kimi çox kəs eşidibdir,
Hər dilləyənə yetməyəcək gül səsi, müşkül!

Yoxdur buna heç şübhə ki, çox elmi bilən var,
Eşq elmini mən tək çoxunun bilməsi müşkül!

Ruhimlə bərabər uçacaq göylərə eşqim,
Çünki, belə eşqin, gözəlim, ölməsi müşkül!

Surət çəmənindən keçə bilməzsə qəzəlxan
Mənə deyilən mülkə yaxın gəlməsi müşkül!

*9.11.1995*



***

Bixəbərdim sanki hədsiz möhnətindən aləmin,
Çox təzadından zamanın yaxşı agahəm bu gün.

Dəmbədəm hicran ağırlıq salmadaydı qəlbimə,
Yox təmənnam indi heç kəsdən ki, gümrahəm bu gün.

Müşkülüm həll, işlərim yaxşı, nigarım mehriban,
Mən vüsalın mülkünü fəth eyləyən şahəm bu gün.

*10.11.1995*

***

Yandırırlar, dağıdırlar, talayırlar gerçək,
Bilmirəm ki, yiyəsizdir görəsən yer yiyəli?

Niyə əllər qoparır gül, niyə dillər dinmir?
Neçə sorğu "niyə"lidir, nə qədər sirr "niyə"li...

Xəbərin varmı ki, yoxdur xəbərindən xəbərim?
Məni üzdün axı sən burda, sorağ verməyəli.

Baxıram gündə - ziya, ayda - işıq əksilmir,
Azalır amma gözüm nuri səni görməyəli.

*18.11.1995*

***

Lovğalıq eyləməsin heç də cavan aşiqlər,
Gözəlim, çox elə aşiqlərə mən sərdarəm.

Lütfümə kimsə ümid eyləməsin aləmdə,
Bəzəyən təkcə sənin qəlb evini memarəm.

Kim görərsə məni meyxanədə hərdən, bilsin:
Sadə eşq əhlinə ömrüm boyu minnətdarəm!

Mənə heç vədə Züleyxalər əli dəyməyəcək,
Yusifin köynəyi əynimdəsə də, huşyarəm!

*22.11.1995*

***

Qəzəlin, saf qəzəlin saribanı oldum mən,
Karivan məqsədinə özbaşına çatmayacaq.

Elə söz söylə ki söz ağlamasın heyrətdən,
Göz yaşı olsa da sel, söz yaşına çatmayacaq.

Sirrini söyləmə hər kimsəyə, sirdaşına de,
Neçə sirdaş doğula, sirdaşına çatmayacaq.

Saribanlıq elə ki, karivanın, ey Şahin,
Sariban olmasa, mənzil başına çatmayacaq!

25.11.1995

***

Qəlbimdə mənim bil ki, ağappaq bir ümid var,
Biz zar edərik gülsə əgər vəsl, fərağı.

Zülmət mənə zülm eyləmədə hər gecə, yarım,
Gündüz məni axtar, gecədən alma sorağı.

Sən ki, günəşi göydə görə bilməyəcəksən
Yandırsan əgər lap gecə minlərlə çırağı.

28.11.1995

***

Aləm qəmini qəlbimə yığdım gecə-gündüz...
Idxal çox olmuş yenə, ixrac qalıbdır.

Eşqin qədəhi cilvələnir saqi əlində,
Amma bu sevən badəyə möhtac qalıbdır.

Yetsəm də vüsalə, hələ ki doyımamışam mən,
Vəsl arzulayan aşiqə bax, ac qalıbdır.

Getdin, gözəlim, xatirə qalmış mənə isti,
Köksüm kimi, bir də, alışan sac qalıbdır.

Eşqin ki, bu gün bir yeni peyğəmbəriyəm mən,
Eşq asimanında mənə merac qalıbdır.

2.12.1995

***

Vəslə yetmək arzularkən yetmədim mən kamıma,
Sən vüsalından məni, heyfa ki, məhrum eylədin.

Məlum idi aləmə qətiyyətim çoxdan bəri,
Möhkəm idim, qənbər idim, qənbəri mum eylədin.



Yox şirinlikdən əsər bir zərrə, şəkkər qeyb olub,
Bir həyatı öd kimi, bir ömrü zəqqum eylədin.

Dörd divardır, bir qapı, bir pəncərə - məhbəsdəyəm,
Sanki bir gənci ömürlük həbsə məhkum eylədin.

Qalmayıb dərya sevincim, ey pəri, bir damcı da,
Şahdağımdan həm böyükkən həzzimi qum eylədin.

4.12.1995

***

Gəzmədə hər yerdə gözüm Tanrını *,
Dinləyirəm gündə müqəddəs səsi.

Sanki bu cür kimsə eşitmir onu,
Dərk edə bilmir belə heç kəs səsi.

Bəd səs eşitcək, mənə qəlbim deyir:
Xəncəri al, doğra səsi, kəs səsi!

Istəyirəm tərk eləyim aləmi,
Bənd eləyir çünki bu məhbəs, səsi.

Şahina, irfanmı, təsəvvüfmü bu?
Aləmi kar etdi səsin, kəs səsi!

***

Dikəlibdir daha qəddim ki, fərağım bitmiş,
Qamətim az qala hicr ilə kaman olmuşdu.

Məni tənha qoyaraq sən hara yollanmışdın?
Həmdəmim sən gedəli ahü fəğan olmuşdu.

Heç təsəvvür eləməzdim bu təhər sevdiyimi,
Neçə eşq əhli təsəvvürdə güman olmuşdu.

Bilməsin kimsə mənim sirrimi səndən başqa,
Mənədək çox sevənin sirri əyan olmuşdu.

* Tehran şəhərində, otelin "Talare-vəhdət" adlı sarayında əgər cənublu şair dostum Rəhim Çavuş Əkbəri Yəsnayе-Təbrizi mənə XVIII əsrin məşhur şairi həkim Lətinin "Gəlir hər tərəfdən səsin, kəs səsi" misrasını xatırlatmasaydı, bəlkə də bu qitə yazılmazdı.

Eşqimi gizləyirəm, qoy deməsinlər bir gün
"Başıbatmış qoca sinnində cavan olmuşdu".

*19.01.1996*

***

Mən kitabxanəmə irfani kitablar yığdım,
İndi, əlbəttə ki, irfani sevinc lazımdır.

Məni Allah əbədi həzzə giriftar eləsin,
Deməərəm bir də "mənə ani sevinc lazımdır".

Deməərəm bir də sevinc ilə "fəna dünyadə
Cismimə, ey pəri, cismani sevinc lazımdır".

Deməərəm mən daha "lütf eylə şərab, ey saqi,
Rahət etmək diləsən cani sevinc lazımdır".

Ruhimin şahini qoy göylərə pərvaz eləsin,
İndi, canan, mənə ruhani sevinc lazımdır!

*21.01.1996*

***

Bütün ömrüm boyu düzgünlüyə meyl eyləmişəm,
Düzgünəm, əyri əməllər nəyə lazımdı mənə?

Sən ki varsan, mənə var yar, özünsən yalnız!
Gözəlim, qeyri gözəllər nəyə lazımdı mənə?

Yazıram şeri tutub dişlərim ilən qələmi,
Səni qucmazsa, bu əllər nəyə lazımdı mənə?

*23.01.1996*

***

Üzə gündən-günə qoy təzə bulaqlar çıxsın,
Göz yaşından yaranan qeyri bulaqsa qurusun.

Dodağın qırmızıdır, yoxsa boyaqdır qızaran?
Sünilikdən uzaq ol, gərçi boyaqsa, qurusun!

Gözəlim, əl ətəyindən yapışıbdır möhkəm,
Əl məhəbbət ətəyindən qopacaqsa, qurusun!

*26.01.1996*



***

Eşq səltənətində sənə şah söyləmişəm mən,
Mən bəndəyə lütf eylə, ümid şahə qalıbdır.

Hər gün nə həşirdir ki, cəfa toxmu əkirsən?
Bir bax sinəm üstdə nə qədər sahə qalıbdır?

Hey ah edirəm ki, onu Allah eşitsin,
İndi ümidim iztiraba, ahə qalıbdır.

Etmək mən edən yaxşılığı gəlmir əlindən,
Pislik həmişə nakəsə, bədxahə qalıbdır.

Canan işimi bir hala salmış ki, düzəlməz,
Billah, işim tək ulu Allaha qalıbdır.

*29.02.1996*

***

Baxıram öylə ki, "Məcməş-şüəra" məclisinə,
Görürəm orda bu gün yaxşı qəzəlxan çoxdur.

Elə şair görürəm gül qoxyur kəlmələri,
Qələmində, elə şair görürəm, qan çoxdur.

Elə şair görürəm beyti-təsəvvüf dəməti,
Amma vardır elə misrası ki, irfan çoxdur.

Elə şair görürəm şeri bütün təqliddir,
Niyə görmür axı təqliddə nöqsan çoxdur.

Elə söz gülşəni var ki, alağı güldən çox,
Elə söz meydanı var yad sözə meydan çoxdur.

Düşünək biz niyə vəsl atəşi var Xalidədə *,
Amma Şövkətdə ** neçin bir belə hicran çoxdur.

Bitəmənnanı *** nədir şerə təmənnalı edən?
Niyə Səyyardə **** fəryad ilə əfğan çoxdur?

---

* Xalidə Qaraçaylı
** Şövkət Hicran
*** Əliheydər Bitəmənna
**** Səyyar Tarıverdiyev

Gətirib şerinə monqol sözünü beziləri,
Niyə türk sözlərinə bir belə tüğyan çoxdur?

Nə üçün dəbdədi farsın, ərəbin kəlmələri?
Çox suallarda müəmma dolu pünhan çoxdur.

Yoxsa Şahin unudub indi ərəb-fars dilini?
Niyə Şahində o şairlərə üsyan çoxdur?

Azəri övladının öz dili vardır göyçək,
Tutiyə məmləkətimdə şəkəristan çoxdur.

Inanın, sizlərə çox hörməti vardır bu kəsin,
Mən zənn eyləməyin siz sizə böhtan çoxdur.

Öldürək şeytanı ki, hakim olub çox qəlbə,
Yaşadaq biz bizi bir halda ki, imkan çoxdur.

*8.03.1996*

***

Hər dərdü bəla məndə, hər zövqü səfa səndə,
Kim sən kimi ömr etsə, əlbəttə, kədər çəkməz.

Şəkkər ki, dodağından çəkmiş neçə illərlə,
Aşiq elə zardır ki, çoxdandı şəkər çəkməz.

Gər şişəyə daş dəysə, ya şişə daşa dəysə
Əlbəttə, sınar şişə, daş daşdı, zərər çəkməz.

*8.04.1996*

***

Elə öz aşiqini xar elədin, ey dilbər,
Mərhəmin var isə, mərhəm də qəbul etməyəcək.

Ona məqbul idi hicrin qəmi də, indi isə
Fərəhin bir yana, heç qəm də qəbul etməyəcək.

Sirrimiz aləmə car oldu, daha yar səni
Aşikar etməsə, mübhəm də qəbul etməyəcək.

Hətta dərmanı onun gər bilə Zəmzəm suyudur,
Verəsən sən ona Zəmzəm də, qəbul etməyəcək.



Cənnətə bəsləmə ümmid, ey edən əğyarlıq,
Səni cənnət də, cəhənnəm də qəbul etməyəcək.

*12.04.1996*

***

Nə günah eylədim, ey yar ki, qəddar oldun,
Sən atıb daş mənim badəmi sındırmışsan.

Məhrəm oldum sənə illərlə, haram işdir ki,
Sənə həmdəmlik edən məhrəmi sındırmışsan.

Vəslimiz möhkəm idi, hicranımız süst bizim,
Süstü möhkəmlədibən, möhkəmi sındırmışsan.

Səni Həvva düşünürdüm, özümü Adəm mən,
Necə Həvvasan axı, Adəmi sındırmışsan.

*15.04.1996*

***

Nə edim mən sənə məndən olasan sən razı?
Bəndəlik eyləyə billəm necə, şahım yoxdur.

Iki əldir, bir ətək, bir də sənin hökmündür,
Mənə, ey yar, pənah ol ki, pənahım yoxdur.

Göz yaşım mərmi deyildirsə də, yoxdur çarəm,
Ağlamaqdan savayı qeyri silahım yoxdur.

Ey savab əhli, axı mən nə günah eyləmişəm?
Bu günəhdirmi məgər zərrə günahım yoxdur?

Mən bu gün görməsəm hərgah səni verrəm can,
Sən bu gün gəlməyəcəksənsə sabahım yoxdur.

*17.04.1996*

***

Mən füzulluqdan uzaq, fəzlə yaxın bir şəxsəm,
Kimə qismətsə fəzilət ədəbi - fazildir.

Bilməyir qədrimi, əfsus ki, "Məcməş-şüəra",
Neçə şair ki, yazır saf, səbəbi - Fazildir.

Qəzəb eylər mənə hərdən məni duymaz kəslər,
Bir neçə mirqəzəbin bir qəzəbi - Fazildir.

Gəhi səhra kimi sakit, gəhi çöl tək dinməz,
Gəhi dərya kimi coşğun, əsəbi - Fazildir.

Türk dili öz dilimizdir, onu az-çox bilirik,
Oxuyan mən kimi farsı, ərəbi fazildir.

Sanmasınlar ki, qocalmış və nəzərdən düşmüş,
Neçə afət yenə səslər, tələbi - Fazildir.

Hanı Məcnun izi? Axtarmalıyam Misr içrə!
Aramaq istəyən hətta Hələbi - Fazildir.

Söyləyir bir neçə şair niyə "Fazil" adına?
Adı - Şahindi bu şəxsin, ləqəbi - Fazildir!

*18.04.1996*

***

Neçə divanə mənə indi paxıllıq eləyir,
Sən cünun eşqimi divanələrə bildirdin.

Sevgimi hifz eləmişdin neçə il dürr kimi,
Onu, zənn etmə ki, mərdanələrə bildirdin.

Bizdə var idi həqiqət dolu sevda gerçək,
Ülvi bir gerçəyi əfsanələrə bildirdin.

Yoxdu dürdanələrə səndəki dürrün dəxli,
Niyə öz dürrünü dürdanələrə bildirdin?

Kim bilirdi ürəyim nanə kimi əsməkdə?
Ürəyin əsdiyini nanələrə bildirdin.

Mən sənin sirrini hifz eyləmişəm sirr kimi,
Niyə sən sirrimi biganələrə bildirdin?

*13.05.1996*

***

Hey cavanlıqda deyərdin "qocalım"... Ey Şahin,
Qocalıbsan, daha yaş çoxdu, buyur döz yaşına.



Göz yaşın, yığsan əgər, bir neçə dərya eləyər,
Kipriyindən süzülən qəmdi, dönüb göz yaşına.

Ey xumargöz gözəlim, bir daha giryan olma,
Bu pərişanda dözüm varmı xumargöz yaşına?

O nə sözlərdi deyirsən mənə sən hərdənbir?
Az qalıbdır ki, sözündən utanıb söz yaşına.

*30.05.1996*

***

Şuşada məscidimi zəbt eləyib kafərlər,
Allahım, orda müsəlmanıma yer yoxdu daha.

Tullayın badəni, mən badəni tərk eyləmişəm,
Sındırın qəlyanı, qəlyanıma yer yoxdu daha.

Yarımın həzzi mənim şənliyimi artırdı,
Gözü nurlandı fərəhdən, yanağı al oldu.

"Divan"ım bir neçə bədxahıma divan tutdu,
Neçə qal əhli sükut eyləyərək lal oldu.

Hər qəzəl hər paxılın qəlbinə çox xal saldı,
Hər sözüm amma xeyirxah adama bal oldu.

Hacı Mail, Sona, Pünhan məni vəsf eylədilər,
Neçə batman idi dərdim, neçə misqal oldu.

Çoxalıb məndəki ilham ikiqat gücləndi,
Rüstəm idi bu qəzəlxan, dönüb Zal oldu.

Söz gülüstanımı etməklə alağdan xali
Söylədim "xəlqi deyin söz", niyə cəncal oldu?

Səni millət başa düşmürsə əbəsdir şerin,
Lüğətə baxmada bir çoxları bihal oldu.

Bu şer sahibi hər şerə rəvanlıq veribən
Elinin söz yükünü çəkmədə hambal oldu.

Köhnə "Divan"ı bitirdim, təzəsi hazırdır,
Yeni "Divan" yaratmaq mənə amal oldu.

*17.06.1996*

***

Çox şey bilirəm, bilməz zənn eyləmə heç vədə,
Hifz eylədiyin sirri bilsəm inanarsanmı?

Dağ dəldi külüng ilə, aləm dedi "Aşiqdir!",
Mən Şahdağı barmaqla dəlsəm inanarsanmı?

Ölmürsə əgər şeri şair diridir gerçək,
Sən öldüyümə, canan, ölsəm inanarsanmı?

*19.06.1996*

***

Elə ki, gördü qız üstündə dönüb məzhəbdən,
Ərəbistan dedi: - Sənanıma yer yoxdu daha.

Yenə ilham pərisi gəlmədi... xahiş gözlər...
Hökmümə, əmrimə, fərmanıma yer yoxdu daha.

Necə gündür ki təkəm, qovlamışam hicranı,
Bilməyir vəsl ki, hicranıma yer yoxdu daha.

Məqsədə yetməyirəm varsa da çox imkanım,
Necə mümkündü bu, imkanıma yer yoxdu daha.

Bu qədər qəm ki gəlir, can gedəcəkdir əldən,
Bədənim içrə mənim canıma yer yoxdu daha.

*4.06.1996*

***

Bədnəzərlər gətiriblər zara mən bədbəxti,
Sancılırmış gözünə bir çoxunun ox cismim.

Elə vəznim azalıb eşq qəmiylə, sanki
Tərəzi köynəyimi çəkmədədir, yox cismim.

*6.06.1996*

***

Qəmimin atəşi vurmazdısa ilhamə alov
Mizin üstündə varaq, əldə qələm yanmazdı.



Yanmasaydım mən əgər eşqə, canım odlanmaz,
Ürəyimdən süzülən gözdəki nəm yanmazdı.

Əhdi də, yar ilə peymanı da ləğv eyləyirəm,
Əsli olmazdısa, biçarə Kərəm yanmazdı.

*7.06.1996*

***

Neçə dərviş ilə Tehranda müsahib oldum,
Görüb insandakı heyvanlığı "yahu" dedilər.

Gördülər sehrinə düşmüş çox adam simü zərin,
"Görəsən kim eləyib bunlara cadu" dedilər.

*29.06.1996*
*Qum*

***

Məni həcv eyləmisən, eyləyirəm mən də həcv,
Səndə var xeyli günəh, mən də müqəddəs deyiləm.

Yazıram şerimi saf sözləri ilən dilimin,
Nə ərəbdən, nə də farsdan dilənən kəs deyiləm.

Daha da gur olacaqdır səsimin avazı,
Mən ötərgi, hədəri, sısqa, bəsit səs deyiləm.

*5.07.1996*

***

"Arı"nı "zənbur" edibsən, səni zənbur sancsın,
Gül kimi "bal" sözünü sən niyə "şəhd" eylərsən?

Sən yazan sözləri Seyyid neçə il öncə deyib,
Yoxsa Seyyid Əzimə yetməyi əhd eylərsən?

Var ikən şer səmasında Füzuli günəşi,
Niyə süst şəmini yandırmağa cəhd eylərsən?

*5.07.1996*

***

Həzzinə mən neçə məstin deyiləm biganə,
Ayığın çəkdiyi həzzi niyə məstlər bilməz?

Bilirəm doğma dilin qədrini aqillər tək,
Aqilin qiymətini əqlişikəstlər bilməz.

Nə tələb etmədəyəm köhnəpərəstlərdən mən?
Yenilik ləzzətini köhnəpərəstlər bilməz!

*5.07.1996*

***

Heç nədən mən səni tərif elədim hərdənbir,
Niyə narazı olubsan, ey özündən razı?

Şerimin siqlətini dərk edə bilməzsən sən,
Səni kim təyin edibdir ki, olubsan qazi?

O Füzuli babanı fənd ilə təqlid edərək,
Yaradırsan elə zənn eyləmisən ecazı.

Sən yazan şeri əgər istəsə hər naşı yazar,
Mənə həmtay isə yoxdur gəzəsən Qafqazı.

Kabula, Tehrana, Istanbula çatmış şerim,
Heç sənin şerlərin keçməyəcək Xaçmazı.

*5.07.1996*

***

Qənddən də şirin sözlərimə tənə edən var,
Qəndə "acıdır" söyləmək ilən acı olmaz.

Ölkəmdə bu gün çox şeyi hərracə qoyublar,
Hifz etməli pak eşqi! Onun hərracı olmaz!

Sən öylə cılız söz yaradansan göz önündə,
Səndə, gəl inan sən ki, böyüklük tacı olmaz.

Zəvvar olar, çünki ziyarətçi olubdur,
Hər həccə gedən kimsədən amma hacı olmaz!

*5.07.1996*

***

Köhnə sözlər məni bezdirdi, bilib söylədilər:
- Yenə söz naminə sağ cismi həlak etmədədir.

Tökürəm üstünə göz yaşlarımı lalələrin,
Çünki, hər qətrəsi tozdan gülü pak etmədədir.

*10.07.1996*



***

Sual etdim ki, neçin üstümə daş yağmaqda,
"Atmayın daş, - dedim mən, - yarılar baş axı".

Siz də şer əhlisiniz mən də şer əhli, neçin,
Niyə incitməlidir yoldaşı yoldaş axı?

Çox deyildir mənə bədxah, iki-üç adəmdir,
Məni görcək, görürəm ki, çatılır qaş axı.

Daş atan olmadı hətta mənə qürbətdə də heç,
Mənə daş atma vətəndə, a vətəndaş, axı.

Bu sualın cavabın Əlbaba* ərz etdi mənə:
- Niyə etmiş iki-üç kəs səni çaşbaş axı?

Heç görübsənmi ki, sərvə, söyüdə daş atıla?
Barsız bir ağaca kimdi atan daş axı?

*2.08.1996*

***

Hindukuşdan keçmişəm mən gəncliyimdə, indisə
Sinnimin bir həddidir ki, hər qaya - hündür mənə.

Aşinalər baxəbərdir, türfə günlər görmüşəm,
Günmüdür bu, gün bu isə, gün əcəb gündür mənə.

Sanmasınlar meydən ötrü gəlmişəm meyxanəyə,
Saqini görmək mey içməkdən çox üstündür mənə.

*22.08.1996*

***

Nöqsan arayırsan yenə şerimdə, sözümdə,
Zillət səni kəssin, mənə zillətmi verirsən?

"Zər qədrini zərgər bilər ancaq" deyilibdir,
Qiymətsiz özünsən, mənə qiymətmi verirsən?

Bir yaxşılığı görməmişəm gəlsin əlindən,
Sən nəzrini əlsizlərə xəlvətmi verirsən?

---

* "Məcməüş-şüəra"nın üzvü xanəndə Əlibaba Məmmədov

İllərlə namaz qılmayıb, ey "mömün" olan kəs,
Qılmaqla namaz Allaha rüşvətmi verirsən?

*24.08.1996*

***

Bir ömürdə bir çox ömrü başa vurdun, ey qəzəlxan,
Neçədir ömür - bilinməz, neçədir yaşın - tapılmaz.

Mənim ey qərəzli "dostum", sənə dost demək günəhdir,
Elə xudpəsənd adamsan iki sirdaşın tapılmaz.

Ağıram, nə bəhs edirsən belə faydasız mənimlə,
Tərəzində, çəkmək üçün məni, bir daşın tapılmaz!

*4.09.1996*

***

Harayım nalə yaratdı, kədərim qəm çilədi,
Harayım Mirzə Ələkbər dedi, naləm Cəfər.

Gəh dram yazdı, şer söylədi, gəh şərqi dedi,
Həmi Cabbarlı deyərlərdi ona, həm Cəfər.

İki ustadı itirmək məni məyus elədi,
Biri Rüstəm Əliyevdi, biri Əkrəm Cəfər.

*9.10.1996*

***

Öpürəm torpağını indi ey özbək diyarı,
Salam olsun sənə ey torpağı Teymurləngin.

Bu gözəl bayrama * gəlmiş nə gözəl insanlar,
Başlanıbdır təzədən növrağı Teymurləngin.

Neçə mərdanə savaş etdi... Savaş günlərinin
Qarası düşmənin oldu, ağı Teymurləngin.

Söz dedi, yazdı "Tüzukat"ını ** ilham ilə,
Bir yaşıl nəğmə idi söz bağı Teymurləngin.

Kafərə çəkdi o cür dağ ki, ötüb altı əsr,
Getməyibdir sinəsindən dağı Teymurləngin.

* Əmir Teymurun təvəllüdünün 660 illiyi ilə əlaqədar Daşkənd və Səmərqənddə keçirilən bayram günləri.
** Əmir Teymurun yazdığı əsər.



Köhnə bir düşmənə qarşı qəzəbim dalğalanır,
Dalğalansın təzədən bayrağı Teymurləngin.

*26.10.1996*
*Daşkənd*

***

Məni bir dəstə qəzəlxan gətiribdir təngə,
"Dərman"ı "daru" yazırlar, nə bilim "daru" nədir?

Hər "məcaz əhlinə zənciri-eşqdir geysu" *,
Yarımın saçları "saç"dırsa əgər "geysu" nədir?

Bülbülü mən "solovey" yazsam əgər düzmü olar?
"Aycamallım" demişəm dilbərimə, "məhru" nədir?

"Bərgi-güldür meyi-ləb ləli və ya, ətəşi-ab **?
Afərinlər, suya "ab" söylə həmişə, su nədir?

Bu ərəb şeri deyildir, nə də fars şeri deyil,
Nə də türk şeri deyildir, əcəba, bəs bu nədir?

*1.12.1996*

***

Razıyam mən qələmimdən girərək meydanə
Çox "mənəm" söyləyənə kəllə atıbdır qələmim.

Qələmim əl kimi tutmuş əlimi, əğyarə
Ən səlis sözlər ilə şillə atıbdır qələmim.

Bu qələmdirmi, deyildir, elə bil top lüləsi!
Nə qədər nanəcibə güllə atıbdır qələmim.

*4.12.1996*

***

Elə şirindi nigarım acılıq yox zərrə,
Elə şirin ki, onun göz yaşı da şirindir.

Olalı mən ona sirdaş şirinləşdi dilim,
Elə sirdaş olanın sirdaşı da şirindir.

Tökmüşəm mən ətəyimdən daha qürbət daşını,
Vətənin qənbəri şirin, daşı da şirindir.

*18.12.1996*

* Misra Mirzə Məhəmmədəli Binəvanındır.
** Misra Sadıq Rahilindir.

***

Şəhri anıb, düzdə məkan etmədi,
Qeysə baxın, "Leyli düzü"ndən gəlir.

Ulduzu gəl bir belə tərifləmə,
Aləmə gündüz gün üzündən gəlir.

Bir nəfərin tənqidi gəlməz vecə,
Şahinə tərifsə yüzündən gəlir.

*9.01.1997*

***

"Failatun" söyləyənlər çoxsa da, öz şerinə
Failatundan qəliz sözlər yazanlar az deyil.

Dağ basıblar sinəmə haqsız yerə, şükr eylərəm
Sinəmin üstündəki dağlar çalın-çarpaz deyil.

Ecaz oldur tər-təmiz sözlərlə nəzm olsun qəzəl,
Öz sözün varkən dilənmək özgədən ecaz deyil.

Etmək istərdim gülüstanı alağdan xali mən,
Tutduğum əldə qələmdir, çox heyf dəryaz deyil.

*20.01.1997*

***

Vəznin şahı, əlbəttə, əruz vəzni gözümdə,
Bir gün də görərlər o şahın tacı mən oldum.

Olmuşmu görən ac məni, könlüm tox olubdur,
Amma həmişə ülvi məhəbbət acı oldum.

Ağ çöhrədəki Kəbə xalından yarın öpdüm,
Mən həm hacıyam, Kəbəni öpdüm - hacı oldum!

*22.01.1997*

***

Xəlqin dili - sadə, qəsrin dili - rəngin,
Heç vədə deyilməz qəsrin dili göyçək.

Məsulluğu gördük nasirlərimizdə,
Nəzmin dili - bərbad, nəsrin dili - göyçək.



"Üşşaqi-müdəbbər..." *, yarəb, dilə bir bax!..
Öylə yazaq olsun əsrin dili göyçək.

*25.01.1997*

***

*Özlərindən razı hacıların*
*bir məclisində yazmışam.*

Ey adı başqa, özü Leyla olan,
Aləmə divanə kimi gəlmişəm.

Aşikar olsun, deyiləm mən kölə,
Mən bura şahanə kimi gəlmişəm.

Məhrəm adamlar məni incitdilər,
Yad kimi, biganə kimi gəlmişəm.

Bir də həlim görməyəcəklər məni,
Qeyz ilə üsyanə kimi gəlmişəm.

Eyləmirəm bülbülə heç etina,
Mən də gülüstanə kimi gəlmişəm.

Meyxanaçı, lütf eləmə mey mənə,
Mən bura məstanə kimi gəlmişəm.

Etmə himayə, mənə lazım deyil,
Nofəla! Mərdanə kimi gəlmişəm.

Aqilə fərzanəlik öyrətməyin,
Aqilü fərzanə kimi gəlmişəm.

Ey hacılar, məşhədiyəm, məşhədi,
Mən də Xorasanə kimi gəlmişəm.

*1.03.1997*

***

Mən ki qovğa etmişəm hicran ilə,
Gəlsə gəlsin, intizar neylər mənə?

* İdbar aşiqlər

Heç səfərdən qorxmadım dərviş olub,
Qum nə etdi, Qəndəhar neylər mənə?

Sərt Bədəxşan iqlimindən qorxmadım,
Bir desinlər indi qar neylər mənə?

Söz gəmim keçməkdədir ümmandən,
Şahə qalxan dalğalar neylər mənə?

*1.04.1997*

***

Ehramda yatırlarsa da çoxdan, sağı həm var,
Dünya üzünün söyləməyin Fironu yoxdur.

Ömrün sonu yetməkdədir, eşqimsə tükənmir,
Ömrün sonu var, amma ki, eşqin sonu yoxdur.

*22.04.1997*

***

Kim deyir şairə söz qalmayacaq?
Tapacaqsan sözü gər şairsən.

Bilirəm amma ki, iz qalmayacaq
Izin üstüylə gedən şairdən.

*30.04.1997*

***

Rədd ol göz önündən, səni görmək mənə dəhşət,
Dəhşət yaradanlardan uzaq olmadayam mən.

Hərdən dəlisov Qeys tək, hərdən dəliqanlı,
Hərdən qoca, hərdən də uşaq olmadayam mən.

Hərdən qələmim aldı bıçaq şəkli deyirlər,
Xain kəsə, əlbəttə, bıçaq olmadayam mən.

*2.05.1997*

***

Eşqə biganə olub hər nə qədər cəhd etsə
Zahidin, eşq evini yıxması, mümkünmü məgər?

Ey qəzəlxan, nə qəliz dillə yazırsan şeri,
Şahinin əllərini sıxması mümkünmü məgər?



Dairə oldu Füzuli, sən isə bir nöqtə,
Nöqtənin dairədən çıxması mümkünmü məgər?

*4.05.1997*

***

Dövrəmi, yaxşı ki, çox yaxşı adamlar bürüyüb,
Yad qədəm bassa bizim bağə qədəm sındırram.

Bu qədər məndə ki var güc qəmə üstün gəlləm,
Qoyaram başmağımın altına, qəm sındırram.

Qəzəlimdən qəzəlin bir gilə üstünsə əgər,
Mən mürəkkəb dağıdar, bil ki, qələm sındırram!

*24.05.1997*

***

Sözlər nə acı, sanki ağu qatılıb şerə,
Sözlər nə şirin, sanki qənd var dilim altında.

Cismim dolu ziddiyyət var məndə. təzadəm mən.
Var öylə tikanım ki, qalmış gülüm altında.

Ilhamıma tay olmaz, Qudyal çayıdır təbim!
Cahil məni dərk etməz, sel var selim altında.

Məsciddə dua şövqüm, meyxanədə cəngim var,
Quran başım üstündə, xəncər əlim altında.

Ay - günlərim üstündə, il - aylarım üstündə.
Gün var ayım altında, ay var ilim altında.

Bir qəm məni tərk etcək min bir qəmə tuş ollam.
Qəm var qəmim üstündə, qaldım zülüm altında.

Ulduzları qoy sönmüş zənn eyləməsin kimsə.
Mən sönməmişəm, yannam, od var külüm altında!

*18.06.1997*

***

Qadir adamın niyyəti bəlli, işi məlum.
Kim niyyətinə yetməsə qadir demək olmaz.

Nadirlərik yarım ilən canbir olandan,
Hər aşiqə, əlbəttə ki, nadir demək olmaz.

"Bir" üstə gələk "bir", eləyər "bir" nəzərimcə,
Birləşsə iki şəxs məgər bir demək olmaz?

Çatmaq diləyən "Hop-hop"a var hapgopu ilən,
Hər Mirzə Əli Əkbərə Sabir demək olmaz.

Şairmi? Xeyr! Adicə bir şeryazandır,
İlhamı zəif bir kəsə şair demək olmaz!

*26.06.1997*

***

Mən düzdanışan, amma əğyardə düzlük yox,
Əlbəttə, nüda dümdüz, amma ki, sual əyri.

Çox bəhsdə düz çıxdım, ustadıma eşq olsun,
Şagird zəifdirsə olmazmı misal əyri?

Ay indi yarımçıqdır, səbr eylə bədirlənsin,
Göz göylərə baxdıqca görsəndi hilal əyri.

Əyriylə işim yoxdur, düzlük dilərəm səndən,
Yarım, qaşını çatma, getməkdə xəyal əyri.

*3.07.1997*

***

Düzürəm sözlərimi şerimə muncuq kimi mən,
Aləm heyrandı bu şəxsin sözünə, görmürsən.

Yenilik - şerinə yad, köhnəpərəstsən çünki,
Vurulubsan, bilirəm, öz-özünə, görmürsən.

Görmək üçün məni dostanə baxış lazımdır,
Şerimin iynəsi batmış gözünə, görmürsən.

*14.07.1997*

***

Dərdə bax, naləmizi indi eşitmir kimsə,
Yazaraq namə deyəkmi görəsən dərdimizi?

Elə bir faidəsi olmadı dəftər-qələmin,
Badəyə, camə deyəkmi görəsən dərdimizi?



Allaha, mən biləni, xeyli yaxındır bizdən,
Şeyxülislamə deyəkmi görəsən dərdimizi?

*17.07.1997*

***

Gözəlim, məsləhətim var sənə: Məndən sonra
Nə gərək bildirəsən sirrini sirdaşlarına.

Bil ki, tezliklə nişan görməyəcəksən məndən,
Mən nişanəm gecə-gündüz fələyin daşlarına.

Ürəyim mücrü kimi topladı min bir dərdi,
Kipriyim oldu süpürgə gözümün yaşlarına.

*21.07.1997*

***

Sabiri, Seyyidi təqlid eləyənlər - yaşamaz,
Yaşayar öylə qəzəlxan ki, onun öz sözü var.

Odumun üstdə görüb kül elə sanma söndüm,
Sönə bilməz ocağım, çünki kül altda közü var.

Görürəm mən elə ulduz ki, münəccim görmür.
Səndə var adicə göz, məndə bəsirət gözü var.

*25.07.1997*

***

"Vardırsa əgər dərd, - dedin, - çarə də vardır".
Mən dərdini bilsəydim əgər çarə edərdim.

Bilsəydim əgər ağ günümə qibtə edirsən,
Səndən ötəri ağ günümü qarə edərdim.

Əğyar adamın bir üzü yox min üzü varmış,
Düşsəydi ələ mən onu min parə edərdim.

*2.08.1997*

***

Ərşəcən düz gedəcək gərçi təməl möhkəmsə.
Sütunun düzlüyü, memar, təməlindən görünür.

Saf deyilsən deyə sən saf da qəzəl yazmırsan.
Şairin xisləti, əlbət, qəzəlindən görünür.

Nəyə baş qoşdusa baş qoşdu əməlli-başlı,
Bu cəhət Şahinin hər bir əməlindən görünür.

*15.08.1997*

***

Duracaqsan yenə mey növbəsinə, ey sərməst,
Demə "meyxanədəki növbə yadımdan çıxdı".

Mən də mey içməmək üçün eləmişdim tövbə,
Saqini gördüyüm an tövbə yadımdan çıxdı.

*20.08.1997*

***

"Ol" söylədi Xaliq və yaratdı bu cahanı,
Yox şəkk eləyib ərz qılan: "Ol" nə uzundur!..

Bədxahləri vurdu əsa ilə başından,
Musadə, o həzrətdə olan qol nə uzundur.

Bildirmədi dil bir neçə il eşqimi yarə,
Eyvah, ürəkdən dodağa yol nə uzundur!..

*22.08.1997*

***

Cahil məni çox seyr elədi bəd nəzər ilə,
Möhkəmsə də qəlbim onu sındırdı şər ilə.

Qəlb mücrü kimi sınmasa qəm göylərə çıxmaz,
Göylər doludur böylə sınıq qəlblər ilə.

*29.08.1997*

***

Məni haqsız yerə inkar eləyən kəs bilsin:
Hikkəmi göstərərəm hikkəni tərk etmirsə.

Az qəzəl təmin edibdir bu şer sahibini,
Gözləyin tənqidini tərifi bərk etmirsə.

Ana dil, doğma kəlam ilə yazanlar azdır,
Yoxdur idrakı onun kim məni dərk etmirsə.

*3.09.1997*

***

Əllidən yeddi keçib sinni bu söz sahibinin,
Bilirəm ki, biliyim yetdi kamal sahilinə.



Şükür olsun ki, məhəbbətdə gətirmiş bəxtim,
Eşq dəryası məni atdı vüsal sahilinə.

Iki qız, dörd nəvə, bir övrətə malik şəxsəm,
Yetməyi istəmirəm cahü cəlal sahilinə.

Mən bu günlərdə bitirdim təzə "Divan"ımı da,
Gəmisi ilhamımın çatdı xəyal sahilinə.

*5.09.1997*

***

Bənzəmirsən, gözəlim, yerdəki adəmlərə sən,
Bilmirəm huri deyimmi sənə, ya bəndə deyim?

Ey qüsursuz, mələk sorğu-sual etdikdə
"Cənnətə düşməliyəm mən dəxi sayəndə" deyim.

Amma, məhşər günü, ey yar, bizim sirrimizi
Necə izah edəcəksən, de mənə, mən də bilim.

*9.09.1997*

***

Sərt qəzəl dağını fəth eyləyə bilmiş qələmim,
Bu dağı bəlkə külünglə qaza bilməzsən sən.

O qəzəllər ki yazırsan, yazaram, dil bilirəm,
O qəzəl ki yazıram mən, yaza bilməzsən sən!

*13.09.1997*

***

Ey imamın yolunu gözləyən aciz bəndə,
Elə zənn eyləmə ki, gəlsə pənahin gəldi.

Rəml atıb söylədilər "çək gözünü cənnətdən",
Bir savabın var isə çoxlu günahin gəldi.

Necə göyçək dedi Hafiz bu gözəl misranı:
"Ey göyərçin, özünü gözlə ki, şahin gəldi" *.

*18.09.1997*

---

* Hafiz Şirazi: "Ey kəbutər, nigəran baş ke, şahin aməd".

***

Bəsdir, bu mübahisə gərəkməz,
Bəhs etmə günün qəzəlxanıyla.

Sən şeri mürəkkəb ilə yazdın,
Amma mən isə ürək qanıyla.

*20.09.1997*

***

Mən zirvəsini dağın görmək dilərəm şəffaf,
Şahdağdan uzaq eylə, Rəbbim, çəni bir ləhzə.

Mən, bil ki, "sən"əm, ey yar, sən "mən" ola bilmirsən,
Eykaş, ala bilsəydim səndən səni bir ləhzə.

Səndən ötəri, canan, dünyanı unutdum mən,
Yad eyləyə bilmirsən sənsə məni bir ləhzə.

*25.09.1997*

***

Məni sən sözdəki mənə selinə qərq eləsən
Etina eyləmərəm, ey şəkərim, bal çayına.

Ağladıbdır məni göz yaşları Məcnun çölünün,
Çox qəzəllər demişəm mən o çölün lal çayına.

Günlərin bir günü, ey yar, əgər atsam səni mən,
Ayağımdan yapışıb at məni Qudyal çayına!

*30.09.1997*

***

Yağdırıb tənqidi, çox cahilə cəbr eyləmişəm,
Yaxşılıq istəmişəm, yox qərəzim cəbrimdə.

Dözmüşəm həm də özüm səbr ilə çox eyhamə,
Əyyubun səbri duyulmaqda mənim səbrimdə.

O qədər nəğməpərəstəm ki, öləndən sonra
Kəfənin iplərini çalmalıyam qəbrimdə.

*5.10.1997*



***

Təqlidanə qəzəlinlə özünü baş sandın,
Çox nahaq düşmüsən, ey dost, bu ucuz sevdayə.

Məğrur olma bu qədər, Seyyid Əzimlər vardır,
Sən bir arpayə dəyirsən, mən iki buğdayə.

*9.10.1997*

***

Gələcək Cəm yenə möhkəm tutacaq əldə camı,
Heç xəyal eyləməsinlər camı Cəm sındıracaq.

Əhdü peymanı müqəddəs biləcək aşiqlər,
Nə onu Qeys qıracaqdır, nə Kərəm sındıracaq.

Qələmimlə yaza bilməz daha heç kim qəzəli,
Çünki, Şahin qələmin öldüyü dəm sındıracaq.

*17.10.1997*

***

Ermənistan zəbt edən torpaqlarım xiffət çəkir,
Çoxlu torpaq vermişəm əldən ki, qorxağəm hələ.

Söyləyirlər hər kəsin dünyadə qalmaq vaxtı var,
Sanki Allahım unutmuşdur məni, sağəm hələ.

*22.10.1997*

***

Məcnunə oxşamazsan illərlə çöldə yatsan,
Yüz Bisütun uçursan Fərhadə bənzəməzsən.

Gerçək yanılmağın var, röyayə ümmid etmə,
Gerçəkdə bənzəməzsən, röyadə bənzəməzsən.

Şerində heç nə yoxdur, şair deyilsən əsla,
Surətdə bənzəyərsən, mənadə bənzəməzsən.

*3.11.1997*

***

Külün altında közüm var, hələ ki sönməmişəm,
Yandırır qəlbimi eşqin közü gündüz və gecə.

Gecələr təbimə şahid mənim - ay, gündüz - gün,
Tükənə bilmədi şair sözü gündüz və gecə.

Qeyrilər tək oturub gözləmirəm ilhamı,
Gözləyir Şahini ilham özü gündüz və gecə.

*7.11.1997*

***

Qızdırın qəlbimi, qızdırmalı tək titrəyirəm,
Bağlayın pəncərəni tez, məni yıxmaqda soyuq.

Nəzərim sanki donub, isti baxışlar yoxdur,
Gözlərim gözlərinə gör necə baxmaqda soyuq.

Soyudubsan məni sən öylə özündən, gözəlim,
Qələmimdən də qəzəllər daha çıxmaqda soyuq.

*15.11.1997*

***

Varmıdır qeyri gözəl gül gözəl olsun səndən?
Onları mən kimi rişxənd ilə, yarım, süz, gül.

Qibləgahın səni güldən yaradıbdır deyəsən,
Əl-ayaq gül, bədənin gül, dodağın gül, üz gül.

*17.11.1997*

***

Iki cür bəxtli adam var - biri xoşdur, biri bəd,
Niyə vardır görəsən bəxt ilə bəxtin fərqi?

Bədbinəm mən o qədər ki, yaşamaq istəmirəm,
Yox gözümdə daha tabut ilə təxtin fərqi.

*24.11.1997*

***

Çoxuna yaxşılıq etdimsə də yoxdur xeyri,
Köpəyi tutsa quduzluq qapacaq sahibini.

Pak ibadət yerinə eyləyirəm mən səcdə,
Sevirəm mollasını, kahinini, rahibini.

Tərtəmiz dillə yazılsın elimin hər qəzəli,
Bulanıqdırsa əgər su görən olmaz dibini.

*26.11.1997*



***

Əliboş çıxmamısan seyrinə şer aləminin,
Səfərə yollananın olmalıdır sursatı.

Səni qəsdən balaca zənn eləyənlər vardır,
Vermisən əsrimizə gör nə böyük sovqatı.

Şübhə yoxdur, çoxu istərdi ki, yazsın "Divan".
Sənsə meydanə girib dördnala çapdın atı.

Bilir aləm ki, müasir qəzəlin şahinisən,
Sənə vacibdimi şahinliyinin isbatı?

*28.11.1997*

***

Bəndə şahdan əlini çəkməyəcək,
Bəndəyə şah özü insaf etsin.

Aşiqin ahı tənəffüs bilmir.
Aşiqə ah özü insaf etsin.

Mənə, ey yar, dedin "insafsız",
Sənə Allah özü insaf etsin.

*16.12.1997*

***

Ey yaxını görməyən adəm, lal ol,
Sən özünü şövq ilə islahə keç.

Məscidə yox, meyl elə meyxanəyə,
Xoşlamasan şənliyi gər, ahə keç.

Getmə uzaqlarə, yaxın - biz varıq,
Sən bizi öyrən, sora Allahə keç!

*19.12.1997*

***

Düşmüşəm mən dəli bir niyyətə, neynim, yenə də,
Açılə niyyətimi car eləmək istəyirəm.

Göz yaşı ot bitirərmi görəsən səhradə?
Quru səhranı çəmənzar eləmək istəyirəm.

Mənə kim pislik edirsə alacaqdır əvəzin,
Pisliyə pisliyi meyar eləmək istəyirəm.

Cahilin sözlərinə mən qulaq asmaqdansa,
Barmağımla qulağı kar eləmək istəyirəm.

*27.12.1997*

***

Çox yaxşı ki, təxt üstdə oturmaqdan uzağam,
Altımda mənim köhnə kətildir, daha yaxşı.

Gördüm bir "əsilzadə", əsillikdən əsər yox,
Amma ki, çoban gördüm əsildir, daha yaxşı.

Zənnimcə mənim, min kərə mindilli adamdan
Ey dost, ilan ki, ikidildir, daha yaxşı.

*2.01.1998*

***

Eşqə düşəndən bəri döymədəyəm başıma,
Eşqə əgər düşməsən baş səlamət qalar.

Tutduğu işlər qara, üz-gözü daşdan yara,
Tullamasaq əğyara daş səlamət qalar.

Qəlbi deşib çıxmasa, kiprik onu sıxmasa,
Gözdən əgər axmasa yaş səlamət qalar.

*9.01.1998*

***

Əcnəbi söz əvəz etmir dilimin sözlərini,
Gələcək baxmayacaqdır mənə nöqsanlı kimi.

Ölü hər kəlməni dəfn eyləmişəm çoxdandır,
Qəzəlim sanki danışmaqda mənim canlı kimi.

Saf yazıb, bilməyirəm mən nə günah eyləmişəm?
Neçə bədxah üzümə baxmadadır qanlı kimi.

Ata nəslimdə mənim ləzgi qanı var, amma
Yazıram hər qəzəli azəribaycanlı kimi!

*12.01.1998*



***

Nə qədər çarəsizin ağlayıram mən halına,
Hər kimin varsa gözü göz yaşı yağdırmalıdır.

Bu şer sahibinə hərzəvü hədyan deməyin,
Lal olun, yoxsa sizə söz daşı yağdırmalıdır.

*25.01.1998*

***

Etibarım kimsəyə yoxdur mənim, zar olmuşam,
Yad olan kəs zülm edirsə, aşina cövr eyləyir.

Səkkiz ötmüş əllidən, əldən gedibdir qüvvətim,
Görmədim dünyadə rahətlik, yaram qövr eyləyir.

Dinclik umma, ey könül, asudəlikdən söz demə,
Yer məgər asudədirmi, dəmbədəm dövr eyləyir.

*9.02.1998*

***

Qopmayır bir gör nə vaxtdır əllərindən əllərim,
Əllərindən, sevgilim, əl çəkməyim mümkünmüdür?

Əllərimdən əl götürmək istəmirsən sən dəxi,
Saçların pəjmürdə, seyqəl çəkməyim mümkünmüdür?

Hüsnünü hər bir qəzəldə çəkməyim adət mənə,
Hüsnünü bundan mükəmməl çəkməyim mümkünmüdür?

*11.02.1998*

***

Şirinim, mən dəxi Şahdağı yarıb arx çəkirəm
Bisütunda acı göz yaşlarının arxı kimi.

Saf qəzəl bayrağı əldə, gedirəm hey irəli,
Dönmərəm mən geri əsla fələyin çarxı kimi!

*13.02.1998*

***

Şerindəki hər beyt şirinlikdən uzaqdır,
Şerində sənin zərrə qədər duz görünmür.

Qəlbin elə donmuş ki, açılmaz donu bir də,
Pakizə ürəklərdə isə buz görünmür.

Ulduz qədəri bəlkə də xidmətlərim olmuş,
Çiynimdə neçin bəs hələ ulduz görünmür?

20.02.1998

***

Cahilsə əgər şəxs - yaxın düşməyəcəkdir,
Elan eləyir amma fələk aqilə cəngi.

Cəngin biri oddur, biri atəş, bilir aləm,
Əlbəttə ki, cəngdir gətirən hasilə cəngi.

Qoy nəzm edə aləmdə qələm daima sülhü,
Eykaş, Xudavənd yer üzündən silə cəngi.

Cəng atəşini cəng ilə söndürmək əbəsdir,
Düşdükdə yaxın - cəng eləyir hamilə cəngi.

3.03.1998

***

Aqil adəmlər olan məclisə açdınsa ayaq,
Güvənib əqlinə cahilliyi tərk etməlisən.

Alimin elminə, dərrakəsinə qarşı bu gün
Süst olan meylini qənbər kimi bərk etməlisən.

Təhsilin yox, ədəbin, mərifətin yoxsa əgər
Necə fazil olacaqsan? Bunu dərk etməlisən.

4.03.1998

***

Neçə il şerimizə oldu qəliz dil hakim,
Xəlqi sözlərlə əritdim o qəliz söz buzunu.

Köhnəlik tazəliyə manea olmuş daim,
Nə qədər manea sədd oldu mənə yol uzunu.

Ulduzun yanmadadır, amma görünmür, Şahin,
Neçə ildən sora aləm görəcək ulduzunu.

8.03.1998

***

Tökülür yerlərə qanlar ki, dalaşqanlar var,
Mən ciyərqan oluram hər dalaşımdan sonra.

Arabir bilməyərəkdən dəyirəm qəlbinə mən,
Gözəlim, ağrı qopur bil ki, başımdan - sonra.



Dedilər yoxsa canın - olmayacaq cananın,
Bilmişəm mənsə bunu əlli yaşımdan sonra.

10.03.1998

***

Gecənin çadrası göydən getdi,
Səhərin güzgüsü şəffaf oldu.

Gecədən, məncə, səhər göyçəkdir,
Neçə şerim ona ithaf oldu.

Tərpənib köhnə buludlar qaçdı,
Qəzəlim tək göy üzü saf oldu.

13.03.1998

***

Incidirlər məni hərdən şərəşur cahillər,
Qələmim, naxələfə qarşı çomaq olmalısan.

Hara yollanmadasan, getmə, ey ilham pərisi,
Gecələr sübhə kimi mənlə oyaq olmalısan.

Nə gərəkdir kəsəsən kəlmə fəsad əhli ilə,
Yaxın olsa o sənə, sənsə uzaq olmalısan.

Ürəyim, umma ziya qəlbi qara kəslərdən,
Alışıb yan ki, qaranlıqda çıraq olmalısan.

Nə deyim mən sənə, ey xudbin adam, cəhdin xam,
Günəş olmaq diləyin varsa, ocaq olmalısan.

Hamı narazıdı səndən, ey özündən razı,
Istəsən olmağı baş, əvvəl ayaq olmalısan.

15.03.1998

***

Gərçi mən gündə qəzəllər yazıram şövq ilə,
Tuturam, hərdən olur, süngü kimi mən qələmi.

Qələmi, zənn eləmə badə təki sındırdın,
Saqiya, verməırəm heç vədə əlimdən qələmi!

25.03.1998

***

Nə qədər qəlbi işıqlandıracaq,
Qəzəlim, şəmə dönüb yay işığı.

"Mənə şerindən işıq lazımdır" -
Desə hər kəs verirəm pay işığı.

Qoy qaranlıqda əziyyət çəksin,
Zülmətə kim ki tutur tay işığı.

Gecələr bir də çıraq yandırma,
Gözəlim, bəsdi bizə ay işığı.

*26.03.1998*

***

Səni gördükdə, a dilbər, niyə dillənməyirəm?
Görməyibdir bəşəriyyət belə dilbərsevəni.

Gül gülür, gülmür üzüm bağçada sən yoxsansa,
Bağımın yasəməni qərq eləyir yasə məni.

Mən çəmənzarə səninçin gəlirəm, yoxsa, gülüm,
Məni səhrayə qovun, neyləyirəm mən çəməni.

Əyilib-qalxır adamlar namazın qıldıqda,
Əyilib-qalxmadayam mən isə gördükdə səni.

*28.03.1998*

***

Sən deyirsən ki, görür hər şeyi, Allah eşidir,
Əgər Allah eşidirsə ucadan qışqırma.

Mənim ardımca hədər söz danışırsan, cahil,
Qapı var, pəncərə vardır, bacadan qışqırma.

*4.04.1998*

***

İstərəm Həccə gedim şeytana daş atmaqçın,
Nə qədər üstümə daşın axı şeytan atacaq?

Verələr Kəbədə ev gər bu qəzəl sahibinə,
Yenə də dönmək üçün ölkəsinə can atacaq.



İstərəm vəslinə tezliklə yetim mən, yoxsa
Sevgilim, oxlarını üstümə hicran atacaq.

Meyə meylim daha yox, saqini istər könlüm,
Mənə hər kim "qocalıbsan" desə, böhtan atacaq.

*11.04.1998*

***

Yazmaqda qələm xəlqi qəzəllər yenə, şadəm,
Olmaq diləməm mən daha məyus, kifayət.

Yad sözlərə bənddir sənə nə qeyri qəzəlxan?
Ey dil, sənə yüz dəfə dedim "sus, kifayət!"

*3.05.1998*

***

Haqsız sözə, haqsız əmələ dözməyirəm mən,
Çoxdandı mənə, bax bu səbəbdən də, hücum var.

Seyr etməyirəm cahili çoxlar tək uzaqdan,
Əlbəttə, ilan kim ki, yaxındır, onu sancar.

*5.05.1998*

***

Odlayıb gülşəni bir mərdiməzar etdi fərar,
Bağiban ağlayaraq gülşəni söndürməkdə...

İldırımdan gəminin yelkəni odlanmışdı,
Qabaran dalğa coşub yelkəni söndürməkdə...

Canda var yanğı, fəqət yanmayıram mən, çünki,
Gözlərim göz yaşım ilən məni söndürməkdə...

*14.05.1998*

***

Mümkün işdirmi məgər sevməyəsən cananı?
Yarsevməz adama eyləyirəm heyrət mən.

Ovçu timsalı durub pusquda yol gözləyirəm,
Gəzirəm gündə görüş şövqü ilən fürsət mən.

O səbəbdən ki, dəyibdir əlinə dilbərimin,
Öpürəm əllərimi - almaq üçün ləzzət mən.

*7.06.1998*

***

Sevgilim, istəyirəm sevginə yetməklə sənin
Sevgidən güc götürüm, qüvvət alım, tab çəkim.

Tarçı çəkməkdə tarın simlərinə mizrabı,
Mən isə istəyirəm zülfünə mizrab çəkim.

Dedi: - Şahin, sənə zülm etdi bu dövran, ağla,
Mənsə göz yaşlarını yığmaq üçün qab çəkim.

*9.06.1998*

***

Şair olmaq diləyirsənsə, gəlib şövqə, gərək
Əllərin gündə şer yazmağa vərdiş olsun.

Üç babat şerin əgər yoxsa nə şairsən sən?
Yarpağı olmayan adəm necə dərviş olsun? *

*11.06.1998*

***

Cahanın şövq ilə hər səmtini sevmək - qayəm,
Aləmin Qərbi ilə Şərqi mənimçin yoxdur.

Içirəm and, müqəddəsdi mənə hər ikisi,
Kəbə ilə Qubanın fərqi mənimçin yoxdur.

*14.06.1998*

***

Nakam aşiq olanın hər gözü fəvvarə olur,
Bəlkə də, qismət olur hər gününə bir dərya.

Amma, aşiq ilə aşiqdə təfavüt çoxdur,
Birinə - min dənə dərya, mininə - bir dərya.

Iki dərya yaranardı yığa bilsəydim əgər,
Hər gözümdən yaş axıbdır önünə bir dərya.

*16.06.1998*

***

Bizi tərk eylədi Samit, gedəcəkdir Qəni də,
Şahidin həm solacaqdır gülü də, gülşəni də.

* "Bərge-səbzist tohfeye-dərviş" (farsca).
Tərcüməsi: "Töhfəsi yarpaq olar dərvişin".



Doymuşam mən yaşamaqdan bu fəna aləmdə,
Torpağın gözləri acdır, yeyəcəkdir məni də.

*24.06.1998*

***

Neçə məclisdi sizə söz şabaşı yağdırıram,
Amma söhbət nə üçün söz şabaşımdan getməz?

O təhər aşiqiyəm mən o gözəl cananın,
Gər başım getsə də, sevdası başımdan getməz.

*2.07.1998*

***

Şairlərimiz daim edir vəsfini əqlin,
Əlbəttə ki, məşhur eləyir insanı əqli.

Bir mətləbi min bir kərə təkrar eləyən var,
Tuti quşunun var dili, amma hanı əqli?

*9.07.1998*

***

Deməyin "bəsdi, şer çox yazdın",
"Bəs" deməzdimmi bəs olsaydı mənə?

Mən ögeylikdən üzərdim əlimi
Hər bəşər doğma kəs olsaydı mənə.

Nəfəsim düz ikiqat artardı
O gözəl həmnəfəs olsaydı mənə.

Şahinəm, sevgilimin ağuşi
Sevinərdim qəfəs olsaydı mənə.

*13.07.1998*

***

"Odludur" söyləməyin isti yer aşiqlərinə,
Hindliyə od vuraram mən, həbəşi yandırram.

Mən Dağıstanə yaxın yerdə doğuldum, amma
O qədərməndə alov var günəşi yandırram!

*4.08.1998*

***

Sevincin çox, nişatın ondan artıq,
Neçin, yarəb, mənə qəm göstərirsən?

O dünyadə mənim cənnət yerimmi -
Bu dünyadə cəhənnəm göstərirsən.

7.08.1998

***

Daşqalaq etmədəyəm məddahı ki, yaltaqdır,
Daşqalaq etməyimə xeyli şadam məddahı.

"Heyrət, ey büt!.." demişəm yarıma baxcaq, dedilər:
Görməyibdir hələ aləm belə xam məddahı.

Bəli, mən bircə bütü mədh edirəm, ey Yaradan,
Xəlq edibsən nə üçün sən bu avam məddahı?

Büdpərəstlikdə məni tənqid edir din əhli,
Bütpərəstəm, deyiləm çünki adam məddahı.

9.08.1998

***

Nə qədər dərd varınsa mənim olsun hamısı,
Mən sənin dərdini, zənn etmə ki, sovqat alıram.

Müftə sevda məni cəlb eyləməyib heç vədə,
Dərdinin qiyməti, yarım, neçədir, sat, alıram.

13.08.1998

***

Ya Ilahi, kömək et, üzgünüyəm xəlqi dilin,
Nə kömək sahibisən üzgünü görmürsənsə?

Qəlbimi güzgü kimi əks eləyir saf qəzəlim,
Ey qəzəlxan, nə deyim güzgünü görmürsənsə.

Gün kimi saçmadayam nur qəzəlin mülkündə,
Deməli, korsan əgər sən günü görmürsənsə.

16.08.1998

***

Gəl inan sözlərimə, indiyəcən
Tutmayıb bircə də xilqət gözümü.

Niyə gerçəkliyini görməmişəm?
Edirəm gündə məzəmmət gözümü.

20.08.1998



***

3-4 üzü yox, qoy adamın 1 üzü olsun,
40 ildi ki üzmüş məni fənd-felli adamlar.

Etməkdə rəqəmlərlə adamlar məni düşmən,
Dövrəmdə görünməkdədi 1000 dilli adamlar.

22.08.1998

***

Xəstələndim yenə qürbətdə, şer yazmayıram,
Mənə lazımdı vətən mehri, vətən dərmanı.

Təbim idi mənə dərman, neçin qeyb elədim?
Çalışıb tapmalıyam indi itən dərmanı.

Hər qəliz şerimi gözdən keçirib tullamışam,
Tullayırlar axı hər vaxtı ötən dərmanı.

24.08.1998

***

Natiq sayağı vəcdə gəlib təntənə ilə
Nitq eyləyirəm mən, a sənəm, sənsə susursan.

"Ey dağ!.." dedim, əksi-səda gəldi o saət,
Təsir eləyir söz dağa həm, sənsə susursan.

29.08.1998

***

Şeyxəna, rüşvətin qədərdən çox,
Hörmətin şeyx yox, gəda boyda.

Sözünün qiyməti sözümdən az,
Sözümün siqləti qaya boyda.

Sənə bir zərrə hörmətim olmaz
Saqqalın olsa lap əsa boyda.

4.09.1998

***

Təxti eşqin nəsib olmuş əbədi Fərhadə,
Xosrova! Eşq sarayında sütun olsam, xoş.

Başa düşdüm ki, bəla gəlmiş əqldən çox vaxt,
Mən dəxi sən kimi, ey Qeys, cünun olsam, xoş.

9.09.1998

***

Şəkk eyləmə, göydən hələ çox sallanacaqdır,
Allah özü vermiş qoca dünyayə zəmanət.

Divanə edir aşiqi eşqin gücü, heyhat,
Varmı görəsən, ey pəri, sevdayə zəmanət?

Dəryası bu eşqin məni qərq eyləyəcəkdir,
Vardırmı verən, coşdusa, dəryayə zəmanət?

*12.09.1998*

***

Düşünürdüm məni eşqin alovu yandırmaz,
Bu nə işdir ki, ürək eşqinə dərhal yandı?

Etsə də ömrü boyu cəng səlamət qaldı,
Sevgidə amma ki, Rüstəm əridi, Zal yandı.

İstədim yanmaya pərvanə hədər sevdadə,
Şamı tez söndürə bildimsə də, saqqal yandı.

*16.09.1998*

***

"Cami-Cəm" məsələsindən çoxusu hali deyil,
Saqiya, meylə ləbaləb elə, doldur camı.

İstərəm Kəbə görüm camdə, Sinayə baxım,
İstərəm camə baxıb seyr eləyim mən Şamı.

Gələcək günləri görmək bizə mümkün ki deyil,
Barı görsün gözümüz gendə qalan əyyamı.

Gözümə bəlkə Füzuli görünə təbə gəlim,
Deyirəm bəlkə görüm Sədi ilə Xəyyamı.

Yazıram gündə şer mən, mənə hər gün bayram,
Sönməyibdir hələ qəlbimdəki təbin şamı.

Amma var öylə qəzəlxan ki, həsəd sahibidir,
Ona işgəncə olur başqasının bayramı.

Kimin ilhamı zəifdirsə, yəqindir mənə ki,
İstəməz güclü ola qeyrisinin ilhamı.

*18.09.1998*



***

Mənə şor söyləmə, olsun ədəbin,
Bu ədibin tabını sındırma.

Çox şeyi əxz eləyirsən məndən,
Duzu ye, duz qabını sındırma.

*25.09.1998*

***

Mən təmənna edirəm vəslini gündüz və gecə,
Nə deyirsən mənə de, amma ki, "səbr eylə" demə.

Cürbəcür arzuların məskəni olmuş köksüm,
"Arzulardan ötəri köksünü qəbr eylə" demə.

Bir xətər görməyəcəksən, gözəlim, sən məndən,
Şairəm mən, deyiləm şah, mənə "cəbr eylə" demə.

*19.10.1998*

***

Gözəlim, birgə gedib seyr eləyək üqbanı,
Həmi fərqsizliyi görrük orada, həm fərqi.

Bil ki, "var yerdə də var, göydə də vardır" dedilər,
Bizə məlum olacaq öldüyümüz dəm fərqi.

Biz əgər birgə olarsaq o biri dünyadə,
Mənə olmaz daha cənnətlə cəhənnəm fərqi.

*5.11.1998*

***

Sədəqə istəyən adəm çoxalır gün-gündən,
Rəhmin olsun - qabağında əl açılmışsa əgər.

Sirrini söyləmə sözgəzdirənə, faş eylər,
Dilini saxlamaq olmaz dil açılmışsa əgər.

Eşqimi məxfi daha saxlamaq olmur, canan,
Ətrini saxlamaq olmaz gül açılmışsa əgər.

*7.11.1998*

***

Elə cəlb etmədə meyxanadə işrət məni ki,
Saqidən heç inana bilməyirəm yan olaram.

Hələlik Həcci ziyarət eləmək fikrim yox,
Qorxuram tövbə edib sonra peşiman olaram.

*10.12.1993*

***

Şəddad çox olsaydı əgər dad az olardı,
Çox yaxşı ki, tarix boyu Şəddad az olmuş.

Imdad eləyibdirsə də çox dərdliyə loğman,
Loğmanların dərdinə imdad az olmuş.

Öyrənmədəyəm tarixi hər mərhələ üzrə:
Şagird nə çox, amma ki, ustad az olmuş.

*18.12.1998*
*Lənkəran*

***

Təyin edir tale özü hər şeyi,
Şairə təb, aşiqə xülya verib.

Leyliyə sevdadə acı göz yaşı,
Qeysə biyaban ilə səhra verib.

Pak Əminə bizə peyğəmbəri,
Bakirə Məryəm isə Isa verib.

*22.12.1998*

***

Dağa tez-tez çıxıram, var səbəbi əlbəttə,
Tanrıya xeyli yaxındır dağın üstündəkilər.

Tapdayırlar budağından üzülən yarpağı,
Yarpağı torpaq edir yarpağın üstündəkilər.

Torpaq altında xəzinə qalacaqdır aram
Yerini tapmasalar torpağın üstündəkilər.

*22.01.1999*
*Lənkəran*

***

Bəlkə də göydəki ulduz sanı çoxdur dostum,
Əlini məndən uzaq et, mənə düşmən batmaz.

Məni ustadlərim yaxşı ediblər təlim,
Düşdüyü torpağı münbitsə əgər, dən batmaz.



Bülbülün gözləri aydın, təzədən güllənəcək,
Qara yel yağı kimi gəlsə də gülşən batmaz.

Qopmasa tufanı Nuhin ölə bilməz şair,
Gəmi batmazsa əgər, bəlli ki, yelkən batmaz.

*1.02.1999*

***

Çoxdur paxıl insan bu diyar içrə, məbada
Dərd etmə ki, birdən səni tərifləyə bilməz.

Güllər səni tərifləməsə, qəm yemə, ey gül,
Nərgiz səni, susən səni tərifləyə bilməz.

Biganəsayaq sən ki kənarından ötürsən,
Bülbül, daha gülşən səni tərifləyə bilməz.

Düşmən sözünə eyləmə diqqət daha, şair,
Əlbəttə ki, düşmən səni tərifləyə bilməz.

*1.04.1999*

***

Ey Yaradan, ərz edirəm sidq ilə:
Boğdu bu çağlar məni, xoş çağ gətir.

Qarə ömür-gün canımı bezdirib,
Rəngi dəyiş, günlərimi ağ gətir.

Baş ağarıb, bel bükülüb yay kimi,
Bağlamağa belimə qurşağ gətir.

Töhfə üçün yox quru bir yarpağım,
Dərvişinəm, dərvişə yarpağ gətir.

Ya məni Şahdağə apar təcili,
Ya önümə lütf elə Şahdağ gətir.

Dağlar aşıb dilbərimə yetməsəm
Sinəmə dağ boyda mənim dağ gətir.

Eh, nəçiyəm mən Sənə yol göstərəm?
Ey Yaradan, döy məni, şallağ gətir.

Hicrə giriftar olanın yox günü,
Rəhmini mən bəndəyə, ey haqq, gətir.

Hicranı öldürməlisən, ey əlim,
Çax başına gülləni, çaxmağ gətir.

Bax, qoca Şahin uşaq olmaqdadır,
Tez mənə, ey yar, oyuncaq gətir.

*12.07.1999*

***

Şahin kimi düzgün yaşayıb qəddini şax tut,
Iş tutsa kim əyri özünü şəst edə bilməz.

Meyxanəyə hərdən o səbəbdən gedirəm ki,
Təsbeh ilə əmmamə məni məst edə bilməz.

*14.08.1999*

***

Çiynim üstdə oturub ey aparanlar hesabı,
Qıymayın bircə günahım da hesabdan çıxsın.

Ya, savabın ki olubdur, kitaba səbt eləyin,
Əməlim yaxşı-yaman qoy o kitabdan çıxsın.

Doşab aldım, a sevənlər doşabım bal çıxdı
Və gərəkdir ki, balın ətri doşabdan çıxsın.

Çox qəzəl qaldı niqabında ögey kəlmələrin,
Diləyim var ki, yazanlar o niqabdan çıxsın.

Hər qəliz söz, sanıram mən ki, hicabdır qəzələ,
Gözəlin çöhrəsi lazımdı hicabdan çıxsın.

*24.10.1999*

***

Niyyətim səcdə olubdur, olacaqdır səcdə,
Belə məfkurədən ötrü qıyaram canıma mən.

Ömrümün hər dəmi, ey Tanrı, ibadətdə keçir,
Hey ibadət edirəm sevgili cananıma mən.

*29.10.1999*



***

Saqilik eyləyirəm təkcə qalıb öz-özümə,
Yarsız, qoxlayıram mən yenə yar köynəyini.

Mən bu halətdə ikən gəldi nigarım birdən,
Əllərimdən götürüb geydi nigar köynəyini.

Əl atıb paltarı cırmaq işidir məstlərin,
Saqi, mey vermə o dildarə, cırar köynəyini.

*15.12.1999*

***

Küllənməliyəm, çünki əsəb tonqalıyam mən,
Neynim, əsəbə bir gilə həm hövsələ gəlməz.

Gəldin yanıma gözdə qəzəb, sözdə gileylə,
Dostun yanına dost, əzizim, belə gəlməz.

*8.01.2000*

***

Ey ömrünü qürbətdə hədər badə verən kəs,
Dön yurda, vətən torpağı qoy məskənin olsun.

Ey qəlbi rəhmdən uzaq insan, yaxın gəl,
Salma qəfəsə bülbülü, qoy gülşənin olsun.

Ey şeyx, sənə məsləhətim var, fikirləş:
Meyxanə mənim, saqi mənim, Həcc sənin olsun.

*18.01.2000*

***

Göz yaşı boğdu bizi, kim bizə dəsmal verər?
Gün gələr Allahımız bizlərə həm hal verər.

Bilmirəm neyləmişəm mən, nə üçün çərxi-fələk
Dərdi batman eləyər, dərmanı misqal verər?

Gözəlim, etmə inad aşiqinə, etsən əgər
Təzə müşkül törədər bu, yeni cəncal verər.

Talayıb qəlbimi getdin, deyirəm "ver geriyə",
Əcəb axmaq adamam, oğru məgər mal verər?

*26.01.2000*

***

Bir halda ki sən şirin olubsan,
Şirin dodağa acı yaraşmaz.

Ey yar, yanımdan öylə ötmə,
Baxmaq mənə qıyqacı yaraşmaz.

Möhtacının ehtiyacı - səndən,
Qovmaq çölə möhtacı yaraşmaz.

Səndən mənə xoş səda yetişmir,
Saxla dilini, hacı, yaraşmaz!

*29.01.2000*

***

Tanrının rəhminə minnətdarəm,
Adəmin bəxtinə dünya düşdü.

Bəlkə dəryaləri gözdən yaradıb?
Gözlərimdən neçə dərya düşdü.

Qələmim çox varağı garələdi,
Nə qədər dəftərə misra düşdü.

Çal başımdan göyə xülya qalxdı,
Bəbəyimdən yerə röya düşdü.

Cəngü qovğanı bitirmək dilədim,
Araya cəng ilə qovğa düşdü.

Şahinin bəxtinə, əfsus, şəhər,
Məcnunun bəxtinə səhra düşdü.

*3.02.2000*

***

Dini inkar eləmək qırmızı haqsızlıqdı,
Bizlərə din təzədən mətləb olubdur deyəsən.

Bir zaman vardı papaq, sonra papaqsızlıqdı,
Indi əmmamə zamanı dəb olubdur deyəsən.

*25.02.2000*

***

Şahlar çox olub, amma ki, hər şah Cəm olmaz,
Ayinə bərabərmi Cəmin caminə qarşı?



Leyla nəçidir, kimdi demə Vis yanında,
Məcnuni rəqib bilməməli Raminə qarşı.

Cüllütlə işim yoxdu qəzəl asimanında,
Şahin tək uçanlar gələ qoy şahinə qarşı!

*3.03.2000*

***

Əhrimən görsə də göz gərçi oyaq vaxtında,
Əhrimən görməyirəm, hər gecə Hörmüz görürəm.

Çoxsa da əyri əməllər, adamam mən nikbin,
Olacaq hər işimiz düz, bunu mən düz görürəm.

Elə kəslər görürəm görmədə gündüzdə qara,
Gecənin qapqara bağrında da gündüz görürəm.

*7.03.2000*

***

Bu nə səs-küydü yetişməkdədi hər ləhzə belə?
Yenə şair əbədi naləni, eyvah, eşidir.

Kimi həzzin, kimi eyşin səsini dinləmədə,
Bu kəsin dərdi böyükdür ki, müdam ah eşidir.

Yəni Məcnun eləyən nalə yetişməkdə mənə,
Qulaq axşam eşidir naləni, sabbah eşidir.

Çəkdiyim naləni, ey büt, sən eşitmirsənsə,
Arxayın ol, onu gündüz-gecə Allah eşidir.

*14.03.2000*

***

Kəsilib qarşımıza baş atılır,
Kəsəkəs günləri başlandı niyə?

Ürəyimdən gözümə yaş atılır,
Kipriyim bir daha yaşlandı niyə?

Küçələrdə nə yaman daş atılır,
Dəlilər yoxsa çıxıblar eşiyə?

*20.03.2000*

***

Elə sevdalı kəsəm ki, qoca dünyadə mənə
Iki söz var isə doğma - biri "Sevda" adıdır.

Iki dərya qovuşubdur O Iraq içrə gözəl,
Suyu bol Şəttülərəb * var - iki dərya adıdır.

Iki canan adı vardır lüğətində Qeysin:
Biri "Leyli" adıdır, digəri "Leyla" adıdır.

*23.03.2000*
*Samur çayı*

***

Məstliyi olmasa idi bizi məst etməzdi,
Nə edibdir görəsən bir belə bihuş meyi?

Aşikar nuş edirəm mən, bunu gizlətməyirəm,
Amma var molla ki, gizlində edir nuş meyi.

*3.04.2000*

***

Sən hər şeyə qadirsən, ey Tanrı, özün saxla
Aqilləri azadə, divanələri bağlı.

Hərçənd vəfasızlıq etməkdədi çox canan,
Aşiqlərə çox gördüm cananələri bağlı.

Dərvazəsi bağlanmış məscidləri həm gördüm,
Göz görməyə qoy bir dəm meyxanələri bağlı.

*29.04.2000*

***

Ya Ilahi, məni gündən-günə sarmaqda maraq,
Bu cahan mülkü, əzizim, hədəriymiş, hədəri.

Bəxtimin rəngi qara, saqqalımın rəngisə ağ,
Bəxtimin qiyməti yoxdurmu məgər tük qədəri?

*16.06.2000*

***

Ey dəli, ey Qeys, rəqibin mənəm?
Üstümə səndən daş axıbdır yenə.

* Şəttülərəb çayı Dəclə və Fərat çaylarının qovuşmasından yaranmışdır



Meyxanaçı, aç qapını, gəlmişəm,
Yanıma yar-yoldaş axıbdır yenə.

Saqiyə bax, məst çıxır qarşıma,
Göz süzülübdür, qaş axıbdır yenə.

Eh, təzədən yadıma yarım düşüb,
Göz buludundan yaş axıbdır yenə.

*18.06.2000*

***

Meyə çox böhtan atıblar, çox şər,
Zahidə ver meyi xatircəm ola.

De ona: Mey canı gümrah eylər,
Ipi islat ki, düyün möhkəm ola.

*24.06.2000*

***

Görürəm gündə qiyamət gününü,
Qoy bu dünyanı qiyamət - yıxsın.

Zəng edir hərdən Ərəbzəngi mənə,
Aşiqi qoy elə afət yıxsın.

Evimi tikmişəm məhəbbət ilə,
Evimi yıxsa məhəbbət yıxsın!

*29.06.2000*

***

Cövr oxlarının sanki nişangahıdı köksüm,
Cövrün mənə bəsdir, daha göndərmə, Ilahi.

Nöqtə hərəkətsiz dayanan, çevrə gəzəndir,
Mən çevrəni bir nöqtəyə döndərmə, Ilahi.

*20.07.2000*

***

Nə izafətdi bu çoxqat, nə qəliz sözlərdir...
Çirklidir indi qəzəl, yaş tökürəm çirkə görə.

Çox qəzəlxanə demişdim sözümü ərk eləyib,
Neçə "əhsən" dedilər eylədiyim ərkə görə.

Əfqanıstanda Bədəxşanə gedib kürk aldım,
Məni əfv eyləmədi ləl orada kürkə görə.

Gözəlin türkü gözəldir ki, bu Şahin Fazil
Neçə yol Türkiyəyə getdi gözəl türkə görə.

*29.07.2000*

***

Çox səbr elədim, qədrini bildim gecə-gündüz,
Qəlbin o qədirbilməzə yoxdur daha tabı.

**Günlərlə bəla gördü canım həzzə yetincə,**
**Həzzindən onun amma ki, çox oldu əzabı.**

Şahin, sənə hər kimsənə pislik eləyirsə,
Sən yaxşılıq etməklə utandır o cənabı.

*13.08.2000*

***

Yenə "Məcməş-şüəra"da ey özündən razı,
Böylə məclisdə sənin ali məqamın hanı bəs?

Yazıram gündə şer mən, itidir ilhamım,
Gündə şerin hanı bəs, gündə kəlamın hanı bəs?

Nə gəlirsən önümə işvə ilə, ey saqi,
Məni sərməst qılan mey dolu camın hanı bəs?

Söyləmişdin ki, verərsən canını uğrumda,
Canı qoy bir yana, ey şux, salamın hanı bəs?

*18.08.2000*

***

Bağlansa da zəncirlə kəfən yox yenə xeyri,
Zənn eyləmə adi ölülərdən biriyəm mən.

Dəfn et məni, sonra qayıdıb damə nəzər sal,
Bil, damdə şahin quşu görsən, diriyəm mən.

*6.10.2000*



***

*"Cəzbi-qülubi-mərdüm içün zahidi-cəhul,*
*Büdətlər ilə məscidi çün sumənat edər".*
**Əbdülxaliq Cənnəti**

Nə ərəb şeri, nə fars şeri, nə türk şeridi bu,
Nə şerdir bu belə, hansı dilin sözləridir?

Ərəbistan və İran xalqı bunu dərk eləməz,
Kim deyər ki, yeni dövrün, nəslin sözləridir?

Bu dili indi qəbul etməyir Azərbaycan,
Nə Aranın, nə Muğanın, nə Milin sözləridir.

*9.10.2000*

***

Məşhəd şəhərində neçə məscid gözə dəydi,
Allah-təalanın elə məbədi çoxmu?

Dörd dəfə olub məşhədi, amma yenə istər,
Şahin kimi divanə olan məşhədi çoxmu?

*10.10.2000*

***

Dərd var isə, - deyirlər, - dərmanı da müəyyən!..
Köks içrə dağlər var, amma şəfa görünmür.

Canan neçin yan oldu, qəm-qüssə batman oldu,
İnsaf yoxmu, yarəb, neyçün səfa görünmür?

Etməzdi bivəfalıq məndən vəfa görən kəs,
Məndən vəfa göründü, ondan vəfa görünmür.

*19.10.2000*

***

Qalxmadayam zirvəyə tədric ilə,
Alçaq adamdan ucalıq gözləmə.

Bənzəri yoxdur Xoca Nəsrəddinin,
Qeyrilərindən xocalıq gözləmə.

"Namixuda" söylə mənə, ey pəri,
Ağsa da zülfüm qocalıq gözləmə!

*7.11.2000*

***

Etməsinlər mənə imdad bu gündən sonra,
Mən gərək daima Rəbbin köməyindən yapışım.

Əl atıb boynuma cırdım yaxamı, ey dilbər
Ki, sənin paltarının mən ətəyindən yapışım.

Ya İlahi, əzəni sən özün əz, güc ver ki,
Əzilən kimsələrin mən biləyindən yapışım.

*17.12.2000*

***

Vurdum qədəhi daşə, yox meydə daha təsir,
Qırdım oxu mən, çünki hər bir naşı atmaqda.

Hicranə "əleyküm" de, əfğanə "səlam" eylə,
Tale yenə, ey Şahin, hicran daşı atmaqda.

*3.01.2001*

***

Zülm edibsə kimə hər kim ona "zalım" dedilər,
Yaşadım altmış il mən bu ömür zalım ilə.

Niyyətim bir neçə il həm yaşamaqdır amma,
Qalarammı görəsən sağ bu zəif halım ilə?

Qüvvədən düşdü qolum, saqqaladır indi ümid
Ki, silim göz yaşımı, ey pəri, saqqalım ilə.

*22.01.2001*

***

Eşqini mən, gözəlim, zərrə güman eylərdim,
Görünür gözlərimə indi böyük şəklində.

Səni qəm çəkməyə qoysam kişilikdən uzağam,
Yığmışam qəmlərini çiynimə yük şəklində.

O qədər hicr oxu atdın mənə ki, zülf deyil
Oxlarındır, yığılıb başıma tük şəklində.

*12.02.2001*

***

Ağzının fikrin edirsən həmişə, ey miskin,
Hələ ki, qalxmayıb əqlin qaşığından yuxarı.



Saqqalından aşağı heç nəyə yoxdur meylin,
Fikrini cəlb eləmir heç nə bığından yuxarı.

*29.06.2001*

***

Qələmim varsa da, var daş kimi yumruq məndə,
Üstümə kim daş atarsa daşını sındırram.

Sən mənim qəlbimi sındırsan əgər, ey zahid,
Mən sənin, məlumun olsun, başını sındırram.

*19.08.2001*

***

Söylədi şeyxə bir əyyaş ki, bir arzum var:
Süfrə tək qoy açıla sidq ilə qəlbim, ya şeyx.

Qəlbimin şişəsini yüz kərə sındırmaq olar,
Təki mey şişəsini qırmaya heç kim, ya şeyx.

*29.09.2001*

***

Elə çöl var elə səhra ki, qar istər göydən,
Düşməyə bir yeri yoxmu, başıma qar ələnib.

Cazibə qüvvəsinin əksi verir baş məndə,
Ey şəlalə, gözümün yaşları fəvvarələnib.

*10.10.2001*

***

Aləmin miqyasının isbatə yoxdur hacəti,
Min qəmim vardır ki, hər qəm məndə aləm boydadır.

Hər savabım Qudyalımdan bəlkə də çox-çox böyük,
Gər günahım var isə olsun ki şəbnəm boydadır.

*27.10.2001*

***

Bilməyirəm doğrudan xəlq eləyibdir fələk
Fərhadı Şirinşünas, Xosrovu Şəkkərşünas?

Ömrü boyu əlləri oynasa da zər ilə
Mən isə hər zərgəri sanmayıram zərşünas.

Göz yaşıma etina eyləyəni görmədim,
Heç biri dilbərlərin olmadı gövhərşünas.

*31.10.2001*

***

Şahin idim, indi isə tutiyəm,
Duzlu nigarım dilini qənd edir.

Var ürəyi içrə vəfa qönçəsi,
Qəlbimi daim özünə bənd edir.

Xas idi bir vaxt ulu şairlərə,
İndi o ilham pərisi məndədir.

Gündə şer yazmadayam şövq ilə,
Təbi zəiflər mənə rişxənd edir.

*27.12.2001*

***

*Qəlizdil qəzəlxanlara!*

Biədəb kimsələrə üz tutuban söyləyirəm:
Nə ədəbdən danışırsız, ədəbi bilmirsiz.

Bürüyüb şerinizi farsü ərəb kəlmələri,
Axı siz mən kimi farsı, ərəbi bilmirsiz...

"Gərək hər kəlməbaşı bir kərə qamusə * baxam" **,
Guya ki, qeyzimə bais səbəbi bilmirsiz.

Deyil uyğun o qəliz kəlmə bu gün tazə dəbə,
Köhnəlik aşiqisiz, tazə dəbi bilmirsiz.

*7.03.2002*

***

Söylədim "Ey bu kəsin şahı, nə çoxdur dərd-qəm?.."
Mən qula ərz elədi bunları ol şahın özü:

"Nə bəla gəlsə, ey aşiq, yenə döz, səbr eylə,
Nə gəlirsə bizə göndərmədə Allahın özü".

*29.03.2002*

***

Saf qəzəl tacını qoydum başıma,
Deməsin kimsə ki, bəxtim yoxdur.

* Lüğət

** Misra Məmməd Səid Ordubadinindir.



Mən də şah'əm, qələmim var mənim,
Etmirəm qüssə ki təxtim yoxdur.

*6.04.2002*

***

Doldu bir badə kədərlə, o biri qüssə ilə,
Çıxacaqdır sonuma badələrin hər birisi.

Qəm haramzadə olubdur, ələm ondan da betər,
Məni yıxdı bu haramzadələrin hər birisi.

*20.04.2002*

***

Gah sülh arzulayıb, gah bezib cəngə gəlib,
Bezdirib Şahini, yarəb, bu həyatın axarı.

Altmış yaş məni bezdirdi, canım təngə gəlib,
Yaşayır amma İmam Mehdi min ildən yuxarı...

*24.04.2002*

## MÜRƏBBE, MÜSƏBBE, MÜLƏMME, MÜXƏMMƏS, SÜRUD, TƏRKİBBƏND VƏ TƏRCİBƏNDLƏR

### MÜRƏBBE

Mey gətir Şahinə, dildar, haram olmayacaq,
Yenə badə yana par-par, haram olmayacaq.
Özümün öz hesabım var, haram olmayacaq,
Sən verən mey mənə, ey yar, haram olmayacaq.

Gəlməsən sən bizə yazmaz qələmim bircə sətir,
Sən gəlirkən yayılır hər tərəfə, bəh, nə ətir...
Çəkinib eyləmə əsla, meyi cürətlə gətir,
Sən verən mey mənə, ey yar, haram olmayacaq.

Dərk edən mən kimi sənsən məni məndən başqa,
Sevirəm mən meyi həm sənlə vətəndən başqa,
Verməsin qoy mənə heç kim meyi səndən başqa,
Sən verən mey mənə, ey yar, haram olmayacaq.

Sən gələn gün yanıma böylə nizam olmalıdır:
Nə çıraq yanmalıdır evdə, nə şam olmalıdır!

Mənə mey versə əgər saqi haram olmalıdır,
Sən verən mey mənə, ey yar, haram olmayacaq.

Gəlmisənsə sən əgər, ey pəri, qaytarmamışam,
Ehtiram eyləmişəm, var yeri, qaytarmamışam,
Əlini mən sənin, əlbət, geri qaytarmamışam,
Sən verən mey mənə, ey yar, haram olmayacaq.

Mey üzümdən süzülür, ah, haram etmişlər,
Nökər içsin, ya da ki şah, haram etmişlər...
Meyi nuş etməyi hərgah haram etmişlər,
Sən verən mey mənə, ey yar, haram olmayacaq.

Sanma kim nuş eləsə mey ona lənət dedilər,
Meyi kəşf eyləyənə, Şahina, rəhmət dedilər,
Meyə məna dedilər, badəyə surət dedilər,
Sən verən mey mənə, ey yar, haram olmayacaq.

*21.06.1996*

## MÜRƏBBE

Səmərsizdir bu gün Şahin, daha heç bir bəhər vermir,
Gözəllərdən salam almır, qəzəllərdən xəbər vermir.
Heca bilmir, əruz bilmir, nə müddətdir əsər vermir,
Məni tuti edən dilbər küsüb məndən, şəkər vermir.

Uzaqda qaldı yar ilə gülüb xummar olan dəmlər,
Məhəbbət var olan dəmlər, səadət var olan dəmlər,
Dilimdə pak adı dəmdən-dəmə təkrar olan dəmlər,
Məni tuti edən dilbər küsüb məndən, şəkər vermir.

Yolunda qorxu bilməzdim, çəkinməzdim xətərdən də,
Əgər bağ bağlı olsaydı aşardım lap çəpərdən də,
Yanında nazlı dildarın üzüm ağdır şəkərdən də,
Məni tuti edən dilbər küsüb məndən, şəkər vermir.

Könül var iztirab almır, könül var ahüzar içrə,
Qəzəllər şahı ah içrə, gözəllər şahı zar içrə,
Ucuzluqdan əlamət yox, şəkər qalxıb bazar içrə,
Məni tuti edən dilbər küsüb məndən, şəkər vermir.



Yaman çox dərdçəkən vardır, hərə bir cür çəkər dərdi,
Məgər əllər yorulmazmı səpər dərdi, əkər dərdi,
Mənim dərdim qədərsizdir, mənim dərdim şəkər dərdi.
Məni tuti edən dilbər küsüb məndən, şəkər vermir.

Bu gün Fərhadü Qeys ilə yarışmaq istəyir könlüm,
Gəhi səhranişin olmaq, gəhi dağ istəyir könlüm,
Məni yormuş bu küskünlük, barışmaq istəyir könlüm,
Məni tuti edən dilbər küsüb məndən, şəkər vermir.

Mən üç yol məşhədi oldum, ziyarət - baş tacı oldu,
Görərlər bir zaman Şahin gedib həccə hacı oldu,
Şirin-şəkkər günüm vardı, zəhərdən də acı oldu,
Məni tuti edən dilbər küsüb məndən, şəkər vermir.

*17-20.07.1996*

## MÜRƏBBE

Bir dəfə gülüb eyləmisən qəlbi sevincək,
Ey nazlı nigarım, üzümə bir də gülümsə.
Qəlbin zəmisində, nə olar, bir də sevinc ək,
Ey nazlı nigarım, üzümə bir də gülümsə.

Hər cahili gördükdə pərişan oluram mən,
Dönsün ciyəri qanə, ciyərqan oluram mən,
Biganə gülüşdən qaçıram, yan oluram mən,
Ey nazlı nigarım, üzümə bir də gülümsə.

Səndən savayı sən kimi munis mənə kim var?
Gül, canə gəlim, qəmdən üzülmüş ürəyim var,
Billah, mənim indi fəqət bir diləyim var:
Ey nazlı nigarım, üzümə bir də gülümsə.

Dərman eləsən dərdə, təbəssüm görəcəksən,
Sevdalı könüllərdə təbəssüm görəcəksən,
Gir bağçaya, güllərdə təbəssüm görəcəksən,
Ey nazlı nigarım, üzümə bir də gülümsə.

Gülsən, gülərəm mən də, gülüş bəxş elə yarə,
Olsa, gülüşündən olacaqdır mənə çarə,
Ağ idi günüm, indisə zülfün kimi qarə,
Ey nazlı nigarım, üzümə bir də gülümsə.

Bildir mənə hər dərdini, bilmək dilərəm mən,
Yetməzsə əlacım sənə ölmək dilərəm mən,
Sən gül ki, gülüm mən dəxi, gülmək dilərəm mən,
Ey nazlı nigarım, üzümə bir də gülümsə.

Ey saqi, qəmi yoxsa soraqlar qoca Şahin,
Mey şişəsinin ağzını bağlar qoca Şahin,
Sən gülməsən, əlbəttə ki, ağlar qoca Şahin,
Ey nazlı nigarım, üzümə bir də gülümsə.

*12.02.1998*

## MÜRƏBBE

Deyirəm hər sevənin arzu bağı güllənsin,
Nəsib olmuş nə gözəl gün bu gün, ey Tanrı, mənə.
Görübən bağda məhəbbət gülünü dillənsin:
Nəsib olmuş nə gözəl gün bu gün, ey Tanrı, mənə.

Fərəhi boğmalayıb qəm mənə olmuşdu nəsib,
Bürüyüb gözlərimi nəm mənə olmuşdu nəsib,
Ələmim çoxdu, kədər həm mənə olmuşdu nəsib,
Nəsib olmuş nə gözəl gün bu gün, ey Tanrı, mənə.

Bir görüş etdi əvəz sanki neçə toy-düyünü,
Heç təsəvvür eləməzdim bu gözəllikdə günü,
Gözü vardır qələmin, yazmadadır gördüyünü,
Nəsib olmuş nə gözəl gün bu gün, ey Tanrı, mənə.

Daha mən qan eləyib qəlbi fəğan eyləmərəm,
Faidəm olmalı eşqimdə, ziyan eyləmərəm,
Bəxtimin dönməsini bir də güman eyləmərəm,
Nəsib olmuş nə gözəl gün bu gün, ey Tanrı, mənə.

Günəşim tazə çıxıbdır, qəmərim tazələnib,
Baxışım tazələnibdir, nəzərim tazələnib,
Bütün aşiqlərə, bəh-bəh, xəbərim tazələnib,
Nəsib olmuş nə gözəl gün bu gün, ey Tanrı, mənə.

Nə gözəl gündü, çəkirkən bu günün həsrətini,
Təbimin şahini göstərdi uçuş vüsətini,



Bu mürəbbe verə bilmişsə əgər qiymətini
Nəsib olmuş nə gözəl gün bu gün, ey Tanrı, mənə!

*10.09.1998*

## MÜRƏBBE

Sirli çox məsələdən baş aça bilmişdim mən,
Açmadım baş bu məhəbbət nə təhər başlandı.
Çox pəriçöhrə əlindən qaça bilmişdim mən,
Açmadım baş bu məhəbbət nə təhər başlandı.

Gərçi can içrə əzəldən də fərasət çoxdu,
Bacarıq çoxdu, təpər çoxdu, cəsarət çoxdu,
Dilbərə amma nə müddətdi məhəbbət yoxdu,
Açmadım baş bu məhəbbət nə təhər başlandı.

Yoxsa da qönçələrin hüsnünə diqqət məndə,
Çox gülün sevgisi qalmışdı əmanət məndə,
O təhər var idi tənhalığa rəğbət məndə,
Açmadım baş bu məhəbbət nə təhər başlandı.

Təkliyə bir neçə müddət ki, vəfadar oldum,
Nə özüm yar bəyəndim, nə də ki, yar oldum,
Bir də gördüm yeni sevdayə giriftar oldum,
Açmadım baş bu məhəbbət nə təhər başlandı.

Bəlkə də, göydə dübarə iki ulduz görüşüb...
Şahinin qoy başı batsın, nə oyundur bu düşüb?
Deyəsən ağlı çaşıb, zehni başından sürüşüb,
Açmadım baş bu məhəbbət nə təhər başlandı.

*3.01.1999*

## MÜSƏBBE

Ey göy qəməri, yerdə də sən tək qəmərim var,
Ardınca gəzən gün kimi hər gün səfərim var.

Hərçənd nə ləlim, nə dürüm var, nə zərim var,
Amma ki, zər ardınca dəmadəm nəzərim var.
Sənsən mənə zər, sən kimi qiymətli pərim var,
Fəxr eylə, pərim, söylə ki, zər tək dəyərim var,
Qoy fəxr eləyim mən də, əzizim, gühərim var.

Ol dəm ki, səni sevməyi sidq ilə qət etdim,
Ovcumda tutub qəlbi səninçin dəmət etdim,
Bir kəs demədi mən bu əməllə qələt etdim,
Məcnun ilə, Fərhad ilə çox məşvərət etdim,
Aşiqliyi hər nabələdə məsləhət etdim,
Sevdayə düşəndən bəri çox mənfəət etdim,
Bir dəm demədim mən ki, bu işdən zərərim var.

Çoxdandı ki, hicrin arada səddi görünmür,
Vəsl ilə fərağın daha sərhəddi görünmür,
Bədxahlərin gözlərimə qəddi görünmür,
Şerim ki rəvandır, gözəlim, ziddi görünmür,
Dastan qoşuram tərifinə, rəddi görünmür,
Gördükdə səni şənliyimin həddi görünmür,
Billah, səni görmədiyim gün kədərim var.

Bağlandı könül sidq ilə ilqarına eşqin,
Məst oldu sevəndən bəri rəftarına eşqin,
Zəngin bir ürək bəxş elədim varına eşqin,
Əhsən, gözəlim, sən təki memarına eşqin,
Alqışlar ola böylə səbəbkarına eşqin,
Tez-tez gedirəm şövq ilə gülzarına eşqin,
Tənha deyiləm indi daha, həmsəfərim var.

Eşqim daha da şölələnib şöləvər olsa,
Cismimdə ömürlük elə bir şölə gər olsa,
Eşq əhli saf eşqim sarıdan baxəbər olsa,



Amalıma, rəftarıma xoşbin nəzər olsa,
Aşiqbaşı söylər mənə gər mötəbər olsa...
Hər dəm bu şərif yolda əgər min xətər olsa,
Bir yol deməram mən ki, bu yolda xətərim var.

Gəlmişsə də ömrün qışı, qış fəsli bahar - mən,
Ən sevməli bir yarə nə müddətdi ki, yar - mən,
Hərgah yarın bəxti qıfıllansa, açar - mən,
Gündən-günə vəsliylə onun məstü xumar - mən,
Çox nakişiyə qarşı çıxan bir kişi var - mən,
Çin səddi kimi əyriliyə qarşı hasar - mən,
Hifz eyləməyə tər-təmiz eşqi sipərim var.

Yarın sənə huri, sən ona qılman olursan,
Hərgah turac olsa, ona tərlan olursan,
Ya, dönsə gülə, sən dönübən bağban olursan,
Loğmanə lüzum olsa əgər loğman olursan,
Gündən-günə sən sevgilinə heyran olursan...
Eşq mülkünə, Şahin, dedilər sultan olursan,
Qafil deyiləm mən, bu xəbərdən xəbərim var.

*26.02.1996*

## MÜLƏMMELƏR

Qəzəle-taze neveştən ke, zərurəst emruz *,
Tazə-tər olmasa hər gül, xəzəlindən nə xeyir?

Vəzn-o bəhr-o həme gər qafiyeaş niktərəst **,
Anlaşılmırsa, o şerin gözəlindən nə xeyir?

Minevisi bezəbani ke, nəmifəhmani ***,
Səni bir kəs başa düşmür, qəzəlindən nə xeyir?

*30.11.1995*

* Bizə vacibdi bu gün təzə qəzəllər yaradaq.
** Tutalım qafiyəsi, vəzni gözəl, bəhri gözəl.
*** Elə bir dildə yazırsan ki, özündən başqa.

***

Eşqe-an hur ra dər gur nehaneş kərdəm[1],
Aşiq olsam ona mən bir də əgər namərdəm.

Məni bica yerə incitdi o dilbər, mənsə
Rəveşe-əhdo sədaqətra beca avərdəm [2].

Sali yek mərtəbe gər qosse xorənd - bimarənd [3],
Mən isə çəkmədəyəm qüssə, kədər, qəm hər dəm.

Axtarıb tapmalıyam baisi gündüz və gecə,
Ruzgərdəm ço oğab, həmço pələng şəbgərdəm [4].

Neyləyim, göydə qəmər tək saralıbdır bənizim,
Nəkonid hiç soaləmra çera ruzərdəm [5]?

Əhle-meyxane pəsəndəm nənəmayənd, əmma [6]
Neçə dərd əhli dedi: Şahin ilə həmdərdəm.

*4.02.1996*

***

Naşad idim şad oldum, etdi cananəm səda [7],
Həmço naşad şad gəştəm, kərd cananəm səda.

Hər sədanı dinləyib canım səda etməkdədir,
Hər səda ra guş kərde mikonəd canəm səda.

Yaş tökür indi vüsalım, amma hicran - səsləyir,
Gerye-vəsləm minəmayəd, leyk hicranəm - səda.

Başqa imkanım yox olmuş, qaldı imkanım səsə,
Qeyre emkan ra nəmibinəm ke, emkanəm - səda.

Xəstəyəm, loğmanım hərdənbir səda eylər məni,
Mən mərizəm, mikonəd gəh-gah loğmanəm səda.

Şahina, vəslim yox artıq, səslədi hicran məni,
Şahina, vəsləm berəfto kərd hecranəm səda.

*10.05.1996*

1. O hurinin eşqini dəfn elədim.
2. Əhd və sədaqət qayda-qanununa əməl etdim.
3. Ildə bir yol qüssələnən adamlar xəstələnirlər.
4. Qartal kimi gündüz uçan, pələng kimi gecə gəzənəm.
5. Məndən soruşmayın ki, niyə bət-bənizin saralıbdır?
6. Meyxanə əhli məni pəsənd etməyir.
7. Bu müləmmənin hər beytinin ikinci misrası birinci misranın farsca tərcüməsidir.



## MÜXƏMMƏS

*Qəzəlxan Ələmdar Mahirə*

*"Minrəngli dünyada ki bir ömr dolandım,*
*Heç bilmədim hardan belə min rəngə boyandım,*
*Mahir kimi qəflətdə idim sanki, oyandım,*
*Min rəngə düşüb rəngimi gördükdə utandım,*
*Bir çarə edək qalmaya bir rəng aramızda".*

**Ələmdar Mahir**

Eşq aləminin mən kimi ey sərvəri Mahir,
Qoyduq qınına çəkdiyimiz xəncəri, Mahir,
Aldıq ələ şövq ilə qələm-dəftəri, Mahir,
Söz cənginin ey mən kimi cəngavəri Mahir,
Çox yaxşı ki, bitmiş deyəsən cəng aramızda.

Ən ümdə kəlam oldu hər aqildə - məhəbbət,
Yarəb, ola hər hücrədə, mənzildə məhəbbət,
Dəryadə məhəbbət qala, sahildə - məhəbbət,
Qəlb içrə səadət ola, həm dildə - məhəbbət,
Məclisdəkilər olmaya diltəng aramızda.

Zərgərliyimiz var isə misgər bizə neylər?
Olsaq biz əgər tunc kimi, xəncər bizə neylər?
Üzmək biliriksə daha Tərtər bizə neylər?
Şeytan nə edər bizlərə, kafər bizə neylər
Əlbirliyimiz olsa həmahəng aramızda.

Gər Mailə bənzər ola bilsəydi hər insan,
Çəkməzdi fəna mülkdə, əlbət, zərər insan,
"Imanı olanlardı fəqət bəxtəvər insan" *,
Çox yaxşı ki, vardır Qəni tək mötəbər insan,
Çox yaxşı ki, kök atmadı xərçəng aramızda.

Bağbanə gərəkdirmi ola bağda xəzəllər?
Hər gün yaradaq şövq ilə dürdanə qəzəllər,

* Misrə Mahirindir.

Qoy sözlərimizdən gələlər vəcdə gözəllər,
Çıxsın yadımızdan daha əvvəlki əməllər,
Yarəb, havalansın təzə ahəng aramızda.

Amal gülümüz qoy yenə əvvəlki tək açsın,
Qəlb içrə neçə arzu cücərsin, dilək açsın,
Söz gülşənimiz ətr ilə dolsun, ürək açsın,
Qoy solmaya şerin bağı, yarəb, çiçək açsın,
Nərgiz yerinə bitməyə turşəng aramızda.

Kin saxlamaq, əlbəttə, bu minval yaraşmaz,
Hər sözdə səmimanə olaq, xal yaraşmaz,
Sülh arzulayan kəslərə cəncal yaraşmaz,
Hal əhlinə, zənnimcə mənim, qal yaraşmaz,
Hal əhli daha olmaya qoy dəng aramızda.

Gizlin diləyim qoy ola zahir, bağışla,
Təkzib elədim şerini, şair, bağışla,
Həcvim də olubdur sənə dair, bağışla...
"i" hərfini atdım, məni, Mahir, bağışla,
Münsif ola bilmirdi Ərəbzəng aramızda.

Xoşdur ki, kənar eyləmişik cəngi, a Şahin,
Mahir dəyişibdir daha ahəngi, a Şahin,
Şur ilə çalaq sülh udunu, cəngi, a Şahin,
Inkar edirəm mən də qara rəngi, a Şahin,
Ağ rəng olacaq olsa əgər rəng aramızda.

*1.01.1999*

## SÜRUD

Dərvazəmi bəxtim sayağı bağlamışam mən,
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.
Əvvəl də qalıb tək nə qədər ağlamışam mən,
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.

Bir yanda qaranlıq gecə, bir yanda səhər var,
Bir yanda sevinc var isə, bir yanda kədər var,
Bir yanda təbəssüm - dolu, bir yanda qəhər var,
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.



Ey şəm, sənin hüsnünə pərvanə mənəm, mən,
Bir vəqt deyərdim qəmə biganə mənəm, mən,
Göz yaşı tökən indisə divanə mənəm, mən,
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.

Bir kəs bu kəsin sən kimi dildarı olarmı?
Dünyadə bir afət yarının yarı olarmı?
Yığsam mən əgər göz yaşı mirvari olarmı?
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.

Çox dərdimi əvvəl bölüşərdim varağ ilə...
Çox zülməti dərhal əridərdim çırağ ilə...
Bəlkə, ürəyim dinc olacaq ağlamaq ilə,
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.

Bitmir gecə, ey yar, günün çıxması müşkil,
Göylərdə bulud var, günün çıxması müşkil,
Yağmazsa yağışlar günün çıxması müşkil,
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.

Ol beyt, a Şahin, daha misra kimi olma,
Gəl, gəl yanıma, ey pəri, tənha kimi olma,
Mən Qeysə dönüm, sən isə Leyla kimi olma,
Sən gül, gözəlim, ağlamağım var yenə sənsiz.

*14.03.1996*

## SÜRUD

Pərt oldu bu aşiq, yenə şad oldu alağlar,
Bağında vüsalın yenə həsrət gülü bitdi.
Bülbül də olub halıma pəjmürdəhal ağlar,
Bağında vüsalın yenə həsrət gülü bitdi.

Çox gül mənə hərçənd o həmdəm gətiribdir,
Həm nəşə veribdir mənə, həm dəm gətiribdir...
Mən qoxlamaram bir gülü ki, qəm gətiribdir,
Bağında vüsalın yenə həsrət gülü bitdi.

Mülkündə bu şahın yenə dövlət gülü soldu,
Şöhrət gülü, izzət gülü, iffət gülü soldu,

Göz dəydi mənim eşqimə, vəslət gülü soldu,
Bağında vüsalın yenə həsrət gülü bitdi.

Yaz, yaz, a qələm, qismət olub gör kimə həsrət,
Yanmış, külə dönmüş Kərəməm Əslimə həsrət,
Həsrət güludür, qoydu məni vəslimə həsrət,
Bağında vüsalın yenə həsrət gülü bitdi.

Söz yox ki, müdam lütfünü gözlər hərə həqqin,
Rəhmi yoxa çıxdı mənə birdən-birə həqqin,
Hicran yağışı yağdı göyündən yerə həqqin,
Bağında vüsalın yenə həsrət gülü bitdi.

Rəngi göyərəndən bəri rəngim saralıbdır,
Gülmür daha qəlbim, məni qəm-qüssə sarıbdır,
Kim xidmət edibdir o gülə, kim suvarıbdır?
Bağında vüsalın yenə həsrət gülü bitdi.

Gün çıxsa da, gündüz mənə qətran kimi qarə,
Ay doğsa da, dəymir nəzərim indi o yarə,
Şahin necə bağbandı ki, yol verdi dübarə
Bağında vüsalın yenə həsrət gülü bitdi.

*1.08.1997*

## SÜRUD

Nə bəşər? Qalmışam heyrətdə, yadımdan çıxdı,
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.
Tək bəşər yox, bəşəriyyət də yadımdan çıxdı,
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.

Gözəlim, aç gözünü sinnimə bax, yaşıma bax,
Şahdağın zirvəsi tək sən ağaran başıma bax,
Qoca olsam da, cavanlar kimi yaddaşıma bax,
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.

Düşünürdüm ötəcək, sadəcə həsrətdir bu,
Dedilər falə baxanlar ki, məhəbbətdir bu!
Bu nə möcüz, bu nə sirdir, nə kəramətdir bu -
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.



Öz canım çox nədi, az həm yada düşmür, çünki
Dəstəmazü canamaz həm yada düşmür, çünki
Neçə müddətdi namaz həm yada düşmür, çünki
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.

Dərk edə bilməyirəm, heç belə də yaddaş olar?
Həsədindən dinə bilməz karıxıb, yad daş olar,
Bu kəsin zehni zehinlər yarışında baş olar,
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.

Taybatay aç qapını, bağlama, sənsiz ölürəm,
Tədrisə dərsini eşqin təzədən mən gəlirəm,
Məni dərsin kimi yaddan çıxarıbsan, bilirəm,
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.

Öylə zərgər ki bu Şahin, zəri sənsən təkcə,
Qeyri bir gövhəri yox, gövhəri sənsən təkcə,
Yapışan yaddaşıma, ey pəri, sənsən təkcə,
Səni yaddan çıxara bilməyirəm, bilməyirəm.

*30.09.1999*

## SÜRUD

Var bir Xaliq ki, xilqət əqlinin heyranıdır,
Hər məkanın, asimanın, kəhkəşanın şanıdır,
"Hökm onun hökmüdürür, fərman onun fərmanıdır" *,
Çünki cananım bütün cananların cananıdır.

Ərşi çoxdur, fərşi çoxdur, bəhri çox, ümmanı çox,
Səbri çox, insafı çoxdur, ədli çox, imkanı çox,
Hər kimin nöqsanı vardırsa onun nöqsanı yox,
Çünki cananım bütün cananların cananıdır.

Zatını əks eyləyib Quranda "Bismillah" özü,
Aləmə sultan özü, xaqan özü, padşah özü,
Allahı Allah edibdir Həzrəti-Allah özü,
Çünki cananım bütün cananların cananıdır.

Bağibandır, saribandır, mehribandır hər zaman,
Hökmrandır, ləhzə-ləhzə, dəmbədəm hökmü rəvan,
Laməkandır, amma ki, hər bir məkan içrə əyan,
Çünki cananım bütün cananların cananıdır.

* Misra Məhəmməd Füzulinindir.

Göylərə qaldırsa da merac üçün Peyğəmbəri,
Yerlərə salmış atından Cəmşidi, Isgəndəri...
Laşərikdir, binəzirdir, kimsəyə yox bənzəri,
Çünki cananım bütün cananların cananıdır.

Özgə sirdaşım mənim yox, söylədim sirdaş ona,
Layiq olsun hər minacatım mənim eykaş ona,
Kainatda qeyri canan yoxdur olsun baş ona,
Çünki cananım bütün cananların cananıdır.

Heç qələm ecazını vəsf etməyə qabil deyil,
Əqlinə şəkk eyləyən divanədir, aqil deyil,
Fəzlini dərk etməyən kəs, Şahina, fazil deyil,
Çünki cananım bütün cananların cananıdır.

*2.02.2001*

## SÜRUD

*Mahir kamança ustadı Mirnazim Əsədullayevin 50 baharı münasibətilə*

Gülşəndə ayaq altda qalan güllərə baxdım,
Gördüm ki, kaman ağladı Mirnazim əlində.
Fəryad eləyən mən kimi bülbüllərə baxdım,
Gördüm ki, kaman ağladı Mirnazim əlində.

Şad oldu çatıb əlli baharə, üzü güldü,
"Əhsən" dedi "əhsən" bu diyarə, sözü güldü,
"Hər dərdə olar, - söylədi, - çarə, gözü güldü,
Gördüm ki, kaman ağladı Mirnazim əlində.

Dilləndiyi ləhzə elə ki çıxdı sədası
Od vurdu "Çahargah" bizə, dağlatdı "Nəva"sı,
Yandırdı "Rahab"ı, elə ağlatdı "Nəva"sı,
Gördüm ki, kaman ağladı Mirnazim əlində.

Sadiqdi müdam eşqinə bir olsa da yarı,
Mat etdi muğamatına bir dəstə nigarı,
Ol dəmdə ki, ifa elədi "Bəstənigar"ı
Gördüm ki, kaman ağladı Mirnazim əlində.



Heyfa, neçə orman, neçə dağ yadə düşəndə,
Dərda, neçə gülşən, neçə bağ yadə düşəndə,
Yad əllərə düşmüş Qarabağ yadə düşəndə
Gördüm ki, kaman ağladı Mirnazim əlində.

Illərlə kaman atəşinə öylə ki yandı,
Habil ilə qardaş kimi yan-yanə dayandı,
Nəsli ki, seyid nəslidi, seyyidləri andı,
Gördüm ki, kaman ağladı Mirnazim əlində.

Ustad əli mey kuzəsinə, camə dəyəndə,
Zərgər nəzəri musiqidə xamə dəyəndə,
Hərdən gözü Şahin kimi nakamə dəyəndə
Gördüm ki, kaman ağladı Mirnazim əlində.

*9.10.2001*

## SÜRUD

Ölümü zəhr deyil, ey pəri, şərbət sayırıq,
Ölürük bir-birimizçin, yaşasın böylə ölüm.
Ölümü rədd eləyirlər, biz isə xoşlayırıq,
Ölürük bir-birimizçin, yaşasın böylə ölüm.

Nə fəxarətdir, əzizim, nə şərafətdir bu,
Nə məlahət, nə lətafət, nə səadətdir bu,
Yaşamaqdan ötəri gör nə zərurətdir bu,
Ölürük bir-birimizçin, yaşasın böylə ölüm.

Yaşa nikbin, acı bədbinliyə sən qalibsən,
Necə göyçək, necə saf bir ürəyə sahibsən,
Sənə mən lazımam, ey gül, mənə sən vacibsən,
Ölürük bir-birimizçin, yaşasın böylə ölüm.

Inkirü münkir ilə sazişimiz var bizim,
Əzrayıl ləngiyəcək, xahişimiz var bizim,
Yaşamaqdan da gözəl bir işimiz var bizim,
Ölürük bir-birimizçin, yaşasın böylə ölüm.

Neçə yol söyləmişəm, söyləyirəm mən yenə də:
Ən böyük arzu yatıbdır sənə vurğun sinədə,

Sənə də arzuladım mən ölümü, Şahimə də,
Ölürük bir-birimizçin, yaşasın böylə ölüm.

9.01.2002

## SÜRUD

Hər tərəfdə, səni hər yanda, Ilahi, görürəm,
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?
Səni qadir görürəm, mən səni dahi görürəm,
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?

Od və Torpaq və Hava, həm Suda əksin görünür,
Birinə bir görünürsə, mənə min-min görünür,
Günə baxdım səni gördüm... necə zərrin görünür...
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?

Ulu Adəm, ulu Həvva... ulu səndən başlar,
Həzrəti-Musa əsası, qolu səndən başlar,
Hər Şəriət və Təriqət yolu səndən başlar,
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?

Cəmşidi, Xosrovu, Isgəndəri verdin bəşərə,
O Məhəmməd kimi peyğəmbəri verdin bəşərə,
Sabiri, Mirzə Əli Əkbəri verdin bəşərə,
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?

Sən özün qoymusan, ey şəh, necə dövlət təməlin,
Cəmi xilqətdə sözün var, hərəkətdə əməlin,
Elmü sənətdə gözün var, mədəniyyətdə əlin,
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?

Səpmisən sən göyə ulduzları mərcanlar tək,
Yeri abad edəcəksən, gözəlim, memar tək,
Mənə bəxş eyləmisən sevgini sonsuz var tək,
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?

Şahinə lütf elədin fəxrü fəxarət nəzəri,
Mərifət gözləri, ey yar, Həqiqət nəzəri,
Görürəm mən səni, var məndə bəsirət nəzəri,
Mənə lazımmı bu gözlər səni görmürsə əgər?

28.02.2002



## TƏRKIBBƏND

Sevdadə əda olduğunu bilməz idim mən,
Eşq içrə bəla olduğunu bilməz idim mən.
Səslərdəki səssizliyi duymazdım əzəllər,
Səssiz də səda olduğunu bilməz idim mən.
Ağ günlərin üstündə qara örtüyü görməz,
Ağ içrə qara olduğunu bilməz idim mən.
Yaxud, gecənin rəngi qaranlıqdı gözümdə,
Zülmətdə ziya olduğunu bilməz idim mən.
Ya qırmızı rəng içrə qanın rəngini seçməz,
Qan varsa qada olduğunu bilməz idim mən.
Gündən-günə hər rəng əyan oldu gözümdə,
Vaxt ötdü və çox rəmz bəyan oldu gözümdə.

Gənclikdə Quba yurduna vurğun kimi idim,
Qudyalıma, Şahdağıma məftun kimi idim.
Bir nazəninin nazına dözdükcə dözürdüm,
Eşqiylə onun bir yeni Məcnun kimi idim.
Çox şey mənə əsrar idi, rəmz idi müəmma,
Lənətlər idim çox şeyi, məlun kimi idim.
Bədxahları gördükdə müdam fikr eləyirdim,
Gündən-günə bədbin kimi, məhzun kimi idim.
Qəlbimdə cavanlıq alovu vardı, vücudim
Zidd olsa da yorğunluğa, yorğun kimi idim.
Hər bir günü görmək daha da ağ - diləyimdi,
Şahin kimi ənginliyə uçmaq - diləyimdi.

Yığdım, gülü gülşəndə gülab eyləmədim mən,
Hətta gülə də zərrə əzab eyləmədim mən.
Inkar eləyən çox tapılar pisləyən olsa,
Təsdiq eləyən varmı savab eyləmədim mən?
Tərk eylədim ol nazənini, oldu yamanlıq,
Çox yaxşılığım var ki, hesab eyləmədim mən.
Dərc eyləməyə şerimi çapxanə yox idi,
Dəftərdə yazıb şeri, kitab eyləmədim mən.
Çox günləri qoydum geridə, amma ki, bir gün
Göyçək Qubada qalmağa tab eyləmədim mən.
Elm almaq üçün şövq ilə paytaxta tələsdim,
Şah olmaq üçün sanki qızıl taxta tələsdim.

Gəldim Bakıya, elmə həvəs şakərim oldu,
Xəyyam sözü, Hafiz qəzəli əzbərim oldu.
Dil şövqünə düşdüm, dedim "Allah kərimdir",
Öyrətdi mənə çox dili, Allah kərim oldu.
Zərdirsə əgər dil, dili tədris eləyən kəs
Zər qədrini, əlbəttə, bilən zərgərim oldu.
Hərdən qələmə döndü silah dil savaşında,
Hərdən silaha döndü qələm, xəncərim oldu.
Ustadlərim Sədi, Nizamiylə Füzuli,
Seyid Əzimim, Mirzə Əli Əkbərim oldu.
Farsın dili ilə yeni bir canə yetişdim,
Təhsil başa yetdi, özüm əfqanə yetişdim.

Sinnim az olarkən belə, mən çox yanı gördüm,
Əfqan elini, Türkiyəni, İranı gördüm.
On üç baharım oldu xəzan qürbət içində,
Tərk eyləyibən vəsl evimi, hicranı gördüm.
Çox mərəkəni seyr elədim, dəfələr ilə,
Əfqan diyarında tökülən al qanı gördüm.
Minlərlə igid - bir cahadın qurbanı oldu,
Minlərlə mücahid tək ölən qurbanı gördüm.
Gündüz-gecə şeytan əməliyyat aparırdı,
Çox-çox yeri viran eləyən şeytanı gördüm.
Zülm etmədə insanlara şeytan, aman Allah,
İndi Çeçenistanda axır qan, aman Allah.

Şahin, ağarıb saç elə bil qar həvəsiylə,
Ömrüm başa yetməkdədi bir yar həvəsiylə.
Könlüm elə viran ki, çətin bir də düzəlsin,
Əzm eyləmişəm çox yerə memar həvəsiylə.
Qəlbimdə məhəbbət varı tək var varımdır,
Yığdım bu gözəllikdə varı var həvəsiylə.
Dillənməz idi dil əgər olmazdısa ümmid,
Dil şurə gəlir gör necə dildar həvəsiylə.
Əsla deyiləm pərt əcəlim gəlsə də, ömrüm
Bitməkdədi cənnətdəki gülzar həvəsiylə.
Ümmid ilə axşamı başa vurmadayam mən,
Dünyadəki əyyamı başa vurmadayam mən.

*28.02.1996*



## TƏRCİBƏND

*"Məcməüş-şüəra"nın üzvü*
*Baba Pünhana*

Yerlərdə bu gün fəğan nə çoxdur,
Göylərdə bulud, duman nə çoxdur.
Nöqsanını görməyirmi naqis?
Yaxşı yaman az, yaman nə çoxdur.
Həzz çoxluğunun gümanı varmı?
Dərd çoxluğuna güman nə çoxdur.
Şerimdə kədər gəlir bəyanə,
Yarəb, belə çox bəyan nə çoxdur.
Sevdadə də mənfəət görünmür,
Faidə nə az, ziyan nə çoxdur.
Eşq içrə sınanmışam həmişə,
Çoxdur sınaq, imtahan nə çoxdur.
Şahin, sitəmin ağırlığından
Saqqalə həna yaxan nə çoxdur.
Saqqalə həna yaxıb gəzərsən,
Eynək gözünə taxıb gəzərsən.

Yol yoldaşa tənə eyləyərsə,
Şəkk yox çaşa, tənə eyləyərsə.
Bilməm yenə qurşanarmı eyşə
Eyş əyyaşa tənə eyləyərsə.
Yonmaz necə büstünü nigarın,
Daş nəqqaşa tənə eyləyərsə?
Sirdaş necə sirri gizli saxlar
Sirr sirdaşa tənə eyləyərsə?
Dönməzmi qoşa qılınca dərhal
Gözlər qaşa tənə eyləyərsə?
Olmazmı hənayə ehtiyacın
Yaş birbaşa tənə eyləyərsə?
Saç-saqqalına baxıb gülüşlə
Qızlar yaşa tənə eyləyərsə.
Saqqalə həna yaxıb gəzərsən,
Eynək gözünə taxıb gəzərsən.

Qalmışsa canında mehribanlıq
Et yaxşılıq, eyləmə yamanlıq.
Vardırmı keçib təəssübündən

Sənan kimi eyləyən çobanlıq?
Bir gündə iyirmi dörd saat var,
Sanki gözə görsənir bir anlıq.
Eyvah, nənəm də öldü getdi,
Çoxdan ona almıram tumanlıq.
Gündən-günə ət tökür bu millət,
Yoxdur əti evdə bir qazanlıq.
Görmür Qarabağ günəş ziyası,
Ətrafdə artmada qaranlıq.
Sürətlə cavanlığın yetişdi,
Bir gün də gələr gedər cavanlıq.
Saqqalə həna yaxıb gəzərsən,
Eynək gözünə taxıb gəzərsən.

Hərbin ki, əzəl çalındı zəngi,
Adəm nə üçün bəyəndi cəngi?
Əğyardə doğruluq görünmür,
Tez-tez danışır bizə cəfəngi.
Qəsdi bəşərin nədir, Ilahi,
Etmiş neçin ixtira tüfəngi?
Güc qolda deyil əqldədirmi?
Çaqqal niyə aldadır pələngi?
Sülh istəyi - ən sevimli istək!
Susmuş niyə istəyin qəşəngi?
Eyvah, zəfər çağı uzaqmı?
Görrükmü yenə çalındı "Cəngi"?
Göz məşəlinin azaldı nuri,
Saqqalımızın dəyişdi rəngi...
Saqqalə həna yaxıb gəzərsən,
Eynək gözünə taxıb gəzərsən.

Minnətmi vəfa vəfadə indi?
Zillətmi cəfa cəfadə indi?
Üzlərdə həya təri görünmür,
Vardırmı həya həyadə indi?
Bimarə əlac edirmi loğman?
Vardırmı şəfa şəfadə indi?
Yoxdursa ziyalının ziyası
Qalmışmı ziya ziyadə indi?
Qalmazmı bəşər bəlayə məruz



Artarsa bəla bəladə indi?
Şahin, yerə zülm edir adamlar,
Yoxdur hava da həvadə indi.
Artmaqdadı eynəyin də nırxı,
Olmaqda baha həna də indi.
Saqqalə həna yaxıb gəzərsən,
Eynək gözünə taxıb gəzərsən!

*29.05.1996*

## TƏRCIBƏND

Hərgah zar, ey nigar oldum,
Zənn eyləmə ki bezar oldum.
Şadlıq atına yetişmək üçün
Qəm köhləninə süvar oldum.
Eşqin qəminə mətincə dözdüm,
Eşq əhlinə iftixar oldum.
Sən ay kimi göydə gizlənəndə
Mən gün kimi aşikar oldum.
Zar eyləsə də canı bu hicran
Bil, vəslinə intizar oldum.
Hər gün məni, ey nigar, gözlə,
Çək mən kimi intizar, gözlə.

Hicranə asanmı dözmək, ey gül?
Əfğanə asanmı dözmək, ey gül?
Hicranımıza olubsa fərman
Fərmanə asanmı dözmək, ey gül?
Tök qanım, özünsə qanə düşmə,
Hər qanə asanmı dözmək, ey gül?
Nadan adama salam verme,
Nadanə asanmı dözmək, ey gül?
Əhd eyləmisən və peymanın var,
Peymanə asanmı dözmək, ey gül?
Hər gün məni, ey nigar, gözlə,
Çək mən kimi intizar, gözlə.

Taqətsizə döz demək çətindir,
Söhbətsizə söz demək çətindir.
Gülbilməzi bağiban etmə,
Çay görməzə "üz" demək çətindir.

Iz varsa, dönüb yol olmayırsa
Hər bir izə iz demək çətindir.
Çınqıl közərir, yağış yağırsa
Əlbət, ona köz demək çətindir.
Gözlə, gözümü görüncə gözlə,
Hərçənd ki gözləmək çətindir.
Hər gün məni, ey nigar, gözlə,
Çək mən kimi intizar, gözlə.

Bir kimsə deyil gözümdə sən tək,
Kəlməmdə özün, sözümdə sən tək.
Çox kəsdə səbr görünməyirsə,
Az kəs tapılır dözümdə sən tək.
Əzmin bu səfər zəifləşəydi,
Mən görməmişəm əzmdə sən tək.
Vardır xəbərim özüm-özümdən,
Az kəs yaşayır özümdə sən tək.
Həsrət nəsə indi sən bilərsən,
Çox gözləmişəm özüm də sən tək.
Hər gün məni, ey nigar, gözlə,
Çək mən kimi intizar, gözlə.

Hicranına tab edən mən oldum,
Tabımla savab edən mən oldum.
Fərhadı anıb qəzəllərimdə,
Məcnunə xitab edən mən oldum.
Əğyarı da vəsf edən çox olmuş,
Əğyarə əzab edən mən oldum.
Misranı birər-birər çoxaldıb
Min şeri kitab edən mən oldum.
Günlərlə dözüb də intizarə
Əhvalı xərab edən mən oldum.
Hər gün məni, ey nigar, gözlə,
Çək mən kimi intizar, gözlə.

Olmursa da ahə çarə hər gün,
Mən ah edirəm dübarə hər gün.
Hər gün mənə fəxr idi kənarın,
Çəkdin özünü kənarə hər gün.



İndi yazırıq şer hicrdən
Sən gizli, mən aşikarə hər gün.
Yusif dözəcək, gəl ey Züleyxa,
Et köynəyi parə-parə hər gün.
Halın, bilirəm ki, ahü zardır,
Döz mən kimi ahü zarə hər gün.
Hər gün məni, ey nigar, gözlə,
Çək mən kimi intizar, gözlə.

Sevdadə zərər çəkib bu Şahin,
Qəm, qüssə, kədər çəkib bu Şahin.
Hər gün arı tək vüsal gülündən
Zənn etmə şəkər çəkib bu Şahin.
Bir günlük ürək sevinci üçün
Günlərlə xətər çəkib bu Şahin.
Məcnun qəmi ki bəyan olubdur,
Ondan da betər çəkib bu Şahin.
Çək hicrimi, indi sən bilərsən
Hicrində nələr çəkib bu Şahin.
Hər gün məni, ey nigar, gözlə,
Çək mən kimi intizar, gözlə.

*14.08.1996*

## TƏRCIBƏND

Möhtacına tədbirini imdadə gətirmə,
Hətta daha imdadını röyadə gətirmə,
Yarım, su da göndərmə mənə, badə gətirmə,
Yansam da əgər qupquru səhradə, gətirmə,
Gəl mərəkə açma, daha qovğa də gətirmə,
Şagirdim idin, get, ümid ustadə gətirmə,
İlhamı unut, hissini misradə gətirmə,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Mən öylə bilirdim ki, səmimanə olarsan,
Şəmin olaram, sən isə pərvanə olarsan,
İçdikcə məhəbbət meyi məstanə olarsan,
Yetməklə bu mərdanəyə mərdanə olarsan,
Dillərdə gəzər söhbətin əfsanə olarsan,
Bilməzdi bu aşiq ona biganə olarsan,

Onsuz ola bilsin hələ divanə olarsan,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Mən yaxşı bilirdim, niyə sevda yaman oldu?
Röyada da görməm səni, röya yaman oldu,
Itməzdi xəyalın, daha xülya yaman oldu,
Bitməzdi vüsalın ki, təmənna yaman oldu,
Etdim yenə təbim ilə qovğa, yaman oldu,
Beyt olmadı əla, hələ misra yaman oldu,
Bir yaxşı olan aşiqə dünya yaman oldu,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Yar olsa əgər Tanrısı mehman belə qalmaz,
Bir gün yetişər mənzilə, heyran belə qalmaz,
Bağ içrə açar eşq gülü, bağban belə qalmaz,
Bir çarə edər dərdinə, loğman belə qalmaz,
Zalimlik edən bizlərə şeytan belə qalmaz,
Əlbəttə vüsal olmalı, hicran belə qalmaz,
Bir yol taparam mən dəxi, dövran belə qalmaz,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Kimlər mənə, yarəb, görəsən bəd nəzər etdi?
Kimlər məni dərviş sayağı dərbədər etdi?
Eşq hansı qəra günlü kəsi bəxtəvər etdi?
Ya, hansı xəta eyləyəni mötəbər etdi?
Fərhadı, fələk, bəlli ki, məndən betər etdi,
Zənn etmə bu sevdadə bu aşiq zərər etdi,
Amma düşərək dərdə həzin cismi əritdi,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Bilsəydin əgər qədrimi qiymətli olardın,
Tutsaydın əziz xətrimi hörmətli olardın,
Hifz etsə idin canımı qüvvətli olardın,
Artırsa idin şanımı şöhrətli olardın,



Dil versə idin eşqimə sərvətli olardın,
Izz etsə idin ismimə izzətli olardın,
Vaxt var idi ki, Şahinə həsrətli olardın,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Yarım, nə qədər cövrü cəfa var mənə gəldi,
Dünyadəki hər dərdü bəla var mənə gəldi,
Heç görmədim aləmdə səfa var mənə gəldi,
Qıldım nə xəta, hər nə xəta var mənə gəldi,
Etdim nə cinayət ki, cəza var mənə gəldi,
Qan ağlamağım yoxdu, o da var mənə gəldi,
Çoxdursa da rəng, harda qəra var mənə gəldi,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Hicranını etdimsə də imkanıma tabe,
Vəslin olacaq indisə hicranıma tabe,
Qeyzin ki var idi daha tüğyanıma tabe,
Dərya necə olmaz axı ümmanıma tabe,
Sən öylə qılıncsan daha qalxanıma tabe,
Çox yaxşı ki etdim səni üsyanıma tabe,
Son dəfə də ol əmrimə, fərmanıma tabe,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

Zənn etmə ki, bir cahilə zülm eyləmisən sən,
Bir zalimə yox, adilə zülm eyləmisən sən,
Sözbilməzə yox, qabilə zülm eyləmisən sən,
Elm əhlinə, bir kamilə zülm eyləmisən sən,
Dərya tək aşıb sahilə zülm eyləmisən sən,
Gərginliyə bax, naqilə zülm eyləmisən sən,
Şahin kimi bir fazilə zülm eyləmisən sən,
Bundan belə gəl bir də məni yadə gətirmə,
Sən bir də mənim qəlbimi fəryadə gətirmə!

*5-7.04.1997*

## TƏRCIBƏND

*Fatimeyi-Zəhra səlamullahi-əleyhanın mövludu münasibəti ilə*

Dillərdə adı əzbər, ya Fatimeyi-Zəhra,
Həzrət Əliyə həmsər, ya Fatimeyi-Zəhra.
Xislətdə elə təksən sən çox kəsə örnəksən,
Örnək sənə Peyğəmbər, ya Fatimeyi-Zəhra.
Inkar eləyən cəhli beytin ən əziz əhli,
Ey hüsnü mələkmənzər, ya Fatimeyi-Zəhra.
Zərgər kimi diqqətli, zər timsalı qiymətli,
Həm zərgər olan, həm zər, ya Fatimeyi-Zəhra.
Kim səndə görüb nöqsan ey banuyi-banuvan,
Ey banulara sərvər, ya Fatimeyi-Zəhra.
Ilhamı təzə-tər ki, nəzm etməyə əzm etdi,
Allahə şükürlər ki, Şahin səni nəzm etdi.

Paklıqda şüar oldun, ya Fatimeyi-Zəhra,
Zöhra kimi var oldun, ya Fatimeyi-Zəhra.
Dövranda ətalətdi, çox yanda cəhalətdi,
Görcək bunu zar oldun, ya Fatimeyi-Zəhra.
Beyət elədin həqqə, üsyan isə nahəqqə,
Eşq ilə xumar oldun, ya Fatimeyi-Zəhra.
Həzrət Əli tək fazil, Həzrət Əli tək adil
Bir mömünə yar oldun, ya Fatimeyi-Zəhra.
Övladın imam oldu, islamə inam oldu,
Qış fəsli bahar oldun, ya Fatimeyi-Zəhra.
Ilhamı təzə-tər ki, nəzm etməyə əzm etdi,
Allahə şükürlər ki, Şahin səni nəzm etdi.

Xilqətdə mələksima, ya Fatimeyi-Zəhra,
Çöhrəndə ziya peyda, ya Fatimeyi-Zəhra.
Yarəb, bu nə ülviyyət: mənadə nə xoş surət,
Surətdə nə xoş məna, ya Fatimeyi-Zəhra.
Röyasa - nə xoş röya! Xülyasa - nə xoş xülya!
Sənsənmi bu xoşsima, ya Fatimeyi-Zəhra?
Nəslində nəcabət var, əslində şərafət var,
Vardırmı sənə həmta, ya Fatimeyi-Zəhra?
Izzin nə fəxarətli, ismin nə məlahətli,
Həm Fatimə, həm Zəhra, ya Fatimeyi-Zəhra.



Ilhamı təzə-tər ki, nəzm etməyə əzm etdi,
Allahə şükürlər ki, Şahin səni nəzm etdi.

Qeyrətdə dəyanətli, ya Fatimeyi-Zəhra,
Iffətdə ləyaqətli, ya Fatimeyi-Zəhra.
Sən dürr - kimin dürrü? Dürri-yetimin * dürrü!
Izzətdə şərafətli, ya Fatimeyi-Zəhra.
Düzgün elə yol tutdun, acizlərə əl tutdun,
Xislətdə ədalətli, ya Fatimeyi-Zəhra.
Zülmətdə çıraq oldun, islamə dayaq oldun,
Xidmətdə şəfaətli, ya Fatimeyi-Zəhra.
Iqrarinə alqışlar, rəftarinə alqışlar,
Tinətdə dəyanətli, ya Fatimeyi-Zəhra.
Ilhamı təzə-tər ki, nəzm etməyə əzm etdi,
Allahə şükürlər ki, Şahin səni nəzm etdi.

Ömrün elə şam oldu, ya Fatimeyi-Zəhra,
Tezliklə tamam oldu, ya Fatimeyi-Zəhra.
Şərən elə ömr etdin, düzgünlüyünə dinin
Qəlblərdə inam oldu, ya Fatimeyi-Zəhra.
Ey nadir olan xilqət, daim sənə ülviyyət
Ən ülvi məram oldu, ya Fatimeyi-Zəhra.
Sən tək xanına hər gün, məsum adına hər gün
Minlərlə salam oldu, ya Fatimeyi-Zəhra.
Zəhra, bu nə hikmətdi, Allah elə hökm etdi
Övladın imam oldu, ya Fatimeyi-Zəhra.
Ilhamı təzə-tər ki, nəzm etməyə əzm etdi,
Allahə şükürlər ki, Şahin səni nəzm etdi.

*12.10.1997*

## TƏRCIBƏND

*Özlərini şair adlandıran cızmaqaraçılara*

Hər sayrışan ulduzlara ülkər deməsinlər,
Ya hər çiçəyə lalə-sənubər deməsinlər,
Hər dağə Kəpəz, hər çaya Tərtər deməsinlər,
Yoldan sapan hər başçıya rəhbər deməsinlər,
Hər söz dilənən şairə sərvər deməsinlər,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər" **.

---

* Məhəmməd (s) peyğəmbərin nisbələrindən biri "Dürri-yetim" olmuşdur.

** Beyt fars dilindəki bir şerin tərcüməsidir. Şairin adını unutmuşam. Mərhum Seyid Nigarinin də tərcibəndi belə bir oxşar beyt üzərində qurulmuşdur:

"Bir dilbərə dil ver ki, bəladır deməsinlər.
Bir badəni nuş et ki, xətadır deməsinlər".

Yazdıqca qəzəl, qoşma - pozan çıxdı yadımdan,
Rəhm eyləmədim canıma, can çıxdı yadımdan,
Üqba yada gələcək bu cahan çıxdı yadımdan,
Dünyadəki hər şöhrətü şan çıxdı yadımdan,
Yarəb, bu gözəl beyti yazan çıxdı yadımdan,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Vardır, bilirəm mən uca göylərdə təmizlik,
Qoy qismət ola yerdəki hər fərdə təmizlik,
Saflıq ola - hər güzgüdə, mərmərdə təmizlik,
Billah, eləyər çarə bütün dərdə təmizlik,
Zərgərdə təmizlik ola qoy zərdə təmizlik,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Əğyar olana söz demə, sirdaş deyildir,
Bir baş düşünmürsə əgər baş deyildir,
Qəlbin qapıdır, gözdən axan yaş deyildir,
Kim bilməsə dil qədri vətəndaş deyildir,
Hər daş isə məlumdu ki, daş-qaş deyildir,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Çox-çox tökülür torpağa qıpqırmızı qan, çox...
Hər məsələdə, bəlli ki, fərziyyə, güman çox,
Amma görürəm yaxşı çox azdır və yaman - çox,
Əfsus ki, az zəhmət ilə çox qazanan çox,
Şairliyi asan düşünən, sadə sanan çox,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Bəzən elə sevda yaradan var ki, eybdir,
"Adəm ilə Həvva" * yaradan var ki, eybdir,
"Məcnun ilə Leyla" yaradan var ki, eybdir,
"Vamiq ilə Əzra" yaradan var ki, eybdir,
Hərdən elə misra yaradan var ki, eybdir,

* Son illərdə Bakıda nəşr edilmiş eyni adlı jurnal.



"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Bilsəm ki, mənim şerdə gülşənliyim olmaz,
Ey şer, səni tərk edərəm, sənliyim olmaz,
Dəryadə gəmim olmasa yelkənliyim olmaz,
Ömrüm boyu düşmənlə də düşmənliyim olmaz,
Pis şairi tərif eləsəm mənliyim olmaz,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Meyxanədə cəhl əhlinə meydan ola bilməz,
Düzgün danışan bəndə peşiman ola bilməz,
Yanmazsa əgər canımız əfğan ola bilməz,
Əfğanə dözən mən kimi insan ola bilməz,
Şair sözü aşkar isə pünhan ola bilməz,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Hər məsələdə nəzmü nizam olsa gözəldir,
Hal əhlinə hər ləhzə salam olsa gözəldir,
Ariflərə yüksəkdə məqam olsa gözəldir,

Məsciddə saqi ilə cam olsa gözəldir,
Şerim çox üzün oldu, tamam olsa gözəldir,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

Saf şerə pənahəm ki, pənahin sözüdür bu,
Ahın sözü var yad sözə, ahin sözüdür bu,
Şair, bu günün, həm də sabahın sözüdür bu,
Nə molla, nə qazi, nə də kahin sözüdür bu,
Təkrar oxuyun şerini, Şahin sözüdür bu,
"Zər zərb eləyin ki, sizə misgər deməsinlər,
Gizlində için badəni kafər deməsinlər".

*27.06.2001*

# TƏXMİSLƏR

*Mirzə Ələkbər Sabirin qəzəlinə təxmis*

Fələyin gör neçə vaxtdır ki, sayır sayğacı,
Gəh Şah Abbası çəkir təxtə, gəhi Sərracı...
Xəlq edibdirsə də çox Şahsənəmi, Minhacı
"Xosrovi-hüsnün, əzizim, sən imişsən tacı,
Xublar cümlə sənin dərgəhinin möhtacı".

Məni divanə edəndən bəri Leyla zülfün
Neçə beyt icad edibdir, neçə misra zülfün,
Ya qaşın təbimi dindirmədədir, ya zülfün,
"Qabi-qövseyn qaşın, leylətül-əsra zülfün,
Tapmısan mərtəbeyi-hüsndə sən meracı".

Bu nə zülfdür gözün üstündə hilalın üzrə?
Qorxuram kölgə sala indi vüsalın üzrə,
İstərəm zülfü yığam qalmaya xalın üzrə,
"Tökülüb zülfi-siyəh arizi-alın üzrə,
Kəbəyə çöl ərəbi mane olur hüccaci".

Gecə-gündüz ki xəbərdar oluram halından,
Sənə fal açmadayam Hafizimin falından,
Müntəzəm dadmadayam bal dodağın balından,
"Zairi-xalinəm, ey məh, qoy öpüm xalından,
Həcəri öpməyənə xəlq deməzlər haci".

Köməyi yetməlidir aşiqinə cananın,
Bilmirəm mən olacaqdırmı buna imkanın:
Kipriyin yarələyir cismimi yanmır sanın,
"Kəc nigah ilə dələr bağrımızı müjganın,
Bu ox atmağı kim öyrətdi sənə qıyqaci?"

Ən məharətli adamdan ki mən idim mahir,
Olmuşam indi səni mədh eləyən bir şair,
Şahinəm, qədrimi bilsəydin olardım qadir,
"Gecə-gündüz səri-kuyində sızıldar Sabir,
Neyləsin, qovma qapından, kəsilib illacı".

*19.04.1996*



# SEYID ƏZIM ŞIRVANININ QƏZƏLINƏ TƏXMIS

Etdi viran evimi, yardən oldum məyus,
Hanı memar ki, memardən oldum məyus,
Eşqi tək, əhdi kimi vardən oldum məyus,
"Ah, səd ah ki, dildardən oldum məyus,
Soldu gül, gülşənü gülzardən oldum məyus".

Neçə yol zay olub ömrüm, gedəcək zayə yenə,
Əllərimdən çıxacaqdır təzədən mayə yenə,
Salmışam mən başımı tazə müənmayə yenə,
"Ləntərani" dedilər Turdə Musayə yenə,
Ah kim, dövləti-didardən oldum məyus".

Qəmimə eyləmə gəl çarə, əlac etmə dəxi,
Gün olar çarə ilə qarə, əlac etmə dəxi,
Sızlasın qoy təzədən yarə, əlac etmə dəxi,
"Ey təbibim, dili-bimarə əlac etmə dəxi,
Mövtə müşrifdi, bu bimardən oldum məyus".

Uzanıb sən tərəfə köhnə nizam ilə əlim,
Demirəm doldurasan püstə-badam ilə əlim,
Deyirəm kamə yetim qoy, dola kam ilə əlim.
"Rəf qıl dərdimi, tut bir neçə cam ilə əlim,
Saqiya, ol gözü xummardən oldum məyus".

Aşiqa, dərdini de, halını dərd əhli bilər,
Nə ağardıb belə saqqalını dərd əhli bilər,
Hər qəmin ölçüdə misqalını dərd əhli bilər,
"Bəli, dərd əhlinin əhvalını dərd əhli bilər,
Kimsə bilməz ki necə yardən oldum məyus".

Qələt etdim eləyib dilbər ilə sevda mən,
Çünki oldum sözünə aldanaraq rüsva mən,
Olmuşammış ona aşiq hədəri, bica mən,
"Öpdülər ləli-ləbindən o gülün, amma mən
Buseyi-ləli-ləbi-yardən oldum məyus".

Zülfü tək ol gözəlin indi pərişanəm mən,
Olmasın kimsə peşiman ki, peşimanəm mən,

Şahina, hər iki dünyadə gərək yanəm mən,
"Seyyida, indi nə kafər, nə müsəlmanəm mən,
Getdi dinim, dəxi zünnardən oldum məyus".

*23.04.1996*

## SEYID ƏZIM ŞIRVANININ QƏZƏLINƏ TƏXMIS

Mən qəra bəxtimə qarşı yenə üsyan etdim,
Neçə ağı deyəni ağıma heyran etdim,
Neçə hal əhlini ahımla pərişan etdim,
"Şəbi-hicran o qədər naləvü əfğan etdim,
Ta ki, çeşmi-fələki halıma giryan etdim".

Görərək bir də o Leylanı özümdən gedibən,
Görmədim bir daha səhranı özümdən gedibən,
Uzaq etdim neçə xülyanı özümdən gedibən...
"Görcək ol surəti-zibanı, özümdən gedibən
Surəti-halıma surət kimi heyran etdim".

Mənə rəhm etmə, a dilbər, məni san qurbanın,
Gözünə qoç sayağı oldu əyan qurbanın,
Mələyim, zənn eləmə çəkdi ziyan qurbanın,
"Bu təmənnadə idim kim, ola can qurbanın,
Şükr-lillah ki, axır sənə qurban etdim".

Tapmayırdım yanıban eşqə zülümdən çarə,
Külə dönməkdə idim, yoxdu külümdən çarə,
Əlini ver mənə gəlsin qoy əlimdən çarə,
"Elədim dərdü qəmi-hicrə ölümdən çarə,
Gör nə asan bu qədər müşkilə dərman etdim".

Fikir etdim ki, gedim var nə qədər imkanım,
Dərdimi şərh eləyim bəlkə ola dərmanım,
Görərək gəldiyimi durdu mənim cananım,
"Ta dedim "aşiqinəm", qəhr ilə tökdü qanım,
Aşiq oldum sənə, ey mah, məgər qan etdim?"

Demədim mən ona "canan, peşimanəm mən",
Demədim "ol mənə loğman, peşimanəm mən",



Demədim "çıxmadadır can, peşimanəm mən",
"Oldu qətlimdə peşiman, peşimanəm mən,
Nalə ilə özüm ol mahı peşiman etdim".

Şahinəm, ah elədim ah qəmindən, Seyyid,
Elədim aləmi agah qəmindən, Seyyid,
Sızladım bəndə kimi şah qəmindən, Seyyid,
"O qədər ağladım ol mah qəmindən, Seyyid,
Aqibət Nuh kimi aləmə tufan etdim".

*25.04.1996*

## SEYID ƏZIM ŞIRVANININ QƏZƏLINƏ TƏXMIS

Nə məclisdir bu məclis, söylərəm mən "Mərhəba məclis!"
Ki vermiş hər zaman hal əhlinə nurü ziya məclis,
Ilahi, görməsin bir dəm xəta gəlsə xəta məclis,
"Niqabın üzdən aç, ey gül, kim olsun dilgüşa məclis,
Məqami-nitqə gəl, ey Kəbə kim, tapsın səfa məclis".

Nə halətdir, nə olmuşdur, çox axtardım səbəbkarın,
Üzündə gördüyüm nuri bu gün mən görmədim yarın,
Dedim zülfün pərişan gördüyüm dəmdə o dildarın:
"Səhabi-zülf ara etmə nihan xurşidi-rüxsarın,
Qoy olsun, ey hilaləbru, üzündən pürziya məclis".

Olar əğyar ilən Nofəl kimi əlbət bu gün cəngim,
Çatar eşq əhlinə qovğa təriqim, cəng ahəngim,
Saçından da qara oldu mənim qardan da ağ rəngim,
"Nə dil qaldı, nə dildə taqətim, dün şəb eşitdim ki,
Edibdir ta səhər əğyar ilə ol dilrüba məclis".

Olubdur bəlli hər fərdə nə çəkmişdim məlalından,
Deyil Allahdən gizlin ki zövq aldım vüsalından,
Bu məclisdə cünun gördüm kamal almış kamalından,
"O məclis kim, ziyası olmaya şəmi-camalından,
Nə məclis, eyni zülmət, əhli-eşqə bir bəla məclis".

Xitab etdim tutub üz məclisə: - Dostlar, salın yadə
Bu cür bir möhtərəm məclis görən vardırmı dünyadə?

Nə cənnətdir bu məclis, razıdır Adəm də, Həvva də,
"Hər ol məclis kim, olsun onda rəngin badəvü sadə,
Odur cənnət gər Adəmsən, əfəllah, mərhəba məclis".

Məni xummar edən yarın pərişan eyləyin zülfün,
Qəmimdən hali qəmxarın pərişan eyləyin zülfün,
O qəmxarın, o xummarın pərişan eyləyin zülfün,
"O ahu gözlü dildarın pərişan eyləyin zülfün
Ki, olsun müşki-tərdən səfheyi-dəşti-Xəta məclis".

Əgər tuş olsa idim, Şahina, hər ləhzə cəncalə,
Başım düşsəydi hətta bir xətadən bir neçə qalə,
Qətiyyən yazmaz idim mən düşüb Seyyid düşən halə:
"Tökübsən kövkəbi-əşk ilə, Seyyid, hər gecə nalə,
Nə nöqsanı, qoy etsin qeyr ilə ol məhliqa məclis".

*18.05.1996*

## SÜLEYMAN RÜSTƏMIN QƏZƏLINƏ TƏXMIS

Allahım, qoyma cahan içrə küdurət qalsın,
Saf ürəklərdə müdam eşqü məhəbbət qalsın!
Qalmasa heç nə bu aləmdə sədaqət qalsın!
"Sevgilim, qoyma dilimdə nə şikayət qalsın,
Nə də könlümdə-gözümdə acı həsrət qalsın".

Sevgi üzsün canımı, bənzəmirəm can sevənə,
Vəslini lütf elə hər ləhzə bu canan sevənə,
Mən məgər bənzəmişəmmi acı hicran sevənə?
"Gəl vəfasız demə, bəsdir, səni candan sevənə,
Qoymaram bir daha üstümdə bu töhmət qalsın".

Bu şer sahibi gül çöhrənə dikmiş gözünü,
Nazına, işvənə, hər qəmzənə dikmiş gözünü,
Bir kərə kim ki dikibdir yenə dikmiş gözünü,
"Bir gözəlsən ki, gözəllər sənə dikmiş gözünü,
Deyirəm ölkədə haqqında bu söhbət qalsın".

Eşidibsən həmişə söhbətimi şən - məndən,
Səni incitməmişəm bir gilə də mən - məndən,
Nə şikayətdi edirsən arabir sən məndən?



"Son verək gəl bu şikayətlərə, səndən, məndən
Dərdə dözmək cavan aşiqlərə adət qalsın".

Göz yaşım axmada hərdən, hanı dəsmal, gözəlim,
Ixtilatınla müdam et məni xoşhal, gözəlim,
Sözünə söz deməram, din ki olum lal, gözəlim,
"Varsa şübhən sözümə, onda buyur, al, gözəlim,
Ürəyim qəbrə qədər səndə əmanət qalsın".

Qeys Leylasını, Xummarını - Sənan öpsün,
Şahina, qoy o güləndamı Süleyman öpsün,
O - onundur, nə fikir çək, nə alış-yan, öpsün,
"Gəl, Süleyman o qızılgül dodağından öpsün,
Torpaq altında da ağzında bu ləzzət qalsın".

*6.07.1996*

## HƏBIBININ QƏZƏLINƏ TƏXMIS

Ülvi eşqi təsdiq etdim, varmı inkar istəyən?
Varmıdır pakizə eşqindən səva var istəyən?
Bağlasın ümmidin üqbayə əsl yar istəyən,
"Xabi-qəflətdən oyansun eşqi-dildar istəyən,
Bülbüli-şuridə olsun vəsli-gülzar istəyən".

Istəsə pak eşqinə dünyanı heyran eyləsin,
Qəlbdən aşiq məcazi eşqini yan eyləsin,
Qoy həqiqi eşq ilə dərdinə dərman eyləsin,
"Ney kimi bağrın dəlib, hər dəmdə nalən eyləsin,
Dərd ilə yansın-yaxılsın vəsləti-yar istəyən".

Varsa adəm qeyri-mümkündür onun canani yox,
Hər kimin cananı yoxdursa, yəqin ki, canı yox,
Ali eşqə fani aləmdə vüsal imkanı yox,
"Aşiqin yanmaqdan özgə dərdinə dərmanı yox,
Yanmağa pərvanə olsun şəmi-rüxsar istəyən".

Öylə ki, şad olmağı namərd qıldı ixtiyar,
Qüssəni canü baş ilə mərd qıldı ixtiyar,
Sanmayın dərd etməyi hər fərd qıldı ixtiyar,
"Aşiq oldur canü dildən dərd qıldı ixtiyar,
Dərdinə dərman buldu dərdi təkrar istəyən".

Kim deyir canın verib Şahin yara xürrəm deyil,
Eşqi uğrunda zəiflik eyləyən möhkəm deyil,
Verməyən canana öz canın bəni-adəm deyil,
"Can verib bir can üçün yansa Həbibi, qəm deyil,
Masəvadən fariğ oldu vəsli-dildar istəyən".

*24.07.1996*

## FÜZULININ QƏZƏLINƏ TƏXMIS

Söz nədir, misra nədir, şair nədir, xülya nədir,
Rəmz nə, məfhum nədir, surət nədir, məna nədir,
Aşiqin məşuqinə ərz etdiyi sevda nədir,
"Öylə sərməstəm ki, idrak etməzəm dünya nədir,
Mən kiməm, saqi olan kimdir, meyü səhba nədir".

Kimsə mane olmasın, həqdən sərəncam istərəm,
Bir qədəh, xudmani bir yer, bir də bir cam istərəm,
Bir mübarək, bir əcəb, bir türfə əyyam istərəm,
"Gərçi canandan dili-şeyda üçün kam istərəm,
Sərsə canan bilməzəm kami-dili-şeyda nədir".

Sanmayın Adəmlə Həvvadən olub sadir vüsal,
Aşikardırmı, deyildir, bir müəmma, sirr vüsal,
Düzmü ən pak hissi təlqin etməyə qadir vüsal?
"Vəsldən çün aşiqi müstəğni eylər bir vüsal,
Aşiqə məşuqdən hər dəm bu istiğna nədir?"

Bilməzəm sevdanı mən, sevda bilən arif deyil,
Mey ki içdim, mütiyəm, qovğa bilən arif deyil,
Arifi dünya bilir, dünya bilən - arif deyil,
"Hikməti-dünyavü mafiha bilən arif deyil,
Arif oldur bilməyə dünyavü mafiha nədir".

Niyyətim irfanı bilmək ki, bilim çox mübhəmi,
Toplayıbdır qəlbimə gündən-günə naləm qəmi,
Şahinə, aləmdə qəm var, məndə var aləm qəmi,
"Ahü fəryadın, Füzuli, incidibdir aləmi,
Gər bəlayi-eşq ilə xoşnud isən, qovğa nədir?"

*29.07.1996*



## ABBASQULU AĞA QÜDSININ QƏZƏLINƏ TƏXMIS

Viran olmuş qəlb evim, memar gəlsin, gəlmədi,
Gəlməməkdə etməsin israr, gəlsin, gəlmədi,
Könlümün bir arizusi var gəlsin, gəlmədi,
"Arizu eylər könül dildar gəlsin, gəlmədi,
Zülfi kafər, gözləri xunxar gəlsin, gəlmədi".

Gözləməkdən bezmədim, düşdü duman, çən, gözlədim,
Çıxdı gün, görsəndi ay, görsənmədin sən, gözlədim,
Gülbəniz dilbərlər ilən doldu gülşən, gözlədim,
"Hər pərivəş cilveyi-hüsn eyləmiş, mən gözlədim,
Dülrübalər föвcünə sərdar gəlsin, gəlmədi".

Sanmasınlar sərvətindən, dövlətindən istərəm,
Mən acı, zəqqum həyatın şərbətindən istərəm,
Görmüşəm çox-çox əzabın, şəfqətindən istərəm,
"Canə gəldim bivəfalər ülfətindən, istərəm
Bir vəfa rəsmində sabit yar gəlsin, gəlmədi".

İstərəm yol verməsin bir ləhzə həm dərdü qəmə,
Bezdirib naləm cahanı, son qoyulsun naləmə,
Parlasın yarım günəş tək, nur salsın aləmə,
"Ləhceyi-canpərvərindən şur salsın aləmə,
Əndəlibi-şaxeyi-gülzar gəlsin, gəlmədi".

Görməyim mən heç zaman pəjmürdə halın dilbərin,
Tanrı versin Şahinə hər bir məlalın dilbərin,
Çox kəmal əhli pəsənd etmiş kəmalın dilbərin,
"İstədim, Qüdsi, deyim vəsfi-camalın dilbərin,
Kuşiş etdim zinəti-göftar gəlsin, gəlmədi".

*31.07.1996*

## SEYID ƏZIM ŞIRVANININ QƏZƏLINƏ TƏXMIS

Gümanım varmıdır ərz eyləyim imkanımı, yarəb?
Tutub qəm, qüssə, ah, əfğan mənim dörd yanımı, yarəb,
Qova bilməm kənarımdan bu gün hicranımı, yarəb,
"Çıxır can cismdən, bir dəm yetir cananımı, yarəb,
Görüb rüxsarını təslim edim bu canımı, yarəb".

Sual etdim: - Əgər gəlsə, nəyi qurban edim qurban?
Düşündüm: Qoç nədir, bəlkə yara qaplan edim qurban?
Çıxıb ovlağə, düzlərdə vurum ceyran edim qurban".
"Görüb rüxsarını, nəzr etmişəm ki, can edim qurban,
Yetir yarı, qəbul eylə mənim qurbanımı, yarəb".

Ilahi, sən özün yardımçı ol, lütf eylə imdadı,
Könül mülküm xarab olmuşdur, abad eylə bərbadı,
Hələ çoxmu çıxar ərşə bu zatın ahü fəryadı?
"Təni-zarımdan al ya, ey xuda, bu cani-naşadı,
Mübəddəl qıl vüsali-yarə ya, hicranımı, yarəb".

Bu sevdayə düşən gündən nələr çəkmiş mənim başım,
Ilahi, sirrimi sənsən bilən, yox qeyri sirdaşım,
Arazmı, Kürmüdür, Tərtərmidir axmaqda göz yaşım?
"Tənuri-pirəzəndən bədtər oldu çeşmi-xunpaşım,
Cahan qərq oldu, sakit eylə bu tufanımı, yarəb".

Xilas eylə desəm mən, səhvdir, namərdi hicrandan,
Xilas eylə desəm, nöqsan deyildir mərdi hicrandan,
Xilas eylə, Ilahi, mən təkin hər fərdi hicrandan,
"Tökəydi qanımı, azad olaydım dərdi-hicrandan,
Gətir bir rəhmə ol bidadgər sultanımı, yarəb".

Ötür dərd ilə, möhnətlə zamanım, rəhm edə dilbər,
Cəhənnəmdən də bədtərdir məkanım, rəhm edə dilbər,
Mənim hərçənd yoxdur bir gümanım, rəhm edə dilbər,
"Ümidim var kim, görsə fəğanım rəhm edə dilbər,
Yetir ol mahi-bimehrə mənim əfğanımı, yarəb".

Nə müddətdir qəmü qüssə olur şamü səhər peyda,
Sevən kəslərdə, ey Şahin, neçin dərdü kədər peyda?
Bilən vardırmı qəlbimdə sevincim yox, nələr peyda...
"Tutub xət ruyin, oldu fitneyi-dövri-qəmər peyda,
Xətadən hifz qıl bu Seyyidi-nalanımı, yarəb".

*16-17.08.1996*



## M.ŞƏHRIYARIN QƏZƏLINƏ TƏXMIS

Neçə təqlidçi ilə mən elə qovğa elədim,
Edirəm fərz ki, ölməzliyi peyda elədim!
Türk dilində bu qədər şeri ki, inşa elədim,
"Türki bir çeşmə isə mən onu dərya elədim,
Bir soyuq mərəkəni məhşəri-kübra elədim".

Meylini gəh çiçəyə, gəh gülə salmış qələmim,
Gah gül qədri bilən bülbülə salmış qələmim,
Mehrini mehri danılmaz elə salmış qələmim,
"Nə tək Iranda mənim qülqülə salmış qələmim,
Bax ki, Türkiyyədə, Qafqazda nə qovğa elədim".

Get-gedə şerlərim öylə olubdur şəffaf,
Elə bir çeşməyə bənzər ki, axır gilsiz, saf,
Vətəni mədh eləməz kəsdə görünmür insaf,
"Bax ki, Heydərbaba əfsanə tək olmuş bir Qaf,
Mən kiçik bir dağı sərmənzili-ənqa elədim".

Ürəyi qarələr ağzında dil olmuşdu söyüş,
Dili sədparələr ağzında dil olmuşdu söyüş,
Hicrə-məhparələr ağzında dil olmuşdu söyüş,
"Qəmə-qəddarələr ağzında dil olmuşdu söyüş,
Mən sevinc etdim onu, xəncəri xurma elədim".

Mənim öz doğma dilim var, nə gərəkdir cəncəl,
Dilimə yad deyimlər açır, əlbət, əngəl,
Verirəm şerimə öz sözlərim ilən seyqəl,
"Acı dillərdə şirin türki olurdu hənzəl ,
Mən şirin dillərə qatdım onu, həlva elədim".

Bilələr gər bu dilin qədrini - dünya dilidir,
Həmi surətdə gözəldir, həmi məna dilidir,
Həmi ülfət, həmi iffət, həmi sevda dilidir,
"Türki vallah analar oxşarı layla dilidir,
Dərdimi mən bu dəva ilə müdava elədim".

Yad dil ilə danışan varsa da hədyan hələ də,
Quru cismimdə, a Şahin, durudur qan hələ də,

Çox dəni düşməni görməkdədi meydan hələ də,
"Şəhriyar, heyf, savıqdır bu dəyirman hələ də,
Dartmağa bir dəni yox, mən də müdara elədim".

## ƏLƏKBƏR ŞAHIDIN QƏZƏLINƏ TƏXMIS

Bircə də aşiqimiz olmadı peyda sakit,
Nə Qeys sakit olubdur, nə də Leyla sakit,
Olmayıb, olmayacaqdır qoca dünya sakit,
"Necə gördü yaranıb daməni-səhra sakit,
Rəşkdən olmadı bir dəm ola dərya sakit".

Məsti hüşyar ilə bir yerdə görüb gülşəndə,
Fərəhi zar ilə bir yerdə görüb gülşəndə,
Yarı əğyar ilə bir yerdə görüb gülşəndə,
"Qönçəni xar ilə bir yerdə görüb gülşəndə,
Susa bilmir ki, ola bülbüii-şeyda sakit".

Niyə mən görməyirəm ülfətini şamü səhər,
Etmişəm, etmədəyəm xiffətini şamü səhər,
Çəkmişəm, çəkmədəyəm möhnətini şamü səhər,
"Su kənarında görüb qamətini şamü səhər,
Titrəyir vahimədən sərvi-dilara sakit".

Naz edib aşiqi ilhamə salandan sonra,
Üzünün nurini axşamə salandan sonra,
Araya bir neçə həngamə salandan sonra,
"Yusifə böhtan atıb damə salandan sonra,
Olmadı həsrət əlindən də Züleyxa sakit".

Düşmüsən eşqə, bu sevdanı gurultuyla demə,
Bəlkə röyadı bu, röyanı gurultuyla demə,
Şahina, aləmə xülyanı gurultuyla demə,
"Şahida, şerdə mənanı gurultuyla demə,
Həll olur əhli-kəmal içrə mu məna sakit".



## ƏMINAĞA ARIFIN QƏZƏLINƏ TƏXMIS

Görmüşəm, ey pəri, hərçənd ki, mərdanə səni,
Bu gözəllik salacaq əvvəl-axır qanə səni,
Istərəm müti edim mən belə fərmanə səni:
"Elə get şəmə tərəf görməyə pərvanə səni,
Aldadıb almaya təsirinə biganə səni".

Qoru dür tək bu vüsalı, onu hicran etmə,
Məni bir zərrə yanından, gözəlim, yan etmə,
Qarə zülfün kimi əhvalı pərişan etmə,
"Getmə meyxanəyə mənsiz, ciyərim qan etmə,
Gəl rəva görmə yetən söyləyə məstanə səni".

Gözlərində bu nəmi sən ki çəkirsən, gözəlim,
Iztirabı, ələmi sən ki, çəkirsən, gözəlim,
Hicri görcək, sitəmi sən ki çəkirsən, gözəlim,
"Bu qədər dərdü qəmi sən ki çəkirsən, gözəlim,
Salacaq naleyi-qəm axırı nöqsanə səni".

Özünü Şirin edib, aşiqi Fərhad elədin,
Həmişə şad olasan sən ki, məni şad elədin,
Barı bildir, nə səbəbdən yenə fəryad elədin?
"Yetər ol qədr çəkib nalə, gülüm, dad elədin,
Bəsdi, canan, bu səda, kim yetirər canə səni?"

Sən ki əğyarlığı eylədin inkar, ey gül,
Yenə də bəziləri eyləməyir ar, ey gül,
Çoxalır bağda alağ timsalı əğyar, ey gül,
"O qara qaş, o qara göz ki, sənin var, ey gül,
Qorxuram aldada hər söylənən əfsanə səni".

Sənə can vermişəm, ey can, mənim canımsan,
Qeyri canan ola bılməz belə, cananımsan,
Bu şərəfdir mənə ki, sən şərəfim, şanımsan,
"Sən mənim qönçə gülüm, bağı-gülüstanımsan,
Verməræm cümlə bilir mülki-Süleymanə səni".

Nə qədər çəksə də Şahin kimi insan dərdi,
Yenə şövq ilə çəkir el qəmi, dövran dərdi,

Onu divanə edibdir təzə "Divan" dərdi,
"Arifa, bir vətənin, bir də ki canan dərdi,
Şübhəsiz eyləyəcək axırı divanə səni".

*6.07.1997*

## AZƏR BUZOVNALININ QƏZƏLINƏ TƏXMIS

Məhəbbət olmayan başda, yəqinimdir, kamal olmaz,
Əgər eşqim mənim baş tutsa qəlbimdə məlal olmaz,
Nə müddətdir ki, məndə eşqdən qeyri xəyal olmaz,
"Bəlayi-eşqdən zövq almayanlar bərkəmal olmaz,
Bu zövqü duymayan kəs layiqi-bəzmi-vüsal olmaz".

Bu hüsn ilə cahan mülkündə təksən? Bilməzəm billah!
Bütün göyçəklərə ya müştərəksən? Bilməzəm billah!
Könül bağımdakı gülsən, çiçəksən? Bilməzəm billah!
"Pərisən, hurisən, ya bir mələksən? Bilməzəm billah!
Pəridə, huridə, ya bir mələkdə bu camal olmaz".

Camal üstünmüdür, yaxud kamalınmı camalından?
Kamal üstünmüdür, ya ki, camalınmı kamalından?
Nə cür sehr oldu bu, canan, gözüm doymur vüsalından,
"Verirsən aşiqə can şəhdü şəkkər tək məqalından,
Məsihi-vəqtsən, cana, belə şirin məqal olmaz".

Məhəbbət ən gözəl nemət, gözəlliklər - əyan ondan,
Deyən var "eşqdən vardır ziyan", olsun ziyan ondan,
Mənim xeyrim budur ki, mən xoşam eşqin ziyanından,
"O hansı bəzmdir kim, söhbəti-muyi-miyanından
Müdəqqiqlər söz açmaz, ortada yüz qeylü qal olmaz".

Nə xoşbəxtəm ki, bağlanmış bu vurğun can o sevdayə!
Əcəb sevdadı, Şahin, yan, ömürlük yan o sevdayə,
Təki qurban ola cismim mənim, canan, o sevdayə,
"Qələm çəkmək gərək əfsaneyi-Məcnunü Leylayə
Ki, Məcnun Azərə, Leyla sənə hərgiz misal olmaz".

*14.08.1997*



## ƏLIŞIR NƏVAININ QƏZƏLLƏRINƏ TƏXMISLƏR

### I

Əsmə gəl böylə, əsib abadı viran eyləmə,
Sən yenə qan-qan deyirsən, bağrımı qan eyləmə,
Mülkümüz sakitlik istər, böylə tüğyan eyləmə,
"Zülfigə[1] meyl, ey nəsimi-ənbərəfşan[2] eyləmə,
Tərqətib[3], yüz parə könglümni[4] pərişan eyləmə".

Əsdiyindəndir əsib çəkməkdəyəm mən intizar,
Səndə insaf qalmayıbdır, məndəsə səbrü qərar,
Qorxuram ki, mənzilindən çıxmasın qorxub nigar,
"Aləm əhli caniğə rəhm eyləb, ey çabüksüvar,
Atlanıb üsrük[5], yenə ahəngi-meydan eyləmə..."

Bir müsəlmanəm ki, yarım, bilmərəm əsla həram,
Sənsiz olmaz eşq mülkündə mənə bir dəm nizam,
Aşiqin olmaz səlamət verməsən hər gün səlam,
"Deb imişsən eyləyim islam elində qətli-am,
Eyləmə bu zülmünü, ey namüsəlman, eyləmə".

Gərçi hərdən vəslimi cövr ilə hicran etmədə,
Razıyam Rəbbimdən amma, vəslə imkan etmədə,
Müşkili tədric ilə, səbr ilə asan etmədə,
"Gər desən könglügni gərdun[6] təhbətəh[7] qan etmədə,
Xırda meylin qönçə tək könglümdə pünhan eyləmə".

Ey könül, ah eyləmə, şadlan bu gün, gül bağ ara,
Ağ çiçəklərdirmi bu, ya görsənir tül bağ ara?
Şahinəm mən, olmuşam amma ki, bülbül bağ ara,
"Ey Nəvai, bəzm düzgən irmış[8] ol gül bağ ara,
Ta pərişan bulmasın, bülbül tək əfğan eyləmə".

*8.10.1997*

---

1. Onun zülfünə
2. Ənbərsəpən nəsim
3. Dağıdıb
4. Mənim könlümü
5. Sürətlə
6. Fələk
7. Büsbütün
8. Məclis düzəltmişdir

## II

Bilmədim mən nə üçün sandı günəhkar məni,
Qoymayıb bağə pərişan elədi yar məni,
Bağiban qaldı təəccübdə görüb zar məni,
"Nat'əvan nərgisi tək eylədi bimar məni,
Sünbülü dami ara qıldı giriftar məni".

"Bildirir" kəlməsi özbəkcə olur "bildirədür",
Deyəsən yar adımı hafizədən "sildirədür",
Bir səbəb varmı ki, əğyarı yenə "güldürədür",
"Yar kuyində gər ölsəm qəm iməs, öldürədür,
Kuyidən bu ki qovar hər nəfəs əğyar məni".

Mənə hicranı o yarın bu bəla kim, qılmış,
Elə zənn eyləməsin heç də həlakim qılmış,
Məni məhv etməyə hicranı kim hakim qılmış?
"Dərd dağiyü bəla dəştidə gör kim, qılmış
Eşq Fərhad ilə Məcnunə nəmudar məni"...

Məni inkar eləyib yar peşiman qıldı,
Və həzin halıma aşiqləri heyran qıldı,
Kədəri qəlb evimə daimi mehman qıldı,
"Yandırıb hər səri-dudimni pərişan qıldı,
Dud tək zülf ilə ol od kimi rüxsar məni..."

Yenə tutdum yolumu şövq ilə meyxanəyə mən,
Cəlb edirsən yenidən Şahini, ey saqi, nədən?
Aşiqin qorxusu olmuşmu haçansa hədədən,
"Deme, ey şeyx, Nəvaiyə ki, çıx meykədədən,
Çıxaram, qoysa gər ol dilbəri-xummar məni".

*20.03.1998*

## III

Söyləyən çoxdur: Sənəm kim, məndə vardır, kimdə var?
Fəxr edən var: Möhtərəm kim, məndə vardır, kimdə var?
Amma ki, dərdü sitəm kim, məndə vardır, kimdə var?
"Dilbəra, səndən bu qəm kim, məndə vardır, kimdə var?
Firqətindən bu ələm kim, məndə vardır, kimdə var?"

Çox təmənna eylədim gündüz-gecə Allahdən,
Istəyib daim mədəd mən bəndəyə ol şahdən,



Yetməyir neyçün kömək həmrahinə həmrahdən,
"Məzrəi-eyşim gökərməydir səmumi-ahdən,
Yoxsa, yaşdan bunca nəm kim, məndə vardır, kimdə var?"

Bağiban, mən bülbülə ol güldən üz, heç kimdə yox,
Istəsən axtar gecə, axtar günüz, heç kimdə yox,
Saqiya, mey kim, varındır, durma süz, heç kimdə yox,
"Qoyma minnət kim, üzüm tək pak üz heç kimdə yox,
Böylə eşqi-pak həm kim, məndə vardır. kimdə var?"

Aşina zülm eyləyəndən çoxdu dərdin, ey könül,
Sənləyəm mən, mənlə et söhbət, danış, din, ey könül,
Hicrə ki, tab etmisən, vardırmı mislin, ey könül,
"Qəlbi ruyəndud ilə bey etsə vəslin, ey könül,
Dağdən bunca dirəm kim, məndə vardır. kimdə var?"

Taleyindir cövr edir, vardırmı bədxahin bu növ?
Odlanarsan tüstülənsə göylərə ahin bu növ,
Sən təkin bir başqa aşiq görmədim, Şahin, bu növ,
"Ey Nəvai, gərçi cürmün çoxdurur, lakin bu növ
Xosrovi-sahibkərəm kim, məndə vardır. kimdə var?"

*21.03.1998*

## IV

Dağda arx göstərdi Fərhadı ki, memarım budur,
Saqi meydən xoşlanıb dilləndi: xummarım budur,
Eşqi təsdiq eyləyib dindim ki, inkarım budur,
"Sərv üzə gül açdı kim, qədd üzrə rüxsarım budur,
Canə nitq öyrətdi kim, ləl içrə göftarım budur".

Aşiqəm, etmir pəsənd əğyarı "rədd"im. qayda var.
Səddi-Isgəndər kimi möhkəmdi səddim. qayda var.
Şairəm, yüksəlmək istər ərşə qəddim, qayda var,
"Yüz cəfa, min şuxluq göstərsə həddim. qayda var.
Kim, desəm bir qətlə kim, şuxi-cəfakarım budur".

Bir zamanlar bəxtəvərdim, indi zarəm. indi zar,
Ey nəsim, çoxdan nigarə intizarəm, intizar,
Hövsələm quş tək uçubdur, cismdə yoxdur qərar,
Səbr elə, şövqümni cylə ərz mehman bulsa yar,
Eşq iqbalində neynim kim, yoxü varım budur".

Seyr edib aşiq kəsin dildarə məftun surətin,
Çəkmişəm rəssam olub hər vədə məhzun surətin,
Leyli-Məcnun surətiylə, Dürrə-Vurğun surətin,
"Gərçi mən nabud buldum, ey ki, Məcnun surətin,
Səfhədə qıldın rəqəm, bil kim nəmudarım budur".

Şahina, inkar qılsa vəsli hicran, qılma eyb,
Çünki hicranə vüsal həm uddurur qan, qılma eyb,
Yanına hərgəh dönərsə bir də canan, qılma eyb,
"Ey Nəvai, istəsəm zülfin pərişan, qılma eyb,
Neyləyim, sərmayeyi-bəxti-siyəhkarım budur".

*22.03.1998*

***

Etməyəydim hüsnünə, yarım, təmaşa kaş ki,
Qılmayaydım vəslini səndən təmənna kaş ki,
Olmayaydım yetməyib məqsudə rüsva kaş ki,
"Açmaya idin cəmalin aləm ara kaş ki,
Salmaya idin barı aləmdə qovğa kaş ki".

Görmədim ömrüm boyu aşiqlər olsun şadiman,
Zülm edir aşiqlərə, yarəb, neçin hər dəm cahan,
Olmuşam bülbül misalı, ey gülüm, mən bağrıqan,
"Bulmaya idi gözüm odlu üzün görkən zaman,
Eşqin odlu şöləsin könlümdə peyda kaş ki".

Canımı yandırmağın var, amma yoxdur məlhəmin,
Tazəlik yoxdur, buyam mən, sən həminsən, naz həmin,
Cövr edirsən sən neçin mən munisə, ey nazənin?
"Eyləgəc eşqin bəlası zar könlümni həzin
Qılmaya idin məni-məhzunə pərva kaş ki".

Seyr edib göz yaşlarımdan bağçamı nəm bulmuşam,
Mən səhərlər güllərin üstündə şəbnəm bulmuşam,
Əllərimdən vermişəm rahətliyi, qəm bulmuşam,
"İndi kim, divanəvü rüsvayi-aləm bulmuşam,
Vəsl çün mümkün yox, öldürqay bu sevda məni".

Etməsəm də meylimi inkar, bəs nə faidə,
Eşqdən hər dəm ziyanım var, bəs nə faidə,
Şahina, zülm eyləyir dildar, bəs nə faidə,
"Ey Nəvai, bivəfadır yar, bəs nə faidə,
Hər qədər dersən "əgər", "yaxud", "məgər". ya "kaşki"?

*23.03.1998*



## ŞAH ISMAYIL XƏTAININ QƏZƏLINƏ TƏXMIS

Bezdi aləm çəkdiyim ahü fəğanimdən mənim,
Qorxuram hətta özüm öz ələmanimdən mənim,
Ey pərim, getdinsə də bilmərrə yanimdən mənim,
"Çıxmadı eşqin sənin bir ləhzə canimdən mənim,
Mehri-hüsnün yeg durur ruhi-rəvanımdən mənim".

Sən də türksən, mən də türk, Məcnun ərəb, Leyla ərəb,
Aşiq aşiqdir, nə fərqi türk olsun, ya ərəb,
Hər bir aşiq eşqinə layiqli eşq eylər tələb,
"Gül yüzini yad edəndə, ey pərirüx, qönçələb,
Od çıxar susən təki hər dəm zəbanimdən mənim".

Öylə dilbərsən ki, heç kim görməyib səndən ziyan,
Inşaallah tez dönərsən yanimə, vardır güman,
Olmayıbsan heç mənə namehriban, ey mehriban,
"Əksi-sayəndir vücudim, ey boyu sərvi-rəvan,
Getməsin sayən sənin bir ləhzə yanimdən mənim".

Təngə gəlmiş hicr özü əfğanimizdən, ey mələk,
Eşq odu əksilməyibdir canimizdən, ey mələk,
Var bir qorxum o da hicranimizdən, ey mələk,
"Pərtövi-xurşidi-ruyini görəndə zərrə tək
Dapmaya heç kimsə bu namü nişanimdən mənim".

Zülm edirsən, ey nigarım, sən havayi-xəstəyə,
Bəllidir hicran oxunun təkcə sayi xəstəyə,
Şahinəm mən, xəstəyəm, ver eşq payi xəstəyə,
"Firqəti qəsd etmədin miskin Xətayi xəstəyə,
Bir xəbər ver, ey səba, ol gülsitanimdən mənim".

*21.12.1997*

## VAHIDIN QƏZƏLINƏ TƏXMIS

Kamə yetdim mey içib, ver meyi nakam əlinə,
Düşməsin amma o, əğyar təki bədnam əlinə,
Dəyməsin bir də Ilahi nəzərim xam əlinə,
"Aldı mey camını ol yari-güləndam əlinə,
Can fəda saqiyə, verdi o gülün cam əlinə".

Mey ki, məstanəliyin mən kimi inkarı deyil,
Sübhəcən aşiqi məst eyləsin, əğyarı deyil,
Doldurun badələri, heç gecəmiz yarı deyil,
"Badə zövqün nə bilir kim ki, xiridarı deyil,
Qoymayın ləli-giranmayə düşə xam əlinə".

Işrəti şairə dildarı müsaid bilsin,
Bir-iki badə də qoy saqiyə aid bilsin,
Təbinin qədrini Vahid kimi Şahid bilsin,
"Dəri-meyxanə səfasın niyə zahid bilsin,
Vermə cənnət açarın cahili-bədnam əlinə".

Əhdə sadiqliyi Məcnun, Kərəm etmiş icad,
Meyi həm mən kimi bir möhtərəm etmiş icad,
Məstliyi bəlkə də aləmdə qəm etmiş icad,
"Badə tarixini Cəmşidi-Cəm etmiş icad
Ki, düşübdür bu qədər kafərü islam əlinə".

Xətrini bir daha yad etmək üçün Xəyyamın,
İsmini izz ilə ad etmək üçün Xəyyamın,
Əzmini bir də polad etmək üçün Xəyyamın,
"Rahəti-ruhini şad etmək üçün Xəyyamın,
Cam tut ki, necə almış onu Xəyyam əlinə".

Hanı günlərlə ki bayram tutardım, saqi,
Badəni yarə verib, cam tutardım, saqi,
Hüsnünü görmək üçün şam tutardım, saqi,
"Bir də bir cam ilə aram tutardım, saqi,
Gər yetişsəydi əlim yari-dilaram əlinə".

Meyə aludə olanlarda həyat oldu hədər,
Meyi ifrat eləyənlər nə qədər çəkdi zərər!..
Şahina, iç meyi əql ilə içirsənsə əgər,
"Vahid üçün bu şərəf ləzzəti-dünyayə dəyər
Yar ilə alsa əgər badeyi-gülfam əlinə".

*20.01.1998*



## SEYID ƏZIM ŞIRVANININ QƏZƏLINƏ TƏXMIS

Ürəyim şənliyi etmiş yenə inkar, ağlar,
Ağlaram mən deyə gülzarü çəmənzar ağlar,
Yadə saldıqda məni, gözlərin, ey yar, ağlar,
"Yadə saldıqda səni dideyi-xunbar ağlar,
Yar hicrin çəkən, əlbəttə ki, naçar ağlar".

Utanıb baxdı yerə seyr eləyib çöhrəni gül,
Gözəlim, bülbülü andırmadayam mən, səni gül...
Görəsən mən gülü aram edərəm, ya məni gül?
"Bülbüli-bidil əlindən üzülüb daməni-gül,
Gecələr sübhə kimi nalə çəkib, zar ağlar".

Neyləmişdim görəsən dərdü ələm çəkdi hücum,
Izləyib onları diqqətlə, sitəm çəkdi hücum,
Gözümə rəhmi neçin gəlmədi, nəm çəkdi hücum,
"Şad ikən vəslin ilə könlümə qəm çəkdi hücum,
Oldu min gunə yenə dərdə giriftar, ağlar".

Mənə dildar odur tutsa da lap aləmi yar!
Görəsən yad eləyirmi məni hicran dəmi yar?
Var isə rəhmi neçin tərk eləyir həmdəmi yar?
"Tabi-təb, zülməti-şəb, möhnəti-qürbət, qəmi-yar,
Eyləməz tab bu möhnətlərə bimar, ağlar".

Sinədə qalsa kədər ağlamaq adətdi mənə,
Bədnəzər salsa nəzər ağlamaq adətdi mənə,
Ayrılıq çalsa zəfər ağlamaq adətdi mənə,
"Bəs ki, şəb ta besəhər ağlamaq adətdi mənə,
Həmdəm olmuş mənə yeksər dərü divar ağlar".

Yanmamışdı belə çoxdandı vücudim, billah,
Atəşindən yenə əlvandı vücudim, billah,
Deyəsən yanmamağı dandı vücudim, billah,
"Mən ki, hicr atəşinə yandı vücudim, billah,
Mənim əhvalimə duzəxdə yanar nar ağlar".

Şahinin günləri keçmişdi o canan ilə,
Bəxtə bax, indi keçir naləvü əfğan ilə,

Yarsalar köksümü göz yaşı axar qan ilə,
"O qədər ağladı Seyyid qəmi-hicran ilə,
Ki, onun halına bu çərxi-sitəmkar ağlar".

*10.04.2001*

## SEYID ƏZIM ŞIRVANININ QƏZƏLINƏ TƏXMIS

Dilbər daha Şirinlə Züleyxanı deməzlər,
Xummarı deməzlər, hələ Əzranı deməzlər,
Yarımı deyərlər, daha Leylanı deməzlər,
"Ey gül, sənə hali-dili-şeydanı deməzlər,
Hali-dili-zari-məni-rüsvanı deməzlər".

Meylim, gözəlim, eşq təkin varuva düşmüş,
Neynim ki, bu şövqüm yenə inkaruva düşmüş,
Yox faydası israrımın israruva düşmüş,
"Gördüm o siyəh türrəni rüxsaruva düşmüş,
Yandım oda, bu atəşi-suzanı deməzlər".

Mən Qeys ola bilməmsə əgər məndə nə mənə?
Sən Leyli deyilsənsə əgər səndə nə mənə?
Ardınca sənin mən gəzirəm gündə, nə mənə?
"Xəttin bilirik müshəfi-hüsnündə, nə mənə?
Ləfzi oxudurlar bizə, mənanı deməzlər".

Eşq içrə vəfadarı, könül, axtar, özün tap,
Var kimdə vəfa varı, könül, axtar, özün tap,
Eşqində günəhkarı, könül, axtar, özün tap,
"Sirri-dəhəni-yari, könül, axtar, özün tap,
Söz yox ki, açıb şəxsə müəmmanı deməzlər".

Eşq aləmi öldürdü məni, kimsə inanmaz,
Hüsnün şəmi öldürdü məni, kimsə inanmaz,
Vəslin dəmi öldürdü məni, kimsə inanmaz,
"Ləlin qəmi öldürdü məni, kimsə inanmaz,
Can qatili aləmdə Məsihanı deməzlər".

Dağlandı dodağım, odu sönməzmi o dağın?
Qəlbimdə ölüncən qalacaq həkki dodağın,
Peymanıma yoxdur, gözəlim, şəkki dodağın,



"Bimar məni etdi gözün, ikki dodağın,
Dərdimi bilirlər, mənə dərmanı deməzlər".

Şahin, kiri, eşqin sitəmindən nə məzəmmət?
Eşq aləminin dərd-ələmindən nə məzəmmət?
Şənlik gələcək, qüssə dəmindən nə məzəmmət?
"Qafildi gər ol şəm qəmindən, nə məzəmmət?
Seyyid, ona suzi-dili-şeydanı deməzlər".

*6.08.2001*

## MIRHAŞIM MÜSAFIRIN QƏZƏLINƏ TƏXMIS

Lənkəranda dedilər ki, təzə mehman tapılıb,
Saf qəzəl mülkünə layiq yeni sultan tapılıb,
Çox şükürlər ki, əruz vəzninə meydan tapılıb,
"Ey könül, şənlik elə, dərdinə dərman tapılıb,
Hal bilən, xoş danışan alimü loğman tapılıb".

Oxudum şerini illər boyu mən çoxlu kəsin,
Şair oldur yeni söz söyləməyə cəhd eləsin,
Zər desin qoy qəzələ, ləl desin, inci desin,
"Darıxan qəlbinə söylə daha çox inciməsin,
Ona ahəstə nəfəs almağa imkan tapılıb".

Neçə müddətdi ki, artırdı yenə dərdi-səri,
Ucalırdı günü-gündən fələyə nalələri,
Qoy fəğan eyləməsin bir dəxi bica, hədəri,
"İndi qoy bülbül unutsun qəmi, dərdi, kədəri
Ki, onun gözlədiyi qönçeyi-xəndan tapılıb".

Gəhi Gəncə, gəhi Zəncanları gəzdin bunca,
Gəhi Təbriz, gəhi Səlyanları gəzdin bunca,
Şairim, Azəribaycanları gəzdin bunca,
"Bəsdi, tərk eylə, biyabanları gəzdin bunca,
Sənin axtardığın ahuyi-biyaban tapılıb".

Şahina, sən yenə meydanını tapdın, necə ki,
Lənkəran içrə qəzəlxanını tapdın, necə ki,
Şairə söz demək imkanını tapdın, necə ki,
"Ey Müsafir, deyəsən canını tapdın, necə ki,
Qəlbinə hakim olan sevgili canan tapılıb".

*19.05.2002*

"Ənanım aldılar əldən, dili-zar ayrı, yar ayrı,
Məni divanə qılmışlar xəzan ayrı, bahar ayrı" *.

Sədaqət barədə verdim qərar, əğyar əməl etmir,
Xəyal eylər əməlsizlər əməl ayrı, qərar ayrı.

Deyir saqi "səni məstü xumar etdim məhəbbətdə",
Buna amma əməl qoymur ki, məst ayrı, xumar ayrı.

Vüsal uğrunda hazırdır ki, cırsın dəmbədəm köynək,
Züleyxa ayrı canandır, Xumar ayrı, Nigar ayrı.

Biri vəsf eyləyir yarı, diyarı başqası, amma
Mənəm ki, yazmıram heç vədə yar ayrı, diyar ayrı.

Əzizlər, saxlanılsın yer mənim qəbrimdə yar üçün,
Diriykən - birgəyik, amma neçin ölsək - məzar ayrı?

Xəzanımda baharım düşdü yadə, xoş demiş Qövsi:
"Məni divanə qılmışlar xəzan ayrı, bahar ayrı".

*17.09.1995*

***

Məni girinc eləyibdir yenə yaman fəryad,
Yenə gedir ürəyim, gəldi ay aman fəryad.

Bir tərəfdə dayanıb göz yaşın rəvan etdim,
Nalə yağdırdı cism dörd tərəfə, can - fəryad.

Neçə müddətdi çağırram o yarı, görsənmir,
Həman-həman çağırışdır, həman-həman fəryad.

"Cahan-cahan aləmindən cahan-cahan əfğan,
Zaman-zaman sitəmindən zaman-zaman fəryad" **.

Üzə bax ondakı sən, qorxmayır, neçin qaçmır?
Qəmi dərdin oxu ilən alıb nişan fəryad.

Yenə göy gurladı üstümdə, ildırım çaxdı,
Görübən sanki məni etdi asiman fəryad.

Şahina, sanki yarıb köksü ürək çıxmaqda,
Çıxacaqdır ürəyimdən haçan, haçan fəryad?

*23.09.1995*

---

* Beyt Əlican Qövsi Təbrizinindir.

** Beyt Əlican Qövsi Təbrizinindir.



***

*"Ze came-eşqe-to Xacu çenin ke mest oftad.*
*Be ruze-həşr sər əz xak bər konəd xommar"* *.

**Xacu Kirmani**

Elədin sən məni, yarım, o qədər şən, xummar,
Heç zaman olmamış idim bu sayaq mən xummar.

Saqi, əl çək, məni meyxanəyə dəvət eləmə,
Eləməkdir məni qəsdin səhər erkən xummar.

Kimisi mən kimi, xummarı olub dildarın,
Kimi meyxanədədir saqi meyindən xummar.

Ərəbistanı əvəz eylədi Gürcüstanla,
Görməyib Şeyx yəqin ki, Xumara tən xummar.

Sadiqi çox bu cahanın, sən isə ən sadiq,
Xummarı çox bu zamanın, sən isə ən xummar.

İnsanın olması xummar təəccüblü deyil,
Hansı məskəndə olursansa, o məskən xummar.

Bağiban görcək onu oldu xumar, ey Şahin,
Bağiban bir yana qalsın, hələ gülşən xummar.

*1.10.1995*

***

*"Əz şəm beporsid hədise-dele-Xacu,*
*K-ənduhe-dele-suxtegan suxte danəd"* **.

**Xacu Kirmani**

Elə söz var ki, onu təkcə bu can bilməlidir,
Vardır amma eləsi cümlə cahan bilməlidir.

Nə üçün cəhd edirəm mən ki, qəzəl saf olsun?
İndi qafil bunu bilmirsə, haçan bilməlidir?

---

* "Gözəlim, eşq camından elə məstdir Xacu,
Qalxacaq həşr günü, bil ki, qəbirdən xummar".

** "Xacunun halını, əlbəttə ki, şamdan soruşun,
Yananın dərdini, söz yox ki, yanan bilməlidir".
(Tərcümələr bu sətirlər müəllifinindir).

Qiylü-qalə səbəb olmuş nə qədər yaxşı fikir...
Nə üçün yaxşını qal əhli yaman bilməlidir?

Deməsinlər niyə fəxr eyləyirəm sevgimlə,
Əsl aşiq özünə sevgini şan bilməlidir.

Eşq odu, mehr alovu qəlbdə qalmışsa əgər,
Qoca aşiq özünü onda cavan bilməlidir.

Neçə rahətliyi vardır zamanın - rahətsiz...
Elə rahətliyi insan həyəcan bilməlidir.

Şahinin niyyəti çox şəxsə deyildir məlum,
Arifin niyyətini arif olan bilməlidir.

*2.10.1995*

***

"Gərçi hər aşiqə hicran qatı müşkil görünür,
Mənə hər ləhzə fərağın neçə min il görürnür"*.

Sən gedirsən, təzədən qəlbimə nisgil dolacaq,
Ay aman, gözlərimə gör neçə nisgil görünür...

Varsa da yox kimidir bağçada güllər sənsiz,
Sən ki yoxsan nə mixək var, nə qərənfil görünür.

Məni gördükdə, gələn - qarşıma gəlmir nə üçün?
Məni gördükdə, qaçan - indi müqabil görünür.

Yenə hicranə ağızdan acı söz çıxmaqda,
Acı söz söyləmə, ey dil, o şirindil görünür.

Arabir xoşlamışam hicri, deyildir məxfi,
Mənə hicran təzədən indi əzazil görünür.

Ömrümün sahili görsənmədədir gözlərimə,
Ömür ümmanı quru... qupquru... sahil görünür.

Həmi Şahin, həmi Fazil görünür bircə nəfər,
Biri Şahin görünür, başqası Fazil görünür.

*3.10.1995*

* Beyt Qövsi Əlican Təbrizinindir.



***

"Badeyi-rahəti-candır qədəhi-canə ümid,
Dəmbədəm nəşə verir xatiri - insanə ümid" *.

Görüb haqsızlığı getmişdi ümid qəlbimdən,
Deyəsən indi gəlibdir yenə canənə ümid.

Ey ki pəjmürdə olub eşqdə loğman arayan,
Yardən yoxsa əlac, eyləmə loğmanə ümid.

Can verər xəstə geyinməzsə ümiddən köynək,
Quruyar bağça əgər qalmasa bağbanə ümid.

Biz ümidvar oluban meydana yollanmışdıq,
Bizi çəkmişdi, gətirmişdi o meydanə ümid.

Məndə vardır yaşamaq şövqü, ümid sevdası,
Şəm - ümid, şölə - ümid, yanmasa pərvanə - ümid.

Bitsə qış, gəlsə bahar varmı gülüstan ümidi?
Güllənərmi görəsən düşsə biyabanə ümid?

Qarabağ müşkilinin həllinə imkan yoxmu?
Hər vətənpərvəri qoy çatdıra imkanə ümid.

Şahina, səndə nə var indi ümiddən savayı?
Saf toxum tək səpələnsin təki hər yanə ümid.

*20.10.1995*

***

*"Çəkərəm xəncəri-almas özümü öldürrəm,*
*Igid ölmüş, yola gəl, yaxma mənim qan əlimə".*
**Seyid Əbülqasim Nəbati**

Əfqanıstanda mənim düşmədi imkan əlimə
Ki, girim cəngə xəbislərlə, yaxam qan əlimə.

Indisə zəbt olunubdur Qarabağ məmləkətim,
Alaram torpağımı, Azərbaycan, əlimə.

* Beyt Məhəmmədəli Şəfainindir.

Şükür etsin ki, tutub boğmamışam biryolluq,
Ola əğyar gərək yüz kərə qurban əlimə.

Yenə rüsvay eləsə eşqi onun vay halına,
Keçəcəkdir, bilə qoy, bir kərə pünhan əlimə.

Bağa girdim yara gül dərməyə, güllər solğun,
Dikəcək göz yenə, eyvah, o canan əlimə.

Nə şirinsən mənə, ey yar, dilin şəkkərdir,
Tutiyəm, yaxşı düşübdür şəkəristan əlimə.

Yenə canlandı xəyalimdə vətən faciəsi,
Düşməyib çarəsi üçün hələ dərman əlimə.

Yaş ötübdür, gümanım təkcə qələmdir, Şahin,
Şah Xətaim kimi bənd olmadı qalxan əlimə.

*24.10.1995*

***

"Gəldi bir mahliqa məclisə naz eyləməyə,
Aşiqi-sadiq ilə razü niyaz eyləməyə" *.

Yaşayaq, ey pəri, bundan belə şirin-şirin,
Acı göz yaşlarımı qıyma Araz eyləməyə.

Sən əzəl cövrünü çox, rəhmini az eylərdin,
Cəhd elə rəhmini çox, cövrünü az eyləməyə.

Bu məzəmmətlərim olmuş deyə ibrət dərsi
Aranı istəməyir yar ayaz eyləməyə.

Keyfimə naz ilə doğrandı soğan hərdənbir,
Cəhd edir indi isə keyfimi saz eyləməyə.

Vəsli az idi müyəssər, çox idi hicranı,
Başladı hicri vüsal ilə taraz eyləməyə.

O qədər təzim edibdir yara Allahı kimi,
Başlayıb Şahin o gündən də namaz eyləməyə.

*25.10.1995*

* Beyt Seyid Mehdi Uryanındır.



***

Yetməsə övladı elin dadına
Lənət ola, ar ola övladına!

Ey Nəbinin, ey Həzinin varisi,
Gəl ki, zəfərlər yazıla adına.

Tarixə düşmüş neçə cəngavərin,
Tarixini salmalısan yadına.

Doğma diyarın yenə fəryadı var,
Tanrı yetişsin yenə fəryadına!

"Altı da bir, üstü də birdir yerin,
Arş, igidlər, vətən imdadına!" *

Layiq ola, Şahina, övladı qoy
Torpağın altındakı əcdadına!

*26.11.1995*

***

Dil deyər söz, sözləri dil var edər,
Yarı olsa, hər yarı yar yar edər.

Dəmbədəm təkrar edib Quranı dil
"Qülhüvallahu əhəd" izhar edər.

Bəxtəvərlik var ilən ölçülməyir,
Bəxtəvər hər aşiqi dildar edər.

İşləri yox cəng ilə aşiqlərin,
Nazəninlər davanı inkar edər.

Ey mənim dilbər nigarım, hardasan?
"Gəl" deyib dil hər zaman israr edər.

Gəl mənim qəmxarım ol ki, sinədən
Bərtərəf hər bir qəmi qəmxar edər.

* Beyt Tofiq Fikrətindir.

Dərdimi dərk etməsən, dərd eylərəm,
Qəlbimi bir xoş sözün xummar edər.

Eşqdir əzbər, məhəbbət, sevgidir,
Dilbərim, dil üç sözü təkrar edər.

Söyləmiş Mənsur Həllac, Şahina:
"Hansı kafər sevgini inkar edər?" *

*27.11.1995*

***

Aşikar olmur mənə çox sirr, nə üçün, bilmirəm,
Yoxlaşıbdır müşkilə tədbir, nə üçün, bilmirəm.

Fərz edək əla ötübdür hər günü... hər dövrdə
Ahüzar etməkdədir şair nə üçün, bilmirəm.

"Eyləməz şəmşir onu kim, eyləyər tiği-zəban" **,
Gül kimi "xəncər" ki var, "şəmşir" nə üçün, bilmirəm.

Bir tərəfdən qüssə-qəm cummaqda, bir yandan kədər,
Bilmirəm onlar bu cür əlbir nə üçün, bilmirəm.

Hər biri toplanmaq üçün qəlbə növbət gözləyir,
Səbr ilən dolmaqdadır bir-bir, nə üçün, bilmirəm.

Olmuşam bir möhtərəm zahidlə dost, zahidlərin
Yükləyirlər boynuna təqsir, nə üçün, bilmirəm.

"Yar var ki, mən çəkən dərdin bilir dərmanını,
Söylər amma "bilmirəm", bilmir nə üçün, bilmirəm" ***.

Şahina, tarix boyu zəncirlənibdir çox dəli,
Eşqdən divanəyə zəncir nə üçün, bilmirəm.

*17.12.1995*

---

* "Kafəri ku mikonəd enkare-eşq?"

** Misra Əbdülxaliq Cənnətinindir (Baxın: "Deyilən söz yadigardır" kitabı, Bakı, 1981, səh.61)

*** "Yar midanəm ke midanəd dəvaye-dərde-mən,
Leyk miquyəd "nəmidanəm", nəmidanəd çera?"

*Məhəmməd Füzuli*



***

"Bəhari-hüsnünün bil qədrin, ey məh, cavidan sanma,
O gövhər bil ki, hər kanda bulunmaz, raygan sanma" *.

O şagirdəm ki, "Cəbr" elmində min bir cəbr gördüm mən,
Məhəbbət həm çətin bir elmdir, öyrən, asan sanma.

Bu elmin müxtəlif mövzularından imtahan vermək
Mürəkkəb bir müəmmadır, asandır imtahan sanma.

Nişanlar parlayan hər döşdə zənn etmə zəfər parlar,
Nişanlar gəzdirən hər şəxsi, canan, qəhrəman sanma.

Ləyaqət naminə candan keçən kəslər ziyan etməz,
Xeyirdir, mənfəətdir bu, ziyan sanma, ziyan sanma.

Ac ol - yurdunda ol, qürbətdə ömr etmək müsibətdir,
O - izzətdir, o - şövkətdir, o - şöhrətdir, o - şan sanma.

Fikir vermə "cavanəm mən" deyən ağbaş qəzəlxanə,
Gülüm, dünya görən Şahin qocalmışdır, cavan sanma.

*21.12.1995*

***

"Sərməst yıxıldım genə meyxanələr içrə,
Oldum genə rüsva neçə fərzanələr içrə" **.

Sonra gözə meyxanə də biganə göründü,
Bir kimsə məni görmədi biganələr içrə.

Ey gözləri ulduz, üzü gündən də işıqlı,
Yandın yenə gövhər kimi dürdanələr içrə.

Oğrunca, gözaltı neçə cananəyə baxdım,
Yox, sən kimisi olmadı cananələr içrə.

Bir canlı kitabsan ki, veribsən mənə hikmət,
Yox böylə kitab cümlə kitabxanələr içrə.

Pərvanən olub istinə bilməm necə dözdüm -
Sağ qalmadı heç bircəsi pərvanələr içrə.

---

* Beyt Fövzi Əfəndi Ruminindir.

** Beyt Seyid Əbülqasim Nəbatinindir.

Eşq eylədi mərdanə məni, eşq ola eşqə,
Mərdanə göründüm neçə mərdanələr içrə.

Bir vaxt mənim eşqimə əfsanə yazarlar,
Şahin, yaşaram mən dəxi əfsanələr içrə.

*24.12.1995*

***

*"Tökdü bu üzüm suyi üzüm suyini, saqi,*
*Doldur qədəhim, xeyr işə naz ilə qiyam et"*

**Haşım bəy Saqib**

Ey nalə, yetib dilbərə izz ilə salam et,
Bildir ki, "fəraq aşiqi bezdirdi, tamam et".

Ərz et ki, "gərəksizdi ömür yoxsa məhəbbət",
Yansın, gecə-gündüz ərisin, ömrümü şam et.

Göz yaşlarım ilən, gözəlim, badə dolubdur,
Yoxdursa əgər cam, daha ovcunu cam et.

Sənsiz dalaraq qüssəyə nuş eyləyirəm mey,
Tez gəl mənə meynuşini bilmərrə haram et.

Səndən savayı bir kəsə eşqim qona bilməz,
Aşiqliyi öyrətmə yarımçıq mənə, tam et.

Əvvəlki o rəftarını tərk etmə, amandır,
Əvvəl məni qul etmiş idin, indi qulam et.

Söz gülşəni içrə alağın düşməniyəm mən,
Şahin, belə bir yolda səbat ilə davam et.

*27.01.1996*

***

"Nola dil bilməsə rəmzi-rüxi-cananı dürüst,
Kimdir ol kəs ki, bilə məniyi-Quranı dürüst?" *

Sözü düz, kəlməni düz kəs, bilən olmaz billah,
Kəsən olmazsa əgər kəsdiyi qurbanı dürüst.

"Yazdılar cərgeyi-üşşaqdə danəndə məni" **,
Düşmədim mən başa vallah bu qəzəlxanı dürüst.

Hey əlindən, ayağından öpürəm bağbanın,
Varmı kəs mən kimi düşsün başa bağbanı dürüst?

Dərdə üstün gələcəksən, vətənim, əlbəttə,
Yazsalar eşq qələmiylən sənə dərmanı dürüst.

Iki şeytan - biri "zəbt eylə" deyir, başqası "qır",
Düşmüşəm mən başa artıq iki şeytanı dürüst.

Şahinəm, qoy canım olsun elə canana fəda,
Əhdi möhkəm, özü düzgün ola, peymanı dürüst.

*03.02.1996*

***

Məhəlim yoxdu gedəm bircə məhəldən başqa,
Gözəlim yoxdu mənim tək o gözəldən başqa.

Amma, neynim ki, mənim eşqimə qiymət vermir,
Dili çox kəlməni söylər mənə "gəl"dən başqa.

Deyirəm yoxdumu çarə, a ciyarparə, mənə?
Görmürəm çarəmi dünyadə əcəldən başqa.

"Əlimin dəydiyi yer ya ətəyindir, ya başım,
Əlimin başqa işi yox bu əməldən başqa" *.

Əlini kəssə də, kəsməz kişi canan ətəyin!
Xeyli zərbülməsəlim var bu məsəldən başqa.

Allahın olmasa meyli bir əməl baş verməz,
Dağıdan başqasıdır yoxsa düzəldən başqa?

Istərəm çatsa gücüm yer üzünün, ey Şahin,
Uçurum hər yerini, təkcə təməldən başqa.

*14.02.1996*

---

* Beyt Seyid Əzim Şirvaninindir.
** Misra Ələmdar Mahirindir.

* "Ya be damane-to, ya bər sərе-xod xahəm zəd,
Ba sərо kare-degər kar nədarəd dəstəm".
*Məhəmməd Füzuli*

***

*"Nə qəddi-sərvi-çəmən, la ilahə illəllah,*
*Nə zülfi-müşki-xütən, la ilahə illəllah".*
**Ə.Raci**

Söylədim öylə ki mən "La ilahə illəllah",
Sən dedin: "Əşhədu ən la ilahə illəllah".

Mənə bax, bülbülə bax, laləyə bax, nərgizə bax,
Alışıb yandı çəmən, la ilahə illəllah.

Amma çox qönçə yumulmuş, gülə dönmür hələ ki...
Açıl, ey qönçə, bəzən, la ilahə illəllah.

Çox təəssüf ola, Allah, nə qədər laməzhəb
Deməyib indiyəcən la ilahə illəllah.

Xəlq edən, xilqət edən, məxluq edənsən, əhsən!
Hər şeyin xaliqi sən, la ilahə illəllah.

Qəlbdə sən, əldə qılınc, dildə şəhidlik diləyi,
Şəhidə yoxdu kəfən, la ilahə illəllah.

Kərbəla düşdü yada, həm də şəhidlər düşdü,
Qana qərq oldu düzən, la ilahə illəllah.

Xatirə gəldi Hüseynin yara almış bədəni,
Gözə görsəndi Həsən, la ilahə illəllah.

Mehdi qalmış harada, gör neçə ildir yanına
Var gedən, yoxdu gələn, la ilahə illəllah.

Gələcək gün gələcək gündü, gələr bir dəfə,
Olarıq biz dəxi şən, la ilahə illəllah.

Neçə il həsrətə mən tab elədim qürbətdə,
Məni hey çəkdi vətən, la ilahə illəllah.

Söz deyil, cümlə deyildir qocalan, Şahindir,
Söz həmən, cümlə həmən: La ilahə illəllah!

*24.02.1996*



***

*Həsənoğlunun qəzəlindən ilhamlanaraq*

Nə göyçəkdir bu bağ, Allah, gələn dilbər, gedən dilbər,
Zərif güldür yanaq, Allah, nə güldür - yasəmən dilbər.

Mənə bir gülbədən dilbər olub saqi nə müddətdir,
Nə dilbər - gülbədən saqi, nə saqi - gülbədən dilbər.

Qərənfildir, qızılgüldür, sənubərdir, ətirşahdır,
Dodaq - lalə, buxaq - zanbaq, açıbdır nəstərən - dilbər.

Sevir bir öylə istəklə məni, aləm təəccübdə...
Güman ki, görməyibdir yer üzü böylə sevən dilbər.

Nə vaxtdır baxmıram mən qeyri bir dildarə, hərçənd ki,
Bu bağ - dilbər, o dağ - dilbər, düzən - dilbər, çəmən - dilbər.

Fərağında nələr görmüş gözüm, çəkdim vətən dərdi,
Vətən həm dilbər olmuşdur, mənə göyçək vətən - dilbər.

Yoxumdur başqa bir həmdəm, yoxumdur başqa bir guşə,
Həmən guşə, həmən busə, həmən Şahin, həmən dilbər.

*9.03.1996*

***

*"Mübtəlayi-dərdi-eşqəm, əl götür məndən, təbib,*
*Eylə bir tədbir kim, bu dərdə dərman olmasın".*
**M.Ə.Sabir**

Varmı bir aldəm ki, sevdadə ciyərqan olmasın,
Mənbilən, vardırsa da var şübhə insan olmasın.

Yarə heyran olmayan aşiq məgər aşiqmidir?
Yoxdur aşiq dilbəri gördükdə heyran olmasın.

Gəldi qurban bayramı, aşiq deyildir öylə kəs
Qoç kimi, yoxdursa qurban, yarə qurban olmasın.

Dərdsizlikdən böyük bir dərdi yoxdur aqilin,
Dərd qoy olsun, dərd budur ki, dərdə dərman olmasın.

Qorxmuram mən cismimin var-yoxluğundan, sevgilim,
Qorxum ondandır fəqət olsun cism, can olmasın.

Şeyx edir cənnətdə qılman arizusin, mən isə
- Huri olsun, - söylərəm, - olmazsa qılman olmasın.

Gəldi hicran vəsli qovdu, ya ilahi, hicri qov,
Qoy vüsal olsun dəmadəm, amma hicran olmasın.

Şahina, qorxum qocalmaqdan deyildir, qorxuram
Yar olsun, sevməyə ol yarı imkan olmasın.

*23.03.1996*

***

*"Aqil olmaq istəyənlər bir-birindən küsməsin,*
*Əhli-haldan dəm vuran kəs əhli-hal olsun gərək".*

**Səməd Vurğun**

Eşqimiz can içrə, ey dilbər, zülal olsun gərək,
Eşqsiz bir qəlbdə hər dəm məlal olsun gərək.

Cəncala imkan olarsa ruzi görsənməz gözə,
Eşq mülkündə dəmadəm cah-cəlal olsun gərək.

Gülməsə güllər-çiçəklər bağbanı dindirməyin,
Qönçələr güllənməsə bülbül də lal olsun gərək.

Qoç kimi mən kəllələşmək istərəm hicran ilə,
Bitməsə hicrin cəfası qiylü qal olsun gərək.

Qanə dönmüş qəlbimə sən qarə xal saldın, gülüm,
Rəsmdir, al lalə içrə qarə xal olsun gərək.

Ayrılıq bir halə salmışdır məni, zarəm bu gün,
Ayrılıqdan sonra, əlbət, xoş vüsal olsun gərək.

Ehtimalım var gələr bir gün zamanın sahibi,
Böylə göyçək müjdə üçün ehtimal olsun gərək.

Şahinəm, cananıma canım əgər qurban isə,
Azəribaycanıma qanım halal olsun gərək!

*28.03.1996*



***

*"Baxıram, keçdiyimiz yollara bir-bir baxıram,*
*O keçənlər hələ sövq etmədə röyayə məni".*

**Səməd Vurğun**

Ürəyim bənd eləyibdir elə Leylayə məni,
Qova bilməz yeni Məcnun kimi səhrayə məni.

Ərəbistan məni, yağmır deyə qar, cəzb eylər,
Canı dondurdu bu şaxta, aparın yayə məni.

Ərəbistan nə, ərəb nə, nə Misir? Yurdum xoş!
Qorxuram tuş edələr orda Züleyxayə məni.

Üz tutub gözlərimin qəm yaşı dərya tərəfə,
Çəkəcək gözlərimin yaşları dəryayə məni.

Oluban hicrə əsir mən neçə qovğa gördüm,
Mübtəla eyləmə, yarəb, daha qovğayə məni.

Birgəyik şamü səhər, hər gecə-gündüz birgə,
Sən özün saldın, əzizim, bu təmənnayə məni.

Yaradan bir-birimizçin eləyib xəlq bizi,
Sövq edibdir səni xülyalərə, sevdayə məni.

O şəkər busələrindən elə artıb şəkərim
Ki, nənəm cəlb edə bilmir daha həlvayə məni.

Tutilik eyləyirəm mən daha şahinlik yox,
Öyrədibsən, gözəlim, şəkkərə, xurmayə məni.

*29.03.1996*

***

"Sən cilvələnirsən, gözəlim, rahət içində,
Mən qovruluram dərdü bəla, möhnət içində" *.

Adəm görürəm eşqü məhəbbət nədi bilmir,
Yarım, baxıram öyləsinə heyrət içində.

Aşiqlər üçün mən oxuyub məruzə hərdən
Çox rəmzi bəyan eyləyirəm söhbət içində.

* Beyt Ənvər Nəzərlinindir.

Məcnun ilə, Fərhad ilə, Sənan ilə tayəm,
Şəxsiyyətə döndüm neçə şəxsiyyət içində.

Hər dəm bu qəzəl sahibi şer əhlini görcək
Dil saflığı axtarmada şeriyyət içində.

Eykaş, qəzəlxanlarımız sadə yazaydı!..
Qovrulmada qəlbim belə bir niyyət içində.

Yazdımsa da hər şerimi can yanğısı ilə
Layiqli yerim olmadı cəmiyyət içində.

Dünya mənə, heyfa, hələ qiymət verə bilmir,
Yoxdur hələ düz qiymətimiz qiymət içində.

Oldumsa da şahin uçuşum olmadı, lakin
Ruhim uçacaqdır, bilirəm, cənnət içində.

*13.04.1996*

***

Qəlbimi dildarə açdım amma razı qalmadı,
Öylə israr eylədim ki, etirazı qalmadı.

Söyləyiblər aqil insanlar ki "israf etməyin",
Öylə çox naz eylədi bir zərrə nazı qalmadı.

"Səcdədir hər gün işi məşuqinə hər aşiqin,
Mən bilən, aşiqlərin bir gün namazı qalmadı" *.

Göz yaşımla dəstəmaz aldım düşüb hicranə mən,
Mömünün, şahiddi aləm, dəstəmazı qalmadı.

Var imiş bir sazçalan aşiq, çalırmış qəlb həm,
Eh, Qərib tək aşiqin, heyfa ki, sazı qalmadı.

Çox yaxınmış yaz ilən qış fəsli ömrün, ey könül,
Ömrümün qış fəsli yetdi, getdi yazı, qalmadı.

Şahina, yad eylədim röyadə Azərbaycanı,
Təşnə bir div timsalı içdim Arazı, qalmadı.

*22.04.1996*

* Beyt Hacı Mailindir.



***

Sərf eləyib, ey pəri, imkanımı
Tazə bitirdim təzə "Divan"ımı.

Əssə də yel, qopsa da tufan, məgər
Soldura bilmişmi gülüstanımı?

"Yoxdu xəzinəm sənə bəxş eyləyim" *,
Gəl sənə qurban eləyim canımı.

Ünvanı hərçənd unutmursa da,
Qoyma, Ilahi, gələ hicranımı.

Mən ki həmişə onu şən görmüşəm,
Qoyma pərişan ola cananımı.

Şahinə can bəxş eləsin eşq ilə,
Tanrı, xəcil eyləmə loğmanımı.

*4.05.1996*

***

Çox kəs görürəm, ey Yaradan, bir kəsi yoxdur,
Rəhm eylə ki, çox kimsəsizin kimsəsi yoxdur.

Çoxdandı mənim Babəkimin zərbi görünmür,
Çoxdandı Koroğlu babamın nərəsi yoxdur.

Çox şəm yanır lütfün ilə indi də, amma
Pərvanələri cəm eləyən şöləsi yoxdur.

Sərkərdəsi sərkərdələrin Məcnun olubdur,
Məcnunlərin bəs niyə sərkərdəsi yoxdur?

Allah, sevincdən ölərəm söyləyən olsa
"Məhbuslərin yoxluğu var, məhbəsi yoxdur".

Aludə olubdur qəzələ xeyli qəzəlxan,
Neyçün neçə vaxtdır tüyuğu, növhəsi yoxdur?

* "Gənc nədarəm ke, nesarət konəm"
*Nizami Gəncəvi*

Yüksəldi Süleyman səsi, Rüstəm səsi, Şahin:
"Bədbəxtdir o şair ki onun öz səsi yoxdur" *.

*19.05.1996*

***

Sevən qəlbin sevincin qoy mənim tək hər sevən bilsin,
Dəyişmişdir dövr, Leyla gərəkdir Qeysi şən bilsin.

Xəbərdən hali olsunlar: yeni Fərhadü Məcnun var,
O dağ bilsin, bu bağ bilsin, düzən bilsin, çəmən bilsin.

Gərəkdir ki, yetişməkçin şirin bir vəslə, ey Fərhad,
Sütunsuz bir dağın cövrün sənin tək Kuhkən bilsin.

Sarılmış sarmaşıqlar bülbülə, bülbül məhəl qoymur,
Gərəkdir bülbülün meylin qızılgül, yasəmən bilsin.

Müsibətdən sevinməz hər yetən, zülmü gərəkdir ki,
Əli oğlu Hüseyn çəksin, Əli oğlu Həsən bilsin.

Ölümdən qorxdu namərdlər, libaslar olmadı rəngin,
Ölümdən qorxmasın mərdlər, libası qoy kəfən bilsin.

A Şahin, gör nə qayğıyla demiş Ənvər bu misranı:
"Vətən qədrin oğul bilsin, oğul qədrin vətən bilsin" **.

***

Aqilin əql ilə sevdasını məndən soruşun,
Cahilin cəhl ilə xülyasını məndən soruşun.

Xoş vüsal, xoşdu ki, hicran ilə qovğa eləyir,
Vəslin hicran ilə qovğasını məndən soruşun.

Ağuşində nə qədər sirri yatır... Dünyanın
Neçə əsrarlı dünyasını məndən soruşun.

O Füzuli babamın vahid olan Allah tək
Möhtərəm, sevgili Leylasını məndən soruşun.

---

* Misra Süleyman Rüstəmindir.
** Misra Ənvər Nəzərlinindir.



Mən də imza atıram Şahdağa şirin-şirin,
Fərhadın dağdakı imzasını məndən soruşun.

Yatanın gördüyü röyasını qoy yozsunlar,
Oyağın gördüyü röyasını məndən soruşun.

"Məncə, dünyayə uyanlar ola bilməz aşiq" *,
Mailin çox belə misrasını məndən soruşun.

Şerimin siqləti surətdə deyildir, Şahin,
Surətin örtülü mənasını məndən soruşun.

*28.05.1996*

***

"Ey dost, şəkər yaxşı, yoxsa şəkər ustadı?
Ya, söylə, qəmər yaxşı, yoxsa qəmər ustadı?" **

Dildarə kəmər verdim göyqurşağı rəngində,
Göyqurşağını gördüm oldum kəmər ustadı.

Bir molla və bir dərviş qürbətdə rəfiqimdi,
Molla kədər ustadı, dərviş səfər ustadı.

Dost baxdı - baxış gördüm, yad baxdı - nəzər dəydi,
Kəs var baxış ustadı, kəs var nəzər ustadı.

Olmazsa əgər oğru bağban çəpəri neynir?
Bir gör ki, bağ ustadı olmuş çəpər ustadı.

Yar olsa mənə cəh-cəh vuraram mən də,
Yar olsam ilan ilə, ollam zəhər ustadı.

Canan dedi: - Ey Şahin, tər-tazə qəzəldir bu,
Vardırmı təmiz şerin səndən betər ustadı?

*2.06.1996*

***

Parlaq olmuşdur gecəm hər gün, yanır par-par göz,
Zülməti etməkdədir gündən-günə inkar göz.

---

* Misra Hacı Mailindir.
** Beyt Şəms Təbrizinindir (orijinaldan tərcümə)

Doğru ərz etmişlər ariflər bizə: Göz - güzgüdür,
Dərdini dərd əhlinin etməkdədir izhar göz.

Qədri vardır hər bir üzvün, amma ki, göz başqadır,
Göz yetir hər dəm mənə, qoy göz görüm, ey yar, göz.

"Eylə ki, mən bir zaman səndən götürməm könlümü,
Lütf qıl məndən götürmə sən dəxi zinhar göz" *.

Yaxşı gözdən dinc olur canım, yamandan əlhəzər,
Verməरəm yol mən ağartsın üstümə əğyar göz.

Ey deyən "xummar olubdur gözlərin", əlbəttə ki,
Yarə baxcaq mümkün işmi olmasın xummar göz?

Şahina, dilbər dedi "sevdamıza göz dəyməsin,
Gəl üzərrik yandıraq bədxah gəlcək, var göz".

*18.06.1996*

***

*"Gül ərusin sübhdən bülbül nikah etmiş məgər
Kim özün yaşıl duvağ altında pünhan eyləmiş?"*

**Şahi (XVI əsr)**

Hansı dərmandır ki, candan hər qəmi yan eyləmiş?
Hansı loğmandır ki, hər bir dərdə dərman eyləmiş?

Ey qəzəlxan, ar elə, əğyarə yar olmaq nədir**?
Asi könlüm hər zaman əğyarə üsyan eyləmiş.

Gər müqəddəs sevgidən dönsəm yox olsun varlığım,
Çünki Məcnunlar buna hər ləhzə fərman eyləmiş.

Gendən hətta seyr edərkən naxələf şeytanları
Nifrətim gündən-günə şiddətlə tüğyan eyləmiş.

* Beyt Əlican Qövsi Təbrizinindir.

** "Əğyarə bica könlünü vermişsə də ol yar,
Əla olar ondan geriyə birtəhər alsa.
*Ələkbər Şahid*



Naxələf qonşum mənim şeytan deyildir bəs nədir?
Baş verən hər pisliyi hər yanda şeytan eyləmiş.

Xan Şuşam getmişdir əldən, getdim əldən mən dəxi,
Şahina, düşmən məni al qanə qəltan eyləmiş.

*2.07.1996*

***

"Könlüm yenə min şövq ilə, canan, səni istər,
And olsun əziz canına ki, can səni istər"*.

Loğman da mənim dərdimə imkan edə bilmir,
İmkan elə imkansıza, imkan səni istər.

Üz ki, suyu şordur Xəzərin, sənsə şirinsən,
Şor su şirin olsun deyə ümman səni istər.

Bayramda demişdim olaram qurbanın, ey yar,
Çək xirtdəyimə xəncəri, qurban səni istər.

Ey qeybə çıxan zat, haçan görsənəcəksən?
Vardırsa da çox kəs bu qəzəlxan səni istər.

Dən tək dəni insan üyütmək - diləyimdir,
Gəl, gəl, a dəyirmançı, dəyirman səni istər.

Var inci kimi çox sözüm, amma kimə lazım?
Yaqut səni, almas səni, mərcan səni istər.

Gündən-günə aləmdə rəzalət niyə artır?
Üsyan eləyək aləmə, üsyan səni istər.

Hərçənd irəli getməyə adət eləyibsən,
Şahin, sayıq ol, dön geri, hicran səni istər.

*7.07.1996*

***

Ey sevgili dildar, bu viranədə sən - yox,
Ey Leyli, yetiş dadə ki, mən Qeysi sevən yox.

* Beyt Süleyman Rüstəmindir

"Hər rəhgüzəri-ömrdə min xövfü xətər var,
Sərmənzili-məqsudinə azadə yetən yox"*.

Qudyal çayının zümzüməsindən uzaq oldum,
Şahdağ, babadağ gendə qalıbdır, Göyəzən yox.

Fikrimdə, düşüncəmdə biyabandı çəmənlik,
Qürbətdə qalan şairə, əlbəttə, çəmən yox.

Mən görməyirəm bağdakı tər gülləri əsla,
Vardısa da yoxdur sanıram, burda süsən yox.

Vallah, bu dağlardakı çən başqa təhərdir,
Qafqaz dağı üstündəki örpək təki çən yox.

"Xoş keçsə günün harda - vətən orda" deyən var,
Şahin, sənə qürbətdə vətən yoxdu, vətən yox!

***

Nədir bilməm günahım kim, mənə Allah qəm yazmış,
Kimə hər nə yazıbdırsa, mənə dərdü ələm yazmış.

Gedər qüssə, gələr nəşə... Mənim qüssəm neçin getməz?
Neçin bilməm mənimçin qüssəni həqq dəmbədəm yazmış.

"Nə qəm gər iftixar ilə bəni zikr eyləsə zahid
Ki, arif dəftəri-üşşaqə namim möhtərəm yazmış" **.

Ilahi mərhəmət qılmaqla xəlq olmuşdur əcdadım,
Mənim iqbalımı Həvva nənəm, Adəm dədəm yazmış.

"Sənin şerində gerçəklik, sənin elmində hikmət var",
Bu misranı məhəbbətlə mənimçin bir sənəm yazmış.

* Beyt Süleyman Rüstəmindir.
** Beyt Molla Abbas Cavanşirindir.



Nə xoşbəxtəm mənim vardır əlimdə Eşq fərmanı,
Həmən fərmanə qol qoymuş cünun *, amma Kərəm yazmış.

Nədir şairliyin sirri, a Şahin, sirri aç söylə:
Xəyal uçmuş məhəbbətlə, könül duymuş, qələm yazmış.

*16.07.1996*

***

Yalvarmadayam bağibana nanədən ötrü,
Çünki dərirəm nanəni cananədən ötrü.

Dürdanədi yarım deyə dürdanə təbim var,
Dürdanə gərəkmiş mənə dürdanədən ötrü.

Şerin sayı artır ona artdıqca məhəbbət,
Mövzu gəzirəm hey təzə əfsanədən ötrü.

Insafsızam, badəni oymaq ilə içdim,
Sərf eyləmədim ömrümü meyxanədən ötrü.

Kövrəltdi mənim qəlbimi mərdanə şəhidlər,
Göz yaşı axıtdım neçə mərdanədən ötrü.

"Gizlətmə qara xalı, - dedim, - ağ yanağında,
Tökdü üzünə zülfü o, bir danədən ötrü" **.

"Məcnun" deyib çölləri gəzdim, dedilər ki,
"Şahindi, gəzir boş yerə divanədən ötrü".

*20.07.1996*

***

"Dil düşüb zülfi-pərişanə giriftar olmuş,
Yetişib mətləbə könlüm mənə əğyar olmuş" ***.

Bir kiçik guşə tapa bilməyirəm mən özümə,
Bu gen aləm başıma gör nə sayaq dar olmuş.

Qarabağ davası, abxaz, Çeçenistan cəngi...
Yerdə yoxluq yaradanlar nə təhər var olmuş?

* Məcnun
** Beyt Məhəmmədəli Şəfainindir.
*** Beyt Molla Zeynalabdin Sağərinindir.

Saçımın rəngi unun rənginə dönmüş qəmdən,
Rəngi saqqalımın isə ağarıb qar olmuş.

Hər kimə etdisə ümmid ürəyim döndü qana,
Indisə Tanrıya sidq ilə ümidvar olmuş.

Halımı bir neçə bədxah görüb şadlanmış,
Neçə şad aşiq isə dərdə düşüb zar olmuş.

Istəsəm gər gətirən var mənə lap quş südü də,
Ürəyim heç nəyə yox, yarə tələbkar olmuş.

Rəhmət olsun o böyük Vahidə, ondan sonra
Qəzəlin mülkünə Şahin yeni memar olmuş.

*21.07.1996*

***

"Dərdimiz dildarə söylənmiş, dəva söylənməmiş,
Macəra söylənmiş, amma müddəa söylənməmiş" *.

Nəydi Qeysin təqsiri, ardınca, təxmin eylərəm
Bollu qarğış söylənilmişdir, dua söylənməmiş.

Eşqdən gəlməzsə çarə, çarə olmaz çarədən,
Aşiqə eşqindən özgə bir şəfa söylənməmiş.

Bihəyalıq eylədin sən ömr-billah, el bilir,
Yoxsa ki, əğyarə, ey əğyar, həya söylənməmiş?

Hər cinayət bir cəza eylər tələb, çox yerdəsə
Çox cinayətlər cəzasızdır, cəza söylənməmiş.

Gərçi sinnim əlli yox, birdən dönüb yüz olsa da,
Mən təkin aşiqlərə əsla qoca söylənməmiş.

Eşqə afət söyləmişlər, sevgi guya bir bəla,
Sevgiyə Şahin dilindənsə bəla söylənməmiş.

*22.07.1996*

* Beyt Osman Şəmsindir.



***

Mənə zülm eyləmədə gör necə hicran sənsiz,
Gözlərimdən süzülür yaş yerinə qan sənsiz.

Çox gözəl var, ürəyin yoxdu deyə aramı
Olmuram bircə dilaramə də heyran sənsiz.

"Oldu divanə könül sərv qədindən ayrı,
Tutmuşam Qeys sifət rahi-biyaban sənsiz" *.

Bağibanlıq mən edərdim həvəsindən, ey gül,
Dönəcək indi biyabanə gülüstan sənsiz.

Bisütun yarmağı şad eyləmədi Fərhadı,
Dağ ilən əlləşirəm mən də pərişan sənsiz.

Qovladım bir neçə tibb işçisini, indi mənə
Çarə etməz dirilib gəlsə də loğman sənsiz.

Ya Imam Mehdi, qayıt gəl, ürəyim batdı qəmə,
Qıracaq bir-birini yoxsa müsəlman sənsiz.

Ayırıblar ulu bir ölkəni cəbr ilə, qayıt,
Birləşə bilməyəcək Azəribaycan sənsiz.

Ya imam, Şahini qatilliyə məcbur eləmə,
Təbini öldürəcəkdir bu qəzəlxan sənsiz.

*23.07.1996*

***

*"Baxıram zülfi-çəlipasına tərsabecənin,*
*Erməni sanki baxır şövq ilə zünnarə tərəf".*

**Seyid Əzim Şirvani**

Çıxmışam mən yola artıq, gedirəm yarə tərəf,
Gedirəm hicri kənar eyləyib ilqarə tərəf.

O səbəbdən ki, yarımdır səbəbi dönməyimin
Tutmuşam səmtimi, əlbəttə, səbəbkarə tərəf.

Gülü çox sevməyi məlumdu, bu aşiq yetərək
Təzədən yağdıracaqdır gülü dildarə tərəf.

* Beyt Şəmsinindir.

Deyəsən gözlərimin nuri çoxalmış kimidir,
Baxacaqdır təzədən Şahdağa, Qoşqarə tərəf.

İki Səttar - biri xandı, biri Bəhlulzadə,
Baxıram əksi qalan hey iki Səttarə tərəf.

Çıxmayıbdır neçə gündür ki, tarım köynəkdən,
Gözüm həsrətlə baxıb bir neçə gün tarə tərəf.

Mən çəmənzarə nigarımla çıxardım hər gün,
Uçuram mən yenə, Şahin, o çəmənzarə tərəf.

*28.07.1996*

***

*"Gül üzlü yarımı xatırlaram gülzarı gördükdə,*
*Bütün güllər düşər gözdən gül üzlü yarı gördükdə".*

**Ələmdar Mahir**

O gözdən başqa göz görməz bu gözlər yarı gördükdə,
A zərgər, gözlərin par-par yanar mirvari gördükdə.

Bilirsən zəhmətindən razıyam dünya qədər, bağban,
Qəzəllər xəlq olur daim gözüm gülzarı gördükdə.

O dildar olmayan yerdə mənəm dilsiz, mənəm dinməz,
Dilim cəh-cəh vurar bülbül təkin dildarı gördükdə.

Nə sərvət var, nə var vardır, müdam eşq oldu meyarım,
Bu şair saf olur dərhal o saf meyarı gördükdə.

Görüb inkarı yardan ölməyir əğyar arından,
Mən ölləm mütləqa billah əgər inkarı gördükdə.

Nə xoşrəftar yarın var, cod idi rəftarın, Şahin,
Xoş oldun sən də, əlbəttə, o xoşrəftarı gördükdə.

*2.08.1996*

***

"Müjə çeşmimdə guya atəşin mismardır sənsiz,
Rəhi-nəzzarəyə mövci-nigahim xardır sənsiz" *.

Elə zənn eyləyən var ki, səni küsdürmüşəm bəlkə,
Həmişə yar olan kəslər mənə əğyardır sənsiz.

* Beyt Məhəmməd Bəliğindir.



Həyatın eyşü zarından xəbərsizdir xəbərsizlər,
Həyatım eyş idi sənlə, həyatım zardır sənsiz.

Qəfildən kim qulaq assa məni tuti güman eylər,
Dilimdə qeyri söz yoxdur, adın təkrardır sənsiz.

Heç olmazsa, a dildarım, dua eylə tapım səhhət,
Duanə ehtiyacım var, canım bimardır sənsiz.

Əgərçi tərk edibsən sən məni, meyar isə qalmış,
Sənin sevgin, sənin eşqin mənə meyardır sənsiz.

Həqiqətdən uzaq sanma qətiyyən Şahinin vəslin,
Xəyalınla qucaqlaşdım, vüsalım vardır sənsiz.

*4.08.1996*

***

"Səslərəm mehrini sinəmdə ki, canım kimidir,
Kimsəyə faş edəməm, razi-nihanım kimidir" *.

Dərvişin naləsi fəryadıma oxşar, ey yar,
Qəribin çəkdiyi ah ahü fəğanım kimidir.

Gər desəm mən kimi aşiq deyəsən görsənmir,
Bunu ehkaın güman etmə, gümanım kimidir.

Mən cavanlıqda xeyirlə şərə fərq qoymazdım,
Faidəm, zənn eləyirdim ki, ziyanım kimidir.

Düşünürdüm mənə meyxanəçi - baş molla kimi,
Saqinin söylədiyi şərqi - əzanım kimidir.

Neçə adəm nə qədər fikrini məndən götürüb,
Heç bəyan etməmişəm fikri bəyanım kimidir.

Şahinəm, cəhd edirəm eldə nişanəm qalsın,
Bu qəzəllər ki qalır eldə nişanım kimidir.

*5.08.1996*

* Beyt Növrəs Osmanınındır.

***

"Gəlsə gər naz ilə ol sərvi-rəvan ortayə,
Çəkər üşşaq nisar etməyə can ortayə" *.

Aldığım busəni vermək dilədim rədd elədin,
Faidə istər ikən çıxdı ziyan ortayə.

Mən dedim, sən də dedin, güllələbaran başlandı,
Düşməsin bir də, gülüm, güllələbaran ortayə.

Tuşlayıbsan oxunu kipriyinin üstümə düz,
Oxunu at qırağa, salma fəğan ortayə.

"Çox güman" söyləmə, "hökmən!" de mənə, ey dilbər,
Gələcək can boğaza gəlsə güman ortayə.

Acı söz mərəkə icad eləyir, qan tökülür,
Düşməsin qoy araya - mərəkə, qan - ortayə.

Sən yamacda, mən isə zirvədəyəm, ey əğyar,
Görmərəm bir də səni, düşdü duman ortayə.

Tövbə etdim demə, and içmə, aman olmayacaq,
Daha salma bu qədər andü aman ortayə.

Nə şirinsən, gözəlim, gəl bu şirin şeri oxu,
Acı tərk etdi dili, gəldi bəyan ortayə.

Əruz ahəngi yəqin Şahini rəqqas edəcək,
Bu vəzn rəqsi məni çəkdi yaman ortayə.

*8.08.1996*

***

Istədim əldə yenə cam tutum,
Kədərim qoymadı aram tutum.

"Məndən ahu kimi hürkər, bilməm,
Mən bu ahuni necə ram tutum?" **

* Beyt Məhəmməd Əli bəy Məxfinindir.
** Beyt Fədəvinindir.



Ayrılıqdan əridim şam kimi,
Yenə gəl çıx, yoluna şam tutum.

Çox sərəncamımı saldın ayağa,
Əldə bəs hansı sərəncam tutum?

Ildə vardır cəmi üç-dörd bayram,
Gündə gəl gündə də bayram tutum.

Yenə, ey möhtərəm, hörmətlə danış,
Niyə rişxəndinə eyham tutum?

"Vəssalam" söyləməsən Şahinə sən,
Mən gərək "şüdtamam"ı tam tutum.

*11.08.1996*

***

"Hücumi-əşk edər hər dəm ciyərdən yarələr peyda
Ki, gül tarac olsa cuybar eylər əsər peyda"*.

Çaşıb qaldım, gözüm gəh yerdədir, gəh mavi göylərdə,
Əzizim, yerdə sən peyda və göylərdə qəmər peyda.

Yarı görsəm də, görməzsəm də dildə "yar, yar, yar" var,
Susar tuti, olar dinməz gər olmazsa şəkər peyda.

Bağ aldım tez çəpər çəkdim, çəpərsiz bağ bağ olmaz,
Aramda amma yarımla heç olmuşmu çəpər peyda?

Əgər şad eyləsən əhvalımı şadlıq qədərsizdir,
Əgər olmazsan hali dərdlərimdən, dərdisər peyda.

Ilahi, et nəzər gəlsin nəzər daim mənə, yarı
Nə cür peyda edər gözlər gər olmazsa nəzər peyda.

Qəzəlxanlar olub peyda ki, üç-dörd şerə qanedir,
Tən olmaz Şahinə hər gün şer yazmaqda hər peyda.

*12.08.1996*

* Beyt Mirzə Əbülhəsən Şəhidindir.

***

"Etmədi getdi əsər naleyi-cangah sənə,
Mərhəmət vermədimi həzrəti-Allah sənə?"*

Küsmüsən sən yenə məndən deyə ilham küsüb,
Baxıram gəh qələmə, gəh vərəqə, gah sənə.

Səndə, hərdənbir, əzizim, bu nə xislətdi belə?
Bərəkallah, desəm mən "bərəkallah" sənə.

Çəkirəm ah, edir əksi-səda dağ ahımı,
Əsər etmir nə üçün çəkdiyimiz ah sənə?

Demişəm aç qulağın, asma qulaq bədxahə,
Axı təlqin edəcək bədliyi bədxah sənə.

Səndə gül sevgisi, el sevgisi, yar sevgisi var,
Qələt olmaz desə dil sevgili hərgah sənə.

Razıyam qatili olsan sən əgər hicranın,
Şahinəm, fərz elə hökm etmədədir şah sənə.

*13.08.1996*

***

"Pərişan qarə zülfün tək pərişan olmayım neynim,
Qapında, padişahım, söylə, dərban olmayım neynim?" **

Canımda bir bütövlük var yanımda yarım olduqda,
Nə müddətdir gedib yarım, yarımcan olmayım neynim?

Nə cür tab eyləyirsən hicrə sən, vallah çaşıb qaldım,
Təəccüblü çox işlər var ki, heyran olmayım neynim?

Səni incitmişəm bir dəfə, yüz bir dəfə üzrüm var,
Qüsur etmiş sevənlər tək peşiman olmayım neynim?

Müsəlmanlar müsəlmanlarla tez-tez cəng edir bica,
Müsəlmanlar, müsəlmanəm, müsəlman olmayım neynim?

* Beyt Xızır Ağazadə Səidindir.
** Beyt Mir Əbdülvahab Seyid Zərgərindir.



Mənimlə aşina olmuşdu yad kəslər ki, yad etməm,
Deyin, yad aşinalardən bu gün yan olmayım neynim?

Səni tənqid edənlər var qəzəl yazmaqda, ey Şahin,
Qəzəl gülzarı solmaqda, qəzəlxan olmayım neynim?

*15.08.1996*

***

Xitab eylə, a dildarım, könül səndən xitab istər,
Cavabım var sualsızdır, sualım var cavab istər.

Nə olmuşdur, neçin görsənməyirsən, ey güləndamım,
Mənim əhvalımı yoxsa güləndamım xərab istər?

Günəhdir eşqsizlik, sən yox idin, eşq həm yoxdu,
Günahə batmışam sənsiz, günəhkarın savab istər.

Deyil sakit, deyil sabit, dəyişkəndir mənim könlüm,
Sevinc istər əgər varsansa, yoxsansa əzab istər.

Şər atmışdır mənə saqi - şərabə mailəm guya,
Yarım, yarın haçandır ki, dodağından gülab istər.

Əlində badə gördüm, yar məni, yarım, ciyər - məndə,
"Bəli, mey nuş edən kəslər bu adətdir kəbab istər" *.

Şərabı ləğv edərdim ölkədə imkanım olsaydı,
Şüarım - inqilab etmək, məramım - inqilab istər.

Yönəlmişdir bütün aşiqlərin meyli fərəh səmtə,
Məgər vardırmı aşiq ki, mənim tək iztirab istər?

Hələm, Şahin, mənim çap olmayan minlərlə şerim var,
Çıxıbdır on kitabım, azdı bu, könlüm kitab istər.

*19.08.1996*

* Misra Hüseynindir (XIX əsrin sonu - XX əsrin əvvəli)

***

"Vəslinə can istər ol huri-mələksima əvəz,
Bunca bilməz kim, iməs yüz can ola əsla əvəz" *

Mən səni dünyadən üstün yazmışam, dünya küsüb,
Çıxmaq istər sevgilindən, sevgilim, dünya əvəz.

Etirazın olmasın heç "getmə" söylərsəm sənə,
Istəməzdim eyləsin, yarını, səni xülya əvəz.

Halva çaldın söylədim lazım deyil həlva mənə,
Bal dodağə mümkün işdirmi ola həlva əvəz?

Ah çəksən, çəkdiyin ah ildırımdan güclüdür,
Göz yaşın bir qətrə həm düşsə, deyil dərya əvəz.

Gəl qulağə qulluq eylə, neyləyirsən sırğanı,
Eyləməz əsla qulağı, sevgilim, sırğa əvəz.

Surətü mənə dəmadəm məşğul eylər fikrimi,
Etməsin mənanı surət, surəti mənə əvəz.

Qoy ki sülh olsun yekuni cürbəcür qovğələrin,
Ya Ilahi, kaş sülhü etməsin qovğa əvəz.

Şahinəm, etdim əvəz, məlumdu ki, Məcnuni mən,
Eyləməz bir yarımı min bir ola Leyla əvəz.

*21.08.1996*

***

Niyə gəldim həyata, bilməyirəm,
Çöpə də ömrü sata bilməyirəm.

Nazəninlər hey atır qəmzə oxu,
Mənə kim qəmzə ata, bilməyirəm.

Batırıbdır məni qəm dəryası,
Fərəhə, eyşə bata bilməyirəm.

* Beyt Əlişir Nəvainindir.



Taqətim uçdu canımdan quş tək,
Nə olubdur səbata, bilməyirəm.

Düşmənim var Qarabağ mülkündə,
Mən o bədzatə bata bilməyirəm.

Nə bəladır bu ki, üz verdi bizə,
Nədən oldu bu xəta, bilməyirəm.

"Gecəmiz sülh olacaq, ya hələ var?
Baxıram hey saata, bilməyirəm" *.

Minərikmi görəsən biz bir də
Dürata, ya Qırata, bilməyirəm.

Xatirəm, Şahin, öləndən sonra
Dönəcək ixtilata? Bilməyirəm.

*27.08.1996*

***

"Aşiq gözüdür, çeşməyi-Zəmzəm də deyirlər,
Hicran odudur, nari-cəhənnəm də deyirlər" **.

Eşq öylə şəfadır ki, dəva eşqə deyilmiş,
Dərman da deyən var ona, məlhəm də deyirlər.

Aşiq kəsə aqil deyilir - eşqi əsilsə!
Əğyar olana, bəlli ki, sərsəm də deyirlər.

Mübhəm deyirəm aşikar olsun sözüm, ey yar,
Bəzən sözü cananəyə mübhəm də deyirlər.

Verməklə qəmin eyləmisən sən məni xürrəm,
Qəmgin də deyirlər mənə, xürrəm də deyirlər.

Beynimdə təzadım elə boi ki, mənə indi
Biganə deyən var isə məhrəm də deyirlər.

* Beyt M.Şəhriyarındır.
** Beyt M.Şəhriyarındır.

Aləm qəmini çəkməyi öyrənməli yaxşı,
Ariflərə şənlik gətirir qəm də deyirlər.

Hicranı görüb sən yenə göz yaşını tökmə,
Şahin, zəif olma, sənə möhkəm də deyirlər.

*28.08.1996*

### III

Özünü sən yenə məndən ki uzaq eyləmisən,
Elə sandın ki, günüm qarədi, ağ eyləmisən.

Bəli, gün qarədi, amma ki, fərağınla sənin!
Nə üçün vəslimi, ey yar, fəraq eyləmisən?

"Qeyrətin dağ kimidi, dağ dağa əlbət dayanar,
Sən də dağlar kimi dağları dayaq eyləmisən" *.

Sən ki, mənsiz ötüşən günləri lənətlər idin,
Orda mənsiz güzəran bəs nə sayaq eyləmisən?

Səni mehdən xəbər aldım ki, gəlib yetdi mənə,
Məni sən heç görəsən orda soraq eyləmisən?

Yolumu azmadım heç vədə həyatda, çünki
Eşqini sən yolum üstündə çıraq eyləmisən.

Geriyə dönmək üçün xeyli yaxın yollar var,
Yolunu sən yanıma gör nə iraq eyləmisən.

Şahin ilham pərisindən alır ilham sənsiz,
Deyəcəksən bu nə canan ki, qonaq eyləmisən?

*29.08.1996*

***

"Əla, ey şuxi-şirinkari-bihəmta, xudahafiz,
Qəmi-eşqində bəsdir olduğum rüsva, xudahafiz" **.

Şirin xülya edərdim mən xəyalən sənsiz, ey dilbər,
Təsəvvürdə daha canlanmayır xülya, xudahafiz.

* Beyt M.Şəhriyarındır.
** Beyt Abdulla bəy Asinindir.



Deyirdim dərdimi tərk eylərəm səhradə, aldandım,
Sən ey Məcnun, xudahafiz, sən ey səhra, xudahafiz.

Sən ey sevda ki, qəlbimdə yerin var idi, yoxlaşdı,
Səni sevdim, məni sən sevmədin, sevda, xudahafiz.

Təlatümlər ki var idi canımda səndə qaynardı,
Gözüm yaşı qarışmaz suyinə, dərya, xudahafiz.

Sən ey "Divan" kitabım ki, səni şövq ilə yazmışdım,
Sən ey misra, sən ey surət, sən ey məna, xudahafiz.

Qaçıb ceyranı ilhamın, uçubdur təb durnası,
Sən ey ceyran, xudahafiz, sən ey durna, xudahafiz.

Mənəm, dünyanı dərk etdim, məni dərk etmədi dünya,
Bu Şahin küsdü biryolluq daha, dünya, xudahafiz!

*1.09.1996*

***

*"Dərdim ki, könül zirü zəbər olmasın, oldu,*
*Həmvarə gözüm əşklə tər olmasın, oldu".*

**Seyid Əzim Şirvani**

Dad etdi könül "Bir də səfər olmasın", oldu,
"Qürbətdə günüm qüssə-kədər olmasın", oldu.

Cumduqca fəraq üstümə fəryad eləyərdim:
"Yarəb, belə dəhşətli xəbər olmasın", oldu.

Hicran elədikcə mənə fərman deyər idim:
"Fərmanları bundan da betər olmasın", oldu.

Gördükcə şirindilləri bərk arzulayardım:
"Dillərdə, dodaqlarda zəhər olmasın", oldu.

"Sidq ilə, ürəkdən sevən aşiqlərə, Yarəb,
Göz dəyməsin heç vədə, nəzər olmasın", oldu.

Quçduqca yarın belini, Şahin deyər idim:
"Belində qolum bəsdi, kəmər olmasın", oldu.

*4.09.1996*

***

"Yenə, ey mehriban, noldu cidalıq ixtiyar etdin,
Məni-sərgəştəni hər ləhzə kuyindən kənar etdin" *.

Sənin sirrin - mənim sirrim, mənim sirrim - səninkiydi,
Neçin gizlətdiyin sirri car etdin, aşikar etdin?

Başım batsın mənim ki, bilmədim gizlin əməllər var,
Sanırdım ki, məni sən aşikara bəxtiyar etdin.

Əlinlə daşqalaq etdin dilimlə etdiyim əhdi,
Əlimlə tikdiyim qəsri dilinlə tarimar etdin.

Təbiət gül yetirmiş ki, şən olsun bülbülün könlü,
Neçin, ey bağiban, bağə çəpər çəkdin, hasar etdin?

Qəzəlxan görmüşəm mənlə giribdir bəhsə mənasız,
Mənim zirvəmdə, ey qafil, nə cürətlə qərar etdin?

Əsasından uzundur Musanın, Şahin, qələm - səndə,
Yazıb "Divan"ını əsrin bu işlə iftixar etdin.

*5.09.1996*

***

"Qəsdin budu gər xatiri-biçarə dağılsın,
Bir şanə çək ol türreyi-tərrarə, dağılsın" **.

Bir ah ilə min dağı dağıtmaq nə hünər ki?***
Var qorxu ahımdan neçə səyyarə dağılsın.

Söz qumbarası yağmadadır nakəsə məndən,
Dəycək hədəfə, bəlli ki, qumbarə dağılsın.

Var güclü qəzəlxanlarımız məclisimizdə,
Var isə əgər bir neçə avarə, dağılsın.

* Beyt Mirzə Ələkbər Aşiqindir.
** Beyt Qasım bəy Zakirindir.
*** "Olsaydı məndəki qəm Fərhadi-mübtəladə,
Bir ah ilə verərdi min Bisütuni badə".
*M.Füzuli*



Əğyar axıdıb göz yaşın ətrafə dağıtdı,
Qoymam kənara gözdəki fəvvarə dağılsın.

Zülmət gecə vaxtı, gözəlim, çöhrəni göstər,
Qoy şakin olan mənzilimə qarə dağılsın.

Çarə tapa bilmir nə qədər dərdinə Şahin,
Dərdim o qədər çoxdu ki, et çarə, dağılsın.

*7.09.1996*

***

"Mənə ol silsileyi-türreyi-tərrar gərək,
Zülfünün kafəriyəm, kafərə zünnar gərək" *.

Gözünə sürmə çəkim mən çək əlin köksümə sən,
Sənə məşşatə gərəkdir, mənə memar gərək.

Az bəzən, tərk edəcək getsə belə huş məni,
Bəli, aşiqlik edən kəs ola hüşyar gərək.

Gəl məzəmmət eləmə, söyləmə "varım yoxdur",
Mənə eşqin kimi yalnız, gözəlim, var gərək.

Tutmasınlar mənə irad ki, hər dəm dedim "Eşq",
Bu gözəl kəlmə dəmadəm ola təkrar gərək.

Aşiqin eşqi hara, eşqi hara əğyarın -
Ona təsdiq gərəksə, buna inkar gərək.

Yar dərdiylə xoşam, bəxtəvərəm, ey Şahin,
Arizu dərd eləyən dərdə giriftar gərək.

*8.09.1996*

***

"Irişdir, saqiya, peymanəmi rindanə düşdükcə,
Ayaqlandır xərabat əhlini məstanə düşdükcə" **.

Əlim qüvvətlənir görcək, gözümsə artırır nurin,
Əlim cananə dəydikcə, gözüm cananə düşdükcə.

* Beyt Növrəs Osmanindir.
** Beyt Xəlil Bəzminindir.

Fəraqın qəlbdə - qəm tək, vüsalın canə - mərhəm tək,
Bu aşiq yanmada şəm tək yada pərvanə düşdükcə.

Tələs fərmanı verməkçin, mənə imkanı verməkçin,
Sevinnəm canı verməkçin gümanın canə düşdükcə.

Günüm keçməkdə tufanlı, təlatümlü, burulğanlı,
Gözümdən yaş axır qanlı könül əfğanə düşdükcə.

Əzizdir Seyyidin adı, yadımdan çıxmayır yadı,
Yada Sabir düşür, Hadi, yolum Şirvanə düşdükcə.

A Şahin, sönməyə çox var, həyatə rəğbətim artar,
Yaratmaq qüdrətim artar cahan səhmanə düşdükcə.

*Quba,*
*10.09.1996*

***

Canım yox-var arasında, sevincim var, qübarım var,
Nə müddətdir vüsalım yox, haçandır intizarım var.

"Nigara, məhcəbina, sərv qəddin iştiyaqında
Edən hər ləhzə çeşmə cari çeşmi-əşkbarım var" *.

Nə taxtım var, nə tacım var, nə mülküm var, nə var varım,
Qəzədldir aşikar varım, bu var tək yadigarım var.

Mənəm şah aşiqi, Həzrət Əli müdrik imamımdır,
Dilimdə Ismayıl şeri, əlimdə zülfüqarım var.

Təkəbbür əhlini gördüm, təkəbbürdən uzaq oldum,
Qürurim yoxdu bir zərrə, mənim amma vüqarım var.

Odam mən azərim vardır, bu məlum, azər - atəşdir,
Canımda atəşim var ki, mənim azər diyarım var.

Yox oldu ötdü nisgillər, hicr bitdi, fəraq itdi,
A Şahin, bəxtiyarəm ki, vüsalə ixtiyarım var.

*Quba,*
*11.09.1996*

* Beyt Həsən bəy Hadinindir.



***

Ürək hərçənd su içmək dilər Kövsər kənarında,
Könül Qudyal qırağında, canım Tərtər kənarında.

"Düri-dəndanını ləl içrə gördüm söylədim pəh-pəh,
Nə layiqdir sədəf kim, bəslәsin gövhər kənarında" *.

Qırarsam əhdü peymanı qırılsın qollarım, yarım,
Qoy olsun qan sızan kəlləm mənim xəncər kənarında.

Yuxumda büstünü yarın yonan Fərhadı gördüm mən,
Həmi Şirinini gördüm durub mərmər kənarında.

Sözüm qiymətlidir zərdən, misiylə fəxr edən gördüm,
Nə həddi misgərin var ki, dura zərgər kənarında?

Əgər tədqiq olunmazsam öləndən sonra, ey Şahin,
Heç olmazsa yazılsın qoy adım dəftər kənarında.

Fəxarətdir sənə, Şahin ki, Mail munisin olsun,
Nə xoşdur Şahid olsun, həm Qəni, Ənvər kənarında.

*Quba,*
*12.09.1996*

***

"Şah ki, haçan bir yerə get-gəl edir,
Sursatı, azuqəsi əvvəl gedir" **.

Gəldisi var, getdisi var adəmin,
Çox sualı eyləməyib həll gedir.

Bəllisə də qanunauyğunluğu,
Bir çoxu dünyayə məəttəl gedir.

Olsa da həll gərçi beş-üç cəncəli,
Sanma gedər-gəlməzə cəncəl gedir.

Hey götürürdüm aradan əngəli,
Öylə bilirdim daha əngəl - gedir.

* Beyt Əbdülxaliq Yusifindir.
** Beyt Nizami Gəncəvinin "Məxzənül-əsrar" poemasındandır. Tərcümə Mir Cəlal Zəkinindir.

İstəyirəm bir də şer yazmayım,
Amma qələmdanə tərəf əl gedir.

İstəmirəm, Şahina, heykəlləşim,
Gör nə qədər büst uçur, heykəl gedir.

*14.09.1996*

***

"Əcəb hüsnü əcəb tale, əcəb şəmsü əcəb taban,
Əcəb qüdrət, əcəb sane, əcəb xaliq, əcəb sübhan" *.

Əcəb məşuq, əcəb aşiq, əcəb qönçə, əcəb bülbül,
Əcəb bağü əcəb bağban, əcəb sünbül, əcəb reyhan.

Əcəb Həvva, əcəb Adəm, əcəb xoş gün, əcəb xoş dəm,
Əcəb xoş an, əcəb müjdə, əcəb təşrif, əcəb mehman.

Əcəb şanü əcəb şöhrət, əcəb fəxrü əcəb şövkət,
Əcəb saziş, əcəb ilqar, əcəb əhdü əcəb peyman.

Əcəb nazü əcəb qəmzə, əcəb xəlvət, əcəb fürsət,
Əcəb ləhzə, əcəb guşə, əcəb busə, əcəb canan.

Əcəb mərdü əcəb comərd, əcəb dərdü əcəb həmdərd,
Əcəb çarə, əcəb imdad, əcəb loğman, əcəb dərman.

Əcəb tuti, əcəb şəkkər, əcəb təşnə, əcəb Kövsər,
Əcəb bəxtü əcəb tale, əcəb iqbal, əcəb imkan.

Əcəb vəqtü əcəb əyyam, əcəb məhrəm, əcəb söhbət,
Əcəb "gəl-gəl", əcəb "qal-qal", əcəb hökmü əcəb fərman.

Əcəb meylü əcəb məqsəd, əcəb təbü, əcəb dəftər,
Əcəb Şahin, əcəb Fazil, əcəb ilham, əcəb "Divan".

*21.09.1996*

* Beyt Fazil xan Şeydanındır (XIX əsr)



***

*"Aşüftə olub kakil əbruyi-kəcin tutdu,*
*Mah idi bu eyd üçün əbr içrə nihan oldu"*

**Seyid Əzim Şirvani**

Bir-bir bu qəzəllər ki eşqinlə bəyan oldu,
Fikrim sənə, ey dilbər, getdikcə əyan oldu.

Mən öylə qəzəlxanəm şerimdə qəlizlik yox,
Bundan nə zərər gəldi? Bundan nə ziyan oldu?

Bilmərrə xilas oldu xanəndə çətinlikdən,
"Aşüftə olub kakil..." şerimdə haçan oldu?

Xəlq anlamayan dildə mən yazmadım əlbəttə,
Saf, sadə qəzəllərçin könlüm nigəran oldu.

Şövqüylə təmiz şerin sürətlə qocaldım mən,
Tezliklə görərlər ki, Şahin qocaman oldu.

*22.09.1996*

***

"Halımı ərz et, səba, dildarə Allah eşqinə,
Suzişi-dildən xəbər ver yarə Allah eşqinə" *.

Bəndələr birdəfəlik tərk eyləsinlər dəvanı,
Başlasınlar sevgiyə, ilqarə Allah eşqinə.

Qırsa qoy min naz ilən qırsın gözəllər bizləri,
Qırmasın aşiqləri qumbarə Allah eşqinə.

Çox qəzəlxan var ki, etmişdir tərənnüm badəni,
Başlasınlar badəni inkarə Allah eşqinə.

Yazmasınlar "yarımı əğyar sevsin, mən baxım?" **,
Asi könlüm az qala yalvarə Allah eşqinə.

Vur, külüngüm Fərhadındır, sevgilim, vur kəlləmə,
Yusifindir köynəyim, et parə Allah eşqinə.

* Beyt osmanlı şairi İshaq Əfəndinindir (XVII əsr)
** Bax: Qəzəllər, Bakı, 1986, səh.110.

Çarə tap qalmışsa hərgah səndə Şahin sevgisi,
Etmə gəl sən Şahini biçarə, Allah eşqinə.

*12.10.1996*

***

"Hər nə etdim mürği-bəxti ram edəm, ram olmadı" *,
Yarsız, dildarsız həzzim mənim tam olmadı.

Mey camından badə-badə mey süzənlər görmüşəm,
Mən mey içdim oymaq-oymaq, şakərim cam olmadı.

Pərdəsizdir mən deyən sözlər tamam, sərrastdır,
Məndə tənə, məndə rişxənd, məndə eyham olmadı.

Çox sevən kəs yarə xahiş yox, sərəncam yollayır,
Xahiş oldu, heç zaman məndən sərəncam olmadı.

Ildə üç-dörd bayram etmişlər müəyyən millətə,
Aşiqə amma vüsaldan özgə bayram olmadı.

Yar yaddan çıxmayır, şam eyləmək düşmür yada,
Şəm yandı, iştəha yoxdur deyə şam olmadı.

Olmadı ilham yarsız çox şerlər mən yazım,
Fürsət oldu, vaxtım oldu, amma ilham olmadı.

*21.10.1996*

***

Yalqızam, aşiqi təklik elə təsirlə çəkib,
Sanki ağuşinə yar yarını tədbirlə çəkib.

Quba... Şahdağ dağı... Qudyal çayı... Qəçrəş bulağı...
Fikrimi gör bu təbiət necə təsvirlə çəkib...

Şəhəri özxoşuma mən yenə tərk eyləmişəm,
Deməsinlər məni qəm çöllərə zəncirlə çəkib.

Düşünərdim hələ məktəbdə ki "dərd olmayacaq,
Elimin dərdini Allah baba Sabirlə çəkib".

* Misra Seyid Əbülqasim Nəbatinindir.



Zalimin zülmünü görcək böyüdükdən sonra
Başa düşdüm ki, fələk rəhmi təbaşirlə çəkib.

"Qaldırıb əllərimi göylərə bu çərxi-cəfa,
Elə bil ki, bu fələk onları kəndirlə çəkib" *.

Elə cəlb eylədi, Şahin, məni təklik özünə
Zərgəri müştərisi sanki cəvahirlə çəkib.

*25.10.1996*

***

Qəlbimdə olan sevgi bu dünyayə sığışmaz,
Ulduzə sığışmaz, günəşə, ayə sığışmaz.

"Bilməm bu qədər göz yaşı hardan belə çıxdı,
Billəh bu qədər göz yaşı dəryayə sığışmaz" **.

Sən sevgi edirsən mən isə eşq təmənna,
Yarım, o təmənna bu təmənnayə sığışmaz.

Xülyavü xəyalın dedilər yoxdur hüdudi,
Arzum o qədər çoxdu ki, xülyayə sığışmaz.

Məfkurə böyük, qayə böyükmü, ürəyimmi?
Məfkurə sığışmaz ürəyə, qayə sığışmaz.

Yarım, daha nəsr ilə kitab yazmalıyam mən,
Rüxsarını tərif daha misrayə sığışmaz.

Şerində, a Şahin, bu şirinlik ki varındır,
Qəndə, nabata, şəkkərə, xurmayə sığışmaz.

*7.11.1996*

* Beyt Əlişir Nəvainindir.
** "Nədənəm k-əz çe xizəd in həme eşq
Ke çəndin ab dər dərya nəgoncəd"
*Nizami Gəncəvi*

***

Soruşmursan neçin qəlbim pərişan eyləyən kimdir?
Sənin bir ahinə min bir kərə "can" eyləyən kimdir?

Sorurlar bir-birindən qonşular ahim çoxaldıqca:
- Dəmadəm sübhəcən fəryadü əfğan eyləyən kimdir?

"Sənin könlün qəmi-hicr ilə mən qan eylədim, girəm *,
Mənim bu könlümü, ey bivəfa, qan eyləyən kimdir?" **

Dilindən açmadım mən baş, Süleyman quş dili bilmiş,
Yəqin etdim Süleymanı Süleyman eyləyən kimdir.

Gözüm qəmli, sözüm qəmli, özün mənsiz, özüm qəmli,
Xuraman olmayan qəlbi xuraman eyləyən kimdir?

Söz açdım mən Məhəmmməddən, soruşdun ki, Məhəmməd kim?
Müsəlmansan, müsəlmanı müsəlman eyləyən kimdir?

Qaranlıqda işıq olmaz, işıqda yox qaranlıqlar,
Sevən qəlbi qaranlıqda çırağban eyləyən kimdir?

Qəzəlxan olmaz idim mən və "Divan"ım yazılmazdı,
Özün de, Şahini, yarım, qəzəlxan eyləyən kimdir?

*11.12.1996*

***

Yoruldum mən qəlizdil şair ilə cəng tutmaqdan,
Yorulmaq bilmirəm amma yeni ahəng tutmaqdan.

"Əgərçi qafiyə çox təngdür, Ey Cənnəti, ar et
Bir əldə xamə, digər əldə bir fərhəng tutmaqdan"***.

Yığıb yemlik, yeyərdik novbahar olcaq, çəmənlikdən,
Dilim turş oldu illərlə dərib turşəng tutmaqdan.

Mənə, yarım, müğənni olmusan, çəngi kənar eylə,
Əlimdən tut, nə xeyri, ey müğənni, çəng tutmaqdan.

* Girəm - tutaq ki (farsca)
** Beyt Əbdülxaliq Yusifindir.
*** Beyt Əbdülxaliq Cənnətinindir.



Gəhi sürmə, gəhi vəsmə, gəhi ənnik, gəhi kirşan...
Nigarım, rəngsaz oldum önündə rəng tutmaqdan.

Çalan zəngi mənəm aşiqlərə, bidar olsunlar,
Qabar əksilməyir barmaqlarımdan zəng tutmaqdan.

Keçibdir əllidən sinnim, yorulmaq bilmirəm əsla,
Əlimdə "Məxzənül-əsrar", "Həft övrəng" tutmaqdan.

Savabın səmtinə hey ley kimi, şahin kimi cumdum,
Çoxalmışdır günah indi savabı ləng tutmaqdan.

*23.12.1996*

***

*"Dedim: - Ey şux, Füzuli sənə meyl etdi, - dedi:*
*- Bu ədəbsizlik üzündən ləqəbin böylə olub" *.*

**Məhəmməd Füzuli**

Mənə rəhm eyləmədin sən, qəzəbin böylə olub,
Buyur al canımı, ey gül, tələbin böylə olub.

Qeyb edibsən məni duymaq, məni qucmaq dəbini,
O dəbin öylə olubdur, bu dəbin böylə olub.

Şerimə çoxdan "əcəbdir" deməyirsən, nə əcəb?
Nə səbəbdən "əcəb"in, "çox əcəb"in böylə olub?

Səbəbi küsməyinin yoxdu, səbəbsiz qaldın,
Bu səbəbsiz ki deyildir səbəbin böylə olub.

Gəl ədəb dərsi keçim, tərbiyələn, ey əğyar,
Tərbiyən olmadığından ədəbin böylə olub.

Əsəbin, Şahina, gündən-günə qalxır şahə,
Yarını görmədiyinçin əsəbin böylə olub.

*26.12 1996*

* "Goftəm: - Ey şux, Füzuli be to meyli darəd,
Goft: - Z-in biədəbihast ke inəş ləqəbəst".

***

*"Dəmadəm cami-tərəb qeyr ilə ol mah çəkib,*
*Mən iraqdan baxıban qan udubü ah çəkib"*

Əlişir Nəvai

Bu qəzəl sahibi hər gün nə qədər ah çəkib...
Nə gəda çəkdi o cür ahı, nə də şah çəkib.

Şükr olsun ki, ayıldım, o gözəl saqi məni
Çəkməyibdir gəhi meyxanə sarı, gah çəkib.

Çoxu meyxanədə çəkmişmi həyatın qəmini?
Biri məstanə çəkibsə yüzü agah çəkib.

Uzun illər vətəni seyr elədim qürbətdən,
Qürbətin zülmünü az mən kimi səyyah çəkib.

Mən ziyan eyləmişəm xeyr əvəzi illərlə,
Nə üçün öylə ziyanı bu xeyirxah çəkib?

Nə üçün Qeysi qovub çöllərə cövr etdi fələk?
Sınağa aşiqi tale niyə, eyvah, çəkib?

Niyə anmaqda o rəhmətliyi hər gün Şahin?
Həmrəhin dərdini əlbəttə ki həmrah çəkib.

*30.12.1996*

***

"Vəsl şami xəlvətimdə yaxsalar nagah şəm,
Rəşkdən canımni gahi sayə örtər, gah şəm" *.

Dərdlərim görsənməyir, qapqarə zülmətdir gecə,
Dərdlərimdən çox güman olmaq dilər agah şəm.

Ey Füzuli, Bəxtiyarın səhhəti olmuş xarab **,
Yanə-yanə sən kimi sönməkdədir, eyvah, şəm.

Şairin əqlində şəmin nurini görmüşsə gər,
Daima cəm etmək istər dərgəhində şah şəm.

* Beyt Əlişir Nəvainindir.
** Bəxtiyar Vahabzadə xəstələnmişdir.



Qailik Quranə, öyrətməkdədir hər sübhü şam
Biz xəbərsiz bəndəyə, Rəbbim, kəlamullah * şəm.

İstərəm gündüz də yansın parlaq etsin gündüzü,
Kaş ola aşiqlərə gündüz-gecə həmrah şəm.

Söndü əğyarı görən tək, heç təəccüb etmədim,
Şahina, etmək dilər əğyardən ikrah şəm.

*4.01.1997*

***

"Qılğalı xələtin ol sərvi-güləndam qızıl,
Qıldı qan tökmək ilə dəhrini gülfam qızıl" **.

Ötə lap zirzəmidə yar ilə ömrüm, xoşdur,
Neynirəm mən elə kaşanə ola dam qızıl.

Mənə lütf eylə qızıl mey ki, ziyalansın göz,
Heç gərəkdirmi ki, olsun, gözəlim, cam qızıl?

Söz deyin, şer oxuyun, inci nə, mirvari nədir?
Söz var ikən edə bilməz məni aram qızıl.

Deməsinlər filan əyyam qızıl əyyamdı,
Qızıl insanı ilə olmalı əyyam qızıl.

Quranın qiyməti əfzəldi cahan varından,
O Məhəmməd özü bir ləldi, islam - qızıl.

Bir əlifba daha üstündü əlifbalərdən,
Deməyin adi hərflərdi... Əlif, lam - qızıl.

Bəşəriyyət nə qədər gör ki, qızıl qeyb etmiş -
Bəşərə Cami qızıl, Hafizü Xəyyam qızıl.

Şahinəm, çəkmərəm əl mən Bakıdan heç vədə,
Başıma səpsə də gər Məkkə, Ədən, Şam - qızıl.

*10.01.1997*

* Quran
** Beyt Əlişir Nəvainindir.

***

*"Məqamı gəh bəla dağidürür, gəhi fəna daşti*
*Ki, eşq içrə verür Fərhadü Şirindən nişan könlüm"*

Əlişir Nəvai

Ürəksizlər sırasında həmişə bağrıqan könlüm,
Diləksizlər arasında diləkdən yan olan könlüm.

Həmi gülmüş, həm hönkürmüş, həyatda çox sınaq görmüş,
Alıbdır imtahan könlüm, veribdir imtahan könlüm.

Cəfa gördü - cəfalandı, bəla gördü - bəlalandı,
Məhəbbətdən həvalandı məhəbbətsiz qalan könlüm.

Baxıb yaxşı yaman gördüm, könül mülkündə qan gördüm,
Görüb qanı üzüb canı olub qan çox güman könlüm.

Müsibətlər, cəfalər var, əziyyətlər, bəlalər var,
Cahanı görsə gər yaxşı sızıldarmı yaman könlüm?

Könül ağ gün haçan gördü? Vüsalında ziyan gördü!
Haman qəmdir, haman əfğan, haman hicran, haman könlüm.

Bətndən ayrılan gündən bəlalı eşqə düşdüm mən,
Ürək söylər aman Şahin, aman qəlbim, aman könlüm.

*12.01.1997*

***

*"Çərxdən mehr təmə tutdumü afət gördüm,*
*Yardən vəsl tələb qıldımü hicran tapdım"*

Əlişir Nəvai

Bir gülü tərk elədim, amma gülüstan tapdım,
Mən əgər qətrə itirdimsə də, ümman tapdım.

Canım itmişdi itircək yarı, Allahımdan
Cismimə mərhəmət oldu, yenidən can tapdım.

Həsrətim var idi can içrə, canım dincəldi,
Elə ki, mən arayıb sən kimi canan tapdım.

Acı söz zəhr idi, amma məni hüşyar elədi,
Almaq ilən ilanın zəhrini dərman tapdım.



Görəsən mən kimi xoşbəxt bir adam vardırmı?
Qazanıb çoxlu qanan, bir-iki nadan tapdım.

"Nöqsanım varmı?" deyən şəxsdə nöqsansızlıq,
"Nöqsanım yoxdu" deyən kimsədə nöqsan tapdım.

Əcnəbi sözləri şerimdə üyütdüm, yoxdur,
Daşı daş üstünə qoymaqla dəyirman tapdım.

Rudəki, Sədi, Nizami, hələ Cami, Sabir -
Qəlb mehmanxanasında neçə mehman tapdım.

Yazmadım şerimi şairləri təqlid edərək,
Yaradıb saf dil ilə şerimi "Divan" tapdım.

"Halva-halva" deməyinlə şirin olmaz ağzın,
Elə ki, tutilik etdim şəkəristan tapdım.

Əfqanıstan ilə Türkiyyədə tapdım sevgi,
Gedibən Hafizimin yurduna Iran tapdım.

Hələ mən dürri-Ədənçin Ədənə getməliyəm,
Mən Bədəxşanə gedib ləli-Bədəxşan tapdım.

Kimə dağ zirvəsi qismət, kiməsə dağ ətəyi,
Şahdağa qonmaq ilə mən dəxi meydan tapdım.

Yuxuda cənnətə düşdüm, hamı bir ümmətdi,
Mən nə kafər, nə bürəhmən, nə müsəlman tapdım.

Loğmanım cananım oldu, gözə görsənmə, təbib,
Nə gərəksən mənə, bir halda ki, loğman tapdım.

Bu halım, zənn edirəm mən ki, məhəbbətdəndir,
Şahinəm, gündə qəzəl yazmağa imkan tapdım.

*15-16.01.1997*

***

"Qıldı avarə məni-xəstəni avarə könül,
Xanimanımnı qəra qıldı üzü qarə könül" *.

Şübhə yoxdur buna sidq ilə keçərdim candan
Verməyəydim təki sidq ilə o dildarə könül.

Ürəyim tək bütöv idi, tam idi, vahiddi,
Verəli yarə könül etdi özün parə könül.

Çox könüllərdə tamah şövqü məkan etmişdir,
Heç zaman uymayacaq dəbdəbəyə, varə könül.

Elə müşkilləri var ki, edə bilmir çarə,
Nə canın dincliyi vardır, nə tapır çarə könül.

Bilirəm rəngi qəmin qapqaradır qətran tək,
Bu qədər qəm ki yoluxmuş olacaq qarə könül.

Sevgi azarına urcah idi... Şahin, ölürəm,
Mübtəla olmayacaqdır daha azarə könül.

*17.01.1997*

***

"Yüz bəla hicran tapar hər dəm bu məhzun can üçün,
Tanrı guya kim, yaratmışdır məni hicran üçün" **.

Xalidirsə göz yaşından hər sədəf gövhər deyil,
Qətrə-qətrə göz yaşı tökmək gərəkümman üçün.

Xahiş etmə, dilbərim, fərman elə ömrün boyu,
Xahişim yağmaqdadır yağmur təki - fərman üçün.

Arif olmaq aşiq olmaqdırsa - ariflik gözəl!
Aşiq olmaq - nöqsan isə, hazıram nöqsan üçün.

Gəldi qurban! Şad olmuş kimsələr qurban kəsir,
Göz yaşı tökməkdəyəm amma ki, mən qurban üçün.

* Beyt Əlişir Nəvainindir.
** Beyt Əlişir Nəvainindir.



Şerə şan-şöhrətdən ötrü qurşananlar az deyil,
Mənsə yazdım şeri şan üçün deyil, canan üçün.

Xali etməkdir alağdan gülşəni qayəm mənim,
Meyl vardır, indi can üzməkdəyəm imkan üçün.

Şahinin saf şerinə böhtan atan müslim deyil,
Ey müsəlmanlar, cavab vermək gərək böhtan üçün!

*7.02.1997*

***

"Aşiq oldum, bilmədim yar özgələrğə yar imiş,
Allah-allah, eşqdə bunca bəlalər var imiş" *.

Ey Nəvai, "özgələrğə" yar olan əğyardır,
Sevdiyin yarın sənin, əlbəttə ki, əğyar imiş.

Yarı inkar eyləyən kəs mərhəmətsiz bir vücud,
Eşqi inkar eyləyən kəs var isə qəddar imiş.

Qanda - sevgi, canda - sevda, göydə - Allah, yerdə - yar,
Yar bir örnək yaranmış, yar bir meyar imiş.

Yarsız olmazdı səhman eşq qəsrimdə mənim,
Yar imiş ustadı qəsrin, yar bir memar imiş.

Eşq mülkündə nizam olmazsa, təqsirkar - yar,
Yar - başçı, yar - rəhbər, yar - bir sərdar imiş.

Ey Nəvai, "özgələrğə" yar olanə yar demə,
Yar seçməkdə bu Şahin doğrudan pərgar imiş.

*8.02.1997*

***

"Xublar min bulsələr mən xəstəğə bir yar bəs,
Onda mehr ətvarinin mindən biri gər var, bəs" **.

Əhdü peyman aşiqin ilqarıdır, ilqar - xoş,
Xacələr söylər fəqət peyman bəs, ilqar bəs.

* Beyt Əlişir Nəvainindir.
** Beyt Əlişir Nəvainindir.

Kim deyir yetmək vüsalə eşq ilə mümkün deyil,
Nazəninim, sən vüsalı eyləmə inkar, bəs.

Guya, ölmək yetmədən vəslə məram - eşq əhlinə,
Öylə sözlər boş cəfəngiyyat, yox meyar, bəs.

Çox təəssüflər ki, hər gün vəslə imkan olmayıb,
Başıma hicranı eşqin yağdırıbdır qar bəs.

"Hər şeyə "bəs" söyləmək mümkündü, inkar etmirəm,
Qoy dilimlənsin dili kim söyləsə "dildar bəs".

Hər yetən sərdarı olmaq istəyir eşqin bu gün,
Bəsdir, ey sərdarlər, Şahin kimi sərdar bəs!

*10.02.1997*

***

"Dustlər, bir çarə mən divaneyi-şeyda üçün,
Kim, ölərmən ol pəripeykər mələksima üçün" *.

Hər sevəndən aşiq olmaz, hər Qeys Məcnun deyil,
Aşiqi xəlq eyləyibdir Tanrı istisna üçün.

Bilmədim ki, xəlq edib dünyanı bizlər naminə,
Ya, bizi xəlq eyləyibdir Allahım dünya üçün?

Kimsədən gizlin deyil, surətpərəst olsam da mən,
Bağrımı qan etmişəm hər sözdəki məna üçün.

Ey nigarım, gəl yaxın, məndən bu istiğna nədir?
Güldü yarım ki, "bu istiğna nədir mənə üçün?"

Sən məni öz sözlərimlə dəvət eylə mən gəlim,
Nəzm edirsən xəlq üçün, ya bir-iki molla üçün?

Üç dili göyçək bilib şair Füzuli, indisə
Çox qəzəlxan söz gəzir sözlükdə "istiğna" üçün.

Öylə şair olma gəl, sən Şahini-Fazilsən,
Sanki peyda olmusan saf şerimi bərpa üçün".

*20.02.1997*

* Beyt Əlişir Nəvainindir.



***

İstərəm mən səs ki, olsun hər zaman mərdanə səs,
Qoy yetişsin bir sevinc, bir müjdə tək hər yanə səs.

Var səs - xoş bir tərانə, var səs - müdhiş sәda,
Var səs - mərdanə səsdir, var səs - məstanə səs.

Var səs - hər gün zərurət, var səs - hər dəm zərər,
Var səs - məhrəm qəzəldir, var səs - biganə səs.

Vaxt olur hal əhlini tez-tez çəkir meyxanəyə,
Vaxt olur cəng əhlini hərdən çəkir meydanə səs.

"Qeysə üz tutdum mənim fəryadimə səs verdi o,
Rəsmdir, versin gərək divanəyə divanə səs" *.

Az qalıb qışqırtısından kar olum, zarəm daha,
Allah-Allah, kim veribdir bir belə hicranə səs?

Dözməyi pərvanə təlqin eyləyibdir Şahinə,
Odlanır, amma ki, etmir azca həm pərvanə səs.

*28.02.1997*

***

Əmin oldum məhəbbət bir bəla imiş, fərar ondan,
Yaxırdı, yandırırdı, tüstü tək oldum kənar ondan.

Qərarı böylə imiş Tanrının ki hicri göndərdi,
Qərarından səbr peyda, səbr - məndən, qərar - ondan.

O dilbərdən üzüm döndü, sözüm küsdü, dilim yandı,
Məzarım qoy məni çəksin çəkərsəm intizar ondan.

"Qədi-nəxlindən ölsəm, dustlər, budur vəsiyyət kim,
Başım üzrə əgib sərvi qılın mili-məzar ondan" **.

Məhəbbət öylə afət ki, uzaqlaşdım məhəbbətdən,
Mənəm mən, olmaram Sənan kimi məstü xumar ondan.

* Beyt Mirzağa Novruzundur (1890-1969).
** Beyt Əlişir Nəvainindir.

Kədər məndən kənar olmur, kənarə qoymaram getsin,
Fərəhdən yox, bilin, qəlbim görübdür etibar ondan.

Bu Şahinmi, deyildir, yox, əruz bağında bülbüldür,
Qəzəlxanmı, deyildir, yox, çıxıbdır nəğməkar ondan.

*10.03.1997*

***

*"Məcnun olmaq diləyin varsa bu Leyla, bu da sən".*
**Səyyar Tarıverdiyev**

Müşkil açmaq diləsən, gəl, bu müəmma, bu da sən,
Bacara bilməyəcəksən bunu amma! Bu da sən!..

Elə aram adamam istəmirəm qovğanı,
İstəmirsənsə əgər sülh, bu qovğa, bu da sən.

Bilməyirsənsə əgər üzməyi tullanma suya,
Ya, boğulmaq diləyirsənsə bu dərya, bu da sən.

"Dami-zənciri-cünun türreyi-pürxəm..."*, pəh-pəh,
Hünərin alqışa layiqdi, bu misra, bu da sən.

Şerimin buğda unuyla ağarıbdır hüsnü,
Bu dəyirman, bu dəyirmançı, bu arpa, bu da sən.

Ad çıxarmaq diləyirsənsə əgər Məcnun tək,
Duruxub qalma, bu səhra, bu qasırğa, bu da sən.

Nə tərəddüdlə qalıbsan bu təhər, ey Leyla,
Bu mənəm, ibni-Salamdır, bu, bu sevda, bu da sən.

Bil ki, qəlbimdə məhəbbət deyilən dünya var,
Bacarıb saxla bu dünyanı, bu dünya, bu da sən.

Bizi Tanrı yaradıb bir-birimizdən ötəri,
Bu mənəm, güzgüyə bax, eylə təmaşa, bu da sən.

Sən gərək Şahin olub qorxmayasan tufandan,
Bu dənizdir, bu gəmi, sür ki, bu dalğa, bu da sən.

*11-12.04.1997*

* Haşım bəy Saqib. "Deyilən söz yadigardır" kitabı, I cild, səh.124.



***

Ey dil, daha dillənmə, o dildarı çağırma,
Can mülkü dağılmışsa da, memarı çağırma.

Əhd harda qalıbdır, hanı peyman ilə ilqar?
Peymanı çağırma, daha ilqarı çağırma.

"Gər cəzbeyi-eşq olmasa gəlsə vecə gəlməz?"
Məcburi gətirmə, onu icbari çağırma.

Quranını, Peyğəmbərini, Tanrını səslə,
Mərcan demə, dürr söyləmə, mirvari çağırma.

Yoxluq ki deyərdik, orada var var imiş,
Ey tərk eləyən varlığı, gəl varı çağırma.

Əğyarı ki lənətləmisən, yaxşıdı, hətta
Əzraili səslə gələ, əğyarı çağırma.

Var idi günahın, edirəm tərk günahı,
Şahin, günəh etmə, o günəhkarı çağırma!

*16.04.1997*

***

Kimi pəhriz edir meydən, kimə meyxanə lazımdır,
Mənə gündüz-gecə, axşam-səhər cananə lazımdır.

Xoşam yaqut dodağından: vüsalın dürrüdür eşqin,
Dünən yaqut dilərdim mən, bu gün dürdanə lazımdır.

Saçından çəkmişəm mən nanə ətri, nanədən məstəm,
Mənim tək aşiqə, canan, dəmadəm nanə lazımdır.

Nənə, zənn eylərəm hərdən mən əfsanə o dünyanı,
Mənə gerçəklik üstündür, sənə əfsanə lazımdır.

Eşit, ey dəva əhli, dəva əhlindən xoşum gəlmir,
Mənəm gülxanə məftuni, sənə viranə lazımdır.

"Bu vazehdir ki, cani-tən sevənlər vəslə yetməzlər,
Məhəbbət atəşində yanmağa pərvanə lazımdır" *.

İlahi, ölkədən neyçün cəfa itmir, bəla getmir?
Bəlalı yurduma min-min bu gün mərdanə lazımdır.

* Beyt Əbdülxaliq Yusifindir.

Dedi dünya ki, Məcnun can veribdir, canişin sənsən,
Bizə hərdənbir, ey Şahin, o cür divanə lazımdır.

*28.04.1997*

***

"Dərdsiz, gözəlim, eşqinə dərman tapılarmı?
Aləmdə tikansız da gülüstan tapılarmı?" *

Allahımızın hökmü, sərəncamı olarsa,
Insanlar içində yenə şeytan tapılarmı?

Işdir bütün aşiqlərimiz yetsə vüsalə,
Aləmdə məgər bir dəxi hicran tapılarmı?

Fərhadı məgər bir də bəşər xəlq eləyərmi?
Məcnundan olarmı yenə, Sənan tapılarmı?

Olmazsa Maralgöldə əgər qərq maral, ya
Ceyranbatana batmasa ceyran tapılarmı?

Eşq əhlini yox, zahidi loğman sağaltsın,
Eşq əhlinə canan kimi loğman tapılarmı?

Canan dedi: - Yaz, şerinə yad oldu izafət,
Şahin, sənə bənzər də qəzəlxan tapılarmı?

*1.05.1997*

***

*"Saçın ki, hər xəmi yüz piçü tab ilən doludur,
Nə tab, min dilü pür iztirab ilən doludur"*

**Azər Buzovnalı**

Cahanda yaxşı nə vardır, əzab ilən doludur,
Nə xeyri var ki, badəm şərab ilən doludur.

Nə yaxşı oldu ki, gəldim cahanə, Allahım,
Yaman budur ki, cahan iztirab ilən doludur.

Mənim də oldu günahım, əbəsdi inkarım,
Günahı olsa da, qəlbim savab ilən doludur.

---

** "Bidərd qəme-eşqe-to dərman natəvan yaft,
Bi xare-aləm vəsle-golestan natəvan yaft"

*Bədr Şirvani*

(Fars dilindən tərcümə bu sətirlər müəllifinindir).



Cavab gəlməyəcək qafilə xitab eləsən,
Sual alimədirsə cavab ilən doludur.

Edirəm öylə təsəvvür ki, cənnət, ey Rəbbim,
"Segah"ü, "Şüştər"ü, "Rast"ü "Rahab" ilən doludur.

Ya Ilahi, görəsən badə var cənnətdə?
Təsəvvür eylədiyim mey gülab ilən doludur.

Elədin nə çox inqilab, ey Xaliq,
Bəla deyilmi cahan inqilab ilən doludur?

Həmişə yazmadasan, yaz, mərhəba, Şahin,
Sinən kitab evi olmuş, kitab ilən doludur.

*15.05.1997*

***

Yenə fışqırsa da al qan bıçağın altından,
Vüsalı görmədəyəm mən fərağın altından.

Günəşi seyr edirəm, nurlu o göylər qızını,
Nə işıqdır bu ki, düşmüş çırağın altından.

Bulaq üstündə gözəllər oxuyurlar şən-şən,
Bulağın üstünə çıxdım bulağın altından.

Eşq sirri, demişəm, tək sənə olsun bəlli,
O nə sözdür qaçırıbsan dodağın altından?

"Qəbrimin torpağına bassan ayaq sən bir gün,
Ot kimi çıxmalıyam mən ayağın altından" *.

Elə baş var ki, papaqsız da gözə görsənmir,
Baş da var ki, gözə çarpır papağın altından.

Bir sınaqdır Qarabağ məsələsi, ey Şahin,
Üzüağ çıxmalıyıq biz sınağın altından.

*21.05.1997*

---

* "Gər nəhi bəd əz vafate-ma qədəm bər xake-ma,
Çon giyzəh əz zire-payət sər bedər xahim kərd".

*Bədr Şirvani*

***

*"Sevmişəm varlığımla bir gözəli,*
*Edirəm ahü zar, yumşalmır".*

**Cəfər Rəmzi**

Daşa dönmüşmü yar, yumşalmır,
Qalmışam intizar, yumşalmır.

Daha səbrim bitib, yoxdur tab,
Olmuşam biqərar, yumşalmır.

Əriyər qurğuşun ahimdən,
Yumşalar daş-divar, yumşalmır.

Deyirəm dərdimi mən yumşaq,
Zar olur laləzar, yumşalmır.

Çox nigar oldu mum eşqimlə,
Nə edim, bir nigar yumşalmır.

Qəzəlim həm onu cəlb etmir,
Eləmir iftixar, yumşalmır.

Nə üçün Şahinə yox rəhmi,
Niyə Pərvərdigar yumşalmır?

*24.05.1997*

***

Başıma yağsa da hey daş sənin eşqindən,
Qurtula bilməyim, eykaş, sənin eşqindən.

Qələmim qeyri kəsin eşqi ilən söz yazmaz,
Yazıram mən, a qələmqaş, sənin eşqindən.

Düşünürdüm məni çaşdırmayacaq bir kimsə,
Olmuşam bəs niyə çaşbaş sənin eşqindən.

Demisən sirrini sirdaşlarına sən gizlin,
Danışıbdır neçə sirdaş sənin eşqindən.

"Kəsələr başımı hərgah sənin zülfün tək,
Ola bilməz qaçıram baş sənin eşqindən" *.

* "Əgərəm sər ço sere-zolfe-to xahənd borid,
Sər ze sevdaye-to yek muy nəxahəm piçid".

**Bədr Şirvani**



Eşqinə heyrət edənlər çoxalır getdikcə,
Çatılıbdır nə qədər qaş sənin eşqindən.

Şahinəm, surətini Şahdağa nəqş eyləmişəm,
Olmuşam, ey pəri, nəqqaş sənin eşqindən.

*23.05.1997*

***

Bilməm bu nə aşiqdir yarı vecinə almaz,
Ya, bu necə tarzəndir tarı vecinə almaz.

"Canım sənin eşqinlə məst oldu "Ənəlhəq"dən,
Mənsur kimi, vallah, darı vecinə almaz" *.

Kabulda Nəim adlı dərviş ilə dost oldum,
Zərdən xəbəri yoxdur, varı vecinə almaz.

Qış düşmədədir artıq, dərdimsə - papaq dərdi,
Şəxsin papağı varsa qarı vecinə almaz.

Əğyar həya bilməz! Arsızlığa qurşandı,
Bir üzdə həya yoxsa, arı vecinə almaz.

Əlbəttə, "tikan" doğma, yaddır mənə "xar" isə,
Şahin ki, "tikan" söylər, "xar"ı vecinə almaz!

*29.05.1997*

***

"Ey könül, naləvü fəryad eləmə, yad eşidər,
Bisütunə yetişər qülqülə, Fərhad eşidər" **.

Belə zülm eyləmə aşiqlərə sən, ey əğyar,
Elə zülm eyləyərəm mən sənə Şəddad eşidər.

Qaş-qılınc, kipriyin-ox, hər ikisi cəlladdır,
Qorxuram mən ki, bu cəlladı o cəllad eşidər.

Yenə fəryad edirəm fəryadı susdurmaqçın,
Ehtimal eyləyirəm bəlkə də fəryad eşidər.

* "Canəm ze meye-eşqət sərməste-ənəlhəqq şod,
Mənsursifət, vallah, əz dar nə əndişəd"

**Bədr Şirvani**

** Beyt Hacı Mailindir.

Bu pərimlə yenə ilham pərisi cəng eləyir,
Bu pərizadı güman ki, o pərizad eşidər.

Şah Füzuli dedi ki, sadə yazın, zənn elədim
Atanın etdiyi tövsiyyəni övlad eşidər.

Mən qəzəl gülşənimi etdim alağdan xali,
Hələ çox xidmətini doğma bilər, yad eşidər.

Şahina, gəl özünü bir belə tərif eləmə,
Hacı Mail kimi qüdrətli bir ustad eşidər.

*30.05.1997*

***

Qəlbimi sevda fəğana çəkmədə,
Yoxsa da xeyri ziyana çəkmədə.

"Zülfü yarın çəkdi səni, ey könül,
Səbr elə, bir gör hayana çəkmədə?" *.

Tuşladı hər kipriyini üstümə,
Sanki qoyub ox kamana, çəkmədə.

Yar yenə şübhə edir bəlkə də...
Gündə məni imtahana çəkmədə.

Eşqimizə məndə inam var idi,
Indi inamım gümana çəkmədə.

Röyada gördüm: Məni peyğəmbərim
Hicrət olan ol məkana çəkmədə.

Istəyirəm həqqə yaxınlaşmağı,
Meyli bu hiss nərdivana çəkmədə.

Qırmızı rəng ilə yazır şerini,
Şairi rəng yoxsa qana çəkmədə?

* "Ey del, əgər mikeşədet zolfe-yar,
Səbr kon-o bin ke koca mikeşəd"
**Bədr Şirvani**



Şahinə bax, yerdə qərar etməyir,
Təbi onu asimana çəkmədə.

*3.06.1997*

***

*"Libasi-zülfə girmiş bir pərişanbəxt yarım var,*
*Gözünə sürmə çəkmiş bir əcaib ruzigarım var"*
**Məlik bəy Avçı (XVII əsr)**

Sevincim qeyb olub çoxdan, nə müddətdir qübarım var,
Əlimdə yoxdur imkanım, dilimdə ahü zarım var.

Nə müddətdir əlim tutmur əlindən nazlı dildarın,
Nə müddətdir dilim gəlmir deyim həzzim, xumarım var.

Qalıb qürbət diyar içrə obamdan ayrı düşdüm mən,
Qubamdan ayrı düşdüm mən, nə boyda intizarım var.

Ilahi, min şükürlər, munisim min-min kitab oldu,
Mənim Hadim, mənim Racim, Nizamim, Qəmgüsarım var.

Qəzəllər yazmışam Seyyid Əzimdən ilham aldıqca,
Füzulim var, Nəsimim var, Cəlil tək iftixarım var.

Gəlib vəcdə ədiblərdən bu gün Şahin edir səcdə,
Nə yaxşı Sabirim vardır, nə xoş ki, Şəhriyarım var.

*5.06.1997*

***

*"Aşiq önündə dikələn bir tikan*
*Sonda görürsən ki, gülüstan olur"*
**Şəms Təbrizi**

Gah görürsən ki, ürək qan olur,
Gah görürsən gülə heyran olur.

Gah görürsən canı yar oxlayır,
Gah görürsən cana loğman olur.

Gah qarışqayə dönür göz görə,
Gah görürsən ki, Süleyman olur.

Gah dönür kafərə Xummar tək,
Gah görürsən ki, müsəlman olur.

Gah görürsən ki, zəhərdən acı,
Gah görürsən şəkəristan olur.

Gah görürsən üzümə baxmayır,
Gah görürsən yenə heyran olur.

Gah görürsən yox edir canımı,
Gah görürsən canıma can olur.

Təb bulağıyla cücərdir şer,
Şahinə bax bir, yenə bağban olur.

*6.07.1997*

***

"Dünyanı soruş, ey dil, dünyanı bilənlərdən,
Mənanı sual eylə mənanı bilənlərdən" *.

Ömrüm boyu çox rəmzi öyrənməyə cəhd etdim,
Öyrəndim əsa sirrin Musanı bilənlərdən.

Aşiq gözünə röya gəlmir niyə günlərlə?
Röyanı sual etdim röyanı bilənlərdən.

"Eşq içrə vüsal olmaz!" - bildim bu müəmmanı
Məcnuni bilənlərdən, Leylanı bilənlərdən.

Açmazsa savaşdan baş qafil nə bilər qovğa?
Öyrən savaşın fəndin qovğanı bilənlərdən.

Divanə olar, amma "Divan" yaradan olmaz
Hər qafiyəpərdazdan, misranı bilənlərdən.

Sevda qəminə nisbət Şahdağ daha yüngülmüş,
Şahin bunu öyrəndi sevdanı bilənlərdən.

*9.07.1997*

* Beyt Həkim Qəninindir.



***

Ürəkdə sirrlər vardır ki, pünhan eyləmək olmaz,
Əgər pünhan olarsa həlli asan eyləmək olmaz.

Pərişan hüsnə baxdıqda, pərişan zülfü gördükdə
Pərişan olmayan şəxsi pərişan eyləmək olmaz.

Məhəbbət dərdinə yalnız məhəbbətlə olar çarə,
Bu dərdə qeyri tədbir ilə dərman eyləmək olmaz.

Gülə bənd olmasa bülbül dilindən nəğmə yüksəlməz,
Dilə bietina fərdi Süleyman eyləmək olmaz.

"Firəngi, ey bürəhman, özgədir, amma bizim yerdə
Müsəlmanzadələr var ki, müsəlman eyləmək olmaz" *.

Üzüm yumşaqsa da, əl çəkmərəm bir dəm vüsalımdan,
Vüsalı, daş kimi möhkəmsə, hicran eyləmək olmaz.

Xəbər tutsun xəbərsizlər: Bilin, Şahin gəzir mənə,
Onun tək aşiqi surətlə heyran eyləmək olmaz.

*11.07.1997*

***

Sən ki gəldin yanıma, bir də pərişan olmam,
Daha mey şövqü ilən saqiyə mehman olmam.

Səni vəsf etməsəm hər gün, cıraram dəftərimi,
Qələmi sındıraram, bil ki, qəzəlxan olmam.

Mən ki, öz sözlərim ilə yazıram təzə qəzəl,
Kim deyər təzə qəzəl mülkünə sultan olmam.

"Baxmamaq surətinə gərçi müsəlmanlıqsa,
Dönərəm kafərə, heç vədə müsəlman olmam" **.

* Beyt Əlican Qövsi Təbrizinindir.
** "Gər müsəlmani bovəd tərki-nəzər əz surətət,
Bəs dər in surət müsəlman nistəm, mən kafərəm"
*Bədr Şirvani*

Qeyri kəs diqqətimi cəlb eləmir, qeyrisinə
Məni heyran eləyibsən deyə, heyran olmam.

Qurban olmaq sənə - məqsəd mənə, səndən savayı
Daha bir dilbərə qoç timsalı qurban olmam.

Şahinəm, tarixə Şahin kimi həm düşməliyəm,
Mən nə Məcnun, nə Vərqa, nə də Sənan olmam.

*11.08.1997*

***

Hicrin qəmini kim ki çəkir, şad ola bilməz,
Sevda evi abad isə bərbad ola bilməz.

Ustadına şagirdlik edən şairə əhsən!
Xor baxsa kim ustadına ustad ola bilməz!

"Farsa, ərəbə sözlərini qatmasa şair..." *,
Türk isə o kəs türk dilinə yad ola bilməz.

Səhradə yatan hər kəsə Məcnun deməyirlər,
Hər dağ dağıdan kimsənə Fərhad ola bilməz.

Bir busə verib guya mənə mərhəmət etdin,
Bir damcı rəhmdən mənə imdad ola bilməz.

Kim söyləsə "var yerdə pərizad" elə inkar,
Səndən savayı yerdə pərizad ola bilməz.

Məcbur eləmə Şahini olmursa əsirin,
Bir kəs ki, əsir oldu, o, azad ola bilməz.

*5.08.1997*

***

Ad sahibi fazilsə, ad çıxmayacaq yaddan,
Ya cahilü qafilsə, iz qalmayacaq addan.

Selləndi zülüm, eyvah, dilləndi dilim, eyvah,
Bir kimsə deyil agah könlümdəki fəryaddan.

---

* Misra Şəhriyarındır.



Dünyadə bizə, yarım, Allah özü yar olsun,
Göz yummalı yardımdan, əl çəkməli imdaddan.

Təlqini ilə Qeysin səhradə məkan etdim,
Dağ çapmağı əxz etdim mın şövq ilə Fərhaddan.

"Əqlim nə qədər fənni öyrənmiş idi əvvəl,
Yar, eşqini öyrəndim, çıxdı hamısı yaddan" *.

Göylərdəmidir təkcə? Yox-yox, o pəriçöhrə
Yerlərdə pəri var ki, xəlq oldu pərizaddan.

Şahin, bizə həm bir gün ustad dedilər bəlkə,
Ustadlığın sirrin öyrənmişik ustaddan!

*26.08.1997*

***

*"Rəqibə etməliyəm qətlim üçün minnət mən,*
*Gör nə bədbəxtəm, əcəldən də gərək naz çəkəm"**.*

**Əhli Şirazi (XV-XVI əsrlər) Külliyyat**

*"İstərəm ölməyi mən, leyk qaçır məndən əcəl,*
*Gör nə bədbəxtəm, əcəldən də gərək naz çəkəm".*

**Mirzə Ələkbər Sabir**

Hövsələm olmasa da işvə görəm, naz çəkəm,
Mən gərək dərdini hərdən, a sərəfraz, çəkəm.

Çəkinib-eyləmə, öyrəncəliyəm, ey tale,
Mənə çox ver kədəri, istəmirəm az çəkəm.

Niyə gəlmir daha durna, neçə yaz ötdü... gərək
O qərib durnaların fikrini hər yaz çəkəm.

Basdı söz gülşənimi gərçi alağ hərdənbir,
O alağlarə gərək qeyz ilə dəryaz çəkəm.

---

* "Əqləm həme fənha ra araste bud əvvəl,
Çon eşqe-to bərxandəm, əz yad berəft anha"

*Mənsur Həllac*

** "Mennəte-qətl əz rəqibəm baz mibayəd keşid,
Bəxte-bəd bin k-əz əcəl həm naz mibayəd keşid"

Çəkdiyin möcüzədir fırça ilən, ey rəssam,
Mən gərək kəlmə ilə, söz ilə ecaz çəkəm.

Şahinəm bülbülə aşiq, bu məhəbbətlə gərək
O quşun hər oxuşundan neçə avaz çəkəm.

*16.09.1997*

***

*Ağəmi Buzovnalıya təzmin*

Busəni ki sevgili canan verir,
Sanki üzülmüş canıma can verir.

Öylə həkimanə verir məsləhət,
Sanki həkimdir, mənə dərman verir.

Yoxdu təbiətdə təsadüf-filan,
Həqq özü hər tədbirə fərman verir.

Kimsəni möhtac eləyir bir gülə,
Kimsəyə gülzar, gülüstan verir.

Fərhada dağ qismət edir - sıldırım,
Məcnuna səhra və biyaban verir.

Eh, kişi var gizlənir arvad kimi,
Amma Ərəbzəngiyə meydan verir.

Ərz elədim mən canı cananıma,
Söylədilər: - Şahinə bax, can verir.

*31.09.1997*

***

Mən məhəbbətdən əl üzməm, dərdimin dərmanıdır,
Aşiq olmaq, ey adamlar, Adəmin fərmanıdır.

Bir gözəldən zövq alıb min bir qəzəl nəzm etmişəm,
Nəşri baş tutsun gərək, "Min bir qəzəl" divanıdır.

Tanrısından qorxmayır Xankəndimin sakinləri,
Naşükür tüğyanıdır bu, naşükür üsyanıdır.

Bir müqəddəs meydanım var, səslərəm comərdləri,
Pəhləvan meydanıdır bu, qəhrəman meydanıdır.



Əzrayıl, mən uyğudaykən, gəldi canımçın, dedim:
- Bir canım var, vermirəm, get, yarımın qurbanıdır.

Çoxdur hicranım mənim, hərgah saysam dağ olar,
Çıxmayan bir ləhzə candan cananın hicranıdır.

Şahinəm, bir vaxt Füzuli oldu Məcnun, indi mən,
"Doğru derlər hər zaman bir aşiqin dövranıdır" *.

*14.11.1997*

***

Versə izn Həqq, səni ram eylərəm,
Günləri vəslinlə tamam eylərəm.

"Gərçi halaldır sənə qanım mənim,
Verməyəsən busə haram eylərəm" **.

Nisgilini, varsa, qoyub natamam,
Səndəki xoşbəxtliyi tam eylərəm.

Dil sənə bir dəm "xudahafiz" deməz,
Hey sənə icz ilə "salam" eylərəm.

Azca da qalmaz acılıq, tərk olar,
Sözlərimi püstə-badam eylərəm.

Olsaq əgər birgə, qiyamətdə də
Ayrılığa qarşı qiyam eylərəm.

Gərçi, gülüm, şahı pəsənd eyləməz,
Şahini sən şahə qulam eylərəm.

*16.11.1997*

---

* Misra Füzulinindir.

** "Gərçe həlal əst to-ra xune-mən,
Gər nədehi buse həramət konəm"
*Şeyx Əttar*

***

"Yarəb, ağzın püstəmi, ya qönçeyi-xəndanmıdır?
Ya Süleyman xatəmi, ya həqqeyi-Mərcanmıdır?" *

Elan etdik biz nəhayət müstəqillik şərtini,
Islah etmək nöqsanı, Tanrım, məgər nöqsanmıdır?

Söyləmişlər guya canan can alır, şəkkim böyük...
Söylə bir, gerçəkmidir bu, ya yarım, böhtanmıdır?

Mərhəmətmi, ya zülmkarlıqmı hakim qəlbinə?
Səndə bir ceyranmı yatmış, ya yatan qaplanmıdır?

Şah ikən dərviş təkin iqrarinə sadiq qalıb, **
Şah Xətaim bilmədim dərvişmi, ya sultanmıdır?

Hər yağan yağmur deyildir, hər vətəndaş daş deyil,
Hər bir insan bir adamdır, hər adam insanmıdır?

Söylədin sən Şahinə "divanə ol Məcnun kimi",
Bilmədim, canan, sözün xahişmidir, fərmanmıdır?

*20.11.1997*

***

Gözlər ki, o gözlərdən dostanə nəzər gözlər,
Məlum elədim mən ki, yox xeyri, hədər gözlər.

"Həqbin nəzər olmazsa, görməz məni bir kimsə,
Allahın üzün görməz xudbinsə əgər gözlər" ***.

Kiprik çəpərindən mən narazı qalan fərdəm,
Görməz bəbək üstündə gər görsə çəpər, gözlər.

Pərvanəsifət dönnəm şəmin başına, yansa!
Istər görə ol şəmi hər şamü səhər gözlər.

* Beyt Imadəddin Nəsiminindir.
** "Sadiq dərviş iqrarindən dönərmi"

*Şah Ismayıl Xətai*

*** "Həqbin nəzəri bayəd ta ruye-məra binəd,
Çeşmi ke, bovəd xodbin key ruye-xoda binəd?"

*Seyid Imadəddin Nəsimi*



Var ağu, şəkər yoxdur, şənlikdən əsər yoxdur,
Qəlbimdə təpər yoxdur, qəlb indi kədər gözlər.

Ümmidə inam itdi, az vardı, tamam itdi...
Yox faidəsi, gözlər gözlərsə, zərər gözlər.

Dilbərdi, xətərsizdi, dildarım idi, indi
Şahin o xətərsizdən hər ləhzə xətər gözlər.

*25.11.1997*

***

O qədər sirli qəzəl yazdı bu sirdaş adına,
Qəzəlim, ey gözəlim, layiq ola kaş adına.

Yox işi, yox peşəsi, şişəsi var əyyaşın,
Qoy lüğətlərdə də göz dəyməyə "əyyaş" adına.

"Isanın eşşəyini Məkkəyə gər gördərələr,
Yenə eşşək deyəcəklər qayıdan baş adına" *.

Nə bilirdim ki, nədir mərsiyə, dərdim yoxdu,
Yazmışam dərdə düşüb mərsiyə qardaş adına.

Zərgərəm, "Divan"ım içrə neçə daş-qaşım var,
Adi daş satmayıram mən sizə daş-qaş adına.

Səni sərməst eləyirlər, yatırırlar guya,
Ey uşaq, nəşə verirlər sənə xaşxaş adına.

Qələmim düşsün əlimdən yerə, Şahin Fazil,
Yazmasam gündə qəzəl mən o qələmqaş adına.

*27.11.1997*

***

Bəşərəm mən, bəşəriyyət şərəfim, şanımdır,
Əbədi səcdəgəhim Azəribaycanımdır.

Qan axıb köynəyimi bayrağa döndərmişdir,
Lalənin rəngi - hopan torpağa al qanımdır.

* "Xərə-Isa gərəş be Məkke bərənd,
Çon beyayəd hənuz xər başəd"

*Sədi "Gülüstan"*

"Bütün əğyarlərin ləğvi gərəkdir" deyirəm,
Bu da Aşiqbaşı tək növbəti fərmanımdır.

Saf qəzəllər yazan azdırsa da, safdır qəzəlim,
Bu mənim bəlkə də bir qətrədə ümmanımdır.

"Qaldı can, çəkdilər ol şuxun oxun cismimdən,
Öylə bildim ki, oxu qaldı, çıxan canımdır" *.

Şahina, can nədi Seyyid kimi qorxum, canımı
Verirəm sidq-ürəkdən yara, qurbanımdır.

*28.11.1997*

***

"Şəha, könlün həmişə biqəm olsun,
Əlində daima cami-Cəm olsun" **.

Neçin, Tanrım, kədər doğsun kədərdən?
Neçin, Yarəb, qəm üstündən qəm olsun?

Sevənlərdən zərərsiz kimsə yoxdur,
Sevənlər qoy şən olsun, xürrəm olsun.

Xəyanətlər yox olsun tüstülər tək,
Sədaqətlər poladdan möhkəm olsun.

Üzün yaş olmasın göz yaşlarından,
Gözün mən qoymaram, dilbər, nəm olsun.

Məhəbbətdən ölüncə dönmərəm mən,
Qoy əhvalın sənin xatircəm olsun.

Yaman qıtlıq var ölkəmdə, a Şahin,
Məhəbbət aclara qoy məlhəm olsun!

*14.12.1997*

* Beyt Seyid Əzim Şirvaninindir.
** Beyt Imadəddin Nəsiminindir.



***

"Kim var görəsən kuyinə yarın nəzər etsin,
Bu haləti-zarımdan onu baxəbər etsin" *.

Cananələri loğmana timsal eləyirlər,
Olmazmı gəlib dərdimə loğman nəzər etsin?

Tənha adamın günləri zəqqum misalı,
Zəqqumə dönən dəmləri gəlsin şəkər etsin.

Fəryadımı sanki eşidib gəldi nigarım,
Zənn eyləmirəm bir də yanımdan səfər etsin.

"Min bir gecə" dastanına dönməkdə həyatım,
Qoy carçı gedib aləmi bundan xəbər etsin.

Mən bir gecədə bir neçə min bir gecə gördüm,
Ey Tanrı, məhəbbət hamını bəxtəvər etsin.

Bir şəm yanırdı iki aşiqlə bərabər...
Şahin gecəni böyləcə hər gün səhər etsin.

*24.12.1997*

***

"Olur payan o dəm hicran rüxi-dildar görsənsin,
Təbibə ehtiyac ol vəqt olur bimar görsənsin"**.

Kələk qəsdində durmuşdur mənim bir naxələf qonşum...
Döyüşsün, haydı, Babək tək igidlər var, görsənsin.

Qan olmuşdur elin köksü, aman, cərrah gəlsin qoy,
Dağılmış yurdumun bağrı bu gün, memar görsənsin.

Çəmən güllərdən əlvandır, düzən güldən deyil xali,
Yoxumdur gül təmənnam, tək o gülrüxsar görsənsin.

Əlim qoynumda heykəl tək dayanmaqdan yoruldum mən,
Gözüm yollarda qalmışdır, görünmür yar, görsənsin.

* Beyt Məhəmmədəli Şəfainindir.
** Beyt Hacı Şıxəli Tutinindir.

Nə müddətdir sızıldar hər hüceyrəm yarə yetməkçin,
Üzüm solğun, sözüm küskün, gözüm bidar, görsənsin.

Ölüb Məcnun, itib Fərhad, mənim ömrüm də bitməkdə,
Hanı, Şahin təkin vardırsa bir sərdar görsənsin.

*25.12.1997*

***

*"Xanəgah caye-to vo xaneye-mey caye-mən əst,
Pir səccade tora dade vo zonnar məra"* *.

**Əfzələddin Xaqani**

Kiməsə çərxi-fələk dam dolusu var verib,
Sənə ilham, ona badə, mənəsə yar verib.

Mənə versəydi cəfakar cəfa, yanmazdım,
Neyləyim mən ki, cəfanı o cəfakar verib.

Tanrıdır memarı hər gördüyünün aləmdə,
Adəmə hər nə veribdirsə o memar verib.

Verib Isgəndərə güzgü və əsa Musayə,
Kimə şərbət, kimə şərbətdə zəhrmar verib.

Ulu Tanrı yetirib diqqətini nöqtəyə həm,
Nöqtəyə, dönmək üçün başinə, pərgar verib.

Rəbbimiz hər kəsə layiq olanı bəxş etmiş,
Kimə dar, kimsəyə dil, Şahinə dildar verib.

*6.01.1998*

***

*"Kədərindən olma razı, ürəyim xarab olsun
Və səbrkəsən hicrdən ciyərim kabab olsun"***.

**Nizami Gəncəvi**

Fərəhim ki, səndən idi, neçə yol əzabə döndü,
Daha qıyma, ey vəfalım, fərəhim əzab olsun.

Tək olub ziyan çəkdim, ziyanı yaman çəkdim,
Nə qədər, özün de, ey gül, mənə iztirab olsun?

* "Xanəgah oldu yerin, amma mənim - meyxanə,
Sənə səccadə verən kəs mənə zünnar verib"

** "Məgozar k-əz qəme-to dele-mən xərab gərdəd,
Ze fəraqe-səbrsuzət cegərəm kəbab gərdəd"



Ey, dilim, de, meypərəstə, mey evində gün keçirsək,
Mənə saqi qismət olsun, sənəsə şərab olsun.

Dönürəm günah əməldən, oluram səvab əhli,
Hər işim günəhdən ayrı, əməlim səvab olsun.

Nə qədər görüm riya, şər? Məni başə düşməyirlər...
Sənə üz tutum dəmadəm, sənə qoy xitab olsun.

Sənə, ey sərəfrazım, mən dilərəm ki, çox yazım mən,
Yeni yazdığım şerlər yeni bir kitab olsun.

Şahinəm, qəzəl nədir ki, yara bəlkə "Xəmsə" yazdım,
Mənə qüvvə versin Allah, ürəyimdə tab olsun.

*7.01.1998*

***

"Dur gəl yanıma, sevgili canan, ölürəm mən,
Cismimdən uzaq düşmədədir can, ölürəm mən" *.

Gəlsəydi, mənə əzrayılın rəhmi gələrdi,
Yoldan çıxarıbdır onu şeytan, ölürəm mən.

Canım sağ olan vaxtda loğman görünərdi,
Çoxdandı görünmür niyə loğman, ölürəm mən.

Bülbül kimi güldən-gülə şövq ilə qonardım,
Mənsiz qalacaq indi gülüstan, ölürəm mən.

Zər yığmağa iqdam elədim, olmadı qismət,
Yaqut, ölürəm mən, daha mərcan, ölürəm mən.

Can dərmanı lap olsa yarımcanə nə xeyri?
Təsir eləməz cismimə dərman, ölürəm mən.

Ilham pərisi, bir də yarımdır mənə canan,
Ah-vay edəcəkdir iki canan, ölürəm mən.

Dinməzcə qalıbsan yığılıb köksümə, ey ah,
Bəlli elə fəryadımı, pünhan ölürəm mən.

* Beyt Ələkbər Şahidindir.

Gündən-günə Qurana mənim rəğbətim artıb
Üstümdə oxunsun deyə Quran ölürəm mən.

Şahin, üyüdür insanı bir dən kimi dünya,
Fırlanmadadır hey bu dəyirman, ölürəm mən.

14.01.1998

***

*"Ağlamaqluq sənə hərçənd gərək kar olsun,*
*Ağlama böylə ki, əğyar xəbərdar olsun"*
**Hacı Əbülhəsən Raci**

Ev yıxan, ev dağıdan kəs həmişə xar olsun,
Əcəm olsun, ərəb olsun - təki memar olsun.

Söyürəm hicri ki hərdən, deyiləm təqsirkar,
Vəsli görsənməyən aşiq necə xummar olsun?

Sevənə ömr uzunu sevgili yar olsun yar,
Yara yar şəxsə Böyük Tanrı mədədkar olsun.

Arı yoxdursa da min bir üzü var əğyarın,
Elə "aşiqlik" edən arsıza qoy ar olsun.

Bağiban, aşiqi incitmə, gülüstanə burax,
Amma yanında gərək gül kimi dildar olsun.

Var şüarlar elə ki, adəmi bezdirmişdir,
Amma qoy eşq şüarı həmişə car olsun.

Olmasın dərdə giriftar, Ilahi, heç kim,
Hamı Şahin kimi qoy eşqə giriftar olsun!

15.01.1998

***

Yusifə bənzədəcəklər səni peyda edəni,
Mənə, yarım, eləmə sən də Züleyxa edəni.

Şəhəri tərk eləyib yandı yanar səhradə,
Xatirə salmadayam Məcnuna səhra edəni.

Çağlayıb qərq eləmişdi məni bir gün dərya,
Gözlərin etməyəcəkmi mənə dərya edəni?



Nəyə lazımdı küdurət, daha sülh eyləməli,
Söyəcəkdir bu qəzəl sahibi qovğa edəni.

"Ulu Allah əgər bir də mədəd eylərsə,
Başqa kəslər də edərlər o Məsiha edəni" *.

Bir mələk şerimi ifa elədi röyadə,
Axtarıb tapmalıyam mən onu ifa edəni.

Hazıram ölməyə hər ləhzə, cəhənnəm də belə
Şahina, etməyəcəkdir mənə dünya edəni.

17.01.1998

***

*"Cananıma can bəxş edirəm can gedir əldən,*
*Can qeydinə qaldıqdasa canan gedir əldən".*
**Əlibaba Məmmədov**

Canım tələf olmaqdadı, dərman gedir əldən,
Dərman gedirsə, deməli, can gedir əldən.

Sinnim qocalıq ilə cavanlıq arasında,
Əfsus, cavanlıq kimi imkan gedir əldən.

Gül vardı, çiçək vardı, gülüstan nə gözəldi!..
Gül soldu, çiçək yandı, gülüstan gedir əldən.

Məcnunin ahındanmı yanır torpağı böylə?
Bir gün görəcəklər Ərəbistan gedir əldən.

Ceyran göbəyindən əl atıb müşkü çıxardı,
Ovçu niyə rəhm etmədi, ceyran gedir əldən.

Bir dəfə gəlib şad eləmişdi məni hicran,
Şadəm nə qədər mən yenə, hicran gedir əldən.

Şəkk eyləməsinlər, canım əldən gedəcəkdir,
Canan, desələr gər mənə "canan gedir əldən".

* "Feyze-ruhülqüds ər baz mədəd fərmayəd,
Digəran həm bekonənd an çe Məsiha mikərd"
*Hafiz Şirazi*

Bilsəydi əcəl qurbanınam rəhmi gələrdi,
Sən Şahini bərk saxla ki, qurban gedir əldən.

20.01.1998

***

Gətir, saqi, gətir gülrəng şərab ahəstə-ahəstə,
Edərsəm nuş itər məndən əzab ahəstə-ahəstə.

Mələklər çiynim üstündə, cəfalər göz qabağında,
Bütün bunlar olunmaqda hesab ahəstə-ahəstə.

Gedənlər getdilər, yaddan çıxarma, fanidir dünya,
Nə bir taqət qalır canda, nə tab ahəstə-ahəstə.

Gülün solmaqdadır, bağban, gülab qurtardı, qurtardı,
Gül olmazsa əgər, qalmaz gülab ahəstə-ahəstə.

"Sarayın sahibi yoxsa, demək memarı həm yoxdur,
Olar faydası yox bir qəlb xarab ahəstə-ahəstə" *.

Birinci "Divan"ım bitdi, ikinci "Divan" hazırdır,
Şükür, Şahin, çıxır bir-bir kitab ahəstə-ahəstə.

24.01.1998

***

*"İstəsən könlüm kimi zülfün pərişan olmasın,*
*Ol qədr cövr et mənə ah etmək imkan olmasın"*
**Mirzə Ələkbər Sabir**

Ya İlahi, öylə et yurdumda əfğan olmasın,
Qoy mənim Azər diyarım əfğanıstan olmasın.

"Dərd var - dərman da vardır" söyləyirlər çox zaman,
Ya İlahi, qorxuram ki, dərdə dərman olmasın.

Ya İlahi, düşmənim vardır mənim şeytansifət,
Ya İlahi, şeytana heç yanda meydan olmasın.

Ya İlahi, bezmişik pis niyyətindən yağının,
Qoy həqiqət bəlli olsun, qoyma, böhtan olmasın.

* "Sərayi ra ke, sahib nist, vey ra nist memarəş,
Dele-bieşq migərdəd xərab ahəste-ahəste"
*Saib Təbrizi*



Ya İlahi, ac xəmirdən yoğrulubdur kündəsi,
Qoy ədunun xisləti aləmdə pünhan olmasın.

Ya İlahi, doğruluq, düzlük yar olsun aləmə,
Əyri məslək, əyri qayə, əyri vicdan olmasın.

Ya İlahi, "Ya İlahi..." söyləyir Şahin müdam,
"Ya İlahi..." söyləyən kəslər pərişan olmasın.

25.01.1998

***

*"Məni Seyyid təki çək guşeyi-meyxanələrə,*
*Artırır qəm, dəxi məsciddə nəyim var mənim?"*
**Seyid Əzim Şirvani**

Bilmisən dərdimi, ey gül, sənə tən görməmişəm,
Sən kimi heç kimi mən dərd bilən görməmişəm.

Demə meyxanədə, ey şeyx, zərər görmüşsən,
Sən görübsənsə, özün bil, onu mən görməmişəm.

Yağmasın dərd yağışı qəm buludundan bir dəm,
Şad olaq daima, şənlikdən ölən görməmişəm.

Tərtəmiz sevgi məkanında duman görsənmir,
Saf məhəbbət dağı üstdə hələ çən görməmişəm.

Bölünürsə əgər eşq, eşq deyildir gerçək,
Hər şeyi bölmək olar, eşqi bölən görməmişəm.

Bu nə matəm, nə hüzndür, nə kədərdir səndə?
Zahida, öl kədərindən, səni şən görməmişəm.

Artırır qəmləri məscid, oradır qəmxanə,
Şahina, mən hələ məsciddə gülən görməmişəm.

30.01.1998

***

"Məclisdə şəm yandı, pərvanələr yığılsın" *,
Dürrün başına bir-bir dürdanələr yığılsın.

Bülbül təkin qonardım güldən-gülə mən aşiq.
"Ey saqi, - söyləyərdim, - cananələr yığılsın" **.

Aşina məclisində biganələr nə lazım?
Təmənna etməz idin biganələr yığılsın.

Badəylə məst olanlar məstanədirmi, ey dost,
Məstin kamalı olmaz, məstanələr yığılsın.

Meydən nə fayda vardır, bundan belə, a saqi,
Qoy badələr qırılsın, peymanələr yığılsın.

Əğyarı qoyma gəlsin, Nofəl, təşəbbüs et ki,
Mərdanələr yanında mərdanələr yığılsın.

Ey Şahin, əqlin olsun, məclisdə Qeysə bənzər
Divanələr görünmür, divanələr yığılsın.

*17.02.1998*

***

"Maili-sərvi-qədin olmasam hərgah sənin,
Necə sirrindən olardım bu gün agah sənin?" ***

Sənlə əhd eylədiyim gün ki, avand oldu işim,
İşini gündə avand eyləsin Allah sənin.

Bürüyübdür səni eşqim elə başdan-ayağa
Ki, daha qəlbinə yol tapmayacaq ah sənin.

Ölürük bir-birimizçin, yaşasın böylə ölüm!
O, bizim qismətimiz, gah mənim, gah sənin.

Gözəlim, Yer kürəsi adlı gülüstan içrə
Hər gülün öz yeri var, var yerin illah sənin.

* Misra Mir Haşım Müsafirindir.

** Misra Rüstəm Samitindir.

*** Beyt Məhəmməd Füzulinindir.



Oldu Fərhad ilə Xosrov, sanıram məndə əyan,
Dağçapan indi sənin, ey Şirinim, şah sənin.

Şahinin hər nəyi vardırsa sənindir şəksiz,
Gəl göz üstündə qərar et, bu qərargah sənin.

*27.02.1998*

***

*"Bildir imanımı bir busəyə aldın, küsdün,*
*Bu il al canımı bildirki ziyanın çıxsın"*
**Hacı Əbülhəsən Raci**

Ey könül, ah elə çək ərşə fəğanın çıxsın,
Yenə şad etmədi zənnin səni, canın çıxsın.

Yürü Xankəndinə, dad et ki, "Pənah xan harada?"
Tərpənib qoy məzarından çölə xanın çıxsın.

Ey qəzəlxan, el uğrunda yapış qalxandan,
Meydana sən təki minlərlə cavanın çıxsın.

Dəyənəkdən də yapışmaq, silah olmazsa, olar,
Minərək atlara gəncin, qocamanın çıxsın.

Bir zamanlar İrəvan torpağı məskəndi sənə *,
Razı oldun niyə əldən İrəvanın çıxsın?

Sən bu çəndən, bu dumandan daha bezdin, bəsdir,
Aradan çən götürülsün və dumanın çıxsın!

Şah baban İsmayılın vaxtı kamanın vardı,
Şahina, hər yanı axtar o kamanın çıxsın.

*15.03.1998*

***

"Yarəb, kərəm et, ol büti-mehparə qayıtsın,
Bir rəhm eləsin bu dili-bimarə qayıtsın" **.

Bilmirmi məgər yar qərarında cəfa var,
İnsafü mürüvvət o cəfakarə qayıtsın.

* XVI-XVIII əsrlərdə İrəvan (Rəvan, Çuxur-Səd) vilayəti azərbaycanlı hakimlər tərəfindən idarə olunur və Səfəvilərin hakimiyyəti altında idi.

** Beyt Heyran xanımındır.

Qeyb eyləyən ahusini Qoşqar dağıyam mən,
Ahuyə deyin qoy yenə Qoşqarə qayıtsın.

Sındırmış idim könlünü mən bilməyərəkdən,
Xoş sözlərimiz qoy təzədən yarə qayıtsın.

Dərdim görünür, çarəm isə yoxdu, görünmür,
Qoy yar qayıtsın ki, mənə çarə qayıtsın.

Var öylə kişi rəng yaxır saçına, mənsə
Cəhd eyləmirəm saçlarıma qarə qayıtsın.

Mən bağiban oldum, daha yox bağın alağı,
Bülbül uçuban qoy yenə gülzarə qayıtsın.

Abad eləmişdim o bütün könlünü, Şahin,
Qüvvət yenə qoy mən kimi memarə qayıtsın.

*18.03.1998*

***

"Saqi, xumari-eşqəm, bir mey gətir, amandır,
Həsrət və intizarəm, halım yenə yamandır" *.

Gün gizlənib gözümdən, göylərdə qarə pərdə,
Bağlar başı buluddur, dağlar başı dumandır.

Ey bağiban, bağında dünya kimi ədl yox,
Gül var - tikanla birgə, bülbülsə bağrıqandır.

Hər dəm hədərmi ötmüş, hər ləhzə boşmu keçmiş?
Hər dəm sınağə bənzər, hər ləhzə imtahandır.

Cövr eylədikcə hicran vəslin bilindi qədri,
Billah, yaxşıdır ki, hicranımız yamandır.

Hər şəxsə tövbə vacib! Kim var günahı yoxdur?
Çıxmaqsa niyyət ərşə, hər tövbə nərdivandır.

Eşq atəşində yandı, şöhrət qazandı Şahin,
Var xeyri, kim deyir ki, eşq atəşi ziyandır.

*19.03.1998*

* Beyt Hökümə Büllurinindir.



***

"Dil ki, el təngə gəlib ahü nəvasından onun,
Bixəbərdir yəqin eşq içrə cəfasından onun" *.

Bəxtiağ insana öz lütfünü bildirmiş Rəbb,
Xəbəri varmı görən bəxti qərasından onun?

Çoxuna zövq verir sevgili yarın nazı,
Mənsə həzz almadayam cövrü cəfasından onun.

Niyə ardımca deyinməkdədi hərdən zahid?
Yaradan hifz eləsin qəlbi bəlasından onun.

Şerimin təkcə əruzmu mənə ilham verəni?
Alıram qüvvətimi həm də hecasından onun.

Nur səpir haqq kəsə Həqqin günəşi, ey Şahin,
Düşə kaş üstümə bir zərrə ziyasından onun.

*20.03.1998*

***

"Nə bu gün bağdə yarım, nə meyim var mənim,
Seyri-gülzardə bihudə nəyim var mənim?" **

Sən məgər verməyə qəm qeyri sevən tapmırsan?
Ulu Allahıma hərdən gileyim var mənim.

Üz tutub dağə əgər ah eləsəm dağ dağılar,
Etmirəm ah, deyərlər kələyim var mənim.

Çox "mənəm" söyləyənin mən qolunu qatlamışam,
Bəlli olsun ki, bükülməz biləyim var mənim.

Inana bilməyirəm göydə mələklər vardır,
Amma, ilham pərisi tək mələyim var mənim.

Sən get, ey meyxanaçı, saqi ilən birlikdə
Badəni bağə aparmaq diləyim var mənim.

* Beyt Ənvər Nəzərlinindir.
** Beyt Seyid Əzim Şirvaninindir.

Şahina, əldə qələmdirmi, ləlәkdir yoxsa?
Durnadan bir lələk aldım, lələyim var mənim.

*24.04.1998*

***

*"Qazaram sinəmi dırnaq ilə şirin-şirin"*
**Hacı Əbülhəsən Raci**

Ixtilat eyləsə qorxaq ilə şirin-şirin,
Deşərəm mən dili sancaq ilə şirin-şirin.

Yetirib gül, becərib gül, suvarıb gülzarı,
Girmişəm sazişə torpaq ilə şirin-şirin.

Belə mən qurban olum bağbana bağdan ötəri,
Yenə söhbət eləyir bağ ilə şirin-şirin.

Mən Süleyman kimi hətta bilirəm quş dili də,
Edirəm söhbəti yarpaq ilə şirin-şirin.

Meyi tərk eyləmişəm birkərəlik, bir vaxtlar
Nuş edərdim meyi bardağ ilə şirin-şirin.

Başlanıb indi bizim növrağımız, dildarım,
Necəsən sən belə növrağ ilə şirin-şirin?

Aslanın yox dişisi-erkəyi, dönsəm səndən,
Aslanım, boğ məni caynağ ilə şirin-şirin.

Bir igid qazdı külüng ilə dağın sinəsini,
Qazaram mən dağı dırnaq ilə şirin-şirin.

Indi Fərhad mənəm, amma dağım Şahdağdır,
Başlaram mərəkəyə dağ ilə şirin-şirin.

Inci tək saf qəzəlin bir yeni bayraqdarıyam,
Ömr elə, Şahina, bayraq ilə şirin-şirin.

*25.04.1998*



***

*"Möcüzati-həme peyğəmbər olub məndə əyan"*
**Əbülqasim Nəbati**

Saf qəzəllər kimi nadir zər olub məndə əyan,
Elə saflaşmadayam cövhər olub məndə əyan.

Mənəm "Ağlar-güləyən" şəxsi bu gün dövranın,
Sabiri-Mirzə Əli Əkbər olub məndə əyan.

Qəzəlim var ki, qəzəl mücrüsünün gövhəridir,
Oxusunlar məni, çox gövhər olub məndə əyan.

Leylican, fəxr edirəm, mən təzə Məcnun kimiyəm,
Ey Nüşabəm, yeni Isgəndər olub məndə əyan.

Istərəm əzm eləyim mən də bu günlər cəngə,
Qarabağ mülkü üçün əsgər olub məndə əyan.

Şəhid olmaq diləərəm mən də, görərlər bir gün
Saplanıb köksümə bir xəncər - olub məndə əyan.

Düzürəm sözləri zərgər sayağı, ey Şahin,
Neçə müddətdi ki, bir zərgər olub məndə əyan.

*30.04.1998*

***

*"Mehri könlümdə nihan olduğun ol mah bilir,*
*Kimsə bilməz, füqəra sirri-dilin şah bilir"*
**Məhəmməd Füzuli**

Dönürəm yurduma! Yarım məni səyyah bilir,
Gah bilmir necə həsrət çəkirəm, gah bilir.

Bilənə bəllidi dərvişliyimiz, bilməyənə
Bəlli olsun ki, bu dərviş özünü şah bilir.

Üzmürəm gülləri qürbətdəki gülzardə də,
Məni qürbətdə də hər şəxs xeyirxah bilir.

Dərdimizdən hələlik hali olan kəs yoxdur,
Dərdliyik, dərdimizi çəkdiyimiz ah bilir.

Ölkəmi böldülər, amma calamırlar qəsdən,
Bu qəzəlxan elə adəmləri bədxah bilir.

Öylə arif adamam heç nə gözümdən qaçmır,
Söyləyənlər mənə arif məni agah bilir.

Yaxşı öyrən bu günün işlərini, ey Şahin,
Gələcəkdə olası işləri Allah bilir.

*1.05.1998*

***

Üzüm gülmür, nə müddətdir, çəmən məhzun, mən məhzun,
Çiçək məhzun, mixək məhzun, süsən məhzun, mən məhzun.

Qızılgüllər görünmür qırmızı, solğunlaşıb lalə,
O şux nərgiz, qərənfil, yasəmən məhzun, mən məhzun.

Ətirşahdan ətir gəlmir qətiyyən, ətri qeyb olmuş,
Olub pəjmürdəhalət nəstərən məhzun, mən məhzun.

Edib basqın rəzil qonşum, bu bağ qəmgin, bu dağ qəmgin,
Bu çöl məhzun, bu düz məhzun, düzən məhzun, mən məhzun.

Bizi istiqlala həsrət qoyanlar var, xar olsun,
Vətən, cummuş bəla sürətlə, sən məhzun, mən məhzun.

"Ölürsəm görmədən millətdə ümmid etdiyim feyzi,
Yazılsın səngi-qəbrimdə: Vətən məhzun, mən məhzun".*

Bu dünyadən köçüb narazı getsəm, seyr edər ruhim
A Şahin, mafə məhzundur, kəfən məhzun, mən məhzun.

*13.05.1998*

***

*"Məst olmadığım dəm yox idi dəhrdə bir gün,*
*Səd heyf, ölən vəqtdə hüşyar ölürəm mən"*

**Seyid Əzim Şirvani**

Ərz eyləyirəm ah ilə, ey yar, ölürəm mən,
Ərzim sənə çatsın açıq-aşkar, ölürəm mən.

Bir kimsəyə zar olmağı qıymazdım, əzizim,
Kor bəxtimə bax, indi olub zar ölürəm mən.

* Beyt türk şairi Namiq Kamalındır.



Saf dilli qəzəl mülkümüzün sərvəri idim,
Saf dillilərə eyləyələr car ölürəm mən.

Eşq ordusunun başçısı oldum neçə müddət,
Məndən sora kimdir yeni sərdar, ölürəm mən.

Dərd əhlinə şer ilə dilərdim ola çarə,
Bundan belə yox çarə ki, naçar ölürəm mən.

Qəmlər ki çəkirdim onu Şahdağ çəkə bilməz,
Bir gör nə ağırlıqda yüküm var, ölürəm mən.

Çox keçdi günüm yardən ayrı neçə eldə,
Şahin, bu günəhdirsə, günəhkar ölürəm mən.

*15.05.1998*

***

"Sənsən sevərim, xahi inan, xahi inanma,
Qandır ciyərim, xahi inan, xahi inanma" *.

Səndən savayı qeyri mələkmənzərə bir dəm
Düşməz nəzərim, xahi inan, xahi inanma.

Dünyadə məgər varmı sənin tək yenə dilbər?
Yoxdur xəbərim, xahi inan, xahi inanma.

Xainlərə üsyan eləyən mən Nəbi olsam,
Sənsən Həcərim, xahi inan, xahi inanma.

Busən nə şirindir, şəkərim, busələrindən
Artıb şəkərim, xahi inan, xahi inanma.

Sənsiz, gəl inan, qalmadı cismimdə səfərdə
Tabım-təpərim, xahi inan, xahi inanma.

Qoymaz səni tənha, daha Şahin səfər etməz,
Olmaz səfərim, xahi inan, xahi inanma.

*27.05.1998*

* Beyt özbək şairi, Əlişir Nəvainin ustadı Mövlana Lütfinindir (XIV əsrin ortaları - XV əsr).

***

Şerimin mövzusu daim eşq olubdur, yar olub,
Ey pəri, qəlbimdə od var, baxma zülfüm qar olub.

Aşiq olmuşlar səfində mən də bayraq tutmuşam,
Kimdə eşqin bayrağı var isə bayraqdar olub.

Məcnunu məşhur edib, əlbəttə ki, divanəlik,
Xeyli şadəm məndə həm divanəlik izhar olub.

"Göz pərişan, sinə büryan, qəlb qan, can müztərib,
Şükrlillah kim, xudadan istəyim bunlar olub" *.

Varlığında yoxluğu zahir olan adəm nə çox,
Yoxluğundan sonra, xoşbəxtdir o kəs ki, var olub.

Bir sözü hər ləhzə təkrar eyləmək eyb eyləməz -
Qəlbimizdə "Qülhüvallah" kəlməsi təkrar olub.

Sevgiyə kəc baxma, ey zahid, oxu hər şerimi,
Eşqi inkar eyləyən kəs hər zaman inkar olub.

Viran oldu qəsri eşqin, niyyətim təmirdir,
Şahinə şair demə, alim demə, memar olub.

*4.06.1998*

***

Bu misranı Məmaidən ** çevircək öylə zar oldum:
"Əsiri-qeydi-zənciri-səri-zülfi-nigar oldum".

Nədir bilməm "qarışmış muyi-dərdim şanələr açmaz" ***,
Qəlizdil şairə əğyar olub bezdim, bezar oldum.

---

* "Dide gıryan, sine suzan, del təpan, can moztəreb,
Şükrlilləh, yaftəm anc əz xoda mixastəm".

*Rəziəddin Ərtimani*

** Məmo bəy Məmai - XIX əsr Azərbaycan şairi ("Təzkireyi-Nəvvab", Bakı, 1998, səh.231)

*** Arif Buzovnalı. Ömrün ötən anları, Bakı, 1999, səh.14



"Mən etdim şöleyi-ahımla rövşən rahi-səhranı" *,
Qərarım getdi əldən, yox qərarım, biqərar oldum.

"O bakir nuri-çeşmində müəlla asiman gördüm" **,
Olub hüşyar gənc ikən bu sözlərdən kənar oldum.

"Ötür bülbül ki, aşiq olduğun gül nalədən bilsin" ***,
Oxurkən Ənvərin misrasını məstü xumar oldum.

Süleyman Rüstəmin, Mir Mehdinin ardınca at sürdüm
Və Vahid, Şəhriyar ilən qəzəldə həmqatar oldum.

Qəzəlxanlar qəliz yazmaq ilən bədbəxt olurlarsa,
Mən isə, Şahına, sadə sözümlən bəxtiyar oldum.

*10.06.1998*

***

"Nə müddətdir ki, qürbətdə gəzib yaxşı-yaman gördüm,
Məhəbbət toxmunu əkdim, cəfa çəkdim, ziyan gördüm" ****.

Vətəndən bir qərib quş tək çox illər ayrı düşsəm də,
Həmişə ilhamım coşğun və təbim hey rəvan, gördüm.

Mən ustadlıq təmənna eyləyən şagird olub, daim
Mətin çıxdım sınaqdan, çox sınaq, çox imtahan gördüm.

Cavanlıq vaxtı düşdüm qürbət ardınca, yanıldım çox,
Sanırdım şahlığı quşdur, baxıb amma ilan gördüm.

Müxənnəs, nanəcib bir qonşuya yer verdim, ondansa
Bıçaq gördüm, əmud gördüm, qılınc gördüm, kaman gördüm.

Qurultaylar... Beşilliklər... Yarışlar... "Möhkəm" addımlar...
Umarkən doğru-düzgün məlumat, heyfa, yalan gördüm.

Səsim çox gəldi qürbətdən, qocaldım, ey cavan Şahin,
Nə könlüm arxayınlaşdı, nə qəlbi şadiman gördüm.

*12.06.1998*

---

* Hacı Ələmdar Mahir. Səadət intizarında, Bakı, 1998, səh.187

** Əliağa Bakir. Eşq ilə gülmüş təbiət, Bakı, 1990, səh.26

*** Ənvər Nəzərli. Məhəbbət gülşəni-həsrət çələngi, Bakı, 1998, səh.169

**** Beyt Mir Mehdi Xəzaninindir (XIX əsr)

***

Bu gün qəlbimdə illərlə tutan yer həmdəmim gəldi,
Sevincim məndən əl çəkdi, ayaq açdı qəmim gəldi.

Həzin qəlbimdə gizlincə fərəh girmişdi bir küncə,
Fərəhdən - məhrəm olmazdı, qəmimdir məhrəmim, gəldi.

Qəmimlə, ey təbib, hər dəm xoşam arif adamlar tək,
Sənin çarən köməksizdir, mənim öz məlhəmim gəldi.

"Vəzirimdir qəmü qüssə, oturmuş ikki yanımda" *,
Nə şahanə büsatım var, nə göyçək aləmim gəldi.

Bəşər fəryad içində inlər ikən həzzə hacət yox,
Tükənmir gözdə nəm, Şahin, qəm üstündən qəmim gəldi.

*15.06.1998*

***

Hey yanır... pərvanə gəlmir... az qalıb qurtarə şəm...
Tapmadan bir qeyri çarə ağlayır biçarə şəm.

Şəm yoxkən bir zamanlar, zülmət eylərdi qiyam,
Başlayıbdır zülməti çoxdan bəri inkarə şəm.

Zil qaranlıq şairi qorxutmayır, daim yazır,
Axşam olcaq amma yandırmaq gərək memarə şəm.

Məğzi yandıqca, müdam axmaqdadır göz yaşları,
Şəm - tək, pərvanə - çoxdur, neyləsin biçarə şəm?

"Rövşən etdim qəlbi-zarı ahi-atəşbar ilən,
Yandırarlar qəm yatağında yatan bimarə şəm" **.

Gün çıxanda şəm sönər, yar çöhrəsi hər dəm yanar...
Qibtə eylər, Şahina, hər dəm o şəm rüxsarə şəm.

*25.06.1998*

* Misra Şah İsmayıl Xətainindir.
** Beyt Ələmdar Mahirindir.



***

*"Tərğibi-vüsal eyləmə bixud məni, ey məh,*
*Müştaqi-fəraqəm, mənə didar nə lazım?"*
*Ağadadaş Sürəyya - "Məcməüş-şüəra" ədəbi məclisinin katibi (XIX əsrin sonu)*

Sevdanı şüar etməyənə yar nə lazım?
Dil zar olacaqsa, daha dildar nə lazım?

Eşq ordusunun başçısı, ey Qeys, özünsən,
Eşq ordusuna bir yeni sərdar nə lazım?

Əğyar güman etməli yavd sözləri dildə,
Yar var isə, yar yar isə, əğyar nə lazım?

Var kəlmə gərək min kərə təkrar edəsən sən,
Var kəlmə onu bir daha təkrar nə lazım?

Cəh-cəh vura söz bülbülü söz gülşəni içrə,
Yoxdursa əgər gülşəni gülzar nə lazım?

Dil saflığı lazımdı qəzəllərdə sədəf tək,
Düz məsələdir bu, dəxi israr nə lazım?

Qoy şeri də, Şahin, dilimizçin yaradaq biz,
Təsdiq gərəkdir buna, inkar nə lazım?

*29.06.1998*

***

"Bu cəhani dolanıb əhli-kəmal axtarıram,
Bülbüli-vadiyi-eşqəm pərü bal axtarıram" *.

Mən xəyalən o gözəl dilbəri görmək dilədim,
Hara yollandı xəyalım ki, xəyal axtarıram.

Göydə ulduz gözə dəymirsə, heç əqlim varmı
Ki, dikib gözlərimi ərşə hilal axtarıram.

O qara gözlü gözəllər məni haldan salmış,
Mən bu üzgün canım içrə yenə hal axtarıram.

* Beyt Əliqulu Səbahinindir.

Yadə gəldikcə o dəmlər ölürəm dərdimdən,
Uğurum olmayacaqdırsa məlal axtarıram.

O nə baldır dodağında, bal əlimdən çıxdı,
"O nə xaldır yanağında", yenə xal axtarıram.

Vermisən nazını hər gün mənə zənbil-zənbil,
Qəmzəni yığmağa, ey yar, çuval axtarıram.

Daha bəsdir, məni göynətdi bu təklik, bezdim,
Şahina, qovlayıram hicri, vüsal axtarıram.

*1.07.1998*

***

"Eşqüvə, ey nigar, möhtacəm" *,
Onu ver yadigar, möhtacəm.

Nəzərim hər zaman yol gözlər,
Çəkirəm intizar, möhtacəm.

Etina, etina hər ləhzə,
Etibar, etibar, möhtacəm.

Mən qulam, mən - qulam, mən - bəndə,
Sənə, ey şəhriyar, möhtacəm.

Olaram bəxtiyar eşqinlə,
Məni et bəxtiyar, möhtacəm.

Varlığım tək sənin hökmündə
Gözəlim, ver qərar, möhtacəm.

Şahinə ülvi eşq lütf eylə,
Ulu Pərvərdigar, möhtacəm!

*2.07.1998*

***

Yeri ev yox, bağ olar dərvişin,
"Töhfəsi yarpaq olar dərvişin" **.

Yorğanı göydə buluddur varsa,
Döşəyi torpaq olar dərvişin.

Elə zənn eyləməyin yoxsulluq
Köksü içrə dağ olar dərvişin.

Ələmi, kəşkülü var, sırğa taxar...
Silahı toxmaq olar dərvişin.

Meylini, mehrini salmaz yarə,
Qarə zülfü ağ olar dərvişin.

Heç güman eyləmirəm bir kimsə
Qəminə ortağ olar dərvişin.

Varı yoxdur, yoxu var, çox vədə
Bədəni çılpaq olar dərvişin.

Söyləmişlər nə səlis, ey Şahin:
"Töhfəsi yarpaq olar dərvişin".

*3.07.1998*

***

"Nə işim vardı mənim seyri-gülüstanə gedim?" *
Etmədən təklifimi sevgili cananə gedim?

Başa düşdüm ki, yanıldım, başıma daş düşsün,
Nə gərək seyrə o gülsüz, nə də seyranə gedim.

Qələt etsəm təzədən öylecə mən, onda gərək
Oluban cismimə yaği vurub od canə, gedim.

Mən gərək sevgili dildar ilə bundan sonra
Olaraq qolboyun, əlbət, yenə məstanə gedim.

Nə səbəbdən tək olum quli-biyaban sayağı?
Nəyə lazım ki, olub sevgiyə biganə gedim?

Gözəlim, incimisən haqlı yerə, əfv eylə,
Rəhm elə, Qeys kimi yoxsa biyabanə gedim?

Xəstələndikdə sənin vəslin idi dərmanım,
Qapına gündə sənin, ey pəri, dərmanə gedim.

---

* Misra Seyid Əzim Şirvaninindir.
** Bərge-səbzist töhfeyi-dərviş"
Fars zərbül-məsəli

* Misra Seyid Əbülqasim Nəbatinindir.

Etmişəm əhd ki, mərdanə olub hər vədə
Lap ölüm gəlsə belə, Şahina, mərdanə gedim.

*23.08.1998*

***

*"Yoxdu bir kimsə məgər dərdimi bilsin, yarəb?*
*Ki, mən öz qanım ilə dərdimə dərman etdim"*
*Xurşidbanu Natəvan*

Nə o cananımı vəslimlə xuraman etdim,
Nə də hicranımı öldürməyə imkan etdim.

Bəxtimin güzgüsü, eyvah, ciladən düşmüş,
Neçin, ey çərxi-fələk, söylə nə nöqsan etdim?

Hər nə verdinsə mənə bir-bir əlimdən çıxdı,
Hər nəyim vardı əlimdə sənə qurban etdim.

Yoxmu bir çarə ki, biçarə ürək dinc olsun?
Vaxt olar bəlkə pərişanlığımı yan etdim.

Isti bir ah çəkib Məcnuna döndüm bəlkə,
Azəri yurdunu bir gün Ərəbistan etdim.

Nə şikayətdi bu, yarəb, belə dolmuş qəlbə?
Acı fəryad ilə hər fərdi pərişan etdim.

Şahina, dərdimi bir gün görərəm yandırdım
Və qaranlıqda qalan könlü çıraqban etdim.

*24.08.1998*

***

*"Parə-parə ciyərim şişə çəkib etdi kəbab,*
*Dikdi göz dideyi-giryanıma göyçək-göyçək"*
**Seyid Əbülqasim Nəbati**

Bildirib eşqimi cananıma göyçək-göyçək,
Elədim dəvət onu yanıma göyçək-göyçək.

Acı dəmlər o saat bitdi, şirinlik çökdü
Evimə, bağçama, eyvanıma göyçək-göyçək.

Elə sandım ki, Ərəbzəngi gəlib əldə çiçək
Yaraşıq verməyə meydanıma göyçək-göyçək.



Artırıb şənliyimi şövq ilə nikbin-nikbin,
Nöqtə qoydu mənim əfğanıma göyçək-göyçək.

Bəzi bihudə əməldən məni məhrum eləyib
Meyi doldurmadı fincanıma göyçək-göyçək.

Babadanqalma gümüş müştüyümü sındırdı,
Tütünü tökmədi qəlyanıma göyçək-göyçək.

Onu hər ləhzə sıxıb bağrıma oldum sərməst,
Etiraz etmədi imkanıma göyçək-göyçək.

Dedim: - Hökm eylə ki, Şahin sənə qurban olsun!
- Qurbanam, - söylədi, - qurbanıma göyçək-göyçək.

*27.08.1998*

***

Bir qəzəlxan tək sözüm çoxdur, əyan etmək gərək,
Şerimin ecazını hökmən bəyan etmək gərək.

Yad sözü bir-bir dilimdən dartıram nəqqaş tək,
Şerdən yad kəlməni, əlbəttə, yan etmək gərək.

Sadə yazsın hər qəzəlxan, olmasın qoy nagüman,
Nagümanlıq bədgümanlıqdır güman etmək gərək.

Eşqi duymaq, eşqə düşmək, aşiq olmaq - qayədir,
Aşiq olmaqdan ziyan etsək ziyan etmək gərək.

"Yaxşı gündə bilmək olmaz kim, dəyanət kimdədir,
Yaxşı yoldaşı yaman gün imtahan etmək gərək"*.

Yarımın ilham pərimlə hər zaman qovğası var,
Onları bir yol tapıb tez şadiman etmək gərək.

Mehriban, Şahin, mənə həm yar, həm ilham pərim,
Mehribanı mehribanə mehriban etmək gərək.

*1.09.1998*

* Beyt Nişat Şirvaninindir.

***

*"Dedüm: - Al nəqdi-canın Racinin, bir busə lütf eylə,*
*Dedi: - Çoxdur bu sevdadə ziyan, vallahi-billahi"*
**Hacı Əbülhəsən Raci**

Gülüm, sənsiz mənə yoxdur məkan, vallahi-billahi,
Əgər gəlsən gedər hicran o an, vallahi-billahi.

Üzümdən zəhrmar yağmaqdadır, həzzim bitib sənsiz,
Görən yoxdur olum mən şadiman, vallahi-billahi.

Xilas olmuş cahan "şura" şərindən, hey deyərdim ki,
Xilas olmaz əzabından cahan, vallahi-billahi.

Böyük Şah Ismayıldan təlim aldım hərb dərsində,
Mənəm Xosrov təkin bir hökmran, vallahi-billahi.

Saçım ağ surətindən ağsa da, bundan məhəbbətdə
Zərər yoxdur, xətər yox, yox ziyan, vallahi-billahi.

Məgər qəlbimdəki oddan xəbərdar çoxmu dilbər var?
Məni sən tək, inan, olmaz duyan, vallahi-billahi.

Fərağından əzilmişdir, üzülmüşdür, qocalmışdır,
Əgər gəlsən, olar Şahin cavan, vallahi-billahi.

*29.09.1998*

***

Həşrədək qəlbim içində o gülün nisgili var,
Ahımın şiddəti artıb, bəmi yoxdur, zili var.

Ahımın ömrü bir anlıq deyil imiş, əfsus,
Günü var, həftəsi vardır, ayı vardır, ili var.

Nə qədər sevgi var isə sevən adəmlərdə
Bu fəna aləm içində o qədər sevgili var.

"Heç qıfıl özgə açar ilə açılmaz əsla,
Hər dilin öz qulağı, hər qulağın öz dili var" *.

* "Hiç qofli ze kelide-degəri va nəşəvəd,
Hər zəban guşi-yo hər guş zəbani darəd"
*Saib Təbrizi*



Deyilik ayrı, gülüm, biz iki sahil sayağı,
Sevgi dəryadı, onun bircə fəqət sahili var.

Şahinəm, verməmişəm eşqimi hər dildarə,
Eşqimin bircə könüldə yeri var, mənzili var.

*2.11.1998*

***

"Fəraqi-arizi-alın salıb od canə, billahi,
Könül dərdi-fərağından dönübdür qanə, billahi" *.

Bu dilbərlər sırasında budur dilbər ki, yox misli,
Bu cananlar arasında budur cananə, billahi.

Təbim sönmüşdü, gəlmirdi bir ayda bir şer, indi
Atı ilhamımın hər gün gəlir cövlanə, billahi.

Qətiyyən şəkkimiz yoxdur, gözəl saətdə, bir vədə
Ey Allahım, Imam Mehdi gələr dövranə, billahi.

Bu gün islamı sübut etmək dilər kafər, bu mümkünmü?
Müsəlmanlar edib vəhdət olar mərdanə, billahi.

Ucalsa qovğa bayrağı, hücum etsə əgər yağı,
Zəif cismim edər qovğa, girər meydanə, billahi.

Ağılsızlar arasında yarış başlandı şiddətli,
Dedi Şahin qürur ilə: - Mənəm divanə, billahi!

*5.11.1998*

***

Etməyək faidə verməzsə də eşq xan - zərəri,
Qaldıraq göylərə gün tək, eləyək zar - zərəri.

Qar təkin zülfüm ağarmışsa da, yoxdur qocalıq,
Gəncliyimdən mənə dəymiş, gözəlim, qar zərəri.

"Yığmaq üçün bu cahan malını çox səy elədim,
Sonra düşdüm başa: Xeyrində onun var zərəri" **.

* Beyt Mirzə Hüseyn Çakərindir (XIX əsr)
** "Moddəti dər tələbi-mali-cəhan kərdəm səy,
Ta be axer xəbərəm şod ke, ze nəfəs zərərəst"
*Ibn-Yəmin. Divan*

Şərəfi oldu çəkilmək dara Həllacımızın,
Onu məşhur eləyib ip zərəri, dar zərəri.

Şahin, ey mənəvi eşqin bu dövrdə şahı,
Onu tərk eyləmə ki, fayda pıçıldar zərəri.

*27.11.1998*

***

Görməmişdi belə çoxdandı şəhər divanə,
Xəzri qopcaq təzədən oldu Xəzər divanə.

Sanmayırmış dodağı bal kimi şirin, elə ki,
Dəydi şirin dodağa oldu şəkər divanə.

Altda at, üstdə süvari, ola bilsin ki, olur
Atın üstündəki altında yəhər divanə.

"Aqila, asma qulaq biz kimi divanələrə,
Edərik biz səni bizdən də betər divanə" *.

Hər vilayətdə, şəhərdə nə qədər aşiq var...
O vilayət dəlidirsə, bu şəhər divanə.

Dəliyə daş atılır, amma ki, divanəyə söz,
Bu əməldən nə qədər çəkdi zərər divanə.

Mən də divanəyəm, ey Qeys, sənin tək, amma
Çata bilməz sənə, əlbəttə ki, hər divanə.

Dəliyə yoxdu təfavüt ki, gəlir cahillər,
Amma, öz dövrəsinə çəkdi çəpər divanə.

Söyləyin Şahinə divanə, ağılsız deməyin,
Qəzəlindən sizə verməkdə xəbər divanə.

*Lənkəran,*
*20.12.1998*

* "Məşno, ey dana, hekayəthaye-ma divanəgan,
V-ər nə, ma əz xod to-ra divanətər xahim kərd"
*Kamal Xocəndi*



***

"Zərfi açdıqda dəyir xətti-nigarə nəzərim" *,
Zərf ilən xətdən umur hicrinə çarə nəzərim.

Nəzərim oldu ağappaq və əmin oldum ki,
Beləcə ağ qalacaqdır daha qarə nəzərim.

Zərf pakizə, kağız pakizədən pakizə,
Onları diqqət ilən gəzdi dübarə nəzərim.

Getdiyin səmtə dəmadəm nəzərim zilləndi,
Sənə istər ki, edə burdan işarə nəzərim.

Baxışım ulduza qondu gözünü anmaqçın,
Qəddini görmək üçün dəydi çinarə nəzərim.

Getdiyin yerdə, xəbər ver, qalacaqsan nə qədər?
Elə bil qondu, əzizim, o diyarə nəzərim.

Qala zərf bir yana, xətt başqa yana, ey Şahin,
Nə zaman bir də dəyər sevgili yarə nəzərim?

*26.12.1998*

***

"Ey könül, aləmə aldanma, sənə rəng gəlir" **,
Yerbəyerdən neçə avaz, neçə ahəng gəlir.

Sızladır canımı saz, ruhə verir tar qida,
Məclisin şurinə bax, ud gedir, çəng gəlir.

Niyə bəs sən məni yad eyləməyirsən tez-tez?
İstərəm sülh ola, amma təzədən cəng gəlir.

Ey təbiət, nə təzaddır, bu nə ziddiyyətdir?
Çiyələk istəyirəm, qarşıya turşəng gəlir.

Qaldırıb quyruğunu üstümə əqrəb şığıyır,
Çevirib arxasını dal-dalı xərçəng gəlir.

* Misra Mirhaşım Müsafir Talışlınındır.
** Misra Məhəmməd Füzulinindir.

Cəbrayıldırmı və ya hansı mələkdir çağırır?
Əzrayılmı görəsən, gündə mənə zəng gəlir.

Bədbinəm, Şahina, bədbinliyimin var səbəbi:
Kədərim çox iti, amma fərəhim ləng gəlir.

*17.01.1999*

***

"Qaşın belimi bükdü, kəman eylədi getdi,
Eşqin məni rüsvayi-cəhan eylədi getdi" *.

Il var ki, xəzan ömrə bahar paltarı biçdi,
Il var ki, bahar ömrü xəzan eylədi getdi.

Əfsus ki, əğyarə uyan bağdə gül var,
Bağban bu halı gördü fəğan eylədi getdi.

Bilməm nə sehr, möcüzə vardırsa dilimdə
"Yan" söylədiyim kəs mənə "can" eylədi getdi.

Illər boyu ilham pərisi qaldı yanımda,
Hər müşkülü səbr ilə asan eylədi getdi.

Əfsanəni gerçəkliyə tay etdisə hər kim,
Gerçəkliyi əfsanə güman eylədi getdi.

Neyçün demişəm "aşiqə hicran da gərəkdir"?
Hicran gəlib qəlbimi qan eylədi getdi.

Aqillərimiz Şahin ölərkən deyəcəklər:
- Aləmdəki çox rəmzi bəyan eylədi getdi.

*17.02.1999*

***

Bağdə həzzimə, şadəm, yenə cananə şərik,
Ola bilməz mənə bundan belə biganə şərik.

Müştərək olsa qızılgüldü fəqət müştərəki,
Zülfünün ətrinə cananəmizin nanə şərik.

* Beyt Ağakərim Salikindir.



Üzü güldür, əli güldür, ayağı, dırnağı gül,
Ola bilməz o gülüstan bu gülüstanə şərik.

Leylinin zülfünə Məcnun özüm oldum, ey Qeys,
Mümkün işdirmi mənə sən kimi divanə şərik?

Dərdinə, arxayın ol sən ki, əlac eyləyərəm,
Gözəlim, bil ki, sanırlar məni loğmanə şərik.

"Artırır qəm, dəxi məsciddə rəyim var mənim?" *,
Ola bilsə olacaqdır mənə meyxanə şərik.

Zəli tək qanımı sormuş neçə il qonşu mənim,
Zəlini qoymaram olsun təzədən qanə şərik.

Əriyibdir ürəyin yağı daha, ey Şahin,
Iki-üç yağı olub Azəribaycanə şərik.

*12.04.1999*

***

Kim görübdür ki, riya əhli ziya sahibidir?
O kəsə ehtiramım yox ki, riya sahibidir.

Inanaq indi necə, sözlə əməl düzlüyünü
Görmədim mən elə kəsdən ki əba sahibidir.

Hacı Həccdən qayıdıb bir də günah eylərsə,
Həm bu dünyadə, həm üqbadə cəza sahibidir.

Bivəfa kəsləri, heyfa ki, gözüm çox görmüş,
Afərinlər elə insanə vəfa sahibidir.

Niyə yol verdi Hüseynin başına gəldi bəla?
Kərbəla əhli, deyərdim ki, bəla sahibidir.

Gecə-gündüz ulu Allahə dua etməliyik,
Yetəcək niyyətə hər kim ki, dua sahibidir.

Şahina, gör nə gözəl söylədi Salman bu sözü:
"O kəsə afərin olsun ki, həya sahibidir" **.

*4.05.1999*

* Misra Seyid Əzim Şirvaninindir.

** "Afərin bad bər an kəs ke, həyayi darəd".
*Salman Saveci*

***

*"Xilqətdə bərabər sənə ə-bu ola bilməz,*
*Müşk ətri gəlib zülfüvə həmbu ola bilməz"*

Ələkbər Şahid

Yarım, mənə çöhrən kimi güzgu ola bilməz,
Gördüm üzümü səndə, demə bu ola bilməz.

Göz yaşı güman etmə görüb sən gözü nəmli,
Ey şux, ürək qanıdı bu, su ola bilməz.

"Yahu" deyirəm mən dəxi dərviş kimi hərdən,
Kafərdə, bu məlumdu ki, "yahu" ola bilməz.

Cananıma qurban ola canım mənim eykaş,
Heç kimsədə, billəh, belə arzu ola bilməz.

Dildarıma ahu deyibən səhv eləmişdim,
Səhradəki ahu belə ahu ola bilməz.

Şahin, yenə sən qu quşu tək nəğmə deyirsən,
Hər quş oxusa nəğməsini qu ola bilməz!

*8.05.1999*

***

"Sənsiz, ey gül, demə biganələr ağlatdı məni,
Bəzi uydurmalar, əfsanələr ağlatdı məni"*.

Saçının ətri gələn nanələrə baxdıqca
Yadıma düşdü saçın, nanələr ağlatdı məni.

Yanıram eşqə, fəqət ağlamıram mən, amma
Alışan atəşə pərvanələr ağlatdı məni.

Nə meyim var əlimdə, nə yarım yanımda,
Məst olan yar ilə məstanələr ağlatdı məni.

Yetmədən vəslə köçürlər bu fəna aləmdən,
Neçə Leyla kimi cananələr ağlatdı məni.

Qeys divanə idi, mən dəli, sərsəmdi Kərəm,
Bizə bənzər dəli-divanələr ağlatdı məni.

* Beyt Əliağa Vahidindir.



Bir zaman qəsr idi, viranəyə dönmüş gerçək,
O Mədain kimi viranələr ağlatdı məni.

Şahinəm, zərrəcə yanmırsa canım namərdə,
Tərk edən aləmi mərdanələr ağlatdı məni.

*21.05.1999*

***

Niyyətim vardı cəhllə elə qovğa eləyim,
Cahili həşrə qədər qeyz ilə rüsva eləyim.

Amma yox çarə, çoxalmaqdadı cahillərimiz,
Bu işin çarəsini mən necə peyda eləyim?

Ürəyim öylə sınıbdır fələyin cövründən,
O sınıq mülkü tikib mən necə bərpa eləyim?

Dedilər "sən də qəliz yaz savadın görsənsin",
Nə təhər mən bu savadsızları ifşa eləyim?

Nə gərəkdir oxucu cibdə lüğət gəzdirsin?
Nəyə lazımdı asan fikri müəmma eləyim?

Niyə adlanmalı oğlan uşağı indi "pesər"?
Axı kafər qızını mən niyə "tərsa" eləyim?

"Elədi şahidi-məqsudi-cəhan ərzi-cəmal" *,
Şahina, mən belə sətri necə məna eləyim?

*25.10.1999*

***

Hardadır, etməyirəm mən daha peyda sözünü,
Gözəlim, eyləyirəm gündə təmənna sözünü.

Gəl gedək sahilinə, gör necə dərya danışır,
Tərcümə etməliyəm mən sənə dərya sözünü.

Sözü vardır - sözü atəş səsidir qovğanın,
Ixtilat eyləməsinlər mənə qovğa sözünü.

* Misra Əbdülxaliq Yusifindir.

Ehtiyac hiss eləməz qeyri sözə aşiqlər,
Danışaq Qeysə fəqət şövq ilə Leyla sözünü.

"Şəmvəş məhrəmi-bəzm eylədi ol mah məni" *,
Ey Füzuli, bürüyüb gör nə müəmma sözünü.

"Görə bilməm özümü onda ki, canan görünür" **,
Gecə-gündüz eşidim qoy belə misra sözünü.

Söz yarın zülfü deyildir ki, uzansın, Şahin,
Sözünü müxtəsər eylə, demə bica sözünü.

*30.10.1999*

***

*"Naləm ilən fələyin batdı qulağı gecələr"*

**Həkim Qəni**

Kəsiləndən yanıma vəslin ayağı gecələr,
Saxladım evdə fərağ adlı qonağı gecələr.

Bu səbəbdən ki, o pərvanə görünmür gözümə,
Daha yandırmayıram şamü çırağı gecələr.

Nə gözəl çağ idi, birlikdə idik biz, gözəlim,
Ürəyim xatirə salmaqda o çağı gecələr.

Cürəti yoxdu görünsün gözə hicran o zaman,
Saxlayardım balış altında bıçağı gecələr.

Qəhqəhəmdən otağın pərdələri titrərdi,
İndi doldurmadadır ahım otağı gecələr.

Gərçi gündüz gözə həsrət seli axmaqdaydı,
Gözün amma quruyar idi bulağı gecələr.

Yollanardıq işə gündüz gecənin şövqüylə,
Sinəmizdən çıxar idi sinə dağı gecələr.

Şahinin həm gecələr naləsi vardır Qəni tək,
"Naləm ilən fələyin batdı qulağı gecələr".

*6.02.2000*

* Misra Məhənməd Füzulinindir.
** Misra Məhəmməd Füzulinindir.



***

Hər kim desə Şahindi o, yox, yox, o - mən olmaz,
Xəlqin sözünü mən kimi xəlqi deyən olmaz.

Fars şairinin var "süxən"i, yox "söz"ə hacət,
Sən həm sözünə "söz" de ki, "söz"dən "süxən" olmaz.

"Sordum nə qədər sirri-dəhanın ürəfadən,
Böylə dedi: Get-get, belə rəmzi bilən olmaz"*.

Yar ilə olar şad cəhənnəmdə də aşiq,
Cənnətdə də olsa, yarı olmazsa, şən olmaz.

Fərhad olana bağ nə gərək, dağ gərəkdir,
Səhranı verin Qeysə ki, səhra çəmən olmaz.

Ey zənn eləyən qürbəti üstün vətənindən,
Aldanma, behişt olsa da qürbət vətən olmaz.

Köynəkdə qoyun qəbrinə Şahin şəhid olsa,
Əfsus ki, hər şairə köynək kəfən olmaz.

*2.03.2000*

***

Şadəm ki, yolum bir də bu gülzarə düşübdür,
Gülzardə çünki nəzərim yarə düşübdür.

Artıqsa da bir qətrə gülab mey dolu camdan,
Bir qətrə mey üçün çoxu avarə düşübdür.

Qırmaq ürəyi daima əğyarə olub xas,
Təmir işisə, bəlli ki, memarə düşübdür.

Müsliməni məcbur edəsən kafərə getməz,
Salmaq tora Sənanısa Xummarə düşübdür.

Etsəydi əməl buyruğa cənnətdə qalardı,
Adəm haradan düşdü yola, harə düşübdür...

* Beyt Əbülhəsən Vaqif Kamranzadə Salyaninindir.

"Məşşatə, aman, vurma dəxi şanə o zülfə,
Canım quşu ol türreyi-tərrarə düşübdür" *.

Ağ rəng arayan Şahinə baxdı, dedi falçı:
- Ağsaç kişinin bəxtinə bax, qarə düşübdür.

*5.03.2000*

***

Söyləmirəm mən daha "qəm gözləyir",
"Çatdı vüsal vaxtı, sənəm gözləyir" **.

Sevgili dildar gəlin tək gəlir,
Köhnə bəyi tazə qədəm gözləyir.

Kipriyinin hər biri bir ox kimi,
Oxlarını yolla, sinəm gözləyir.

Üstümə şənlik yüyürür, nikbinəm,
Bədbini, əlbəttə, sitəm gözləyir.

Gözlərimə bax ki, olub qupquru,
Mən demərəm bir daha nəm gözləyir.

Gəlmək üçün - həzzü fərəh müntəzir,
Qaçmaq üçün dərdü ələm gözləyir.

Şahina, təbin qapısın bağlama,
Dəftər açılmış və qələm gözləyir.

*30.07.2000*

***

*"Eşq camından içən kimsənə hüşyar olmaz,*
*Nə bu dünyadə, qiyamətdə də bidar olmaz"*
**Seyid Əbülqasim Nəbati**

Eşqi inkar eləyən kəsdə əql var olmaz,
Elə təsdiqləmişəm mən bunu inkar olmaz.

Mənə yar eşqi, diyar eşqi, bahar eşqi calaq,
Kimdə vardırsa calaq böylə o kəs xar olmaz.

* Beyt Əbülhəsən Vaqif Kamranzadə Salyaninindir.
** "Ruze-vosaləst, sənəm hazerəst"
*Şəms Təbrizi*



Eşq sevdasını zahid günəh adlandırmış,
Kim günah etsə bu sevdadə günəhkar olmaz.

Əsl aşiqdə vəfa peyda, sədaqət peyda,
Bivəfalərdə təmiz sevgi, düz ilqar olmaz.

Kimdə vardırsa əsillik, bədəsillik bilməz,
Yar əsl yar isə, aləm qopa, əğyar olmaz.

Mərhəmət sahibinin mərtəbəsi yüksəkdir,
İnsanın qədrini hər kim bilə qəddar olmaz.

Hər qəzəl sahibi Şahin kimi fazillənməz,
Ev tikən hər kişidən, bəlli ki, memar olmaz.

*11.08.2001*

***

*"Hanı məclisdə bir saqi, hanı mütrüb, hanı munis?*
*Şərabi-nab olan yerdə gözəl canan olar, olmaz?"*
*Mirzə Əli Möcüz*

Tikandan qorx, aman bülbül, sinən əlvan olar, olmaz?
Əgər vursam bıçaq köksə vücudim qan olar, olmaz?

Deyirlər hökmran olmaq dilər əğyar eşq içrə,
Olar bəndə, olar qul, şübhə var sultan olar, olmaz.

Nəcibdirmi nəcabətdən açan söz nanəcib kəslər?
Təbabətdən deyən dərs hər təbib Loğman olar, olmaz?

Canım, dünya neçin fani, səmimiyyət neçin ani?
Mələk cildində şeytan var, mələk şeytan olar, olmaz?

Çox olsa mərdi namərddən şərəf dövranə yetməzmi?
Az olsa mərdi namərddən xəcil dövran olar, olmaz?

Yaman dünya dəyişmişdir, könül asi, deyil razi,
Adamlar olsa narazı məgər tüğyan olar, olmaz?

Nə həngamə, nə işdir bu, qırırlar, qıldırırlar hey,
Bu cür getsə, bütün dünya məzarıstan olar, olmaz?

Vətəndaşə vətən əmr eyləsə icrası vacibdir,
Bu aşiq millətə, xəlqə məgər qurban olar, olmaz?

Vətən mülkündə çalmazsa əgər vəhdət zəfər tezcə,
Məgər, Şahin, bu gün nalə, sabah əfğan olar, olmaz?

*25.08.2001*

***

*"Mən tərke-sərə-kuye-nigar eylədim, oldu,*
*Mən tərke-şərabe-ləbe-yar eylədim, oldu"*
*Əliağa Sərraf (XIX əsr)*

Mən sevgini yoxdan yenə var eylədim, oldu,
Sevdadə cəsarətlə qərar eylədim, oldu.

Meyxanədə, ey qəlbi xumar meylə edənlər,
Mən qəlbi kitab ilə xumar eylədim, oldu.

Öz yarına əğyarləri yar eləyən var,
Əğyarləri mən isə xan eylədim, oldu.

Qış mövsümü olmur dedilər qəlb sevincək,
Ovqatımı qış fəsli bahar eylədim, oldu.

Ömrüm boyu olmurdu meyl məndə şüarə,
Yar ismini şerimdə şüar eylədim, oldu.

Yad hər sözə yadəm həmişə, ey qoca Şahin,
Yad hər sözü şerimdə kənar eylədim, oldu.

*1.09.2001*

***

"Dili-üşşaqə gərçi qeydi-zülfündən fərar olmaz,
Götürmə bəndi-zəncirin, əsirə etibar olmaz" *.

Mənim fikrim xəyalından keçirmi, nazlı dildarım?
Sənin fikrin xəyalımdan mənim bir dəm kənar olmaz.

Var idi iztirabım, intizarın var edib bir də,
Nə öylə iztirab bəlli, nə böylə intizar olmaz.

* Beyt Qasım bəy Zakirindir.



Əgər hicranı tapsaydım kötüklərdim onu, hərçənd
Kənarimdən mənim, ey yar, hicranın kənar olmaz.

Aman tale, hələm qoyma qıfıllansın mənim bəxtim,
Aman Tanrı, əgər bəxtim qıfıllansa açar olmaz.

Vətəndən başqa, qürbətdə mənim hər nemətim vardı,
Vətənpərvər uzaq olsa vətəndən bəxtiyar olmaz.

Qəzəl cəngəlliyində öz yerim vardır, çinarəm mən,
Əgər, Şahin, ucalsa sarmaşıq ərşə çinar olmaz.

*2.10.2001*

***

*"Mənim aşiqliyim daim qalardı sirr tək məxfi,*
*Başı batsın ki, xəlqə sirrimi biganə bildirdi"*
*Hacı Mail*

O gündən ki, mənə sevdasını cananə bildirdi
Coşan yellər xəbər tutdu, bunu hər yanə bildirdi.

Məhəbbətdən xəbərsizmiş canım illərlə, şadəm ki,
Məhəbbət ən gözəl hissi cahanda canə bildirdi.

Mən ifrat etmərəm bir dəm daha tənhalıq eşqində,
Qənaət həzzini miskin gəda sultanə bildirdi.

Məhəbbət sehri səhhət bəxş edib aləmdə çox şəxsə,
Məhəbbət sehrini loğman özü dərmanə bildirdi.

Cəsur oldum alıb röyadə Nofəldən nəsihətlər,
Cəsarət sirrini mərdanəyə mərdanə bildirdi.

Dəmadəm yanmasam şəmə, dönər pərvanələr məndən,
Müdam odlanmağın əsrarını pərvanə bildirdi.

Mənəm "Divan" yazan şair bu dövran içrə dərdimdən,
Füzuli dərdini "Divan" yazıb dövranə bildirdi.

Vüsalə yetməsəm Məcnun olub ölmək şüarımdır,
Həqiqət dərkini mən bilməzə əfsanə bildirdi.

Təzad axtarmasın fikrində Şahin Fazilin kimsə,
Mənə idrakı aqil yox, bilin, divanə bildirdi.

*11.10.2001*

***

*"Bilsəm əgər xoş gəlir ol güli-xəndanə rəqs,*
*Tari bilir eylərəm mən necə məstanə rəqs"*
*Seyid Əbülqasim Nəbati*

Təklif edir meh yenə laləyə, reyhanə rəqs,
Bağçada nərgiz gülü, bağda edir nanə rəqs.

Rəqs eləyir erməni, mənsə oyundan kənar,
Aqil oyundan çıxar eyləsə divanə rəqs.

Göydə mələk mat olub, yerdə bəşər gərdişə,
Qismət olubdur bu gün bir neçə şeytanə rəqs.

Mən kimi laqeyd olub rəqsə vətənpərvərim,
Məhrəmi oynatmayın eyləsə biganə rəqs.

Ovqatımız zar ikən, bunca kədər var ikən
Kimdi o ki, eyləsin indi səmimanə rəqs?

Könlüm açılmır, çəkil, oynamıram, ey pəri,
Eyləmə təklif gəl könlü pərişanə rəqs.

Şahinə üz vurma çox, rəqs edəcəkdir fəqət
Olsa nəsib sərbəsər Azəribaycanə rəqs.

*17.10.2001*

***

"Ruhim eylər o ləbi-bərgi-güli-tərdən həzz,
Bülbül eylər necə ki, qönçeyi-əhmərdən həzz" *.

Hanı Məmmədquluzadə, hanı Tahirzadə
Ki, alaq Mirzə Cəlil, Mirzə Ələkbərdən həzz.

Mən münəccim təki ulduzları seyr eyləyirəm,
Alıram yerdəki bir gözləri ülkərdən həzz.

* Beyt Nacinindir.



Məni qiymətli sözün ləzzəti sərməst eləyir,
Amma, almaqdadı bir çoxları gövhərdən həzz.

Edam etmək diləsə yar məni ollam xoş,
Alaram hətta onun vurduğu xəncərdən həzz.

Mənə bülbül kimi yoxdur gecə-gündüz fərqi,
Gecə-gündüz çəkirəm lalə-sənubərdən həzz.

Mən kiməm? Mən nəçiyəm? Köksükitab bir şair,
Şahinəm, almadayam bir sinədəftərdən həzz.

*25.10.2001*

***

Nə adamıdır o ki bilməz, nədi canan bilməz,
Nədi möhnət, nədi həsrət, nədi hicran bilməz.

Xəstələnsəm çağırın yanıma tez cananı,
Məni loğman başa düşməz, məni loğman - bilməz.

Aşiqin qədrini bilsin gərək aşiq, əcəba
Bağbanın çəkdiyi zillətləri bağban bilməz?

Səbr ilən axtarıram qəbrini Məcnunimizin,
Baş Ərəb harda verib can Ərəbistan bilməz.

Istərəm mən yenə sərgərdan olum dərviş tək,
"Bu səfa ləzzətini qeysərü xaqan bilməz" *.

Üyüdür bizləri dünya o dəyirman sayağı,
Çax-çaxından qulağım batdı, dəyirman bilməz.

Doğru yol göstərirəm, Şahina, əğyarlərə,
Olmasa yolda bələdçi, yolu karvan bilməz.

*27.10.2001*

***

*Ələkbər Şahidin qəzəlinə təzmin*

Əgər etsən bu sevən aşiqə naz gündə bir az,
Ömrümü eyləyəcəksən mənim az gündə bir az.

Sevgi ümmanına hökmən yenidən baş vurruq,
O dərinlik əgər olmazsa dayaz gündə bir az.

* Misra Məhəmməd Əmaninindir.

Gözəlim, sən mənə bir vaxt "sevirəm" yazmışdın,
O gözəl kəlməni lütfən yenə yaz gündə bir az.

Həzzimiz indi azalmışsa da sən dərd etmə,
Olacaq həzzimiz, əlbəttə, taraz gündə bir az.

Isti göz yaşlarım axdıqca bəyaz qar əriyir,
Gəl ki, qış çıxmadadır, gəlmədə yaz gündə bir az.

Harda qaldın belə, gəl çıx ki, isinsin Şahin,
Sənsizəm mən, məni dondurdu ayaz gündə bir az.

*30.10.2001*

***

"Yeni ruhə irdi canım yenə bu cahan içində,
Nə əcəb bahar gördüm, sənəma, xəzan içində" *.

Üşüyüb-donan da Şahin, alışıb-yanan da Şahin,
Donuram vətəndən ayrı, yanıram fəğan içində.

Vətəni o tayda gördüm, vətəni bu tayda gördüm,
Nə xeyir, nə fayda gördüm, yaşadım ziyan içində.

Kədərim ürəkdə, ey dost, elə bil ki, qurğuşundur,
Kədərim olarmı yüngül bu ağır zaman içində.

Olacaqmı yerdə cənnət hələ ki baş açmıram mən,
Cahanım, məni qoyubsan hələ ki güman içində.

Bizə ta qədim zamandan Qarabağ məkan olubdur,
Bu nə qırhaqırdı oldu, bu nə qan məkan içində?

Niyə iqbalım yamandır? Həzinəm, halım yamandır,
Bir ümid rüşeymi varmı bu yaman-yaman içində?

Dedilər: - Qocaldı Şahin, saçı ağ... yarım buyurdu:
- Uca Şahdağımdı Şahin, dayanıb duman içində.

*1.11.2001*

* Beyt Qazi Bürhanəddinindir.



***

Hər səyahət eləyən mən kimi səyyah deyil,
Söyləsə gərçi o səyyahdı, vallah deyil.

Sən deyirsən ki, çəkim mən ayağı qürbətdən,
Mənə heç kim, gözəlim, böylə xeyrxah deyil.

Kipriyin sinəmin üstündə yazır gündə giley,
Nə qərar eyləmisən, sinə qərargah deyil.

"Bər-bəzəkli uca göylər nə deməkdir? Mübhəm!
Bu müəmma hələ bir kimsəyə agah deyil" *.

Şah əgər ərz eləsə "kölgəsidir Allahın",
Bir gədadır deyərəm mən o adam, şah deyil.

Dərvişin mənzili Allahə yaxındır məncə,
Nə saraydır, nə qəsrdir, nə o dərgah deyil.

Nə zaman Mehdi zühur eyləyəcək, ya Rəbbim,
Bu bizə bəlli deyildir hələ, eyvah, deyil.

Bu qədər ah ilə bir gün yanacaqdır Şahin,
Qəlb evimdən bir alovdur ucalır, ah deyil.

*13.11.2001*

***

*"Dən düşübdür başıma, oldum qoca,*
*Amma ki, təbim cavanlıq eyləyir"* **
*Sədi Şirazi*

Hicri çox, vəsli bir anlıq eyləyir,
Kəc fələk hərdən yamanlıq eyləyir.

Xançoban sellərdə Sara axtarır,
Şeyx Sənansa çobanlıq eyləyir.

Var ziyanım ki, veribdir faidə,
Faidəm var ki, ziyanlıq eyləyir.

* "Çist in səqfe-bolənde-sadeye-besyar nəqş?
Z-in moəmma hiç dana dər cəhan agah nist"
*Hafiz Şirazi*

** "Bərfe-piri mineşinəd bər sərəm,
Həmçenan təbəm cəvani mikonəd".

İp verim yığ zülfünü, ey nazənin,
Mənzili zülfün qaranlıq eyləyir.

Etmirəm mən gərçi eşqimdən giley,
Amma hissim bədgümanlıq eyləyir.

Sən məni qov bağdən, ey bağiban,
Göz yaşım bağı şoranlıq eyləyir.

Şahinəm, oldum qoca mən Sədi tək,
"Amma ki, təbim cavanlıq eyləyir".

*12.01.2002*

***

*"Vətənimdir, vətənimdir, vətənimdir, vətənim"*
*Məhəmməd Füzuli*

"Vəhdəti-zatına əqlimcə şəhadət lazım,
Canü könlümlə mınacatü ibadət lazım" *.

Ulu Allah, sənin varlığına yoxdur şəkk,
Rəbbəna, isminə hər ləhzə itaət lazım.

Nə siyasət, nə siyasətçi məni cəlb eləmir,
Bəllidir amma ki, hər işdə siyasət lazım.

Özgədən söz dilənən şairi çək doğru yola,
Söylə ki, şairə hər vədə ləyaqət lazım.

Hər qəzəlxan yaza bilməz qəzəli saf dildə,
Qəzəli yazmağa saf sözlə məharət lazım.

Xəlqimin əksəri bilmir ki, izafət nə demək...
Nə qəliz sözlərə uymaq, nə izafət lazım.

Vətəni varsa desin şeri vətəndaş kimi,
Bu şərəfdir ki, vətəndaşə şərafət lazım.

Yazdı "Şahnamə"ni Firdovsi əcəb dildə!.. Bizə
Dədə Qorqud dilinə eşqü sədaqət lazım.

Şahina, xəlqə məhəbbət və məhəbbət vacib,
Və məhəbbət və məhəbbət və məhəbbət lazım!!!

*6.03.2002*

* Beyt osmanlı şairi İbrahim Şinasinindir (XIX əsr)



***

*"Cuşişi-əşki-dili-pürxun bir, məcra iki,*
*Heyf kim, fülki gühərməşhun bir, dərya iki"*
**Sami (XVI əsr osmanlı şairi)**

Arifəm mən, şerim içrə ən azı məna iki,
Gah Şahin, gah Fazil - şəxs bir, imza iki.

Var sevdası inkarın, var sevdası elin,
Allah-Allah, cövrə bax ki, qəlb bir, sevda iki.

Qaşların öldürmək istər, gözlərin görmək məni,
Ey nigarım, can birdir, amma ki, icra iki.

Biz ki, bir beytin iki misrası tək olduq yaxın,
İndi ayrılmaq çətindir, beyt bir, misra iki.

Leyli-Məcnun var yeni, Leyla da təkdir, mən də tək,
Ey mənim divanə könlüm, olmasın Leyla iki.

Eşq Allah eşqidirsə, bəzi qafil kimsələr
Sormasınlar bir-birindən "eşq birdir, ya iki?"

Ömrümün, Şahin, yarımçıq qalmasından qorxu yox,
Etməsin təşviş cismim ömr bir - dünya iki.

*9.03.2002*

***

Mərdanədirsə gər şah üsyanə varmı hacət?
"Yoxdursa dərd hərgah dərmanə varmı hacət?" *

Söhrab bihal isə, can tutisi lal isə,
İqbalı pamal isə loğmanə varmı hacət?

Hər qum dən olsa bir gün, səhra şən olsa bir gün,
Yer gülşən olsa bir gün bağbanə varmı hacət?

Düşdün sorağə, yandın, gəldin qabağə, yandın,
Neyçün çırağə yandın, pərvanə, varmı hacət?

* "K-anca ke dərd nəbvəd dərman çe kar darəd?"
*Misra İraqi Həmədanınindir.*

Şahin, nigar getdi, istəkli yar getdi,
Pərvərdigar getdi, canana varmı hacət?

*8.06.2002*

## RÜBAİLƏR

Getdin çıxaraq sən ki, sözümdən, ey dost,
Küsdüm həmi səndən, həm özümdən, ey dost,
Gülgündü əzəl, indisə muncuq-muncuq
Göz yaşları axmaqda gözümdən, ey dost.

*24.09.1995*

***

"Qulsan" desə kim aşiqinə, sən "şah" de,
Fərhadə məni, Qeysə məni həmrah de.
Hərçənd bilirsən bunu təkdir Allah,
Amma yenə "Lailahə illəllah" de.

*13.03.1996*

***

Çox sirr açılır, indiyəcən sirr - Mehdi!
Hər Mehdi olan şəxs deyildir Mehdi.
Allah özü birdir və Məhəmməd birdir,
Yarəb, gələcəkdir nə zaman bir Mehdi?

*13.03.1996*

***

Yarım məni iztirabə qərq etmişdir,
Şənlik yerinə əzabə qərq etmişdir.
Canana sanır ki, tabımı almışdır,
Təbimsə onu kitabə qərq etmişdir.

*15.03.1996*

***

Hərdən unudub sevinci əfğan yazdım,
Hərdən itirib vüsalı hicran yazdım.
Divanə məni edirdi "Divan" şövqü,
Allahə şükür ki, mən də "Divan" yazdım.

*15.03.1996*

***

Ol yar vəfanı tərk edibdir, əfsus,
Hər zövqü, səfanı tərk edibdir, əfsus,
Verməzmi şəfa məgər bu üzgün qəlbə?
Loğmandı, şəfanı tərk edibdir, əfsus.

*18.03.1996*



***

"Söndün" demə gəl mənə, gülüm, yandım mən,
"Yandın" demə, səhv olar bu, odlandım mən.
Bir an da uzaq mən olmadım andımdan,
Andım səni, gündüz və gecə andım mən.

*22.03.1996*

***

Yar ilə yarın ahü qübarı birmi?
Eşq məsti ilə badə xumarı birmi?
Əğyar ilə məndə yoxmu fərq, ey canan,
Mis ilə zərin, söylə əyarı birmi?

*10.06.1996*

***

Kül basdı yenə üstünü, köz gizləndi,
Seyr eyləmədi çöhrəni - göz gizləndi.
Vəsf eylər idi hüsnünü göyçək sözlər,
Təbin dili sözlənmədi, söz gizləndi.

*16.05.1997*

***

Dilbər, nə sayaq oldu ki, gözdən düşdün?
Yoxsan, a təbəssüm, niyə üzdən düşdün?
Ey söz, nə təhər oldu ki, mənə itdi?
Mənə, necə baş verdi ki, sözdən düşdün?

*18.05.1997*

***

Sənsənsə qovan varmı qaçan? Görsənmir.
Bəxtim güləcəkdirmi? Haçan? Görsənmir.
Hərçənd mən açmışam, gülüm, çox düyünü
Qəlbimdə düyün var ki, açan görsənmir.

*20.07.1997*

***

Tale qəmi vermişsə məgər düz vermiş?
Yarəb, bu nə qəmdir təzədən üz vermiş?
Bir qeyrisinə qismət olursa bir qəm,
Dildarı qəmi Şahinə yüz-yüz vermiş.

*20.07.1997*

***

Qəm neyləyəcək mənimlə qəmxarsansa,
Sınmaz bu ürək əgərçi məmarsansa.
Qalsam da əgər tək, gözəlim, bir dilbər
Düşməz yadıma, yadımda sən varsansa.

*23.07.1997*

***

Şadəm ki, mənim sevgili dildarım - sən,
Şahin kimi yox varlı adam, varım - sən.
Məndən də səadətli adam görsənməz,
Olsan, o biri cahanda da yarım - sən!

*23.07.1997*

***

Tale çoxunu edib kələk döymüşdür,
Mən aşiqisə o şux mələk döymüşdür.
Məndən uzaq et, gülüm, cəza qamçısını,
Onsuz da məni bu kəc fələk döymüşdür.

*28.08.1997*

***

Odlandı dəmadəm, yenə od düşsün qoy,
Xudbinliyə, cəhlə, kinə od düşsün qoy.
Yansam da inanmayır mənə cəhl əhli,
Yansın elə kəs, qəlbinə od düşsün qoy!

*6.09.1997*

***

*Filankəsə!*

Şerimdə mənim əyriliyə meydan yox,
Düzgün deyirəm sözlərimi, böhtan yox.
Mən getməmişəm Həccə, sən isə - zəvvar,
Məndə hacılıq, səndə isə iman yox.

*9.03.1999*

***

Zərsənmi zərin qədrini zərgər bilsin?
Dürsənmi dürü dürrü bilənlər bilsin?
Yandırmaq üçün məni gün ol, ey dilbər,
Atəş nə olan şey ki, səməndər bilsin?

*7.05.1999*

***

Qəlbimdə kədər də var fərəhdən qeyri,
Həm var səvab orda günəhdən qeyri.
Gör bəxtimi ki, əlimdə, ey yar, mənim
Yoxdur daha heç nəyim qədəhdən qeyri.

*3.12.1999*

***

Gəl, gəl, haraya gedibsən, ey yar, ey yar,
Dünyamı qara edibsən, ey yar, ey yar.
Məndən məni sən soruşmayırsan, amma
Səndən səni istərəm mən, ey yar, ey yar.

*6.01.2000*



***

Tale görəsən bir daha qəm yazmazmı?
Həzz gözləyənə dərdü ələm yazmazmı?
Cəhd eylə ki, düşməsin əlin qüvvətdən,
Əl yazmağa başlarsa qələm yazmazmı?

*28.10.2000*

***

Onsuz da qəmin gəlməsi var hərdənbir,
Dolsun canıma qüssə-qübar hərdənbir,
Əlbəttə, yadımdasan mənim sən daim,
Yad et məni, ey sevgili yar, hərdənbir.

*29.11.2000*

***

"Bəs" söyləmə, ey gülüm, mənə "bəs" yoxdur,
Həbs et məni, köksün kimi məhbəs yoxdur.
Mən məktəbə gəlmirəm, müəllim, çünki,
Eşq elmini tədris eləyən kəs yoxdur.

*2.12.2000*

***

Dəymək könülə sanki qərardır səndə,
Qırmaq ürəyi köhnə azardır səndə.
Dil pis, hərəkət pisdir, əməl ondan pis,
Bir söylə görüm, yaxşı nə vardır səndə?

*5.12.2000*

***

Yoxdur o gözəl xanimanımda, Rəbbim,
Dövran eləyir eşq qanımda, Rəbbim.
Al şadlığımı dərdi əlimdən alma,
Qalsın yarımın dərdi canımda, Rəbbim.

*20.12.2000*

***

Əsdirmə, əsirinəm sənin, ey gül, mən,
Küsdürmə ki, gülşənə bu gün bülbül - mən.
Çəkdim o qədər dərd telinçün, indi
Oldum o telindən də sənin yüngül mən.

*22.12.2000*

***

Bəh-bəh, dodaq üstdə tər bitər, şirindir,
Hər tər acısa, amma bu tər şirindir.
Sən bir daha mən tutiyə şəkkər vermə,
Vəslinmi şirin, yoxsa şəkər şirindir?

*15.01.2001*

***

Yağdıqda yağış başə çətir çəkmişlər,
Sirdaşlərim daima sirr çəkmişlər.
Yarım, sarılır gül ayağa gülşəndə,
Məlum ki, ayağından ətir çəkmişlər.

*16.01.2001*

***

Yığdım pulu zövq ilə kitab almaqçın,
Sıxdım gülü şövq ilə gülab almaqçın.
Var öyləsi mey satıb papaq əldə edir,
Satdım papağı mənsə şərab almaqçın.

*24.01.2001*

***

Etsəydi fələk rəhm ziyan tökməzdi,
Dillər mənə məkr ilə yalan tapmazdı.
Tökdün qanımı sən ki, bu cür, ey ahu,
Billah, pələng həm belə qan tökməzdi.

*9.06.2001*

***

Əlbəttə, şəkər başqadı, xurma başqa,
Söz yox ki, turac başqadı, durna başqa.
Hərçənd qamışlıqda yetişmiş hərəsi,
Amma ki, qamış başqadı, zurna başqa.

*15.07.2001*

***

Ey surəti gizlin pəri, mənə sənsiz,
Yoxsan, daha olmaz mənə sevda sənsiz.
Tərk eyləmisən cahanı, üqba - sənli,
Dünyadən üzübsən əli, dünya - sənsiz.

*30.05.2002*

## SƏKKİZLİKLƏR

Daha tərgitmişəm günah etməyi,
Kimin nə işinə kimə bağlıyam?
Kimin nə borcuna sevirəm nəyi?
Kimə nə dəxli var qaşqabaqlıyam.

Oğrun pişik kimi, savabı güdür,
Yığıb saxlayıram günah varımı.
Mənim günahlarım özümünküdür,
Odur ki, sevirəm günahlarımı.

*11.10.1995*



***

Nə vaxtdır qəlb içrə iztirab yaşar,
Ürək yuvasıdır ahın, nisgilin.
Yarım, ikimizin bir qatili var,
Sənin qatilindir mənim qatilim.

Sarardı məhəbbət sevinci bizi,
Səni dindirərdim şirin dillə mən.
Iztirab öldürdü sevincimizi,
Bacara bilmədim bu qatillə mən.

*20.10.1995*

***

Günəşim, yeri var mənə bu gündən
Duman bağışlasan, çən bağışlasan.
Sevinnəm kədəri, qəmi mənə sən
Şadman bağışlasan, şən bağışlasan.

Bilmədən pərişan elədim səni,
Bilmədən incitdim sən tək sevəni,
Mənim taxsırımı əfv elə, məni
Allah bağışlayar sən bağışlasan.

*20.01.1996*

***

Ülvi məhəbbətim hədərmiş, hədər,
Səni pərt etmədi pərtliyim mənim.
Inan ki, ömrünün sonuna qədər
Səni ağrıdacaq sərtliyim mənim.

Gözün həlimliyi neçin görmədi?
Daha bu həlimlik məndən uzaqdır.
Səni istiliyim isindirmədi,
Səni soyuqluğum donduracaqdır.

*8.06.1996*

***

Bu gözəl, sevimli aləmdə hərə
Aşiq olsa yaxşı, vurulsa yaxşı.
Məhəbbət sevdasız, sönük gözlərə
Işıq olsa yaxşı, nur olsa yaxşı.

Duyğu aşıb-daşır sevgi diləksə,
Aşiq bülbül olur eşqi çiçəksə,
Gözlər gözəlliyi görməyəcəksə,
Görməsə yaxşıdır, kor olsa yaxşı.

*12.06.1996*

***

Ömrün baharında sevmişəm səni,
İndi ömrün qışı atıbdır qədəm.
Sənin soyuqluğun soyudur məni,
O isti günlərin həsrətindəyəm.

Gülüm, soyuqluğu hər səhər-axşam,
Neçin aralıqda sədd eləyirsən?
Mən sənə əlimi uzatmaqdayam,
Sən mənim əlimi rədd eləyirsən.

*18.08.1996*

***

Sən mənim eşqimə məskən olmusan,
Mən də eşqin üçün döndüm məskənə.
Neçə müddətdir ki, sən mən olmusan,
Mən isə, gözəlim, dönmüşəm sənə.

Sındırma ürəyi, dəymə könülə,
Gəl bu şən aşiqi bağrıqan etmə.
Mənə yaşamağı qadağan elə,
Amma sən sevməyi qadağan etmə.

*24.09.1996*

***

Üstümə yağdırma böhtanı hədər,
Susa bilməyəcək şair ilhamı.
Sənə eləmirəm tüğyanı hədər,
Yaxşı tanıyıram yaman adamı.

Üz-üzə durubdur gör kim kim ilə,
Əlində qılınc var, əlimdə qələm.
Ülgücdən də iti qələmim ilə
Sənin qılıncını kəsə bilərəm.

*26.12.1996*



***

Sevgidə işıq var, işıqsevənəm,
Sən də mənim kimi sev ki işığı
Günlərin bir günü sevgin sönsə həm,
Səni tərk etməsin sevgi işığı.

Ah, sevgi işığı!.. İşə bax, işə,
Sönən o işıqdan canım odlanır.
Gözlərim önündə mənim həmişə
Sönmüş bir sevginin işığı yanır.

*6.02.1997*

***

Bir mətləb yüz dəfə təkrar olunur,
Hər dəfə dumanlı söhbət görünür.
Şahinin önü nur, solu, sağı nur,
Amma, arxasında qiybət görünür.

Bədliyi kənar et nəzərindəki,
Mənim düz sözümə göz dəyə bilməz.
Sözlərin düz deyil əyri ox kimi,
Əyri ox hədəfə düz dəyə bilməz.

*10.02.1997*

***

Gələn kimi, ey mələk,
Cövr etdi sənə, mənə.
Biz isə birləşərək
Hicranı qovduq yenə.

Onu mürdəşir yusun,
Daha ayırmaz bizi.
Bizi Allah qorusun,
Biz isə eşqimizi.

*2.10.1998*

***

Şahinin əlindən, yarəb, al ovu,
Gülüm, sevmədəyəm mən səni mənən.
Canımda varsa da eşqin alovu,
Bu vəslə yetməyi istəmirəm mən.

Ləkə olmayacaq adında sənin,
Riyadan uzaq bil mənim eşqimi.
Qalmaq istəyirəm yadında sənin
Gözütox, qəlbitox aşiqin kimi.

*12.11.1998*

***

Ahım qara tüstü, boğazım baca,
Yarım, tüstü qovan baca oluram.
Gün var ki, balaca qumdan balaca,
Gün də var Şahdağdan uca oluram.

Nə xoş zaman idi, yanında vardım,
Sənin eşqin ilə aşıb-daşardım.
Məni sevsə idin cavanlaşardım,
Sən məni sevmədin, qoca oluram.

*29.11.1998*

***

Sən idin qəlbimin təkcə həmdəmi,
Nisgilim yox idi zərrə qədər də.
Büsbütün itmişdi gözümün nəmi,
Sevincim qələbə çalmışdı dərdə.

Qəlbimdən çıxırsan, məni tənha bil,
Nisgilli aşiq tək ağlayıram mən.
Çünki, yanağıma göz yaşı deyil,
Səni axıdıram kipriklərimdən.

*5.01.1999*

***

Mən sənə baxıram, sən isə gülə,
Gül isə başını dikib aşağı.
Sındırma ürəyi, dəymə könülə,
Bağban xətrinizə tərk edib bağı.

Görən söyləyir ki, dəlidir mənə,
Belə ecaz olmaz, belə sirr olmaz.
Dodağın məhəbbət gülüdür mənə,
Bağça-bağ gülündə bu ətir olmaz.

*14.04.1999*



***

Sözüm itməyəcək, ötərgi deyil,
Mənə belə deyir şair qüruru.
Ey mənim sözümdə işıq görən, bil,
Qəlbimin nurudur sözümün nuru.

Gözlərim çürüyüb göz yaşın içrə,
Dodağım sahil tək qupquru qalıb.
O qədər işıqlı söz demişəm ki,
Mənim ürəyimdə söz nuru qalıb.

*8.06.1999*

***

Neçin aləmdəki gözəllər sənin
Ayağın altında xəli olmayır?
Amma rəhmsizsən sən, ey nazənin,
Dilində "yox" olur, "bəli" olmayır.

Mən kiməm? Sükutda donan fəryadam...
Qəzəlli, dastanlı, nağıllı adam...
Gərək dəli ola ağıllı adam,
O kəs dəlidir ki, dəli olmayır.

*11.06.1999*

***

Ilahi, o qədər zəifləmişəm,
Dağa baxmaq üçün başım qalxmayır.
Hətta qabağıma kimsə gələn dəm,
Işarə edirəm qaşım qalxmayır.

Ürək əriyibdir başım varsa da,
Ölmək istəmirəm yaşım varsa da,
Düşmənə atmağa daşım varsa da,
Əlim tərpənməyir, daşım qalxmayır.

*2.09.1999*

***

Mənə dinsiz demə, Allahsız demə,
Səcdə eləməkdən dizi yarayam.
Yönüm cənnətədir, ya cəhənnəmə?
Hansı səmtə gedim, üzü harayam?

Heç kim dadmayıbdır nəşə mənim tək,
Məhəbbət yolunda üzüldü ürək.
Amma, ağarandan saçım, ey fələk,
Gözəllər yanında üzüqarayam.

16.09.1999

***

Sən qəzəllər ki, yazırsan xəlqi,
Neçə şairciyəzi dərdə salıb.
Bu yol ilən o qədər yüksəl ki,
Çıxasan zirvəyə bir gün ucalıb.

Nə gözəldir sənə layiq bu peşə,
Qabağında neçə baş enməlidir.
Şahina, qəddini dik tut həmişə,
Şamı dik saxlamasan sönməlidir.

15.01.2000

***

Indi sevim nəyi, unudum kimi?
Qara rəng böyüyüb ağ boyda oldu.
Sevinci əritdim oldu qum kimi,
Kədəri böyütdüm dağ boyda oldu.

Səhəngi götürüb bulağa gəlmir,
Yolunda olaram sadağa, gəlmir.
Çoxdandı o yarım bu bağa gəlmir,
Bağbanam, qübarım bağ boyda oldu.

10.02.2000

***

Gözüm gerçək gəzir, xəyal istəmir...
Harama qurşanan halal istəmir...
Aşiq əsil isə, vüsal istəmir,
Onun iqbalına yazığım gəldi.

Məcnun çəkə bilmir Leyla dərdini,
Məhəbbət dərdini, sevda dərdini,
Görən, necə çəkir dünya dərdini,
Allahın halına yazığım gəldi.

7.04.2000



***

Yaşıllıq qərq olub zibilliklərə,
Əyyaş, meşə sənə "rədd ol, get" deyir.
Içki şüşələri tullanıb yerə,
Yaxşı ki, heyvanlar araq içməyir.

Meşə yerin deyil, tələs yerinə,
Yoxsa bu gözəllik itəcək burda.
Qarağac yerinə, vələs yerinə
Araq şüşələri bitəcək burda.

26.04.2000

*Moskva, Domodedovo meşəsi*

***

Qəzəlini, ey şair,
Bu günün sözüylə yaz.
Keçmişin dili ilə
Indi yazmaq yaramaz.

Inan mənə, hədəri
Olacaqdır zəhmətin.
Geriyə baxa-baxa
Irəli getmək çətin.

6.07.2000

***

Aşiq adlanmadıq biz hələm-hələm...
Ustadımız olub Məcnun tək ədib.
Bizə Eşq Himnini oxudub Kərəm,
Məhəbbət fənnini Fərhad öyrədib.

Düzəngah kimidir dağ-dərə bizə,
Biz eşqə hayanıq, eşq bizə hayan.
Əgər aşiqsənsə gəl cərgəmizə,
Əgər əğyarsansa çıx aramızdan!

***

Yamanca yuxadır mənim ürəyim,
Ac-susuz kəsləri andığım zaman
Həmişə yarımçıq qalır xörəyim,
Çayım içilməyir heç vaxt sonacan.

Bütöv bir sevgi var hər əməlimdə,
Fəqət istəyirəm, istəyirəm mən
Dirilik suyu tək tutub əlimdə
Sevgi badəsini içəm dibəcən.

***

Əzizim, vaxt vardı ünsiyyət vardı,
Ağ bir ümidimiz vardı sabaha.
Bizim aramızda hər şey qurtardı,
Ögey adamlarıq indi biz daha.

Axırı heç oldu o ünsiyyətin,
Heç oldu arada olan sevda, heç.
Səni oyaq vaxtı görməyim çətin,
Səni görməyirəm röyada da heç.

*29.09.2000*

***

Solubsa da ümidimin çiçəyi,
Ürəyimdə güman hələ diridir.
Ay adamlar, qınamayın fələyi,
Məkan diri, zaman hələ diridir.

Günəş çıxıb dağıdacaq dumanı,
Yetişəcək bəxtəvərlik zamanı...
Qulağımdan çəkilməyir fəğanı,
Məcnun olub, fəğan hələ diridir.

*14.08.2001*

***

Səni səsləməkdən yorulub dilim,
Oduna yanmışam, atəşimə yan.
Qələm səndə də var, məndə də, gülüm,
Şairlik səndə də, məndə də əyan.

Müdam hicran ilə cəngə çıxardım,
Daha ayrılığa dözüm tükənib.
Bir zaman mən sənə şer yazardım,
İndi sən şer yaz, sözüm tükənib.

*19.03.2002*



***

Bu ahıl çağımda mənə yanaşıb
Sevgimə caladı səni bu sevgi.
Yaxasını açıb, yaxamı açıb
Yaman yaxaladı məni bu sevgi.

Eşqinlə o təhər səda salmısan
Məni başqa gözəl dindirə bilməz.
Sən məni elə bir oda salmısan,
Xəzər dənizi də söndürə bilməz.

*11.05.2002*

***

Ümidim çoxalır mənim get-gedə,
Artır qəzəlxanlar sözü kəsərli.
Başqa şairlərlə müqayisədə
Qəzəli saf yazır Ənvər Nəzərli.

Şadam ki, ənvərlə bu gün həmraham,
Hələlik ümid yox daha heç kimə.
Saf qəzəl odunu yandıran şaham,
Tüstüsü çatacaq varislərimə.

*23.05.2002*

## DÖRDLÜKLƏR

Sənin nə işinə, sən məni səslə,
Səni eşitməksə mənim işimdir.
Səni əzəlki tək sevəni səslə,
Bu - mənim ömürlük göstərişimdir.

*4.10.1995*

***

Bilirəm mən o gözəl dərdə şəfa eyləyəcək,
Yenə öz lütfünü, əlbəttə, əta eyləyəcək.
Mən düşəndən bəri sevdayə xətadən uzağam,
Söyləyən olsa "xəta" eşqə xəta eyləyəcək.

*16.10.1995*

***

Saf qəzəldən bizə illərlə səfa ətri gəlir,
Bəlli ki, gəlsə səfa ətri, şəfa ətri gəlir.
Mənə ilham pərisi öylə olubdur məhrəm,
Yetərək vəslinə, gördüm ki, vəfa ətri gəlir.

*28.10.1995*

***

Kədərə qərq olan insanə sevinc - arzu olar,
Təşnə hər aşiqə zənn eyləmə yardım - su olar.
Istəmir cənnəti Şahin o biri dünyadə,
Mən sənin vəslinə yetsəm mənə cənnət bu olar!

*12.11.1995*

***

Düşünmə sən ki, sənlə dərd edərdim,
Bütün ahı, fəğanı tərgidərdim.
Yanımda olsa idin hicr ölərdi,
Sənin dərdindən özgə varmı dərdim?

*14.11.1995*

***

Kim yanından yanıma gəlsə, səlamin söylə,
Saxlaram eşqi zəmanət, məni zamin söylə.
Görüşək, gün o gün olsun ki, a dilbər, təzədən!
Sən mənim eylədiyim niyyətə "amin" söylə!

*24.11.1995*

***

Gəlib çıx, yasə mən batdım. O zülfün yasəmən billəm,
Səninlə gəzdiyim qumsalı da, yarım, çəmən billəm.
Çox elmin sirrini öyrənməyə cəhd etmişik, amma
Heyf ki, sirrini eşqin nə sən bildin, nə mən bildim.

*5.12.1995*

***

Yenidən saldı məni sevgili canan gözdən,
Yenidən doldu mənim cismimə hicran gözdən.
Qəlbimi yaraləmiş, amma gözüm giryandır,
Nə səbəbdən üzümə axmadadır qan gözdən?

*24.12.1995*

***

Ötdü qış fəsli, ürək yazə həvəslənməlidir,
Elə donmuşdu canım, tazə həvəslənməlidir.
Daha yox gündə qəzəllər, nə ətalətdir bu?
Təbimin şahini pərvazə həvəslənməlidir.

*28.01.1996*

***

Deyəsən bitmədə artıq nigəranlıq vaxtı...
Doğacaq gün, ötəcəkdir bu toranlıq vaxtı.
Sən gələn tək yanıma, ey pəri, zülmət gedəcək,
Mənə üz verməyəcək qorxu qaranlıq vaxtı.

*2.02.1996*



***

Şövqə bax məndəki, hər ləhzə neçə fəndə düşüb,
Qəzələ, qoşmaya, hərdən də qıfılbəndə düşüb.
Özümə mən səni, ey gül, nə təhər bənd eləyim?
Neyləyim mən ki, mənim hər bir işim bəndə düşüb.

*6.02.1996*

***

Yağı meydanımı almaqda çətinlik çəkəcək,
Əldən imkanımı almaqda çətinlik çəkəcək.
Istəyim qopmasa hərgah canından, canan,
Əzrayıl canımı almaqda çətinlik çəkəcək.

*9.02.1996*

***

Söz çıxdı söz altından, qəm gəldi qəm üstündən,
Bir dəm bu ağır dərdim qopmur sinəm üstündən.
Ağlar nə qədər qalsın gözlər ki, səni gözlər,
Gülməzmi qələm çəksə aşiq ələm üstündən?

*11.02.1996*

***

Təzədən yandı canım qüssə, kədər, qəm oduna,
Belə yansa, yanacaqdır bütün aləm - oduna.
Görmüşəm mən o cəhənnəm odunu, yar var ki,
Yandırır yarı bu dünyadə cəhənnəm oduna.

*13.02.1996*

***

Sən düşərkən yadıma könlümdə qəm yaddan çıxır,
Dəmbədəm xatirdə idi, dəmbədəm yaddan çıxır.
Dilbərim dilləndi: - Sən ki, şənliyin müştağısan,
Dərd içində inləyən Qeysü Kərəm yaddan çıxır.

*23.02.1996*

***

Kim xəyal eyləsə hər qəlbə ümid yar olmaz,
Elə zənn eyləməsin məndə ümid var olmaz.
Ümidim öylə böyükdür ki, sığışmır köksə,
Ümidi olmayan aşiq ümidvar olmaz.

*27.02.1996*

***

Məni məstanə nə peymanə edir,
Nə gözəl saqi, nə meyxanə edir.
Kərəmi yandırır eşqin alovu,
Qeysi Leyla qəmi divanə edir.

*5.03.1996*

***

Hər bir diləyin hasili üsyan ilə olmur,
Rahətliyi hər hərb edənin qan ilə olmur.
Təklif eləyibdir yenə dərman təbibim,
Eşq əhlinə çarə axı dərman ilə olmur.

*6.04.1996*

***

Neçə qürbətdə əziyyətlə keçibdir günlər,
Gözəlim, gör nə vəziyyətdə keçibdir günlər.
Səni qəlbimdə apardım həmişə qürbətə də,
Sən kimi sevgili afətlə keçibdir günlər.

*11.05.1996*

***

Savaşırsan ki, bu aşiq savaşından qaçsın?
Mümkün işdirmi turac ovda laçından qaçsın?
Qucmuşam mən o səbəbdən başını, ey dilbər,
Qorxuram ki, saçının ətri başından qaçsın.

*23.05.1996*

***

Deyiləm mən elə aşiq ki, məni incidələr,
Elə ah eyləyərəm dürr dağıdar, inci dələr.
Bir zireh tək məni eşqim qoruyur, həmlən - əbəs,
Kim görübdür ki, polad bir zirehi inci dələr.

*25.05.1996*

***

O vəfasızla pozub əhdi sözümdən qaçıram,
Baxmıram güzgüyə hətta ki, gözümdən qaçıram.
Daha mən təzələşən Şahinəm! Ancaq irəli"
Qaçmıram tək o bəladən, öz-özümdən qaçıram.

*27.05.1996*

***

Dağlardakı çəndirmi? Bəyaz tülmü görünmüş?
Saçdırmı qoşa, ya gözə sünbülmü görünmüş?
Bülbül kimi susmaq nədi bilmir niyə Şahin?
Gülşəndə gözə yoxsa təzə gülmü görünmüş?

*5.06.1996*

***

Hər yan yenə güllləndi, çöl başqa, çəmən başqa,
Qalxdı dizəcən lalə, düz başqa, düzən başqa.
Sən Şahinə, ey əğyar, həmtay ola bilməzsən,
Sən başqa bir adəmsən, əlbəttə ki, mən başqa.

*20.06.1996*



***

Doğmasa indi günah əhli günah etməkdən,
Doyacaq həqq günəhkarə pənah etməkdən.
Bu qədər ah ki, çəkdim, ölürəm, cananım,
Kəsilibdir, nəfəsim qalmadı ah etməkdən.

*10.04.1996*

***

Qələmim əldə, varaq öndə, qəmim odlandı,
Elə odlandı ki, qəmdən qələmim odlandı.
Bəs mənim başıma sevda açacaqdır nə oyun -
Xarab oldu başı Qeysin, Kərəmim odlandı.

*6.05.1996*

***

Ölləm o vüsalım yenə təkrar ola bilsə,
Yarım təzədən bir də həmin yar ola bilsə.
Oldum buna şahid ki, gözəllərdə vəfa yox,
İnkar edərəm eşqi də, inkar ola bilsə.

*6.05.1996*

***

Mənə sevda pərisi bir də əyan olmuşdur,
Yenə gerçəkdi vəsl, hicr güman olmuşdur.
Məni canan ilə gülşəndə görənlər dedilər:
- Qoca Şahin deyəsən bir də cavan olmuşdur.

*6.05.1996*

***

Ey məhəbbət saqisi, bir cam məhəbbət ver mənə,
Yox təmənnam heç nədən, ənam məhəbbət ver mənə.
Sübh tezdən busə ver, yarım, günorta aç qucaq,
Axşamüstü naz elə, axşam məhəbbət ver mənə.

*6.05.1996*

***

Sevər idim qəmin - hərgah qəmim olsaydı,
Ələmin tərk eləməzdim ələmim olsaydı.
Saçının tərifini qurtara bilməzdim mən
Saçının sayı qədər gər qələmim olsaydı.

*6.05.1996*

***

Dəryada damlanı görmək asandır,
Damlada dəryanı görməyi bacar.
Əl atıb zərrənin örtüyünü cır,
Zərrədə dünyanı görməyi bacar.

*27.06.1996*
*Qum*

***

Məqsədim - zülmü ki divanə çəkir, bilməkdir,
Leylinin cövrünü mərdanə çəkir, bilməkdir.
Cismi pərvanə kimi şəm oduna yandırıram,
Niyyətim - həzzi ki pərvanə çəkir, bilməkdir.

*26.07.1996*

***

Yanmazdısa can, gözdə yaş olmaz idi böylə,
Heç məndə qətiyyən təlaş olmaz idi böylə.
Qəlbində onun, eyləyirəm zənn ki, daş var,
Yoxsa o pəri qəlbidaş olmaz idi böylə.

*27.07.1996*

***

Demə əfv eləyim səni, ey nigar,
Məni daha çəkmə çəmənə, bağa.
Səni əfv eləmək günahım olar,
Sən layiq deyilsən əfv olunmağa.

*5.10.1996*

***

Gözə bir dəfə göründün, gözəlim, bir də görün,
Sözü xoş, söhbəti şirin-məzəlim, bir də görün.
Buna yox şəkk, nə qədər mən səni görsəm o qədər
Səni vəsf eyləyəcəkdir qəzəlim, bir də görün.

*12.12.1996*

***

Mərəkən bir inqilabdır gah şirin, gah acı,
Xoş sözün eynən şərabdır gah şirin, gah acı.
Kim sual eylərsə etsin barəsində sevginin,
Şairəm, şerim cavabdır gah şirin, gah acı.

*17.12.1996*

***

Ömrümün gülşəni sənsiz idi - qar oldu mənə,
Qışdasa ruzigarım sənlə - bahar oldu mənə.
Mən dil açdıqda təəccüb eləyiblər, çünki
Ilk sözüm, şahid olub bir çoxu - "yar" oldu mənə.

*19.12.1996*

***

Gülüm, iqbalımda zəfər görürəm,
Məhəbbət bağında bəhər görürəm.
Zülfünə baxanda - qaranlıq gecə,
Hüsnünə baxanda - səhər görürəm.

*5.01.1997*



***

Gül qədrini bilməz kəsə gül göndərən olmaz,
Kal meyvəni, əlbəttə, ağacdan dərən olmaz.
Dağ altda qalıbsa qızılın qədri bilinməz,
Çap olmasa şerim ona qiymət verən olmaz.

*2.02.1997*

***

Yuxu ayrılığa kəsilib qənim,
Allahım, məni çox yuxudan saxla.
Şadam ki, əzəldən yuxum az mənim,
Çox iş görmək olmaz çox yuxlamaqla.

*13.02.1997*

***

Göydən yerə nur yağa
Güllə yox.
Busə dəyə yanağa,
Şillə yox!

*21.02.1997*

***

Öyünmə, ey muğamatçı, səsim hər səsdən üstündür,
Məni həbs eyləmiş saqi, yerim məhbəsdən üstündür.
Yarım, vəsf eylərəm daim səni, kimdir ərəb Leyla?
Sənin rüxsarını görmək mənə hər kəsdən üstündür!

*6.03.1997*

***

Hansı bir yerdə ki, söhbət o gözəldən düşəcək,
Bəlli ki, ondakı çox türfə əməldən düşəcək.
Neçə ildir ki, əlim əllərini tutmuşdur,
Əlini verməsə dilbər əlim əldən düşəcək.

*9.04.1997*

***

Dərd eyləməyi mən kimi hər fərd bacarmaz,
Gəlsən yanıma sən mən ilə dərd bacarmaz.
Namərdə görünmüşmü məgər mərd deyilsin?
Mərdanəliyi, bəlli ki, namərd bacarmaz.

*20.04.1997*

***

Gör nə günə qaldım, a zalım fələk,
Bildirçin oxuyur şahinə meydan.
Mənim kimi alim çox yetişəcək,
Amma, az gələcək mən tək qəzəlxan!

*10.05.1997*

***

Məni divanə bilir yar, bilirəm bildiyini,
Etmirəm mən bunu inkar, bilirəm bildiyini.
O da şairdi, Füzuli ona da örnəkdi,
Bilir eşq içrə bəla var, bilirəm bildiyini.

*2.06.1997*

***

Kim desə, ey pəri, qürbətdə şənəm, şər görünər,
Bir gözüm Qudyal olubdur, biri Tərtər görünər.
Mən əgər tərk eləyib qürbəti dönsəm yanına,
Ağu içsəm də əlindən mənə şəkkər görünər.

*27.06.1997*

***

Saqi, gətir badə, təmənnası var,
Düşdü yenə yadə, təmənnası var.
Mən qəzəli sadə dedim, Şahina,
Sadə kəsin sadə təmənnası var.

*8.07.1997*

***

Arif olana qayə, əqidə, məram üstün,
Aqil kəsə dəftər-qələm, əyyaşə cam üstün.
Əmmamənin altındakı nadan bir adamdan
Əmmamənin üstündəki aqil adam üstün.

*12.07.1997*

***

Unutmuşam gileyi,
Yoxdu kin məramımda.
Varmı intiqam meyi
Məgər sevgi camımda?

*6.08.1997*

***

Həzz tapıbdır ürəyim dərd itiribdir yenə də,
Sinəmin gülşəni al gül bitiribdir yenə də.
Dedilər Məcnun ölübdürsə də, Şahin doğulub,
Yeni aşiq kimi meydanə giribdir yenə də.

*9.08.1997*

***

Get, get, daha göz sən gözələ baxmasa yaxşı,
Bundan belə ay doğmasa, gün çıxmasa yaxşı.
Göz yaşlarımı qonşu görüb qorxuya düşdü,
Göz yaşları xalqın evini yıxmasa yaxşı.

*18.08.1997*



***

Allahım, yalvarıram arzu-dilək sındırma,
Cümlə zəhmətçəkənin fikrini çək, sındırma.
İstəsən güzgüsünü vur daşa İsgəndərinin,
Lap Cəmin camını sındır da, ürək sındırma.

*23.09.1997*

***

Görən olmaz məni qəm-qüssəli bundan sonra,
Gözəlim, olmalıyam qüvvəli bundan sonra.
Dəli olmuş deyə Məcnun belə məşhur olmuş,
Özümü etməliyəm mən dəli bundan sonra.

*27.09.1997*

***

Fəxr ilə deyən var ki, qızıldan dirəyim var,
Mənsə deyirəm qəmdən üzülmüş ürəyim var.
Yusif kimi hicran quyusundan çıxa bilsəm,
Şövq ilə vüsal dağına çıxmaq diləyim var.

*2.11.1997*

***

Qəlbimdə fərəh yox yenə, qəmdən gileyim var,
Var dərdü ələm, dərdü ələmdən gileyim var.
Əlbəttə, giley çoxdu, qələmdir buna bais,
Az yazmadadır şeri, qələmdən gileyim var.

*18.11.1997*

***

Neynirəm qeyri dilaramı, bəsimsən, gözəlim,
Nə qədər var nəfəsim həmnəfəsimsən, gözəlim.
Seyyid "Aləmdə səsim var" demiş fəxr ilən,
Olmasam mən, mənim aləmdə səsimsən, gözəlim.

*22.11.1997*

***

İşıqlıq olacaq od aləmində,
Hər tərəf yanacaq, hər yan yanacaq.
Deyirlər Allahın cəhənnəmində
Yanacaq yerinə insan yanacaq.

*10.12.1997*

***

Qorxudan çox uzaq olsam da, amma
Tüfəngin yaydığı səsdən qorxuram.
"Qorxuram" deyərsəm deyil müəmma,
Allahdan qorxmayan kəsdən qorxuram.

*5.01.1998*

***

Ey qaranlıq gecə, get, ağ daha da yaxşı olar,
Saqi, çıx meyxanadan, bağ daha da yaxşı olar.
Gülü gül səsləyəcək, bülbülü bülbül yenə də,
Qədəhi bağə aparmaq daha da yaxşı olar.

*19.01.1998*

***

Sözlər nə gözəl, bir daha eyham ola bilmir,
Gözlər nə gözəl, göz yaşına cam ola bilmir.
Hərçənd təlatüm daha yoxdur ürəyimdə,
Düşdükdə məhəbbət yada, aram ola bilmir.

*23.01.1998*

***

Qardaşı, sirdaşı quca bilməyən
Gedib qara daşı qucmaq istəyir.
Tövbə qapısını aça bilməyən
Kəbə qapısını açmaq istəyir.

*27.01.1998*

***

Əcnəbi sözlə nə vardır ki şerlər deməyə?
Ağı qarə, qaranı ağ yazırlar yenə də.
Yazılan kəlmələri dil utanır söyləməyə,
"Aşiq"in cəmini "üşşaq" yazırlar yenə də.

*29.01.1998*

***

Ey qəzəlxan, vurulubsan yenə də yad sözünə,
Sən gərək içməyəsən Azəribaycan suyunu.
"Abi-heyvan" ki, deyirsən, ola qismət özünə,
Sənin olsun hamısı, nuş elə heyvan suyunu.

*2.02.1998*

***

Sənin bircə anlıq sinə dağından
Sinəmin dəmbədəm dağlanmağı xoş.
Düymənin eşqsiz açılmağından
Düymənin eşqsiz bağlanmağı xoş.

*3.02.1998*

***

Özümə hey "qocal, qocal" deyirəm,
Təbimsə get-gedə alışıb yanır.
Ömrümün sonunu mən gözləyirəm,
Gününsə sonunda kölgə uzanır.

*29.03.1998*



***

Şerin bəndəsi - sən, sultanı - mənəm,
Sultan ümman isə, bəndə bir gilə.
Görən hər şerində nöqsanı mənəm,
Şairlik görünmür səndə bir gilə.

*10.04.1998*

***

Səni Leyla sayağı, qıyma ki, biçarə görüm,
Bir gilə göz yaşını qoyma ki, fəvvarə görüm.
Işdi-şayəd, gözəlim, dönsən əgər 'əhdindən,
Mən sənin halını xalın kimi qapqarə görüm.

*21.04.1998*

***

Niyə yetməyir nigarın mənə çarələr əlindən?
Axı, mən fəğanə gəldim yenə yarələr əlindən.
Qara rəngi sevməsəm də neçə rənglər içində
Günü qarə oldu Şahin gözü qarələr əlindən.

*28.04.1998*

***

Bənzəməyəcəyəm sən qardaşıma,
Əqlim var, ey Məcnun, dərdə bax, dərdə.
Hava gəlməyəcək mənim başıma,
Hava çatışmayır bizim şəhərdə.

*17.05.1998*

***

Aralı deyilik günlə qəmər tək.
Amma isitməyir eşqın eşqimi.
Ayrıla bilməyirik canla ciyər tək,
Birləşə bilmirik odla su kimi.

*19.05.1998*

***

Səni düşünürəm mən bütün günü,
Eşq odum yanırmı canında sənin?
Ağappaq etməsəm əgər gününü,
Üzüm qara olsun yanında sənin!

*28.05.1998*

***

Üzünə sövq eləyib diqqətimi
Düşmüşəm mən nə gözəl sevdayə.
Gözünü yumma görüm surətimi,
Gözünü bənzədirəm aynayə.

*1.06.1998*

***

Hər kamallı görünən rəhbərə Harun deməyək,
Ya da zəngin sayılan adəmə Qarun deməyək.
Çalışaq incimәsin ruhu onun bizlərdən,
"Leyli-Leyli" deyən hər aşiqə Məcnun deməyək.

*28.06.1998*

***

Nə vaxt yetişəcək hicranın sonu?
Ağır dağ varmıdır sinə dağı tək?
İstərəm oxşayım sənin boynunu
Bəyaz boynundakı boyunbağı tək.

*17.07.1998*

***

Nə rəvandır, gözəlim, dil səndə,
Şerimin kaş elə ahəngi ola.
Daima istəyirəm çöhrəndə
Çiçəyin ətri, meyin rəngi ola.

*19.07.1998*

***

Görəsən köməksiz varmı mənim tək?
Bəlkə də tək sənsən pənahım mənim.
Günaha batmışam səni sevərək,
Səni sevməyimmiş günahım mənim.

*27.07.1998*

***

Saf qəzəlçin çox əziyyət çəkirəm, gər bilsən,
Söyləyərsən ki, adamsanmı məgər, sən filsən.
Türk sözüylə qəzəli nəzm eləmək müşküldür,
Bacara bilməyəcəksən bunu, ey qafil, sən.

*24.08.1998*

***

Fəth etdin fateh kimi,
Bac-xəraclığın olmaz
Və yedin ürəyimi,
Sənin aclığın olmaz.

*25.08.1998*

***

Deməyin "dön geri, baş qoşma, əzəldən düşmüş",
Yox canım, qəlbimə xal tək o gözəldən düşmüş.
Qoymuram boş qala səhranı, əzmlən gedirəm,
Neyləyim mən axı, Məcnun daha əldən düşmüş.

*15.10.1998*



***

Var hurim, deməsinlər ki, şüurim yoxdur,
Qılmanam mən, deyən olmaz daha hurim yoxdur.
Dikinə gəl gözlərini gözlərimə, ey dilbər,
Bir xəta baş verəsi olsa, qüsurim yoxdur.

*23.11.1998*

***

Bizə həsrət qalıb Qarabağ yolu,
Sözlə hərb udmağın əsası varmı?
Vəsləmi aparır bu fəraq - yolu?
Bu yol çox uzundur, qısası varmı?

*30.11.1998*

***

Düz yolla getmişəm ömür boyu mən,
Düz yolla yeriyən yıxıla bilməz.
Sənsə dağa çıxmaq niyyətindəsən,
Dağdan düşməlidir dağa çıxan kəs.

*7.12.1998*

***

Nəsə narahatlıq yaranıb məndə,
Qəfil bir ölümü gözləyirəm mən.
Hər səhər əynimə köynək geyəndə
Elə sanıram ki, geyirəm kəfən.

*9.01.1999*

***

Girinci olmuşam çox müsibətin,
Dərdimi heç kəslə bölə bilmirəm.
Yaşamaq da çətin, ölmək də çətin,
Yaşaya bilmirəm, ölə bilmirəm.

*13.01.1999*

***

Təbim gündən-günə ərşə yüksəlir,
Hey vəcdə gəlirəm ilham pərimdən.
Mənə deyirlər ki, gül ətri gəlir
Gülə həsr etdiyim şerlərimdən.

*19.01.1999*

***

Yarım, cövrün yenə sinə dağlayır,
Aşiqi necə də bu dağ sındırır.
Ağac - bar yetirir, budaq - saxlayır,
Bar isə yetişib budaq sındırır.

*28.01.1999*

***

Özün nə gündəsən şerin nə gündə...
Sənə baş qoşuram neçin mən axı?
Ox kimi dümdüzəm hamı önündə,
Amma sən kaman tək əyrisən axı.

*3.02.1999*

***

"Yox" deyib elədin canımı xəstə,
Çəkdin bir sözünlə mənə min dağı.
Əlimi qoymuşam sinəmin üstə,
Əlimin altında sinəmin dağı.

*12.02.1999*

***

Ey vətən torpağı, vətən torpağı,
Səndə Qoşqar dağı, məndə yar dağı.
Öyünmə Şahdağın, Göyəzənin var,
İndi Şahinin də axı var dağı.

*15.02.1999*

***

Mənim öz yolum var, öz üslubum var,
Dilim haqq deməkdən kiriyə bilməz.
Çəkməmi, yəqin ki, geyən tapılar,
Amma, yerişimi yeriyə bilməz.

*19.02.1999*

***

Gəzirəm çöldə küləklərlə keçir əyyamım,
Pakizə, ülvi diləklərlə keçir əyyamım.
Məni bezdirdi adamlar, gəzirəm xülyalı,
Adamam, amma mələklərlə keçir əyyamım.

*12.03.1999*

***

Ərazim yer ilə hüdudlanmayır,
İndi insan deyil həmdəmim mənim.
Şahin bu kürəni hüdud sanmayır,
Başqa aləmdədir aləmim mənim.

*19.03.1999*

***

Qəlbimə yazılıb elə iztirab
Biri oxunursa, onu oxunmur.
Ömür kitabımsa elə bir kitab,
Əvvəli düşübdür, sonu oxunmur.

*24.05.1999*



***

Nəzəri cəlb eləyir hər gülşən,
Çal-çağır əyyamı, saz vaxtı gəlib.
İncidim amma məhərrəmlikdən,
Nə müsibətdi bu yaz vaxtı gəlib?

*26.05.1999*

***

Min savab eyləmişəm, bircə günahım gəlməz,
Qalmışam dərdü bəla içrə, pənahım gəlməz.
Demisən sən ki, sabah olmalısan yanımda,
Qorxum ondandı ki, ey yar, sabahım gəlməz.

*9.06.1999*

***

Ey şux, əlindən daha heç əl çəkərəmmi?
Bir qeyrisinin zülfünə seyqəl çəkərəmmi?

Rəssamı olub bir neçə büt şəklini çəkdim,
Bir kimsəni səndən də mükəmməl çəkərəmmi?

*14.06.1999*

***

Aşiqəm, məni dərdim,
Zərgəri zər yaşadır.
Olmasaydı ölərdim,
Məni kədər yaşadır.

*29.06.1999*

***

Gündən-günə əğyarlərə yad oluram mən,
Xoşdur bu ki, çox aşiqə imdad oluram mən.
Meyxanəni gördükdə açıq şənliyim artır,
"Allahə şükür söyləyibən şad oluram mən.

*3.07.1999*

***

*Həsədkar bir qəzəlxana!*

Dərvişəm, Tanrıma "hu" deyirəm, "hu",
Dilimdə həmişə "Yahu" olacaq.
Sən həsəddən ölsən, həyatın boyu
Etdiyin yaxşı iş tək bu olacaq.

*30.07.1999*

***

Gəzir xoş günlərin istiqbalında,
Cahilə qürbət də, vətən də birdir.
Mənimsə gözüm yox dünya malında,
Aşiqə köynək də, kəfən də birdir.

*5.08.1999*

***

Cəlb etmir meyxana büsatı məni,
Bezdirib bu dünya həyatı məni.
Ölərsəm, ucadan bir bayatı de,
Oyatsa oyadar bayatı məni.

*15.08.1999*

***

Mən sənəm, dönmüşəm çox hədər sənə,
Əzizim, mən məni unutmaqdayam.
Səcdə eləmişəm o qədər sənə,
Namazda səcdəni unutmaqdayam.

*18.08.1999*

***

Şairin xətrinə dəyən adamsan,
Nahaqdan özünü öyən adamsan.
Axı, bacarmırsan şer yazmağı,
Həvəng ilə hava döyən adamsan.

*31.08.1999*

***

Göz yaşım quruyub, daha çağlamır,
Yarın həsrətiylə gərək yaş - yağa!
Gözüm ağlamaqdan qorxub, ağlamır,
Tez olun, aparın məni çildağa.

*6.09.1999*

***

Camı əgər sınsa, camın sahibidir, Cəm nə olar?
Qədəhim sındı, meyi şişədən içsəm nə olar?
Guya bir qeyrisi yoxdur, dolaşıbdır canıma,
Görəsən, ölsə bu Şahin o zaman qəm nə olar?

*15.09.1999*



***

Ey saqi, özümü məst görürəm mən,
Sən gözüm önündə durandan bəri.
Kim aşiq olmursa səni görərkən,
Demək, o adamın yoxdur gözləri.

*17.09.1999*

***

Ölkədə haqsızlıq görür nə qədər...
Şahin istəməyir geyə papağı.
Yaxın gəlin mənə, ey müştərilər,
Satıram bir qədəh meyə papağı.

*23.09.1999*

***

Ölüm qurtulacağam
Əlindən qəmin, ahın.
Göydə məst olacağam
Meyi ilə Allahın.

*28.09.1999*

***

Imtina elədin sözümdən mənim,
Bədxah zənn edirəm özümə səni.
Elə düşübsən ki, gözümdən mənim,
Qaytara bilmirəm gözümə səni.

*26.10.1999*

***

Çox dedi çətinə "can",
Şahin pis günə düşüb.
Hardadır düyünaçan?
Işim düyünə düşüb.

*3.11.1999*
*Lənkəran*

***

Yandırmısan, nə çarə et, nə yardım,
Qəlbim sənin eşq odunla dağlanıb.
Əgər zəncir olsa idi qırardım,
Ayaqlarım zülfün ilə bağlanıb.

*13.11.1999*

***

Hər dəm edirəm arzu səni, arzu - şerdir,
Könlümdə əgər var isə xoş duyğu - şerdir.
Lazımmı sənə qeyri kəsin yazdığı sözlər?
Canan, oxuyub şerimi dillən: Bu şerdir!

*18.11.1999*

***

Könül sənə olan arzularından,
Ürək diləyindən çəkilməyəcək.
Əlimi çəkirəm dünya varından,
Əlim - ətəyindən çəkilməyəcək.

*21.11.1999*
*Bağdada səfər ərəfəsində*

***

Məcnun necə oldu, Fərhad bəs hanı?
O - yumub gözünü, bu - qalmayıbdır.
Yeyir acgöz-acgöz yaratdığını,
Dünyanın üzündə su qalmayıbdır.

*5.12.1999*

***

Hey səcdə edirəm ulu Allaha,
Təvanlı eləsin mən natəvanı.
Əlimin qüvvəsi tükənib daha,
Əlim göyə qalxmır dua zamanı.

*11.12.1999*

***

Gözlərinin yaşını selləmə, ey molla, sən
Saqi yenə yer verir pəhpəhə meyxanədə.
Mən demirəm get hara, indi özün seç, bəyən,
Göz yaşı məsciddə, qəhqəhə meyxanədə.

*17.12.1999*

***

Gəl daha mənimlə burax söhbəti,
Bütün fərəhimi əvəz etdi qəm.
Çıxsın xatirindən dodaq söhbəti,
Səni dişim ilə öpə bilərəm.

*21.12.1999*

***

Yanıma gəlirsən yenə, ey pəri,
Kədəri canımdan tez ayır daha.
Sən mənim halıma yanandan bəri
Ürəyim kədərdən yanmayır daha.

*24.12.1999*

***

Dilim hamısını danışıb sənə,
Ürəkdə sözlərim tükənib daha.
Demə ki, "nə yaman susursan" mənə,
Yenə şerim olar, pənah Allaha!

*28.12.1999*



***

Inadkaram, ey mələk,
Belə sevən hayanda?
Köynək cırıla gərək
Düymə açılmayanda.

*30.12.1999*

***

Qaya da eşidir, dağ da eşidir,
Hər qulaq eşitmir sözümü mənim.
Qəzəldə saflığa öz izim gedir,
Heç kim gedə bilməz izimi mənim.

*3.01.2000*

***

Sanki daşdan çıxır çörək,
Fırlanıram gündüz-gecə.
Fırlanmayır çərxi-fələk
Amma mənim ürəyimcə.

*10.01.2000*

***

Fələyin əlindən mənəm bağrıqan,
Neçin düyün düşən sapı açılmır?
Qapıçı, gəl yetiş, harda qalmısan?
Üzümə bağlanan qapı açılmır.

*17.01.2000*

***

Eşqimiz qığılcım vermədə bizim,
Qığılcım nə zaman alovlanacaq?
Bir gün görərik ki, mənim əzizim,
Qəlbimiz içində alov yanacaq.

*22.01.2000*

***

Təbibin köməyi kömək deyildir,
Məhəbbət dərdinin çarası varmı?
Şahinə məsləhət gərək deyildir,
Aşiq məsləhətə qulaq asarmı?

*25.01.2000*

***

Üzündə əks edir qəlbinin kini,
Ürəyin yuvadır şərə, bilirəm.
Sənin ayinədə gördüklərini
Mən divara baxıb görə bilirəm.

*28.01.2000*

***

Ya İsa, adam var nəfəsi buzdur,
Sənin eşşəyinin çuluna dəyməz.
Qulaq var sırğadan daha ucuzdur,
Baş var ki, papağın puluna dəyməz.

*12.02.2000*

***

Göz yaşıdırmı axır, Dəclə çayıdır yoxsa?
Ürəyindirmi yanır, qəm sarayıdır yoxsa?
Şahin, ah eləmə bir də, qulaqlar tutulur,
Bu səninmi belə, Qeysin harayıdır yoxsa?

*15.02.2000*

***

Canım, varmı görən cənnət, cəhənnəm?
Yerdəyəm, görünmür başımın üstü.
Yerin bağrı oddur, göyüsə görməm,
Aşağı atəşdir, yuxarı tüstü.

*19.02.2000*

***

Hələ yaşayacaq, hələ çatacaq
Adamdan adama adamın adı.
Atam ölübsə də neçə il qabaq
Adımda yaşayır atamın adı.

*29.02.2000*

***

O güldən xəbər yox, böyükdür dərdim,
Yenə ümidsizlik!.. Fəlakətdi bu!!!
Bir təhər ovcuma yığıb öpərdim
Küləkdən gəlsəydi ümid qoxusu.

*13.03.2000*

***

Nə qədər diriyəm, nə qədər sağam
Kəsmərəm torpaqdan mən öz sevgimi.
Bir vaxt torpaq olub tapdanacağam
Ayağım altdakı bu torpaq kimi.

*17.03.2000*

***

Məndə ölməzliyə səbat - əbədi,
Yenidən olarıq diri üqbada *.
Vüsal müvəqqəti, həyat - əbədi,
Biri dünyadadır, biri üqbada.

*1.04.2000*

* Üqba - o biri dünya



***

Gün göydə qənimətdi, günün qədrini bil sən,
Gün gəldi-gedərdir, axı göylərdə yağış var.
Gülzardə, Şahin, qədəhi qoyma əlindən,
Fürsətdi bu dəmlər ki, bahardan sora qış var.

*8.04.2000*

***

Ey özündən razı balaca adam,
Gözə görünürsən uzaqdan böyük.
Şerini arabir mən yamayıram,
Olur hər yırtığın yamaqdan böyük.

*12.04.2000*

***

Yarım, soldurmasın fəlakət - gülü,
Axıt göz yaşımı gəl, qurumasın.
Əlimdə bitibdir səadət gülü,
Yarəb, bu gül olan əl qurumasın.

*14.04.2000*

***

Eşqi mən ömürlük əhd eləmişəm,
Məgər eşq ən ülvi əməl deyilmi?
Aşiqlik - sənətim, aşiqlik - peşəm,
Aşiqlik hər şeydən gözəl deyilmi?

*18.04.2000*

***

Küçə!.. Mini gəlir, min biri gedir...
Qəribə həyatdır küçə həyatı.
Görəsən cənnətdə küçə necədir?
Orda küçələrin varmıdır adı?

*20.04.2000*

***

Mənə aşkar olan sənə - müəmma,
Sərvət tək saxlama qəlbində kini.
Dəryada sən köpük görürsən, amma
Mən isə dəryanın dibindəkini.

*22.04.2000*

***

Gülüm, dalaşqandı, çəkindi səndən,
Hicranın mənimlə cəngi dəyişdi.
Yaman tutqun idi, səni sevəndən
Yerin də, göyün də rəngi dəyişdi.

*25.04.2000*

***

Adımı həyatdan silməyim gəlir,
Onsuz da bir yana çatmayacağam.
Allaha and olsun ölməyim gəlir,
Ölməsəm, canana çatmayacağam.

*30.04.2000*

***

Sənə vəsiyyətim belədir, ey yar,
Ruhum ayrılanda bədən içindən
De ki, kəfənimi bağlamasınlar,
Bəlkə çıxacağam kəfən içindən?

*2.05.2000*
*Tehran*

***

Keç sinəm üstündən, yolunam sənin,
Başqa yolçu olsa qovlayacağam.
Yarım, qolubağlı qulunam sənin,
Kaş gözə gəlməsin bu yüksək məqam.

*12.05.2000*

***

Baxıram güzgüyə hərdən, üzümü görməyirəm,
Gecəmi görməyirəm, gündüzümü görməyirəm.
Sözşünaslar nə qədər söz yaradıb aləmdə,
Baxıram sözlər içində sözümü görməyirəm.

*19.05.2000*

***

Irfanla təsəvvüf qoşa qanaddı,
Surət yoxa çıxsa, məna var olmaz.
Biri digərinə doğru can atdı,
O parça olmasa, o paltar olmaz.

*24.05.2000*

***

Güzgülük etsə də mənə gözlərin
Heç zaman güzgü tək olma, ey nigar.
Baxsan ürəyində hazırdır yerin,
Güzgünün qəlbində hər kəsə yer var.

*28.05.2000*

***

Sevincin, fərəhin gedib hay-huyu,
Bezmişik fələyin bu qıtlığından.
Xızra nəsib oldu dirilik suyu,
Biz isə ölürük su qıtlığından.

*3.06.2000*



***

Qocalmaq istəmir anıb keçmişi,
Üzü qırış-qırış, saçları düm ağ.
Qoy bilsin saçını rəngləyən kişi:
Gəncliyi geriyə qayıtmayacaq!

*7.06.2000*

***

Bağdə yarımı gördüm, səpəcək gül başıma,
Yenidən toplaşacaqdır neçə bülbül başıma.
Mən oyaq vaxtı nigarımla vüsal istəyirəm,
Yuxuda vəslinə yetdim, qoy ola kül başıma.

*9.06.2000*

***

Yaddaşımda heç nə yoxdur, baş xarab olmaqdadır,
Baş xarab olmaqdadır, yaddaş xarab olmaqdadır.
Daşda bərklik olsa da, daşın dəxi daş ömrü var,
Hey çəkilməkdən qılınca daş xarab olmaqdadır.

*11.06.2000*

***

Bilməm yuxu nədir səni anarkən,
Gözümün qapağı aşağı düşmür.
Nə qədər baxsam da, Rəbbim, göyə mən
Başımın papağı aşağı düşmür.

*15.06.2000*

***

Süsən sünbül məgər yoxdur?
Susan bülbül məgər yoxdur?
Tikansız gül məgər yoxdur?
Tikansızdır gülüm mənim.

*21.06.2000*

***

Məndə küy olmasa da,
Səndə küy var, səda var.
Səslənməz dolu kasa,
Boş nağara guruldar.

*27.06.2000*

***

Eşqəm, məhəbbətəm iliyəcən mən,
Sevdasız kəslərdən gen olacağam.
Hələ ki, sevgidən olmayıb ölən,
Deyəsən birinci mən olacağam.

*14.07.2000*

***

Vəfadarəm, bilinməkdə sədaqət mülkümün qədri,
Cəsarət mülkümün qədri, şücaət mülkümün qədri.
Məhəbbət mülkümün qədri cahan mülkündən artıqdır,
Cahan mülkündən artıqdır məhəbbət mülkümün qədri.

*22.07.2000*

***

Çırpıram əllərimi gah dizimə, gah başıma,
Sirrimi mən niyə verdim görəsən sirdaşıma?
Məni daş yağmuruna qərq eləyib min daş atır,
O, axı dözməyəcəkdir atılan bir daşıma.

*24.07.2000*

***

Hanı atəşin, odun?
Edirəm hamıya car:
Ürək oddur, eşq odun,
Od odunla alışar.

*1.08.2000*

***

Sevinc daşıyan dünya,
Kədər daşıyan dünya...
Yaşatmaqla hamını
Özü yaşayan dünya.

*5.08.2000*

***

Mənim həzzim əzabımda,
Mənim nəşəm ələmimdə.
Mənim gücüm kitabımda,
Mənim əqlim qələmimdə.

*7.08.2000*

***

Bezmişəm, ey pəri, "Eşq" adlı boyat nəğməndən,
Qeys yoxdur daha... Leyla da yox olmuş kimidir...
Sındırıb könlümü sevda diləyirsən məndən,
Ümid ölmüş deyə sevda da yox olmuş kimidir.

*11.08.2000*

***

Qəzəl, qoşma, bayatı...
Qəzəl, qoşma, bayatı...
Qəzəl, qoşma, bayatı -
Şahinin nəqaratı.

*24.08.2000*



***

Adi rica deyil mənim sözlərim,
Qələmim nə yazsa ürəyim deyir.
Rədd olsun ayrılıq, gəl ey dilbərim,
Sən mənə ilham ver, mən sənə şer.

*1.09.2000*

***

Cahil - kabab məsti, aqil - kitab məsti,
Olmur gülab gülsüz, dilbər - gülab məsti.
Içmir şərab Şahin, amma ki, məst olubdur,
Şahin kimi sevən kəs olmur şərab məsti.

*3.09.2000*

***

Şerə yenə qəlbin giriftar isə,
Boynunu çiyninə qısıb dayanma.
Dilləndir dilini dilin var isə,
Divanələr kimi susub dayanma.

*8.09.2000*

***

O kimdir kədərdən yapışıb yenə,
Ilhamı bulaq tək çağlamır daha.
Şahindir, hicranı sıxıb köksünə,
Vüsaldan ötəri ağlamır daha.

*24.09.2000*

***

Qovaq canımızdan hirsi, hikkəni,
Səni əzizləyim, məni əzizlə.
Hicran gələn zaman, əzizim, məni
Açıb köynəyini yaxanda gizlə.

*28.09.2000*

***

Çəkdiyim qəm-kədəri şərh eləyim, mümkünmü?
Yetə bir gün sənə əhdim-diləyim, mümkünmü?
Həzrəti-Musa əsasından uzundur bu gecəm,
Gecəmin olması gündüz, mələyim, mümkünmü?

*12.10.2000*

***

Işıqsan, gün kimi, qəmər kimisən,
Gülüm, şirinlikdə şəkər kimisən.
Amma hicr odunda, fəraq suyunda
Məni əritmisən şəkər kimi sən.

*16.10.2000*

***

Çöhrəmdə xəzanın rəngi bərqərar,
Tənasübü vardır yaşın rəng ilə.
Yarın üzündəsə güllənib bahar,
Görürəm qarışıb neçə gül gülə.

*2.11.2000*

***

Daha şahinliyim əlimdən gedib,
Mənə əcəl quşu çatmaq üzrədir.
Həyat ümmanıma əlvida edib
Ömrümün gəmisi batmaq üzrədir.

*6.11.2000*

***

Xeyri yox yeri Qərb, Şərq olacaqdır,
Düşünmə kiməsə fərq olacaqdır.
Əgər əcəl seli coşub gələrsə,
Mahir üzgüçü də qərq olacaqdır.

*9.11.2000*

***

Şahini bezdirib həyat məskəni,
Ona ox atacaq, daş vuracağam.
Batmaq istəyirəm, buraxın məni,
Dənizin başına baş vuracağam.

*12.11.2000*

***

Nə qədər ki, məni ağuşə əcəl çəkməyəcək,
Bu sevən ömrü boyu sevgidən əl çəkməyəcək.
Mən ki söz rəssamıyam, ey pəri, rəssamların
Heç biri şəklini məndən də gözəl çəkməyəcək.

*12.12.2000*

***

Məndədir, sadə qəzəl heç kimdə!
Əcnəbi kəlmədən hey dad etdim.
Viran olmuşdu qəzəl əsrimdə,
Mən qəzəl mülkünü abad etdim.

*16.12.2000*

***

Şerim kimi, eykaş, həmişə dinə şerin,
Artırmadasan qədrini, yarım, yenə şerin.
Hüsnündə gözəllik elə çoxdur ki, sığışmır
Mənasına, misrasına, həm beytinə şerin.

*23.12.2000*



***

Çıxdım səfərə bir neçə ustad ilə birgə,
Sənan ilə, Məcnun ilə, Fərhad ilə birgə.
Əsl aşiqin əcdadı bu üç şəxsə deyərdim,
Yoldur, gedirəm ər kimi əcdad ilə birgə.

*24.12.2000*

***

Zülmət həyatımın çilçırağı - sən,
Ömür sarayımın, bil, dayağı - sən.
Vaxt vardı gül kimi gülərdin, gülüm,
İndi ağlayırsan şam sayağı sən.

*6.01.2001*

***

*Ələkbər Şahidin vəfatının bir ili münasibətilə*

Yoxluğun bir ili keçdi, neçə il həm keçəcək,
Bilmirəm amma ürəkdən nə qədər qəm keçəcək.
Bu fəna aləmi Şahin də keçər Şahid tək,
Neçə Mail * keçəcəkdir, neçə Rüstəm ** keçəcək.

*9.01.2001*

***

Iki "Divan"ım ilə öylə sərəfrazəm mən,
Qələmi bağlamayıb gündə gərək yazəm mən.
Nərdi bağla, zəri tulla, qapını yaxşı qapa,
Mən qumarbaz deyiləm, saqi, eşqbazəm mən.

*21.01.2001*

***

Baxıram bir yanar səhraya sarı,
Torpaq tək od tutur, alışır qəlbim.
Sevda səhrasında bitən otları
Allah sulamasa sulayacaq kim?

*27.01.2001*

***

Varlığım sənindir, varsan ki varam,
Məstanə baxıram hey yenə sənə.
Min dənə təsbeh mən bağışlayaram
Sənin xallarının bir dənəsinə.

*9.09.2001*

* Hacı Mail

** Rüstəm Samit

***

Əbəs yerə düşünmə
Məni sındırmağın var.
Mən elə kuzəyəm ki,
Daşa vursan daş sınar.

*23.09.2001*

***

Mən onu itirdim, taleyimə bax...
Görən çıxaramımı sabahkı günə?
Sanki neçə illik vaxt sərf olacaq
Hicran gecəsindən ümid sübhünə.

*16.10.2001*

***

Canımda ah ilə fəğan yanaşı,
Ürək parələnib, dil yarələnib.
Axır şəlalə tək gözlərin yaşı,
Mənim göz yaşımsa fəvvarələnib.

*19.10.2001*

***

Bağıma qaçırsan
Çiçəyim açılır.
Qapımı açırsan
Ürəyim açılır.

*21.10.2001*

***

Tərk edib səhranı, qurşanıb meyə,
Məhəbbətə salmır meylini daha.
Leyli qəhətliyi yaranıb deyə
Məcnun tapa bilmir Leylini daha.

*5.01.2002*

***

Yenə pərvanə kimi yandıracaqsan məni sən,
Gəlirəm yanına, şadlandıracaqsan məni sən.
- Yanağın zilləti çoxdur, - dedi, - Şahin, gəlmə,
Oda yox taqətim, odlandıracaqsan məni sən.

*29.01.2001*

***

Öləcək sevgi o dildarını əldən versən,
Varlığın olmayacaq varını əldən versən.
Şahina, quc yarı möhkəm, əlinin qədrini bil,
Əlin iflic olacaq yarını əldən versən.

*7.02.2001*



***

Hicran çiçəkləyir sevda gülümdə,
Səndən asılıdır, gülüm, nicatım.
Sənin səadətin - mənim əlimdə,
Sənin əlindəsə - mənim həyatım!

*15.02.2001*

***

Meyvə dərə bilsəydim əgər bar ağacından,
Olmadı canım böylə giriftar - ağacından.
Bir zülfü o yarın iki zəncir kimi möhkəm,
Assın məni bir zülfü ilə dar ağacından.

*9.07.2001*

***

Canım sızıltıyla, ağrıyla dolu,
Qüvvə tərk etmədə məni get-gedə.
Çəkir hacıları Kəbənin yolu,
Mənisə Qubanın yolu çəkmədə.

*12.07.2001*

***

Qocalıq məni tənha
Qoydu çox arzu ilə.
Meyə olan yanğımı
Söndürürəm su ilə.

*19.07.2001*

***

Ölkəmi işsizlik bürüyübsə də,
Sevgi aləminə səyahətim çox.
Işim məhəbbətdir, peşəm eşqdir,
Mənim işsizlikdən şikayətim yox.

*1.08.2001*

***

Adəmin yarpağı var,
Həvvanın donu yoxdur.
Hər şeyin sonu olar,
Eşqinsə sonu yoxdur!

*9.08.2001*

***

Vətənin düşünən başa vətən - baş,
Bülbülü öldürür gülşən həsrəti.
Ilahi, görüm ki, heç bir vətəndaş
Vətəndə çəkməsin vətən həsrəti.

*15.08.2001*

***

Mənə hədəri söz təsir eləyir,
Ürəyim dözməyir kəlmə dağına.
Şair var dilimi təhqir eləyir,
"Sağlığı-can" deyir "can sağlığı"na.

*21.08.2001*

***

Yetdi qürubim, günəşim batmada,
Asimanın al donu görsənmədə.
Əvvəli qalmış geridə, görmürəm,
Ömrümün amma sonu görsənmədə.

*3.02.2002*

***

Ürək əzəlki tək sınadı ağlı,
Ürək "yazma" deyir, ağıl "yaz" deyir.
Fikir şahinimin qanadı bağlı,
Amma o arabir uçmaq istəyir.

*3.03.2002*

***

Qəzəldə yenə də pəlid *, zəban var,
Xamları, ey Şahin, döyməkdən daşın.
Sənə nə qəzəli qəliz yazırlar,
Baş qoşma onlara var isə başın.

*21.03.2002*

***

Sevda dükanında, eşq bazarında
Olmayıb Yusifdən bahalı heç nə.
Gözlərimi həmişə sevgi varında,
Əvəz edə bilməz bu halı heç nə.

*31.03.2002*

***

Saqinin lütfünü görürəm meydə,
Hər biri qəlbimdən dərdi çıxardır.
Haramdır saqi də, haramdır mey də,
Haramın nə böyük ləzzəti vardır!..

*8.04.2002*

***

* səviyyəsiz, pis, yaramaz



Bomboşdur, əlimi doldura bilməz,
Cibə əlim çatmır, cib dərindədir.
Adam var başına "boşdur" deyilməz,
Adam da var başı ciblərindədir.

*16.04.2002*

***

*Ilqar Fəhmiyə*

Qoymaram qəlbimi deşsin güllə,
Güllə deşmək diləyim var mənim.
Qocayam, amma novcavanlar ilə
Kəlləleşmək diləyim var mənim.

*25.04.2002*

***

Öylə hopubsan mənə ki, məndəsən,
Incimə tən eyləsələr Şahinə.
Mən deyiləm mən, gözəlim, məndə - sən,
Var yeri "mən"siz desələr Şahinə.

*16.05.2002*

***

Dərdimin çarəsi yoxdur, ey ürək,
Ilham pərisini səndən ayırdım.
Sən mənim fikrimi dərk edənədək
Qələmi sındırdım, varağı cırdım.

*26.05.2002*

***

Yarəb, açıla nola sabahım gecə vaxtı,
Tənha oluram, yoxdu pənahım gecə vaxtı.
Gündüz çağı məşğul edirəm başımı, amma
Zarəm, ucalırt göylərə ahım gecə vaxtı.

*28.05.2002*

## TƏKBEYTLƏR

Başım üstündə buludlar görünür çadra kimi,
Göylərin çadrasını cırdı günəş görsəndi.

*26.09.1995*

***

Saç-saqqalımın ağlığı qardan da ağappaq,
Zövq almadayam amma saçı qarə gözəldən.

*28.09.1995*

***

Otağında, gözəlim, qalmağa izn olsaydı,
Oradan, fikr edirəm, həşrə qədər çıxmazdım.

*29.09.1995*

***

Məni ov şövqü ilə ovlağa göndərmə əbəs,
Şahinəm, amma bulaşmaz qana caynağlərim.

*3.10.1995*

***

Birinci aşiqdir Məcnun, mən isə
Birincidən sonra birinci aşiq.

*.10.1995*

***

Qəlbimi etmisən sən sınıq-sınıq,
Barı bir yerə yığ o sınıqları.

*25.10.1995*

***

Dilimə böylə şirinlik görəsən kimdən ki,
Acı hicranı şirin dillə bəyan etdim mən.

*29.10.1995*

***

Günbəgün göydə günəş həm itirir istiliyin,
Heç güman eyləmirəm səndə gözəllik tükənə.

*1.11.1995*

***

O səbəbdən ki, dönüb tutiyə sevmiş şəkəri,
Təbimin tutisi şer adlı şəkərsiz qalmaz.

*4.11.1995*

***

Baxıram hüsnünə, hüsnün elə bil nur çiləyir,
Ehtiyacım şama vardırmı, yanırsan bu gecə.

*6.11.1995*

***

Tutalım qəlbimi aldın əlinə badə kimi,
Sən əlimdən alacaqsanmı müsəlmanlığımı?

*16.11.1995*

***

Zilim fələyə çatır, bəmimi kimə deyim?
Allah asimandadır, qəmimi kimə deyim?

*30.12.1995*

***



Mən nələr çəkməmişəm eşqə giriftar olalı,
Canının düşmənidir eşqini dost zənn eləyən.

*5.01.1996*
*Tehran*

***

Hərçənd bu gün şahinəm eşq asimanında,
Məna bağının bülbülü ollam gələcəkdə.

*14.01.1996*

***

Əlim tək indi qısalmış dilim də, ey Şahin,
Qocalıq gəldi, deyildir əlim dilimdən uzun.

*16.01.1996*

***

Acı aləmdə şirin dəm yoxdur,
Sən ki yoxsan mənə aləm yoxdur (Epitafiya)

*16.02.1996*

***

Var qəmim, bəs hanı qəmxarlığımız?
Yorğunluğundan üzülür varlığımız (Epitafiya)

*18.02.1996*

***

Ürəyimdə, mələyim, qeyrisi yox, sən varsan,
Ürəyimlə niyə bəs böylə oyun oynarsan?

*3.03.1996*

***

Sən baxırsan mənə gendən, gözəlim, mən gendən,
Iztirabın ki çəkirsən, bilinir rəngindən.

*16.03.1996*

***

Şahin, yerə girsin, elə hicran uzanıb ki,
Var qorxu ki, ömrüm bu əzab ilə qısalsın.

*26.03.1996*

***

Məni cəlb etdi cavanlıqda məhəbbət sirri,
Qocayam, cəlb eləyir indi həqiqət sirri.

*3.04.1996*

***

Ali əməl uğrunda minlərlə şəhidlər var,
Mən həm şəhidəm, Şahin, oldum şəhidi eşqin.

*14.04.1996*

***

Deməsin daimiyəm kimsə fəna dünyadə,
Neçə Rüstəm yox olub, Gavə ölüb, Zal gedib.

*30.04.1996*

***

Qulağımdan çəkilməyir fəğanı,
Məcnun ölüb, fəğan hələ diridir.

*4.05.1996*

***

Vüsal aşiqlərə lalə bağışlar,
Hicran lalə rəngli nalə bağışlar.

*14.05.1996*

***

Ilanı qucmuşam neçə il demə...
Nə mənə Şahin de, nə Fazil demə.

*3.06.1996*

***

Elə ki badəni sənsiz içirəm, ey dilbər,
Içdiyim badə həmin ləhzə gözümdən süzülür.

*11.06.1996*

***

Mən də məstəm saqi də, məst ilə məstin fərqi var,
Mən inkarın məstiyəm, saqi şərabın məstidir.

*13.06.1996*

***

Hicrin küləyi əsmiş, vəslin külü sovrulmuş,
Heyfa, yenə bağ içrə həsrət gülü bitməkdə.

*14.06.1996*

***

Mən tərəfkeşliyimə son qoyuram son dəfə,
Bitərəflik mənə xoşdur, alışıb yanə tərəf!

*15.06.1996*

***

Görürəm günbəgün ömrüm qısalır, ey Şahin,
Amma, gündən-günə artır, uzanır ümmidim.

*16.06.2000*

***

Ey təbib, ərz etmə xidmət, bil ki, yarımdır təbib,
Sən də varsan, yar da var, sən gəlmə, varımdır təbib.

*25.06.1996*
*Tehran*

***



Qəlbində onun eyləyirəm zənn ki, daş var,
Yoxsa o pəri qəlbidaş olmaz idi böylə.

*2.07.1996*
*Iran Astarası*

***

Önümdə nadan kəs dayanan zaman
Susmaq imkanını vermirəm əldən.

*25.07.1996*

***

Gərək sevda bağından Leyla gülü dərəm mən,
Yarım şəhərdə qalmış, səhrayə getmərəm mən.

*30.07.1996*

***

Haray, icad olan dəmdən yazır hər dəm qələm qəmdən,
Azalmaz, bəllidir artar, əgər qopmazsa qəm qəmdən.

*1.08.1996*

***

Gülüm, eşqim ki eşqindir, neçin bəs intizarın var?
Canım almaq dilərsənsə, buyur, al, ixtiyarın var.

*6.08.1996*

***

Günbəgün əksilsə də ömrüm, ölümdən qorxmuram,
Günbəgün əksilməyir, artır vüqarım, mən mənəm!

*3.09.1996*

***

Gecə birdən-birə nurlandı bu gün, ey Şahin,
Yanına yar gəlib, sanma səhərdir açılan.

*25.09.1996*

***

Payızı başladı ömür fəslimin,
Eşqin də xəzanı gəlib yetişdi.

*27.09.1996*

***

Bilməm niyə doymur axı dürdanə yığanlar?
Yoxdursa da şahin quşunun danəsi, doydu.

*29.09.1996*

***

Var gümanım ki, yetim vəslinə mən,
Məni öldür, gümanı öldürmə.

*29.10.1996*

***

Sənə dil bir də kobudluq eləsə,
Dişlərim dişləyəcəkdir dilimi.

*1.11.1996*

***

Qəlbimi doldurma gileylərinlə,
Açılması vardır dolu tüfəngin.

*5.11.1996*

***

Dərk edə bilirikmi məgər yaraşığını?
Neçin tapdalayırıq biz ayın işığını?

*6.01.1997*

***

Qeys - oldu səhra Məcnunu, Leyla - çəmən Leylasıdır,
Şahin - vətən Məcnunidir, yarım - vətən Leylasıdır.

*11.02.1997*

***

Dostum olan adam ola bilməz mənə düşmən,
Düşməndi, girib cildinə dostun, gözə girdi.

*6.05.1997*

***

Həmləsindən qurtula bilmir bu gün kafərlərin,
Allahım, pəjmürdədir neyçün müsəlman aləmi?

*25.06.1997*

***

Fəryadıma yoxdur fələyin heyrəti, çünki
Fəryadımı Qeysin ürəyindən eşidibdir.

*5.07.1997*

***

Səndə var cövrü sitəm, məndəsə Əyyub səbri,
Nə sitəm səndə tükənməkdə, nə Şahində səbr.

*18.07.1997*

***

Mənsur "Ənəlhəqq" deməsəydi yaşayardı,
Şahin, yaşamaqdan ötəri söylə "Ənəlhəqq".

*28.07.1997*

***

Səfərim təmamə yetdi, gözəlim, hədiyyə istə:
Səən töhfə can gətirdim, qəbul et bu canı məndən.

*30.07.1997*
*Quba*

***



Öldü, - deməsinlər, bu da, dəfnimdə desinlər:
Yer kürəsini əyninə paltar kimi geydi (Epitafiya).

*8.08.1997*

***

Gündüz-gecə axmaqda gözündən yenə yaşlar,
Aşiq, necə odsan, nə alovsan ki, suyun var.

*17.08.1997*

***

Söylənmə sözün şordu, şirinlik sözə lazım,
Yarım, kababın ləzzəti duzsuz ola bilməz.

*24.08.1997*

***

Gördün ki, gərilmiş sən olan səmtə yay - əldə,
Yaydan çıxası amma ki oxdan xəbərin yox.

*30.08.1997*

***

Söndürürlər gecə bitdikdə, əzizim, şəmi,
Gözümün şəmi xəyalınla yanır gündüz həm.

*7.09.1997*

***

Hərgəh dayanar olsa Yer kürrəsi gərdişdən,
Şahin, yenə sev yarı, əl çəkmə bu vərdişdən!

*11.09.1997*

***

Üstünə nifrətimi yağdırıram yağmur tək,
Nə "salam" ilə yaxınlaş, nə "əleyküm"lə mənə.

*14.09.1997*

***

Elə ki, saqi yetişdi bu kəsin diqqətinə
Əlinə baxmayıram mən, baxıram surətinə.

*28.09.1997*

***

Söylədim: - Məst olmuşam eşqinlə, ver busə, dedi:
- Kim ki məst olmuş məgər saqi verərmi mey ona?

*3.10.1997*

***

Dərvişin paltarının rəngini sordun məndən,
Dərvişin paltarı vardırmı məgər rəngi ola?

*21.10.1997*

***

Batdımsa da mən, Şahina, eşqin dənizində,
Bəxti yar olan aşiq üzüb sahilə çıxdı.

*24.10.1997*

***

Söz söyləsə hər kəs eşidə bilmirəm əsla,
Canan, qulağım səndədi, avaz eşitmir.

*29.10.1997*

***

Aləm buna şahid qapım heç vədə döyülmür,
Çünki, gecələr həm qapımı bağlamıram mən.

*1.11.1997*

***

Nə mənə xeyri dəyibdir, nə də ki başqasına,
Mən gərəkdir ki cıram indi ürək dəftərimi.

*4.11.1997*

***

Ölkəmdə, səbəb var ki, qiyam eyləyirəm mən,
Ya şeyx, qiyamət günü bundan da betərmi?

*21.11.1997*

***

Sən mənim səbrimi almışsan əlimdən, ey şux,
Nə yaman qarət edibsən məni, qarətgərsən!

*29.11.1997*

***

Razıyam barmağa batsın tikanı,
Təki düşsün əlimə bir də o gül.

*11.12.1997*

***

Öz evinə versə tək diqqətini mollalar,
Onda şəriət evi get-gedə bərbad olar.

*17.12.1997*

***

Cahilin qoy evi olsun abadan,
Mənə fazilliyimi bildirdi.

*20.12.1997*

***

Yerdədir, amma gözü göylərdədir,
Şahini, əlbəttə, səma cəlb edər.

*22.12.1997*

***



Qəbr üstdə qucub baş daşımı ağla ürəkdən,
Ey yar, təsəvvür elə baş daşı başımdır.

*26.12.1997*

***

Necə düzgün yaradıbdır Yaradan, ey əyyaş,
Qədəhi verdi sənə, amma ki, ilhamı mənə.

*29.12.1997*

***

Bağda ətri, qoxunu, rayihəni alma vecə,
Bil ki, mən yanmadayam gəlsə kababın qoxusu.

*11.01.1998*

***

Kipriyim öylə çəpərdir ki, tutub göz yolunu,
Kipriyim qoymayır əsla yuxu gəlsin gözümə.

*14.01.1998*

***

Tuti kimi üç-dörd sözü əzbərləyən adəm
Heç vədə bu Şahin kimi bülbülləşə bilməz.

*21.01.1998*

***

Neçə müddətdi qara görmədəyəm dünyanı,
Bəxtimin qarəliyindənmi qaralmış dünya?

*16.02.1998*

***

"Vardırmı məhəbbət?" deyə sordun, nə deyim mən?
Zülfün sayağı şərhi uzundur bu sualın.

*18.02.1998*

***

Ayrılıq şerini yazmaq gərək daşa, çünki
Göz yaşımdan qaralır sözlərim varaq üstdə.

*25.02.1998*

***

Məşəl kimi, bəzən də, qəzəbdən alışır qəlb,
Qəlbimdəsən, ey gül, onu yandırma, yanarsan.

*11.03.1998*

***

Pərvanə yanıb-söndü, budur dərdinə çarə,
Biçarə o kəsdir ki, yanır mən kimi, sönmür.

*16.03.1998*

***

Güvə də gəzsə eşitməkdəyəm addım səsini,
Nə deyirsən de, səni bil ki, eşitmir qulağım.

*27.03.1998*

***

Yansın ciyərim eşqinə qoy, ağlayıram mən,
Artır duzu, göz yaşları axdıqda, kababın.

*30.03.1998*

***

Ey molla, tərəddüd eləsəm nakişiyəm mən,
Qır qəlbimi, mey şişəsini qırma, amandır.

*1.04.1998*

***

Bəlası böyükdür aşiq olmağın,
Başını itirir eşqi tapan kəs.

*2.04.1998*

***

Ey fələk, hələ ki, görən olmayıb
Çobanı çomaqsız, məni qələmsiz.

*9.04.1998*

***

Şöləlləndim, deməyin "qorxu var ki, can yansın",
Qorxuram mən bu alovdan bütün cahan yansın.

*22.04.1998*

***

Bilməyirəm mən necə eyləmişəm dərdə tab,
Dərd ikiqat artacaq - qədd ikiqat olmada.

*26.04.1998*

***

Yığmışam min dürlü xislət qəlbimə - kindən səva,
Başqa bir dinim mənim yox eşq dinindən səva.

*2.05.1998*

***

Söz evində sözü gəl saxlama, Şahin Fazil,
Şüşədə qalsa əgər ətri bilinməz ətrin.

*7.05.1998*

***

Aşiqəm, dilbər yanımda, şişə öndə, əldə gül...
Öylə bir aləmdəyəm ki, aləmim aləmdə yox.

*9.05.1998*

***



Gəl mənə söz demə söz qabağında,
Bütün "şerlərin" göz qabağında.

*11.05.1998*

***

Şahdağə dedim: Şahin idim, dağyaran oldum,
Dağ qəhqəhə çəkdi, dedi: - Fərhad deyilsən!

*30.05.1998*

***

Əvvəlcə atam, sonra anam köçdü cahandan,
Dürri-yetimə* bəllimi Şahin yetim oldu?

*3.06.1998*

***

Hər qəliz şer ki, düşmək başa müşkül kimidir,
Çürüyən bağda xəzəldir, büzüşən gül kimidir.

*5.06.1998*

***

Şair ki, salır sevgini yadə, üzü gülsün,
Şair ki, yazır həcv ilə mədhiyyə, söyülsün!

*13.06.1998*

***

Diləyirsən sənin, ey şux, olum qurbanın,
Şahinəm mən, uçuram göydə, qoyun sanma məni.

*18.06.1998*

***

Dedi meyxanəçi: - Meyxanədə msey yoxdu, - dedim:
- Mən olum, saqi ola, yoxsa da mey sərməstəm!

*20.06.1998*

***

Boş sözdü deyirlər ki, ölümdən yaxa qurtar,
Şahin, acıdır günlərim, ölmək nə şirindir!

*22.06.1998*

***

Atmınən olmadım həyatım boyu,
Neçin yəhərlədin hicran atımı?

*23.06.1998*

***

Oğrunu çirkin əməldən uzaq etmək müşkül,
Başına qoysa da şeyxin əgər əmmaməsini.

*27.06.1998*

***

* Məhəmməd (s) peyğəmbərin nisbələrindən biri

Heç nə cəlb eyləməyir diqqətimi badə kimi,
Canımın düşmənidir mey, sevirəm düşmənimi.

*28.06.1998*

***

Gülləri açmır daha, yar, könül bağımın,
Qum qədəri qönçəsi var könül bağımın.

*30.06.1998*

***

Ah, öylə zəifəm daha yer tutmur ayağım,
Şahin, gedəcəksən nə təhər cənnətə bəs sən?

*4.07.1998*

***

Olmaq diləsən gül, nə olar, dön gülə, amma
Hər nakəsə gəl gül kimi göz dikmə, amandır.

*6.07.1998*

***

Şahin kimi uçmaq diləsən şahinə bənzə,
Yoxsa, düşəcəksən yenə tezliklə səmadən.

*7.07.1998*

***

Yoxdurmu utancaqlığın, ey qəmzəli afət,
Üryan dayanıbsan, geyin, ayinə utandı.

*15.07.1998*

***

Dərsində saatlarla "Eşq" idi sözü yalnız,
Bir sözlə müəllimlik Məcnun eləyib təkcə.

*21.07.1998*

***

Dirilir sanki ölən can, gətirin badə bizə,
Dirilik çeşməsini saqi süzür badəmizə.

*25.07.1998*

***

Ömr-billah düşmərik gen saqidən meyxanədə,
Biz ki, meydən tövbə etdik, saqidən yox tövbəmiz.

*29.07.1998*

***

Dərviş kimiyəm, heç nə yoxumdur, ürəyim var,
Bilsəm ki, ürəkdən köməyin var - köməyim var!

*30.07.1998*

***



Adəm neçə ildir ki, cahan içrə olub yox,
Adəm gəzirəm mənsə adamlar arasında.

*3.08.1998*

***

Bil qiymətini, göz yaşı tökmə, quruyarsan,
Bir yer ki, quraqlıq ola, qiymət verən olmaz.

*6.08.1998*

***

Olmarıq yox, bu cahanda izimiz qalmalıdır,
Sönsə də atəşimiz, odlanacaqdır külümüz.

*11.08.1998*

***

Zənn eyləmirəm bülbülə rəhm eyləyəcəklər,
Daşlaşmış ürəklərdə məhəbbət gülü bitməz.

*15.08.1998*

***

"Dərdi olmaz dəlinin" - söylədilər, böhtandır,
Dərdliyəm, dərdimi say, ya qumu say səhradə.

*18.08.1998*

***

Mənə hər vədə "oruc tut" deyənin görməmişəm
Özünün bir kərə sidq ilə oruc tutduğunu.

*27.08.1998*

***

Bir otaq, bircə qədəh, bir şüşə meydir, bir mən,
Bir də qəlbimdə o dildarə gileydir, bir mən.

*31.08.1998*

***

Əqlin qısadır, təsbehin amma çox uzundur,
Vardırmı məgər təsbehinin xeyri, uzunsa?

*2.09.1998*

***

İt kimi qovlamışam mən qapıdan hicranı,
Dönə bilməz daha bir dəm geri, çıxsın canı.

*7.09.1998*

***

Tapmışam bir yeni düşmən, nə deyim, mən döyüşüb -
Özümün düşməni oldum öz-özümlən döyüşüb.

*11.09.1998*

***

Əyilib-qalxmamışam mən namaz üstündə hələ,
Amma cananı görəndə əyilib-qalxmalıyam.

*14.09.1998*

***

- Məsciddə mey olmaz, - dedilər, iradım oldu,
Qoy söyləyələr yaxşısı: - Mey məscidə gəlməz!

*20.09.1998*

***

Allaham, cismimi qeyb eylə məzarıstanacan,
Olmağı yük diləməm çiynınə insanlərin.

*22.09.1998*

***

Məsciddə gəlir qəm mənə, meyxanədə - şənlik,
Saqi eləsin qoy məni meyxanəyə dəvət.

*26.09.1998*

***

Sənə layiqmi məgər yırtıcılıq?
Sirrimin pərdəsini yırtıbsan.

*5.10.1998*

***

Adətim ovlamaq olmuşdu mənim hər vədə,
İşə bax, indi əcəl ovlayacaqdır özümü.

*29.10.1998*

***

Mən özüm özümə inanmayanda
Yarım, ??? mənə sən inanmısan.

*1.11.1998*

***

Cismimə yükdü canım, gəl canımı al rahət
Ki, olur yüksüz olan vəqtdə hambal rahət.

*14.11.1998*

***

Aşiq desə hər kəs özünə xam xəyaldır,
Yox, yox, bu deyil xam xəyal, tam xəyaldır!

*14.11.1998*

***

Təqlid yolu tutandan alimlik ummaq olmaz,
Vallah, şair olmaz üslubi olmayandan.

*21.11.1998*

***



Şairdə əgər söz yoxdursa nə şair,
Zərgərdə əgər zər yoxdursa nə zərgər?

*25.11.1998*

***

Saqiyə baxdıqda gözüm məst olur,
Saqi danışdıqda sözüm məst olur.

*27.11.1998*

***

Mənə Nuh ömrü nəsib olsa idi, ey Şahin,
Kim bilir mən yaradardım neçə "Divan" əsəri.

*24.12.1998*

***

Bizə iki deyən qələt deməzmi?
Biri birə vursan bir eləməzmi?

*21.01.1999*
*Lənkəran*

***

Adını dağə dedim əksi-səda göndərdi,
Danışır dağ dilim ilən, gözəlim, indi mənim.

*25.01.1999*
*Lənkəran*

***

Var ağacla ağacın fərqi, biri bar ağacı,
Kəsdilər başqasını eylədilər dar ağacı.

*25.01.1999*
*Lənkəran*

***

Canan yerinə təsbehi öpməkdə olanlar
Bilməm ki, cahanda nə görər yaxşı, nə anlar?

*30.01.1999*

***

Təşnəyəm, gözləyirəm, yox yerin üstündə yağış,
Hanı sevda buludu, gözləyirəm gündə yağış.

*30.01.1999*

***

Gündüz mən edirəm günə tamaşa,
Gecə aya isə deyirəm: Yaşa!

*24.02.1999*

***

Qarə gözün seyr edən gözlər işıqlandılar,
Öylə ki, sən söz dedin sözlər işıqlandılar.

*24.02.1999*

***

Dedilər "daği-cünun səndə görünmür", dindim:
- Deyiləm mən dəli, divanə isə dağlanmaz!

*18.03.1999*

***

Yaranışdan bəri ahəng bəşərin qaydasıdır,
Zərəri bir nəfərin - başqasının faydasıdır.

*22.03.1999*

***

Alnımı möhrəyə vurmaqda sədaqət görməm,
İmanım Tanrıya vardırsa sədaqət budu, bu!

*24.03.1999*

***

Səni başım üstündə dayanan zaman
İnan ki, başım da yadımdan çıxır.

*29.03.1999*

***

Surətin çoxdandı gözümə dəymir,
Könüldən getməyir gözdən getsə də.

*31.03.1999*

***

Qəhqəhə çəkəcək Şahin bu gündən,
Daha Məcnun olub ah etməyəcək.

*5.04.1999*
*Lənkəran*

***

Əbəs dəm vurursan şairliyindən,
Əvvəlcə adam ol, sonra şair ol.

*7.04.1999*
*Lənkəran*

***

Bir ömür borcluyam Allahıma mən,
Veribdir, indisə geri istəyir.

*7.04.1999*
*Lənkəran*

***



Saçım ağardı qar kimi,
Ağarmadı qara bəxtim.

*9.04.1999*

***

Elə şirin oldu qəzəlim mənim,
Xəbisin gününü acı elədi.

*11.04.1999*

***

Mən həyatımda bayılmaq nə bilirdim, Şahin,
Ürəyim getdi həmin dəmdə ki, dilbər getdi.

*15.04.1999*

***

Ayda bir beyt yazıb qürrələnirsən hey sən,
Hərfimin hər biri üstündü sənin beytindən.

*21.04.1999*

***

Tək bircə gilə nuş elədim kin dənizindən,
Tərk etdi məni tərlə o da, çıxdı canımdan.

*23.04.1999*

***

Əğyar ilə bir tutma məni eşqdə, ey yar,
Bir tutsan əgər, bişməmisən eşqdə, xamsan.

*25.04.1999*

***

Bu qədər adamın qanını içir,
Dimdiyi qanamır əcəl quşunun.

*27.04.1999*

***

Məni eləmişdin ümidsiz deyə
Özün də uğradın ümidsizliyə.

*29.04.1999*

***

Hər qəzəlxan yaza bilmir qəzəli saf, ey dil,
Mümkün işdirmi göyərçin edə şahin uçuşu?

*1.05.1999*

***

Gündüzlər yarasa görmürsə əgər,
İşığın qüsuru varmıdır məgər?

*3.05.1999*

***

Davud bir tərəfdə, avaz başqa yanda,
İsa o yanda qaldı, ecaz başqa yanda.

*11.05.1999*
*Gəncə*

***

Dərdimin çoxluğunu sinə bilir, ah bilir,
Dilbərim bilmədi, amma onu Allah bilir.

*22.05.1999*

***

Sənə, ey şux, ümidim vallah yox,
Ay kimi gah görünürsən, gah yox.

*31.05.1999*

***

Ey Tanrı, eşqin imkanı səndə,
Hər naəlacın dərmanı səndə.

*2.06.1999*

***

Bu nə meydir ki, veribsən mənə, ey saqi bacı,
Əvvəli çox şirin oldu, axırı oldu acı.

*6.06.1999*

***

Bülbül səsini hər eşidən kəs eşidibdir,
Bəs gül səsini? Gül səsini bir mən eşitdim!

*12.06.1999*

***

Şair, çalışıb söhbətini müxtəsər eylə,
Əlbət, qısalar hövsələ əfsanə uzansa.

*28.06.1999*

***

Neçə ildir oxuyur nəğmə dilim,
Hələ sən zümzümə öyrənməlisən.

*5.07.1999*

***

Məhəbbət kəlməsi tutubdur qərar
Mənim ürəyimdə, sənin dilində.

*6.07.1999*

***

Naz ondadı - ehtiyac məndə,
Hökm ondadısa, xərac - məndə.

*7.07.1999*

***



Hərçənd ki, pərvazdə Şahin zirək idi,
Amma onu bir gül yerə saldı göyə qalxıb.

*9.07.1999*

***

Söylədi Leylayə Məcnun: - Yaxşı düşdüm çöllərə,
İndi səhra padişahı, mən biyaban şahıyam!

*11.07.1999*

***

Boldur fərəhim, amma ki, dərd çəkmədəyəm mən,
Dərdim bu ki, dərdim tükənibdir ürəyimdə.

*14.07.1999*

***

Qeys idi, Fərhad idi, Sənan idi ustadlər,
Bilmədim amma ki, ustadbaşi kimdir Eşqdə?

*16.07.1999*

***

Hamilə buludun qarnı cırıldı,
Asiman başladı balalamağa.

*18.07.1999*

***

Taqətim qalmadı, ey şah, əlimdən getdi,
Hər nəyim vardısa, billah, əlimdən getdi.

*20.07.1999*

***

Oluram şad elə ki, sevgili canan oxuyur,
Mən ölüm cahilə bax, arifə meydan oxuyur.

*22.07.1999*

***

Sən surətə mənə gözü ilə baxa bilsən,
Şahin kimi, surətdə də mənə görəcəksən.

*23.07.1999*

***

Gözüm səni görməkdənsə,
İlan məni çalsa yaxşı.

*25.07.1999*

***

Bu nə həsrət idi, nə intizardı,
Dodağım dişini çəkib çıxardı.

*29.07.1999*

***

Diləsən cənnəti, ey şeyx, var-yoxundan keç,
Bu nə vardır ki, yığıbsan, sənin yoxun yoxdur.

*1.08.1999*

***

Kəsmirsə, bıçağın qüsuru yoxdur,
Qoyun da qocadır, qəssab da qoca.

*3.08.1999*

***

Istiqamət nə sağ olmuş, nə də sol, düz gedirəm,
Öz yolumla səhər-axşam, gecə-gündüz gedirəm.

*7.08.1999*

***

Yanıram, versən izn yan durram,
Qorxuram ki, səni həm yandırram.

*9.08.1999*

***

Əzizim, görmürük bir-birimizi,
Durmuşuq yan-yana iki göz kimi.

*11.08.1999*

***

Bir bağı qırıb şeyx özünə qəsr tikibdir,
Bilmir ki, bu dünya şaha da qalmayacaqdır.

*19.08.1999*

***

Bu tərəfdən görünür qəm, o tərəfdən qüssə,
Məni divanə edibdir, inanın, hər birisi.

*21.08.1999*

***

Çox genişdir bu cahan, amma mənə
Bu genişlikdə darısqallıq var.

*25.08.1999*

***

Çəkmə əziyyət, ey əcəl, dəymə mənə gəl, ölmüşəm,
Doğumdan ön doğulmuşam, ölümdən əvvəl ölmüşəm.

*29.08.1999*

***

Günlərin bir günü açılacaqdır
Qəlbinin kilidi əllərim ilə.

*4.09.1999*

***



Təsbehi oynatmağın xeyri nədir Şahinə?
Oynadıram yarımın zülfünü gündüz-gecə.

*8.09.1999*

***

Mümkün deyilsə də qovuşmaq sənə,
Sənə qovuşmağa can atacağam.

*8.09.1999*

***

Sənə bir busə edib sonra şəkərdən daddım,
Busədən, mən əmin oldum ki, o şəkkər acıdır.

*8.09.1999*

***

Deyir yara mənlə eləməsin cəng,
Dərdinə həmdərdəm, rənginə həmrəng.

*19.09.1999*

***

Gecəni görürəm gündüzə düşmən,
Dünya bizə dostdur, biz bizə düşmən.

*24.09.1999*

***

Qar əriyibdir bütün... Gərçi bahar ətri var,
Pəncərəni açmıram, evdə nigar ətri var.

*16.10.1999*

***

Mən qələm deyiləm kim nə deyərsə
Susub dediyini varağa yazım.

*7.11.1999*
*Lənkəran*

***

Dodağın xeyri, dişin mənfəəti məlumdur,
Məni agah eləsinlər ki, bığın xeyri nədir?

*9.11.1999*

***

Yarım, qaranı ara, görünmür,
Bəxtimdə mənim qara görünmür.

*12.11.1999*

***

Pis qalıbdır, aparır yaxşı kəsi,
Əcəlin gözləri kordur deyəsən.

*16.11.1999*

***

Sənə yar olmayana sən də yar olma, Şahin,
Sənə əl verməyənin sən də əlindən əl çək.

*19.11.1999*

***

Rəbbim yetiribdir məni muradə:
Bir əlimdə təsbeh, birində badə.

*2.12.1999*

***

Mən rədd elədim badəni, saqi dedi: - Şair,
Kim istəsə hüşyar ola meyxanəyə gəlməz.

*7.12.1999*

***

Dilimdə qılınc var, əlimdə qələm,
Dilimin qılıncı səni kəsəcək.

*9.12.1999*

***

Ilhamını soldurma çiçək, gül kimi, Şahin,
Gül solsa, çiçək solsa gülüstan olacaq yox.

*13.12.1999*

***

"Içmə mey" söylədin, ey şeyx, mənə, korsanmı,
Görməyirsənmi ki, cananə baxır saqi kimi?

*19.12.1999*

***

Qəlbimdə sevgisi vardır Allahın,
O - məndən uzaqdır, mən - ona yaxın.

*26.12.1999*

***

Mey içib, busə yeyib, rəqs elədik,
Bunlara eyb demək mümkünmü?

*14.01.2000*

***

Sən ki, ox görəndə titrəməkdəsən,
Uzun kiprik görsən bağrın yarılar.

*19.01.2000*

***

Hey özüm özümlə savaşmaqdayam,
Özümə düşmən də, dost da özüməm.

*30.01.2000*

***



Hər kimə qəm lazım olsa, vermərəm bir zərrə də,
Hər kimə şənlik gərəkdirsə, yüyürsün yanıma.

*7.02.2000*

***

Bədənim çərxi-fələkdən o qədər yarə alıb
Ki, səlamət yeri yoxdur ürəyimdən savayı.

*17.02.2000*

***

Çəkib ağuşuma nəsimi öpdüm,
Nəsim gətiribdir sənin ətrini.

*27.02.2000*

***

Kim satıbdırsa vətən torpağını mərd deyil,
Ey qələm, yaz bunu: Dərdim çəkilən dərd deyil.

*1.03.2000*

***

Heç zaman Məkkəyə getməyəcəyəm,
Mənim öz qəlbimin Kəbəsi vardır.

*4.03.2000*

***

Ey şeyx, yığıb pul kədərü ahsız oldun,
Allah adını çəkmə ki, Allahsız oldun.

*6.03.2000*

***

O gözəl gül ki, zühur oldu gecə,
Zil qaranlıq idi, nur oldu gecə.

*9.03.2000*

***

Qapına gəlmişəm, ey saqi, mənə
Vüsal badəsi ver, mey badəsi ver.

*11.03.2000*

***

Ən böyük xilaskar əcəldir, əcəl,
Ruhu xilas edir can qəfəsindən.

*16.03.2000*

***

"Əhsən" dedilər bağdə güllər məni görcək:
- Şahindi bu, bülbülmü məgər hər gülə qonsun?

*18.03.2000*

***

Ey çarəsi qeyb olmuş biçarə ovum, qaç, qaç,
Şahində rəhm vardır, biçarəni öldürməz.

*19.03.2000*

***

Birinin gündüzü - bir başqasının axşamı,
Birinin matəmi - bir qeyrisinin bayramı.

*21.03.2000*

***

Dilimdən təlim aldı, mənim sevgilim oldu,
Qəlbinin kilidinin açarı dilim oldu.

*24.03.2000*

***

Dediyi büsbütün riyadır, Allah,
Səsini eşitmə sən bu mollanın.

*26.03.2000*

***

Yar zülfüylə məni zəncirə çəkmiş, Rəbbim,
Neyləyim, Şahinə qismət belə zəncir olmuş.

*28.03.2000*

***

Məni şam sayağı sən əridibsən,
Işığı olarmı əriyən şamın?

*30.03.2000*

***

Fələyə eşqdən oxuma dastan,
Elə dastanları çox eşidibdir.

*2.04.2000*

***

Mənə şirin sözlər söyləsən əgər,
Gözümdən süzülər meyə sədəflər.

*4.04.2000*

***

Od vurma həzin bu qəlbə, yarım,
Bir gün sənə lazım oldu bəlkə.

*6.04.2000*

***

Qalamaq istəyirəm bir elə tonqal ki, yığıb
Yandırım atəşinə mən bütün əğyarləri.

*10.04.2000*

***



Dilimi dişimlə sıxmadım niyə,
Ən böyük düşmənim dilimmiş mənim.

*12.04.2000*

***

Deyəsən ömrümün sonudur, məni
Ölüm beşik kimi yırğalamada.

*15.04.2000*

***

Əsib papağımı aldı başımdan,
Oğurluq eləyir yenə də külək.

*17.04.2000*

***

Hər gün səliqəylə çevirir fələk
Ömür kitabımın varaqlarını.

*19.04.2000*

***

Yanıb, yaşamağı öyrənməsə də,
Pərvanə öyrəndi yanmağı məndən.

***

Bizim baş mollamız etmir əməl Quranə bir zərrə,
Müsəlmanlıq budursa, mən müsəlmanlıqdan əl çəkdim.

*28.04.2000*

***

Bir busə versəydi ay mənə, gülüm,
Üzü üzün kimi təmiz olardı.

*13.05.2000*

***

Susmağı qızıla ey tay tutanlar,
Özümü lal edə bilmirəm axı.

*13.05.2000*

***

Yüzlərlə Qeys gəlmiş hərçənd bu dövranə,
Məcnun isə bənzərsiz, Məcnun isə bir danə!

*15.05.2000*

***

Gözümü dörd edirəm görməyirəm cananı,
Görürəm amma ki, hər vədə yatıb röyadə.

*17.05.2000*

***

Dərman da məndədir, dərd də məndədir,
Dərd mənə dərmandır, dərman isə dərd.

*26.05.2000*

***

Ey yar, məni öylə soyutdun sən özündən,
Billah, canım indi şərab ilə də qızmaz.

*30.05.2000*

***

Qolumu qaldıra bilmirəm göyə,
Kəsib qoltuğuma qoydun başımı.

*1.06.2000*

***

Yuxlamaq istəyirəm, uyğuya həsrət çəkirəm,
Su kənarındayam, amma suya həsrət çəkirəm.

*6.06.2000*

***

Qarı sevməsəm də soyuğu canda,
Bulud necə donmur soyuq doğanda?

*13.06.2000*

***

Qoyma qaranlıqda məni, gəl, a yar,
Ay görünəndə gecə aydınlaşar.

*1.07.2000*

***

Bilin, hər saniyə məstdir bədənim,
Cismimin saqisi ruhimdi mənim.

*4.07.2000*

***

Ölü gördüm neçə şəxsi ki, düşübdür çayə,
Mən balıq tək diri qaldım atılıb dəryayə.

*8.07.2000*

***

Budaqda tikan da, qızılgül də var,
Qızılgül, şadam ki, tikanı görmür.

*12.07.2000*

***

Həvva kimisən, söyləmirəm Adəmi sındır,
Ey saqi, gəlib yanıma sən badəmi sındır.

*17.07.2000*

***



Tale saçlarımı əcəb ağartdı,
Saçım ağarandan işığım artdı.

*26.07.2000*

***

Bu çətin suala asan cavab yox:
Mən eşqi yaratdım, yoxsa eşq məni?

*28.07.2000*

***

Əgər bir adamda varsa iki üz,
Deməк, vardır onda iki ürək həm.

*3.08.2000*

***

Görən olmayacaq sənin eybini
Həya libasını geyinsən əgər.

*9.08.2000*

***

Çox qəzəlim yaddasa, xeyli yadımdan çıxıb,
Mən necə divanəyəm Leyli yadımdan çıxıb.

*16.08.2000*

***

*"Hu! ("O" - yəni Allah)*

Can qalıbdır o yarın yanında,
Mən bu yar yanına cansız gəldim.

*22.08.2000*

***

Ağla indi, o qədər badə içibsən, əyyaş,
O qədər ağla ki sən badə gözündən gəlsin.

***

Gələcək günlərdən çox danışmışıq,
Ağ gün ömrümüzə nə vaxt gələcək?

***

Mərdi namərd öldürür,
Məni bu dərd öldürür.

***

Ey gül, bizə innən belə mey süzmə, gülab süz,
Gül mövsümü məclisdə gülab olsa pis olmaz.

***

Bir gülün ətrini verməz yüz ətirsiz qönçə,
Şahina, bir gülü sevsən sənə bəsdir məncə.

***

Əyri danışanın ağzı əyilmir,
Doğru danışanın ağzı dağılır.

***

Təbi coşğun, sözü bol öylə qəzəlxanəm ki,
Şer bağında tikanım da cücərməkdə mənim.

*25.08.2000*

***

Qəlbimin gülşəninin güllərini sən qırma,
Gözəlim, bax gül özünsən, qırılarsan orada.

*28.08.2000*

***

Eşq əhli olan kəslərə etdim belə təklif:
Meyxanədə mey sizlərə, saqi mənə çatsın.

*30.08.2000*

***

Çarəsizəm, yoxdu yanan dərdimə,
Qəm yeyirəm, yoxdu deyən kəs: "yemə!"

*5.09.2000*

***

Zil qaranlıqdı əhatəm, demə halın necədir?
Sənə gündüz görünən gün mənim üçün gecədir.

*7.09.2000*

***

Qəzəlim yarpaqdır şer ağacıma,
Yarpağı tökülən ağac quruyar.

*10.09.2000*

***

Ey süvari, yenicə atminən olmuşam mən,
Yetməyib niyyətimə arzu atından düşdüm.

*11.09.2000*

***

Bir adam bir kərə olsa Hacı bəsdir məncə,
Tanışım bir Hacı vardır "Hacı" olmuş təzədən.

*13.09.2000*

***



Birlikdə tutmur qərar əql ilə yar bu canda,
Əqlim gedir başımdan yarım gələn zamanda.

*16.09.2000*

***

Həzzi də, dərdi də var bu sevginin,
Qəlbimdə gülü var tikanla birgə.

*18.09.2000*

***

Həzrəti-Musa əsasından uzundur bu gecə,
Gecənin olması gündüz, mələyim, mümkünmü?

*21.09.2000*

***

Ayağım büdrəsə də, amma yıxılmaq yoxdur,
Ətəyindən yapışıb çünki əlim cananın.

*26.09.2000*

***

Əzrayıl saçını kəsməsin sənin,
Ömrün uzun olsun uzun saçın tək.

*2.10.2000*

***

Mənim əsəblərim - arı topası,
Arı topasına dəymə, əzizim.

*26.10.2000*

***

Gənclikdə deyiblər mənə "saqqalın ağarsın",
Allahə şükürlər ola, saqqalım ağardı.

*10.11.2000*

***

Söylədi yarım bu gün: - Aş bişirdim sənə,
- Ac deyiləm mən bu gün, qəm yemişəm, - söylədim.

*27.11.2000*

***

Hər gün dua edəcəyəm Allaha
Ki, sevgidən yan olmayaq bir daha.

*30.11.2000*

***

Kişiyəm, amma xəcalət çəkirəm
Kişilər nakişilik etdikdə.

*4.12.2000*

***

Qəzəlim gövhərdən qat-qat dəyərli,
Gövhər ucuzlaşıb bəxtimdən mənim.

*6.12.2000*

***

Ümid qiymətlidir, yoxsa can baha?
Mən sənə can verim, sən mənə ümid.

*9.11.2000*

***

Mən sənin busəni dərdiyim zaman
Canan, istəyirəm zaman dayansın.

*11.12.2000*

***

Eşq bağımda zərif gül sayağı
Ey son eşqim, gec açıb tez soldun.

*14.12.2000*

***

Mən bu tamahkar olan mollaları seyr edib
Azca qalır son qoyum məndə müsəlmanlığa.

*18.12.2000*

***

"Daş"ı, izah elə gəl, sən niyə "səng" eyləmisən?
Düşə qoy daş başına, lap bizi dəng eyləmisən.

*21.12.2000*

***

Yanılar kim mənə söylərsə dəli,
Aşiq, əlbət ki, dəli olmalıdır!

*28.12.2000*

***

Hər il nə qədər adam olur qərq Xəzərdə,
Şahinsə olur qərq məhəbbət dənizində.

*30.12.2000*

***

Eşqin, məhəbbətin hərarətindən
Günbəgün mum kimi əriyirəm mən.

*2.01.2001*

***

Bu can cananımın, dil dilbərindi,
Bu can "canan" deyir, dil "dilbər" indi.

*7.01.2001*

***



Sevgisiz hər insan bilsin ki, sevgi
Yaz yağışı kimi yağıb üstümə.

*11.01.2001*

***

Sən mənim yanıma yetişən kimi
Bağrı çatlayacaq hicranın yenə.

*13.01.2001*

***

Məst eləyib saqi səni, Şahina,
Şəst ilə məstanəliyin vaxtıdır!

*19.01.2001*

***

Mən günah etməmişəm badə içib, ey zahid,
Badəni çünki mənə saqi verib, başqası yox.

*26.01.2001*

***

Doğhadoğ bürüyüb cahanı necə!..
Gecə gündüz doğur, gündüzsə gecə.

*10.02.2001*

***

Mən mey içirn, sənsə su,
Məndə - üzüm, səndə - su.

*5.07.2001*

***

Gah təsbeh, gah badə!.. Məstəm ki, məstəm!..
Allaha and olsun Allahpərəstəm!!!

*17.07.2001*

***

Qocayam, ömrə məzəmmət daşım çoxalmaqda,
Altmışdan bir ötübdür, yaşım çoxalmaqda.

*22.07.2001*

***

Cənnət diləyi ilə hey baxırsan göyə sən,
Yerə nə vermisən ki, göydən nə istəyəsən?

*24.07.2001*

***

Olmasa mey günmü olur gün mənə?
Qırmızı su ağ sudan üstün mənə.

*13.08.2001*

***

Içirəm, atəşimi söndürə bilmir Qudyal,
Qəlbimin istiliyindən bədənim yanə bilər.

*17.08.2001*
*Quba*

***

Şerim öz rəngini almış qəzəlin rəngindən,
Könül ahəngini çalmış sözün ahəngindən.

*23.08.2001*

***

Xəlbirə çoxluğun nə faydası var,
Xəlbir çox işləyər buğda çox olsa.

*29.08.2001*

***

Bircə misqal da deyil vəzni sənin yazdığının,
Mən yazan şerlərin vəznisə batman-batman.

*8.09.2001*

***

Şahin yüyürər yanına bir kəlmə sözünlə,
Şahdağ da gələr "gəl" deyə Şahdağı çağırsan.

*13.09.2001*

***

Ağ su içən dilbərim, qırmızı su eylə nuş,
Qalmaya qoy məndə əql, olmaya qoy səndə huş.

*24.09.2001*

***

Ovçu oxu atır hey ov səmtinə,
Ovçu ilə oxun dostluğu olmaz.

*26.09.2001*

***

Səsin, ey gül, əruz ahəngi kimi,
Dodağın rəngi meyin rəngi kimi.

*27.09.2001*

***

Qələmim düşdü əlimdən, ayaq altında qalıb,
Qəzəlim eylə gəlin ki, duvağ altında qalıb.

*28.09.2001*

***

Güzgüsü olmadığından dili lal olmuşdu,
Baxıb ayinəyə tuti danışır tuti ilə.

*1.10.2001*

***



Deyirlər səbr edim hicrə... Nə Əyyubəm, nə peyğəmbər,
O peyğəmbər ki, Əyyubdur adı, səbrində tənhadır.

*4.10.2001*

***

Darağı sındıracaqdır yenə qıvrım zülfün,
Qoy ki, barmaqlarım ilən darayım zülfünü mən.

*6.10.2001*

***

- Busə ver, təşnəliyəm lap məni əldən saldı..
- Təşnəsənsə, - dedi, - iç su, sənə şərbət nə gərək?

*8.10.2001*

***

Insanın düzlüyü məncə hər əməldən yaxşı,
Dəstəmazdan, canamazdan və namazdan üstün.

*12.10.2001*

***

Bağiban söz deyən olmur, onu dilləndirmə,
Var isə bağdə gər gül - sözüdür bağibanın.

*14.10.2001*

***

Onda qəm ahəngi var, naləni mən sevmirəm,
Lalədə qan rəngi var, laləni mən sevmirəm.

*18.10.2001*

***

Şahinəm, bəbirdir, pələngdir ovum,
Mən kəklik ovlayan ovçu deyiləm.

*23.10.2001*

***

Mən gül əkib tikan dərdim,
Aman dərdim, aman dərdim!..

*2.11.2001*

***

Həmi ovlayıram, hər ovlanıram,
Ovçu da özüməm, ov da özüməm.

*19.11.2001*

***

Od tutub yanıram soyuqluğundan,
Sənin soyuqluğun məni isidib.

*26.11.2001*

***

Min dəfə fəda ömrünü etdin gözəllərə,
Min dəfə dedim mən sənə "Şahin, elə etmə!"

*30.11.2001*

***

Əllərimdə, kasıbam, yoxdu mənim mirvari,
Gəlmədə gözlərimə amma ki, mirvari suyu.

*7.12.2001*

***

Böyük adamlardan qorxum yox mənim,
Balaca adamlar məni qorxudur.

*9.12.2001*

***

Zabit, nəzəri salma başa sən bizə hərbi,
Mümkündü zəfər - əsgəri əsgər başa düşsə!

*18.12.2001*

***

"Aşiqliyi tərk eylədi Şahin" deməsinlər,
Aşiqliyi tərk eyləmək aşiqliyim oldu.

*20.12.2001*

***

Baxıram hər tərəfə, amma gözüm bomboşdur,
Səni görmür deyə heç kim gözümə görsənmir.

*22.12.2001*

***

Ey ölüm, canımı almazdan əvvəl
Saçımı ağartdın, ağ olsun ömrün.

*25.01.2002*

***

Pərvanə yanır şəmə bilirsən nə səbəbdən?
Pərvanə yanır ki, otağın nuri çoxalsın.

*4.02.2002*

***

Könül buludundan yağış yağmasa
Vüsal bağçasının gülü göyərməz.

*28.02.2002*

***

Ürək bədənimdə, gözüm üzümdə,
Gözüm ürəyimə baxır həmişə.

*1.03.2002*

***



Gözün hərçənd işi şamü səhər baxmaqdır,
Gözünə rəhm elə, çox baxma qərə gözlülərə.

*23.03.2002*

***

Yerdə gün batdığı an tutmayacaq kölgə qərar,
Kölgə vardırsa da, varlıqda onun yoxluğu var.

*2.04.2002*

***

Mövləvi bu fikri söyləyib qısa:
"Xəncərdən nə fayda comərd yoxdusa" *.

*4.04.2002*

***

Bir deyildir, beş deyildir, düz bir aləmdir qəmim,
Aləməm mən öylə ki, aləmdə vardır aləmim.

*11.04.2002*

***

Qeysə "papağın yox" dedilər, dedi:
Papağım gecə ay, gündüzsə gündür.

*14.04.2002*

***

Ey Şahin, başını həmişə dik tut,
Qədəh meylə dolmaz başı aşağı.

*18.04.2002*

***

Zəif güman etmə şüa sınırsa,
Günəşdən istini şüa gətirir.

*22.04.2002*

***

Kim dedi aşiqlərə söyləmişəm mən dəli?
Gördüyüm aşiqlərin hər biri divanədir!

*5.05.2002*

***

Məni axtarmayın əldə tutub şam,
Nigarım hardasa mən də ordayam.

*7.05.2002*

---

* "Çonk mərdi nist xəncərha çe sud?"
*Mövlana Cəlaləddin Rumi*

***

Xəlqi qəzələ mən olmuşam şah,
Yoxdur bu sözün o yan - bu yanı.

*13.05.2002*

***

- Səpirəm göz yaşımı, ey pəri, mirvari kimi...
Dedi: - Mirvariləri saxla yığıb, lazım olar.

*17.05.2002*

***

Dincliyə kim ki tərəfdardı nadinc olmaz,
Dilini saxlamasan, bil ki, başın dinc olmaz.

*21.05.2002*

***

Günəhin mən yolunu əzm ilə bərkitməliyəm,
Məzhəbin əksinədir badə ki, tərk etməliyəm.

*24.05.2002*

***

Iki qonşu yan-yana, bir görünüz nə işdir:
Bir gözüm digərinin evini görməmişdir.

*27.05.2002*

***

Məndən kim eşidib əbəs əks-səda,
Səssiz qışqırıram qışqıranda da.

*29.05.2002*

***

Quraqlıq bürüsə cahanı əgər
Mənə gözlərimin suyu bəs edər.

*31.05.2002*

***

Molla şərab içib söylədi belə:
Bu suyun içində atəş yaşayır.

*1.06.2002*

***

Bildim həqiqəti mən qocalanda:
Su səbətdə qalmır, cavanlıq canda.

*3.06.2002*

***

Su ilə yusan da Xəzər suyunu
Duzdan xilas edə bilməzsən onu.

*4.06.2002*

***



Sənin müalicən xeyirsiz, gülüm,
Bir dərman verirsən min yara vurub.

***

Rəbbimin lütfü bir olmuşsa cəfası min bir,
Bir dilim var, ona amma ki, duası min bir.

*7.06.2002*

***

Bağiban gözləmirəm Şahinə gül göndərsin,
Mən özüm göndərirəm bağibana tər güllər.

*9.06.2002*

***

Surətdə gözəllik arayan varsa, zəifdir,
Mənada gözəllik arayan kəsdədi qüvvət!

*10.06.2002*

# SƏFƏRNAMƏLƏR

## İRANA ÜÇÜNCÜ SƏFƏRİM* MÜNASİBƏTİLƏ ŞERLƏR

Bülbül kimi şadəm ki, gülüstanə yetişdim,
Can intizar idi, elə bil canə yetişdim.

Meylim düşübən ardına imkanı qovurdu,
Meylim elə gücləndi ki, imkanə yetişdim.

Yetmək diləyib Azəribaycanə Iranda,
Iranə yetib, Azəribaycanə yetişdim.

Canan, ürəyim getsə də, loğmanı çağırma,
Bir xəstəliyim qalmadı, loğmanə yetişdim.

Qurbanın olum, gəl mənə mey təklifi etmə,
Saqi, yenə meyxanəyə məstanə yetişdim.

Mazəndəranın şəkkəri çox şəkkərə üstün,
Tuti quşu oldum şəkəristanə yetişdim.

Dost ölkəyə, qardaş elə dördüncü səfərdir,
Şahin, gözüm aydın, yenə Iranə yetişdim.

*Iran Astarası.*
*6.12.1995*

* Irana əvvəlki səfər şerlərim çap olunmuşdur.

***

Yoxdur işim şivən ilə, zar ilə,
Dil dilə gəlmiş yenə dildar ilə.

Qəlb evimiz olmayacaqdır xarab,
Eyləmişəm əhd bu memar ilə.

Tar ki, var, söyləmişəm tarçıya,
Gəl dağıdaq dərdimizi tar ilə.

Eşq çıxar heç yadımızdan məgər,
Beynə yeritsək onu mismar ilə?

Gör neçə qürbət meyi nuş etmişəm,
Ömrü puç etdim bu zəhrmar ilə.

Saç elə sürətlə ağarmaqda ki,
Bəhsə giribdir elə bil qar ilə.

Eşqə ki "yoxdur" dedilər, "var" deyib
Bəhsə girişdim elə inkar ilə.

Can ola qoy eşqə fəda, Şahina,
Böylə qərar eyləmişəm yar ilə.

*Tehran,*
*7.12.1995*

***

"Insan olanın heç vədə dövranı dəyişməz.
Hər şey dəyişik olsa da, insanı dəyişməz" *.

Cananı yolunda gözünü yummasa da hətta
Aşiq dəyişər aləmi, cananı dəyişməz.

Rahətsiz edən kimsəni rahətliyə ziddəm,
Könlüm elə rahətliyə tüğyanı dəyişməz.

Hicranı da sevmiş bu qəzəl sahibi hərdən,
Etməzsə vüsal arizu, hicranı dəyişməz.

Alim qələmə, dəftərə zər sərf elədikcə,
Zərgər qələmə, dəftərə mərcanı dəyişməz.

Min bir mərəzə düşsə də Məcnun kimi aşiq,
Loğmanı əgər Leylisə, loğmanı dəyişməz.

Tez-tez düşür Irana yolum, söylədilər ki,
- Şahindi bu, hər ölkəyə Iranı dəyişməz!

*Tehran,*
*8.12.1995*

## ƏZIZIM, BIZ YENƏ GÖRÜŞƏCƏYIK

Əzizim, çatırmı sənə bu səda?
Bilirəm, biz yenə görüşəcəyik.
Günəşlə ay kimi ayrıyıqsa da,
Bilirəm, biz yenə görüşəcəyik.

Qaralayıb hicran qara baxtını,
Qəlbimdə qurmuşam eşqin taxtını,
Dəqiq bilməsəm də görüş vaxtını,
Bilirəm, biz yenə görüşəcəyik.

Əhdimiz sırğadır qulağımızda,
Vüsal gizlənibdir fərağımızda,
Çin səddi də dursa qabağımızda,
Bilirəm, biz yenə görüşəcəyik.

Dilək tükənməzdir arzumuz kimi,
Istək tükənməzdir arzumuz kimi,
Ürəyim sərindir, inan, buz kimi,
Bilirəm, biz yenə görüşəcəyik.

Bir gün qoymasa da fələk sağ bizi,
Yandırıb-yaxsa da od-ocaq bizi,
Mümkün olmayacaq ayırmaq bizi,
Bilirəm, biz yenə görüşəcəyik.

Yaramız dərindir, aramız sərin,
Aramız sərindir, yaramız dərin...
Gülüm, acığına nakəs kəslərin
Bilirəm, biz yenə görüşəcəyik.

* Beyt Həsən Məcidzadə Savalanındır.

Məni düşünsənə, məni duysana,
Ayrılıq mərəzi yoluxub cana,
Acıq vermək üçün acı hicrana,
Bilirəm, biz yenə görüşəcəyik.

Kim görüş diləsə, onun zövqü var,
Zövqün şövqü vardır, şövqün zövqü var,
Əzizim, canımda görüş şövqü var,
Bilirəm, biz yenə görüşəcəyik.

*Tehran,*
*10.12.1995*

***

Yarəb, elə sürətlə dolur canə məhəbbət,
Dönmək diləyir qəlbdə ümmanə məhəbbət.

Məşəl kimi sönmüşdü, günəş timsalı yandı,
Billah, güman etməz idim yanə məhəbbət.

Göz gördü, könül sevdi, ürək coşdu fərəhdən,
Başlandı o cananəyə cananə məhəbbət.

Divanə məni yar eləyibdirsə, qəbuldur,
Etsin məni gündən-günə divanə məhəbbət.

Canlanmadadır məndə müdam aləmə sevgi,
Cananəyə eşq, Azəribaycanə məhəbbət.

Gerçək sevənə tay deyil əfsanəvi aşiq,
Gerçəkliyə üstün deyil əfsanə məhəbbət.

Türküstana şəmi, odu əfqanə çatıbdır.
Yandırmada Şam mülkünü pərvanə məhəbbət.

Gah öpmədə, gah oxşamada, qucmada Şahin,
Cananı kimi etmədə Iranə məhəbbət.

*Tehran,*
*11.12.1995*



***

Nə gərək fikrimi gülzarü gülüstan apara?
Qoy mənim diqqətimi təkcə o canan apara.

Olmasın imkanı qurbanlığa bayram gəlcək,
Gözəlim qoç yerinə qoy məni qurban apara.

Hökm elə, yerdə də cənnət yarana, ey Rəbbim,
Qılmanı huri çəkə, hurini qılman apara.

"Bu qaranlıq gecələrdə qapımız pis döyülür,
Nə bilim, bəlkə əcəldir dayanıb can apara?" *.

Məni hərgah o mələk çəkməsə öz ağuşinə,
Qorxu var cismimi heçsizliyə şeytan apara.

Ya da, şirin canıma qəsd edərəm Fərhad tək,
Qoymasınlar yeni bir aşiqi də qan apara.

Şahinin "Divan"ı, Rəbbim, kömək ol, nəşr olsun,
Istəmir qəbr evinə sinədə "Divan" apara.

*Tehran,*
*12.12.1995*

***

Kim ki istər mən onu bənzətməyim biganəyə,
Yanmağı heç vədə irad etməsin pərvanəyə.

"Qeyri kəslər zər gətirmiş səpmək üçün başına,
Canımı verrəm mən isə həzrəti-cananəyə" **.

Gözlərin dürdanə gəlməz, çünki etməz etina,
Ey pəri, dürdanələr dürdanəsi dürdanəyə.

Sən ki, varsan, gül ki, yox gülxanədə səndən gözəl,
Istərəm olmaq gözətçi, ey gülüm, gülxanəyə.

---

* Beyt Məhəmmədhüseyn Şəhriyarındır.
** Beyt Mənsur Həllacındır. Farscası:
"Digəran gər sim-o zər arənd əz bəhre-nesar,
Mən nesare-həzrəte-canane sazem cane-xış".

Bişüur eylər məni əqlim bu yerdən çəksəm əl,
Mən şüur ilən dəyişsəm abadı viranəyə.

Baş ayıq, yaddaş oyaq, aşiq sayıq olsun gərək,
Çayçı qoy çay dəmləsin, mən getmirəm meyxanəyə.

Eşqi təqdim eyləmək namərdə məqbul iş deyil,
Yadigar olsun bu söz mərdanədən mərdanəyə.

Gerçək aşiqlər gəzək, əfsanələrdən əl çəkək,
Şahinəm, ömrüm boyu bağlanmadım əfsanəyə.

*Tehran,*
*13.12.1995*

***

Bir yanda durub ki, səsi hər yanə yetişdi,
Aləm yaranandan sözü hər canə yetişdi.

Heyran eləyibdir məni surətdəki məna,
Can verdisə də, şəminə pərvanə yetişdi.

Şirin cana öz istəyi tuş etdi külüngü,
Öz meyli lə zəncirə divanə yetişdi.

Iranə yetişcək Bakıda gəzdi sözüm ki:
- Hicranı sevəndir bu ki, hicranə yetişdi.

Hər hansı həyatın sonu, əlbəttə, ölümdür,
Ey Tanrı, ölüm varmı ki, dərmanə yetişdi?

Zənnimcə mənim bəxtəvər adəmdi o kəs ki,
Imkanı əlindən verib imkanə yetişdi.

Bir gün deyəcəklər mən öləndən sora: Şahin
Tərk eyləyərək aləmi cananə yetişdi.

*Tehran,*
*14.12.1995*



## İRANA DÖRDÜNCÜ SƏFƏRİM MÜNASİBƏTİLƏ ŞERLƏR

Səsləmədə bir neçə canan məni,
Qum məni, Zəncan məni, Tehran məni.

Bülbülü oldumsa da çox gülşənin,
Cəlb eləyir tazə gülüstan məni.

Xatirə düşcək yenə qan qaynadı,
Çəkmədə Qəzvin məni, Kaşan məni.

Qurban olum Azəribaycanə mən,
Şad edəcək Azəribaycan məni.

Varmı məgər qəlb kədərlənməsin?
Görməyəcək kimsə pərişan məni.

Dilbərimin vəslinə yetməkdəyəm,
Zar edə bilməz acı hicran məni.

Bismillahir-rəhmanir-rəhim
Sövq edəcək düz yola hər an məni.

Şahina, şadəm, necə şad olmayım?
Dəvət edibdir yenə Iran məni.

*1.01.1996*
*Bakı-Tehran,*
*təyyarədə*

***

Ayrılıq gözlərə görsəndi kədər rəngində,
Nəzərə dəydi vüsal isə şəkər rəngində.

Necə rəngindi, ilahi, bu muğam gülşənimiz,
Var onun bir neçə məna gülü hər rəngində.

Var imiş, sevgili yarım, gülüşün həm rəngi,
Qəhqəhən gəldi mənə çatdı qəhər rəngində.

Saçların - renginə bənzər gecənin, hüsnünsə
Dəymədə gözlərimə nurlu səhər rəngində.

Həmişə mən kimi rahətliyə möhtac olacaq
Kim ki rahətliyi görmüşsə xətər rəngində.

Xoş xəbər yetsə vətən barədə halım xoş olar,
O xəbər görsənə, eykaş, zəfər rəngində.

O həqiqət nə gərəkdir mənə ki, ömr uzunu
Üstümə axmada böhtan ilə şər rəngində.

Şahina, bilməyirəm eşqdə xeyrim nə olub,
O xeyirdirmi məgər gəldi zərər rəngində?

*2.01.1996*
*Tehran*

***

Aşiqə, ey pəri, qürbət kimi məhbəs yoxdur,
Səslərəm hey səni, səndənsə mənə səs yoxdur.

Gecə-gündüz bir olaq vəslə yetişdikdə yenə,
Daha "bəs" söyləmə, "bəsdir" demə ki, bəs yoxdur.

Gözəlim, qurban olum Allaha, peyğəmbərə mən,
Amma, sən tək mənə aləmdə müqəddəs yoxdur.

Hey qəzəl yazmada "Məcməş-şüəra" üzvləri,
Niyə şer içrə bu gün "qitə", "müsəddəs" yoxdur?

Nə üçün "tərci" yazılmır, niyə qeyb oldu "sürud"?
Bəs "mülənnme" niyə yoxdur, nə "müxəmməs" yoxdur.

"Ey Füzuli, bu cahan mülkünə çox bağlanma,
Buraya çoxdu gələn, amma qalan kəs yoxdur" *.

Nə zaman şad olacaqdır görəsən yer kürəsi,
"Yağı yoxdur" deyəcəklər və "müxənnəs" yoxdur.

Ləğvi mümkünmü görən birkərəlik hicranın?
Şahina, varmı güman, ümmidini kəs, yoxdur!

*3.01.1996*
*Tehran*

* "Be molke-dəhr, Füzuli, məbənd del k-inca,
Bəsist amede, əmma kəsi ke, manəd, nist".



***

*"Mehri könlümdə nihan olduğun ol mah bilir,*
*Kimsə bilməz füqəra sirrini, ol şah bilir"*
**Məhəmməd Füzuli**

Oldumu şah ki, aləmdə nədir ah bilir?
Bunu biz bilməyirik, bilsə də Allah bilir.

Gəlməyir başqa vilayətdə qərarı bu kəsin,
Ayağın altını, ey şux, qərargah bilir.

Aşiqin üzgün olur səndən uzaqlarda müdam,
Özünü amma kənarındasa gümrah bilir.

Oxudan bülbülü gəh vəsl, gəhi hicr olmuş,
Gah bilmir bu gözəl sirri o gül, gah bilir.

Bəndəyəm mən, mənə şah isə o dilbərdir, onun
Necə şah olduğunu bəndə bilir, şah bilir.

Ürəyindən keçəni bildirirəm öylə dəqiq,
Özünü aşiqi cananəsi cərrah bilir.

Yurda dön, hər səfərin zilləti var, ey Şahin,
Səfərin zillətini sən kimi səyyah bilir.

*4.01.1996*
*Tehran*

***

Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl,
Nə qədər cazibədar, sevgili, yarəb, nə gözəl.

Nə qədər şairi vardır, əcəba, Iranın,
Neçə arif yetirib hər ili, yarəb, nə gözəl.

Qərq olubdur gülə hər guşəsi, güldən başqa
Bu qədim ölkədə var dil gülü, yarəb, nə gözəl.

Adi hər sözdəki məzmun məni ovsunlatmış,
Sanki axmaqdadı məna seli, yarəb, nə gözəl.

Bu rəvan dildə Nizami yaradıb, Sədi yazıb,
Yetirib Ənvərini, Bideli, yarəb, nə gözəl.

Bu dilin şöləsi çox qəlbi işıqlatdı, bu dil
Nurə qərq eylədi çox mənzili, yarəb, nə gözəl.

Hafizin şerini Şahin dedi, bülbül susdu,
Fars dili məst elədi bülbülü, yarəb, nə gözəl.

*6.01.1996*
*Tehran*

***

Hərdən gülürəm mən məni hicran çağıranda,
Hərdən oluram zarü pərişan, çağıranda.

Hicranə düşərkən bilinir qiyməti vəslin,
Dönnəm geri, əlbəttə, a canan, çağıranda.

Gəlmək yanına sanma çətindir mənə, əmr et,
Getməzmi məgər bəndəni sultan çağıranda?

Olmazsa qəfəs sakini, güldən aralanmaz,
Bülbül məgər uçmazmı gülüstan çağıranda?

Çox vaxtımı yar ilə keçirdimsə də, hərdən
Əzm eyləmişəm meydana meydan çağıranda.

Üsyan odu bir vaxt yanar idi canımda,
Asi oluram indisə üsyan çağıranda.

İndi məni söz meydanı çəkməkdə, gedibdir
Fərhadı qaya, Qeysi biyaban çağıranda.

Döndərmərəm əsla üzümü yaxşı adamdan,
Hər an olaram munisi hər an çağıranda.

Şahin, nə qədər dəvətə göz yummadayam mən,
Amma gedirəm şövq ilə İran çağıranda.

*7.01.1996*
*Tehran*

***

Həm vəslə yetən, həm də ki, hicranə mənəm, mən,
Həm aqil olan, həm də ki, divanə mənəm mən.



Hərdən yanıram, yandırıram amma ki hərdən,
Həm şəmə dönən, həm də ki, pərvanə mənəm mən.

Mey məst eləyir canımı, məstanə edir yar,
Həm məst görünən, həm də ki, məstanə mənəm mən.

Kin bəsləməyin ziddinə olsam da həyatda,
Həm doğma olan, həm də ki, biganə mənəm mən.

İllərlə mənə əhd ilə peyman idi məqsəd,
Həm əhdə yetən, həm də ki, peymanə mənəm mən.

Dərdim də olubdur, mənə dərman da tapılmış,
Həm dərdə yetən, həm də ki, dərmanə mənəm mən.

Eşqim elə pak oldu ki, əfsanəyə döndü,
Həm gerçək olan, həm də ki, əfsanə mənəm mən.

Hərdənbir ötüb sərhədi şahinlik edən kəs
Həm İrana, həm Azəribaycanə mənəm mən.

*8.01.1996*
*Tehran*

## İRANA BEŞİNCİ SƏFƏRİM MÜNASİBƏTİLƏ YAZILAN ŞERLƏR

Dərdim o qədər çoxdu ki, dərmanə yetişməz,
Dərman o qədər azdı ki, hər canə yetişməz.

Meydanə girənlər yenə bihudə verir can,
"Bəsdir" sözü, yarəb, niyə meydanə yetişməz?

Bayram yetişib, qoç yenə qurbanlığa hazır,
Bax rəhmimə, xəncər yenə qurbanə yetişməz.

Tapmaq dilədim azca da nöqsanını yarın,
Nöqsanı fəqət bunda ki, nöqsanə yetişməz.

"Gər yandıra öz varını pərvanə rəvadır,
Kimdir ki, qaranlıq gecə cananə yetişmə?" *

Tənə oxu atmaqda səriştən hələ yoxdur,
Canan, oxunun bir dənəsi canə yetişməz.

* Beyt Əlican Qövsi Təbrizinindir.

Şahin, yenə bəxtim gətirib, Məşhədə gəldim,
Arzu eləyən çoxsa da, İranə yetişməz.

*Məşhəd,*
*22.06.1996*

***

Öylə şad etmiş məni yarım, pərişan eyləməz,
Qəlbimi hüsnündən özgə heç nə heyran eyləməz.

Zərrəbinlə bircə-bircə gəzmişəm nöqsanını,
Kim desə nöqsanı gər yoxdursa, nöqsan eyləməz.

"Ah, bir naşı təbibin olmuşam bimarı kim,
Hər nə istər eylər, amma dərdə dərman eyləməz"*.

Dərdimin yetmir dəvası, küsmüşəm loğmandən,
Çarəmin mümkünlüyü yoxdurmu dərman eyləməz?

Vacib olsa eylərəm üsyanımı dünyayə mən,
Asi könlüm bir daha cananə üsyan eyləməz.

Görkəmimdən qorxaraq bir ləhzə aram olmadı,
Vəslimi, bildim ki, yarım bir də hicran eyləməz.

Öylə məftunəm bu yurda, gözlərəm dəvət yenə,
Bivəfalıq Şahinə, əlbəttə, İran eyləməz.

*Tehran,*
*23.06.1996*

## MÜRƏBBE

Aşiq, gözəlim, işvəni görməkdə açıqca,
Hər nazını, hər qəmzəni görməkdə açıqca,
Gizlənmə, gözüm çöhrəni görməkdə açıqca,
Onsuz da xəyalım səni görməkdə açıqca.

Hərdənbir əgər qürbətə etsəm də səfər mən,
Səndən tuturam, ey pəri, hər ləhzə xəbər mən.
Küsmə o gözəl surətə baxmazsam əgər mən,
Onsuz da xəyalım səni görməkdə açıqca.

* Beyt Əlican Qövsi Təbrizinindir.



Hicranın açıq gəldi, vüsalın niyə gizlin?
Bildir mənə, gizlətmə, məlalın niyə gizlin?
Gizlincə xəyal etmə, xəyalın niyə gizlin?
Onsuz da xəyalım səni görməkdə açıqca.

Iqrarını pünhan eləyə bilməyəcəksən,
Ilqarını pünhan eləyə bilməyəcəksən,
Əsrarını pünhan eləyə bilməyəcəksən,
Onsuz da xəyalım səni görməkdə açıqca.

Yarım, fəraq olduqda da görmək səni mümkün,
Gözdən uzaq olduqda da görmək səni mümkün,
Səndən iraq olduqda da görmək səni mümkün,
Onsuz da xəyalım səni görməkdə açıqca.

Mənsiz nə seyr sən, nə çəmən bilməyəcəksən,
Mənsiz nə qızılgül, nə süsən bilməyəcəksən,
Məndən özünü gizlədə sən bilməyəcəksən,
Onsuz da xəyalım səni görməkdə açıqca.

Hərçənd işi aşiq olanın ahü fəğandır,
Nikbinliyim amma mənim hər fərdə əyandır,
Gəl Şahinə gül hüsnünü gizlətmə, amandır,
Onsuz da xəyalım səni görməkdə açıqca.

*Məşhəd,*
*04.06.1996*

***

Ey saqi, gözüm, sanma ki, meyxanədə qaldı,
Fikrim, nəzərim sən kimi cananədə qaldı.

Ay öylə işıqlatdı yeri şəmə yox hacət,
Şadəm, gecə şam yanmadı, pərvanə də qaldı.

Cəlb etmədə hər dəm əni mərdanə adamlar,
Mərdin nəzəri, bəlli ki, mərdanədə qaldı.

Dərdim gülü, qeyb eylədi öz ətrini, amma
Yarəb, nə sehrdir ki, ətir nanədə qaldı?

Məşhəddəyəm, hicran yenidən qismətim olmuş,
Fikrim yenə Ülviyyə və Şahanədə qaldı.

Yox məndə qızıl, var qəzəl, əlbəttə, bu xoşdur,
Minlərlə qızıl var ki, viranədə qaldı.

Şahin, bu şərəfdir mənə ki, gerçəyəm indi,
Bir gün də görərlər adım əfsanədə qaldı.

*Məşhəd*
*04.06.1996*

***

Tarçı, muğamat çal, mizrabını tarə çək,
Çal ki, canım yanmada, oldu ciyər parə, çək.

Ey bu qəzəl sahibi, qoy qələmi bir yana,
Mehrini göstər yara, şilləni əğyarə çək.

Çarəni, tədbirini gözləyirəm, ey pəri,
Sinidə tədbir gətir, məcməyidə çarə çək.

Yandı üzün şəm tək, rədd elə pərvanəni,
Cəzb elə ulduzları, şəminə səyyarə çək.

Gül nə gərəkdir mənə, kəlmələrin gül kimi,
Söyləmərəm mən sənə "gəl məni gülzarə çək".

Vəsmə çəkibsən, qaşın qarələnib gör necə,
Gözlərinə qurbanam, gözlərinə qarə çək.

Şahinə bax, Mənsurun * şerinə məftun olub,
Ya sözümə as qulaq, ya özümü darə çək.

*Tehran,*
*05.06.1996*

## «NAXÇIVAN DƏFTƏRİ» ŞERLƏR SİLSİLƏSİNDƏN

Elim içrə şərəfim var, şanım var mənim,
On kitab ilə elə ərməğanım var mənim.

"Divan"ım ismimi yad etdirəcək illərlə,
Nagüman olmamaq üçün gümanım var mənim.

Gələcəkdə məni tədqiq edəcəklər şəksiz,
Necə tədqiqat içində bəyanım var mənim.

* Həllac Mənsur



Kiminin var cahanı var, kiminin varsızlıq,
Varlıyam mən də, varım - söz cahanım var mənim.

Bəzi kəslər yanılıb eşqə "ziyandır" dedilər,
Mən fərəhlənmədəyəm ki, ziyanım var mənim.

Qaşların dönsə əgər yayə, yayım hazırdır,
Kipriyin olsa əgər ox, kamanım var mənim.

Ayağım yerdə, özümsə uçuram göylərdə,
Gözəlim, şahinə xas asimanım var mənim.

Baharım keçdi, yayım ötdü mənim sürətlə,
Qışıma azca qalıbdır, xəzanım var mənim.

Cansızam, qürbətə düşdükdə canım yox kimidir,
Canlıyam, Azərbaycanda canım var mənim.

Söyləyiblər adına "Nəqşi-cahan" əcdadlar,
Şahinəm, nəqşi-cahan Naxçıvanım var mənim.

*Naxçıvan,*
*11.07.1996*

***

Təkcə qaldıqda müdam ah ilə əfğan edərəm,
Yarı gördükdə isə dərdimi pünhan edərəm.

Sevərəm mən də əgər kim məni sevsə, amma
Mənə bədxah olan insanı pərişan edərəm.

Çarə olmazsa, mənə çarə edən olmasa da
Çarəsiz çox adamın dərdinə dərman edərəm.

Mənə xahiş ilə kim söz desə alsın canımı,
Mənə fərman eləyən adəmə fərman edərəm.

Özümü qəlbigeniş kəslərə qul sansam da,
Özümü qəlbidar insanlara sultan edərəm.

Naxçıvan torpağını ayrı salıblar bizdən,
Bir zaman Naxçıvanı Azərbaycan edərəm.

Zahida, sən mənə gəl eşqimi nöqsan tutma,
Mənə nöqsan isə bu, mən yenə nöqsan edərəm.

Sabirin yazdığı misranı de yarə, Şahin:
"Bir gün öz canımı hətta sənə qurban edərəm"*.

*Naxçıvan,*
*12.07.1996*

***

Göydəyəm mən cahan həsrətli,
Yerdəyəm asiman həsrətli.

Bir nəcib hökmran arzumdur,
Olmasın amma qan həsrətli.

Indimi? Ədlivar insanə
Olmuşuq hər zaman həsrətli.

Yaxşıyam yaxşı yar şövqüylə,
Yaxşı olmaz yaman həsrətli.

O zaman sahibim * görsənmir,
Qalmışam nagüman, həsrətli.

Bir canım var, apar, mən hazır,
Əzrayıl, olma can həsrətli.

Az olur vəslinə imkanım,
Qalmışam Naxçıvan həsrətli.

Bağibanəm, gülüm, heç bir gül
Qalmasın bağiban həsrətli.

Ərməğan ol mənə, görsən bir,
Gözlərim ərməğan həsrətli.

Şahini gəl sına, ey Leylim,
Məcnunam imtahan həsrətli.

*Naxçıvan,*
*13.07.1996*

* Misra M.Ə.Sabirindir.
** Imam Mehdi (ə)



***

Yazıram şerimi vəcd ilə, həyat eşqiylə,
Tutiyəm, söz deyirəm qəndü nəbat eşqiylə.

"Kəlmələr" olmalıdır cəmi əgər "kəlmə" desəm,
Qafiyə düzməliyəm mən "kələmat" * eşqiylə.

"Sevirəm"dir nəqərat eşqimizin nəğməsinə,
Bunu təkrar edirəm hey nəqərat eşqiylə.

Məni qəm dalğası çox döysə də, üzdüm, amma
Çox adam sahilə can atdı nicat eşqiylə.

Ona yardımçı, Ilahi, salavat olsun qoy,
"Salavat" söyləsə hər kəs salavat eşqiylə.

Hanı Düldül, hanı Həzrət Əlinin mindiyi at?
Narahatlıqla günüm keçmədə at eşqiylə.

Ayrılıq əzmimi qırmaz, səbatım var mənim,
Dözürəm ayrılığa əzmü səbat eşqiylə.

Mən gərək həzzə batım, eyşə batım, ey Şahin,
Gəlmişəm Naxçıvana mən Batabat eşqiylə.

*Naxçıvan, Batabat,*
*14.07.1996*

***

Naxçıvan səmtinə, şadəm ki, səfər qismət olub,
Elə bil mən kimi tutiyə şəkər qismət olub.

Bu gözəl yurda yetib xeyli nəvazış gördüm,
Hacəti varmı, deyim orda nələr qismət olub?

Nəzərim öylə ki seyr eylədi "Əshabi-kəf"i **,
Belə dilləndi dilim: - Zərgərə zər qismət olub.

* Kələmat, yəni kəlmələr (ərəbcə)
** "Əshabi-kəf" - Naxçıvan şəhərinin 17 km.-də olan bir mağara. Qurani-Kərimin məlumatına görə bir neçə gənc və onların bir iti kafirlərin bəlasından qorunmaq üçün Allahdan imdad istəmiş və Allah onları "əl-Kəhf" mağarasında 309 il yuxuladaraq qorumuşdur (Bax: Quran, əl-Kəhf surəsi).

Əhdimə, arzuma çatdım Batabat səmtində,
Mənə, şadəm ki, Şərur adlı şəhər qismət olub.

Nə gözəl yerdi Əlincə, nə qəşəngdir Sədərək,
Qeyri bir məskənə Şahbuz məgər qismət olub?

Neçə müddətdi qəmim vardı və həzzim yoxdu,
Gözə nur, əqlə işıq, qəlbə təpər qismət olub.

Etməsinlər belə irad ki verdim qəlbi,
Faydalandım ki mənə böylə zərər qismət olub.

Neçə müddətdi ki, təbim yox idi, görsəndi,
Təbimə sanki bu yerlərdə kəhər qismət olub.

Bu iyirminci əsrdə necə fəxr eyləməyim -
Şahinə "Divan" adında bir əsər qismət olub.

*Naxçıvan,*
*15.07.1996*

## «ÖZBƏKİSTAN DƏFTƏRİ» ŞERLƏR SİLSİLƏSİNDƏN

Qəlbimin qoy bilsin aləm xeyli pünhan eşqi var,
Orda el sevdası vardır, orda canan eşqi var.

Orda vardır həzzü qəm, çəngindəyəm ziddiyyətin,
Orda vardır vəslə sevgi, orda hicran eşqi var.

Dərman umdum, busəni lütf eylədin dərman kimi,
Nazlı yarım, loğmanımsan, məndə loğman eşqi var.

Qurban olmaq niyyətimdir, qurban etmək - şakərin,
Məndə qurban tək kəsilmək, səndə qurban eşqi var.

Dəmbədəm, saatbəsaat gözlərəm fərmanını,
Məndə adət - xahiş etmək, səndə - fərman eşqi var.

Qorxuram ki, mübtəla bir gün olam mən şəkkərə,
Tutiyəm, qəlbimdə daim şəkkəristan eşqi var.



Mən ki, hər əğyarı bir kafər güman etməydəyəm,
Kafərin qəlbində zənn etməm müsəlman eşqi var.

Çox gəzib əfqan diyarın, Iranı, Türkiyyəni,
Şahinin qəlbində indi Özbəkistan eşqi var.

*Daşkənd,*
*21.10.1996*

***

Kimdi bu Şah Ismayıl tək coşdu meydan istədi?
Dostu xürrəm, düşmənin bağrın qızıl qan istədi.

Gahi dərviş tək sərasər gəzdi əfqan yurdunu,
Gahi Iran istədi, gah Özbəkistan istədi.

Bir nicatı yoxmudur, çəngindədir ziddiyyətin,
Gəh vüsalə oldu mail, gah hicran istədi.

Mən sədaqət lütf etdim, aşiq etdi iltifat,
Mən təsəvvüfdən danışdım, arif irfan istədi.

Bəllidir ki, asiyəm əğyar olan hər nakəsə!
Asi könlüm dəmbədəm əğyarə üsyan istədi.

Can nədir canan əgər vardırsa, candan çəkdi əl
Öylə ki, aşiq düşüb sevdayə canan istədi.

Busədir dərmanı Şahin Fazilin, dilləndi yar:
- Guya loğmandır bu kəs, amma ki, dərman istədi.

*Daşkənd,*
*22.10.1996*

***

Baxmasam hüsnünə hər dəm, bürüyür şəkk gözəli,
Baxışından oxunur "ağuşinə çək gözəli".

Məni göyçək neçə afət eləyib cəlb, amma
Doğrusu, görməmişəmmi hələ göyçək gözəli.

Bu nə qaş-göz, bu nə surət, bu nə qamətdi belə?
Mən bəyənnəm, bilir aləm bunu, tək-tək gözəli.

Neçə misra ona qoşdum görübən rəftarın,
Günəhim varmı səvab oldusa görmək gözəli?

Ey qəzəlxan, qəzəlin vaxtı deyildir, bəsdir,
Qələmi at yerə, al fırçanı, tez çək gözəli.

Özbəkistanda dönüb özbəyə ilham pərisi...
Mənə təb verməddir, Şahinə, özbək gözəli.

*Daşkənd,*
*23.10.1996*

***

Mənə məskən nə qədər el, oba hərçənd oldu,
Qismətim indi Buxarayla Səmərqənd oldu.

Neçə tədbir ilə dərviş kimi çıxdım səfərə,
Bu da bir başqa siyasət, bu da bir fənd oldu.

Həmi Kabul məni çəkdi, həmi Tehran özünə,
Məni məftun eləyən həm də Nəhavənd oldu.

Gərçi qəsd oldu Şibirqan * şəhərində iki yol,
Diri qaldım, mənə yardımçı xudavənd oldu.

Özbəkistanə yolum düşdü bu son günlərdə,
Qəlbimə çox şəhəri yaxşıca peyvənd oldu.

Bu böyüklükdə şəhər bəs niyə kənd adlansın?
Daşşəhər söyləyirəm mən, niyə Daşkənd oldu?

Şəhri-səbz ** öylə şirinliklə məni qarşıladı,
Acılıq getdi dilimdən, qəzəlim qənd oldu.

Bənd olan çoxdu şəhərlərdə pəriçöhrələrə,
Şahin isə, deyəcəklər şəhərə bənd oldu.

*Səmərqənd,*
*24.10.1996*

***

Şərqdən elə ki gün tək görsəndi Əmir Teymur,
Fəth eylədi çox şəhri, çox kəndi Əmir Teymur.

İman ilə, qeyrətlə hərb etdi cəsarətlə.
Öyrəndi məharətlə çox fəndi Əmir Teymur.

* Əfqanıstanda şəhər
** Əmir Teymurun doğulduğu şəhər



Düşmənləri qəhr oldu, özbəklərə fəxr oldu,
Turan elinin fateh fərzəndi Əmir Teymur.

Mədh etdim onu mən də, Daşkənddəki hər şerin
Şah beyti Əmir Teymur, şah bəndi Əmir Teymur.

Şahin, elə gün gəldi tunc heykəli yüksəldi,
Alqışlara qərq etdi Daşkəndi Əmir Teymur.

*Daşkənd, Əmir Teymurun heykəli önündə,*
*25.10.1996*

## QƏZƏL

*Hacı Mailə*

Nə böyük dəbdəbə müştağı, nə var aşiqiyəm,
Görür Allah-təala ki, nigar aşiqiyəm.

Neçə vaxtdır mənim İranda gözüm qalmışdır,
Canda Təbriz qübarı var, qübar aşiqiyəm.

Qırğızıstanə yolum düşsə əgər bir də, xoşam,
Var qərarım ki gedim bir də, qərar aşiqiyəm.

Tacikistanda, güman eylə, tacım var mənim,
Gürcü mülkündə xumarəm ki, Xumar aşiqiyəm.

Mən Dağıstandə Dərbəndi görüb bənd oldum,
Neçə Türkiyyə kimi sevgili yar aşiqiyəm.

Türkmənistan, Qazaxıstan mənə çox lütf etmiş,
Mən qopuz çaldım o yerlərdə, setar aşiqiyəm.

Əfqanıstan mənim ömrümdə yadımdan çıxmaz,
Özbəkistan kimi bir türfə diyar aşiqiyəm.

Saçlarım zirvə qarından dəxi ağ Şahdağımın,
Ömrümün yetsə də qış fəsli, bahar aşiqiyəm.

Şahina, baxma, qocalsam da həyat eşqim çox,
Sanmasınlar ki, olub zar məzar aşiqiyəm.

*Daşkənd,*
*27.10.1996*

## İRANA ALTINCI SƏFƏRİM MÜNASİBƏTİLƏ ŞERLƏR SİLSİLƏSİNDƏN

### QƏZƏL

Sənsizəm, mən necə möhnət çəkirəm mən bilirəm,
Ayrılıqdan nə əziyyət çəkirəm mən bilirəm.

Neçə surət meyi süzmüş mənə məna qədəhi,
Bu fəraq içrə nə firqət çəkirəm mən bilirəm.

Öndə dağ, əldə külüngüm... Qələmimdir bu külüng,
Şirinim, mən niyə surət çəkirəm mən bilirəm.

Seçmirəm köhnə lüğətlərdən ərəb-fars sözünü,
Saf yazıb mən necə zillət çəkirəm mən bilirəm.

Bir gülü, qafil olub tapdamışam bağında,
Bağibanım, nə xəcalət çəkirəm mən bilirəm.

Gözləyirsən məni, saqi, sənə minnətdarəm,
Nə səbəbdən sənə minnət çəkirəm mən bilirəm.

Dinməyin Şahinə qürbətdə fərəhdən bir də,
Gecə-gündüz necə xiffət çəkirəm mən bilirəm.

*Tehran,*
*13.04.1998*

### MÜRƏBBE

Dərdimə cananı loğman eləmişdim təzəcə,
Yenidən canımı hicran alovu yandırdı.
Eşqimə aləmi heyran eləmişdim təzəcə,
Yenidən canımı hicran alovu yandırdı.

Başlamışdı təzəcə əhd ilə peyman şövqü,
Düşünürdüm ki, yaranmaz daha hicran şövqü,
Çulğadı qəlbimi birdən-birə İran şövqü,
Yenidən canımı hicran alovu yandırdı.



Məşələ döndü alov, mən isə pərvanə kimi...
Məqsədi xatirə salmaqmı məgər həsrətimi?
Niyyəti yoxlamaq olmuşmu mənim taqətimi?
Yenidən canımı hicran alovu yandırdı.

Düşünürdüm, mətinəm, sındıra bilmişdi məni,
Sirr deyil, bir neçə yol yandıra bilmişdi məni,
Şəhriyar eşqi ilə atəşə verdim bədəni,
Yenidən canımı hicran alovu yandırdı.

Mən ki, ram eyləməyə naləmi söz vermişdim,
Yaxına qoymayacaqdım qəmi, söz vermişdim,
Mən ki, tərk etməməyə ölkəmi söz vermişdim,
Yenidən canımı hicran alovu yandırdı.

Bülbüləm mən, məni gözlər süsənim, yasəmənim,
Dönərəm tez geriyə, arxayın olsun vətənim,
Şəhriyar ilə görüş naminə şadəm ki, mənim
Yenidən canımı hicran alovu yandırdı.

"Dözməzəm hicr oduna, - söylər idim, - ər deyiləm",
Dözmürəm, dərk edirəm ki, daha sərvər deyiləm,
Çünki, mən şahinəm eşq içrə, səməndər deyiləm,
Yenidən canımı hicran alovu yandırdı.

*Tehran,*
*14.04.1998*

### QITƏ

Tanış oldum gülərüz, baməzə bir baqqalla,
İçirəm Qumda yanıb qum kimi baqqal çayını.
Oturub üz-üzə vaxt var idi eyş eylərdim,
Nuş edərdim o şirin dılbərimin bal çayını.

Təşnəyəm öylə ki, indi Qubada olsaydım
Qurudardım içərək bəlkə də Qudyal çayını.

*Qum şəhəri,*
*15.04.1998*

### QƏZƏL

Bağiban, baxmayıram sünbülü reyhan tərəfə,
Baxıram çünki yenə sevgili canan tərəfə.

Sevgilim, vəslə sanırdım daha yoxdur imkan,
Yenə cəlb eyləmisən fikrimi imkan tərəfə.

Yox idi can nəzərimdə, mənə vermişsən ruh,
Təzədən ruhə gəlib meyl edirəm can tərəfə.

Sən şəkərsənmi, deyilsən, şəkəristansan sən,
Şəkərim gəlmədəyəm mən şəkəristan tərəfə.

Göz mürəkkəb tərəfə baxdı qəzəl yazmaqçın,
Qanə düşsün can atan varsa əgər qan tərəfə.

Istərəm mən təzədən vəsf eləyim Iranı,
Qətrə təbim yenə yön tutmada ümman tərəfə.

Bakıda görmədilər Şahini, canan dedi ki,
Şahin uçmuş yenə şahin kimi Iran tərəfə.

*Tehran,*
*16.04.1998*

## QITƏ

*Təbriz, ustad Şəhriyarın məzarı önündə düşüncələr*

Bəllidir ki, nə qədər mədəni saxlar dağlar,
Nə qədər gizli xəzinə dağın altında yatır.

Elə kəs var ki, kəfənsiz uyuyur torpaqda,
Elə adam dəxi var bayrağın altında yatır.

Uyuyur torpağın altında böyük bir şair,
Torpaq üstündə gəzən torpağın altında yatır.

*"Məqbərətüş-şüəra" qəbiristanlığı,*
*17.04.1998*

## QƏZƏL

Istəmişdi neçə yol sevgili canan - ləli,
Istədim töhfə edim bir neçə əlvan ləli.



Deyib "Allahə təvəkkül" səfərə əzm elədim,
Düşdüm hicranə, fəqət vermədi hicran - ləli.

Əfqanıstandakı ləlin əvəzi mümkünmü?
Tapmadım mən yaraşan yarıma Iran ləli.

Neçə ləl almağa var idi əlimdə imkan,
Bəxş edə bilmədi amma mənə imkan - ləli.

Bizə can ləli ürəkdir, çıxarıb köksümdən
Hazıram təklif edim cananıma can ləli.

Gəlib ilhamə yara ləl kimi söz yazdım,
Şairin ləli yanında nədi sultan ləli?

Qiyməti "Divan"ımın ləli-Bədəxşandan çox,
Şahinə, az tapılan daşdı Bədəxşan ləli!

*Təbriz,*
*17.04.1998*

## QƏZƏL

Söz demişik, sözdə qələt var imiş,
Bilməmişik, bizə qələt var imiş.

Mən səni, ey gül, gülə bənzətmərəm,
Lalədə, nərgizdə qələt var imiş.

Qeys ilə Fərhadə əlac olmadı,
Dağda qələt, düzdə qələt var imiş.

Təbrizi bizdən ayırıbmış duman,
Söyləmə Təbrizdə qələt var imiş.

Çox üzə malik bu siyasətçilər,
Bir üzə bax, üzdə qələt var imiş.

Ərdəbil üçün darıxıbdır Bakı,
Bizdə xəta, sizdə qələt var imiş.

Zənn eləyirdim ki, bükülməz dizim,
Ağlayıram, dizdə qələt var imiş.

Şahina, vacibdi bəsirət gözü,
Üzdə olan gözdə qələt var imiş.

*Təbriz,*
*18.04.1998*

## QƏZƏL

Sən mehrini göstər, yenə sevda eləyim zənn,
Bük zəhrini göndər mənə, həlva eləyim zənn.

Bildir mənə şirinliyini, öylə danış ki,
Hər bir sözünü şəkkərü xurma eləyim zənn.

Surətdəki mənanı görən yoxdu mənim tək,
Sən surəti göstər mənə məna eləyim mən.

Var öylə adam dilbəri ağlar gecə-gündüz,
Tək bircə gilə göz yaşı dərya eləyim mən.

Yağmur kimi səp sən mənə xoşbəxtliyi öylə,
Aləmdəki bədbəxtliyi röya eləyim mən.

Səhrayə yolum düşməsə də, istəyirəm ki,
Yarım, məni Məcnun, səni Leyla eləyim zənn.

Canan dedi: - Şahin, daha sən qürbətə getmə,
Yol vermə daha şahini durna eləyim zənn.

*Təbriz,*
*18.04.1998*

## QƏZƏL

Əlvida, ey həmsəfərlər, mən səfərdən bezmişəm,
Hər səfərdə min kədər vardır, kədərdən bezmişəm.

Xoş xəbərlər göndərən yox, bəd xəbərlər tez gəlir,
Bixəbərlər bilməyirlər bəd xəbərdən bezmişəm.

Istərəm sərhədsiz olsun bağlər xülya təki,
Bağiban istər çəpər, mən hər çəpərdən bezmişəm.

Bir yarım var, bezmirəm, amma demiş Xosrov mənə:
"Şirini istər könül, billəh Şəkərdən bezmişəm".



Söyləyirlər eşqdən əl çək, zərərdir, çəksəm əl,
Faidəm vardırmı, ey Rəbbim, zərərdən bezmişəm.

Gör nə müddətdir mənim gülmür gözüm gülzardə,
Saqidən bezməkdəyəm, meydən də hərdən bezmişəm.

Neyləyim, qaçqındlarım, köçkünlərim zillət çəkir,
Bəd nəzərlər dəydi yurda, bəd nəzərdən bezmişəm.

Doğru sözdür, dustlər, ortaq malın var əngəli,
Müştəri beşdir, Xəzər bir *, dərdisərdən bezmişəm.

Isti qum, əngin səma, səhradə Leyla-yanğısı,
Istərəm Məcnun olum, Şahin, şəhərdən bezmişəm.

*Tehran,*
*19.04.1998*

## QITƏ

Varağım şerlə doldu, bu gecəm uğurlu oldu,
Yenə sübh açıldı, saqi, gətir axşamın meyindən.

Necə də səliqəsizdir gecə yazdığım sətirlər,
Qələmim də məst olubdur yenə ilhamın meyindən.

Yenə uçmada xəyalım, sonu varmı arizunun?
Nə ola içəydim indi Cəm içən camın meyindən.

Mənə surə mey olubdur, şərabım olubdur ayə,
Hanı islamın şərabı, hanı islamın meyindən?

Niyə sərxoş olmuram mən, mənə sən su vermisənmi?
Mənə, saqi, öylə mey ver ola Xəyyamın meyindən.

*20.04.1998*

***

Eşq əzəl qismət olub Adəm ilə Həvvayə,
Xoş gəlib onlara, sonra yayılıb dünyayə.

Elə aşiq gəzirəm mən bizə olsun örnək,
Sevəni sövq eləsin surətə yox, mənayə.

---
* Azərbaycan, Iran, Rusiya, Qazaxıstan, Türkmənistan

Fəqət eşqində şirinlik gəzən aşiq hanı ki,
Dikməyə gözlərini tuti kimi xurmayə.

Meyi zəqqum bilə, zənn eyləyə həlvanı acı,
Nə sala badəyə meylin, nə baxa həlvayə.

Hanı aşiq gözü ki, əzmi görünsün gözdə,
Hanı aşiq sözü ki, bənzəməsin röyayə.

Hanı dilbər ki, zərü zivərə meyl eyləməsin,
Neçə daş-qaşə görə başlamasın qovğayə.

Gözü olmuş bulaq aşiq görürəm mən, sanki
Axıdıb göz yaşı verməkdə acıq dəryayə.

Nə dəli söyləyəcəklər, nə şəhərdən qaçacaq
Kim ki, Şahin təhəri düşsə əgər sevdayə.

*Tehran,*
*20.04.1998*

## «GÜRCÜSTAN DƏFTƏRİ» SİLSİLƏSİNDƏN

### QƏZƏL

Yelləndi xəyalım yenidən, hər yana uçdu,
Dağdan, dərədən adlayaraq ormana uçdu.

Ər xisləti hakim kəsilən Ərranı * ötdü,
Şir qəlbli insanı olan Şirvana uçdu.

Xülyalı adamlar belədir, bir də görürsən
Gah eşqə düşüb, gahi gəlib əfğana, uçdu.

Gah üsyana, üsyançılara etmədi rəğbət,
Gah asi olub, ley sayağı meydana uçdu.

Bir yerdə qərar etmədi heç vədə bu şair,
Gah Ərzruma getdi, gah Ərzincana uçdu.

* Aran



Daşkəndi qoyub arxada, Dərbəndə qovuşdu,
Istanbula "sağ ol" deyərək Tehrana uçdu.

Eynən özünün isminə uyğundu bu Şahin,
Şahin quşuna döndü və Gürcüstana uçdu.

*Tbilisi, "Xedi" hoteli,*
*20.05.1998*

### QƏZƏL

Ey vüsalım, təzədən qarşıda hicran dayanır,
Hicri görcək bədənimdə elə bil qan dayanır.

Qoca Gürcüstana çatdım, göz önündə sanıram
Şeyx olan, amma Xumar aşiqi Sənan dayanır.

Əhdü peymanə vəfa eyləmək örnəkdi bizə,
Hara getsək də, fələk, əhd ilə peyman dayanır.

Yüz Xumar olsa da mən dinimi tərk eyləmərəm,
Göz önündə yenə şəst ilə müsəlman dayanır.

Qoca dünyanı səyahət eləməkdir fikrim,
Meyli icra eləməkçin neçə imkan dayanır.

Tutmuram şahlığa tay bəlkə də dərvişliyimi,
Mənə tənə eləyən indi peşiman dayanır.

Şahina, səpməyirəm mən daha göz yaşlarımı,
Bu səbəbdən nə qədər indi dəyirman dayanır.

*axetiya, Telavi şəhəri,*
*21.05.1998*

### QƏZƏL

Mən gərək carçı olub yel kimi hər yanə gedim,
Gəh çıxım dağ başına, gəh də biyabanə gedim.

Car edim: - Məndədi Məcnun ilə Sənan eşqi,
Ərzə bildirməyə bu ərzi səmimanə gedim.

Aləmin diqqətini cəlb eləyəndən sonra
Şirinim, qəsrimə Xosrov kimi şahanə gedim.

Əyləşib sevgiyə dair yaradım qanunlar,
Bütün əğyarlərin dəfinə üsyanə gedim.

Xumarım var başımda, mənə mey ver, saqi,
Mən gərək sevgilimin yanına məstanə gedim.

Gəlmişəm gülşənə, gülşən məni bihuş eləyir,
Toplayıb yarıma şövq ilə süsən, nanə, gedim.

Sala bilsə məni təşvişə alağlar bağda,
Alağı üzməyə bağban ilə mərdanə gedim.

Bu nə güldür, bu nə gülşən, nə gülüstandır bu!..
Vəd edib gəlməyimi nərgizə, reyhanə, gedim.

Şahinəm, bülbülü oldum bu gülüstanın mən,
Dəliyəmmi çıxaraq başqa gülüstanə gedim?

*Tabaxmela,*
*22.05.1998*

## QƏZƏL

Qoca Tiflisdə nə şəfqət, nə məhəbbətdir bu?
Nə lütfdür mənə qarşı, nə lətafətdir bu?

Hurini, qılmanı tapmaq diləyən burda tapar,
İndi zəvvar oluram burda, ziyarətdir bu.

Dəli Kür, coşğun ləri gözü cəlb eyləmədə,
Bu nə seyran, nə seyrdir, nə səyahətdir bu.

Məni əfsunladı sehriyə Tabaxmela yeri,
Haqqı var fəxr eləsə gürcü, fəxarətdir bu.

Bu Tabaxmela "Tabağ məhlə" deməkdir, ey dil,
Ola bilməz yalanım sözdə, həqiqətdir bu.

Şeyx Sənan başa düşdüm ki, neçin eşqə düşüb,
Mən də aşiq oluram, məndə nə halətdir bu?

Neçə saətdi ki, tərif eləyirsən... hələlik
Şahina, nöqtəni qoy burda, kifayətdir bu!..

*Tabaxmela,*
*23.05.1998*



## QƏZƏL

Qalmadı, Sənan, daha səbrü qərarım mənim,
Gürcü diyarındayam, yoxdu Xumarım mənim.

Gəldi bahar, açdı gül, amma şərab içmirəm,
Çünki, görünmür gözə sevgili yarım mənim.

Hicrə edib mübtəla yordu bu Tiflis məni,
Saqi, gətir mey, yenə artdı qübarım mənim.

Munis olubdur mənə burda Əmirəhmədi,
Yaxşı ki, Bəhram * olub yavərü yarım mənim.

Erməni də qonşudur, gürcü də, çox fərqi var,
Ermənidən çox çəkib dərd diyarım mənim.

Yadıma hər dəm düşür qonşumuzun yadlığı,
Xan Qarabağ yaddadır, sındı vüqarım mənim.

Saqi, kədərlənmişəm, sən oxu, mən tar çalım,
Kimdədi mizrab, gətir, hardadı tarım mənim?

Təsiri yox "sim-sim"in, kim məni tilsimləyib?
Bəxt qapısı bağlıdır, yoxdu açarım mənim.

Qədd əyilib yay kimi, saç ağarıb qar təkin,
Sahibini gözləyir indi məzarım mənim.

Şahina, ömrümdə var sanki qatar sürəti,
Olmayacaq saxlayan, getdi qatarım mənim.

*Tabaxmela,*
*24.05.1998*

## QƏZƏL

"Mən yenə yarım tərəfə gəlmişəm" **,
Nazlı nigarım tərəfə gəlmişəm.

Aşiqə yox fərqi təriqətlərin,
Gürcü Xumarım tərəfə gəlmişəm.

---

* Bəhram Əmirəhmədi - Tbilisidə tanış olduğum ziyalı bir iranlı alim
** "Bare-degər canebe-yar amədim"
*Şəms Təbrizi*

Açmalıyam bağını, ey bağiban,
Yol ver, açarım tərəfə gəlmişəm.

Sərvət olub mənəvi dostluq bizə,
Mənəvi varım tərəfə gəlmişəm.

Ovçu mənə ovlağa yol vermədi,
Ovçu, şikarım tərəfə gəlmişəm.

Qırğı, gəlib qon qoluma sən yenə,
Durna, qatarım tərəfə gəlmişəm.

Gürcülərin hörməti var Şahinə,
Sanki diyarım tərəfə gəlmişəm.

*25.05.1998*
*Tbilisi*

## QITƏ

Gürcü qardaşlarımın üst-başına göz qoyuram,
Kimisi başə qoyur fəs, kimisi şallı olur.

Gününü xoş keçirir burda adamlar cümlə
Mey içib, rəqs eləyib, nəğmə deyib, hallı olur.

Millətindən asılı olmayaraq, dünyadə
Niyə dindarlərin hər biri saqqallı olur?

*25.05.1998*
*Tabaxmela*

## DÖRDLÜK

Mən salam etmədəyəm ölkəmə hər dəm sənsiz,
Batmışam burda hicrdən qəmə hər dəm sənsiz.
O səbəbdən ki, adam tapmayıram söhbətçin,
Dərdimi söyləyirəm kölgəmə hər dəm sənsiz.

*Tabaxmela,*
*25.05.1998*

## QƏZƏL

Neçə şahanə adamlarla olub şahanə
Yazıram şer qürur ilə Azərbaycanə.

Istiqamət mənə birdir, yolumu düz gedirəm,
Sözü namərdlərə izhar edirəm mərdanə.



Deməyin "Yox daha aşiq ki, tay olsun Qeysə",
Mən həqiqətsevənə söyləməyin əfsanə.

Meyə, meyxanəyə irfani nəzərlərlə baxın,
Meyə, meyxanəyə əsla deyiləm biganə.

Gəzdim əfqan elini, Türkiyəni, Iranı,
Mən salam ərz edirəm indisə Gürcüstanə.

Şəmi eşqin məni yandırdı bu gün özxoşuma,
Şəmə, əlbəttə, yanaşdıqda yanar pərvanə.

Şahinəm, şahə də baş əyməmişəm ömrümdə,
Bəndəyəm amma o cananə təkin sultanə.

*Mtsxeba (Gürcüstanın VI əsrə qədərki paytaxtı)*
*25.05.1998*

## QƏRAR

Canım, məstanəlik bu qədər olmaz,
Saqi, bir macal ver ayılım barı.
Şərabın təsiri bu təhər olmaz,
Canı xumar edir gürcü Xumarı.

NEcə sevincəyəm, şadam bu yerdə,
Gözəlləri birdir, ikidir bəyəm?
Sənan ola bilər adam bu yerdə,
Daha Gürcüstana getməyəcəyəm!!!

*Tbilisi,*
*26.05.1998*

## «LƏNKƏRAN DƏFTƏRİ»NDƏN:

## QƏZƏL

Ey xumar yar, Lənkərandə
Olmadım xumar Lənkərandə.

Sanma lalə - zar, var laləzar,
Həm də etibar Lənkərandə.

Məndə qəm-qübar oldu aşikar,
Qaldı yadigar Lənkərandə.

Yetdi intizar, getdi ixtiyar,
Tutmuram qərar Lənkərandə.

Yoxluğun ki var, yoxdur ixtiyar,
Şahin oldu zar Lənkərandə.

*21.10.1998*

## ƏGƏR BIRCƏ GECƏ MƏNIMLƏ QALSAN

*"Həme aləm məra başəd ke yek saət mərabaşi"* *
*Ədib Sabir*
*(fars şairi)*

Yetişdi dərdimə çara deyərəm
Əgər bircə gecə mənimlə qalsan.
Ötən hər gecəmə qara deyərəm
Əgər bircə gecə mənimlə qalsan.

Coşğunluq, çılğınlıq coşar canımda,
Inqilab yaranar güzəranımda.
Əbədi bir sevinc qalar canımda
Əgər bircə gecə mənimlə qalsan.

Bir daha dünyadan gileyim olmaz,
Tanrıdan qeyri bir diləyim olmaz,
Gələcək gecələr gərəyim olmaz
Əgər bircə gecə mənimlə qalsan.

Aqillik şövqünə yetmişəm demək,
Kamillik şövqünə yetmişəm demək,
Ləzzətin fövqünə yetmişəm demək
Əgər bircə gecə mənimlə qalsan.

Nəşə elə artar aləm alçalar,
Hicran yasa batar, vüsal əl çalar,
Ətrin məzarda da mənimlə qalar
Əgər bircə gecə mənimlə qalsan.

Bir də eşq bağından çiçək dərmərəm,
Yanmaq diləyərək olaram Kərəm,

* "Əgər bircə saat mənimlə olsan,
Inan, bütün aləm mənimki olar".



Daha yaşamaqda məna görmərəm,
Əgər bircə gecə mənimlə qalsan.

Həzzi bir gecənin bir ömrə dəyər!
Şahinəm, keçərəm candan müxtəsər,
Özüm öz başımı kəsərəm səhər
Əgər bircə gecə mənimlə qalsan.

*22.10.1998*

## QITƏ

Insaf elə, alma nişana ahuni, ovçu,
Al, ömrü verim mən sənə, sən ahu bağışla.

Yerdə su çatışmır deyə fəryad eləyirlər,
Səp gözlərinin yaşını, aşiq, su bağışla.

Qonşum yata bilmir gecələr ahim üzündən,
Ey mən kimi narahət olan qonşu, bağışla.

*23.10.1998*

## ŞIRINLƏŞƏRMIŞ

Yarı andığım anda
Xəyal şirinləşərmiş.
Eşq himni çalınanda
Qaval şirinləşərmiş.

Olmaz o canan təki,
Sevdim onu can təki,
Zülfə toxunan təki
Sığal şirinləşərmiş.

Sözün güldüyü dəmdə,
Gözün güldüyü dəmdə,
Üzün güldüyü dəmdə
Camal şirinləşərmiş.

Qüssə aşıb-daşanda,
Qəmlə bacılaşanda,
Haram acılaşanda
Halal şirinləşərmiş.

Uzatdım sənə əli,
Nənə, ver mənə əli,
Dəyəndə nənə əli
Qoğal şirinləşərmiş.

Nə mənzərə, yahu, bu:
Bu maraldı, ahu - bu!
Görünəndə ahusu
Maral şirinləşərmiş.

Səsləyirəm hicranı,
Gözləyirəm hicranı,
Çoxaldıqca hicr anı
Vüsal şirinləşərmiş.

*24.10.1998*

## QITƏ

Yuxu gördüm, əmin oldum ki, bu gündən sonra
Sənə tay bir daha Allah gözəl verməyəcək.

Şerimin gülşənini seyr eləyib söylədilər:
Elə gülşəndi bu, heç vədə xəzəl verməyəcək.

Məni səhradə xəbərdar elədi Məcnun ki,
Ey şəhər sakini, səhra sənə əl verməyəcək.

*25.10.1998*

## TƏKBEYT

Şerin nə əruzi, nə hecası?
Mərdin nə cavanı, nə qocası?

*26.10.1998*

***

Dərvişəm, indi məkanım Lənkəran olmuş mənə,
Lənkəran əhli təmamən mehriban olmuş mənə.

Hər səfərdə çox xətalərdən çıxardan mən kəsi
Şübhəsiz Pərvərdigarımdır, hayan olmuş mənə.

Mən gələrkən bağə yar ilə, çıxıb bağdan gedir,
Halıma hər dəm yanan kəs - bağiban olmuş mənə.



Imtahandan mən kimi, billəh, heç aşiq çıxmamış,
Dəmbədəm sevda yolunda imtahan olmuş mənə.

Olmaram aşiq dedim heç dilbərə bundan belə,
Bir də gördüm eşqsizlikdən ziyan olmuş mənə.

Hökmranım bir xatundur gör haçandan, Şahina,
Bir pəri - ilham pərisi hökmran olmuş mənə.

*27.10.1998*

## «DAĞISTAN ŞERLƏRİ» SİLSİLƏSİNDƏN:

## SƏKKIZLIK

Açım ürəyimi indi kimə mən?
Məni anlayası varmı sirdaşım?
Ümid eləmişdim ümidimə mən,
Indisə ümidsiz axır göz yaşım.

Vallah, arzu qönçəm açılmayacaq,
Billah, yuxum mənim olmayacaq çin.
Qoy qalsın həsrətim ömürlük oyaq,
Qoy mənim ümidim yuxuya getsin.

*Dağıstan, Məhərrəmkənd,*
*17.05.1999*

## QƏZƏL

Yaradan öylə veribdir bu qəzəlxanə odu,
Görübən qaçdı yanımdan neçə cananə odu.

Bağiban öldürəcəkdir özünü, ey Rəbbim,
Bülbülün məskənidir, vurma gülüstanə odu.

Elə onsuz da vüsal oddu, oda od vurma,
Qoy kül olsun alışıb, sövq elə hicranə odu.

Məndə gündən-günə divanəyə heyrət çoxalır,
Niyə gördükdə qaçır vəhm ilə divanə odu?

Ehtiram eyləyirəm amma ki, pərvanəyə mən,
Mən təkin sevmədədir yansa da pərvanə odu.

Oda qurban olum, amma vətənim odda yanır,
Cəng əli saldı neçin Azəribaycanə odu?

Neçə meydanda yanıbdır ciyərim, ey Tanrı,
Mənə meydan odu yox, lütf elə meyxanə odu.

Səndə ki, var bu qədər od, geri dön, ey Şahin,
Yandırarsan dağı da, vurma Dağıstanə odu.

*Dərbənd,*
*18.05.1999*

## QƏZƏL

Öldüm daha, dərmanımı cananə gətirsin,
Gəlsin yanıma, canverəni canə gətirsin.

Dərviş kimi çox yeri gəzdim... Ulu Tanrı
DƏrviş çəkən ləzzəti sultanə gətirsin.

Etdikcə səyahət nə qədər məscidə getdim,
Bundan belə tale önə meyxanə gətirsin.

Sərhəddə bu gün dağlı igidlərlə görüşdüm,
Tale hamının meylini imkanə gətirsin.

Ey Tanrı, bu gün dostlarım ilən yenə şadəm,
Yol verme daha badəni biganə gətirsin.

Məstanə qayıtdım yenə Dərbəndə gedib məst,
Tale həmişə şairi məstanə gətirsin.

Hərçənd ki, Şahin eləmir həsrətə rəğbət,
Həsrət onu qoy bir də Dağıstanə gətirsin.

*Dərbənd,*
*19.05.1999*

## QƏZƏL

Neçə gündür ki, anıb yarımı hey dad edirəm,
Neçə gündür ki, Dağıstandə fəryad edirəm.



Mən qəzəl yazmasa idim ürəyim çatlardı,
Qəzəl ilən özümə çarəvü imdad edirəm.

Ulu Seyyid, ulu Sabir, ulu Vahid - fəxrim,
Bilmədim heç özümə mən kimi ustad edirəm.

Nə izafət görəcəklər qəzəlimdə, nə xəta,
Mən qəzəl mülkünü təmkin ilə abad edirəm.

Məni şair, məni alim tanıyıbdır çoxusu,
Elimin aşiqi tək amma bu gün ad edirəm.

Dəyməsin qoy mənə cəllad əli düşsəm günəhə,
Özümü öz başımı kəsməyə cəllad edirəm.

Ah çəkdim və Dağıstandə bir dağ yıxdım,
Şirinim söylədi: - Şahin, səni Fərhad edirəm!

*Kaspiysk şəhəri,*
*20.05.1999*

## FƏLƏK AYAĞIMDAN TIKANI ÇƏKMIR

Elə üzülüb ki, Şahinin canı,
Əli gücdən düşüb, kamanı çəkmir.
Amma canda qalıb Qeysin fəğanı,
Bir kimsə o çəkən fəğanı çəkmir.

Arzumun gülünü yellər apardı,
Qəlbin dözümünü illər apardı...
Elə ki, Saranı sellər apardı,
Bulaq da heç daha çobanı çəkmir.

Varımı-yoxumu külək apardı,
Üstəlik çox arzu, dilək apardı...
Əlimdən gülümü fələk apardı,
Amma ayağımdan tikanı çəkmir.

*Dərbənd,*
*21.05.1999*

## İRANA YEDDİNCİ SƏFƏRİM MÜNASİBƏTİLƏ ŞERLƏR

### QƏZƏL

Elə ki naz ilə ol sevgili cananə gəlir,
Nazı çəkmək həvəsim tazələnib canə gəlir.

Gülləri bağibanın gör nə yaman solmuşdur...
Tazə bir gülsə məhəbbətlə gülüstanə gəlir.

Necə istək, nə diləkdir, nə ürəkdir onda,
Sanki şəmin oduna yanmağa pərvanə gəlir.

Əhsən üstdən ona əhsən demişəm hər vədə,
Bütün əğyarlərə gör necə biganə gəlir.

Qədrini sevdiyinin bilməyən insanlar var,
Asi könlüm elə insanlara üsyanə gəlir.

Yaşımın çoxluğunun təbimə yoxdur zərəri,
Təbimin köhləni gündən-günə cövlanə gəlir.

Eşidib dostları Şahin Bakını tərk eləyib,
Dedilər: - Özgə yerə yox, yenə Iranə gəlir.

*Iran Astarası,*
*15.06.1999*

### QƏZƏL

Çox uzandı bu səfər zənnimcə,
Məni üzməkdə kədər zənnimcə.

Yenə sərhəddə dirəklər gördüm,
Çürüyübdür bu çəpər zənnimcə.

Ənzəli, Rəşt, Lahican, Ruyan...
Durudur burda Xəzər zənnimcə.

Dözmüşəm mən neçə il çox hicrə,
Tərk edir cismi təpər zənnimcə.

Gecə rahətliyimiz var bizim,
Amma üstündü səhər zənnimcə.

Gözəlim, gündə üzərrik yandır,
Bizə dəyməkdə nəzər zənnimcə.

Gəl ki, səhrayə gedək, ey Leyli,
Boğanaqdır bu şəhər zənnimcə.

Olaram bəlkə də səhra şahı,
Görərəm orda səmər zənnimcə.

Şahina, xatirə düşməkdə Bakı,
Məni boğmaqda qəhər zənnimcə.

*Ənzəli-Ruyan yolu,*
*16.06.1999*

***

Mey ver mənə, ey saqi, bir ülvi məramım var,
Cəm qoy məni bilsinlər, əldə neçə camım var.

Məndən də bu dünyadə zəngin bir adam varmı?
Qiymətli dürüm yoxdur, qiymətli kəlamım var.

Səyimlə, iradəmlə minlərlə şer yazdım,
Vallah, elə şahəm ki, minlərlə qulamım var.

Şerimdə mənim görməz bir kimsə qəliz kəlmə,
Seyr et nə səliqəm var, bir gör nə nizamım var.

Şer əhli gərək olsun həm milli, həmi xəlqi,
Düzgünlüyünə fikrin, söz yox ki, inamım var.

Bir ölkəni, min əfsus, bir çay ikipay etdi,
Şirvanda Seyid varsa, Təbrizdə Hümamım var.

Mənsur çəkən həzzi Şahin çəkəcək bir gün,
Ey dar "əleyküm" de, ey dar "salam"ım var.

*Çinaran-Məşhəd yolu,*
*17.06.1999*

## QƏZƏL

Məşhədin hər daşı mərcanə bərabərmiş ki!
Qəlbimin sevgisi ümmanə bərabərmiş ki!

Xəstələndim, mənə bir xəstə gəlib verdi şəfa,
Bu yerin xəstəsi loğmanə bərabərmiş ki!

Mən imamı yenə sidq ilə ziyarət elədim,
Niyyətim, şükr ola, imkanə bərabərmiş ki!

Necə mömündü bu iman evinin bəndələri -
Mələyə, huriyə, qılmanə bərabərmiş ki!

Mənə zəng eylədi canan "Bakıya tezcə qayıt",
Cananın xahişi fərmanə bərabərmiş ki!

Bir vüsal naminə mən bir neçə hicran gördüm,
Bir vüsal bir neçə hicranə bərabərmiş ki!

Görübən qüvvəmi eşq içrə mənim söylədilər:
- Necə şahindi bu, aslanə bərabərmiş ki!

*Məşhəd,*
*18.06.1999*

## QƏZƏL

Içsəm meyi az başimə meyxanə dolanmaz,
Saqisə edər naz daha məstanə dolanmaz.

Pərvanələrin xətrinə yanmaq dilərəm mən,
Şam yanmasa, ətrafinə pərvanə dolanmaz.

Bədbinliyim artıb neçə vaxtdır, dedi yarım:
- Şahım niyə çoxdandı ki, şahanə dolanmaz?

Eşqim elə şöhrətli ki, əfsanə deyirlər,
Bilməm niyə dillərdə bu əfsanə dolanmaz?

Biganə adamlar ilə ülfətdə olan var,
Amma mən olan yerdəsə biganə dolanmaz.

Cahil - görübən məndəki fazilliyi gəlməz,
Aqil - dolanar dövrəmə, divanə - dolanmaz.

Hər dəfə gələndə məni Tehranə çəkirlər,
Şahin quşu çoxdandı ki, Zəncanə dolanmaz.

*Təyyarə, Məşhəd-Tehran hava yolu,*
*19.06.1999*

## QITƏ

Gəlmişəm səcdənə, ey Məsumə,
Qəlbimə daimi nisgil sənsən.

Nurisən gözlərinin dindarın,
Dinsizin gözlərinə mil sənsən.

Qum sanı var idi dərdim Qumda,
Eləyən dərdimi yüngül sənsən.

"Sevginin sahili olmaz" dedilər,
Bəlkə də sevgimə sahil sənsən.

Nur edən məscidi qəndilmi məgər?
Bu şərif məscidə qəndil sənsən.

Torpaq üstündə bitən gül çoxdur,
Torpaq altında bitən gül sənsən!

*Qum şəhəri, "Hərəme-mütəhhəre-həzrəte-Məsumə",*
*20.06.1999*

## QITƏ

Salam olsun sənə, ey Qum şəhəri,
Salam olsun sənə, ey Məsumə.

Eləyiblər gülə qərq dörd yanını,
Gəlmişəm gülşənə, ey Məsumə.

Bu ziyarətdə şərafət vardır,
Bu şərəfdir mənə, ey Məsumə.

Çox ziyarət eləyərlər gözəli,
Gələrəm mən yenə, ey Məsumə.

*Qum, ziyarətdən sonra,*
*20.06.1999*

## QƏZƏL

Alaraq şövq ilə islamdən ilhamı Imam,
Təzədən canə gətirdi ulu islamı Imam.

Tazə əyyam zərurətdi qoca dünyadə,
Köhnə dünyayə gətirdi təzə əyyamı Imam.

Onu Məsumə edibdirmi qiyamə vadar?
"Eləyək Qum şəhərindən, - dedi, - iqdamı" Imam.

Müslimin qədrini qədr əhlinə düstur elədi,
Kafərin ziddinə göndərdi sərəncamı Imam.

Şer əhli Imamın ənamını gözlərdi,
"Badeye-eşq"i ilə eylədi ənamı Imam.

Götürüb əllərinə eşqü məhəbbət camını
Içdi, son qətrəyəcən içdi həmən camı Imam.

Niyyətim vardı ziyarət eləyim bir də onu,
Şahinin xiffətinə eylədi əncamı Imam.

*Behişti-Zəhra, Imam Xomeyninin məzarı önündə,*
*21.06.1999*

## TƏKBEYT

Bir quş kimi Iranə uçub danə gəzmişəm,
Eşqü vəfavü mehrü şəfa... da nə gəzmişəm?

*Tehran,*
*22.06.1999*

## UÇA BILMƏYIRƏM YANINA QUŞ TƏK

Hər adı Şahin kəs şahindir bəyəm?
Uça bilməyirəm yanına quş tək.
Qayıdıb adımı dəyişəcəyəm,
Uça bilməyirəm yanına quş tək.



Yerdən aralanıb göyə uçmuşam,
Tehrana uçmuşam, Reyə uçmuşam,
Səni tənha qoyub niyə uçmuşam?
Uça bilməyirəm yanına quş tək.

Sədd deyil yağış, qar, boran quşlara,
Göyün sinəsini yaran quşlara,
Paxıllığım tutur qaranquşlara,
Uça bilməyirəm yanına quş tək.

Göydən qoymayıblar bağdan uçmuşam,
Yoldan qoymayıblar dağdan uçmuşam,
Soldan qoymayıblar sağdan uçmuşam,
Uça bilməyirəm yanına quş tək.

Qərib-qərib uçur durnalar hələ,
Uçur şahin hələ, uçur sar hələ...
Axı qanadımda qüvvə var hələ,
Uça bilməyirəm yanına quş tək.

Niyyətim də açıq, yolum da açıq,
Sağım da açıqdır, solum da açıq,
Ayağım da açıq, qolum da açıq,
Uça bilməyirəm yanına quş tək.

Gərək bir də sənə fikrimi deyəm:
Hər adı Şahin kəs şahindir bəyəm?
Qayıdıb adımı dəyişəcəyəm,
Uça bilməyirəm yanına quş tək,
Uça bilməyirəm yanına quş tək.

*Tehran,*
*23,06.1999*

## QƏZƏL

Çöhrəndə ziya görmədəyəm al ilə birgə,
Qurban o zənəxdanə olum xal ilə birgə.

Gəh cəlb eləyir diqqəti zülfün, gəhi şalın,
Zülfün məni heyran elədi şah ilə birgə.

Hafiz falını təkcə pəsənd eyləyirəm mən,
Falçı, səni inkar edirəm fal ilə birgə.

Dindarlərin tük sanı çoxdursa günahı,
Bir gün yanacaq bığları saqqal ilə birgə.

Çəksəydi əgər qəm hər adam qəm tükənərdi,
Tay-tay çəkirəm qəm yükü hambal ilə birgə.

Şadəm ki, diyarımda igidlər yenə vardır,
Xəlqim, neçə Rüstəm görürəm Zal ilə birgə.

Şahin, sənə şah söyləməyim mən nə deyim bəs?
Fəth eyləmisən Qübbəni Qudyal ilə birgə.

*Təbriz,*
*24.06.1999*

## QƏZƏL

Kaşanəni həqq yıxdısa təmir ola bilməz,
Olmazsa kömək, şah cahangir ola bilməz.

Hər Seyyid olan kimsənə Seyyid Əzim olmaz,
Hər gülməli söz sahibi Sabir ola bilməz.

Söz meydanı söz yox ki, səvad əhli üçündür,
Adəmdə səvad olmasa şair ola bilməz.

Həmtay ola bilməz mənə ilhamı sönüklər,
Cəhd eyləsə də tülkü əgər şir ola bilməz.

Tərlanın önündə axı cüllüt quşu neylər?
İpdən, ikiqat olsa da, kəndir ola bilməz.

Zəncirlə gəlib zülf ilə, divanədi Şahin,
Zülfün kimi möhkəm mənə zəncir ola bilməz!

*Təbriz,*
*25.06.1999*

## QƏZƏL

"Kuh" gəl söyləmə, "dağ" düzgün olar,
"Dəb" demə bir də, "dodaq" düzgün olar.

Sağsa şair ölümündən sonra,
"Zində" gəl söyləmə, "sağ" düzgün olar.



Bilməyir türk, a canım, "guş" nədir,
Qulaq as, türkcə "qulaq" düzgün olar.

Əl-ayaq eyləmə yad sözlər üçün
"Dəst" - "əl", "pa"sa - "ayaq" düzgün olar.

Dilbərin zülfü daraqlanmalısa,
"Şanə" işlətmə, "darağ" düzgün olar.

Yad kəlam öldürəcək doğma sözü,
Xəlqi sözlə yaşamaq düzgün olar!

Olsa hər şairimiz, ey Şahin,
Yad deyimlərdən uzaq, düzgün olar!

*Ərdəbil,*
*26.06.1999*

## «TÜRKİYƏ DƏFTƏRİ» SİLSİLƏSİNDƏN

## QƏZƏL

Ey Ağrı dağı, ağrılı dağ var ürəyimdə,
Olmuş niyə dağ "Ağrı", maraq var ürəyimdə.

Ilhamımı söndürməyə cəhd eyləmə, qürbət,
Sən söndürə bilməzsən, ocaq var ürəyimdə.

Çırpınmada qəlbim neçə ziddiyyət içində,
Var çoxlu vüsal, həm də fəraq var ürəyimdə.

Düşmənlərimin məskəni oldu, qəzəbindən
Qapqarə qaralmış Qarabağ var ürəyimdə.

Mən aləmə hər gün edirəm şer təvəllüd,
Ey hamilə, minlərlə uşaq var ürəyimdə.

Qışqırma belə, sən mənim ardımca deyinmə,
Cahil, demə "kar oldu", qulaq var ürəyimdə.

Gerçək qələmi əldə, silahım demə yoxdur,
Vurram başına, bil ki, çomaq var ürəyimdə.

Şahin, papağın, söylə, neçin yoxdu başında?
Şair, deyəcəksən ki, papaq var - ürəyimdə.

*Ağrı dağının önündə,*
*5.10.1999*

## IĞDIRDA GECƏ

Bu gecə...
Həzrət Musanın əsasından da
uzun oldu gecə.
Bu gecə,
gecə öz boxçasına
yığıb ulduzlarını
getmirdi,
Bu gecə
ulduzlar
göy üzündən
itmirdi.
Bu gecə
səbrim bitmişdi,
hövsələm bitmişdi,
gecəsə
bitmirdi.
Gözümün acısını
şirin yuxu həsrətiylə
ala bilmədi
səhərə qədər.
Xoruz da banlamırdı ki,
açılsın səhər...

*Iğdır şəhəri,*
*6.10.1999*

## QƏZƏL

Canan eləmir lütf bu üzgün cana doğru,
Uçmaqda xəyalımsa mənim canana doğru.

Hicran əgər olmazsa vətən qədri bilinməz,
Tale məni qoy sövq eləsin hicrana doğru.

Hey doğru danışdımsa da, zənn eylədi əyri,
Məqsudimi zahid mənim, eykaş, qana doğru.



Xoşbəxtliyə bax məndəki, imkan ələ düşdü...
Meylim gözünü dikmiş idi imkana doğru.

Bir dəfə keçib getmiş idim Van qalasından,
Şadəm ki, yolum düşdü dübarə Vana doğru.

Pasinləri * gördüm yada göyçək Quba düşdü,
Fikrim qayıdıb döndü bu dəm Şirvana doğru.

Qaldı gədiyi Ərzrumun arxada, Şahin,
Indi gedirəm şövq ilə Ərzincana doğru.

*Pasinlər,*
*7.10.1999*

## QITƏ

Görüşüb Tehran ilə əzm elədim Ankaraya,
Yeni qürbət yeni hicran havası bəstələdi.

Təzə dostlar ilə şad oldu bu gün əhvalım,
Köhnə dostlar yeindən ruhimi sərməst elədi.

Ayrılıq təbimi artırdı yenə, sanki mənim
Qəddimi etdi uca, qamətimi şəst elədi.

Verdi saqi mənə mey, mənsə ona verdim su,
Onu mən huşə gətirdim, o məni məst elədi.

*Ərzincan,*
*8.10.1999*

## QƏZƏL

Türk övladı, gördüm ki, vəfadar Atatürkə!
Olmuşdu vəfadar ki, vəfa var Atatürkə.

Yadlar ulu bir məmləkəti məhv edəcəkdi,
Türkün vətəni eylədi iqrar Atatürkə.

Yardım diləyən bir diyara oldu yararlı,
Allah özü olmuşdu o dəm yar Atatürkə.

* Qədim Pasin, müasir Pasinlər şəhəri

Hər şəxsə olubdursa da meyar neçə sevgi,
Olmuşdu vətən sevgisi meyar Atatürkə.

Sərdarlərin ər kimi sərdarı olub ki,
Təzim eləmişdi neçə sərdar Atatürkə.

Cənnət kimi bir bağda "Anat qəbr"ini * gördüm...
Layiqdi təmamən belə rəftar Atatürkə.

Abad elədi Türkiyəni türk ata, Şahin,
Türk milləti çox borcludu memar Atatürkə.

*Ankara,*
*9.10.1999*

## QƏZƏL

Burda el yaxşıdı, gül yaxşı, çəmənzar yaxşı,
Deyirəm Türkiyədə gör nə qədər var yaxşı.

Dil müdam "Eşq" deyibdir yenə "Eşq" söyləyəcək,
Bu sözü dil həmişə etmədə təkrar yaxşı.

Anlasın, qardaş olub Türkiyə-Azərbaycan,
Düşməni etməliyik bir də xəbərdar yaxşı.

Bir olaq, əlbir olaq, dilbir olaq hər vədə,
Əbədi birliyimizdir bizə meyar yaxşı.

Pislərin pis günü etməz məni qəmgin, Şahin,
Daim olsun deyirəm yaxşı adamlar yaxşı.

*Ankara,*
*10.10.1999*

## QƏZƏL

Məskənim Türkiyə olsun mənim, Iran olsun,
Əbədi məskən isə Azəribaycan olsun.

Köksü tək asimanın qəlbi təmiz bir fərdəm,
Büsbütün yer kürəsi qoy mənə mehman olsun.

* "Anat kabır" - Ankarada Atatürkün movzoleyi



Bəşəriyyətdəki hər xilqətə eşqim vardır,
Mənə yox fərqi qarışqa, ya Süleyman olsun.

Hamını sevməyə vardır, inanın, imkanım,
Təki imkanı sübut etməyə imkan olsun.

Düşmənin qanlı əlindən çıxaraq meydanı,
Əldə gül dəstəsi tutmuş kəsə meydan olsun.

Yaxşılıq görmüşəm, ey gül, o qədər dünyadə,
Deyirəm pislik edən varsa ciyərqan olsun.

Yarımın çöhrəsi bir ləhzə yadımdan çıxmaz
Yerim əfqan diyarı, ya Ərəbistan olsun.

Olmasın təkcə bu Şahin, gözəlim, qurbanın,
Bütün aləmdəkilər qoy sənə qurban olsun!

*Ankara,*
*11.10.1999*

## QƏZƏL

Dünya öləcək bir belə qovğa yaşayırsa,
Çox hövsələ var Tanrıda dünya yaşayırsa.

Insanlara durna özünü hey qərib etdi,
Var ovçuda insaf hələ durna yaşayırsa.

Heç düşməyirəm başə, qocalmaq necə mümkün
Qəlb içrə məhəbbət kimi sevda yaşayırsa.

Yaş çoxluğu aşiqliyini öldürə bilməz,
Aşiqdə əgər eşqə təmənna yaşayırsa.

Misra - yaşayır onda ki, qüdrətlidi şair,
Şair - yaşayır onda ki, misra yaşayırsa.

Acdır gözü, amma ki, acından niyə ölmür,
Allahə dua etməli molla yaşayırsa.

Tənha yaşamaq Şahinə ölmək kimi bir şey,
Tanrı necə zövq almada tənha yaşayırsa?

*Ankara,*
*12.10.1999*

## ZƏIF ŞAIRLƏR... ZƏIF MƏLƏKLƏR...

Xəyalım səmanı gəzmədə yenə,
Səma dolu nur.
Zənnimcə,
misralar pıçıltı ilə
Şairlərə göydən diktə olunur.
Bizə ilham verir ilham pərisi,
Mən ilham mələyi ona deyərdim.
Imkanım olsaydı zəif mələyi
Zəif şairlərlə yan-yana qoyub
Söz gülləsi ilə güllələyərdim...
Çünki, zəif şair açıq-aşikar
Bilə bilməyir ki, bilməməyi var.
Zəif şairlərə ilham verməde
Zəif mələklər,
Zəif mələklərə imkan verməsin
Güclü mələklər,
Çünki, şeri zəif şaircığazlar
Kitab etdikləri şerlərini
Utanmaz-utanmaz ələ götürüb,
Şəst ilə hamıya göstərəcəklər.

*Ankara,*
*13.10.1999*

## VIDALAŞMA

Mən gələndə Ankaraya
Gülürdü göy...
Şəhriyarım düşdü yada:
Gün sinəmi dağlayırdı.
Mən gedəndə Ankaradan
Gülmürdü göy.
Bozdu səma...
Qəm yayırdı...
Bulud cırıb sinəsini
Hönkür-hönkür ağlayırdı.

*Ankara,*
*14.10.1999*



## «BIRINCI IRAQ DƏFTƏRI» SILSILƏSINDƏN

### QƏZƏL

*Qələmini qəzəldə sınayan şair Qəşəm Nəcəfzadəyə*

Sən ki şagirdim olursan işim imdad işidir,
Qəzəl inşa eləmək şerdə ustad işidir.

Qayanı, bəlkə də illərlə dağıtmaq mümkün,
Dağ dağıtmaq isə, əlbəttə ki, Fərhad işidir.

Bakının mehrini qırmaq ürəyimdən nə Dəməşq,
Nə Hələb məsələsidir, nə də Bağdad işidir.

Kiminin boynu kötükdə, kiminin kəndirdə,
Boynu kəsmək, ipi çəkmək işi cəllad işidir.

Mən qəzəl səmtinə addımlamağından şadəm,
Yaxşılıq eyləməmək doğma kəsə yad işidir.

Iz ki, atdım qəzəl içrə dili saflaşdırdı,
Sadiq olmaq dilinə mən kimi ustad işidir.

Çatdıraq xəlqi qəzəllər elə biz şairlər,
Bu nə Firon işi, Nəmrud işi, Şəddad işidir.

"Qarabağ getdi əlimdən" deyə dad etməməli,
Tökməyək göz yaşını, göz yaşı arvad işidir.

Ölkəmin bir neçə səmtində hanı abadlıq?
Bu - rəzil qonşuların gördüyü bərbad işidir.

Ey Qəşəm, gəl qınama Şahini fəryadə görə,
Şahinin çox işi vardır, busa - fəryad işidir.

*Iran-Iraq yolu,*
*21.11.1999*

## QƏZƏL

Həzzim yenə artıb, o pərizad göründü,
Allahə şükür, dərdimə imdad göründü.

Bildim, bilirəm aşiqi doğma mən əzəldən,
Əğyar isə hər dəm gözümə yad göründü.

Fərhad olub heykəl, uzanıb Bisütun üstdə *,
Qalxdım yanına, Fərhada Fərhad göründü.

Var öylə adam ki, eləyər can sənə qurban,
Var öylə adam ki, gözə cəllad göründü.

İllər boyu ey mənlə rəqabət aparan kəs,
Sən fəryad - eşitdin, mənə fəryad - göründü.

Yarım, yuxuda Məcnunu gördüm yenə naşad,
İbni-Salam isə gözümə şad göründü.

Şirin vəsl üçün iki aşiq döyüşürdü,
Şirin isə hər qüssədən azad göründü...

Mən Təbrizi, həm Kabulu, İstanbulu gördüm,
Şahin, gözümə indisə Bağdad göründü.

*Bağdad,*
*22.11.1999*

## HAQLA GÖRÜŞMƏYİM GƏLİR

Sevgi elə istidir ki,
Odunda bişməyim gəlir.
Dəclə axır təbim təki,
Suyuna düşməyim gəlir.

Kədər ilə adaxladı,
Qəhər ilə adaxladı,
Yer məni nə çox saxladı,
Yerdən sürüşməyim gəlir.

* Bisütunda Fərhadın daşdan yonulan heykəli var



Göydə, şəksiz, ey insanlar,
Diriyik biz, ey insanlar,
Xudahafiz, ey insanlar,
Haqla görüşməyim gəlir.

*Bağdad,*
*23.11.1999*

## QİTƏ

Fəxr edirəm, var elə söz zərgəri
Yardım olub, dadə çatıb şöhrəti.

Varmı şer şahı Nizamim kimi,
Doğmaya həm yadə çatıb şöhrəti.

Seyyidimin, Sabirimin, Hadimin
Məşhədə, Bağdadə çatıb şöhrəti.

Bisutunu eşq yarıb şübhəsiz,
Amma ki, Fərhadə çatıb şöhrəti *.

*Bağdad,*
*24.11.1999*

## QİTƏ

Bədxahilərin kəlmələrindən gileyim var,
Vurmuş yara hərdən mənə bədxah kəlamı.

Həm nəğməpərəstəm, həmi Quranpərəstəm,
Gəh musiqini dinləyirəm, gah kəlamı.

Gördüm giribən məscidə məst molla da məstdir,
Məst etmiş idi mollanı Allah kəlamı.

*Bağdad, "Kazimiyyə məscidi",*
*24.11.1999*

## QİTƏ

Ey ki, möminliyimə şəkk eləyən, zəvvarəm,
Elə zənn eyləyirəm mən ki, cavabım çoxalır.

Sayını səcdəmin artırmadayam gün-gündən,
Sanıram ki, bu tənasübdə savabım çoxalır.

* "Bisotun-ra eşq kənd-o şöhrətəş Fərhad bord"
("Bisütunu eşq yardı, amma şöhrət Fərhada çatdı")
Bir fars şairinin misrasıdır.

Bu fəna mülkdə seyrim, səfərim artdıqca
Dəftər olmaqda qədərsiz və kitabım çoxalır.

Təsbehin dənələri barmağımı yarə edir,
Qədəhimdə mey azaldıqca gülabım çoxalır.

Mən səfər yorğunu olsam da, ziyarətlə xoşam,
Boş xəyal eyləməsinlər ki, əzabım çoxalır.

Kərbəla şəhrinə gəldim və inandım qəti
Bu ziyarətdə mənim get-gedə tabım çoxalır.

*Kərbəla,*
*25.11.1999*

## QITƏ

Yar olubdur mənə, çox yardım edib,
Bir də yardım mənə Allah elədi.

Ey Füzuli, sənə etdim səcdə,
Bu ziyarət məni gümrah elədi.

Bəndə tək torpağına üz sürtdüm,
Elə sandım məni haqq şah elədi.

Mən gərək çoxdan olaydım burada,
Əməlim səhvimi islah elədi.

*Kərbəla,*
*25.11.1999*

***

*Kufə qalası... Kufə məscidi...,*
*25 noyabr 1999-cu il*

Göydələn bir qalanın seyrində
Qəlbimə qüssə çöküb qəm doldu.
Elə zənn etmədəyəm mən sanki
Kədərimlə bütün aləm doldu.

Çox əməl sahibi olmuş bu divar,
Qaralıbdır neçə gün nur burda.
Qalada "Həzrət Əli məscidi" var,
Əlinin qətli olubdur burda.



Kərbəladən yenicə döndüm mən,
Məscidin xeyri mənimçin vacib.
Daşına üz çəkilir rəğbətdən,
Qalanın seyri mənimçin vacib *.

Ibn-Mülcəm gözə görsəndi... Aman,
Əlini qaldıracaqdır Əliyə...
Axacaqdır yerə qıpqırmızı qan,
Qüvvəsiz cövr edəcək qüvvəliyə.

Qüvvəli amma yenə qüvvəlidir,
Islama şan, yaraşıq həzrətimiz.
Ibn-Mülcəmlərə qalib Əlidir,
Bəxş edib dinə işıq həzrətimiz.

Əlisiz hər işimiz ah işidir,
Köçdü xoşxah Əli bədxahə görə.
Hamının ölməsi Allah işidir,
Hamının gəlməsi Allahə görə.

Xiffəti hər gecə-gündüz çəkilir,
Əli aydınlıq olubdur, Əli - nur.
Kufədə bir qalaya üz çəkilir,
Kufənin məscidi təmir olunur...

*Kufə,*
*25.11.1999*

## MISRƏ GETMƏK ISTƏYIRƏM

Qəzəllərim yeni qəzəl,
Köhnə qəzəl aləminin yeni səsi.
Heyf, qədrim bilinmədi.
Mən öləndə
Dirilərin çiyni üstdə,
Düşünməyin mavzoleyə, qəsrə getmək istəyirəm,
Ora mənim yerim deyil,
Bura mənim yerim deyil,
Mən özümə piramida tikmək üçün
Iraqa yox,
Yəmənə yox,
Misrə getmək istəyirəm.

*Bağdad,*
*26.11.1999*

* Biz Kufədə olarkən qalada və məsciddə qızğın təmir işləri aparılırdı.

## QƏZƏL

*Vəfat edən bəzi şəxslərin mafəsini Bağdad, Kərbəla və Nəcəfdəki müqəddəslərin uyuduqları məzarların (İmam Museyi-Kazim, İmam Hüseyn və İmam Əli) dövrəsinə dolandırır, sonra dəfn etməyə aparırlar. Mən bu mərasimi Məşhəddə də ("İmam Rza" məsjidində) görmüşəm.*

Nə qədər qüssə-kədər var, neçə dağ tabutda,
Görünür gözlərə hüzn ilə fərağ tabutda.

Bu fəna aləmi tərk eyləməyin son gedişi...
Əbədi aləmə getməkdə sorağ tabutda.

Qocanın ölməyi mütləq, hamımız ölməliyik,
Bir də gördün ki, gedir qəbrə uşaq tabutda.

Əli iplərlə çəkilmiş, yanına bağlanmış,
Bir zaman yerdə idi, indi ayaq - tabutda.

Hər nifaq əhli öləndə elə zənn eyləyirəm
Salacaqdır yenə hiddətlə nifaq tabutda.

Kərbəla dərdi əsrlərlə bitən dərd deyil,
Kərbəla dərdini daim daşıyaq tabutda.

Zəngəzur oldu çiyində qara bir mafə yükü,
Bəxş olub düşmənə dilbər Qarabağ tabutda.

Torpağım azad olundu, əgər ölsəm həzzdən,
Yollayın qəbr evinə Şahini ağ tabutda.

*Bağdad, "Kazimiyyə məscidi"*
*27.11.1999*

## SƏKKIZLIK

Sən ey məscidə gedib
Tanrıdan mədəd uman.
Başını hey yelləyib
Yaşına ədəd uman.



"Çox ömür sürüm" deyə
Tökmə yaş gilə-gilə.
Uzun ömür istəmə,
Əbədi həyat dilə.

*Bağdad, "Şərif Rəzi" məscidi,*
*27.11.1999*

***

Şükür olsun ki, bu əsri başa mən vurmadayam,
Çatdırar istəsə Rəbbim gələcək əsrə məni.

Fikrimi gah lətif şerə yönəldib Tanrım,
Gah nasir sayağı sövq eləyib nəsrə məni.

Şah olub bir neçə şair qəzəlin qəsrində,
Bəlkə də çatdıracaqdır ulu həqq qəsrə məni.

Öylə yer var məni ömrüm boyu cəlb eyləməyib,
Matü heyran eləyib amma bu gün Bəsrə məni.

*Bəsrə,*
*28.11.1999*

## QƏZƏL

Yüzlərlə qayıq var ki, üzər Şəttülərəbdə,
Ümmid o qayıqlarda gəzər Şəttülərəbdə.

Gün batmada qıpqırmızı, əks olmada çayda,
Sanki sulara düşmədə zər Şəttülərəbdə.

Şəttülərəbin sahilinə Bəsrə bəzəkdir,
Baxdım, məni mat etdi şəhər Şəttülərəbdə.

Çox görümşəm, əlbəttə ki, torpaqda çəpər mən,
Çəkmiş suda bir körpü çəpər Şəttülərəbdə.

Birdən-birə mən Sindbadı yadıma saldım,
Yad ellərə etmişdi səfər Şəttülərəbdə.

Tutmaqda qayıqlarda balıq çoxlu balıqçı,
Üz verməsin, ey Tanrı, xətər Şəttülərəbdə.

Şahin, gözümün yaşları Şəttülərəb oldu,
Çünki yadıma düşdü Xəzər Şəttülərəbdə.

*Bəsrə, Şəttülərəb çayında gəmi ilə gəzinti,*
*28.11.1999*

## QITƏ

Bu nə çaymış suyu mavi, nə bağatmış göyçək?
Düşəcək Şəttülərəb, həm düşəcək bağ yadə.
Bir qatar durna olub Bəsrəyə yollanmışdıq,
Biz qatar ilə qayıtdıq yenidən Bağdadə.

*Bəsrə - Bağdad qatarı,*
*29.11.1999*

## QƏZƏL

Qaldı həsrət bu sevən can o sevən canə yenə,
Neçə gündür görə bilmir məni cananə yenə.

Təzə abad eləmişdim qayıdıb qürbətdən,
Olacaq qəlbim evi bəlkə də viranə yenə.

Hanı ülviyyəti şahanəliyin, qeyb etdim,
Hanı Ülviyyə balam, bəs hanı Şahanə yenə?

Bu yerin güllərinin ətri məni məst eləmir,
Oldu möhtac bu bülbül o gülüstanə yenə.

Kərbəla məndə mehr gördü, "qayıt gəl" deyəcək
Gül yenə, qönçə yenə, ordakı hər nanə yenə.

Buraxıb iş-gücümü hey dəli axtarmadayam,
Verəcəkdir mənə əqlin neçə divanə yenə.

Məcnunun qəbrini axtardım Iraqda, yox idi,
Şahinəm, uçmalıyam mən Ərəbistanə yenə.

*Bağdad,*
*29.11.1999*



## ATƏŞIM SÖNƏNDƏ KÜLÜM YANACAQ

Yenidən bürüyüb bağı alağlar,
Bağ - çəkib alağdan zülüm, yanacaq.
Bağdan nə istəyir axı alağlar?
Çiçəyim yanacaq, gülüm yanacaq.

"Şanə" yox, darasın "darağ" deyirəm,
"Təvəccöh" demirəm, "marağ" deyirəm,
Mən yad kəlmələrə alağ deyirəm,
Deməsəm, ağzımda dilim yanacaq.

Türk oğlu, "Özünə dön" deyəcəyəm,
"Xamuş ol" deməyib "Sön" deyəcəyəm,
Şahin, hələm-hələm sönməyəcəyəm,
Atəşim sönəndə külüm yanacaq.

*Qəsri-Şirin, Iraqdan qayıdarkən,*
*30.11.1999*

## İRANA SƏKKİZİNCİ SƏFƏRİM MÜNASİBƏTİLƏ ŞERLƏR

### QƏZƏL

Aram idi könlüm, niyə əfğanə yetişdi?
Hey vəsl eləyən arizu hicranə yetişdi.

Dünya evinin bəxtiqara bəndəsiyəm mən,
Meylim nə zaman oldu ki, imkanə yetişdi?

Məktub ilə ərz eyləmişəm eşqimi yarə,
Ərzim, ümidim yoxdu ki, sultanə yetişdi.

Comərdliyini dərk elədi son nəfəsində -
Şəmin oduna öylə ki, pərvanə yetişdi.

Olsan da şəhid eşqdə qəmlənmə, ey aşiq,
Qəmdirmi bəyəm eşq qəməsi canə yetişdi?

Çoxdandı yaranmır yeni əfsanəsi eşqin,
Bir gün görəcəklər yeni əfsanə yetişdi..

Ömrüm boyu, billəh, mənə yad oldu soyuqluq,
İsti nəfəsim, Şahina, İranə yetişdi.

*Tehran yolu,*
*1.05.2000*

**DÖRDLÜK**

Sənə vəsiyyətim belədir, ey yar,
Ruhum ayrılanda bədən içindən
De ki, kəfənimi bağlamasınlar,
Bəlkə çıxacağam kəfən içindən?

*Tehran,*
*2.05.2000*

**QƏZƏL**

Nuş elə mey ki, fərəhnak edə meyxanə səni,
Ürəyin getsə də, saqi gətirər canə səni.

Söyləyirlər daha divanəliyin bitmişdir,
Qoysa Allah görərik biz yenə divanə səni.

Meylin imkanə münasibdi, gətirmiş bəxtin,
Qoymasın bəxt tamarzı hələ imkanə səni.

Rəğbətin daimidir şəmə də, pərvanəyə də,
Həmi şəm cəzb eləyibdir, həmi pərvanə səni.

Söz gülüstanı alağdan olacaqdır xali,
Talein bağiban etmiş o gülüstanə səni.

Hindukuş dağlarpını gör neçə il gəzmişsən!..
Əfqanıstan eləyibdir belə mərdanə səni.

Yaş çoxaldıqca azalmır həvəsin İranə,
Qoca Şahin, nə çəkir hey qoca İranə səni?

*Tehran,*
*3.05.2000*

**QƏZƏL**

Çarə eləyən şer ilə loğmanə mənəm, mən,
Sidq ilə verən canını canənə mənəm, mən.



Biganəni gördükdə neçin busə edirlər?
Biganəyə, əlbəttə ki, biganə mənəm, mən.

Əqlim də varımdır, hələ divanəliyim də,
Həm aqil olan, həm də ki, divanə mənəm, mən.

Məstanəliyin həzzini məndən soruşun siz,
Zahid nə bilir həzzini, məstanə mənəm, mən.

Təhqirə dözən kimsələrin mənliyi olmaz,
Gördükdə həqir kəsləri, şahanə mənəm, mən.

İstanbulu, Bağdadı gəzən nöqtəbənöqtə,
Hərdən də gedən Təbrizə, Tehranə mənəm, mən.

On üç baharım ötdü Fəğanıstan * elində,
Xoş gün diləyən daima əfqanə mənəm, mən.

İrandə şahin quşunu görmədi Şahin,
Şahinlik edən indisə İranə mənəm, mən.

*Qum şəhəri,*
*4.05.2000*

**İSTƏMİRƏM**

Hicran yavıq, vüsal uzaq,
Çöhrə saysız, camal uzaq,
Haram yaxın, halal uzaq,
İstəmirəm.

Həsrət qoyub yara məni
Tale saldı hara məni?
Basacaqdır qara məni
İstəmirəm.

Həzzi, eyşi, nişatı çox,
Şəkəri bol, nabatı çox,
Bu yerlərin nabatı çox,
İstəmirəm.

Hələ ömrün qışı deyil,
Bu vətəndaş naşı deyil,
Yalan deyən kişi deyil,
Istəmirəm.

Vətən, çəkir ocaq məni,
O bağ məni, o dağ məni,
"Istə, - deyir fəraq, - məni",
Istəmirəm! Istəmirəm!

*Tehran,*
*5.05.2000*

## QƏZƏL

Qəlb evim qəmxanəyə dönmüş yenə,
Sevgilim biganəyə dönmüş yenə.

Yar tənhadır bu gün, qürbətdəyəm,
Xoş vüsal əfsanəyə dönmüş yenə.

Surətimdə göz yaşım muncuqlaşıb,
Dürrə yox, dürdanəyə dönmüş yenə.

Qovlamışdım, zar idi qaçqın kimi,
Hicrə bax, mərdanəyə dönmüş yenə.

Abad idi könlümün hər guşəsi,
Abadım viranəyə dönmüş yenə.

Şəmlikdən bezdi qızğın xislətim,
Şəmə bax, pərvanəyə dönmüş yenə.

Ey fələk, Şahin gəzir Leyla çölün,
Aşiqin divanəyə dönmüş yenə.

*Tehran, Behişti-Zəhra,*
*6.05.2000*

## QITƏ

Aləm haqqında deyirlər yeni fərziyyələri,
O biliklər ki dərindir, dayaz imiş, bildim.



Əl-ayağım yuyulubdur gözümün yaşı ilə,
Bu mərasim bu kəsə dəstəmaz imiş, bildim.

Iki illik meyi, ey saqi, sanırlar köhnə,
Meyi çox saxlayanın əqli az imiş, bildim.

*Tehran,*
*7.05.2000*

## QƏZƏL

Olmasan, olmayacaqdır mənə aləm göyçək,
Mənə heç kimsə deyil, sən kimi həmdəm göyçək.

Dilərəm qəm bütün aşiqlərə səndən başqa,
Şənliyim qoy sənin olsun, mənəsə qəm göyçək.

Məcnunun görkəmi sərsəm qələmə verdi onu,
Leyli sevsəydi, olar idi o sərsəm - göyçək.

Şirinin eşqi nəsib olsa idi Fərhadə,
Həmi asudə olardı, həmi xoş, həm göyçək.

Hər sevən qəlbdə hikkə zəif olsun, amma
Olsa gər eşqü məhəbbət ipi möhkəm, göyçək.

Gözümə dik gözünü naz ilə hərdən, gözəlim,
Sevdiyi olsa əgər aşiqə məhrəm, göyçək.

Gər düşəm cənnətə yarsız, deyərəm: Ya Rəbbim,
Cənnətindən məni rədd eylə, cəhənnəm göyçək!

*Tehran,*
*8.05.2000*

## QƏZƏL

Bağiban, getməliyəm, bağda bəhər qurtardı,
Söyləyin tutiyə lal ol ki, şəkər qurtardı.

Düşünürdüm ki, fərağın daşını atdıqda
Gözdə qəm, üzdə təlaş, canda kədər qurtardı.

Amma səhv eyləmişəm, dərd - əbədi sirdaşım,
Daha zənn eyləmirəm məndə qəhər qurtardı.

Fani dünya fərəhindən elə məhruməm ki,
Bu fəna alməə xoş məndə nəzər qurtardı.

Şair olsam da nədir faydası, təbim söndü,
Zərgər olsam da, nədir xeyri ki, zər qurtardı.

Gəlmək üçün gedirəm mən, yenə hökmən gələrəm,
Nə səyahət başa yetdi, nə Xəzər qurtardı.

Hafizin yurduna sidq ilə "xudahafiz" de,
Bu səfər, Şahina, İranə səfər qurtardı.

*Tehran,*
*9.05.2000*

## QƏZƏL

Bilməm görəcəkdirmi gözüm dilbəri bir də?
Dil söyləyəcəkdirmi ona "gəl bəri" bir də?

Tehranda ikən milli muğamım yada düşdü,
Yarəb, eşidərmi qulağım "Şüştər"i bir də?

Oldum neçə il sərsəri qürbətdə mən aciz,
El söyləyəcəkdir adıma sərsəri bir də.

Məcnunsayaq saç uzadıb... Yurda dönüncə
Yox məndə meyl dəvət edim bərbəri bir də.

İlham görünmür yenə hicran gələndən,
Ey təb, açarammı görəsən dəftəri bir də?

Zər söz düzübən şerimə zərgərlik edərdim,
Heyran edərəmmi təzədən zərgəri bir də?

Şahinlərimiz çox yetişər, Azəribaycan
Bilməm, yetirər Mirzə Əli Əkbəri bir də?

*Tehran-Astara yolu,*
*10.05.2000*



# «İKİNCİ İRAQ DƏFTƏRİ» SİLSİLƏSİNDƏN

## QITƏ

Sanıram ki, məni xoş gündə yaratmış Tanrı,
Həvəsim daima xoş nəzmə gəlir, nəsrə gəlir.

Niyə yoxdur görəsən indi məliküş-şüəra?
Deyəcəklərmi bu şair şah olub qəsrə gəlir.

Allahım verdi izn, yollanıram mən İraqa,
Gözümə sevməli Bağdad görünür, Bəsrə gəlir.

Bu səfər yar ilə yox, qürbətə tənha gedirəm,
Surətin məxrəci yoxdursa kəsr kəsrə gəlir.

*12.11.2000*

## QƏZƏL

Vətənin sevgisi nitqimdə şüarımda qalır,
Dönərəm yurduma, əzmim də, qərarım da qalır.

Yaşım artdıqca azalmır canım içrə sevgi,
Eşq hüceyrəmdə, məhəbbətsə damarımda qalır.

Zəhmətin ziynəti - əllərdə qabardır məncə,
Ziynəti zəhmətimin indi qabarımda qalır.

Bağıbanəm, sevişənlər doluşurlar bağıma,
Gözü əğyarlərin amma hasarımda qalır.

Gedirəm görmək üçün mən yenə Bağdad elini,
Gedirəm, sevgili yarımsa diyarımda qalır.

Şahinəm, bəxt qıfıllansa da hərdən, nə qəmim?
Qıfılım var isə, şadəm ki, açarım da qalır.

*12.11.2000*

## QƏZƏL

Göz yenə görməyəcəkdir, bürüyüb yaş onu,
Çünki pis halə salıbdır o qələmqaş onu.

Qoy təbəssüm görünə səndə, gülüm, hər vədə,
Püstə gülməzsə əgər parçalayar daş onu.

Sirr qoy daima daş timsalı möhkəm qalsın,
Saxlaya bilməyəcək sinədə sirdaş onu.

Molla var getmədə meyxanəyə həm, məscidə həm,
Eləyibdir iki yol göz görə çaşbaş onu.

Təzə "Divan"ını çap eyləmək istər şair,
Qıyma, ey Tanrı, xəcil eyləməsin yaş onu.

Məqsədi bir neçə "Divan" təmam etməkdir,
Qoy sevinsin yada saldıqda vətəndaş onu.

Şahin istər Əlini bir də ziyarət eləsin,
Niyyətə çatdıracaq Allahı birbaş onu.

*12.11.2000*

## QƏZƏL

Gözəlim, gör ki canı mən nə yaman istəyirəm,
Sənə qurban eləyib can yenə can istəyirəm.

Öz günahımdı ki, ey yar, gözündən düşdüm,
Təzədən mən gözünün içrə məkan istəyirəm.

Mənə canandır ömürlük qoca Iran yurdu,
Ərdəbil istəyirəm, mən Həmədan istəyirəm.

Çeçenin yanğısı vardır, mənə həm yanğı verin,
Edir əfqan fəğan, mən də fəğan istəyirəm.

Sadəlövhəm nə qədər, amma, müsəlmanə yanıb,
Mən Iraq əhlinə kafərdən aman istəyirəm.

Yanmaq üçün bəşərin dərdinə, Şahin, özümü
Dədə Qorqud kimi, əlbət, qocaman istəyirəm.

*Iran, Astara*
*13.11.2000*



## QƏZƏL

*Hacı Rafiqə*

Dərvişəm, dərvişə az həm nəzərin ləzzəti var,
Həmsəfər, yaxşı adamda səfərin ləzzəti var.

Dedilər var səfərin bir daha Bağdad elinə,
Gər xəbər xoş xəbər isə xəbərin ləzzəti var.

Çox şəkər təmini daddım, mənə ver gül şəkəri,
Tutiyəm, tutiyə, ey gül, şəkərin ləzzəti var.

Söyləyirlər ki, üzür can, kədərin ləzzəti yox,
Olsa dildardən ötrü kədərin ləzzəti var.

Suyu şirinsə də qürbət çayının ləzzəti yox,
Suyu şordursa da amma Xəzərin ləzzəti var.

Əməyim "Divan"a dönmüş neçə ildən sonra,
Ələ zəhmətlə gəlirsə, bəhərin ləzzəti var.

Nə zaman ləğv olacaqdır görəsən sərhədlər?
Bağiban öylə sanır ki, çəpərin ləzzəti var.

Şahinəm, ər kimi hərdən xətər istər könlüm,
Zərəri olmasa hərgiz zərərin ləzzəti var.

*Iran, Rəşt yolu*
*13.11.2000*

## QƏZƏL

Şirin dayanıb şad ilə naşad arasında,
Yəni ki, o Xosrovla o Fərhad arasında.

Gündən-günə yadlaşmadadır doğma adamlar,
Qəlbim dözəcəkmi bu qədər yad arasında?

Könlüm quşu bir ləhzə də rahətlənə bilmir,
Vurnuxmada əfğan ilə fəryad arasında.

Zəhmət gedəcək əvvəl-axır badi-fənayə,
Eşq olmasa şagird ilə ustad arasında.

Aşiq ilə arifdə təfavüt niyə çoxdur?
Fərq var niyə qatil ilə cəllad arasında?

İlham pərisi yadə düşür həm də nigarım,
Fikrim o pəri ilə pərizad arasında.

Şahin uçub İranə qonubdur yenə, indi
Uçmaqdadı Təbriz ilə Bağdad arasında.

*İran, Qəzvin*
*13.11.2000*

## BISÜTUNDA

Yuxunun xeyri böyükdürsə də çox babətdən,
Yuxu bəzən yatanı məhrum edir ləzzətdən.
Bisütun öndə idi, çatmağa az qalmışdı,
Hacı Rafiq yuxuya dalmışdı...
Elə ki, biz dağa çatdıq, dedim açsın gözünü,
Baxaraq seyr eləsin dağdakı Fərhad izini,
Əmin olsun ki, şərəfdir dağa Fərhadın adı...
Gözünü açdı və dərhal qapadı.
Bu əməllə gözə röya, ürəyə qəm verdi,
Bisütun boyda olan həzzi həmin dəm verdi.

*İran, Bisütun,*
*13.11.2000*

## QƏZƏL

Daim səfərə məndə maraq oldu, nə yaxşı!
Düşdüm yola, yollarda çıraq oldu, nə yaxşı!

Gəzdirməmişəm əldə qılınc, beldə tapança,
Söz xəncəri tək məndə yaraq oldu, nə yaxşı!

Var öylə adamlar adama dağ çəkirlər,
Həmrahlərim arxada dağ oldu, nə yaxşı!

Ömrüm boyu məzlumlərin dərdini çəkdim,
Selləndi gözüm yaşı bulaq oldu, nə yaxşı!

Yanmışları söndürməyə çox cəhd elədim mən,
Donmuşlara köksümdə ocaq oldu, nə yaxşı!



Şadəm, ayağım oldu təpik nakəsə bəzən,
Namərd adama əl şapalaq oldu, nə yaxşı!

Şahin, elə yar var ki, nəzərdən irağ olsun,
Qismət mənə, şadəm ki, İraq oldu, nə yaxşı!

*İraq, əl-Mənzəriyyə,*
*14.11.2000*

## QƏZƏL

Bir daha cananəyə üz tutmuşam,
Mən o səmimanəyə üz tutmuşam.

Ətri tükənmir deyə yar zülfü tək
Mən gedibən nanəyə üz tutmuşam.

Amma gülün ətrinə biganəyəm,
Gül dedi: - Biganəyə üz tutmuşam.

Cəlb eləmir saqi məni azca da,
Amma ki, meyxanəyə üz tutmuşam.

Şəmə dedim: - Gəl bizi qərq et nura,
Söylədi: - Pərvanəyə üz tutmuşam.

Tapmalıyam qəbrini Bağdaddə *,
Bir daha divanəyə üz tutmuşam.

Bəlkə tapam Nofəli də, Zeydi də,
Bir neçə mərdanəyə üz tutmuşam.

İldə yolum düşməsə də məscidə,
Gündə kitabxanəyə üz tutmuşam.

Dənləyirəm yaxşı sözü, Şahina,
Quş sayağı danəyə üz tutmuşam.

*Bağdad,*
*15.11.2000*

* Deyilənə görə, Məcnun guya Bağdad yaxınlığında dəfn olunmuşdur.

## FƏLƏSTINDƏ DAŞ QALMADI...

Əlli ildir
Fələstinlə Israilin arasında
Savaş gedir,
Dalaş gedir...
Şeytanlardan Fələstinə
Güllə gəlir,
Fələstindənsə daş gedir...
Fələstində daş qalmadı.

Ulu Tanrı,
Elə et ki,
Fələstində daş çoxalsın.
Elə et ki,
Güllə olsun onun daşı,
Elə et ki,
Mərmi olsun onun daşı,
Elə et ki,
Raket olsun onun daşı,
Əllərindən daşı atıb,
Gözlərindən yaşı atıb
Azad olsun,
Torpağını geri alsın
Qoy Fələstin vətəndaşı,
Fələstində daş qalmadı.

Fəlsətində daş qalmadı,
Amma orda
Məhəmməd Camal Dürrə * var,
Məhəmməd tək,
Camal kimi
Dürrələr var,
Məhəmməd Camal Dürrələr
Evlərində olub-qalan
Gövhərləri,
Dürrləri
Bir-bir daşa döndərib

* Qətlə yetirilmiş gənc bir fələstinli



Şeytanlara daş atar...
Fələstində daş qalmadı.

Fələstində daş qalmadı,
Eybi yoxdur,
Dənə-dənə toplasalar
Qum daş olar,
Gil daş olar,
Ot daş olar,
Allah qoysa
Şeytanları məğlub edən Fələstində
Adamların ürəyində
Nə həyəcan,
Nə də qorxu, təlaş olar,
Fələstində daş qalmadı.

Fələstində daş qalmadı...
Mən
Dünən
Isti bir gündə,
2000-ci ilin
noyabr ayının 14-də,
Bağdada gələndə,
Yol boyunca,
Sağ boyunca,
Sol boyunca
Çoxlu igid iraqlı gördüm,
Hər birini
hicranlı gördüm, fəraqlı gördüm,
Təlim keçirdilər
mətin-mətin,
Şeytanlarla savaş üçün
And içirdilər
mətin-mətin.
Iraqlılar,
Iraqlılar,
Tufan olun, yel qoparın,
Savaş üçün,
Dalaş üçün
Fələstinə daş aparın...
Fələstində daş qalmadı...

*Bağdad,*
*15.11.2000*

## QITƏ

Ey Füzuli, səni mən bir də ziyarət elədim,
Və ziyarətdə halım bir də pərişan oldu.

Niyə həsrətdə qalıb şairə Odlar Yurdu?
Ürəyim yandı hicrdə, ciyərim qan oldu.

Kənar idi Hüseyn Cavidimiz həm bizdən,
Indisə qəbri onun torpağıma şan oldu.

Ey Füzuli, nə olar bir gün əgər söyləyələr:
Mənzili şairimin Azəribaycan oldu.

*Kərbəla,*
*16.11.2000*

## QITƏ

Sindbad nuş eləyib dadlı suyundan bu çayın,
Amma çay var ki, suyu sanki zəhər timsalı.

Özünə cəlb elədi Şəttülərəb bir də məni,
Qeyri bir ölkədə vardırmı məgər timsalı?

Xəzəri Şəttülərəb zənn eləyirdim Bakıda,
Indisə Şəttülərəb oldu Xəzər timsalı.

*Bəsrə,*
*18.11.2000*

## QƏZƏL

Qoca dərviş kimiyəm, eyləyib israr hələ
Neçə yol gəzməliyəm, çox səfərim var hələ.

Qolda güc, canda təpər, gözdə işıq var, məni
Etməsin, ey ulu Tanrı, qocalıq xar hələ.

Burda mən qalmalıyam tək dözübən hicranə,
Evdəsə tək qalacaq sevgili dildar hələ.

Adımın təsdiqinə eşqdə oldum nail,
Əminəm etməyəcəklər məni inkar hələ. . .



Məcnunun gəzdiyi yerlər məni cəzb eyləmədə,
Qovacaqdır məni səhralərə rüzgar hələ.

Mən vəfa rəmzi olan Zeydi də yad eyləyirəm,
Nofəlin mehri də qəlbimdədi, ey yar, hələ.

Gələrəm mən yenə, Şahin, Iraqa, inşallah,
Məcnunun qəbrini tapmağə ümid var hələ.

*Bağdad,*
*19.11.2000*

## QƏZƏL

"Səfheyi-bəxtim açarsam Leylidən sevda çıxar,
Hasili-ömrüm cahanda ahü vaveyla çıxar" *.

Qafil olma, gün gələr hökmən müsəlman birləşər,
Çək gözün, kafər, bu yurddan, qan düşər, qovğa çıxar.

Şer dünyasında mən dünya yaratmaq istərəm,
Köhnə dünyadən, gələr vəqt, tazə bir dünya çıxar.

Sanki çıxmış gül bağından Bağdadın hər dilbəri,
Söz bağımdan dəmbədəm tərif üçün misra çıxar.

Aşiq olmaq istəməzdim, amma mümkündürmü bu?
Kim bu yaşda aşiq olsa başqa cür mənə çıxar.

Təkcə mən Bağdadə yox, çox mülkə çatmaq istərəm,
Allah-Allah, ağ başımdan gündə bir xülya çıxar.

Xurma burda, Şahina, şirin imiş Bağdad kimi,
Tuti oldum, qarşıma şəkkər gətir, xurma çıxar.

Bağdad,
20.11.2000

## QƏZƏL

Şairin mənzili dəftərlə dolu,
Dəftərin hər vərəqi zərlə dolu.

Neçə gün qürbəti gördüm yenə mən,
Qürbətin ağuşi xəncərlə dolu.

* Beyt Iraqın türkman şairi Osman Məzlumundur.

Dağyaran kəs necə yarmış o dağı?
Bisütun tunc ilə, mərmərlə dolu.

Arxayın gördü gözüm Iranı...
Və Iraq ölkəsi əsgərlə dolu.

Izi görsənmədə cəngin burada,
Bəsrənin çölləri səngərlə dolu.

Iraq içrə Qarabağ düşdü yada,
O müsəlman eli kafərlə dolu.

O qədər göz yaşı düşmüş qucağa,
Qucağım dürr ilə, gövhərlə dolu.

Şahinəm, yazmalıyam gördüyümü,
Şairin mənzili dəftərlə dolu.

*Bağdad-Astara,*
*21.11.2000*

## QOŞMALAR

### SƏN MƏNI DIVANƏ EYLƏYƏCƏKSƏN

Düşünürdüm məni şama bənzədib,
Özünü pərvanə eyləyəcəksən.
Sanırdım sevgini cama bənzədib,
Halını məstanə eyləyəcəksən.

Qiyammı, üsyanmı qəlbinə girib,
Iblismi, şeytanmı qəlbinə girib?
Şahanə taxtımdan məni endirib
Gör kimi şahanə eyləyəcəksən.

Kül güman edirsən köz görə-görə,
Sərrast görə-görə, düz görə-görə,
Görürəm ki, qəsdən, göz görə-görə
Gerçəyi əfsanə eyləyəcəksən.

Belə görürəm ki, vüsalı atıb,
Ağlı tərk eləyib, kamalı atıb,



Harama tuş olub, halalı atıb,
Aşiqi biganə eyləyəcəksən.

Şahin niyə yetdi dadına, neçin?
Neçin düşməyirəm yadına, neçin?
"Divan" bağlamışam adına, neçin?
Sən məni divanə eyləyəcəksən.

*21.12.1995*

### BAĞLANDI VÜSALIN DÜYMƏSI YENƏ

Bağlandı vüsalın düyməsi yenə,
Açıldı hicranın donu təzədən.
Nə deyim fələyin bu istəyinə,
Itirdim, itirdim onu təzədən.

Olmasın cahanın oldu-itdisi,
Çox oldu hicranın gəldi-getdisi -
Bir, iki, üç, dörd, beş, altı, yeddisi,
Səkkizi, doqquzu, onu təzədən.

Saçını təzədən hörəcəyəmmi?
Əlimi əlinə verəcəyəmmi?
Görəsən bir daha görəcəyəmmi
Əridi vüsalın donu təzədən?

Qəhrinə yamanın əvvəlki kimi
Şahin, var gümanın əvvəlki kimi,
Yaxşı ki, hicranın əvvəlki kimi
Göründü gözümə sonu təzədən.

*24.04.1996*

### SƏN DƏ MƏSUM PƏRI DEYILSƏN AXI

Məni günahkar tək təqdim edirsən,
Sən də məsum pəri deyilsən axı.
Tutalım hüsnünün Məcnunuyam mən,
Leylinin bənzəri deyilsən axı.

Yaranmışdı elə təsəvvür məndə,
Bəxtimi görürdüm səni görəndə.
Deyiləm aşiqlər aşiqi, sən də
Dilbərlər dilbəri deyilsən axı.

Səfamı süpürüb cəfa nəsimi,
İnan, avandımı etdi tərs kimi...
Səni unuduram köhnə dərs kimi,
Dilimin əzbəri deyilsən axı.

Dünən ocaq idin, bu gün şaxtasan,
Bu gün iqbalımı bağlamaqdasan,
Qəlbi dönə-dönə dağlamaqdasan,
Qəlbimin təpəri deyilsən axı.

Daha yolum mənim düzdür, hamardır,
Daha haqq sevgisi qəlbimə yardır,
Şahinin sərvəri Pərvərdigardır,
Şahinin sərvəri deyilsən axı.

*12.05.1996*

## MƏHƏBBƏT ZIYANSA ZIYAN GƏZIRƏM

Yer boyda yaraşıq həsrətindəyəm,
Dayansın insanın intizarında.
Günəş boyda işıq həsrətindəyəm,
Deyiləm dumanın intizarında.

Vüsal intizarı üzsə də məni,
Hicran addım-addım gəzsə də məni,
Zaman əzizləsə, əzsə də məni,
Gözlərim zamanın intizarında.

Yamanmı yaxşını yaman gəzirəm?
Yaxşını yamanda nöqsan gəzirəm?
Məhəbbət ziyansa, ziyan gəzirəm,
Mən belə ziyanın intizarında.

Əsli qaçıb gedib, Kərəm tutmayır,
Yansa da min kərə, nə qəm, tutmayır...
Daha barmaqlarım qələm tutmayır,
Qılıncın, qalxanın intizarında.

Gerçəyəm, oluram ram xəyallara,
Qəlbimi vermişəm tam, xəyallara.



Dalıram ümidsiz, xam xəyallara,
Qalmıram gümanın intizarında.

Bu günah, sözümü deməmişəm mən,
Çəkib ah, sözümü deməmişəm mən,
Hələ şah sözümü deməmişəm mən,
Damlayam ümmanın intizarında.

Evimə el gəlsə qoy gələ, şənəm,
Cahanı qoynuna səsləyən mənəm,
Şahin, təzədən bax, bir qarış sinəm
Bu boyda cahanın intizarında.

*7.08.1996*

## DÜNYANI ÖZÜMDƏ DAŞIYIRAM MƏN

Sözüm buzdan uzaq, odla yanaşı,
Çox odu sözümdə daşıyıram mən.
Üzümü yandırır gözümün yaşı,
Atəşi gözümdə daşıyıram mən.

Adamlar söz qoşur, dastan deyirlər,
Doğru söyləyirlər, böhtan deyirlər,
Təsəvvüf deyirlər, irfan deyirlər,
Çox yolu izimdə daşıyıram mən.

Çoxmu söz deyən var sözümün üstdə?
Hələ kül yığışmır közümün üstdə.
Çörəyim olmayıb dizimin üstdə,
Düzlüyü dizimdə daşıyıram mən.

Canda bəsləyirəm söz aləmini,
Bir sözün bəlkə də yüz aləmini.
Elin kədərini, elin qəmini
Təpərdə, dözümdə daşıyıram mən.

Sözümün siqləti mənadan böyük,
Eşqimin mənası sevdadan böyük,
Şahin, böyüklüyüm dünyadan böyük,
Dünyanı özümdə daşıyıram mən.

*9.08.1996*

## YARAŞMAZ MƏNƏ

Məhəbbət gülündən gülab çəkmişəm,
Gülabsız məhəbbət yaraşmaz mənə.
Gülab çəkənəcən əzab çəkmişəm,
Əzabsız məhəbbət yaraşmaz mənə.

Hərçənd eşq yolunda çox iztirab var,
Könlümdə inam var, qəlbimdə tab var,
Məhəbbət sorğuma müsbət cavab var,
Cavabsız məhəbbət yaraşmaz mənə.

Yeni Qeys, car edin hər yanə, mənəm,
Divanə özüməm, divanə mənəm.
Sevgi şərabıyla məstanə mənəm,
Şərabsız məhəbbət yaraşmaz mənə.

Sevincə yetmişəm mən ah itirib,
Yasa qərq olmuşam pənah itirib,
Savab qazanmışam günah itirib,
Savabsız məhəbbət yaraşmaz mənə.

Yoxa qane olub neçə var atdım,
Kimsə deməz amma sevib yar, atdım,
Yarın eşqi ilə "Divan" yaratdım,
Kitabsız məhəbbət yaraşmaz mənə.

*10.10.1996*

## ŞAHIN, ŞAHIN KIMI UÇASAN GƏRƏK

Qəm qonaq olubdur əzəldən mənə,
Dözməyə hər qəmə mətin can gərək.
Kim olar çəkməkdə kədər tən mənə?
Qəlbi sevincə də açasan gərək.

Sevgi yollarımı hamar eləyib,
Məni Sənan kimi xumar eləyib...
Cəfanı ürəkdən kənar eləyib
Vəfanı dərdəlli qucasan gərək.



Hamıya qüvvə, güc diləyirəm mən,
Tutub dəmir kimi daş əyirəm mən.
Həyalı önündə baş əyirəm mən,
Amma həyasızdan qaçasan gərək.

Uçuş atəşi var elə canında
Kəkliklər, turaclar nədir yanında?
Müasir qəzəlin asimanında
Şahin, şahin kimi uçasan gərək.

*6.11.1996*

## DEDIN "ÜŞÜYÜRƏM..."

Dedin "üşüyürəm...", üşüyəcəksən,
Axı qollarından qolum uzaqdır.
O evdən bu evə mənə deyirsən
Yanına gəlmirəm, yolum uzaqdır.

Vüsal nisgilini bilirmisən sən?
Bəmini, zilini bilirmisən sən?
Məhəbbət dəmini bilirmisən sən?
Neyləyim, dilindən dilim uzaqdır.

Hicrana nə təhər dözüm aralı?
Məndən, zənn etmə ki, dözüm - aralı.
Xumar gözlərindən gözüm aralı,
Əl tuta bilmirəm, əlim uzaqdır.

Gəl əhdin, peymanın bilək qədrini,
Vaxt varkən imkanın bilək qədrini,
Gözəlim, hər anın bilək qədrini,
Əsla düşünmə ki, ölüm uzaqdır.

Suya həsrət qalan sahil kimiyəm,
Hərdən Şahin kimi, Fazil kimiyəm,
Hərdən də tamarzı bülbül kimiyəm,
Çiçəyim uzaqdır, gülüm uzaqdır.

*30.11.1996*

## YENƏ ARALIQDA ÇƏPƏR GÖRÜNÜR

Neçin sınıxmısan, nə olub sənə,
Yenə gözlərində kədər görünür.
Təəccüb qalmışam inan səsinə,
Gülüb danışırsan, qəhər görünür.

Çox şirin danışma, sözünü gizlə,
Eynək tax, bəd gözdən gözünü gizlə,
Nəzərə gələrsən, üzünü gizlə,
Hüsnünə yer-yerdən nəzər görünür.

Kədər, qəm - şığıyan dəstəyə bənzər,
Canım həsrətindən xəstəyə bənzər...
Ağzını yumursan - püstəyə bənzər,
Ağzını açırsan - şəkər görünür.

Daim döyüşdəyəm yamana qarşı,
Nur yaymaq istərəm dumana qarşı,
Qəzəbim çoxsa da hicrana qarşı,
Yenə də qəlbimdə təpər görünür.

Söndürə bilərmi sevincin məni,
Ürəkdə qəzəbi, könüldə kini...
Falçıya danışdım könüldəkini,
Dedi bu sevdada zərər görünür.

Yaşayır ülvi eşq ürəyimizdə,
Adəmlə Həvvanın ürəyi bizdə...
Varsa da qovuşmaq diləyi bizdə
Yenə aralıqda çəpər görünür.

Yuxuda görmüşəm o yar yanımda,
Halımı eləyən xumar yanımda,
Koroğlu olmuşam, Nigar yanımda,
Şahin, altımdasa kəhər görünür.

*7.01.1997*



## BELƏCƏ POZULDU SEVDA, EY AFƏT...

Tale səni mənə calaq edəndə,
Sandım ki, nə böyük ədalət oldu.
Sənin məhəbbətin yaşadı məndə,
Səndəsə pak eşqim əmanət oldu.

Sandım ki, bəzəksən bütün cahana,
Cahan bir yanadır, sənsə bir yana.
Həqiqət sandığım döndü yalana,
Yalan sandığımsa həqiqət oldu.

Sənin eşq mülkünü gərək tərk edəm,
İndi qabağında səddəm, sərhədəm,
Sevgi mənim üçün ciddi bir qədəm,
Sevgi sənin üçün zərafət oldu.

Mənim varlığımdı sənin varlığın,
Bəxtiyarlığımdı bəxtiyarlığın...
Sənə az göründü zülmkarlığın,
Mənə çəkdiklərim kifayət oldu.

Beləcə pozuldu sevda, ey afət,
Şahini duymadın əsla, ey afət,
Onun itirdiyi əzab-əziyyət,
Sənin itirdiyin məhəbbət oldu.

*19.01.1997*

## MƏN ELƏ BILDIM KI, DÜNYA DAĞILDI

Qoruya bilmədi mənanı neçin,
Sözlər beyt olmadı, məna dağıldı.
Saxlaya bilmədi röyanı neçin,
Uçdu, gözlərimdən röya dağıldı.

Qəm zili yox etmir, bəmi dağıtmır,
Fərəh gözlərimdən nəmi dağıtmır,
Qəlbimin sahili qəmi dağıtmır,
Aşıb sahilini dərya dağıldı.

Ötdü, daha o xoş çağda işim yox,
Çəməndə işim yox, bağda işim yox,
Fərhadın yardığı dağda işim yox,
Məcnunun gəzdiyi səhra dağıldı.

Gözümdən yaş axır... qara yaşa bax,
Daha demirəm ki, "qaraqaşa bax"...
Qabağıma çıxan qara daşa bax,
Həmin daşa dəydi sevda, dağıldı.

"Bir də görüşmərik" sənə dedim mən...
Haraya üz tutum, hara gedim mən?
Istədim vəsfini yenə edim mən,
Düzələ bilmədi, misra dağıldı.

Köksüm ocaq idi, ocağı dan da,
Şahinin Şahdağdı, o dağı dan da,
Sevgi kaşanəmi sən dağıdanda
Mən elə bildim ki, dünya dağıldı.

*3.04.1997*

## ƏL ÇƏKƏN SIĞALI DARAĞ BACARMAZ

Yenə də soyutdun özündən məni,
Daha isitməyə qucaq bacarmaz.
Yaman yaraladı dilin sevəni,
Dil vuran yaranı bıçaq bacarmaz.

Bulud köynəyindən yağış çiləyir...
Bülbül qızılgülə giley eləyir...
Dodağın "gəl" deyir, gözün "get" deyir,
Gözün dediyini dodaq bacarmaz.

Hərdən cəng edirsən necə qəşəng də!..
Sanki gözəlləşir səninlə cəng də...
Üzündən nur yağır çəhrayı rəngdə,
Belə nur yaymağı çıraq bacarmaz.

Istərəm sözümü yenə ballayım,
Saçını yenə də gəl sığallayım,



Səən uzalıdır əl, sığallayım,
Əl çəkən sığalı daraq bacarmaz.

Ömrümün yönümü zavala doğru...
Ürək daha çəkmir xəyala doğru...
Təzədən qaçıram vüsala doğru,
Vüsalla, ey Şahin, fəraq bacarmaz.

*15.12.1997*

## SIRRI SOYUNDURMA CANAN SAYAĞI

Cahan möhtəşəm bir karvansaradır,
Dövrana gəlmişik mehman sayağı.
Əzizim, bilirik yönü haradır,
Gəl pərişan olma dövran sayağı.

Təzədən dalmısan qəm aləminə...
Açsan ürəyini bu həmdəminə
Sənin kədərinə, sənin qəminə
Əlac eləyərəm loğman sayağı.

Həsəddən olacaq lalə zar kimi,
Libasın qırmızı laləzar kimi,
Ağartma saçımı dağda qar kimi,
Qaraltma günümü hicran sayağı.

Məcnuna üstün nə qəhərdən şirin?
Leylinin nəyi var kədərdən şirin?
Həqiqət şirindir, şəkərdən şirin,
Bəzən də acıdır dərman sayağı.

Sevgi cilvəsini gözündə saxla,
Odunu qəlbinin közündə saxla,
Ey Şahin, sirrini özündə saxla,
Onu soyundurma canan sayağı.

*6.02.1998*

## BIRLƏŞIB IKIMIZ BIR BƏDƏN OLAQ

Ötsün üstümüzdən kədər dumanı,
Sevincin nuruna bürünən olaq.
Nisgilsiz keçirək yenə hər anı,
Yenə şad görünək, yenə şən olaq.

Şöləsi var olsun istəyimizin,
Yolu hamar olsun istəyimizin,
Ayaq əldən düşsə, lap dizin-dizin
Bir istək dalınca sürünən olaq.

Qərq olaq, vüsala elə bataq ki,
Gülüm, əhdimizə elə çataq ki,
Təkliyin daşını elə ataq ki,
Qoşa göyərçin tək görünən olaq.

Günü Məcnun elə yaraşığınla,
Ayı məftun elə yaraşığınla,
Mən hərarətimlə, sən işığınla
Günəşə tən olaq, aya tən olaq.

Görüb xoş arzuda, diləkdə bizi,
Ayıra bilməsin fələk də bizi,
Gəl ki, elə qucaq bir-birimizi
Birləşib ikimiz bir bədən olaq.

*8.02.1998*

## ŞAXTA YANIMDADIR, SOBA UZAQDA

Başımın üstündə küləklər əsir,
Görəsən necədir hava uzaqda?
Göyün libasını şimşəklər kəsir,
Fikrimi cəlb edir səda uzaqda.

Yarım, sənin kimi mehriban azdır,
Ruhumu verərəm sənə, can azdır...
Yanımda sözümü danışan azdır,
Amma, danışırlar qaba-uzaqda.



Ətalət, səfalət boğaza qədər,
Qəbahət, cəhalət boğaza qədər,
Küdurət, rəzalət boğaza qədər,
Cinayət çox, amma cəza uzaqda.

Üşüdüm həmdəmin soyuqluğundan,
Nə qədər adəmin soyuqluğundan,
Dondum bu aləmin soyuqluğundan,
Şaxta yanımdadır, soba uzaqda.

Pərvazım daha yox, qaşqabağlıyam,
Sinəmdə dağım var, sinədağlıyam.
Şahinəm, torpağa amma bağlıyam,
Torpaq yaxındadır, səma uzaqda.

*28.02.1998*

## GÖZ HƏR ŞEYI GÖRÜR, ÖZÜNÜ GÖRMÜR

Canım, qəhrəmanlar nə az yetişir?
Gözüm Koroğlunu, Həzini görmür.
Bəlkə də, hardasa Eyvaz yetişir,
Nəzərlər hələlik üzünü görmür.

Üzlərdə izi var neçə kədərin,
Izlərdə sözü var neçə kədərin,
Leylilər hələ də divanələrin
Birini görürsə yüzünü görmür.

Varım yox olubdur, yoxum var olub,
Gizlində qalanlar aşikar olub,
Tale nə yaxşı ki, mənə yar olub,
Gözüm bədxahların gözünü görmür.

Milli geyimi var qəzəllərimin,
Xəlqi deyimi var qəzəllərimin.
Biganə baxışlar əməllərimin
Əyrisini görür, düzünü görmür.

Hələ deyilməmiş söz kimiyəm mən,
Kül altda közərən köz kimiyəm mən,

Şahin, bəbək kimi, göz kimiyəm mən,
Göz hər şeyi görür, özünü görmür.

*5.03.1998*

## DARIXACAQ

Gedirəm, arxamca sənlə gəzdiyim
Cığır darıxacaq, iz darıxacaq.
Nanə qoxladığım, çiçək üzdüyüm
Çəmən darıxacaq, düz darıxacaq.

Pərişan edəcək əhvalımı qəm,
Yaman tükənəcək səbrim, hövsələm,
Qələm söz gəzəcək, söz isə qələm,
Qələm darıxacaq, söz darıxacaq.

Amma, hicrə məndə dözüm qalıbdır,
Qətiyyət qalıbdır, əzm qalıbdır,
Hələ kül altında közüm qalıbdır,
Üstünə kül düşən köz darıxacaq.

Saçımın ağı var, qarası yoxdur,
Yalan danışanın çarası yoxdur.
Şahinin yalanla arası yoxdur,
Doğru danışacaq, düz danışacaq!

*6.04.1998*

## ŞAHININ ƏLINDƏ YARAQ GÖRÜNDÜ

Hakim hökm edəndə, kölə baxanda
Qara gələcəkdən soraq göründü.
Millət quzu kimi ələ baxanda
Qəssabın əlində bıçaq göründü.

Kimə qılınc qalıb, kimə saz qalıb,
Kiməsə havayı etiraz qalıb.
Deyirlər "yaxındır xoş gün, az qalıb",
Mənə o yaxınlıq uzaq göründü.

Nə qədər müsibət sinə dağladı,
Bir gözüm güldüsə, biri ağladı,



Kişi var başına ləçək bağladı,
Qadın var başında papaq göründü.

Fərəh "yaşa" dedi, kədər "öl" dedi,
Dərdi dərdbilənlə fələk böl dedi,
Yaxşı ki, candakı ümid ölmədi,
Yazıb-yaratmağa maraq göründü.

Tərəddüd yox oldu, güman çəkildi,
Şübhə həm çəkildi, yaman çəkildi,
Şahdağın üstündən duman çəkildi,
Yarımın üzündə duvağ göründü.

Acı tənqidimi qoy bilə bağban,
Etina eləmir tər gülə bağban,
Qolun şikəst olsun, ay belə bağban,
Qəzəl gülşənində alağ göründü.

Yenə qulaq asdı könül deyənə,
Yanından qovaraq aləmi yenə,
Əlinə götürdü qələmi yenə,
Şahinin əlində yaraq göründü.

*20.11.1998*

## CÜCƏRƏR

Bağban göz olmasa əgər bağına,
Xeyir əldən gedər, ziyan cücərər.
Böyük bir sədəmə dəyər bağına,
Gerçəklik yox olar, güman cücərər.

Vətən məğlub olmaz, vətəndaş olsa,
Sərvətdən, dövlətdən vətən baş olsa,
Ağac rişə atmaz dibi daş olsa,
Torpaq münbit olsa saman - cücərər.

Dünyamız haçansa olar bəxtiyar,
Haqqa, ədalətə çox ümidim var.
Əgər öldürsələr açıq-aşikar,
Ürəklərdə ümid pünhan cücərər.

Hər fərd zar olmasın fərdin əlində,
Insanlar qalmasın dərdin əlində,
Düşmənə ox atar mərdin əlində,
Yerə basdırsalar kaman - cücərər.

Tərif eləsən də dilində gülü,
Çalış saxlayasan gilində gülü,
Şahin, çox da tutma əlində gülü,
Birdən ayağında tikan cücərər.

*5.12.1998*

## EY SEVƏNLƏR, ŞAHIN YENƏ QAN GÖRÜR

Zənn edirdim yavaş-yavaş sağalar,
Yaram yenə qanamağa başladı.
Məni etdi yenə giryan, yenə zar,
Yaram yenə qanamağa başladı.

Ah, bu yara yarasıdır eşqimin,
Qaysaqlanan parasıdır eşqimin,
Bəlkə, ölüm çarasıdır eşqimin,
Yaram yenə qanamağa başladı.

Qurumağı - çox bulağın yarası,
Dağılmağı - neçə dağın yarası,
Çıxdı yaddan Qarabağın yarası,
Yaram yenə qanamağa başladı.

Gözləyənə vüsalı hicran nədir?
Bilməyirəm dərdimə imkan nədir...
Alim nədir, şair nədir, qan nədir?
Yaram yenə qanamağa başladı.

Yarabilməz neçə aşiq sevişdi,
Iqbalıma görün mənim nə düşdü!..
Həvva nənə, Adəm baba, nə işdi
Yaram yenə qanamağa başladı.

Mənim yaram çıxmaya kaş aşkara,
Istəmirəm o qopara, bu yara...



Nə sağalmaz yara oldu bu yara,
Yaram yenə qanamağa başladı.

Görən məni zarü pərişan görür,
Falçı xala önümdə hicran görür,
Ey sevənlər, Şahin yenə qan görür,
Yaram yenə qanamağa başladı.

*14.12.1998*

## ISITMƏZ

Buz kimi nisgilin yaşar sinədə,
Məni mey qızdırmaz, dodaq isitməz.
Elə uzağam ki, səndən yenə də,
Yaxına gəlməsən uzaq isitməz.

Yoxsan, bu gədanın sultanı yoxdur,
Yanına gəlməyə imkanı yoxdur.
Kimin ki, yanında cananı yoxdur,
Otaq soyuqladar, yataq isitməz.

Canda bu soyuqluq hələ çox çəkər,
Qanda bu soyuqluq hələ çox çəkər,
Üst-üstə yüzünü qoysam da əgər
Başımı buxara papaq isitməz.

Qızaram nəfəsin isti yayarsa,
Qəlbində sevginin istisi varsa.
Saçımı əllərin daraqlayarsa,
Canım, kim deyər ki, daraq isitməz?

Şahin, məhəbbətin köləsiyəm mən,
Neynim, aşiqlərin bələsiyəm mən,
Ürəkdə od sönsə öləsiyəm mən,
Ocaqda od sönsə ocaq isitməz.

*Lənkəran,*
*20.01.1999*

## MƏSCIDLƏ MEYXANƏ ARASINDADIR

Bu kəs elə kəsdir - ciyəri yanan,
Namərdlə mərdanə arasındadır.
Biri yandırandır, digəri yanan,
Şam ilə pərvanə arasındadır.

Bəzən zəhər olur nabat içində,
Ölüm qanad çalır həyat içində...
Həyatım büsbütün təzad içində,
Dost ilə biganə arasındadır.

İndi kim Şahinə haraya getsin,
Köməyə yetişsin, çaraya getsin,
Biçarə bilmir ki, haraya getsin,
Məscidlə meyxanə arasındadır.

*6.04.1999*

## LAL-DINMƏZ YANIRAM PƏRVANƏ KIMI

Mənim namərdliklə aram olmayıb,
Mərdi səsləmişəm mərdanə kimi.
Halal duz-çörəyim haram olmayıb,
Daim yaşamışam şahanə kimi.

Canda şövqü olub neçə diləyin,
Mənə, ey aşiqlər, qibtə eləyin,
Xəzinədar deyin, gözətçi deyin,
Sevgi qorumuşam dürdanə kimi.

Fələkdə əzəli qayda: Fırlanır,
Deməli ümman da, çay da fırlanır,
Deyirlər günəş də, ay da fırlanır,
Mən də fırlanıram divanə kimi.

Qansızlar cismimi möhkəm oxladı,
Qəlbə nizə atdı dərd, qəm oxladı,
Məni düşmən deyil, həmdəm oxladı,
Həmdəm neçin oldu biganə kimi?



Şahin, can odlayan fani cahanda
Çoxdur alışan da, çoxdur yanan da,
Səsimi eşidən yoxdur cahanda,
Lal-dinməz yanıram pərvanə kimi.

*26.04.1999*

## ELƏ NƏHƏNGƏM KI, YUVA TAPILMIR

Qalır ürəyimdə qəlbimin kamı,
Qəlbin yarasına dəva tapılmır.
Tarçı çala bilmir mənim havamı,
Sümüyümə düşən hava tapılmır.

Gülü yox, gülləni dindirən nə çox,
Bəla üstdən bəla endirən nə çox,
Allaha dualar göndərən nə çox,
Amma bəndəsinə dua tapılmır.

Ümidi doğrayan, paralayan var,
Ümidvar ürəyi yaralayan var,
Ağappaq saçını qaralayan var,
Mənimsə saçımda qara tapılmır.

Səbatımı qırmaq istəyən də var,
Canımı qovurmaq istəyən də var,
Külümü sovurmaq istəyən də var,
Məni qovurmağa tava tapılmır.

Namərdin gözünə bıçaq mənəm, mən,
Tər təzə qəzəldən soraq mənəm, mən,
Şahinəm, yuvadan uzaq mənəm, mən,
Elə nəhəngəm ki, yuva tapılmır.

*29.05.1999*

## QOCA DA ÖZÜMƏM, CAVAN DA ÖZÜM

Sözün əyrisi var, sözün düzü var,
Düzgün danışmasan ziyanı olur.
Sözü ürəyindən düşünüb çıxar,
Sözün də yaxşısı, yamanı olur.

Elə söz demə ki, ola zərərin,
Nə çox isti olsun, nə də çox sərin.
Yağış az yağanda qəmlənənlərin
Yağış çox yağanda fəğanı olur.

Dilimin saflığı - əzəl diləyim!
"Zimistan" *, "əndəlib" ** deyil gərəyim!
Təzad yuvasına dönüb ürəyim -
Qətiliyi olur, gümanı olur.

Günəş də özüməm, duman da özüm,
Yaxşı da özüməm, yaman da özüm,
Qoca da özüməm, cavan da özüm,
Aşiqin qocası, cavanı olur.

*Lənkəran,*
*3.06.1999*

## "MƏN AĞ GÜN GÖRMƏDIM AĞA BÜKÜLƏM"

Həmdəm axtarmışam, dost aramışam,
Gələrəm, çağırın çaraya məni.
Özüm cocuq ikən yun daramışam,
Qoymaram namərdlər daraya məni.

Eşq - bütöv bir aləm, para gəzirəm,
Beləyəm, dəmadəm para gəzirəm,
Mən bütöv gəzmirəm, para gəzirəm,
Öyrədən öyrədib paraya məni.

Quru bir yanımda, nəm bir yanımda,
Fərəh bir yanımda, qəm bir yanımda,
Zil bir yanımdadır, bəm bir yanımda,
Ay aman, qoyublar araya məni.

Şahin, istəmərəm yataqda öləm,
İstərəm qayaya, dağa büküləm.
"Mən ağ gün görmədim ağa bükülən,
Öləndə bükərsiz qaraya məni" ***.

*20.09.1999*

* Zimistan - qış (farsca)
** Əndəlib - bülbül (ərəbcə)
*** Beyt İlham Qəhrəmanındır.



## "ALIB QUCAĞIMA BAŞIMI INDI..."

Ey fələk, qırılsın görüm əllərin,
Sınar, başdaşımı niyə döyürsən?
Daha mən oluram ruzisi yerin,
Oyatma, huşumu niyə döyürsən?

Tamarzı qalmışam vüsala, aman,
Diz dönüb zərbəmdən qavala, aman,
Göz alacalanıb bu hala, aman,
Kipriyim, qaşımı niyə döyürsən?

Gözümdə bir qətrə yaş damcılandı,
Damcı od söndürər, bu damcı yandı,
Ürək qamçılandı, qəlb qamçılandı,
Fələk, sirdaşımı niyə döyürsən?

Sıxdım dodağıma başımı indi,
Verdim bıçağıma başımı indi,
"Alıb qucağıma başımı indi
Qaçıram, başımı niyə döyürsən?" *

*29.09.1999*

## DILIN VƏZIFƏSI ƏLINDƏN ÇIXIR

Allaha and olsun tel ətri deyil,
Bu necə ətirdir telindən çıxır?
Çiçək ətri deyil, gül ətri deyil!
Elə bil cənnətin gülündən çıxır.

Aşiq, görübsənmi göz danışanda -
Göz kəlmə deyəndə, söz danışanda?
Yarım, gözümüzlə biz danışanda
Dilin vəzifəsi əlindən çıxır.

Dadmışam barını neçə diləyin,
Sevənlər, siz mənə qibtə eləyin,
Canım neçə ildir qoca fələyin
Fəndindən ötüşür, felindən çıxır.

* Beyt Qəşəm Nəcəfzadənindir.

Əlim şamı qırıb, çırağı atıb,
Hicranı qovlayıb, fərağı atıb...
Elə bil gəlindir duvağı atıb,
Çöhrəsi rübəndin tülündən çıxır.

Nəhayətsiz sevgi - budur arizu!
Bu imkan, bu canan, bu mən, meyl bu!
Dedilər: - Ey Şahin, qoşma deyil bu,
Nabatmı, şəkkərmi dilindən çıxır?

*4.10.1999*

## ALLAHDAN DA VARLI OLMAYACAQSAN...

Qayıt diyarına, ey qürbətgəzən,
Qürbətdə diyarlı olmayacaqsan.
Dön öz torpağına, vətəninə sən,
Vətənsiz vüqarlı olmayacaqsan.

Vətən pərvanədir, sən isə şam ol,
Vətəninə yetib dinc ol, aram ol,
Burda yarımçıqsan, vətəndə tam ol,
Qayıtsan qübarlı olmayacaqsan.

Şamı pərvanədir yaşadan belə,
Sən onun eşqiylə yaşa, yan belə...
Gülüstan içində yaşasan belə,
Heç zaman baharlı olmayacaqsan.

Daim düşünürəm halını, ey şeyx,
Rəng örtür saqqalda çalını, ey şeyx,
Az topla dünyanın malını, ey şeyx,
Allahdan ki, varlı olmayacaqsan.

*Lənkəran,*
*6.11.1999*

## BIR GÜN BAŞIM ÜSTDƏ DAŞ OTURACAQ

Ömrümün payızı başa yetmədə,
Yaşımın üstündə qış oturacaq.
Şumlamaq növbəsi xışa yetmədə,
Sinəm üstdə torpaq - xış oturacaq.



Qəlbim tərk etmədə tabı, dözümü,
Tanıya bilmirəm özüm-özümü,
Ağlamaq istəməm, silin gözümü,
Qoymayın, gözümdə yaş oturacaq.

Dərd aşiqi idim, həzzi qovardım,
Qəm göyərtmək üçsün kədər suvardım...
Bir vaxt daşın üstdə mən oturardım,
Bir gün başım üstdə daş oturacaq.

Haçansa bu kədər, bu qəm sınacaq,
O həm qalmayacaq, bu həm sınacaq,
Varaq cırılacaq, qələm sınacaq,
Ağıl oturacaq, huş oturacaq.

Uçur, sevgisindən nigaran uçur,
Uçur, dərdli uçur, pərişan uçur,
Dedilər: - Bu Şahin nə yaman uçur...
Az qalıb, yorulub quş, oturacaq.

*Quba,*
*20.12.1999*

## SUSUB RÜSTƏMLƏRI ZAL ADAMLARIN

Tüfəngi tullayıb qaçıb bu dəli,
Daş atıb baş yarar, dəlini bağla.
Irəli uzana bilməsin əli,
Dilənən kişinin əlini bağla.

Vətənin qayğısı yanından keçib...
Bilər ki, boş yerə qanından keçib.
Düşünər ki, nahaq canından keçib,
Birdən cana gələr, ölünü bağla.

Susub Rüstəmləri Zal adamların,
Düşüb ürəyinə xal adamların,
Allah, dilini aç lal adamların,
Məddah şairinsə dilini bağla.

*28.10.2001*

## QOŞMAVARİ ŞERLƏR

### NEÇƏ-NEÇƏ BAŞDA TÜK QALMAYACAQ

Yamyaşıl olacaq ümidin yolu,
Tərtəmiz vüsala şəkk qalmayacaq.
Qolumdan tutacaq sevginin qolu,
Şahin əzəlki tək tək qalmayacaq.

Bulud örtməyəcək yerin üstünü,
Ağappaq olacaq aşiqin günü,
Biz də atacağıq hicran yükünü,
Daha çiynimizdə yük qalmayacaq.

Eşqi eləyən var inkar nə qədər,
Gözü götürməyən əğyar nə qədər...
Nə qədər ki vardır Keçəl Həmzələr
Neçə-neçə başda tük qalmayacaq.

*6.12.1996*

### QƏMI CILOVLAYA BILMIRƏM NIYƏ?

Sönürəm, azalır səsimin zili,
Bəmi cilovlaya bilmirəm niyə?
Göz yaşı zar edir Şahin Fazili,
Nəmi cilovlaya bilmirəm niyə?

Əğyarı qovlamaq - əlimdən gəlir,
Şikarı ovlamaq - əlimdən gəlir,
Atı cilovlamaq əlimdən gəlir,
Qəmi cilovlaya bilmirəm niyə?

Mən ki həlimliyi örnək sayıram,
Qəlbimdən sərtliyi gərək ayıram...
Həmi qəzəbimi cilovlayıram,
Həmi cilovlaya bilmirəm niyə?

*25.12.1996*

### TARI CANAN KIMI SIXIB KÖKSÜMƏ

Tale ağ bir ümid yığıb köksümə,
Bihudə məftunluq yadıma düşmür.
Tarı canan kimi sıxıb köksümə
Çalıram, yorğunluq yadıma düşmür.



Dərdimlə fərəhim qoşa sinəmdə,
Sevinc də yer tutub orada, qəm də.
Hərdən meyxanədə gecələsəm də,
Saqiyə vurğunluq yadıma düşmür.

Bağbansız, barsız bağ nəyinə gərək?
Dumansız, qarsız dağ nəyinə gərək?
Yarım, Leyli olmaq nəyinə gərək?
Şahinəm, Məcnunluq yadıma düşmür.

*13.01.1997*

### ETIRAF

Daha çox sevirəm ahıl çağımda,
Təndirmi ürəyim, kürə? Bilmirəm.
Eşq ağacı bitib sevgi bağımda,
Hələ meyvəsini dərə bilmirəm.

Əlin əlimdədir, gözündə gözüm,
Gözünü əks edir özündə gözüm,
Sədaqət görmədə üzündə gözüm,
Səni ayrı cürə görə bilmirəm.

Qapım döyülürsə, bəndəm bir himə,
"Get" deyə bilmirəm, inan, heç kimə,
Hamının sevgisi girir qəlbimə,
Qəlbin qapısını hörə bilmirəm.

*14.10.1998*

### DƏRD APARAN

Kişilik yaşayır canımda mənim,
Damarımda mənim, qanımda mənim,
Namərdin nə işi yanımda mənim,
Savaşa özümlə mərd aparıram.

Mən sinədəftərəm, dəftərdir sinəm,
Ürəksiz bir əməl etmədim bir dəm,
Elə oyunçuyam hayana getsəm
Vurub qoltuğuma nərd aparıram.

Qarabağ yarası qan verir, aman,
Yaram qanayacaq hələ çox güman...
Belə deyəcəyəm öldüyüm zaman:
Qəbrə cahan boyda dərd aparıram.

*6.03.1999*

## ƏCƏLIN YOLU

Görən haqlıyammı, əməlim haqmı?
Mən tutan yolmudur qəzəlin yolu?
Aparıb cənnətə çatdıracaqmı
Əməlisalehi əməlin yolu?

Didib-parçalayır, könül, qəm səni,
Niyə sevindirmir bu aləm səni?
Gözüm qoy görməsin Keçəl Həmzəni,
Mənim yolum deyil keçəlin yolu.

Bir məzar verirəm bu cahana mən,
Qovrula-qovrula, yana-yana mən.
Şahin, göz dikmişəm asimana mən,
Yanıma ordandır əcəlin yolu.

*25.03.1999*

## FAZIL OLMAYACAQ HEÇ BIRI AMMA

Irfani eşqədir təriqim, yolum,
Çoxuna az olur təsiri amma.
Mənim də Məcnun tək bağlanıb qolum,
Səs-səda etməyir zənciri amma.

Atılıb ömrümün oxu, görürəm,
Ölübdür arzumun çoxu, görürəm,
Yaman qara-qura yuxu görürəm,
Tərsinə yozulmur təbiri amma.

Kimin kimliyini deyər - Gələcək!
Kimə ağlayacaq, kimə güləcək,
Məndən sonra neçə Şahin gələcək,
Fazil olmayacaq heç biri amma.

*Lənkəran,*
*5.06.1999*

## ŞAHIN BÜLBÜL OLUR GÜL GÖRƏN KIMI

Əlimin istisi əlinə keçir,
Ovcumun içində əl görən kimi.
Sözümün şirnisi dilinə keçir
Yanımda bir şirin dil görən kimi.



Yaxşı yazılıbsan mənim adıma,
Vaxtında çatıbsan, gülüm, dadıma...
Sənin gəlinliyin düşür yadıma
Şahdağın üstündə tül görən kimi.

Neçə yer dəyişir, məqam dəyişir,
Neçə "sağ ol" deyir, "salam" dəyişir...
Canım, xasiyyəti tamam dəyişir,
Şahin bülbül olur gül görən kimi.

*1.07.1999*

## BAŞIMDA ÇALMA YOX, ÜZÜMDƏ SAQQAL

Fərağın üzünü usun mürdəşir,
Deyəsən qürbətə yollanacağam.
Həsrəti ananda tüküm ürpəşir,
Yenəmi həsrətə yollanacağam?

Əzaba, zillətə öyrətmək üçün,
Dözümə, taqətə öyrətmək üçün,
Mən səni möhnətə öyrətmək üçün
Əzizim, möhnətə yollanacağam.

Hicran əmr edəcək hicrə "Oyaq qal"!
Vüsal səslənəcək vəslə ki "Sağ qal!"
Başımda çalma yox, üzümdə saqqal,
Necə mən cənnətə yollanacağam?

*2.08.1999*

## HƏR GECƏ EVLƏNƏN BƏYƏM, NƏ YAXŞI!..

Yiyəmə borcluyam adıma görə -
Mənə "Şahin" deyib yiyəm, nə yaxşı.
Tez-tez baş vururam uca göylərə,
Laçınam, qartalam, leyəm, nə yaxşı.

Xəbislik yaşamır ürəyimdə ki,
Büsbütün bəllidir ürəyimdəki.
Haray qoparmıram nağara təki,
Həzin-həzin dinən neyəm, nə yaxşı.

Toy səsi sükutun bağrını dəlir.
"Vağzalı" səslənir, nəğmə yüksəlir.
Hər gecə evimə dərd gəlin gəlir,
Hər gecə evlənən bəyəm, nə yaxşı.

*26.08.1999*

## BAĞBAN DA DESƏLƏR MƏNƏ VAR YERI

Nə üçün hissini bilə bilmədim,
Nadan da desələr mənə var yeri.
Mən sənin dərdindən ölə bilmədim,
Loğman da desələr mənə var yeri.

Hicran cırmaqladım, fəraq qopardım,
Ömür kitabımdan varaq qopardım,
Qəzəlin bağından alaq qopardım,
Bağban da desələr mənə var yeri.

Hərçənd dərviş kimi köçəri oldum,
Şahin tək çox eldən ötəri oldum,
Şer aləminin nökəri oldum,
Sultan da desələr mənə var yeri.

*4.12.1999*

## QƏŞƏM XOŞLASA DA...

*Şair Qəşəm Nəcəfzadə mənim "Bir qədər iztirab çəkməyim gəlir" şerimdəki əğyarlara tənqidi münasibətimi tənqid edib dedi: - Əgər yar ürəkdən sevilirsə əğyarı bağışlamaq olar. Məsələn, xəstəxanaya, sevgilisini sevən əğyarın yanına, Dostoyevskinin bir qəhrəmanı gülçiçəklə gedib onu yoluxurmuş...*

Ümidvar olduğum ellər, ay ellər,
Qoymayın bu kəsin gümanı batsın.
Deyin aparmasın Saranı sellər,
Batırsa qoy onun çobanı batsın.

Qəmi azalarmı qəmxar olanın?
Ya, çarası varmı naçar olanın?
Qəşəm xoşlasa da, əğyar olanın
Bütün yar-yoldaşı, hayanı batsın.



Xeyir axtarıban tapsa da zərər
Aşiqlər içində Şahin bəxtəvər.
Əlimə gəlməsə o qönçə əgər
Barı ayağıma tikanı batsın.

*29.12.1999*

## MƏNIM SAÇLARIMIN HƏYASI YOXDUR

Döyür gecə-gündüz əzazil kimi,
Deyəsən başımı nağara bilib.
Axır ki, mənim də əydi qəddimi,
Kim qoca fələklə bacara bilib?

Titrə o qədər ki, əs o qədər ki...
Səsim eşidilmir, səs o qədər ki...
Mən kimi biçarə kəs o qədər ki...
Nə əlac düşünüb, nə çara bilib.

Gözümün əvvəlki ziyası yoxdur,
Amma ürəyimin riyası yoxdur...
Mənim saçlarımın həyası yoxdur,
Bu qara günlərdə ağara bilib.

*24.01.2000*

## GÜLÜ NEYLƏYIRƏM, BAĞBANA QALSIN!

Mənə varaq verin, qələm gətirin,
Çomaq istəmirəm, çobana qalsın.
Dərviş olacağam, ələm gətirin,
Şəhər - ona meyl salana qalsın.

Həqiqət gəzirəm güman tapıram,
Yaxşı axtarıram yaman tapıram,
Qızılgül arayıb tikan tapıram,
Bu bağı görüm ki, virana qalsın.

Yoxsa da dərdimə çara eləyən,
Tapılır qəlbimi para eləyən,
Tikanı əlimi yara eləyən
Gülü neyləyirəm, bağbana qalsın!

*14.02.2000*

## TƏZƏ BƏY GECƏNİ UZUN ARZULAR

Ürəyim meşədə kiçik bir kaha,
Ağac kötüyündən masa istəyir.
Ayağım sözümə baxmayır daha,
Deyəsən əllərim əsa istəyir.

Yarəb, çox aşiqin toyda, düyündə,
Bu sevənin isə gör ki. nə gündə!..
Həyat arxadadır, əcəlsə öndə,
Bu nəzərə almır, əsa istəyir.

Bu qoca dünyada, ey Pərvərdigar,
Hərənin fələkdən arzu-kamı var,
Təzə bəy gecəni uzun arzular,
Oruc tutan isə qısa istəyir.

*27.03.2000*

## ÖMÜR KƏNDİRİ

Olur bir qəhqəhə min ahla əvəz,
Bir gülüş min ahın əllərindədir.
Edirik savabı günahla əvəz,
Yaxamız günahın əllərindədir.

Canım neçə vaxtdır canana tabe,
Meylim, şübhəsiz ki, imkana tabe,
Mən necə olmayım fərmana tabe,
Bu bəndə o şahın əllərindədir.

Şahin, qalmayacaq ruhum bədəndə
Kəndir çəkiləndə, çəkən çəkəndə -
Ömür karvanının bir ucu məndə,
Bir ucu Allahın əllərindədir.

*Quba,*
*21.04.2000*

## BULUD AĞLADIQCA ÇƏMƏN GÜLÜMSƏR

Dəysə sinəsinə dostun ayağı,
Biyaban gülümsər, düzən gülümsər.
Yan at ayağını bizdən, a yağı,
Qoy olsun yenə də vətən gülümsər.



Məhəbbət hamının işinə dönsə,
Sədaqət sevdanın qaşına dönsə,
Sevilən sevənin başına dönsə,
Sevilən gülümsər, sevən gülümsər.

Demirəm Şahinlə bölün gülüşü...
Könlümə yabançı bilin gülüşü,
Buludun göz yaşı - gülün gülüşü,
Bulud ağladıqca çəmən gülümsər.

*21.05.2000*

## GÖZƏLİM, HAZIRDIR KABABIN SƏNİN

Hicran məktəbini bitirmişəm mən,
Daha olmayacaq əzabın sənin.
Qələmi, dəftəri itirmişəm mən,
Yazılır beynimdə kitabın sənin.

Göz bir də yaş ilə dolacaqmıdır?
Sevda gülüstanım solacaqmıdır?
Cavab ver, bilmirəm olacaqmıdır?
Mənim sualıma cavabın sənin.

Birtəhər dözürəm, lakin... ürəyim...
Daha tab etməyir, Şahin, ürəyim,
Bişdi atəşindən eşqin ürəyim,
Gözəlim, hazırdır kababın sənin.

*19.06.2000*

## ƏLVİDA

Yaddaşıma möhkəm girə bilmədin,
Yadını yadımdan çıxaracağam.
Mənim qiymətimi verə bilmədin,
Adını yadımdan çıxaracağam.

Qədrini bilsəydin əgər sevginin,
Önündə çəkməzdin çəpər sevginin,
Şirin məhəbbətin, şəkər sevginin
Dadını yadımdan çıxaracağam.

Şahin bitirmədə qışı həyatda,
Qalmaz onun kimi kişi həyatda...
Daha sçən şəkildə, daha sən adda
Qadını yadımdan çıxaracağam!

*4.08.2000*

## ƏBÜLFƏZL ABBASIN QOLU KƏSILDI

Xəzanın əvvəli - gülün axırı,
Amma soluxmayan güllər nə çoxdu.
Hər yolun hədəfi - yolun axırı,
Bir hədəfə gedən yollar nə çoxdu.

Mənim üç əlim var - biri çəlikdi,
Ürəyim kədərdən dəlik-dəlikdi,
Bir aylıq maaşım bir həftəlikdi,
Sandıqda çürüyən pullar nə çoxdu.

Çox yerdən Şahinin yolu kəsildi,
Sağı doğranıldı, solu kəsildi,
Əbülfəzl Abbasın qolu kəsildi,
Amma kəsilməyən qollar nə çoxdu.

*4.10.2000*

## GERIYƏ DÖNMƏYƏCƏK

Yad edirəm ərənlərin sözünü,
Atılan ox bəriyə dönməyəcək.
Bir canavar tutub yedi quzunu,
Yazıq quzu, sürüyə dönməyəcək.

Dili başqa, qəsdi, sözü birsə də,
Adı ayrı, amma özü birsə də,
Saxsı küpdən qızıl küpə girsə də,
Küpəgirən pəriyə dönməyəcək.

Beynim içrə bir ümidsiz xəyal var,
Ürəyimdə ölüm adlı məlal var,
Şahin Fazil, ha dad elə, ha yalvar,
Əcəl gəlsə geriyə dönməyəcək.

*14.10.2000*



## ÖMÜR ŞAM TƏKI YANIR...

Hər qəlbin öz yarası...
Göz dağı, göz yarası...
Betərdir söz yarası
Yüz savaş yarasından.

Paklıq diləyim mənim,
Düzlük gərəyim mənim,
Çıxır çörəyim mənim,
Sanki daş arasından.

Ömür şam təki yanır,
Əcəl Şahini anır,
Sürət ilə boylanır
Gözlə qaş arasından.

## MƏCNUN ÇOX DEYIR KI, BAŞ DƏLI ODUR...

Özümü vətəndən aralı gördüm,
Gördüm ki, qürbətin əli əlimdə.
Üç telli durnanı yaralı gördüm,
Üç telli durnanın teli əlimdə.

Əğyarın gözünü, başını yarram,
Qaşını çatmasın, qaşını yarram,
Mənə daş atanın daşını yarram,
Mənə gül verənin gülü əlimdə.

Dəli aşiqlərin əvvəli odur,
Öncüllük yolumun əngəli odur,
Məcnun çox deyir ki, baş dəli odur,
Öləcək bir gün o dəli əlimdə.

*Lənkəran,*
*22.11.2000*

## GƏRAYLILAR

## NAZIN VAXTI KEÇIB-GETDI

Naz görmədim nazın kimi,
Nazın vaxtı keçib-getdi.
Qəlbi çalma sazın kimi,
Sazın vaxtı keçib-getdi.

Bezikdirmə sən aşiqi -
Dərdindən ölən aşiqi,
Az istəmə mən aşiqi,
Azın vaxtı keçib-getdi.

Əcəl indi məni güdür,
Deyir "Şahin, köçünü sür",
Ömrümün qış mövsümüdür,
Yazın vaxtı keçib-getdi.

*20.05.1997*

## ŞAHIN BAXA-BAXA QALDI...

Ildırıma tələ qurdum,
Şimşək çaxa-çaxa qaldı.
Kəhkəşana bir göz vurdum,
Ulduz axa-axa qaldı.

Güllər açdı gözəl-göyçək...
Qızlar gülləri görən tək
Novruzgülü köynək-köynək,
Nərgiz yaxa-yaxa qaldı.

Vüsal getdi, hicran qaldı,
Gerçək getdi, güman qaldı,
Yaxşı getdi, yaman gəldi,
Şahin baxa-baxa qaldı.

*26.06.1998*

## GÖZLƏYƏ-GÖZLƏYƏ

*"Sevirsənsə, daşa dönmə,*
*Öldüm gözləyə-gözləyə".*
*Qiymət*

Qəmlə qoç tək kəllə-kəllə
Gəldim gözləyə-gözləyə.
Göz yaşımı titrək əllə
Sildim gözləyə-gözləyə.

Qaralmışam zəli kimi,
"Döydü fələk əli kimi?!"
Sevdalı bir dəli kimi
Güldüm gözləyə-gözləyə.



Ox atıldı, kaman itdi,
Gözlərimdən yaman itdi,
Sağ qalmağa güman itdi,
Öldüm gözləyə-gözləyə.

Göz yaşlıdı, sinə yara,
Yara üstdən yenə yara.
Ölməliyəm, bu qərara
Gəldim gözləyə-gözləyə.

Camalında göz qalacaq,
Vüsalında göz qalacaq,
Ümidə bax, qız qalacaq,
Bildim gözləyə-gözləyə.

*5.05.1999*

## ŞAHIN DÖVRÜN HƏLLACIDIR

Görünməyir, sarban hanı?
Carçının yox carı neçin?
Bu sarbansız qəm karvanı
Gəlir mənə sarı neçin?

Yer gəzirəm mən avara,
Yerim varmı, gedim hara?
Gecəm bəxtim kimi qara,
Günüm gün tək sarı neçin?

Nə zahiddir, nə hacıdır,
Saf məhəbbətin acıdır,
Şahin dövrün Həllacıdır,
Qurulmayır darı neçin?

*16.05.1999*

## UCUZ UZAQ, BAHA YAXIN...

Düşüb məndən fərəh qaçaq,
Yaşamışam aha yaxın.
Tüstü oddan qaçan sayaq
Düşməmişəm şaha yaxın.

Fəraq sözümü göynədir,
Nisgil gözümü göynədir...
Gözüm həmişə göydədir,
Göy Allaha daha yaxın.

Deməliyəm daha yaxşı
Sözümü Allaha yaxşı.
Ucuz sözdən baha yaxşı,
Ucuz uzaq, baha yaxın...

*31.07.1999*

## XƏSTƏ OLMAQ ISTƏYIRƏM

Elin sevən şairiyəm,
Sınıq sazam, qırıq neyəm,
Şerim dedi: "Acı meyəm,
Püstə olmaq istəyirəm".

Bu yaş hara, sevgi hara?
Deməsinlər "Günüqara!.."
Yoluxaraq bu azara
Xəstə olmaq istəyirəm.

Kaş bu nağıl ola gerçək,
Təzə nağıl ola gerçək,
Qalib çıxan pəhlivan tək
Üstdə olmaq istəyirəm.

8.08.1999

## KIŞI DƏ DOĞA BILIRMIŞ...

Zülmət haqsız ola-ola
Işığı boğa bilirmiş.
Bir ana qız ola-ola
Isanı doğa bilirmiş.

Ümid vardımı - düzəlim?
Etdi yardımı - düzəlim.
Gözəllərdən o gözəlim
Gözümü yığa bilirmiş.

Istədim olmayıb qara
Qara yerdə qar ağara...
Guya ki, yer yoxdu qara,
Sağıma yağa bilirmiş.



Çoxmu yazan mənim kimi?
Yazan-pozan mənim kimi?
Mən doğuram hər şerimi,
Kişi də doğa bilirmiş.

*20.08.1999*

## QARA AĞI QARALADI

Hara getdi o gülyanaq?
Gözüm bağı qaraladı.
Almayıb bağdan bir soraq,
Solu, sağı qaraladı.

Görməyirəm gündə günü,
Bildir, ey fələk, qəsdini,
Bulud başımın üstünü,
Duman dağı qaraladı.

Nə həmlədi, nə hücumdu?
Əli açdı, gözü yumdu
Tüstü mənə sarı cumdu,
Qara ağı qaraladı.

*1.09.1999*

## YETIM QALAN IZIMƏ VAY!..

Çıxmayıram neçin şəkdən?
Yalanıma, düzümə vay!
Əllərimlə döyülməkdən
Gömgöy olan dizimə vay!

Daha görmür gözüm səni,
Itirmişəm özüm səni,
Vəsf eləmir sözüm səni,
Gül tək solan sözümə vay!

Gözlərimin nəmi vardır...
Şahin təkdir, kimi vardır?
Izin də yetimi vardır,
Yetim qalan izimə vay!

*7.09.1999*

## AĞIL XOŞUMA GƏLMƏDI

Bir daş atdım turac sarı,
Turac daşıma gəlmədi.
Nə də səhra ahuları
Mənim tuşuma gəlmədi.

Ahəng sözümə dönmədi,
Avaz sazıma dönmədi,
Qışım yazıma dönmədi,
Yazım qışıma gəlmədi.

Nə nasirəm nasir təki,
Nə şairəm şair təki...
Füzulinin beynindəki
Neçin başıma gəlmədi?

Saqiyə biganə oldum,
Şərabsız məstanə oldum,
Şahindim, divanə oldum,
Ağıl xoşuma gəlmədi.

*15.10.1999*

## ÖNÜNDƏKI UŞAQ DEYIL

Başa düşdüm kimliyini,
Fərağımız uzaq deyil.
Çək sinəmdən kipriyini,
Sinə sənə varaq deyil.

Aman vermir duman günə,
Saldın məni yaman günə,
Daha pərişan zülfünə
Barmaqlarım daraq deyil.

Görüş - yenə diləyinmi?
Oduna su çiləyimmi?
Diş busəsi gərəyinmi?
Dişimdi bu, dodaq deyil.



Soruşursan necəyəm mən?
Ucalardan ucayam mən,
Dünyagörmüş qocayam mən,
Önündəki uşaq deyil.

*21.10.1999*

## TEZ UÇMUSAN TÜSTÜ KIMI

Ayrılığa boyun əydim,
Taleyimin qəsdi kimi.
Heç gərəkmi əyiləydim
Meyxanənin məsti kimi.
Geri dönməyin gümandır,
Ayrılığın nə yamandır?
Səsim çıxmır nə zamandır
Aşiqlərin süstü kimi.

Sirdaşlığı sən danmısan,
Tənhalığa heyranmısan?
Yaş sərv tək gec yanmısan,
Tez uçmusan tüstü kimi.

*22.10.1999*

## HANI, QOLUM NECƏ OLDU?

Ey sevənlər, bu nə işdi,
O sevgilim necə oldu?
Qəlbimdə eşq güllənmişdi,
Mənim gülüm necə oldu?

Gözdən getməz bu nəm daha,
Ömürlükdür bu qəm daha,
Yarı quca bilməm daha,
Hanı, qolum necə oldu?

Dilimdə şəkər qalmadı,
Sözümdə kəsər qalmadı,
Şahindən əsər qalmadı,
Yandım, külüm necə oldu?

*1.12.1999*

## QOCALIQDAN XOŞUM GƏLIR

Bu aşiqə cəza gəldi,
Yarı getdi, cəfa gəldi.
Bəsla üstdən bəla gəldi,
Xəta üstəlik gəlməsin.

Gözlərimə nəm düşməsin,
Ürəyimə qəm düşməsin,
Əlimdən qələm düşməsin,
Əlimə çəlik gəlməsin.

Altıncı on yaşım gəlir,
Əsə-əsə qışım gəlir,
Qocalıqdan xoşum gəlir,
Təki xəstəlik gəlməsin.

*22.12.1999*

## ŞAHIN, DEMƏ QOCALMIŞAM

Gəldi bahar, yedi qarı,
Yel tufandan bizə qalıb.
Kül - ocağın yadigarı,
Gül - bağbandan bizə qalıb.

Hər gün şer gözləyirəm,
Ilhamıma "döz" deyirəm,
Neçə ildir söz deyirəm,
Həvəs yenə sözə qalıb.

Xərac verib bac almışam,
Altmışa ucalmışam,
Şahin, demə qocalmışam,
Hələ qırx il yüzə qalıb.

*1.01.2000*



## DIL BIR CÜRƏ, GÖZ BIR CÜRƏ...

Dərs öyrədir mənə fələk:
"Poz bir cürə, düz bir cürə".
Bağbana söyləyir çiçək:
"Ək bir cürə, üz bir gücə".

O gülə bax, bağrıqandı,
Bülbülün də bağrı - qandı...
Hər ikisi yandırandı,
Od bir cürə, köz bir cürə.
Şahin, eşqə məşəl deyir,
"Uç, uç" deyir, "yüksəl" deyir,
"Get-get" deyir, "gəl-gəl" deyir
Dil bir cürə, göz bir cürə.

*21.01.2000*

## ŞƏKƏR DƏ VAR, ZƏHƏR DƏ VAR

Sözlərimdə təzad kimi
Fərəh də var, kədər də var.
Yaxşı oxu qəzəlimi,
Şəkər də var, zəhər də var.

Rahatlığı aldı bizdən,
Söz yadigar qaldı bizdən,
Yarım, bizə eşqimizdən
Zərər də var, səmər də var.

Sevinc gördüm gül üzündə,
Yenə qaldı göz gözündə...
Süvariyəm "Söz düzü"ndə,
Kəhər də var, yəhər də var...

*27.01.2000*

## GÜNƏŞIN NƏ GÜNAHI VAR?

Başlandı yenə sürgünüm,
Yüz kədəri, min ahı var.

Qaradırsa əgər günüm,
Günəşin nə günahı var?

Kədər yenə mələr canda...
Çoxalsa da kədər canda
Bu aşiqin hər məkanda
Allah kimi pənahı var.

Gecəm yenə zar gecəsi,
Şahinin yanar gecəsi...
Hər sabahın var gecəsi,
Hər gecənin sabahı var.

*23.05.2000*

## ƏCƏL MƏNDƏN SORUŞARSA

Qaya gördüm gül çıxarıb,
Solub amma gülüm mənim.
Uşağa bax, dil çıxarıb,
Neçin susub dilim mənim?

Günüm ilimi kəsibdir,
Bəmim zilimi kəsibdir,
Qəməm əlimi kəsibdir,
Qələm tutmur əlim mənim.

Tanrı səni qoruyarsa,
Mənliyini qoru, varsa.
Əcəl məndən soruşarsa:
Həyat sənin, ölüm mənim.

*23.06.2000*

## SÖZÜM DILIMI YANDIRIR

Od da özüm, ocaq da mən,
Közüm külümü yandırır.
Çıxan kimi ürəyimdən
Sözüm dilimi yandırır.



Yandırıb çox diləyimi
Alov dilli məşəl kimi...
Söz var yaxır ürəyimi,
Söz var əlimi yandırır.

Mənim varım qəzəl varı,
Əcnəbi söz gülün xarı,
Biçim gərək alağları,
Alağ gülümü yandırır.

*9.07.2000*

## VƏTƏNDƏN NƏ ISTƏYIRSƏN?

Bu vətəni talayıblar,
Vətəndən nə istəyirsən?
Nə gülü var, nə otu var,
Çəməndən nə istəyirsən?

Aşiq - fərağın qurbanı,
Lalə - alağın qurbanı,
Fərhad - bir dağın qurbanı,
Düzəndən nə istəyirsən?

Əsgər var! Meydanı yoxdur.
Xəncər var! Qalxanı yoxdur.
Quruyub, bağbanı yoxdur,
Süsəndən nə istəyirsən?

Meyxanəsindən cam küsüb,
Pərvanəsindən şam küsüb,
Pəri qaçıb, ilham küsüb,
Küsəndən nə istəyirsən?

Qələmim, yaza bilmirəm,
Özümü asa bilmirəm,
Qəbrimi qaza bilmirəm,
Sən məndən nə istəyirsən?

*20.02.2000*

## GÖYDƏ YERIM VARMI GÖRƏN?

Taqətim əriyib gedib,
Qalxım, heyim varmı görən?
Çomağım çürüyüb gedib,
Çoban, neyim varmı görən?

Zər gəzmirəm viranədə,
Bağda gözüm hey nanədə,
Çoxdan yoxam meyxanədə,
Saqi, meyim varmı görən?
Az getməyə, çox getməyə,
Ac getməyə, tox getməyə,
Yerdə yerim yox getməyə,
Göydə göyüm varmı görən?

*17.08.2000*

## QALIB

Gəl kömək ol mənə, canan,
Əl tutmaq Əlidən qalıb.
Qan tökmək qansız adamdan,
Qan sormaq zəlidən qalıb.

Yazıram ər Koroğludan,
Ər olmaz hər Koroğludan...
Bu qılınc nər Koroğludan,
O zəncir dəlidən qalıb.

Gözəlim, telindən tutum,
O incə belindən tutum,
Gəl sənin əlindən tutum,
Əl tutmaq Əlidən qalıb.

*25.09.2000*

## PARTLADI

Daş dövründən qalan daşım -
Daşım partladı, partladı.



Gözlərimdən axan yaşım,
Yaşım partladı, partladı.

Ötən günü axtar, ara,
Yollamışıq onu hara?
Qarabağın bağı qara!..
Başım partladı, partladı.

Şahin şerə "uca" dedi!..
Əruz dedi, heca dedi...
Biri mənə qoca dedi,
Yaşım partladı, partladı.

*11.06.2001*

## GÖZÜMƏ KIPRIYIN BATDI

Sevgisini sənə dedi
Sözüm xoşlandı, xoşlandı.
Əlindən bir şillə yedi,
Üzüm xoşlandı, xoşlandı.

Doğacaqmı gün üzümə?
Bax gecəmə, gündüzümə...
Daş atdın dəydi dizimə,
Dizim xoşlandı, xoşlandı.

Əzabın Şahinə çatdı,
Saxlayıram, amanatdı,
Gözümə kipriyin batdı,
Gözüm xoşlandı, xoşlandı.

*7.07.2001*

## KÜLÜM ILƏ OYNAYIRAM

Il yaşadım mən hər gündə,
Ilim ilə oynayıram.
Qocalıram, toy-düyündə
Zülüm ilə oynayıram.

Ölüm edir ölü sağı,
Kimə dostdur, kimə yağı...
Sevməsəm də oynamağı
Ölüm ilə oynayıram.

Kəsiləndə əl ağacı
Qələm mənə əl ağacı...
Söz deyirəm hərdən acı,
Dilim ilə oynayıram.

Yaxınlaşdım addım-addım,
Çox uzaqdım, fəqət çatdım,
Əfv et, sənə əl uzatdım,
Əlim ilə oynayıram.

Ilhamını kim dindirib?
Kim Şahini sevindirib?
Əfsus, odumu söndürüb
Külüm ilə oynayıram.

*31.12.2001*

## YANDIRIR

Göz yaşım axa bilməyir,
Dərdim üzümü yandırır.
Gözümdən çıxa bilməyir,
Yaşım gözümü yandırır.

Dost qibtəsi, yad hıkkəsi,
Eh, yaxşı bildim pis kəsi...
Çölüm neçə xəbis kəsi,
Içim özümü yandırır.

Şahin, səma məni yıxır,
Əlimdən şikar, ov çıxır,
Ürəyimdən alov çıxır,
Alov sözümü yandırır.

*3.01.2002*



# NƏĞMƏLƏR

## ÜRƏYIMI ÜZMÜSƏN

Eşqin çiçəyim idi,
Çiçəyimi üzmüsən.
Çiçək diləyim idi,
Diləyimi üzmüsən.

Peymanın gərəyimdi,
Ilqarın əməyimdi,
Köməyin köməyimdi,
Köməyimi üzmüsən.

Telim telinə dəymir,
Qolum belinə dəymir,
Əlim əlinə dəymir,
Biləyimi üzmüsən.

Göz yaşın süzülməsin,
Muncuq tək düzülməsin,
Ürəyin üzülməsin,
Ürəyimi üzmüsən.

*23.12.1995*

## "ŞAHNAMƏ"SI ÜRƏKDƏDIR

*Mahnı Tofiq Bakıxanov tərəfindən Iran səfəri zamanı dahi fars şairi Əbülqasim Firdovsinin xatirəsinə bəstələnmişdir.*

Firdovsini yad elədik,
"Şahnamə"si ürəkdədir.
Dönə-dönə rəhmət dedik,
"Şahnamə"si ürəkdədir.

Bağban varsa, çiçək də var,
Cahan varsa, dilək də var,

Insan varsa, ürək də var,
"Şahnamə"si ürəkdədir.

Yaşamayıb ömrü hədər,
Şöhrəti var dünya qədər,
Şahlar gələr, şahlar gedər,
"Şahnamə"si ürəkdədir.

Əsrlərdə qalan kəsin,
Min yaşına dolan kəsin,
Şerin şahı olan kəsin
"Şahnamə"si ürəkdədir.

Yeri vardır hər könüldə,
Ötsə neçə ay da, il də,
Firdovsinin adı dildə,
"Şahnamə"si ürəkdədir.

*21.04.1997*

## MƏN SƏNDƏN SOYUMUŞAM

Eşqim isinə bilmir,
Mən səndən soyumuşam.
Ürəyim dinə bilmir,
Mən səndən soyumuşam.

Yetirmi səsim sənə?
Kim qarğıdı, kim sənə?
Soyuq deyildim sənə,
Mən səndən soyumuşam.

Əhdə sədaqətin yox,
Əvvəlki ülfətin yox,
Odun, hərarətin yox,
Mən səndən soyumuşam.

Məni salıb fəryada
Sirrimi dedin yada...
Canımda od varsa da,
Mən səndən soyumuşam.

Bilirdin diləyimi,
Sındırdın ürəyimi...



Istiydim kürə kimi,
Mən səndən soyumuşam.

Qorumadıq eşqi biz,
Yaşayırıq eşqsiz,
Soyuqladı eşqimiz,
Mən səndən soyumuşam.
Şahin deyir: - Ey mələk,
Sənə qarşı bu ürək
Bir də isinməyəcək,
Mən səndən soyumuşam.

*10.07.1997*

## VƏTƏNDƏN AYRI

*Məmmədbağır Bağırzadə tərəfindən bəstələnmişdir.*

Mən yana-yanə qalmışam vətəndən ayrı,
Qəlbi əzabə salmışam vətəndən ayrı.
Mən vətəni, vətən məni görərmi bir də?
Qüssə-xəyalə dalmışam vətəndən ayrı.

Vətən mənə vüsal dedi fərağə düşdüm,
Arzulayıb yaxınlığın uzağə düşdüm,
Mən vətəni qeyb eləyib sorağə düşdüm,
Mən yana-yanə qalmışam vətəndən ayrı.

Çəmənsizəm, gözlərimə çəmən görünmür,
Nərgiz hanı, lalə hanı, süsən görünmür,
Hey baxıram vətən sarı, vətən görünmür,
Mən yana-yanə qalmışam vətəndən ayrı.

Göz görəsi zar olmuşam gözüm yolunda,
Hicrə giriftar olmuşam gözüm yolunda,
Gör necə naçar olmuşam gözüm yolunda,
Mən yana-yanə qalmışam vətəndən ayrı.

Üzülmüşəm, qəribliyin üzgünüyəm mən,
Qürbət elin, yad diyarın sakiniyəm mən,
Indi qərib səmalərin şahiniyəm mən,
Mən yana-yanə qalmışam vətəndən ayrı.

*25.06.1998*

## ƏLLƏRINI VER MƏNƏ

Köməyimə gəl mənim,
Əllərini ver mənə.
Ətək sənin, əl mənim,
Əllərini ver mənə.

Hər gülə bülbül gərək,
Qəlb evimə gül gərək,
Əllərimə əl gərək,
Əllərini ver mənə.

Ömrümün ey mərcanı,
Bitdi daha hicr anı,
Şillələdim hicranı,
Əllərini ver mənə.

Gəl bəri - nisgil acı,
Bilməyəcək dil - acı.
Əl acıyam, əl acı,
Əllərini ver mənə.

Kimsə - gülün möhtacı,
Kimsə - telin möhtacı,
Mənsə - əlin möhtacı,
Əllərini ver mənə.

Dodaq sənin, bal mənim,
Yanaq sənin, xal mənim,
Əllərimi al mənim,
Əllərini ver mənə.

El gücüdür sel gücü,
Sel gücüdür el gücü,
Əl gücüdür əl gücü,
Əllərini ver mənə.

*12.08.1998*

## SƏN YANIMA GƏLƏNDƏ

Gedir, dərd-ələm gedir.
Sən yanıma gələndə.



Canımdan sitəm gedir,
Qüssə gedir, qəm gedir
Sən yanıma gələndə.

Yandırdığın yara yan,
Ürəyimə sevinc ək.
Hicran çıxır aradan,
Vüsal gəlir sevincək
Sən yanıma gələndə.

Sənin gəlişin - bəsim!
Həzin qəlbim ovunur.
Dodağıma təbəssüm,
Üzümə sevinc qonur
Sən yanıma gələndə.

Fikrin sözlərimdədir,
Dağılır dərdi-sərin.
Gözün gözlərimdədir,
Əllərimdə əllərin
Sən yanıma gələndə.

Qətrə düşür gül çalır,
Darağ dəyir tel çalır...
Mahnı deyir, rəqs edir,
Yanımda həzz əl çalır
Sən yanıma gələndə.

Sanki sərəncam gəlir,
Dərdə hər əncam gəlir,
Qarşıma içilməyə
Sevgi dolu cam gəlir
Sən yanıma gələndə.

Gülüm, aşiqbaşı tək
Halım yaman xoş olur.
Şahin şahin quşu tək
Şikarına tuş olur
Sən yanıma gələndə.

*16.10.1998*

## SƏNİ BAĞIŞLAMARAM

Hər küsən barışsa da,
Səni bağışlamaram,
Yer göyə qarışsa da,
Səni bağışlamaram.

Olma ümidvar mənə,
Aləm olub dar mənə,
Eyləmə israr mənə,
Səni bağışlamaram.

Qəlb yenə sevə kini?
Yığdım bu evə kini,
Orda var dəvə kini,
Səni bağışlamaram.

Az deyimmi, çox sənə?
Tuşlayımmı ox sənə?
Qeyri sözüm yox sənə,
Səni bağışlamaram.

Nə durmusan, get daha,
Şahini tərk et daha,
And içirəm Allaha,
Səni bağışlamaram!

*22.04.1999*

## SƏN NƏYİMƏ GƏRƏKSƏN?

Çox dəymisən könülə,
Bir hiyləsən, kələksən.
Dönməyəcəksən gülə,
Sən soluxan çiçəksən.

Tanrı eşqə pənahsa,
Əməllərin günahsa,
Bu gün ələ, sabahsa
Ayağa düşəcəksən.

Əvvəl-axır, ey mələk,
Fərəh şamın sönəcək,
Sevincin tükənəcək,
Qəmlə görüşəcəksən.

Min bir vəfadarım var,
Eşqim kimi varım var,
Səndən gözəl yarım var,
Sən nəyimə gərəksən?

*14.09.1999*

## ÖZÜNDƏN SORUŞ

Get, əhvalımı
Özündən soruş.
Mənim halımı
Özündən soruş.

Qəlbi, ey sənəm,
Neçin sarıb qəm?
Deyə bilmərəm,
Özündən soruş.

Çıxarma yaddan,
Məni heç zaman
Soruşma yaddan,
Özündən soruş.

Bir sınıq neyəm,
Böyrü üstdəyəm,
Neçin xəstəyəm?
Özündən soruş.

*1.10.1999*

## FIRDOVSININ SÖZ DÜNYASI

*Musiqisi Tofiq Bakıxanovundur.*

Bənzəridir ayın, günün,
Firdovsinin söz dünyası.

Gövhəridir söz mülkünün
Firdovsinin söz dünyası.

Söz parladı, söz şam oldu,
Nizamiyə ilham oldu,
Füzuliyə ənam oldu
Firdovsinin söz dünyası.

Öz xalqının bal sözüdür,
Rüstəm sözü, Zal sözüdür,
Qızılgülün al sözüdür
Firdovsinin söz dünyası.

Xəzan deyil, güllü yazdı,
Əsrarəngiz bir avazdı,
"Şahnamə"siz yaşamazdı
Firdovsinin söz dünyası.

Həm surətdir, həm mənadır,
Həm sevdadır, həm qovğadır,
Bu dünyada bir dünyadır
Firdovsinin söz dünyası.

*1.05.2002*

## BAYATILAR VƏ VARSAĞILAR

Kefim çağ olsun gərək,
Qara ağ olsun gərək,
Qarabağı almasaq
Bığ yasaq olsun gərək!

Hardadır?
Qara! Ağım hardadır?
Qəlb necə geniş olsun,
Qarabağım dardadır.
Büsatım qara oldu,
Həyatım qara oldu,
Qarabağı itirdim,
Nabatım qara oldu.



Bağ gülü,
Bağ çiçəyi, bağ gülü.
Bir də açılacaqmı
Qarabağın ağ gülü?

Çəpər də güllələndi,
Nələr də güllələndi...
Qocaldım, əy Xocalı,
Şəhər də güllələndi.
Qəlbin ilhamı uçub,
Şerimin tamı uçub,
Damtikənlər hardadır,
Ağdamın damı uçub.

Kədərdədi Xankəndi,
Qəhərdədi Xankəndi,
Xandaydı, işə bax ki,
Nökərdədi Xankəndi.

Qoşasız,
Zərim gəldi qoşasız.
Çoxdan görə bilmirəm,
Darıxmışam Şuşasız.

Ağ dama,
Qara demə ağ dama.
Ürəyimə qoy mənim
Dağ edilmiş yağ dama.

Səsim ellərdə qaldı,
Sözüm dillərdə qaldı,
"Nahaq qan yerdə qalmaz",
Nahaq qan yerdə qaldı.

O kəndi,
O şəhəri, o kəndi
Bir də haçan görərəm?
Daha səbrim tükəndi.

Mən aşiqəm, bağa bax,
Dönüb sola, sağa bax.
Köksünə dağ basdılar,
Qarabağda dağa bax.

Ağ, qara,
Qarabağda bağ qara.
Yurduma qəsd edənin
Günü olacaq qara.

Əzizim, bağım hanı?
O xoş növrağım hanı?
İtirib deyirəm ki,
Xan Qarabağım hanı?

Laçın, he-ey,
Laçına yol açın, he-ey,
Qaçqınlarım, indi də
Laçın sarı qaçın he-ey!..

*31.01.1999*

***

Qudyala,
Yolum düşdü Qudyala.
Mən ki odam, Qudyalım,
Dodağımdan od yala.

***

Əzizinəm, bağda gül,
Bağda çiçək, bağda gül.
Ətrini tər güllərin
Ətirçi, çək, bağda gül.

***

Məyusam mən,
Qürbətdə məyusam mən.
Neynirəm qızıl teşti
İçində qan qusam mən.

***

Güllərim,
Bağçada yox güllərim.
Bağban olub istərəm
Gül becərim, gül dərim.



***

Yar andı,
Yar peymanı, yar andı.
İki könül bir oldu,
Bir məhəbbət yarandı.

***

Köçəri bir quşam mən,
Yurddan qovulmuşam mən.
Torpağımdan ayrılıb
Didərgin olmuşam mən.

***

Yuxu gördüm, çin oldu,
Kədərim min-min oldu.
Özüm cilayi-vətən,
Adım didərgin oldu.

***

Ölümdən beşbetər gün!..
Olmaz bundan betər gün.
Fərariyəm, fərari,
Didərginəm, didərgin.

***

Ağrıdı,
Dağın adı Ağrıdı.
Hətta ağrımı duyub
Ağrı dağı ağrıdı.

***

Məzarda göynər dədə,
İgid dədə, ər dədə.
"Yurda qayıdın" deyir
Aşıq Ələsgər dədə.

***

Zillətinə dözüm yox,
Möhnətinə dözüm yox.
Ey hicran, yenə gəldin,
Daha sənə sözüm yox.

***

Sözüm var deyiləsi:
Deyilərn əyiləsi.
Qürbət yenə "gəl" desə
Öləsiyəm, öləsi!

***

Əzizinəm, nə sirdir?
Bilmirəm heç nə sirdir!..
Yoxsa əsarət, neçin
Şahın eşqə əsirdir?

***

Nə dərdi?
Vecsiz kəsin nə dərdi?
Nə yoğurdu, nə yapdı,
Nə becərdi, nə dərdi.

***

Çoxalan azalarmış,
Çoxun da azı varmış.
Yazıya pozu yoxdur?
"Ömrün də yazı varmış".

***

Bu dünya gidi dünya,
Dəlidi-nədi dünya? -
Atından yerə saldı
Neçə igidi dünya.

***

Bu dünya ulu dünya,
Atəşli, sulu dünya.
Heyf ki, insanla az,
Adamla dolu dünya.

***

Bu dünya güllü dünya,
Tikanlı, güllü dünya.
Neçin bayquşun da var,
Dünya, bülbüllü dünya?



***

Bu dünya ana dünya,
Bu dünya sona dünya.
Qorxuram gələ bir gün
Alışa, yana dünya.

***

Bu dünya dəli dünya,
Kinli, hikkəli dünya.
Döyür hey başımıza
Allahın əli, dünya!

***

Dünyada talan nə çox!..
Pis nə çox, yalan nə çox!..
Dərdimi çəkən yoxsa,
Canımı alan nə çox!..

***

Dünya, sən-mənli dünya,
Dumanlı, çənli dünya.
Silkələnir, fırlanır,
Hamıya nənni dünya.

***

Fərəhli, qəmli dünya,
Həzzli, ələmli dünya.
Dünya, həyatlı dünya,
Dünya, ölümlü dünya.

***

Vətəndir,
Bakı - Təbriz vətəndir.
Vətən torpaq, duz-çörək,
Vətən VƏTƏN və MƏNdir.

***

Vətəndir,
Neçin pərən-pərəndir?
Şahdağ da, Savalan da,
Bircə qum da vətəndir.

***

Vətəndir,
Vətən inci, vətən dürr.
Qalsam torpağın üstü,
Ölsəm altı vətəndir.

***

Vətən yar,
Vətəndaşa vətən yar.
Ölsəm yar ürəyimi,
İçindən vətən çıxar.

***

Vətəndən,
Əl üzmərik vətəndən.
Vətən Şuşa, Urmiyə,
Vətən sənsən, vətən mən.

***

Vətəndən,
Vətən çörək, vətən dən.
Vətən acı olarsan,
Üz çevirsən vətəndən.

***

Vətən baş,
Vətəndaşam, vətəndaş.
Yolunda baş verərəm,
Vətən ümdə, vətən baş.

***

Vətən yox,
Vətən süngü, vətən ox.
Fələstinə vətən var,
Fələstinə vətən yox.

***

Vətənim,
Yas da, toy da vətənim.
Vətən boyda dünyam var,
Dünya boyda vətənim.

***

Vətənsiz,
Quş da olmaz vətənsiz.
"Məndən başlanır vətən" *,
Vətən mənəm, vətən siz!

***

Dərd məni,
Öldürər bu dərd məni.
Vursa da qoy mərd vursun,
Vurmasın namərd məni.

* Misra Xəlil Rzanındır.



***

Bu dağa,
Bu dərəyə, bu dağa.
Gəl mənə çəkdirmə dağ,
Verək dodaq-dodağa.

***

Yan durur,
Həzz canımdan yan durur.
Aləmi od, mənisə
Araz suyu yandırır.

***

Dağımı,
Gör sinəmdə dağımı.
Araz çayı bıçaq tək
Kəsibdir torpağımı.

***

Arazım, yan,
Yanıram, Arazım, yan.
Sərhədsiz qalım deyə
Keçərəm Arazımdan.

***

Ov cuma,
Ovçu qaça, ov cuma.
Gərək Arazı içəm
Dolduraraq ovcuma.

***

Bu xara,
GÜL neyləsin bu xara?
Təki sərhəd olmasın,
Araz dönsün buxara!

***

Vətənə,
Bəndəm, düzü, vətənə.
Vətəndən ayrı ölsəm,
Dəfn et üzü vətənə.

***

Çəmən də bölünərmiş,
Düzən də bölünərmiş...
Bez kimi, kətan kimi
Vətən də bölünərmiş.

***

Neçin siz bizə həsrət?
Neçin biz sizə həsrət?
Neçin Təbriz Bakıya,
Bakı Təbrizə həsrət?

***

Qardaş qardaşa həsrət,
Sirdaş sirdaşa həsrət...
Vətənimi bölənin
Başı bir daşa həsrət.

***

Gülüstandı... və çaydı...
Kimə həzz, kimə vaydı...
Kaş solaydı Gülüstan,
Türkmənçay quruyardı.

***

Göz qara,
Qaş qaradır, göz qara.
Gərək elə ömr edək
Ki, olmasın üz qara.

***

Başındakı şal qara,
Üzündəki xal qara.
Vətənim tək bəlalı
Ölkə axtar, xalq ara.

***

Gün qara,
Dərd əlindən gün qara.
Bir ağ günəşə qarşı
Neyləyəcək min qara?



***

Ağ, qara,
Qarabağdah bağ qara.
Yurduma qəsd edənin
Günü olacaq qara.

***

Ağ, qara,
Mənim saçım ağ, qara.
Azərbaycan birləşsə,
Yenə olacaq qara.

***

Sözüm gəzir,
Vətəndə sözüm gəzir.
Söz də, göz də ayaqlı,
Çöhrəndə gözüm gəzir.

***

Göz qara,
Göz badamı, göz qara.
Qaralsa göz qaralsın,
Qoy olmasın üz qara.

***

"Göz üstdə",
Mən deyərək "göz üstdə"
Qarşısında yarımın
Dayanmışam diz üstdə.

***

Gözümə bax,
Söz deyim sözümə bax.
Hicrana ki dözmüşəm,
Sən məndə dözümə bax.

***

Qar aya,
Sanki yağıb qar aya.
Göz üstdəki qaşa bax,
Göz altdakı qaraya.

***

Öldürdülər, öldülər,
Barışdılar, güldülər,
Axırda cəllad kimi
Vətənimi böldülər.

***

Məndəki qəm yüküdür,
Zülm, sitəm yüküdür.
Ikilər bir olurlar,
Azərbaycan ikidir.

***

Varı var
Hər kimin ki yarı var.
Səndə nə var bilmirəm,
Məndə sevgi varı var.

***

Sinə dağ,
Nə yaraşır sənə dağ!..
Sinəsi dağlı gözəl,
Məni etmə sinədağ.

***

Eşqə çat,
Sevgiyə dal, eşqə çat.
Dünyanı əvvəl-axır
Eləyəcək eşq abad.

***

Eşqə çat,
Yarını sev, eşqə çat.
Sevməyi bacarmasan,
Xacə kimi eşqi at.

***

Yan asan,
Alış asan, yan asan.
Gərək yarın yolunda
Kərəm kimi yanasan!



***

Dan yeri,
Sübhün qızaran yeri.
Düşməndən yara alsan,
Ağrımaz yaran yeri.

***

Qan yeri,
Sinəndə var qan yeri.
Səni dost yaralasa,
Ağrıyar yaran yeri.

***

Duman yeri,
Çən yeri, duman yeri.
Yox etmə gümanımı,
Sənədir güman yeri.

***

Aran yeri,
Dağ yeri, Aran yeri.
Hər yeri vətənimin
Mənə şərəf, şan yeri.

***

Qüssəmin,
Əsiriyəm qüssəmin.
Əgər sevinc birsə də,
Ürəyimdə qüssə min.

***

Cücərmədi,
Bu toxum cücərmədi.
Kor bəxtim bu toxumun
Meyvəsini dərmədi.

***

Ap-aydın,
Yazdıqların ap-aydın.
Məktubun tapdı məni,
Kaş ki özün tapaydın.

***

Əzizinəm, vətən gül,
Çəmən çiçək, düzən gül.
Mən qürbətdən dönmüşəm,
Əziz yarım, bəzən, gül.

***

Qurban olum səsinə,
O isti nəfəsinə.
Yarım tez qayıtsın ki,
Can qıza, ev isinə.

***

Var gülü,
Var çiçəyi, var gülü.
Bitib yar dodağında
Sevginin qaynar gülü.

***

Hər ağacın var gülü,
Heyva gülü, nar gülü...
Şahin gülü qoparmaz,
Şahin salamlar gülü.

***

Axı, bizim yar gülü
Öpüb oxşayar gülü.
Dimdiyində, göyərçin,
Yarıma apar gülü.

***

Saxlasın gül,
Ətrini saxlasın gül.
Gül aparım gül yara,
Qoy gülü qoxlasın gül.

***

Vətənim var,
Ikitay vətənim var.
Gör nə şirin pay imiş -
Ikipay vətənim var.



***

Cəfakeş deyim sənə,
Bəlakeş deyim sənə.
Sənin birləşməyindən
Söz açmayır kimsənə.

***

Hardadır?
Varın ki var, hardadır?
Sənin qəmini çəkən
Bir havadar hardadır?

***

Dinəydi,
Dostun, yarın dinəydi.
Nüfuzlu kürsülərdən
Xilaskarın dinəydi.

***

Kefdi, neynim?
Özgəyə kefdi, neynim?
Zərəri çox, nəfi az,
Mən belə nəfi neynim?

***

Ad qalıb,
Sərbəstlikdən ad qalıb.
Bizdən əl çəkməyirlər,
Damağlarda dad qalıb.

***

Azər var, bay var, can var,
Iki Azərbaycan var.
Xəritədə bu adda
Niyə iki məkan var?

***

Bada verdik fürsəti,
Yada verdik fürsəti.
Iki yerə bölündü
Azərbaycan dövləti.

***

Düzlük zəfər çalmayır,
Ədalət ucalmayır.
Görən haram mal neçin
Boğazlarda qalmayır?

***

Tez edən,
Ay bu işi tez edən,
Nə zaman birləşəcək
Azərbaycan təzədən?

***

Bir əlimdə lalə var,
Birində piyalə var.
Yarım gəlib çıxmadı,
Ürəyimdə nalə var.

***

Lalə düz,
Lalə-düzən, lalə-düz...
Ey Şahin, yarın gəlir,
Yollarına lalə düz.

***

Lalə dər,
Dağ döşündən lalə dər.
Lalənin gözəlliyi
Bir gün məni lal edər.

***

"Lalə üz",
Bir də demə "lalə üz".
Yarım canlı lalədir,
Lalə-dodaq, lalə-üz.

***

Buxağı xal iləndi,
Dodağı bal iləndi.
Yara eşqimi açdım,
Yanağı lalələndi.



***

Lalə itdi,
Qış getdi, lalə itdi.
Yardan bir busə aldım,
Üzündə lalə bitdi.

***

Lalə - siz,
Ey gözəllər, lalə - siz!
Qoymasın Allah bizi,
Qərənfilsiz, lalәsiz!

***

Ah-fəğandı hicr anı,
Nə yamandı hicr anı!..
Hicranın vüsalı yox,
Vüsalınsa hicranı.

***

Əkil-bəkil quşarn mən,
Dərdə-qəmə tuşam mən.
Dünya bir gün görəcək
Yoxam mən, uçmuşam mən.

***

O dünyaya düşərik,
Əlbəttə, görüşərik!
Yaxşı kəslər, sağ olun,
Cənnətdə görüşərik!

***

O şən könül nə oldu?
Sevən könül nə oldu?
Bağrı yandı bülbülün,
Hanı, o gül nə oldu?

***

O ay, o il hardadır?
O söz, o dil hardadır?
Bir vaxt soruşacaqlar:
Şahin Fazil hardadır?

***

Çox yerin var aşığı,
Mən aşıq yar aşığı.
Yar olmasa pozular
Dünyanın yaraşığı.

***

Hörmətim var aşığa,
Rəğbətim var aşığa.
Yar elin yaraşığı,
Aşığam yaraşığa.

***

Söyləyib "yaraşıqsan",
Sevgini yaraşıq san.
Şahin elə aşıq ki,
Əl çəkmir yar aşıqdan.

***

Şahin, a yar aşığı,
Şahin tək yara şığı!
Gərək sən kimi yarın
Yar ola yaraşığı.

***

Baharı qışa döndü,
Incidi, Şuşa döndü...
Şuşanı görmək üçün
Ürəyim quşa döndü.

***

Əzizinəm, Milə var,
Muğana çat, Milə var.
Mey camını aparma,
Içində bir gülə var.

***



Xoş apar,
Salamımı xoş apar.
Saqican, piyaləmi
Dolu gətir, boş apar.

## TƏBRİKNAMƏLƏR

*Yazıçı dostum Əlibala Hacızadənin 60 baharı münasibətilə*

Bəllidir, xeyli görübdür qoca dövran - dostu,
Dost hər ləhzə gərək eyləyə heyran dostu.

Bu gözəl gündə qəzəl şövqü ilə vəcdə gəlib
Məşədi Əlbalanın adi qəzəlxan dostu.

Dostlarım var idi meyxanədə bir vaxt çoxlu,
Məni cəlb eyləmədə indisə meydan dostu.

Sənlə qürbətdə keçən günləri yad eyləyirəm,
Olmuşuq gör neçə illər boyu hicran dostu.

Qoca əfqan eli, Iran eli də dostundur,
Kim görüb dost eləyə dostuna qurban dostu?

Iranın Azəribaycanda olan dostu nə çox!..
Irana verdi əlin Azəribaycan dostu.

Dostların gör nə qədər, amma ki, cananın bir!..
Aşiqin olmalı bir sevgili canan dostu.

Şahina, mən sıxıram Əlbalanın əllərini,
Mən kiməm? Əlbalanın köhnə bir "əfqan" dostu.

*21.09.1995*

***

*"Füzuli ədəbi məclisi"nin yaranmasının bir illiyi münasibəti ilə*

Qabiliyyət sınağında dilimiz var bizim,
Dəyməsin göz, nə qədər qabilimiz var bizim.

Bircə il öncə "Füzuli ədəbi məclisi"ni
Bakıda təsis edən Mailimiz [1] var bizim.

Şübhəsiz, qarşıda vardır hələ çox illərimiz,
Geridə gör nə gözəl bir ilimiz var bizim.

Təbimiz, ilhamımız bir neçə dərya qədəri,
İnana bilməyirik sahilimiz var bizim.

Nikbin olsaq da, kədərdən yazırıq hərdənbir,
Qarabağ nisgili tək nisgilimiz var bizim.

Gələcəkdə neçə "Divan" olacaq hasilimiz,
Hasil axtarsan əgər hasilimiz var bizim.

Qənimiz [2], Şahidimiz [3], Ənvərimiz [4] var olsun,
Mahirü [5] Müştağımız [6], Kamilimiz [7] var bizim.

O əql sahibidir əqlə şəfa bəxş eylər,
Bəli, Namıq [8] kimi bir aqilimiz var bizim.

Var Südabə [9]. Sona [10] var, Natiqə [11] var, Şövkət [12] var,
Gülşənində qəzəlin çox gülümüz var bizim.

Ola bilsin gələcəkdə quracaq söz sarayı,
Rəhim [13] ismiylə ötən bülbülümüz var bizim.

Bəşirü [14] Arifimizdən [15] çoxunun yox xəbəri,
Zəkimiz [16], Tərlanımız [17], Amilimiz [18] var bizim.

Yazırıq gündə hərarətli şerlər, çünki
Cərəyan xəlq eləyən naqilimiz var bizim.

O ətirlər ki çəkirlər, sözümüzdən süzülür,
Bixəbərlər eləyir zənn hilimiz var bizim.

Ləqəbi Aşiq, adı Şıxlar [19] olan şair var,
Adı Şahin, ləqəbi Fazilimiz [20] var bizim.

*16.12.1995*

2. Həkim Qəni
3. Ələkbər Şahid
4. Ənvər Nəzərli
5. Ələmdar Mahir
6. Mirzə Müştağ
7. Kamil Sərbəndi
8. Namiq Şəfai
9. Südabə Cəlil
10. Sona Xəyal
11. Natiqə Yusifqızı
12. Şövkət Hicran
13. Rəhim Saraylı
14. Bəşir Əmiroğlu
15. Arıf Buzovnalı
16. Mir Cəlal Zəki
17. Tərlan Quliyev
18. Amil Məlikzadə
19. Şıxlar Aşiq
20. Şahin Fazil



***

*Ənvər Nəzərlinin 70 yaşı münasibətilə*

"Məcməş-şüəra" ordusa, əsgərdi Nəzərli,
Əsgərlərə sərkərdədi, sərvərdi Nəzərli.

Səyyarəsə "Məcməş-şüəra", peyki bizik, biz,
"Məcməş-şüəra" peyk isə, məhvərdi Nəzərli.

Allah-təala elə ilham ona vermiş,
Hər dəm yaradır söz zəri, zərgərdi Nəzərli.

İlhamı axır gur sulu çaylar kimi coşğun,
Qudyaldı, Kürəkçaydı və Tərtərdi Nəzərli.

Şirvan elinin bir neçə şirvanşalı olmuş,
Şirvanlıdı, şirvanşaha bənzərdi Nəzərli.

Sabirsayağı şerini hərdən eşidərkən,
Zənn eyləyirik Mirzə Ələkbərdi Nəzərli.

Yüzlərlə şer pəhlivanı varsa da bizdə,
Çox pəhlivanı sözlə yerə sərdi Nəzərli.

Şair görürəm fikri gözəllərdədi, amma
Bir guşədə, bir mizdi və dəftərdi, Nəzərli...

Tər söz bağının qönçəsini tutmuş əlində,
Gənclikdə şer qönçəsini dərdi Nəzərli.

Cahilləri, nadanları meydanda görəndə,
Kəskindi dili, fərz elə xəncərdi Nəzərli.

Yanmaqda vətən naminə, el naminə daim,
Atəşlərə yanmaqda səməndərdi Nəzərli.

Şahindi bu, Şahindi bu, Şahindi bu - fazil,
Ənvərdi bu, Ənvərdi bu, Ənvərdi - Nəzərli.

*11.01.1996*

## BITƏMƏNNA

*"Məcməüş-şüəra"nın üzvü Əliheydər Bitəmənnaya*

Dünya, mənə əta eylə
Qələm-dəftər bitəmənna.
Qəzəlimi, səda eylə
Deyim əzbər bitəmənna.

Səndə hər yan təmənnalı,
Gül, gülüstan təmənnalı,
Dava-dərman təmənnalı,
Qılınc-xəncər bitəmənna.

Şənlik etmək təmənnalı,
Həccə getmək təmənnalı,
Həzzə yetmək təmənnalı,
Qüssə-kədər bitəmənna.

Bağda bəhər təmənnalı,
Dağda nələr təmənnalı...
Səndə şəkər təmənnalı,
Ağu, zəhər bitəmənna.

Əqlə aqil təmənnalı,
Çaya sahil təmənnalı,
Şahin Fazil təmənnalı,
Əliheydər bitəmənna!

*22.01.1996*

***

*Füzulişünas alim Lalə Əlizadəyə*

Şairin ilhamı vardırsa əsər verməlidir,
"Mis gətir" söyləməyin zərgərə, zər verməlidir.

Hər sədəfdən ələ, məlumdur ki, gövhər gəlməz,
Gər sədəf yaxşısa, əlbəttə, gühər verməlidir.

Elmə eşq ilə, məhəbbətlə yetişmək mümkün:
Bunu elm əhlinə eşq əhli xəbər verməlidir.



Elmi irfan eləsən - şad olacaqsan, işə bax,
Meyi içsən əgər ifrat, kədər verməlidir.

Yarı əğyar ilə bir gözdə görən var, amma
Əlim əğyarə zəhər, yarə şəkər verməlidir.

Yaxşı şairlərin hər şeri zaman ötdükcə
Təbə güc, əqlə ziya, qəlbə təpər verməlidir.
Hey Füzuli babanın zəhmətini çəkmişsə,
Nəvənin zəhməti, əlbəttə, səmər verməlidir.

Var imiş çox bəhəri Laləmizin, ey Şahin,
Alimin elmi çiçəklənsə, bəhər verməlidir.

*7.02.1996*

## OQTAY ƏFƏNDININ ƏSƏRLƏRINDƏ...

*Oqtay Əfəndiyev... Oqtay Əfəndi... Göyçayda doğulub. Moskvada ali təhsil alıb. Şərqşünas olub. Aspirantura bitirib. Bakıya qayıdıb. Müxtəlif institutlarda işləyib. Elmlər doktoru olub. Ondan çox aspirant yetişdirib. Mən də onlardan biri olmuşam...*

*1981-ci il idi. Ikinci böyük monoqrafiyası çapdan çıxmışdı. Mənə verdiyi həmin kitabında "Ilk aspirantıma..." sözləri yazılmışdı. O vaxt onun 55 yaşı vardı. Indi mənim 55 yaşım var. Aspirantlığımdan illər ötüşüb. Amma mən hələ də onun aspirantıyam. Özü də ilk aspirantı!..*

*Indi onun şöbəsində işləyirəm. Vəzifəm də var. Müavinəm. Onunla yol yoldaşı da olmuşam. Moskvaya, Leninqrada, Tbilisiyə, Mahaçqalaya getmişik, Türkiyədə olmuşuq. Indi mənim də aspirantlarım var. Amma mən hələ də onun aspirantıyam. Özü də ilk aspirantı!*

*Oqtay müəllimə, onun 70-ci baharında öz dərin ehtiram və minnətdarlığımı bu şerimlə bildirirəm.*

Nə vaxt süqut edib Ağqoyunlular?
Səfəvi dövləti yaranıb haçan?
Görən, neçə məşhur Ağqoyunlu var?
Qızılbaşdan olub neçə hökmran?

Dövlətdən dövlətə söz aparan kim?
Əmir Div Sultanın nə olub adı?
Durmuş xan kim idi, Tozqoparan kim?
Təhmasib gücünü harda sınadı?

Ağzıvar Sultanın ağzı yoxdumu?
Qudurmuş Sultanı nədi qudurdan?
Öldürən çoxdumu, ölən çoxdumu?
Görən su ucuzdu, yoxsa qızıl qan?

Nəqbəçi nə təhər lağım atırdı?
Qoyub mancanağa atan daşı kim?
Şah Abbas nə üçün qızılbaş qırdı?
Təvaçi kim idi, qurçıbaşı kim?

Neçin lələ oldu Hüseyn bəy Lələ?
Məqamın bir başqa pilləsi yoxdu?
Harda öldürüldü Abdal bəy Dədə?
Neçin vuruşmağa gülləsi yoxdu?

Neçin ordubazar hərəmlə dolu?
Dürsədəf adında pəri kim idi?
Şahın nəyi idi Halvaçıoğlu?
Pərixan xanımın əri kim idi?

Rumlular kim idi, hayandaydı Rum?
Neçin türklər etdi Təbrizə hücum?
Bu qədər sualın cavabı məlum
Oqtay Əfəndinin əsərlərində.

Nə yolla qazanır xalq istiqlalı?
Zəfər təntənəsi, cəng qiylü qalı.
Kiçik bir ölkənin böyük amalı
Oqtay Əfəndinin əsərlərində.

Cığatay yürüşü, tatar hərbi var,
Ləzgi çarpışması, avar hərbi var,
Şirvan əsgərini zərbə zərbi var
Oqtay Əfəndinin əsərlərində.

Qönçə diləklərin çiçəklənməsi,
Ismayıl əzminin gerçəklənməsi,
Qızılbaş harayı, qızılbaş səsi
Oqtay Əfəndinin əsərlərində.

Imkansız fəryadı, imkanlı gücü,
Imkanın qılınclı, qalxanlı gücü,
Səfəvi qüvvəsi, Osmanlı gücü
Oqtay Əfəndinin əsərlərində.



Tayfanın üçü var, beşi, onu var,
Neçə hücumların önü, sonu var,
Qızılbaş papağı, sufi donu var
Oqtay Əfəndinin əsərlərində.

Niyyətin, diləyin gerçəkləşməsi,
Sözü düz deməyin gerçəkləşməsi,
Gərgin bir əməyin gerçəkləşməsi
Oqtay Əfəndinin əsərlərində.

Şahin ehtiramla deyəndi sözü,
Sözdən söz çəkərək bəyəndi sözü,
Neçə şah inamı, əfəndi sözü
Oqtay Əfəndinin əsərlərində!

*17.03.1996*

***

*Görkəmli rəssam Cabbar Quliyevə həsr olunur.*

Qəlbimdə mənim sevgi təki var da vardır,
Məlum, qəzəlim içrə gözəl yar da vardır.

Şəmin başına bir neçə pərvanə yığışmış,
Viranə könül varsa da, memar da vardır.

Çox qalmışıq illər boyu müşkillər içində,
Çox yaxşı ki, qəm var isə qəmxar da vardır.

Aşiqləri təsdiq görünür hər əməlimdə,
Əğyarləri, amma ki, inkar da vardır.

Qaynar sinəmin altı da od, üstü də oddur,
Amma, sinəm üstdə arabir tar da vardır.

Comərdliyi hər beynə yeritmək diləyim var,
Əldə çəkicim var deyə mismar da vardır.

Alim görürəm, eyləyirəm elminə şübhə,
Qəlbimdə əsl alimə iqrar da vardır.

Rəssam, elimin sönməyən ulduzları çoxdur,
Çək şəklini, var Əlbaba *, Gülxar ** da vardır.

* Əlibaba Məmmədov
** Gülxar Həsənova

Cəlb eyləməsin rəssamı tək dağ ilə səhra,
Yurdumda gülüstanü çəmənzar da vardır.

Qaryağdı var idi, adı Cabbar idi, səsli,
Şahin, əli rəng-fırçalı Cabbar da vardır.

*17.04.1997*

## QOCAMAN MÜƏLLIM ƏFRASIYAB MAQSUDOVUN 70 YAŞI MÜNASIBƏTILƏ

Günlər ki, keçirdim, mənə hərdən əzab oldu,
Bilməm nə təhər oldu ki, qəlbimdə tab oldu.

Məktəbdə müdam elmini artırdı müəllim,
Ustadlərin verdiyi hər dərs hesab oldu.

Hərdən sözümün tənəsi çox nakəsi kəsdi,
Hərdən də sözüm şəkkərə döndü, gülab oldu.

Aşiqlərə etdikcə ədəb dərsini tədris,
Zənn eyləyirəm xeyli günahım savab oldu.

Çox yaxşı ki, mən birkərəlik yurduma döndüm,
Qürbətdə ötən gün günü-gündən xarab oldu.

Var öylə suallar ki, cavab vermək əbəsdir,
Kim sorğu-sual etdisə şerim cavab oldu.

Mənalı qocalmaqda səadət görürəm mən,
Hər şəxsin həyatı neçə cildlik kitab oldu.

Yetmiş yaşa yetmək o deməkdir ki, ömürdə
Illərlə sevinc oldu, fərəh, iztirab oldu.

Saç-saqqalı ağ çox kişi vardırsa da, Şahin,
Ağsaqqalımız, bəlli ki, Əfrasiyab oldu.

*7.05.1997*



## MÜĞƏNNI DOSTUM ISLAM RZAYEVIN 60 YAŞI MÜNASIBƏTILƏ

Səni vəsf etməyə mail ki, bu ilham oldu,
Yarıda qalmadı niyyət, gözəlim, tam oldu.

Heç güman eyləməz idim sənə "Divan" yazaram,
Sanki həqdən mənə əmr oldu, sərəncam oldu.

Elə ki, görməyirəm mən səni yox aramım,
Sən dilaramı görən dəmdə dil aram oldu.

Sən könülsüz ki, gəlirsən yanıma, qəmlənirəm,
Sən gələn gün yanıma zənn elə bayram oldu.

Deməsinlər ki, mən hərdən meyə meyl eyləyirəm,
Bu nə rişxənddi göründü, bu nə eyham oldu?

Saqini görməyim üçünsə əgər meyxanə,
Sanmasınlar ki, bizim məqsədimiz cam oldu.

Saf qəzəl mülkümüzün sərvəri Şahinsə əgər,
Saf muğam aləminin sərvəri Islam oldu.

*27.10.1997*

## ZƏHMƏTIN BÜRÜYÜB ÖMRÜNÜ NURA

*General Oqtay Maqsudovun 60 yaşı münasibətilə*

Biz bu gün isti bir sevincə şərik,
Bu gün həzzimizə hüdud qoyulmaz.
Hamımız vətənin əsgərləriyik,
Amma hər əsgərdən general olmaz.

Sənin bu günündə gül qoxusu var,
Alağdan xalidir sinəndə könül.
Həyat cazibədar, gül cazibədar,
Kaş səni həmişə cəzb eləsin gül.

Gül-çiçək ətirli gün - ömrün tacı,
Qızılgül səninki, çiçək mənimki.

Sən zirvə yolçusu, mən ətək acı,
Zirvə sənin olsun, ətək mənimki.

Keçdiyin yollarda çox sınaq olub,
Düçar olmayasan daha səddə kaş.
Hamının yanında üzün ağ olub,
Çatasan bundan da uca həddə kaş.

Zəhmətin bürüyüb ömrünü nura,
Uca bir məqamda tutmusan qərar.
"Niyyətin harasa - mənzilin ora"
Söyləyib babalar, deyib atalar.

Bütün arzu-kamın yetib hasilə,
Məkrdən, hiylədən iraq olmusan.
Yanında silahın olsa da belə
Onu işlətməkdən uzaq olmusan.

Qanunu əlində bayraq eləyən
Hər kəsə afərin, hər kimə alqış.
Qanun məcəlləsi çərçivəsindən
Kənara çıxmayan hakimə alqış.

Qırx yox, əlli deyil, altmışdı bu,
Gedib çatıbsa da yaşın qış ömrü.
Qəlbi cavan kəsə qışdan nə qorxu,
Qorxuda bilərmi 60 ömrü?

Hamıya yaxşılıq niyyətin sənin,
Hələ pisliyini olmayıb görən.
O qədər böyükdür hörmətin sənin
Ifadə eləyə bilməyirəm mən.

Məqamın ucalsın sənin get-gedə,
Rütbən, arzumdur ki, çoxalsın yenə.
Göydəki ulduzun bir neçəsi də
Kaş yerindən qopub qona çiyninə.

Biz bu gün isti bir sevincə şərik,
Bu gün həzzimizə hüdud qoyulmaz.
Hamımız vətənin əsgərləriyik,
Amma, hər əsgərdən general olmaz!

*6.11.1997*



## BACIM NAIBƏNIN 60 YAŞI

*Kimya elmləri doktoru, professor bacım Naibə Musayevanın yubileyi münasibətilə*

Nəhayət, göründü, oldu aşikar
Bacım Naibənin altmış yaşı.
Altmış xəzandır, altmış bahar
Bacım Naibənin altmış yaşı.

Elm - təntənədir ona, qürurdur,
Elm - yollarında işıqdır, nurdur.
Nə qədər diləkdir, neçə uğurdur
Bacım Naibənin altmış yaşı.

Həyatın yazını, qışını görüb,
Fələyin atılan daşını görüb...
Bəlkə də bir əsrin işini görüb
Bacım Naibənin altmış yaşı.

Yolunda həmişə gül-çiçək olsun,
Zəhməti ömrünə qoy bəzək olsun.
Qardaşı deyir ki, mübarək olsun
Bacım Naibənin altmış yaşı.

Kim bəzək deyilsə həyata əgər
Ömürdən nə fayda, yaşdan nə səmər?
Ey Şahin, bəlkə də yüz yaşa dəyər
Bacım Naibənin altmış yaşı.

*5.04.1998*

## DÜNYA SƏNIN ÖZÜNDƏDIR

*Gülnigar Rəhimlinin "Dünya mənim özümdədir" kitabının təqdimat mərasimində oxunan şer*

Sahibi var sənin təki,
Dünya sənin özündədir.
Bizə özün demisən ki,
Dünya sənin özündədir.

Möhkəm dayan sözündə sən,
Kül saxlama közündə sən.

Sən dünyanın özündəsən,
Dünya sənin özündədir.

Xəzər, Şirvan yaşar səndə,
Aran, Muğan yaşar səndə.
Azərbaycan yaşar səndə,
Dünya sənin özündədir.

Var çox qəmim, gəlmir saya,
Var ələmim, gəlmir saya,
Gileyimi de dünyaya,
Dünya sənin özündədir.

"Torpaq batıb qana", söylə,
"Qan əllərdə xına", söylə,
Dərdimizi ona söylə,
Dünya sənin özündədir.

Allah qoysa nə cəng olar,
Nə dünyada tüfəng olar...
Əsl şair nəhəng olar,
Dünya sənin özündədir.

Şair böyük, məkan kiçik,
Mühit kiçik, zaman kiçik,
Dünya səndən yaman kiçik,
Dünya sənin özündədir.

*29.09.1998*

***

*Gülnigar Rəhimlinin "Dünya mənim özümdədir" kitabının təqdimat mərasimində oxunan qəzəl*

Təzadə tuş olub dünya: Əməl qeyri, qərar ayrı,
Könüldə başqa söz, amma divar üstdə şüar ayrı.

Məgər əğyar aşiqmi bilinsin sevginin qədri?
Məgər əğyar bilmir sarmaşıq ayrı, çinar ayrı?

Bu gün bağda solubdur gül, düşüb şaxta, ölübdür gül,
Pərişan olmasın bülbül, xəzan ayrı, bahar ayrı.



Qürurə mübtəla - qafil, vüqarə mübtəla - fazil,
Neçin bilmir bu gün cahil qürur ayrı, vüqar ayrı.

Qübar etmişsə də gər köksüm, qabar etmişsə barmağım,
Bu gün cismi sınaq eylər qübar ayrı, qabar ayrı.

Zəfər çalmazsa gər vəhdət, tamam gözdən düşər vəhdət,
Cəmaət bir çətinlikdə qalıbdır, hökmdar ayrı.

Məgər məxluq bilmirmi qiyamət adlı gün vardır?
Cahanın birdir Allahı, deyil Pərvərdigar ayrı!

Neçin birlik deyil mümkün fəna aləmdə, ey Tanrı,
Nigar ayrı, gül ayrı, Şahin ayrı, Gülnigar ayrı.

*29.09.1998*

## BABA PÜNHANA

*50 yaşı münasibətilə*

Çox gözəllər Babanın şerinə heyran oldu,
- Aşikarmış, - dedilər, - bəs niyə Pünhan oldu?

Çoxunun qəhrəmanı şerdə canansa əgər,
Babanın qəhrəmanı kilkə, badımcan oldu.

Babacan, qırx saçını, saqqalını qırxdırma,
Tərifi saqqalının aləmə dastan oldu.

Ağladıbsan anasın bir neçə məlun adamın,
Sənə yox fərqi məsihi, ya müsəlman olsun.

Eləyibsən elə tənqid haramzadələri,
Şübhəsiz ki, ciyəri hər birinin qan oldu.

Evdəki, qonşudakı, bir də ki, ilham pərisi,
Sənə munis hələlik üç dənə canan oldu.

Sən bilirsən ki, səninlə zarafat eyləyirəm,
Deyəcəksən nə zərafətdi, bu böhtan oldu.

Məşədi, kəbleyi ol, ya da hacı, yox fərqi,
Səni mömün eləyən səndəki iman oldu.

Ey Baba, fikrini təsdiq edirəm Məşdibadın,
Nöqsanın yoxdu, bu yoxluq sənə nöqsan oldu.

Aşikar söz deyirəm mən həmişə, ey Şahin:
Məzəi şerimizin sultanı Pünhan oldu!

*8.11.1998*

## HACI MAIL - 63

Baş əyməyirəm bir neçə cahil qabağında,
Amma gəlirəm səcdəyə aqil qabağında.

Təbim yenə dərya kimi sahilləri aşdı,
Təbim necə aram ola sahil qabağında?

Hər söz deyənin öz sözü olsun, yolu olsun,
Təqlidçi nədir mən kimi fazil qabağında?

Acizlik edir söz dilənənlər yenə, mənsə
Bir zərrə də aciz deyiləm dil qabağında.

Göz yaşlarımı seyr eləyənlər elə bildi
Aşiq dayanıbdır yenə nisgil qabağında.

Qüdrətli sənətkarları təqlid eləyirlər,
Milçək nə cəsarət eləyir fil qabağında?

Ilhamı sönüklər hələ də bilmədilərmi
Şəmin işığı heç nədi qəndil qabağında.

Ifası ilə Əlbaba fəth etdi muğamı,
Xamdır neçə xanəndə o qabil qabağında.

Kamilliyə yetmiş Ağaxan ilə Canəli,
"Əhsən" dedi dil kamilə kamil qabağında.

Şöhrət diləyən hər "uşağa" söyləyirəm ki,
Əl dəymə kəmanə, bala, Habil qabağında.

Var ehtiramı ömrü boyu, Şahini tale
Heç vədə xəcil etməyə Mail qabağında.

*9.12.1998*



## ŞAIRANƏ FRAQMENTLƏR

### NAILƏ VƏLIXANLININ YUBILEYI MÜNASIBƏTILƏ

Bir qadın tanıyıram,
Gözləri
Xəzərin suyu tək mavi,
Bakının göyü tək səmavi...
Bir qadın tanıyıram,
Sözləri
"Min bir gecə" nağıllarının
diliylə
axşamı səhər,
səhəri axşam edən,
Şəhriyarı ram edən
Şəhrizadın sözləri...
Bir qadın tanıyıram,
Gözlərini nəm tutub,
Ürəyini qəm tutub...
Əlində qələm tutub
qədrini, qiymətini
bilir ötən hər anın...
Gorun çatlasın, Hacı,
divarları çat verir
sən tikdiyin binanın...

Bir qadın tanıyıram,
Cahana gəlişindən
Tomris Ana yurduna,
Nüşabə diyarına
Bir az şöhrət,
Bir azca da şan gəldi...
Işimiz-gücümüz,
dərdimiz-sərimiz
azmış kimi
bu zəlzələ hayandan gəldi?..

Bir qadın tanıyıram,
Xilas edir xalqımın
qaranlıq tarixini
tarixin dumanından,
"Iki yerə ayrılan
Azərbaycan" deyəndə,
"Torpağı şəhid olan

"Qarabağ" söyləyəndə
ağrı qopur canından...

Bir qadın tanıyıram,
zəhmətin,
əziyyətin
qabarı əlindədir,
Muzeyləşən tarixin,
Tarixləşən muzeyin
açarı əlindədir...

Bir qadın tanıyıram,
Iki,
Üç,
Beş,
On qadın
Ona çətin çatası...
Məmmədəli Vəlixanlı - atası,
Aqşin Vəlixanlı - qardaşı,
Nakam Elgünü - oğlu,
qurumayan göz yaşı...

*1.02.2001*

## "XATUN MƏCLISI"NIN BAŞ XATUNU VAR

*"Vahid poeziya evi"ndə şairə
Fəridə Ləmanla keçirilən görüş münasibətilə*

Keçmək istəmirəm hamar yolları,
Rahat səyahətdən bezmişəm yaman.
Istərəm yollanım dağlara sarı,
Ətəkdə bəyaz qar, zirvədə duman.

Məramım qətidir, niyyətim qəti,
Kəlamım qətidir, söhbətim qəti.
Məni qorxutmayır yol əziyyəti,
Haçan demişəm ki "aman, ay aman!.."

Fəridə, ölkəmdə çox Fəridə var,
Fəridə Ləmana hansı tay olar?
Çalışqan, döyüşkən, mətin, fədakar...
Mən belə görmüşəm səni hər zaman.



Həm alim, həm şair, səadətə bax,
Sözündə gül kimi lətafətə bax,
Qismətin, nəsibin uğurdur ancaq,
Yaxşı şairəyə yan almaz yaman.

Doğrusu aşikar, düzü aşikar,
Əməli aşikar, sözü aşikar,
"Xatun məclisi"nin baş xatunu var,
Fəridə Ləmandır, Fəridə Ləman!

*2.02.1999*

## FƏRIDƏ LƏMANA

Pələngin caynağı oldum ayaqlaşdım zaman ilə,
Qətiyyət müştağı oldum, aram yoxdur güman ilə.

Bütün ömrüm boyu daim işim yaxşı gətirmişdir,
Məramım yaxşıdır, çünki aram yoxdur yaman ilə.

Qaranlıqlar kənar olmuş, məni qərq eyləyibdir gün,
Kənarımdan bulud qaçmış, yox olmuşdur duman ilə.

Canımda bir qərəz varmı, sənin qəsdin nədir, hicran,
Qələm məndə, dayanmışsan sən isə ox-kaman ilə.

Ol ub şerə əsir Şahin yazır, hər gün yazır Şahin,
Həmişə fəxr edir Şahin Ləman ilə, Ləman ilə.

*2.02.1999*

## YAQUB MAHMUDLU - 60

"Qoca" kəlməsini lüğətdən pozub
60 yaşında cavan bir alim.
"Bəlkə 100 yaşımda qocaldım" yazıb
60 yaşında cavan bir alim.

Görüb ağırlıq da, görüb çətin də...
Ilahi qoymasın onu çətində!
Ağqoyunlu Yaqub əzəmətində
60 yaşında cavan bir alim.
Nə qədər zəfərin müəllifidir,

Nələrin, nələrin müəllifidir,
Yüzlərlə əsərin müəllifidir
60 yaşında cavan bir alim.

Qanında hərarət, canında od var,
Qəlbində tarixə məhəbbət yaşar,
60 qış görüb, 60 bahar
60 yaşında cavan bir alim.

Onu məşhur edib əməli, işi,
Onu qocaltmayıb çərxin gərdişi,
60 yaşında cavan bir kişi,
60 yaşında cavan bir alim.

*28.02.1999*

## HACI SOLTANIN "MƏSUMNAMƏ" KITABININ TƏQDIMATI MÜNASIBƏTILƏ

Dikmiş gözünü göylərə, canan, Hacı Soltan,
Hazırdı yolunda gedə qurban Hacı Soltan.

Seyr eyləyirəm Soltan olan məclisi hərdən,
- Burda, - deyirəm, - nurludu hər yan, Hacı Soltan!

Bir yanda Şəriət meyi, bir yanda Təriqət,
Bir yanda təsəvvüf ilə irfan - Hacı Soltan.

Bir yanda Həqiqət dayanıb Mərifətiylə,
Bir yanda məhəbbətli bir insan - Hacı Soltan.

Öz bağçası var, bağçasının bənzəri yoxdur,
Söz bağçası var - bağçaya bağban - Hacı Soltan.

Elmiylə edir fəhminə alimləri müştaq,
Şeriylə edir bizləri heyran Hacı Soltan.

Ey çarə üçün dərdinə loğman diləyən kəs,
Pünhan eləmə dərdini, loğman Hacı Soltan.

Şah Ismayılın şəninə çox söz yazılıbdır,
- Qoy çox yazıla! - eylədi fərman Hacı Soltan.



Yaz Taclı xatundan dəxi, hal əhlisən, ey dost,
Aç indi Ərəbzəngiyə meydan, Hacı Soltan.

Məsumları nəzm eyləmisən, cəhdinə əhsən!
Olsun köməyin daima Quran, Hacı Soltan!

Amma ki, yazaq hər sözü xəlqin dili ilə,
Var səndə də, var məndə də imkan, Hacı Soltan.

Şahindi bu, Şahindi bu - bir Məşhədi Şahin,
Soltandı bu, Soltandı bu, Soltan - Hacı Soltan!

*11.09.1999*

## XANƏNDƏ DOSTUM ƏLIBABA MƏMMƏDOVUN "70" BAHARI MÜNASIBƏTILƏ

Etdi ölümsüzlüyü öylə şüar Əlbaba,
Sağ ikən ölməzliyə verdi qərar Əlbaba.

Həm gözəlin vurğunu, həm qəzəlin məftunu,
Cəzb elədi elmi də cazibədar Əlbaba.

Gör necə sərrafıdır musiqi dünyamızın,
Yollarını təsnifin etdi hamar Əlbaba.

Saqi şərab ilə gəl xəlqi xumar etsə də,
Xəlqi "Humayun" ilə etdi xumar Əlbaba.

Çox qocanın mübtəla olduğu bədbinliyi
Daima inkar edir qəlbibahar Əlbaba.

Altı onillik vida etdi bu xanəndəyə,
Oldu sevincək buna, olmadı zar Əlbaba.

Yetdi onilliklərin indisə yeddincisi,
Yetmişi cananə həm eylədi car Əlbaba.

Hər nə qədər olsa var Azəribaycanımız,
Olmalıdır, Şahina, bəlli ki, var Əlbaba!

*13.02.2000*

Pak ola qoy qəzəlim, Şahina, "Məcməüş-şüəra"
Pakizə məclisidir Azəribaycanımızın.

*23.09.2000*

***

*Gözəl ziyalı, görkəmli pedaqoq, alim, şairanə təbiətli Hacı Aslanın yubileyi münasibətilə*

Meylin yaxası qalsa da imkanın əlində,
Aşiqlərin olsun əli cananın əlində.

Mən vəslə yetişdim neçə tədbir ilə, hərçənd
Qalmışdı vüsalım neçə hicran əlində.

Yoxdursa da aləmdə ölümsüzlüyə çarə,
Çox dərdin əlacı yenə loğmanın əlində.

Söz yox Qarabağ mülkünü azad edəcəkdir
Qalmışsa təvan Azəribaycanın əlində.

Rəbbim, kömək ol insana, Tanrım, elə et ki,
Hər müşkülə imkan ola insanın əlində.

Düşsün işə hər yerdə ədalətli qələmlər,
Əfsus, qılınc var yenə sultanın əlində.

Allah, elə et kəsməyə qoy doğrunu əyri,
Ədlin boğazı olmaya böhtanın əlində.

Hər istəyə imkan eləsin qoy Hacı Aslan,
Şahin, axı imkan nədi aslanın əlində?

*18.10.2000*

## ƏLIBALA HACIZADƏ - 65

*Dostum Əlibalanın adı çəkiləndə nədənsə mən Əlibabanı xatırlayıram, 40 quldurdan qorxmayan comərd Əlibabanı. Bizim Əlibala da ərəb rəvayətinin qəhrəmanı Əlibaba kimi daim haqqın, ədalətin, sədaqətin tərəfdarıdır, hətta qabağına 40 deyil, 1000 quldur çıxsa belə...*

Önünə Qəzəlin Şahini gələ,
Qəzəl vurğunusan, qışın olar yaz.
Qırx quldur yerinə lap mini gələ,
Yenə, ey Əlibala, sənlə bacarmaz.



Əli qeyrətlisən... Əli - şanımız!..
Ey şirin nəsrimin tacı, sadəsən.
Qoca olmasan da, qocamanımız,
Hacı olmasan da, hacızadəsən!

*6.02.2001*

## GÖZƏL XANƏNDƏ SABIR MIRZƏYEVƏ

Ruhani gözəllik ki, gülüm, səndə göründü,
Minlərlə şer cilvəsi sayəndə göründü.

Şairləri şövq ilə çox illər oxuduqca
Qəmgin də göründü bu sevən şən də göründü.

Taqqıldamağa başladı yad söz qulağımda,
Üsyan eləmək meyli o dəm məndə göründü.

Basmışdı alağ şer gülüstanını, heyhat,
Sözlər gözümə xeyli pərakəndə göründü.

Yad kəlmələri mən elə yondum qəzəl içrə,
Hərdən qələmim bir çoxuna rəndə göründü.

Allahə şükürlər ola məqsudə yetişdim,
Tər-təzə qəzəl gülləri gülşəndə göründü.

Şair var idi Sabir adında bizə, Şahin,
Şadəm, gözə Sabir kimi xanəndə göründü!

*9.02.2001*

## VAMIQ TAR ÇALIR...

*Məşhur tarzən Vamiq Məmmədəliyevin 55 yaşı münasibəti ilə*

Sənətdə məqamı var, yeri var, çalır,
Vamiq tar çalır.
Tarını ustad bir sənətkar çalır,
Vamiq tar çalır.
Elə ki, mizrabla simi görüşdü,
Tarın zili ilə bəmi görüşdü,
Qərib bir durnanın lələyi düşdü,
Vamiq tar çalır.

Yaşadır azəri muğamlarını -
Muğam dövlətini, muğam varını...
Yad edib Müşfiqin "Oxu tar"ını
Vamiq tar çalır.

Elə ki, dillənir gərilən simi
Eşitmir heç kimi, görmür heç kimi,
O dəm görə bilmir hətta Vasimi,
Vamiq tar çalır.

Tarzənlər elə ki, onu eşitdi,
Çoxunun öncüllük diləyi getdi,
Həsəddən bülbülün ürəyi getdi,
Vamiq tar çalır.

Alqış söyləyirəm mən dönə-dönə
Bu fərəhli günə, mübarək günə,
Tarı canan kimi sıxıb köksünə
Vamiq tar çalır.

Adəm, haradasan, Həvva, hardasan?
Məcnun, haradasan, Leyla, hardasan?
Vamiq buradadır, Əzra, hardasan?
Vamiq tar çalır,
Vamiq tar çalır...

*25.07.2001*

## ŞAHIN KIMI VAR BIR QOCA, MÜRSƏL KIMI OĞLAN...

*MÜRSƏL HƏKIMOV - 75*

Yetmiş beşə çatdın,
Çatdın və canımda yaşamaq eşqi oyatdın.

Söz gülşəninin bülbülü olsaq nəyi pisdir?
Bülbüllər ilə dolsa əgər bağ nəyi pisdir?
Nikbinliyi Allah-təala sənə vermiş,
Bir qətrə verib Şahinə, dərya sənə vermiş.

Nikbinliyinin bir payını Şahinə bəxş et,
Mürsəl kimi olmaq əməlin qəlbimə nəqş et.



Bədbinliyimi dəmbədəm artırmada dövran,
Ustad, əlimi üzmədəyəm mən bu cahandan.

Güllər və çiçəklər
bir gün görəcəklər:
Şahin kimi var bir qoca, Mürsəl kimi oğlan!

*8.12.2001*

## ŞAIR ISGƏNDƏR ETIBARIN 65 BAHARI MÜNASIBƏTILƏ

Şair sözü kəskinsə əgər xəncərə bənzər,
Şair sinəsi söz dolusu dəftərə bənzər.

Biz küfrü və kafərləri inkar ediriksə,
Mən öylə müsəlman görürəm kafərə bənzər.

Bədbinliyimiz çoxludu nikbinliyimizdən,
Sözlər ki deyirlər gecə-gündüz, şərə bənzər.

Yarəb, quruluq gözləyirik göz yaşımızdan,
Bir gör neçə ildir ki axır, Tərtərə bənzər.

Çoxdursa da insanlarımız Sabir adında
Sabir daha yox Mirzə Əli Əkbərə bənzər!

Yetmiş yaşına qaldı beşin, yetmişin olsun!
Sözlər ki deyibsən, dedilər ki, zərə bənzər.

Bağdadda özüm şöhrətinin şahidi oldum,
Qiymətli şerlər oxudun gövhərə bənzər.

Göz dəyməyə, Şahin, səbirin tək səbir olsun,
Səbrində adam görmürəm Isgəndərə bənzər.

*20.02.2002*

## XANƏNDƏ NADIR AĞAYEVƏ ITHAF

Mən söyləmirəm təkcədi, nadirdi bu Nadir,
Amma, deyirəm ki, hələlik sirdi bu Nadir.

Hal əhlidi, qal əhli deyildir el içində,
Var harda şer məclisi zahirdi bu Nadir.

Sərf eyləməyir vaxtını bica yerə, çünki
Bilmiş ki, bu dünyadə müsafirdi bu Nadir.

Bülbül eşidib cəh-cəhini düşdü sədadən,
Sehriylə səsin çox şeyə qadirdi bu Nadir.

Zəngulәsi var köhnə - edir köhnəyə hörmət,
Zəngulәsi var tazə - müasirdi bu Nadir.

Var öylə müğənni oxumur xəlqi qəzəllər,
Amma ki, qəzəl seçmədə mahirdi bu Nadir.

Mahirliyə, əlbəttə, əziyyətlə yetişdi,
Çox mərəkədən çıxdı, bahadirdi bu Nadir.

Şahin, elə zənn etmə ki, xanəndədi təkcə,
Hərdən danışır şer ilə, şairdi bu Nadir.

*6.06.2002*

## TƏƏSSÜFNAMƏLƏR

### MƏRSIYƏ

*Ziyalı xanım Güllü Əbilovanın vəfatı münasibətilə*

Dünya acı dünyadı, şirin dilli də getdi,
Min bir kələk işlətsə də, fənd-felli də getdi.

Cahil yaşadı yüz yaşacan, bir də görürsən
Aqil bir adam isə fəqət əllidə getdi.

Var sahili ömrün ki, fəna yelləri əssə,
Sel çıxsa əgər sahilə, sahilli də getdi.

Dünya evinin nisgilini anlamayan da,
Dünya evinə mən kimi nisgilli də getdi.

Min şövq ilə Tövratə pərəstiş eləyən də,
Heyhat, əli Quranlı da, Incilli də getdi.



Dünyadə zərə, zivərə mailsiz olan da,
Dünyadə zərə, zivərə mailli də getdi.

Məşəlsiz olan bir yana, məşəlli də söndü,
Heykəlsiz olan bir yana, heykəlli də getdi.

Bir zərrə kimi gözlərə naməlum adam da,
Məcnun kimi eşq aləminə bəlli də getdi.

Şahin, gülü soldurdu fələk, gün gələcək ki,
Gülsüz qalacaqdır bu cahan, Güllü də getdi.

*16.02.1997*

### MƏRSİYƏ

*Meyxana ustadı Nizami Rəmzinin vəfatı münasibətilə*

Yarəb, fələk işlətdi kələk Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

Tərk etdi bizi, yurdu, elatı yarı yaşda,
Ünsiyyəti, növrağı, büsatı yarı yaşda,
Qəndi, şəkəri, noğlu, nabatı yarı yaşda,
Məstanəliyi, eyşi, nişatı yarı yaşda,
Bir şəm təkin söndü həyatı yarı yaşda,
Yarəb, fələk işlətdi kələk Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

Rəmzi, səni cananə soraqlar yaman ağlar,
Dağ üstünə çəkdin neçə dağlar, yaman ağlar,
"Rəmzi" deyibən əsdi dodağlar, yaman ağlar,
Qan-yaş ilə islandı yanağlar, yaman ağlar,
Meyxanəçi yoldaşların ağlar, yaman ağlar,
Yarəb, fələk işlətdi kələk Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

Rəmzi, bürüyüb gülşəni, həm bağı təəssüf,
Seyr eylədiyin gör neçə torpağı təəssüf,

Sərf oldu tələf, eylədi yarpağı təəssüf,
Endi yerə bir meyxana bayrağı təəssüf,
Andıqca səni çulğadı Çildağı * təəssüf,
Yarəb, fələk işlətdi kələk Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

Mey qaldı yarımçıq neçə peymanədə indi,
Meyxanə deyərdin, hanı meyxanə də indi?
Çatdı bu xəbər nərgizə, reyhanə də indi,
Tökməkdədi göz yaşlarını nanə də indi,
Ağlar bu ağır matəmə biganə də indi,
Yarəb, fələk işlətdi kələk Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

***

önmüş nəzərin ki, nəzərim eylədi fəryad,
Nərdtaxta qapandı və zərim eylədi fəryad,
Zülmət gecə gəldi, səhərim eylədi fəryad,
Qəlbimdəki tabü təpərim eylədi fəryad,
Məmmədlə Ağamirzə, Kərim** eylədi fəryad,
Yarəb, fələk işlətdi kələk, Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

Kəs varmı deyə cövrü cəfasızdı bu dünya,
Yainki qəzasızdı, xətasızdı bu dünya,
Yainki cəbrsizdi, cəzasızdı bu dünya,
Təkid eləyər kim ki, bəlasızdı bu dünya?
Bildim ki, vəfa yoxdu, vəfasızdı bu dünya!
Yarəb, fələk işlətdi kələk, Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

Gülşəndə gəzənlər gedibən yatdı qəbirdə,
Yoxdur buna şəkk-şübhə fəğan etdi qəbirdə,
"Səbr eylə" deyirlər, daha güc yoxdu səbirdə,
Gözlər fələyin gərdişinə ağladı bir də,
Dünya evini tərk eləyib getdi Kəbir *** də,

* Meyxanaçı Ağəsəlim Çildağ
** Məşhur Bakı meyxanaçıları
*** Meyxanaçı Kəbir Azəri



Yarəb, fələk işlətdi kələk, Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.
Oldum bu qəza cövrünə qat-qat məəttəl,
Ifrat təəccüb buna, ifrat məəttəl,
Qaldım çoxu tək mən dəxi, heyhat, məəttəl,
Meyxanə məəttəl və muğamat məəttəl,
Şahin fələyin gərdişinə mat-məəttəl.
Yarəb, fələk işlətdi kələk, Rəmzi də getdi,
Məhv oldu ümid, öldü dilək, Rəmzi də getdi.

*26-27.02.1997*

***

## QƏZƏL

*"Məcməüş-şüəra" ədəbi məclisinin sədri, ağ-saqqal şairimiz Rüstəm Samitin vəfatı münasibətilə*

Gizləndi sinəmdə, deməyin "qəm necə oldu?",
Heç bilməyirəm qəm mənə həmdəm necə oldu?

Ya, vardı sevincim, niyə birdən yoxa çıxdı?
Mübhəm ki deyildi, axı mübhəm necə oldu?

Dərdin boğazından yapışıb boğmalıyam mən,
Baş açmayıram dərd belə möhkəm necə oldu?

Gül qaldı, gülün yarpağı həm qaldı bağ içrə,
Gül yarpağı üstündəki şəbnəm necə oldu?

Yunan elinin, bəlli ki, Isgəndəri vardı,
Görkəmli idi, ondakı görkəm necə oldu?

Hər cam ki var, camdı fəqət, cami-Cəm olmaz,
Cam gəzdi çox əllərdə, fələk, Cəm necə oldu?

Loğmandı, Əbu idi, Əli idi o Sina,
Dərman necə oldu, axı məlhəm necə oldu?

Tarix buna şahiddi ki, torpaq - gözüacdır,
Qarundan əsər qalmadı, Hatəm necə oldu?

Seyyid Əzimə, Mirzə Əli Əkbərə rəhmət!
Azər kimi, Vahid kimi adəm necə oldu?

Hadi hanı? Raci harada, Cürmi hayanda?
Cəfər deyilən Rəmzi köçüb həm... Necə oldu?

Məmməd Əli adlı o Şəfai hanı, ey çərx?
Şairlərimiz böylə dəmadəm necə oldu?

Gəlcək yerə boşqablar ilə göydə olanlar
Bir gün soracaq: Yerdəki aləm necə oldu?

Tarixçədi bunlar Ana Yer kürrəmiz içrə,
Yaş var isə gözdə, deməyək "nəm necə oldu?"

"Məcməüş-şüəra" əhli batıbdır yasa, Şahin,
Hər kəs soruşur hüzn ilə: Rüstəm necə oldu?

*10.05.1998*

## QƏZƏL-AĞI

*O kimdi?*
*Bir şair-alimdi,*
*Yazandı, pozandı...*
*O şair-alimi*
*bu dünya itirdi,*
*o dünya qazandı.*

Neçə aylar yoxa çıxdı, nə qədər il getdi,
Amma, dünyada nə qəm bitdi, nə nisgil getdi.

Qara günlər niyə tez-tez ağa meydan oxuyur?
Lal ola qoy acı dillər ki, şirindil getdi.

Nə amansızdı fələk - hər şeyi eylər fani,
Neçə dərya yoxa çıxdı, neçə sahil getdi.

Nailiyyət ki deyirlər, o da boş söhbətdir,
Varmı insan ki, olub hər şeyə nail getdi?



Bir də gördün ki, igid bir kəsi tərk etdi vüqar,
Görməyib ədli ədalətli çox adil getdi.
Həmi fazil, həmi qabil gedəcək aləmdən,
Həmi qatil, həmi qabil, həmi cahil getdi.

Bu səhər qarə göründü bütün aləm gözümə,
Söndü şəm, öldü çırağ, yanmadı qəndil, getdi.

Şahina, maili olma bu fəna dünyanın,
Qəzələ, sənətə mail Hacı Mail getdi.

*27.09.1999*

***

*Röyamda göründü o məzar,*
*Al-əlvan işığa boyandı.*
*Əbədi uyuyan sənətkar*
*Bu gecə yuxudan oyandı.*

Çox şəxsə müdam etsə də imdad Hacı Mail,
Imdad özünə etmədi, ey dad, Hacı Mail.

Gördüm yuxuda qəbrini, çıxmışdı kəfəndən...
Eylərdi "Füzuli!.." deyə fəryad Hacı Mail.

Dağ çəkdi qəzəldə neçə qal əhlinə... heyhat
Dağ çapmayacaqdır daha Fərhad Hacı Mail.

Şəfqətli bir insan idi olduqca səmimi,
Olmaz idi heç yadə belə yad Hacı Mail.

Fikrindəki çox mətləbi zikr eyləyər idi,
Fikrində də, zikrində də azad Hacı Mail.

Din aşiqi idi və xurafatdan uzaqdı,
Cəhlin evini eylədi bərbad Hacı Mail.

"Divan"ımı görcək onu vəsf eyləmiş idi,
Olmuşdu ürəkdən bu işə şad Hacı Mail.

Gördüm yuxuda Maili... Qəbr içrə diriydi...
Bir mqbərə idi iri, abad... Hacı Mail...

Şagirdləri idik biz onun, Şahin, əruzda,
Şagirdləri tərk eylədi ustad Hacı Mail.

*1.11.1999*

***

## QƏZƏL

*Qocaman qəzəlxanımız Ələkbər Şahidin vəfatı münasibətilə*

Demirəm tərk eləyib aləmi zahid getdi,
Deyirəm mən qəzəl uğrunda mücahid getdi.

Köhnə şerin təzə bayraqdarı Şahiddi bu gün,
Elə zənn eyləyirəm mən təzə Vahid getdi.

Daimi mövzusu, əlbəttə ki, eşq idi onun,
Yazdı yüzlərlə qəzəl sevgiyə aid, getdi.

Bu gedişdən nə qədər göynədi Ənvərlə Qəni,
Hüzn ilən ah çəkib söylədi Cahid *: Getdi!..

Yandı Fövcül-füsəha üzvü olan şairlər,
Dedi "Fövcül-füsəha" şairi Nahid **: Getdi!..

Xəstəlik vaxtı da daim sözü "canan" idi,
Şahina, ey bu sözün şahidi, Şahid getdi.

*18.12.1999*

## MÜRƏBBE

*Ələkbər Şahidin vəfatından kədərlənərək*

Qəzəl uğrunda bu gün öylə mücahid yoxdur,
Köhnə şairlərə bu dövrdə sərvər yoxdur.
Vahidi qeyb elədik, indisə Şahid yoxdur,
Əlağa getmiş idi, indi Ələkbər getdi.

* "Məcməüş-şüəra"nın üzvü Yaşar Cahid
** "Fövcül-füsəha"nın üzvü Xanoğlan Nahid



Gecə-gündüz ulu Allahə dua eyləməli,
Hər işi yaxşı bilir həqq-əbədidir, əzəli...
Seydağa [1] getdi, gedib Tuti [2], hanı Məmmədəli [3]?
Ağəmi [4] yumdu gözün, bir sinədəftər getdi.

Cənnəti [5] cənnətə bəxş etdi yığıb sözlərini,
Görmürük Bisavadın [6] indi savad izlərini,
Biqələm [7] qaldı qələmsiz yumaraq gözlərini,
Şahinə "gəl" deyib illər boyu Azər [8] getdi.

O Pərişan [9] neçə vaxtdır ki, qoyub qəmdə bizi,
Göz yumub aləmə tərk eylədi Rüstəm [10] də bizi,
Hacı Mail də yetim qoydu bu aləmdə bizi,
Rəmz olan həm ləqəbi, həm özü Cəfər [11] getdi.

Şirin idi bu həyat, ağu dadır getdikcə,
Neçə şair canı qovrulmadadır getdikcə,
Bu nə bağdır gülü sovrulmadadır getdikcə,
Getdi, Elnarə [12] kimi türfə sənubər getdi.

Nikbinik amma müdam olsa da ah-vay canda,
Var təpər canda kifayət qədəri, hay canda,
Viran olmaz qəzəlin mülkü Azərbaycanda,
Amma, daş qalsa da bu mülkdə, mərmər getdi.

Məst idi cananın eşqiylə, oyanmırdı fəqət,
Neçə meyxanədə qalmışdı, usanmırdı fəqət,
Düşsə də çox alova-atəşə, yanmırdı fəqət,
Oda Şahin yanacaq indi, səməndər getdi.

*25.12.1999*

1. Seyidağa Həbilov
2. Şıxəli Tuti
3. Məmmədəli Şəfai
4. Ağəmi Buzovnalı
5. Əbdülxaliq Cənnəti
6. Muxtar Bisavad
7. Məhəmməd Biqələm
8. Azər Buzovnalı
9. Hacəli Pərişan
10. Rüstəm Samit
11. Cəfər Rəmzi
12. Elnarə Buzovnalı

## QƏZƏL-AĞI

*Əməkdar incəsənət xadimi dostum Imran Xəlilovun faciəli ölümü münasibətilə*

Dünya mənə zülm eylədi, Imranı itirdim,
Imranı deyil, sanki bu dünyanı itirdim.

Hər sirrimə sirdaş idi, yoxdur daha sirdaş,
Hər dərdimə loğman idi, loğmanı itirdim.

Qan ağla, Quba, əy başını, ey ulu Şahdağ,
Axma daha Qudyal çayı, ümmanı itirdim.

Sənət bağının aşiqi, zəhmətkeşi idi,
Bağ qaldı, bağat var yenə, bağbanı itirdim.

Dost itkisi ləl isə, tapılmaz daha ləlim,
Dost itkisi mərcan isə, mərcanı itirdim.

Məclislərimiz qaldı bizim - bülbülə həsrət,
Tərlanı uçurdum göyə, tərlanı itirdim.

Sultan idi, müti görünən bəndə deyildi,
Fəxrimdi, vüqarımdı, o sultanı itirdim.

Cismimdi sizin gördüyünüz indi, deyil can,
Cism içrə canım qalmadı, mən canı itirdim.

Insanı gözəl xəlq eləyibdir ulu Tanrı,
Elan edirəm: Ən gözəl Insanı itirdim.

Zülm eyləyə bilmir qoca dünyayə bu Şahin,
Dünya mənə zülm eylədi, Imranı itirdim.

*Quba,*
*19.07.2000*

## MÜRƏBBE

*Dostum Imran Xəlilovun faciəli vəfatından kədərlənərək*

Bağban, mənə faş eylə, nilufər niyə yandı?
Qalmaqda ələf, lalə-sənubər niyə yandı?



Bağ içrə alağ yanmadı, qənbər niyə yandı?
Dünya, oda qın tabladı, xəncər niyə yandı?

Gündüz-gecə qəm - dəftəri hey cızmada idi,
Dərd, qüssə, ələm - dəftəri hey cızmada idi,
Ey tale, qələm - dəftəri hey cızmada idi,
Gördünmü, qələm yanmadı, dəftər niyə yandı?

Yollarda açıb getdiyi izlər onu gözlər,
Göz qaldı yolunda, neçə gözlər onu gözlər,
Söylərdi bizə daima zər timsalı sözlər,
Zər qaldı təəccübdə ki, zərgər niyə yandı?

Qaldır başını, söz gülünü dər, yenə vardır...
Əfsus ki, aləmdə riya, şər yenə vardır...
Ey bəxt, bibərlikdə bibərlər yenə vardır,
Bilməm, şəkəristandə şəkkər niyə yandı?

Hicrin neçə avazına dözmüşdü o sərvər,
Çox nazına, ecazına dözmüşdü o sərvər,
Çox sərvnazın nazına dözmüşdü o sərvər,
Bir nazə dözə bilmədi, sərvər niyə yandı?

Elmin, ədəbin məftunu idi necə incə,
Eşq aləminin yorğunu idi necə incə,
Incə sənətin vurğunu idi necə incə,
Incə sənətə vurğun olan ər niyə yandı?

Hal əhli idi, sirrimizin sirdaşı idi,
Hər sahədə bişmişdi, cəhldə naşı idi,
Imran idi, atəşdə səməndər quşu idi,
Şahin quşu qaldı, o səməndər niyə yandı?

*Bakı,*
*10.08.2000*

## MƏRSIYƏ

*Əbülfəz Elçibəyin vəfatı münasibətilə*

Əbülfəz Elçibəy getdi, könüllər mülkü zar oldu,
Vətən torpağı qəmləndi, sevincək tək məzar oldu.

Mənim xalqım neçin çoxdan xeyir görmür, ziyan eylər?
Neçin qəm ləşkəri xəncər çəkib yurdumda qan eylər?
Neçin güllər saralmışdır və bülbüllər fəğan eylər?
Neçin bağrımda bir nisgil qovub həzzi məkan eylər?
Fələk çox yaxşılıq etmişsə də hərdən yaman eylər,
Əbülfəz Elçibəy getdi, könüllər mülkü zar oldu,
Vətən torpağı qəmləndi, sevincək tək məzar oldu.

Yoxaldı milli sərvətlər, cəvahir getdi, zər getdi,
Tükəndi səbrimiz illərlə, tab itdi, təpər getdi,
Bağın bağbanı qəhr oldu, bəhər yoxdur, səmər getdi,
Talandı var-yoxu, dərvazə bir yanə, çəpər getdi,
Bilən vardırmı ölkəmdə nələr qaldı, nələr getdi,
Əbülfəz Elçibəy getdi, könüllər mülkü zar oldu,
Vətən torpağı qəmləndi, sevincək tək məzar oldu.

Hanı əvvəlki canlanma, sükutu oldu meydanın,
Sükutu başlayan dəmdən süqutu oldu meydanın,
Bu gün meydan boşalmışdır, nizamı soldu meydanın,
Bu gün bir faydası yoxdur o meydanın, bu meydanın,
Əbülfəz Elçibəy getdi, könüllər mülkü zar oldu,
Vətən torpağı qəmləndi, sevincək tək məzar oldu.

Müdam azadlıq uğrunda elə əzmü səbat etdi,
Neçə bədxahı susdurdu, neçə xoşxahı mat etdi,
O həzrət dillər öyrəndi, dilin qəndü nabat etdi,
Ərəblərlə gedib həmsöhbət oldu, ixtilat etdi,
Böyük bir cəbhənin sərkərdəsi, heyfa, vəfat etdi,
Əbülfəz Elçibəy getdi, könüllər mülkü zar oldu,
Vətən torpağı qəmləndi, sevincək tək məzar oldu.

Onu, Şahin, unutmaz cəbhə də, yoldaş da inşallah,
Yad eylər xatirin biganə də, qardaş da inşallah,
Silahdaşlar da inşallah, cəmi sirdaş da inşallah,
"Əbülfəz Elçibəy" ismin yazarlar başda inşallah,
Xeyrxah insanın xeyri qalar yaddaşda inşallah,
Əbülfəz Elçibəy getdi, könüllər mülkü zar oldu,
Vətən torpağı qəmləndi, sevincək tək məzar oldu.

*22.09.2000*



## BURDA ŞƏKƏR YATIR ASLANLA BIRGƏ

*Lənkəranda Şəkər Aslanın məzarını ziyarət etdim*

Neçə ziddiyyətə məskən olmuşam,
Canımda vüsal var hicranla birgə.
Zəmanə döysə də mən mən olmuşam,
Yaşar həlimliyim üsyanla birgə.

Oxun vıyıltısı - tütək səsində...
Otun xışıltısı - külək səsində...
Neçə kaşanənin bünövrəsində
Xəzinə gizlənib ilanla birgə.

Tikan qopa bilmir gül budağından,
Bülbül yan olmayır gül qabağından,
Nazlı bir gözəlin gül dodağından
Xahiş eşidirəm fərmanla birgə.

Sultanlar görürəm - fələk oynadır,
Tufanlar görürəm - çiçək oynadır,
Şeytanlar görürəm - mələk oynadır,
Mələklər görürəm şeytanla birgə.

Şahin bədbinliyə əsir deyildir,
Amma hər təskinlik səbir deyildir,
Bu qədir adi bir qəbir deyildir,
Burda Şəkər yatır Aslanla birgə.

*12.10.2000*

## 63 YAŞINDA VƏFAT EDƏN HACI MAILIN 65 YAŞI MÜNASIBƏTILƏ

Möhtacıyıq kəfənin,
Əcəl oxuna tuşuq.
Ömür adlı dəvənin
Belində oturmuşuq.
O dəvə
dönmür geri,
Dəvə
irəli gedir.

Hər ömrün son mənzili
axı irəlidədir.
Zaman irəli gedir,
Məkan irəli gedir,
Qoca irəli gedir,
Cavan irəli gedir.

Gedir,
o dəvə gedir,
Gedir altında günün,
qarın,
dumanın,
çənin.
Kimsə bilmir, Ilahi,
Səslənəcək neçə il
Zınqırovu dəvənin.

Gedir,
o dəvə gedir
qoz belinin üstünə
yükləyib sevincini,
yığıb dərdi-sərini...
Ölüm saxlayacaqdır
Dəvənin ləngərini.

Çatdı günün biri də...
Qürur ilə,
şəzst ilə
Dəvə bir şairi də
Çatdırdı son mənzilə.

Ömrü vardır daşın da...
Sanki əhd eyləmişdi,
O, Peyğəmbər yaşında
Dünyasını dəyişdi.

*24.10.2000*



## QƏSIDƏ

*Vəfatının bir illiyi münasibətilə dos-tum Imran Xəlilovun məzarı başında oxunmuşdur*

Gül var, çiçək varsa da, bağban gözə dəymir,
Hil var, mixək varsa da, dərman gözə dəymir.

Aşiqlərə xaqan idi Imran bu cahanda,
Ariflərə sultan idi, sultan gözə dəymir.

Dostum, sənə vermək dilərəm indi hesabat:
Güllər hamısı öylə də əlvan gözə dəymir.

Sellənmədə göz yaşları hərdən gözümüzdən,
Sən heç də güman eyləmə ki, qan gözə dəymir.

Çox yanda yamanlıq görünür, yaxşı xəbər yox,
Kafər elə artır ki, müsəlman gözə dəymir.

Vardır aramızda hələ də tülküsifətlər,
Heç də elə zənn etmə ki, şeytan gözə dəymir.

Artır neçə insandakı insanlığa şübhə,
Adəm o qədər çoxdu ki, insan gözə dəymir.

Dilbər Qarabağ yurdu hələ düşmən əlində,
Xainlərə, alçaqlara üsyan gözə dəymir.

Vaxt var idi namərdlərə meydan oxuyardıq,
Əfsus ki, namərdlərə meydan gözə dəymir.

Qalmaz idi Şah Ismayılın xəncəri qında,
Heyfa ki, haman Azəribaycan gözə dəymir.

Üqbadədi, dünyadə deyil vəslə gedən yol,
Bir gün deyərik biz dəxi: Hicran gözə dəymir.

Biz həm gələrik yanına Allah buyursa,
Dostum, bu saat ölməyə imkan gözə dəymir.

Çox dil bilər idin, buna şahiddi qarışqa,
Əfsus, təəssüf ki, Süleyman gözə dəymir.

Candan da keçərdin, düzü, cananədən ötrü,
Imran, nə oldu, axı canan gözə dəymir.

Neynim ki, hesabat acı söhbətlə bol oldu,
Zəqqum elə artıb şəkəristan gözə dəymir.

Göz görmədə çox kəsləri, Şahin, hanı Imran?
Həsrətdi bu gün göz gözə, Imran gözə dəymir.

*18.07.2001*
*Quba*



# XATIMƏ

Möhtərəm oxucularım! Ulu Pərvərdigarın yardımı ilə yazmağa başladığım və altı ildə tamamladığım "Ikinci Divan" kitabımı Sizin ədalətli mühakimənizə təqdim etdim. Inanın ki, divan bağlamaq olduqca ağır və əziyyətli bir işdir. Bəlkə də buna görə uğurlu sandığım hər bir şerimi yazdıqca hədsiz-hüdudsuz həzz duymuşam və mənə bu həzzi bəxş etdiyinə görə Allah-təalaya minnətdaram:

*Mən ki, "Divan"ımı yazdım və nəşr etdirdim,*
*Neçə hal əhli eşitcək bunu xoşhal oldu.*

*Yarımın həzzi mənim şənliyimi artırdı,*
*Gözü nurlandı fərəhdən, yanağı al oldu.*

*"Divan"ım bir neçə bədxahıma divan tutdu,*
*Neçə qal əhli sükut eyləyərək lal oldu.*

*Hər qəzəl hər paxılın qəlbinə çox xal saldı,*
*Hər sözüm amma xeyirxah adama bal oldu.*

*Çoxalıb məndəki ilham ikiqat gücləndi,*
*Rüstəm idi bu qəzəlxan, dönübən Zal oldu.*

*Bu şer sahibini çəkdi təmizlik dildə,*
*Elinin söz yükünü çəkmədə hambal oldu.*

*Köhnə "Divan"ı bitirdim, təzəsi hazırdır,*
*Yeni "Divan" yaratmaq mənə amal oldu.*

Əziz "Divan"sevərlər! Ikinci "Divan"ımın da birinci "Divan" kitabım qədər uğurlu alınıb-alınmadığını tam arxayınlıqla deyə bilmərəm. Bunu aşağıda Siz bilirsiniz, yuxarıda Allah! Mənimsə Allahın hər şeyi bilməsinə heç bir şəkk-şübhəm yoxdur, çünki müqəddəs Qurani-Kərimdə buyurur: "Ənnəllahə səmiun bəsir! Ənnəllahə huvəl-əliyyül kəbir! Ənnəllahə lətifun xəbir!" ("Allah eşidən və görəndir! Allah ulu və böyükdür! Allah öncə görən və biləndir". Həcc surəsi, 61-63-cü ayələrdən). Əgər bu "Divan" kitabım da uğurlu alınıbdırsa, dünyadakı bəxtəvərlərin biri də mənəm! Birinci "Divan" barədə müxtəlif müsbət rəylər yazılmış, ona bir neçə şer

həsr olunmuş və hal-hazırda kitab dissertasiya obyekti kimi tədqiq edilməkdədir. Amma zənnimcə mərhum Hacı Mailin mənə və birinci "Divan"ıma həsr etdiyi bir məqalə və qəsidəsi mənə və "Divan" kitabıma verilən qiymətlərin ən ucası, münasibətlərin ən səmimisidir. Alim və qəzəlxan dostum Hacı Mail yazır: "Və nəhayət bu yaxınlarda Şahin Fazil tərəfindən yazılan XX əsr şimal Azərbaycanının birinci "Divan"ı çap olundu. Elə bu böyük həcmli kitabla da Azərbaycanın 100 ildən çox bir dövrünü əhatə edən ədəbiyyat tarixində ədəbi-bədii bir hadisə baş verdi, ölkəmizdə Seyid Əzim Şirvanidən sonra yazılmayan divan ədəbiyyatımızın ilk nümunəsi, elə müəllifin özünün dediyi kimi "oxucu divanına" (mühakiməsinə) tapşırıldı". Çox hörmətli "Divan"sevər oxucular! Güman edirəm ki, indi Hacı Mailin qəsidəsinin sizin nəzərinizə bir daha çatdırılması onun ruhuna dərin hörmətin və mənim "Divan"ıma verilən dəyərli qiymətin təzahürü olardı:

### *ŞAHIN FAZILIN "DIVAN"I MÜNASIBƏTILƏ QƏSIDƏ*

*Şahina, baxdım o gün təzə çıxan "Divan"ə,*
*Xoşuma gəldi, inan, and içirəm Quranə.*

*Əhli-insaf sənin zəhmətini dərk eləyər,*
*Əhli-xibrə ola bilməz bu işə biganə.*

*Çox əmək sərf eləyibsən bu kitabdan ötrü,*
*Çıxdı bu səylərin axırı ki meydanə.*

*Yoxdu "Divan" əsərindən bir əsər çox illər,*
*Saldın axır bu işi sən təzədən səhmanə.*

*Eşidərkən yanacaq çoxları, qoy yansınlar,*
*Bəlkə çoxlar həsədindən olacaq divanə.*

*Mislsiz töhfədir alimlər üçün amma bu,*
*Siqlətindən sayılır bir əsəri-şahanə.*

*Bu bizim hamımıza aid olan "Divan"dır,*
*Hali olsun hamı qoy bizdə olan imkanə.*

*"Ədəbi məclis"imiz fəxr eləyərsə, yeri var,*
*Şəm yansa sevinər yanmağına pərvanə.*



*Təki çoxlar yaza "Divan" əsəri biz sevinək,*
*Çatlasın qoy həsədindən bu işə biganə.*

*Sayılır məncə qaranquş bu kitab əsrimizə,*
*Qalmasın leyk o tək, and veririk Sübhanə.*

*Gəlsin ilhamə hamı, eşqə düşüb yansınlar*
*Ki, sədamız düşə bundan belə qoy hər yanə.*

*O gün olsun oturub qeyd eləyək "Divan"ı,*
*Deyirəm bu əsərin layiqi var qurbanə.*

*Yaz, yeni şerlərinlə bizi xoşhal eylə,*
*Binəsib olmaya bundan belə hər fərzanə.*

*Şöhrəti qoy yayıla yazdığının, ey dostum,*
*Ərəbistanə çata, Türkiyəyə, Iranə.*

*Mir Cəlal * qardaşımı təbrik elə adımdan,*
*O, redaktəylə salıb hər qüsuru səhmanə.*

*Zəhmətin zahir olar kim oxuyarsa kitabı,*
*Zərgər olmazsa, bilinməz ki, nədir dürdanə.*

*Kitabın nəşrinə kimlər kömək etmişsə bu gün,*
*Sayıram cümləsini bu iş üçün mərdanə.*

*Yazdığım bir dəki, tərif deyil, dost sözüdür,*
*Dost gərək göz yuma dostunda kiçik nöqsanə.*

*Bu zəif şeri üçün əfv elə gəl Maili sən,*
*Leyk, diqqət elə hər beytdəki ürfanə **.*

Pərvərdigara! "Ikinci Divan"ın xatiməsində üzümü dəfələrlə olduğu kimi yenə Sənə tuturam. Minnətdaram ki, məni yaratmış, böyütmüş və qocalıq həddinə yetirmisən. Minnətdaram ki, yaşadığım bu iyirminci əsrdə, iki yerə bölünmüş Azərbaycanın birində iki "Divan" yaratmaq səadətini məhz mənə nəsib etmisən. Sən hər şeyə qadirsən, "Divan"larımın sayını çoxalt, xətalarını azalt, altmış yaşına yenicə qədəm qoymuş aciz bəndən Şahin Fazili bütün elmi və ədəbi-bədii niyyətlərini həyata keçirməkdən ötrü qocalar qoca-

* "Divan"ın redaktoru Mir Cəlal Zəki

** Bax: Hacı Mail. XX əsrin birinci "Divan"ı, "Ekspress" qəzeti, N 92, 18 may 1999-cu il

sı et, ya Ilahi! "Huvəlləzi xələqəkum min-turabin-summə min-nutfətin-summə min-ələqətin-summə yuxricukum tiflən summə litəbluğu əşüddəkum summə litəkunu şüyuxən" (O elə bir Allahdır ki, sizi torpaqdan, sonra da nütfədən, sonra bir laxta qandan yaratdı. Sonra sizi uşaq ikən dünyaya çıxartdı ta büluğa çatıb, sonra qocalasınız. Ğafir surəsi, 67-ci ayədən).

*Zəhmət də tamam oldu, hasil də göründü,*
*Ömrün gəmisi artıq sahildə göründü.*

*Hərdən bu qəzəlxan kəs Tehranı da gəzdi,*
*Istanbula baş vurdu, Kabildə göründü.*

*Gah eşqə könül verdi, gah elmə girişdi,*
*Divanə də görsəndi, aqil də göründü.*

Mənim "Ikinci Divan" kitabımda klassik "Divan"larda əsas yer tutan minacat, nət, qəsidə, məsnəvi, qəzəl, müqəttəat, tərkibbənd, tərcibənd, rübai kimi şer növləri vardırsa da, mən bu sahədə də təqlid yolu ilə getməmiş, təkbeyt, dördlük, səkkizliklərdən əlavə, heca vəznində yazdığım poetik nümunələri də oxucuların nəzərinə çatdırmağı məqsədəuyğun saymışam, çünki hal-hazırda Azərbaycan şairlərinin çox böyük əksəriyyəti əruz vəznini bilmədiklərindən əsasən heca vəznində şer yazırlar. Lakin, Pərvərdigarımızın lütfü və mərhəməti sayəsində mən hər iki vəzndə qələm işlətdiyimdən heca vəznli şerlərimi niqabda saxlamaq istəmədim və onları da, möhtərəm oxucular, sizin mühakimənizə yetirdim:

*Yar təki sevsəm də əruz vəznini,*
*Söz qoşuram həm də heca naminə.*

Bəzən mənə deyirlər ki, qəzəl və qitələrimdə özüm-özümü çox tərifləyirəm. Nə olsun ki? Mən ətrafımda və sədri olduğum "Məcməüş-şüəra" ədəbi məclisində özündən razı, lakin qəzəllərindən köhnəlib-qaxsımış xəzəl qoxusu gələn bir neçə qəzəlxan görürəm ki, istər-istəməz mənimlə onların arasındakı fərqi nəzərə çatdırmalı oluram. Məlumdur ki, Əfzələddin Xaqani də məğrur və özünü təriflərə layiq sanan şair olub, çünki o, dövründəki şairlərdən (Nizami Gəncəvidən başqa) üstün olduğunu bilir və bunu heç gizlətmirdi də. Əlbəttə, mən Xaqani deyiləm və ola da bilmərəm. Lakin hər



kəs özünün nəyə qadir olduğunu bilməli və bunu bilmək istəməyənlərə bildirməlidir. Mən necə belə deməyim axı:

*Dövrəmi, yaxşı ki, çox yaxşı adamlar bürüyüb,*
*Yad qədəm bassa bizim bağə qədəm sındırram.*

*Bu qədər məndə ki var güc qəmə üstün gələm,*
*Qoyaram başmağımın altına, qəm sındırram.*

*Qəzəlimdən qəzəlin bir gilə üstünsə əgər,*
*Mən mürəkkəb dağıdar, bil ki, qələm sındırram!*

Mən məni görməyənlərə necə deməyim ki:

*Görmək üçün məni dostanə baxış lazımdır,*
*Şerimin iynəsi batmış gözünə, görmürsən.*

Lakin, əlbəttə, nəhəng Nizami, Xaqani, Nəsimi, Füzuli, Seyid Əzim, Sabir kimi söz və sənət bahadırlarının müqabilində bizlər hələ görünmürük və onlarda olan ilahi ilham bizlərdə yoxdur. Öz dilimizlə yaza bilməyəndə, öz yolumuzla gedə bilməyəndə, öz üslubumuzu tapa bilməyəndə başlayırıq təqlidçiliyə:

*Dilindən ötrü yan, dilə nur çilə,*
*Şam əgər yanmırsa ziyası yoxdur.*
*Füzuli diliylə, Seyid diliylə*
*Şer yazan kəsin həyası yoxdur.*

*Kol olma, ağac ol koldan ayrılıb,*
*Qəzəlin gül olsun, olmasın xəzəl.*
*Qeyrinin açdığı yoldan ayrılıb*
*Özün öz izinlə yerisən gözəl.*

*Qəzəl yazmadasan cürət eləyib,*
*Xəlqi şer yazmaq diləyin deyil.*
*Sənin dediyini Füzuli deyib,*
*Füzuli tək yazmaq xörəyin deyil.*

Mən ölkəmizdə tüğyan edən qırmızı inqilab dövründə doğulub boya-başa çatdığımdan müqəddəs Islam dinimizin hər bir müsəlmanın qarşısına qoyduğu şəriət qayda-qanununa həmişə əməl etməmi-

şəm və bunu gizlətmirəm də. "In tubdu şəyən əv tuxfuhu fə-innəl-lahə kanə bi-kulli şəyin əlima" ("Əgər bir şeyi aşkar etsəniz də, gizlətsəniz də, hər halda Allah hər şeydən xəbərdardır", Əhzab surəsi, 53-cü ayədən).

Hələlik hacı deyiləm. Amma, Həcc ziyarətinə gedib "Hacı" olan elə adamlar tanıyıram ki, xəcalət çəkir və üzümü beləlarinə tutub deyirəm:

*İllərlə namaz qılmayıb, ey "mömün" olan kəs,*
*Qılmaqla namaz Allaha rüşvətmi verirsən?*

Son illərdə ən böyük niyyətim, Allah qoysa, Kəbəni ziyarət etmək, günahlarımın bağışlanması üçün Allahın evində Allaha yalvarmaq, savab əməllərimi əməli şəkildə çoxaltmaq, müqəddəs kitabımızın qarşıya qoyduğu vəzifələri yerinə yetirmək üçün ömrü-mün sonunadək eşqbazlıq edərək Allah eşqini qəlbimdə diri yaşatmaqdır:

*Eşqbaz oldu bu Şahin Fazil,*
*Aşiqəm, sevgilim Allah özüdür.*

Qiymətli oxucu! Arzularımın sahili, istəklərimin əyləci yoxdur, hər gün nəsə yazmaq şakərim olduğundan qələmimi qələmdana qoymaq istəmirəm:

*İki "Divan"ı bitirdim, yenə fikrim var ki,*
*Söz qoşum mən iki "Divan"dakı misra qədəri.*

Pərvərdigara! "İkinci Divan" kitabımın redaktorları olmaqla zəhmətə qail olmuş təbli şair Həkim Qəninin və qüvvətli nasir Hacı Rafiq Şirvaninin bütün xoş niyyətli arzu və istəkləri üzərinə nur yağdır, işıq səpələ, onların hər ikisini öz mübarək əməllərində müvəffəq elə.

*Bir təbibdir ki, şəfa bəxş eləyir,*
*Bir həkimdir ki, onun ismi Qəni.*

*Zəhməti ilə şərəfləndirdi,*
*Hacı Rafiq kimi Şirvani məni.*

*Biri şair, biri nasir güclü,*
*Onların hər biri sevməkdə Səni.*



*Ya İlahi, bu iki şəxs kimi*
*Şad elə Şahini şad eyləyəni.*

Nəhayət, hörmətli oxucu, "İkinci Divan" kitabının xatiməsini bir qəzəlimlə xətm edir, mətləbi uzatmaqla sizin səbrinizi qısaltmaq istəmirəm:

*Cananı gördüm, əlhəmdülillah,*
*Loğmanı gördüm, əlhəmdülillah.*

*İranı gəzdim, Turanı gəzdim,*
*Əfqanı gördüm, əlhəmdülillah.*

*Mən din yolunda, həqqin yolunda*
*Üsyanı gördüm, əlhəmdülillah.*

*Dərk etməyimçin qədrin vüsalın*
*Hicranı gördüm, əlhəmdülillah.*

*Bir gün deyib "gəl", yar etdi fərman,*
*Fərmanı gördüm, əlhəmdülillah.*

*Həzzim yox ikən, dərdim çox ikən,*
*Dərmanı gördüm, əlhəmdülillah.*

*Varkən qürurim, çoxkən qüsurim,*
*Nöqsanı gördüm, əlhəmdülillah.*

*Zənn eyləyirdim mümkünsüzəm mən.*
*İmkanı gördüm, əlhəmdülillah.*

*Eşqimdə düzgün, əhdimdə pakəm,*
*Peymanı gördüm, əlhəmdülillah.*

*"Allah" dilimdə, Şahin, əlimdə*
*Quranı gördüm, əlhəmdülillah!*

Sizinlə "Üçüncü Divan" kitabı ilə yeni görüş niyyətində olan Kərbəlayi Şahin Fazil.

Əlhəmdü lillahi Rəbbil-aləmin!!!

*13.09.2002*

## MÜNDƏRICAT

**BIR QƏZƏLDƏ IKI QƏZƏL:**

**ÖTƏN ILLƏRIN ŞERLƏRI**

**TƏZMINLƏR**

**QOŞMAVARI ŞERLƏR**







**GƏRAYLILAR**

**NƏĞMƏLƏR**



**TƏBRIKNAMƏLƏR**







ŞAIRANƏ FRAQMENTLƏR:



**TƏƏSSÜFNAMƏLƏR**

**KORREKTOR:** ***Nazilə Fazil***

**DİZAYNER:** ***Əhməd Əliyev***

**TEXNİKİ REDAKTOR:** ***İlhamə Hacıbəyli***

**«Planet-press» mətbəə mərkəzində çap edilib**

